Dr. ELNUR NÇSÊROV

# ÊSLAM TARÊXÊ

## I cêld

دكتور النور نصيراف

تاريخ الاسلام

الجزء الاوّل

Dr. ELNUR NASIROV

History of Islam

I

NURLAR
BAKI–2014

لقد كان لكم في رسول الله أسوة حسنة

Allahın Elçisi sizlərə gözəl nümunədir ***(Əhzab 21)***

**Elmi redaktor:** **Oqtay Sultanov**
*tarix elmləri doktoru, prosessor,*
*ADPU Tarix fakültəsinin dekanı*

**Rəyçi:** **Rəcəb Əliyev**
*tarix elmləri namizədi, dosent,*
*ADPU Türk və Şərqi Avropa xalqları tarixi*
*kafedrasının müdiri*

Azərbaycan Respublikasının Dini Qurumlarla İş Üzrə Dövlət Komitəsi
DK-620/M saylı, 14 yanvar 2014-cü il tarixli məktubu ilə
çap olunmasına razılıq verilmişdir

**Elnur Nəsirov**
*Tarix üzrə fəlsəfə doktoru*
**İSLAM TARİXİ**
Bakı, "NURLAR" Nəşriyyat-Poliqrafiya Mərkəzi, 2014, 512 səh.

ISBN: 978 – 9952 – 490 – 25 –1

# MÜNDƏRİCAT



[1] (S.Ə.V) – səllAllahu əleyhi və səlləm – Allahın səlat və salamı onun üzərinə olsun.

## II. FƏSİL



## III. FƏSİL



[2] (R.Ə) – radiyAllahu ənh/ radiyAllahu əhna – Allahı ondan razı olsun.

## IV. FƏSİL



## V. FƏSİL

بسم الله الرحمن الرحيم

# ÖNSÖZ

İslamın meydana çıxması, formalaşması və yayılması müasir dövr tədqiqatçılarının ən çox müraciət etdikləri mövzulardan biri olmuşdur. Bu mövzu ictimai və siyasi yönlərilə bir çox dəfə araşdırılmış və mövzuya dair çox sayıda əsər qələmə alınmışdır. Sözü gedən mövzuya dair kifayət qədər köklü tədqiqatlar olduğu üçün bu sahədə qələm alınmış hər hansı bir əsər tarix elminə xüsusi bir yenilik qazandırmaya bilər. Bu səbəbdəndir ki, oxucuya təqdim etdiyimiz bu əsəri araşdırmacı tarixçilik tərzində deyil, daha çox öyrədici, praqmatik tərzdə qələmə almağa üstünlük verdik.

Bəzi tarixçilər tarixi dövr olaraq orta əsrləri Mədinəyə hicrətdən XV əsrin ortalarında İstanbulun fəthinə qədərki zaman dilimi olaraq qəbul etməkdədirlər. Qeyd etmək lazımdır ki, bu dövr özünün bütün cəhətlərilə müsəlman xalqların tarixindəki ən parlaq və ən əzəmətli dövrdür. Bu əsərdə İslam tarixinin məhz bu dövrünü təsvir etməyi düşündük. Səkkiz əsrlik bir dövrdə baş vermiş tarixi hadisələri bir kitaba sığdırmaq mümkün olsa belə əsərin əhatəli, hərtərəfli və oxucu nöqteyi-nəzərindən doyurucu ola bilməsi düşüncəsilə bunu üç cild halında qələmə almağın daha məqsədəuyğun olacağı qənaətinə gəldik. Təqdim etdiyimiz bu kitab qələmə almaq istədiyimiz əsərin birinci cildidir.

Əsərdə sözə İslam dininin meydana çıxığı cəmiyyətin ictimai, siyasi və iqtisadi həyatının təsvirilə başlayıb bu cəmiyyətin uzun sayılmayacaq bir müddət ərzində hansı dəyişikləklərə uğramasının izahı ilə davam etdik. Kitab altı əsas qismdən ibarət olub birinci qismdə İslamın meydana çıxdığı ərəfədə ərəb yarımadasındakı siyasi, ictimai və iqtisadi vəziyyəti təsvir etməyə çalışdıq. Əsərin mövzusu bir dinin meydana gəlməsi və formalaşması ilə sıx bağlı olduğu üçün İslamdan əvvəl ərəb cəmiyyətinin dini etiqadı, inancları məsələsinə aydınlıq gətirməyə üstünlük verdik. Əsərin ikinci qismində Allah Rəsulu Muhəmmədin (s.ə.v) həyatı, risaləti, onun özünün və ilahi dəvətinə iman gətirmiş insanların Məkkədəki fəaliyyətinə, doğma yurdlarını tərk edərək Mədinəyə hicrət etmələrinə işıq tutulmuşdur. Burada hicrətdən sonra Mədinədə formalaşmış İslam cəmiyyətini bütün cəhətlərilə oxucunun diqqətinə çatdırmağa çalışdıq. Peyğəmbərin (s.ə.v) vəfatından sonra başla-

yan dörd raşid xəlifə dövrünü təsvir edərkən onların hər birinin hakimiyyəti dövrünü ayrı-ayrı fəsillər halında qələm aldıq. Faydalı olacağı təmənnisilə əsərimizin birinci cildini oxucuya təqdim edirik.

**Elnur Nəsirov**
***24 ramazan 1434/01 avqust 2013***

# GİRİŞ

## İSLAM TARİXÇİLİYİNƏ BAXIŞ VƏ MƏNBƏLƏRİN XÜLASƏSİ

“*Tarix bizə öncəgörmə qabiliyyəti verməz, lakin zehnimizin müstəqilliyi ilə müştərək olaraq bizim gələcəyə daha aydın baxmağımıza yardım edər*”
**Paul Valery**

Tarix nədir? Bu sualın tarixi tarix elminin keçmişi qədər qədimdir. Qədimdən bəri tarixçilər, mütəfəkkirlər bu sual ətrafında düşünüb mülahizələr yürütmüş, məsələyə müxtəlif aspektlərdən yanaşaraq cavab verməyə çalışmışdılar. Bu suala “*tarix keçmişin elmidir*” kimi qısa və doğru bir cavab vermək mümkündür. Lakin bu yetərli tövsif olmayacaqdır. Bu səbəbdən də tarix elminin mahiyyəti haqqında bir neçə kəlmə söyləmək yerinə düşəcəkdir. Hər bir elmin tarixi olduğu kimi tarix elminin də tarixi vardır. Tarixə dair ilk yazılı əsərlər qədim Yunanıstanda meydana çıxmışdır. “*Epos*” adı verilən bu əsərlər “*loqoqraflar*” tərəfindən qələmə alınırdı. Bu qəbildən olan tarixi əsərlər hekayəçi, rəvayətçi xarakterli əsərlər idi. Daha sonra öyrədici, praqmatik xarakterli tarixi əsərlər meydana çıxmağa başlamışdı ki, bu cür əsərlərin qələmə alınmasında məqsəd keçmişdə baş vermiş hadisələrdən dərs almaq, oxuyucuya əxlaqi və mənəvi duyğular aşılaya bilmək idi. XIX əsrə gəlindiyində tarix elmi sahəsində ciddi irəliləyiş baş vermişdi. Tarixi hadisələrin sadə nəqli və praqmatik xüsusiyyətləri ilə yanaşı meydana gəlmə səbəbləri, bu səbəblərə təsir etmiş müxtəlif amillər, hadisələrin səbəb və nəticə əlaqələri araşdırılmağa başlanmışdı. Hər hansı bir hadisənin tarixi hadisə sayılması üçün şübhəsiz həmin hadisənin insan fəaliyyəti nəticəsində meydana çıxmış olması mühümdür. Məsələn heyvan sürülərinin köçü və ya hər hansı bir təbii fəlakət tarix elminin araşdırma sahəsinə aid hadisə hesab olunmur. Digər tərəfdən insanın daim fəal, aktiv olduğunu nəzərə alaraq onun istənilən fəaliyyətinin də tarixi hadisə hesab olunması mümkün deyil. İnsanın və ya insan topluluğunun fəaliyyətinin tarixi hadisə hesab olunması üçün həmin fəaliyyətin cəmiyyət həyatına təsir etməsi əsas şərtdir. Məsələn bir bənnanın divar hörməsi tarixi hadisə deyilsə də bir memarın yeni inşaat üsulu icad etməsi tarixi hadisədir. Belə ki, bu icad nəticəsində şəhərsalma işində böyük bir həmlə edilmiş ola

bilər. Tarixi hadisələr mütləq mənada səbəb və nəticə baxımından bir-biri ilə əlaqəlidirlər. Tarixi hadisələrin inkişaf dinamikası baxımından determinik bir təşəkkül içində olduğu şübhəsizdir. Tarixçilər tarixi hadisələri mənbə materiallarına istinadən qələmə alarkən hər şeydən əvvəl həmin mənbə materiallarını təsnif etmə, onlara tənqidi yanaşma bacarığına, qabiliyyətinə malik olmalıdırlar. Hadisənin meydana gəldiyi coğrafi məkan və baş verdiyi zamanın tarixçi tərəfindən dəqiq müəyyənləşdirilməsi də həmin hadisəyə tarixi kimlik, hüviyyət qazandıran mümüh xüsuslardan biridir. Beləliklə, buraya qədər sadaladıqlarımızı aşağıdakı kimi xülasə etsək "*tarix nədir?*" sualını bu cür cavablandıra bilərik: "*Tarix, insanların cəmiyyət həyatına təsir edən fəaliyyətləri nəticəsində meydana gəlmiş hadisələri, səbəb və nəticə əlaqələrini müəyyən edərək, mənbə materiallarının tənqidi təhlilinə əsaslanaraq, məkan və zaman bildirərək öyrənən ictimai elm sahəsidir*".

Nə cahiliyyə dövrü ərəb ədəbiyyatına aid nümunələrdə, nə də Qur'ani-Kərimdə "tarix" kəlməsinə rast gəlinmədiyi üçün bunun ərəbcədə alınma söz olduğu düşünülür. Dilimizə ərəb mənşəli söz olaraq keçmiş "tarix" kəlməsi qaynağını sami dillərindəki "ərx" kökündən almaqdadır. Bu kəlmə akkad dilində "ərxu", ibrani dilində isə "yərxu" olaraq səslənir və "ay" mənasını ifadə edirdi. Ərəb dilində bu kökün törəməsi "ay təqviminin hesablanması" və ya "xronologiya" anlamında (**تاريخ**) "tarix", cəm formasında isə (**تواريخ**) "təvarix" olaraq səslənmişdir.

Tarixçilik orta əsr müsəlman şərqində böyük rəğbət görmüş, müsəlman elm adamları tərəfindən təkmilləşdirilmiş elm sahələrindən biri olmuşdur. Orta əsr müsəlman tarixşünasları yunanlar, romalılar, iranlılar və çinlilərin təcrübəsindən, eləcə də cahiliyyə dövrü ərəb ədəbiyyatının tarixlə bağlı təqdim etdiyi zəngin materillardan da faydalanaraq, hədis elminin də yardımı ilə zəngin bir yazılı tarix meydana gətirmişdilər. Onlar əldə olan tarixə dair materialları müəyyən bir xronoloji ardıcıllıq və coğrafi məkan anlayışı üzərinə bina edərək müasir tarixşünaslığın təməlini atmış, bu elmin bütün sahələrinə dair zəngin bir miras qoyub getmişdirlər.

Tarixşünaslıq müsəlman dünyasında müstəqil bir elm sahəsi kimi yaranmaqdan daha çox hədis və dilçilik kimi elmlərin paralelində, onların təsirilə və onlara təsir edərək meydana gəlmişdir. Tarix elmi sahəsində ilk müstəqil və ciddi əsərlərin qələmə alınmasına Əməvilər dövründə başlanılsa da bundan əvvəl də tarixə dair bir sıra kiçik çaplı risalələrin yazıldığı və tarixə dair dərslər verildiyi məlumdur. Qur'an və hədisləri istər əhkam baxımdan, istərsə də hədislərin səhhəti və ayələrin nüzul silsiləsi, nüzul səbəbi, həmçinin təfsiri

nöqteyi-nəzərindən tədqiq edilməsi tarixə dair ilk araşdırmalara təkan vermişdi. Qur'an ayələrinin bir çoxu müəyyən bir hadisənin baş verməsi səbəbiylə nazil olmuşdur. Alimlər ayənin hansı hadisəyə binaən nazil olduğunu, bu hadisənin hansı səbəbdən baş verdiyini, cərəyan etdiyi məkanı və zamanı araşdırarkən istər istəməz tarixi bir araşdırmaya başlamış olurdular. Həmçinin hədislərdə Allah Rəsulunun (s.ə.v[3]) söylədiyi sözü hansı səbəbdən, harada, hansı hadisəyə bağlı olaraq söylədiyini araşdırarkən də əslində tarixi bir araşdırma aparmış olurdular. Çünki yuxarıda da qeyd etdiyimiz kimi hər hansı bir hadisə baş verdiyi coğrafi məkan və zaman baxımından araşdırılırsa həmin hadisə artıq tarixi hadisə hesab olunur. Beləcə İslam dünyasında ilk tarix araşdırmaları və dərslərinin Allah Rəsulunun (s.ə.v) vəfatından qısa müddət sonra başlamış olduğunu söyləyə bilərik.

Hədislərdə istər nəql silsiləsi baxımından, istərsə də hədisdə adı çəkilən və ya bilavasitə cərəyan edən hadisədə iştirak etmiş insanların kimliyi dəqiqliklə araşdırılmaqda idi ki, bu da "rical" elminin, yəni bioqrafik tarixçiliyin meydana gəlməsinə səbəb olmuşdu. Hələ İslamdan əvvəl, tarixçilər tərəfindən cahiliyyə dövrü adlandırılan dövrdə ərəblər arasında "ənsab" elmi, yəni nəsəbin bilinməsi mühüm əhəmiyyət kəsb edirdi. Hər bir ərəb qəbiləsinin ata-babasının adlarının yazıldığı "nəssabə" adlanan soy ağacları, şəcərələr tərtib olunurdu. Sonrakı dövrlərdə "rical", "təbəqat", "təzkirə" tipli ensklopedik tərcümeyi-hal kitablarının meydana gəlməsində bunun mühüm rolu olmuşdur. Xüsusən hədis alimlərinin yazdıqları əsərlərdə ayrı-ayrı şəxslərin adları, xronoloji ünsürlər, vəfat tarixləri dəqiqliklə müəyyən edilərək qeyd edilmişdir. Bu ənənə İslam tarixşünaslığının meydana gəlməsi və inkişaf etməsində böyük rol oynamışdır.

Ömər ibn Xəttabın (634-644) xilafəti dövründə hicri-qəməri təqvimin qəbul edilməsi, rəsmi sənədlərə, yazışmalara tarix qeyd edilməsi, xəzinəyə aid mədaxil və məxaric qeydləri, həmçinin maaş ödəmələri üçün divan dəftərlərinin hazırlanması İslam tarixşünaslığının təməlinin atılması baxımından böyük əhəmiyyətə malik hadisələrdir. Məlum olduğu kimi İslam tarixində ilk divan, hökumət təşkilatı Ömər ibn Xəttab (r.ə[4]) tərəfindən qurulmuşdu. Xəlifənin əmri ilə Cübeyr ibn Mut'im (r.ə), Məhrəmə ibn Novfəl (r.ə) və Uqeyl ibn Əbu Talibdən (r.ə) ibarət heyət xəzinəyə aid maaş dəftərlərində adları qeyd olunmuş şəxsləri mənsub olduqları qəbilələr baxımından yenidən təsnif edərək yeni siyahılar hazırlamışdılar. Divan dəftərlərində ilk müsəlmanların adları həmçinin ilk hicrət edən mühacirlər, ənsar, Bədr, Uhud, Xəndək döyüşləri, Hudeybiyyə beyəti,

---

[3] (S.Ə.V) – səllAllahu əleyhi və səlləm – Allahın səlat və salamı onun üzərinə olsun.
[4] (R.Ə) – radiyAllahu ənh/ radiyAllahu əhna – Allahı ondan razı olsun.

Məkkənin fəthində iştirak edənlər şəklində təsnif edilərək yazılmışdı. Bundan başqa Allah Rəsulu (s.ə.v) və xəlifələr dövründə bağlanmış sülh müqavilələri, əhdnamələr kimi rəsmi sənədlərin mətnləri də divan dəftərlərinə qeyd olunmuşdu. Bu rəsmi vəsiqələr, qeydlər qısa müddət sonra başlayacaq tarixşünaslığa dair tədqiqatlar, təliflər baxımından ilk və zəngin yazılı materiallar idi.

İslam tarixinin ilk dövrlərini araşdıran müasir tədqiqatçılar üçün Qur'an və səhih hədislər hər zaman ən mötəbər mənbə olmuşdur. Qur'anın bəzi ayələrindəki məlumatlara əsasən cahiliyyə dövrü ərəb cəmiyyətindəki ictimai vəziyyət haqqında təsəvvürə malik olmaq mümkündür. Ələlxüsus İslamdan əvvəlki ərəb cəmiyyətinin dini etiqadı, ənənələri, inancları haqqında məlumat verən Qur'an ayələri bu baxımdan əhəmiyyət kəsb edir. Eləcə də hədislərdə bu qəbildən olan məlumatlara rast gəlmək mümkündür.

Müasir tarixçilər İslam tarixşünaslığını formalaşma və inkişafı baxımından iki qola ayırmışdırlar: Mədinə tarix məktəbi və Kufə tarix məktəbi. Mədinə tarix məktəbi təməlinin daha erkən qoyulması, mənsublarının çoxluğu və sahib olduğu elmi potensialın zənginliyi baxımından daha irəlidə idi. Məkkə, Mədinə və Dəməşq kimi şəhərlərdə yaşayan alimlər bu məktəbə, bu cərəyana mənsub idilər. Belə bir qənaət hasil olmuşdur ki, Abdullah ibn Abbas (619-697) Mədinə tarix məktəbinin ilk təmsilçisi və təsisçisidir. Abdullah (r.ə) Allah Rəsulu Muhəmmədin (s.ə.v) əmisi Abbasın (r.ə) oğlu idi və Peyğəmbərin (s.ə.v) Mədinəyə hicrətindən üç il əvvəl Məkkədə dünyaya gəlmişdi. Tabiundan olduğu söylənsə də Peyğəmbərin (s.ə.v) dövründə dünyaya gəlib böyüdüyü üçün səhabə olduğunu deyənlər də olmuşdur. Əli ibn Əbu Talibin (r.ə) xilafətinin sona çatmasından bir müddət əvvəl siyasi hadisələrdən uzaq durmağa üstünlük verərək İraqdan Hicaza qayıtmış və Mədinədə dərs verməyə başlamışdı. Əyyamü'l-ərəb[5], sira[6] və məğazi[7] kimi mövzularda Abdullah ibn Abbasdan (r.ə) bir çox rəvayətlər nəql edilmişdir. Mədinədə təfsir, hədis, sira, məğazi, fiqh (hüquq), ənsab, əyyamü'l-ərəb mövzularında dərslər vermişdi. Abdullah ibn Abbasın (r.ə) müəllifi olduğu hər hansı bir əsər müasir dövrə qədər gəlib çatmasa da onun müxtəlif elm sahələrinə dair qeydlərinin olduğu dəftərlərin mövcudluğu söylənmişdir. Onun tələbələri arasından məğazi sahəsinin iki ən məşhur təmsilçisi Urvə ibn Zubeyr və Vəhb ibn Münəbbih yetişmişdir.

[5] Əyyamü'l-ərəb-İslamdan əvvəlki və İslamdan sonrakı ilk illərdə ərəb qəbilələri arasında cərəyan etmiş döyüşlər.

[6] Sira və ya sirət-Peyğəmbərin (s.ə.v) həyatı ilə bağlı rəvayətlərin toplandığı kitablara verilən ümumi ad.

[7] Məğazi- Peyğəmbərin (s.ə.v) iştirak etdiyi hərbi yürüşlər və döyüşlər haqqındakı kitablara verilən ümumi ad.

Urvənin (644-713) atası Zubeyr ibn Əvvam (r.ə), anası isə birinci raşid xəlifə Əbu Bəkrin (r.ə) qızı Əsmadır (r.ə). Həbəşistan və Mədinəyə hicrətlər, Bədr döyüşü, Xalid ibn Vəlidin (r.ə) komandanlığı altında baş vermiş döyüşlər, Taifin fəthi, Allah Rəsulunun (s.ə.v) məktubları ilə bağlı nəql etdiyi çox qiymətli məlumatlar İbn İshaq, İbn Şihab əz-Zuhri, Təbəri, Vaqidi kimi salnaməçilərin əsərlərində müasir dövrə qədər gəlib çatmışdır. Yəmənli Vəhb ibn Münəbbihin (654-732) "*Kitabu't-Tican*" və "*Kitabu'l-Məğazi*" adlı əsərləri İbn İshaq, Təbəri, Məs'udi kimi özündən sonrakı tarixçilərin faydalandığı qiymətli əsərlərdir.

Məkkədən Mədinəyə hicrət edən mühacirlərin, Bədr və Uhud döyüşündə iştirak etmiş səhabənin adlarının qeyd edildiyi dəftərlərin müəllifi olan Şurahbil ibn Səid (646-740) məşhur səhabə Sə'd ibn Ubadə əl-Ənsainin (r.ə) nəvəsidir. Onun atası Səid ibn Sə'd Peyğəmbərin (s.ə.v) həyatı və iştirak etdiyi döyüşlər haqqındakı məlumatları yazılı hala gətirən ilk məğazi tədqiqatçılarından hesab olunur. Şurahbil atasının yazılı qeydlərindən faydalanmaqla yanaşı ondan eşitdiyi şifahi məlumatları da yazılı hala gətirmişdi.

Muhəmməd ibn Müslim ibn Şihab əz-Zuhri (670-742) qələmə aldığı əsərləri müasir dövrə qədər gəlib çatmış ilk dövr İslam tarixşünaslarındandır. Həmçinin öz dövrünün məşhur hədis alimlərindən biri olan İbn Şihab əz-Zuhri əsərlərində hədisləri və tarixi məlumatları mövzularına görə təsnif edərək qeyd edən ilk şəxsdir. O, Urvə ibn Zubeyr, Səid ibn Müsəyyəb kimi tabiundan olan alimlərdən dərs almışdı. Otuz yaşına qədər Məkkə və Mədinədə yaşayan İbn Şihab daha sonra Şam diyarına köçərək Dəməşqdə yaşamışdı. Topladığı məlumatları daim qeyd edən İbn Şihab əz-Zuhri həmçinin Əməvi sarayının arxivindən də faydalanma imkanına sahib olmuşdu. İbn Şihabın "*Sünən*" adı ilə tanınan hədis və "*Kitabu'l-Məğazi*" adı ilən tanınan tarixə dair iki əsərin müəllifi olduğu bilinməkdədir. Asim ibn Ömər (ölümü 737), Abdullah ibn Əbu Bəkr ibn Həzm, Musa ibn Uqbə əl-Əsədi (ölümü 758) Mədinə tarix məktəbinə mənsub ilk dövr məşhur müsəlman salnaməçiləridirlər.

Yəsar adlı bir iraqlının nəvəsi olan Əbu Abdullah Muhəmməd ibn İshaq (705-767) tələbəsi əl-Vaqidi ilə birlikdə Mədinə tarix məktəbinin zirvəsi hesab olunmaqdadır. Yəsar Ömər ibn Xəttabın (r.ə) xilafəti dövründə İraqın fəthi vaxtı Əynu't-Təmrdə əsir alınaraq Mədinəyə gətirilmiş və Qeys ibn Məhrəmə əl-Qeysinin köləsi olmuşdu. Sahibi tərəfindən azad edilən Yəsar İslamı qəbul edərək Mədinədə qalmış, Qeys qəbiləsinin məvlası olmuşdu. Onun oğulları İshaq və Musa hədis hifzi və nəqlində öz dövrünün məşhur alimlərindən olmuşdular. Əbu Abdullah Muhəmməd atası İshaqla yanaşı İbn Şihab əz-Zuhri, Asim ibn Ömər, Abdullah ibn Əbu Bəkr kimi Mədinənin tanınmış alimlərinin tələbəsi

olmuşdu. Məkkə, Mədinə və Misirdə yaşamış, gələcəkdə qələmə alacağı əsərlər üçün material toplamışdı. Tarix sahəsinə marağı misirli müəllimi Yəzid ibn Əbi Həbiblə tanışlığından sonra başlamışdı. İbn İshaq adı ilə tanınmış Əbu Abdullah Muhəmmədin yaşdığı dövr siyasi qarşıdurmalar, keşməkeşlər və ziddiyyətlərlə yadda qalmış bir dövr idi. VIII əsrin ikinci yarısının əvvəlində Əməvilər iqtidardan uzaqlaşdırılmış və hakimiyyət Abbasilərin əlinə keçmişdi. İbn İslaq Hicazı tərk edərək İraq, əl-Cəzirə, Rey kimi məmləkətlərə səyahət etmişdi. Onun 110-dan çox şəxsdən tarixi hadisələrə dair rəvayətləri dinlədiyi söylənmişdir. Bu şəxslərin arasında kitab əhlindən olanlar da var idi. Bu səbəbdən də İbn İshaq, imam Malik ibn Ənəs (712-795) kimi hədisçilərin tənqidinə məruz qalmaqda idi. İbn İshaqın İslam tarixi araşdırmaçılarının ən çox müraciət etdikləri mənbələrdən biri olan "*Sirətu'n-Nəbəviyyə*" adlı əsəri müasir dövrə qədər gəlib çatmışdır. Bu əsər bəhs etdiyi mövzular baxımından üç əsas qismə ayrılmaqdadır; İslamdan əvvəlki peyğəmbərlərin tarixi, Muhəmməd peyğəmbərin (s.ə.v) dünyaya gəlməsindən hicrətə qədərki həyatı və hicrətdən sonra Peyğəmbərin (s.ə.v) siyasi-hərbi fəaliyyətləri, yəni məğazi. İlk bölümdə, yəni İslamdan əvvəlki peyğəmbərlərin tarixini yazarkən əhli-kitabın rəvayətlərindən istifadə etməsi hədis almiləri tərəfindən tənqid olunmasının əsas səbəblərindən biri olmuşdur. Yuxarıda qeyd etdiyimiz kimi İbn İshaqın yaşadığı dövr Əməvilərin devrildiyi və Abbasilərin iqtidara gəldiyi bir dövr idi. İraqdakı Əməvi əleyhdarı mühitlə müttəfiq olan Abbasilər iqtidara gələrkən onların sahib olduqları siyasi və ictimai gücdən istifadə etdikləri üçün bu dövrdə Haşimilər rəvacda idilər. Yaşadığı dövrdəki siyasi abhavanın təsiri bir çox tarixçi kimi İbn İshaqın da əsərində öz əksini tapmışdı. Əbu Muhəmməd Əbdulməlik ibn Hişam əl-Himyəri (öl. 833) İbn İshaqın bu əsəri əsasında özünün "*Sirətu'n-Nəbəviyyə*" adlı tarix kitabını qələmə almışdır. İbn Hişamın "*Sirətu'n-Nəbəviyyə*"sinin İbn İshaqın adı çəkilən əsərinin genişləndirilmiş nüsxəsi adlandıra bilərik.

Əbu Abdullah Muhəmməd ibn Ömər əl-Vaqidi (747-823) də ustadı İbn İshaq kimi məvalidən idi. Mədinədə dünyaya gələn əl-Vaqidi burada İbn İslaq, Mə'mər ibn Rəşid, Əbu Mə'şar əs-Sindi, Süfyan əs-Səvri, Malik ibn Ənəs, İbn Cureyc kimi dövrün tanınmış alimlərindən hədis, təfsir, fiqh və tarix dərsləri almışdı. Əl-Vaqidi Mədinədə sira və məğazi dərsləri verməyə başlayanda yaşı qırxı ötmüşdü. 786-cı ildə həcc ziyarəti üçün vəziri Yəhya əl-Bərməki ilə Hicaza gələn Abbasi xəlifəsi Harun ər-Rəşid (786-809) Peyğəmbərin (s.ə.v) dövründə bu yerlərdə cərəyan etmiş hadisələri ən yaxşı bilən bir şəxs tələb etdikdə ona Əbu Abdullah əl-Vaqidini təqdim etmişdilər. Beləcə həcc ziyarəti boyunca xəlifəyə bələdçilik edən əl-Vaqidi ilə Harun ər-Rəşid arasında yaxın

münasibət meydana gəlmişdi. 796-cı ildə Mədinədən Bağdada köçən əl-Vaqidi Abbasi sarayının himayəsində elmi fəaliyyətlə məşğul olmuşdu. Xəlifə Mə'mun (813-833) 819-cu ildə onu Bağdadın şərq qisminə qazı vəzifəsinə təyin etmişdi. Əbu Abdullah əl-Vaqidi də dövrün siyasi abhavasına uyğun olaraq Əməvi əleyhadarı mövqe nümayiş etdirmiş tarixçilərdəndir. Sahib olduğu siyasi dünya görüşü əl-Vaqidinin əsərlərində kəskin şəkildə özünü büruzə verdiyi üçün istər müasiri olan, istərsə də sonrakı dövrdə yaşamış alimlər tərəfindən tənqidə məruz qalmışdı. Əbu Abdullah əl-Vaqidi "*Əxbaru-Məkkə*", "*Fütuhu'ş-Şam*", "*Fütuhu'l-İraq*", "*Məqtəlu'l-Hüseyn*", "*Kitabu'l-Cəməl*", "*Kitabu's-Sıffin*", "*əs-Sira*", "*Kitabu'l-Məğazi*", "*Məvlidu'n-Nəbi*", "*Əzvacu'n-Nəbi*", "*Kitabu's-Səvaif*", "*Darbu'd-Dənanir və'd-dərahim*", "*Fütuhu'l-Cəzirə*", "*Kitabu'r-Riddə*", "*Sirətu Əbi Bəkr və futuhuhu*" kimi İslam tarixinə dair bir sıra əsərlərin müəllifidir. Bunlardan bəziləri müasir dövrə qədər gəlib çatmışdır. Əbu Abdullah əl-Vaqidinin tələbələri arasında yetişmiş Muhəmməd ibn Sə'd əl-Bağdadi (784-845) də ustadı kimi məvalidən idi. Daha çox tarixçi-bioqraf kimi tanınan İbn Sə'din ən məşhur əsəri "*Kitabu't-Təbəqatu'l-Kübra*" adlanır. İbn Sə'd bu əsərində Peyğəmbərin (s.ə.v), səhabə və tabiunun, eləcə də öz dövrünün tanınmış alimlərinin bioqrafiyalarına, həyat hekayələrinə təfərrüatı ilə yer vermişdir.

İraq tarix məktəbinin meydana gəlməsi və inkişafında Mədindədəki tarixşünaslıq cərəyanının mühüm rolu olmuşdur. İraqdakı tarixşünaslıq ənənələrinin təməli Kufə və Bəsrə şəhərlərində qoyulmuşdur. Kufənin həm siyasi, həm də elm-mədəniyyət mərkəzi olaraq önə çıxmasında heç şübhəsiz Əli ibn Əbu Talibin (r.ə) dövründə xilafətin mərkəzi olması ilə bağlıdır. Ubeydullah ibn Əbi Rafi (r.ə) xəlifənin əmri ilə Əli ibn Əbu Talibin (r.ə) ordusunda Cəməl, Sıffin və Nəhrivan döyüşündə iştirak etmiş səhabələrin siyahısını hazırlamışdı. Abdullah ibn Abbas (r.ə), Abdullah ibn Məs'ud (r.ə) kimi şəxslər Kufədə yaşadıqları müddətdə həm də hədis, təfsir, fiqh və siraya dair dərs vermişdilər. Bu kimi fəaliyytlər Kufəyə istər tarixşünaslıq, istərsə də digər elmlər baxımından mərkəz olma xüsusiyyəti qazandırmışdı. Əbu Abdullah əl-Vaqidi, İbn İshaq kimi Mədinə tarix məktəbinə mənsub şəxslərin İraqda məskunlaşması də İraq tarix məktəbinin inkişafına təkan vermişdi. Bu ənənə Abbasilərin hakimiyyətə gəlməsindən sonra daha da möhkəmlənmişdi.

İraq tarix məktəbinin ən tanınmış simalarından biri olan Əbu Mixnəf Lut ibn Yəhya Kufədə yaşamış və 774-cü ildə bu şəhərdə ölmüşdü. Otuzdan çox irili-xırdalı əsərin müəllifi olan Əbu Mixnəf əsərlərində Əbu Bəkrin xilafəti dövündən (632-634) Əməvilər dövrünün sonuna qədərki hadisələrə yer vermişdi. Qələmə aldığı tarixi hadisələrin xronoji ardıcıllığına diqqət yetirməsi və hadisələrin

təfərrüatını anlatması şiddətli Əməvi əleyhdarlığı ilə tanınan Əbu Mixnəfi digər salnaməçilərdən fərqləndirən ən əsas xüsusiyyətlərindəndir. O, Kufə və ətrafında məskunlaşmış Əzd, Təyy, Kində və Təmim qəbilələrindən olan ravilərdən eşitdiyi müxtəlif, bir çox hallarda isə ziddiyyətli məlumatları təshih etmədən əsərlərində qeyd etmişdir. Şübhəsiz bunda Kufə mühitinin təsiri də olmuşdur.

Hədis, sira, ədəbiyyat kimi sahələrdə öz dövrünün tanınmış alimlərindən biri olan Əbu'l-Həkəm Avanə ibn əl-Həkəm əd-Darir (ölümü 765) Əbu Mixnəfin müasiri idi. Əbu Mixnəfin əksinə Avanə ibn əl-Həkəm Əməvi sarayına yaxınlığı ilə tanınan bir şəxs idi. Buna baxmayaraq Avanə ibn əl-Həkəm əsərlərində yer verdiyi tarixi rəvayətlərin mənbələri baxımından Əbu Mixnəfə nəzərən tərəfgirlikdən uzaq, daha obyektiv mövqe tutmuşdu. Onun hadisələri dinləyib nəql etdiyi rəvayətçilərin arasında Əməvi tərəfdarı olan Kəlb qəbiləsi mənsubları olduğu kimi, Əməvi əleyhdarı olan şəxslər də olmuşdur. Bu səbəbdən də sonrakı dövrün Təbəri, Bəlazuri kimi bölük tarixçiləri mənbə olaraq Avanə ibn əl-Həkəmin əsərlərinə daha çox müraciət etmişdilər. Avanə ibn əl-Həkəm əsərinin adında "tarix" kəlməsini istifadə etmiş ilk müsəlman salnaməçidir. Onun bu əsəri "*Kitabu't-Tarix*" adlanır. İslam tarixində hakim sülalənin tarixinə dair ilk əsər olan "*Sirətu Müaviyə və Bəni Uməyyə*" adlı əsər də Avanə ibn əl-Həkəmin qələmindən çıxmışdır.

İraq tarixşünaslıq məktəbinin məşhur simalarından olan Seyf ibn Ömər ət-Təmimi (ölümü 796) Kufədə dünyaya gəlmiş, gənclik illərini Mədinədə keçirərək buradakı alimlərdən hədis, təfsir və sira dərsləri almışdı. Daha sonra İraqa qayıtmış, bir müddət Kufədə yaşamış və ömrünü Bağdadda başa vurmuşdu. Əsərlərində Allah Rəsulunun (s.ə.v) dövründəki hərbi yürüşlərlə yanaşı əsasən raşid xəlifələr dövründəki fəthlərlə bağlı geniş məlumat vermişdir. Xəvaric təmayüllü tarixçi olaraq tanınan Seyf ibn Ömər əsərlərində Əli ibn Əbu Talibin (r.ə) xilafəti dövründə baş vermiş daxili qarışıqlıqları da işıqlandırmışdı. Özündən sonrakı bir çox salnaməçi Seyf ibn Ömərin əsərlərindən faydalanmışdır.

Süleyman ibn Tarxan (öl. 803), Hişam ibn Muhəmməd əl-Kəlbi (öl. 819), Əbu Ubeydə Mə'mər (öl. 826), Əli ibn Muhəmməd əl-Mədaini (öl. 840), Əbu Mə'şər əs-Sindi (IX əsr), Əbu Cə'fər Muhəmməd ibn Həbib (öl. 859) Abbasilər dövründə yaşamış İraq tarixşünaslıq məktəbinə mənsub tanınmış salnaməçilərdir.

Əbdulməlik ibn Həbib əl-Qurtubi (796-853) Əndəlusun əl-Bira[8] şəhərində dünyaya gəlmiş Qurtubada (Kordova) və Misirdə təhsil almışdı. Yaşadığı döv-

[8] İspaniya-Elivira

rün məşhur maliki fəqihlərindən və təfsirçilərindən olan əl-Qurtubinin tarixə dair “*Hurubu’l-İslam*”, “*Təbəqatu’l-Füqəha və’t-Tabiun*”, “*Kitabu’t-Tarix*” adlı əsərlərin müəllifi olduğu bilinməkdədir.

Xəlifə ibn Həyyat (786-854) Bəsrədə alim ailəsində dünyaya gəlmişdi. Öz dövrünün tanınmış alimlərindən hədis və sira dərsləri almışdı. Onun yaşadığı dövrdə İraqın elmi mühitində mutəzilə məzhəbinin hakim olması Xəlifə ibn Həyyatın, eləcə də onun müasiri olmuş bir çox mühəddisin təzyiq və təqibə məruz qalmasına səbəb olmuşdu. Tarix və bioqrafiyaya dair bir sıra əsərlərin müəllifi olan Xəlifə ibn Həyyatın “*Kitabu’t-Tarix*” və “*Kitabu’t-Təbəqat*” adlı iki əsəri müasir dövrə qədər gəlib çatmışdır.

Misirli bir maliki fəqihinin oğlu olan Əbül-Qasım ibn Əbdulkərim (öl. 870) mutəzilənin hakim olduğu Bağdaddan uzaqda, Misirin Fustat şəhərində yaşasa da təzyiq və təqiblərdən yaxa qurtara bilməmiş, həmin dövrün mühəddis və fəqihləri kimi möhnətə məruz qalmışdı. O, tarixə dair qələmə almış olduğu “*Fütuhu’l-Misr və’l-Məğrib*” adlı əsərində şimali Afrikada İslam orduları ilə Bizans və bərbəri hərbi qüvvələri arasında cərəyan etmiş döyüşlər, şimali Afrikanın fəthi kimi mövzulara dair dəyərli məlumatlar nəql etməkdədir.

Buraya qədər adlarını sadaladığımız və haqında qısa məlumat verdiyimiz tarixçilərin, salnaməçilərin qələmə aldıqları əsərlər özlərindən sonrakı dövrdə yaşamış tarixçilər üçün məharətlə faydalandıqları mənbə, böyük bir elmi miras olmuşdur. Zaman irəlilədikcə baş verən tarixi hadisələr çoxalmaqda və mahiyyətcə daha qarışıq, daha ziddiyyətli hala gəlməkdə idi. Bu sonrakı dövrlərdə yaşamış tarixçilərin işini çətinləşdirmiş, tarixi hadəsələrin qələmə alınmasını daha zəhmətli bir işə çevrmişdi. Beləcə tarixə dair daha iri həcmli əsərlər meydana gəlmişdi. Abbasi xəlifələrinin, Əndəlus əmirlərinin bir çoxunun elmə, elmi fəaliyyətə dəyər verməsi və alimləri himayə etməsi İslam tarixşünaslığına da öz müsbət təsirini göstərmiş, əksəriyyəti müasir dövrə qədər gəlib çatmış tarixə dair böyük əsərlər qələmə alınmışdı.

Əslən Xorasanın Mərv şəhərindən olan Abdullah ibn Müslim ibn Quteybə (828-889) Kufədə dünyaya gəlmişdi. Öz dövrünün tanınmış alimlərindən dərs almışdı. Abbasilərin vəziri Fəth ibn Xaqanla dostluq münasibəti olan İbn Quteybə hədis, təfsir, ədəbiyyat, tarix sahəsində tanınmış alim idi. Onun yaşadığı dövr mutəzilənin İraqın elmi mühiti üzərindəki hegemonluğuna son qoyulduğu dövr idi və İbn Quteybə bu uğurda ciddi cəhd göstərmiş alimlərdən idi. Onun iyirmiyə qədər əsəri müasir dövrə qədər gəlib çatmışdır. “*Kitabu’l-Maarif*”, “*Uyunu’l-Əxbar*”, “*Kitabu’l-İmamə və’s-Siyasə*”, “*Kitabu’ş-şeer və’ş-Şüəra*” İbn Quteybənin tarix və bioqrafiyaya dair əsərləridir. İbn Quteybənin

"*Kitabu'l-Maarif*" adlı əsəri İslam tarixşünaslığı sahəsində ən çox rəğbət görən əsərlərdən biridir. Əsərdə yaradılışdan başlayıb Abbasi xəlifəsi Mu'təsim Billahın (833-842) hakimiyyəti dövrünə qədər baş vermiş hadisələr öz əksini tapmışdır. Müəllif bu əsərində sadəcə tarixi hadisələri təsvir etməklə kifayətlənməmiş, peyğəmbərlər, İslamdan əvvəlki dövrdə yaşamış ərəb və qeyri-ərəb hökmdarlar, səhabə, tabiun, məşhur alimlər və dövlət xadimlərinin bioqrafiyaları haqqında da qısa məlumatlar nəql etmişdir.

IX əsrdə yaşamış tanınmış tarixçi alimlərdən biri də Əhməd ibn Yəhya əl-Bəlazuridir (öl. 892). İran mənşəli olan əl-Bəlazurinin atası və babası Abbasilərin dövlət məmurları idilər. Misir, Hicaz, Şam və İraqın məşhur alimlərindən dərs almış Əhməd əl-Bəlazuri İslam coğrafiyasının müxtəlif bölgələrinə səyahət etmişdi. Əhməd əl-Bəlazuri İslam tarixşünaslığında özünün "*Fütuhu'l-Büldan*" və "*Ənsabu'l-Əşraf*" adlı əsərləri ilə tanınmaqdadır. Müəllif "*Fütuhu'l-Büldan*" adlı əsərində əsasən İslam tarixində baş vermiş fəthlərə yer vermişdir. İslam tarixində ilk fəth hesab olunan Xeybər qalasının fəthi ilə başlayan "*Fütuhu'l-Büldan*" Əməvilərdən I Vəlidin (705-715) hakimiyyəti dövrü ilə sona çatmaqdadır. Əsərdə I Vəlidin iqtidarının sonuna qədər olan dövrdə baş vermiş böyük fəth hadisələri təfərrüatı ilə anlatılmaqdadır. Əhməd əl-Bəlazrinin bu əsərində Azərbaycanın orta əsrlər tarixi ilə bağlı dəyərli məlumatlar mövcuddur. "*Ənsabu'l-Əşraf*" isə iyirmi cilddən ibarət bioqrafik ensklopediyadır. Əhməd əl-Bəlazuri bu əsərində səhabə, tabiun, müxtəlif elm sahələrində məşhur olmuş alimlər, xəlifələr, hökmdarlar, sərkərdələr, valilər və digrə məşhur şəxsiyyətlərin bioqrafiyaları haqqında dəyərli məlumatlar qeyd etmişdir.

Yaşadığı dövrün tanınmış filoloq, tarixçi, astronom və botanikaçı alimi olan Əbu Hənifə Əhməd əd-Dinəvəri (öl. 895) İranın Dinəvər şəhərində dünyaya gəlmişdi. Onun tarixə dair əsərinin adı "*Kitabu'l-Əxbari't-Tival*" adlanır. Müəllifin bu əsəri üç əsas qismdən ibarətdir. Birinci qism peyğəmbərlər tarixidir. İkinci qismdə qədim yunan və qədim İran hökmdarlarının fəaliyyətləri anlatılmaqdadır. Üçüncü qismdə isə müəllif Ömər ibn Xəttabın (r.ə) dövründən başlayaraq Mu'təsim Billahın (833-842) hakimiyyətinin sonuna qədərki dövrdə baş vermiş hadisələri təsvir etmişdir.

Məvalidən olan Əhməd ibn İshaq əl-Yaqubi (öl.905) Abbasilər dövründə yaşamış böyük tarixçi və coğrafiyaşünaslardan biridir. Abbasilərə vassal bağlılığı olan, Xorasan və İranı hakimiyyəti altına almış Tahirilər dövlətində (821-873) məmur işləmiş Əhməd əl-Yaqubi bu dövlətin tənəzzülə uğramasından sonra Misirdə yaşamışdı. Onun "*Kitabu't-Tarix*" adlı əsəri ümumdünya tarixi-

dir. Müəllif əsərində İsa peyğəmbər (ə.s[9]) və həvariləri, Babil, Assur, Hind, Çin, yunan, Roma, İran, türk, həbəş, yəhudi, bəbəri, İslamdan əvvəlki ərəb hökmdarlarının tarixinə yer vermişdir. Müəllif əsərində həmçinin başlanğıcdan öz yaşadığı dövrə qədərki İslam tarixi haqqında da geniş məlumat nəql etmişdir. Əhməd əl-Yəqubi Abbasi xilafətinin əhatə etdiyi torpaqların coğrafiyasına dair "*Kitabu'l-Büldan*" adlı əsərin də müəllifidir.

İslam dünyasında yetişmiş böyük alimlərdən biri olan Əbu Cə'fər Muhəmməd ibn Cərir ət-Təbəri[10] (840-922) Xəzər dənizinin cənubunda yerləşən Təbəristanın Amul şəhərində dünyaya gəlmişdi. Yeddi yaşında Qur'anı əzbərləyərək hafiz olan İbn Cərir ət-Təbəri gənc yaşlarından üstün zəkalı bir insan olaraq tanınmışdı. O, öz vətənində dövrün tanınmış alimlərindən ərəb dili və ədəbiyyatı, hədis, təfsir, fiqh, tarix kimi müxtəlif elm sahələrində dərs almış, təhsilini davam etdirmək üçün əvvəl Rey şəhərinə, sonra isə Bağdada getmişdi. Həmin dövrün məşhur mühəddisi və fəqihi olan Əhməd ibn Hənbəllə (780-855) görüşmək arzusunda olsa da o, Bağdada gəldiyi vaxt Əhməd ibn Hənbəl artıq vəfat etişdi. İbn Cərir ət-Təbəri Bağdad, Fustat, Dəməşq, Kufə, Bəsrə, Vasit şəhərlərinə səyahət etmiş, buradakı alimlərin dərslərini dinləmişdi. O, ömrünü bütünlüklə elmə həsr etmiş bir alim idi. Abbasi xəlifəsi Mu'təzid Billahın (892-902) vəziri Ubeydullah ibn Xaqan ona Bağdad qazılığı vəzifəsini təklif etsə də İbn Cərir bundan imtina etmişdi. Alim 915-ci ildə özünün tarixə dair "*Tarixu'r-Rüsul və'l-Müluk*" adlı coxcildli əsərini yazıb bitirmişdi. "*Təbəri Tarixi*" adı ilə tanınan bu əsərini qələmə alarkən müəllif öz dövrünə qədər yazılmış tarixə dair demək olar ki,bütün əsərlərdən faydalanmış və beləcə əsərini ən çox müraciət edilən əsas tarix kitabına çevirmişdi. İslam tarixinə dair rəvayətləri qeyd edərkən İbn Cərir ət-Təbəri rəvayətin səhhətini müqayisə yolu ilə deyil daha çox nəql silsiləsinin mötəbərliyi ilə dəyərləndirmişdir. Buna baxmayaraq sözügedən əsərdə səhihlik baxımından mübahisəli olan bəzi tarixi rəvayətlər mövcuddur. İslam tarixinə aid olmayan hadisələri isə daha çox özündən əvvəl bu mövzuda yazılmış əsərlərə istinad edərək qələmə almışdır. "*Tarixu'r-Rüsul və'l-Müluk*" yaradılışla başlayıb peyğəmbərlər tarixi ilə davam etməkdədir. Əsərdə qədim İran, yunan, Roma, yəhudi hökmdarlarının tarixinə də geniş yer verilməkdədir. İslam tarixinə dair qismlərdə isə Allah Rəsulunun

[9] (Ə.S) – əleyhissalam – Allahın salamı onun üzərinə olsun.

[10] Qeyd edək ki, tarixdə Muhəmməd ibn Cərir ibn Rüstəm ət-Təbəri (öl. 1058), Muhəmməd ibn Əbül-Qasım ət-Təbəri və Fəzl ibn Həsən ət-Təbəri (öl. 1153) adlı, imamiyyə firqəsinə mənsub digər müəlliflər və qələmə aldıqları əsərlər mövcud olmuşdur. Burada haqqında bəhs etdiyimiz sünnə əhlinə mənsub Əbu Cəfər Muhəmməd ibn Cərir ibn Yəzid ət-Təbəridir.

(s.ə.v) həyatı və hərbi yürüşləri, riddə hadisələri, şimali Afrika, İspaniya, Şam diyarı, İraq, İran, Qafqaz, Türküstan və Sindin fəthi, Əli ibn Əbu Talibin (r.ə) xilafəti dövründəki daxili çəkişmələr, Əməvilər və Abbasilər dövründə baş vermiş hadisələr geniş şəkildə işıqlandırılmışdır. Müxtəlif elm sahələrinə dair onlarla əsərin müəllifi olan İbn Cərir ət-Təbərinin bir çox əsəri müasir dövrə gəlib çatmamışdır. Onun Qur'an təfsirinə dair otuz cild halında qələmə aldığı "*Camiu'l-Bəyan fi Təfsiri'l-Qur'an*" adlı əsəri də ən çox müraciət edilən təfsir kitablarındandır. Abdullah ibn Əhməd ət-Türki (öl. 972), Ərib ibn Sə'd əl-Qurtubi (öl. 979), Sabit ibn Sənan (öl. 973), Muhəmməd əl-Həmədani (öl. 1157) İbn Cərir ət-Təbərinin "*Tarixu'r-Rüsul və'l-Müluk*"una zeyl (əlavə) yazmış tarixçilərdir.

Ömrünün çoxunu səyahətlərdə keçirmiş məşhur tarixçi və coğrafiyaşünas Əbü'l-Həsən Əli əl-Məs'udi (öl. 957) özünün tarix və coğrafiyaya dair müasir dövrə gəlib çatmış "*Muruzu'z-Zəhəb və Mə'adini'l-Cəvhər*" adlı əsəri ilə tanınmaqdadır. Onun otuz cild halında qələmə aldığı tarixə dair "*Kitabu'l-Əxbaru'z-Zaman*" adlı əsərinin isə sadəcə bir cildi günümüzə qədər gəlib çatmışdır. Əli əl-Məs'udinin "*Tənbih və'l-İşraf*"ında isə qədim Roma və Bizans tarixinə geniş yer verilmişdir.

Əhməd ibnu'l-Ə'səm əl-Kufi (öl. 926) müəllifi olduğu "*Kitabu'l-Fütuh*" adlı üç cildlik əsərində IX əsrin ikinci yarısına qədər İslam tarixində baş vermiş fəthləri geniş şəkildə qələmə almışdır. Əsər İraq, İran, Xorasan, Qafqaz, şərqi Anadolunun fəthi, xilafət orduları ilə xəzərilər və bizanslılar arasında baş vermiş müharibələr, xilafət dövründəki üsyanlara dair dəyərli məlumat verən mənbələrdən biridir. Akad. Ziya Bünyadov "*Kitabu'l-Fütuh*"un Azərbaycan tarixinə dair qismlərini ana dilimizə tərcümə edərək 1981-ci ildə Bakıda nəşr etdirmişdir.

Əbü'l-Qasım Əli ibn Əsakir (1105-1175) Dəməşqdə alim ailəsində dünyaya gəlmişdi. Uşaqkən öz ailəsindəki elm adamlarından, gəncliyində Şam diyarının alimlərindən dərs alan İbn Əsakir daha sonra Bağdada getmiş, həmin dövrdə dünyanın ən böyük və ən üstün təhsil mərkəzi olan Nizamiyyə mədrəsəsində təhsil almışdı. Təhsilini başa vurduqdan sonra elmi səyahətə çıxmış, İslam dünyasının başlıca şəhərlərini gəzmiş, buradakı elm adamları və mütəfəkkirlərlə görüşmüş, onların fikirlərindən faydalanmışdı. 1134-cü ildə Suriyadan yola çıxan İbn Əsakir Azərbaycan, İran, Xorasan və Mavəraünnəhrin böyük şəhərlərinə səyahətlər etmiş, bu yerlərin qabaqcıl alimlərinin dərslərini dinləmək fürsəti tapmışdı. İbn Əsakir Azərbaycanda Marağa, Təbriz kimi şəhərlərin məşhur alimləri ilə görüşmüşdü. O, yaşadığı dövrdə fəqih, hədisçi

və tarixçi alimi olaraq tanınmışdı. Onun tarixə dair ən məşhur əsəri səksən cild halında tərtib etdiyi "*Tarixu Mədinətu'd-Diməşq*" adlı əsəridir. Bu əsər Dəməşq şəhərinin müfəssəl tarixidir. Şəhər və şəhərsalma tarixinə dair ən geniş çaplı əsər Xətib əl-Bağdadi (1002-1072) tərəfindən qələmə alınmış Bağdad şəhərinin tarixi haqqındakı iyirmi dörd cildlik "*Tarixu Mədinətu's-Səlam Bağdad*"dır. İbn Əsakir öz əsərini Xətib əl-Bağdadinin tərz və üslubunu mənimsəyərək qələmə almışdı. "*Tarixu Mədinətu't-Diməşq*" Dəməşqin yerləşdiyi coğrafiyanın üstün cəhətləri, topoqrafiyası, saraylar, imarətlər, məscidlər, məktəblər, mədrəsələr, kilsələr, karvansaraylar, hamamlar, meydanlar, kanallar və digər tikililər haqqında ətraflı məlumatlarla başlanır. Sonrakı cildlərdə isə Dəməşqdə yetişmiş, həmçinin buraya köçüb gəlmiş və bir müddət Dəməşqdə yaşamış müxtəlif elm sahələrinə mənsub alimlər, xəlifələr, sərkərdələr, şəhərin qazıları, canişinləri, hökmdarları haqqında geniş məlumat verilir.

İbnü'l-Əsir adı ilə tanınan İzzəddin Əli ibn Muhəmməd əl-Cəzəri (1160-1233) bugün Türkiyə ərazisində yerləşən Cizrə qəsəbəsində dünyaya gəlmişdi. Bağdad, Dəməşq, Qüds, Mosul, Hələb kimi şəhərlərin tanınmış alimlərindən müxtəlif elm sahələrinə dair dərs almışdı. İbnü'l-Əsir fiqh, hədis, təfsir, ədəbiyyat və tarix sahəsində öz dövrünün məşhur alimlərindən biri olmuşdur. Bir çoxu müasir dövrə qədər çatmış ondan çox əsər qələmə almışdır. Bunlardan tarixə dair ən məşhuru çox cildli "*əl-Kamil fi't-Tarix*" adlı əsərdir. Əsər yaradılışdan monqolların işğalçı yürüşlərinə qədər olan İslam tarixinə dair ən mükəmməl əsərlərdən biridir.

Oğuz türklərinə mənsub olması səbəbiylə "ət-Türkmani" nisbəsi ilə tanınan Şəmsəddin Muhəmməd ibn Əhməd əz-Zəhəbi ət-Türkmani (1274-1348) əslən Türkiyədəki Silvan qəsəbəsindən olub Dəməşqdə dünyaya gəlmişdi. Atası Əhməd zərgər idi bu səbəbdən də "zəhəbi" ləqəbi daşımış, imam Şəmsəddin Muhəmməd də atasının bu ləqəbi ilə məşhur olmuşdu. Şəmsəddin Zəhəbi uşaqlıq və gənclik illərini Şam diyarının tanınmış alimlərindən dərs almaqla keçirmişdi. İyirmi yaşında səyahətə çıxmış, İslam dünyasının başlıca elm-mədəniyyət mərkəzlərinə səyahət edərək oradakı alimlərin dərslərini dinləmişdi. İrili xırdalı 230-dan çox əsərin müəllifi olan Şəmsəddin Zəhəbi hədis, hədis üsulu, fiqh, fiqh üsulu, təfsir, ədəbiyyat, ənsab, əqaid, tarix kimi sahələrdə yaşadığı dövrün məşhur alimlərindən biri olmuşdu. Qələmə aldığı əsərlərdən 148-i tarix və ənsaba dairdir. Zəhəbi tarixə dair əsərlərində xronoji ardıcıllığa ciddiliklə əməl edən müəlliflərdəndir. Onun çox cildli "*Tarixu'l-İslam*" adlı əsəri yaradılışdan XIV əsrə qədər baş vermiş hadisələri əhatə etməkdədir. Alim daha sonra bu əsərini "*İbər fi xəbəri mən ğəbər*" adı ilə ixtisar etmişdi. Onun "*Düvəlu'l-*

*İslam*” adlı əsəri öz dövrünə qədər İslam coğrafiyasında yaranmış dövlətlərin tarixinə dairdir. Zəhəbinin iyirmi dörd cildlik “*Siyəru Ə'lamu'n-Nübəla*” adlı əsəri bioqrafik ensklopediyadır. Əsərin ilk cildində raşid xəlifələr dövründə baş vermiş hadisələrə yer verilir. Bu əsərində alim İslamın ilk günlərindən öz dövrünə qədər İslam dünyasında yaşamış məşhur şəxslərin bioqrafiyalarını təfərrüatı ilə işıqlandırmışdır. Şəmsəddin Zəhəbinin müxtəlif elm sahələrində fəaliyyət göstərmiş alimlərin bioqrafiyalarına dair qələmə aldığı əsərlər belə adlanır “*Təzkirətu'l-Hüffaz*”, “*Təcridu əsmai's-Səhabə*”, “*Züəfa və'l-mətrukin*”, “*Təbəqatu'l-Qurra*”, “*Mizanu'l-E'tidal*”, “*Mu'cəmu'ş-Şüyux*” və s.

İmadəddin İsmayıl ibn Ömər ibn Kəsir (1300-1373) Suriyanın Busra şəhəri yaxınlığındakı Məcdəl kəndində dünyaya gəlmiş, uşaqlıq və gənclik illəri Dəməşqdə keçmişdi. Dəməşqin məşhur alimlərindən dərs almışdı. İbn Kəsir yaşadığı dövrün məşhur hədis, təfsir, fiqh, ədəbiyyat və tarixçi alimlərindən biri idi. O, bir sıra rəsmi dövlət vəzifələrində də çalışmışdı. Onlarla əsərin müəllifi olan İbn Kəsir tarixə dair çoxcildli “*əl-Bidayə və'n-Nihayə*” adlı əsərin müəllifidir. Əsər İslamın meydana çıxdığı vaxtdan başlayıb müəllifin öz dövrünə qədər baş vermiş hadisələri əhatə etməkdədir. Əsərin ən geniş və tarixi məlumatlar baxımından ən zəngin qismi Peyğəmbər (s.ə.v) və raşid xəlifələrin hakimiyyəti dövrünə dair olan hissəsidir. İbn Kəsirin bu əsəri məşhur şəxsiyyətlərin bioqrafiyalarına dair məlumatlar baxımından zəngindir.

Əslən Əndəlusun İşbiliyyə[11] şəhərindən olan Vəliyəddin Əbdurrəhman ibn Xəldunun (1332-1406) ailəsi Tunisdə məskunlaşmış, İbn Xəldun da burada dünyaya gəlmişdi. Öz dövrünün məşhur alimlərindən müxtəlif elm sahələrinə dair dərs almış İbn Xəldun gənc yaşlarından etibarən dövlət məmuru olmuş, müxtəlif vəzifələri icra etmişdi. 1350-ci ildə Həfsilər sülaləsinə mənsub sultan Əbu İshaq İbrahim (1350-1369) onu özünə katib təyin etmişdi. Dövrün keşməkeşli siyasi həyatı İbn Xəldunun Əndəlus və şimali Afrikadakı şəhərlərə səyahət etməyə məcbur etmiş, o, bu şəhərlərdəki hakim sülalələrin saraylarında xidmət etmişdi. 1370-ci illərin sonunda siyasi həyatdan və dövlət məmurluğundan uzaqlaşaraq elmi tədqiqatla məşğul olmağa başlamışdı. Onlarla əsərin müəllifi olan İbn Xəldun özünün “*əl-Müqəddimə*” adlı əsəri ilə tarix fəlsəfəsi və sosiologiya elminin təməlini qoymuşdu. Məmlüklü dövlətinin hakimiyyəti altındakı Misirə köçüb Qahirədə məskunlaşan İbn Xəldun əl-Əzhər mədrəsəsində dərs vermişdi. Məmlüklü sultanları tərəfindən iki dəfə Qahirə şəhərinin baş qazılığına təyin edilmişdi. Teymurilər dövləti ilə Misir Məmlüklüləri arasındakı diplomatik

[11] Sevilla (İspaniya)

əlaqələrin qurulmasında iştirak edən İbn Xəldun Əmir Teymurla (1370-1405) görüşüb tanış olmuşdu. İbn Xəldunun tarixə dair çoxcildli əsəri "*Kitabu'l-İbər*" adlanır. Əsərdə yaradılışdan başlayıb 1396-cı ilə qədər baş vermiş hadisələr təsvir edilməkdədir. Alim əsərinin giriş qismində tarix elminin mahiyyəti, üsulu, mövzusu, mədəniyyətlər, dövlətlər, millətlər, cəmiyyətlərin xüsusiyyətləri, müxtəlif dövlət qurumlarının təşəkkülü haqqında geniş məlumat verməkdədir ki, əsərin bu qismi "*əl-Müqəddimə*" adı ilə tanınmaqdadır. Əsərinin sonrakı qismlərində İslamdan əvvəlki dövrdə baş vermiş mühüm tarixi hadisələrə qısaca toxunan İbn Xəldun başlanğıcdan öz dövrünə qədər İslam dünyasında baş vermiş hadisələri təsvir etmişdir.

İslam tarixinə dair bu əsərimizi qələmə alarkən yuxarıda adları qeyd olunmuş əsərlərlə yanaşı burada haqqında məlumat vermədiyimiz onlarla müəllifin əsərindən də istifadə etmişik. Bu müəlliflər və əsərlərinin adları müvafiq başlıq altında qeyd olunmaqdadır. Bundan başqa müasir tarixçilərin tədqiqatlarına, əsər və məqalələrinə də müraciət olunmuşdur.

## İSLAMDAN ƏVVƏL ORTA ŞƏRQ VƏ ƏTRAF DÖVLƏTLƏR

### *Bizans İmperiyası*

Əsrlərdən bəri bir tərəfdən Sasanilərə, digər tərəfdən isə qərbdən gələn barbar tayfalar və slavyanlara qarşı şiddətli və aramsız mübarizədə olan Bizans imperiyası VII əsrin birinci rübündə iranlılar qarşısında məğlub olaraq Suriya və Misir kimi özünün ən zəngin torpaqlarını itirmişdi. Yaşadıqları torpaqlardan uzaqda baş verən bu hadisələrin əlbəttə ki, Məkkəli ərəblərə hər hansı bir təsiri yox idi. Onlar həm Bizans, həm də Sasanilərlə ticari münasibətlərə sahib idilər. Bu səbəbdən də bu iki dövlətin bir-biri qarşısında torpaq itirməsindən bir o qədər də narahat deyildilər. Buna baxmayaraq Məkkədə zəif vəziyyətdə olan müsəlmanların bu iki dövlət arasındakı mübarizədə kitab əhli olan Bizansın atəşpərəstlərə qalib gəlməsini arzuladıqları Qur'anın məkki ayələrindən anlaşılmaqdadı. Rum surəsi 2-5-ci ayələrində bu hadisə belə təsvir olunmuşdur:

غُلِبَتِ الرومُ فِي أَدْنَى ٱلْأَرْضِ وَهُم من بَعْدِ غَلَبِهِمْ سَيَغْلِبُونَ فِي بِضْعِ سِنِ ـ ٱلْأَمْرُ من قَبْلُ وَمن بَعْدُ وَيَوْمَئِذٍ يَفْرَحُ
ٱلْمُؤْمِنُونَ بِنَصْرِ ا ـ يَنصُرُ مَن يَشَاءُ وَهُوَ ٱلْعَزِيزُ الرحِيمُ

"*Rumlular (bizanslılar iranlılara) məğlub oldular. (Ərəbistana) ən yaxın bir yerdə (Şamda və ya İordaniyada). Lakin onlar (bu) məğlubiyyətlərindən sonra qalib gələcəklər. Bir neçə ilin içində (üç illə doqquz, yaxud on il arasın-*

*da). Əvvəl də, sonra da hökm Allahındır. O gün möminlər sevinəcəklər. Allahın köməyi ilə. (Allah) istədiyinə kömək edər. O, yenilməz qüvvət sahibi, mərhəmət sahibidir!*".

Həqiqətən də Bizansın bu məğlubiyyətindən 9 il sonra (623) Bizans imperatoru Heraklın (610-641) səyləri nəticəsində Sasanilər düşmən qarşısında ard-arda ağır məğlubiyyətə uğradılar. Möminlər bu vaxt sevinc içində idilər, çünki bu vaxt artıq məşəqqətlərlə dolu Məkkə mühitini tərk edib hürriyyətə qovuşduqları Mədinəyə hicrət etmişdilər, sevinclərinin səbəbi yəqin ki, bu idi. Lakin Bizans bu qələbəsindən arzu etdiyi səviyyədə faydalana bilmədi. İllərlə davam edən aramsız müharibələr Bizansın hərbi və iqtisadi qüdrətinə ağır zərbə vurmuşdu. Bununla yanaşı ölkənin ictimai həyatında da dərin bir çürümə və tənəzzül hökm sürürdü. İmperiyanın ictimai həyatında dərin nüfuz sahibi olan yunan pravoslav kilsəsi mənsubları istənilən digər məzhəb və cərəyanlara qarşı son dərəcə dözümsüz mövqe nümayiş etdirirdilər. İmperiyanın iri şəhərləri teoloji münaqişələrlə sirkələnirdi. Bu qəbildən olan münaqişələr əhalinin alt təbəqələrinə qədər nüfuz etmişdi. Dövlət dəstəkli kilsənin təzyiq və təqibləri imperiyanın qeyri-pravoslav xristianlarını Bizansdan başqa istənilən dövlətin təbəəsi olmağı arzu edəcək vəziyyətə gətirmişdi. Sonrakı illərdə Misir, Suriya, Şərqi Anadolu, Cənubi Qafqaz kimi əsasən monofizit xristianların məskun olduqları ərazilərin xilafətə birləşdirilməsində bu amil mühüm rol oynamışdı.

### *Sasani İmperiyası*

Ənuşirvan adı ilə məşhur olan şah I Xosrovdan (531-579) sonra Sasani taxtına IV Hörmüz (579-590) oturmuşdu. IV Hörmüz sələfinin siyasi və hərbi sahədəki uğurlarını davam etdirə bilmiş qüdrətli hökmdar idi. Lakin II Xosrovun (590-628) hakimiyyəti dövründə sərkərdə Bəhram Çubinin qaldırdığı qiyam nəticəsində Sasani imperiyasını qısa müddətli də olsa siyasi böhrana düçar olmuşdu. Bəhram Çubin qiyamından sonra bir sıra islahatlarla idarəetmə aparatını qüvvətləndirən II Xosrov Bizansdakı daxili siyasi çəkişmələri fürsət bilmiş və işğalçılıq planlarını həyata keçirməyə başlamışdı. Əhəmənilər dövründəki ehtişama qayıtmaq həvəsi ilə hərəkət edən II Xosrovun orduları Bizansa məxsus olan Şam diyarını və Misiri işğal etmişdi. 614-cü ildə Qüdsü işğal edən Sasani ordusu xristianların İsa peyğəmbərin (ə.s) üzərində çarmıxa çəkildiyinə inandıqları xaçı ələ keçirərək İrana aparmışdı. Həmin bu dövrdə Bizansın paytaxtı Konstantinopol qərbdən, Sasanilərin dəstəklədiyi, avar və slavyan hücumlarına məruz qalmaqda idi. Lakin II Xosrovun qazandığı bu zəfər tezliklə onun

əleyhinə dönməyə başladı. Çox geniş əraziyə yayılmış Sasani oldular Bisans imperatoru Heraklın (610-641) daxili sabitliyi təmin etdikdən sonra başlatdığı əks-hücum qarşısında səfərbər ola bilmədilər və ard-arda gələn məğlubiyyətlər qarşısında əzildilər. Xəzərilərlə müttəfiq olan Bizans orduları Mesopatomiya və İranın qərb vilayətlərini talan etmişdi. II Xosrovun 628-ci ildə öz oğlunun da əli olan sui-qəsd nəticəsində öldürülməsindən sonra Sasani imperiyası düçar olduğu siyasi böhrandan çıxa bilməmişdi.

***Həbəşistan***

VI-VII əsrlərdə Həbəşistanda xristianlığın monofizit məzhəbini mənimsəmiş Aksum sülaləsi hakimiyyətdə idi. Yəmən torpaqlarındakı Himyər dövlətinin Zu Nuvas adlı yəhudi kralı ölkəsindəki xristianlara qarşı təqib və təzyiqlərə əl atmış və Nəcrandakı xristian ərəb qəbilələrinə qanlı divan tutmuşdu. Zu Nuvas özünə Yusif adını götürərək yəhudiliyi qəbul etmiş ərəb idi. Nəcranın monofizit isəvilərini Uxdud adlanan, içində tonqal qalanmış xəndəklərə atdıran Zu Nuvasın zülmü Qur'ani-Kərimdə də öz əksini tapmışdı[12]. 523-cü ildə baş vermiş, təqribən 20 min isəvinin öldürüldüyü bu hadisə Həbəş krallığı ilə Himyər krallığı arasında gərginliyə səbəb olmuş və bu gərginlik müharibə ilə nəticələnmişdi. Əryat və Əbrəhə[13] adlı iki sərkərdənin başçılığı aldındakı 70 minlik həbəş ordusu Qırmızı dənizi keçərək Yəmən torpaqlarına ayaq basmışdı. Bu ordu Zatu'l-Əbər adlanan yerdə Zu Nuvasın ordusunu ağır məğlubiyyətə uğratmışdı.

Tarixi mənbələrdə bu müharibənin dini təəssübkeşlik nəticəsində baş verdiyi qeyd edilirsə də bunun təməlində iqtisadi-ticari maraqların dayandığını düşünən tarixçilər də olmuşdur. Yəmən bu dövrdə Sasanilərin himayəsi altında idi. Bəsrə körfəzi və Qırmızı dəniz Hindistan və Çindən başlayıb Bizansda bitən ticarət yolunun keçdiyi iki mühüm coğrafi məkan idi. Yəmən bu ticarət yolu üzərində yerləşən strateji məntəqə idi. Yəmənə nəzarət etməklə Sasanilər və Bizans şərq-qərb dəniz ticarətinə nəzarət etmək imkanı əldə etmiş olurdular.

Zu Nuvas üzərindəki qələbədən sonra Əryatla Əbrəhə arasında səbəbi məlum olmayan düşmənlik başlamışdı. Yəmənliləri öz ətrafında toplayan Əbrəhə Əryatla girişdiyi döyüşdə dodağı yarıldığı üçün əl-Əşram ləqəbi ilə məşhur olmuşdu. Əryatın bu döyüşdə öldürülməsindən sonra Əbrəhə əl-Əşram bütün Yəməni öz hakimiyyəti altında birləşdirə bilmiş və əlli ilə yaxın burada hökmranlıq etmişdi. Əbrəhənin əmri ilə Sənada "əl-Kulleys" adlanan möhtəşəm xristian məbədi inşa

---

[12] Bax: Qur›an, Büruc surəsi, 4-10-cu ayələr.

[13] Əbrəhə həbəşilərin dilində İbrahim (Abraham) adının tələffüz forması idi.

edilmişdi. Əbrəhə bütpərəst ərəblərin hər il Məkkəyə gedərək Kə'bə ətrafındakı bütləri ziyarət etdiklərini bilidi. Buna görə də o, bundan sonra bütün ərəbləri Kə'bəni deyil əl-Kulleysi ziyarət etməyə məcbur etməyə başlamışdı. Onun bu təşəbbüsü bütpərəst ərəblərin qeyzinə səbəb olmuşdu. Buna görə İbn Fukay əl-Kinani adlı bir bədəvi əl-Kulleysin içinə bövl edərək murdarlamışdı. Onun bu hərəkəti Əbrəhənin qəzəbini alovlandırmışdı. Əbrəhə bu hadisədən sonra Kə'bəni yıxacağına and içmiş və Məkkəyə yürüş etmişdi. Onun ordusunun önündə nəhəng bir fil gedirdi, bu səbəbdən də bu ordu Əshabü'l-Fil adlanırdı. Taif şəhərinə yaxınlaşanda Səqif qəbiləsi ağsaqqalları Əbrəhənin ordugahına gəlib əl-Lat adlı bütlərinə toxunmaması üçün ona yalvarmışdılar. Əbrəhə onların bu istəyinə müsbət cavab vermiş və hədəfinin Kə'bə olduğunu bildirmişdi. Bu vaxt Muhəmməd Peyğəmbərin (s.ə.v) babası Şeybənin (Əbdulmuttəlib) 200 dəvəsi Əbrəhənin əsgərlərinin əlinə keçmişdi. Şeybənin xahişindən sonra dəvələri özünə qaytarılmışdı. Lakin bu ordu bütün təfərrüatı ilə tarixə məlum olmayan bir şəraitdə, başına gələn fəlakət səbəbiylə Məkkə yaxınlığında məhv olmuş və Əbrəhə də burada ölmüşdü. Bu hadisə Qur'ani-Kərimin 105-ci surəsində də öz əksini tapmışdır. 570-ci ildə baş vermiş bu hadisədən sonra Əbrəhənin oğlu Yeksum, ondan sonra isə Məsruq Yəməni həbəş kralının canişinləri olaraq idarə etmişdilər.

***Türküstan***

VI əsrin sonu-VII əsrin əvvəllərində Türküstan iki dövlətin, Göytürk xaqanlığı və Ağ Hun (Eftalit) dövlətinin hakimiyyəti altında idi. Göytürk xaqanlığı (552-588) avarlar və ağ hunlarla mübarizə nəticəsində meydana çıxmışdı. Şərqdə Çin, qərbdə isə Sasani imperiyası ilə həmsərhəd olan Göytürk xaqanlığı çinlilərlə aparılan çoxillik müharibələr nəticəsində zəifləmişdi. Ağ Hunlar isə bir vaxtlar Qobi çölündən Xəzər dənizinə qədər olan ərazidə hökmran idilər. Ağ Hunların bir qismi cənuba doğru irəliləyərək indiki Əfqanıstan, Pakistan və Hindistanın şimal-qərb torpaqlarını ələ keçimiş və burada öz dövlətini qurmuşdular.

**Ərəb Yarımadasının Coğrafi Vəziyyəti**

"Ərəbistan" ərəblərin ölkəsi mənasını ifadə edir. "Ərəb" kəlməsinin etimoloji izahı, bu sözün ifadə etdiyi məna haqqında müxtəlif mülahizələr var. Bunlardan biri də "i'rab" yəni gözəl danışıq, nitq və bəlağət qabiliyyətinə malik olmaqdır. Hələ qədim dövrlərdə ərəblər öz dillərinin zənginliyi və ifadə qabiliyyətinin üstünlüyü səbəbiylə özlərinə "ərəb", bunun xaricində qalan digər millətlərə isə "əcəm" deyirdilər. Digər bir mülahizə isə "ərəb" kəlməsinin ərəb dilində çöllük, ağacsız və bitkisiz düzənlik mənasını ifadə edən "u'rbə"

sözündən törədiyidir. Məlum olduğu kimi ərəb yarımadasının mühüm bir qismi səhradan ibarətdir. Ərəblər öz ölkələrinə "əl-Cəzirətu'l-Ərəb" və ya qısaca "əl-Cəzirə" demişdilər. Qədim iranlılar, daha sonra isə türklər bu ölkəni "Ərəbistan" yəni ərəblərin yaşadıqları ölkə adlandırmışdılar.

Asiya qitəsinin cənub-qərb hissəsində mövcud olan ərəb yarımadası qərbdən Qırmızı dəniz, cənubdan Hind okeanı (Ərəbistan dənizi), şərqdən İran körfəzi ilə əhatə olunmaqdadır. Ərəb yarımadasının şimal hüdudları barədə isə fikirlər müxtəlifdir. Onun şimal hüdudlarının Hələb şəhəri və Fərat çayı hövzəsindən başladığını deyənlər də var. Hələ qədim dövrlərdən bəri 2,7 milyon $km^2$ əraziyə sahib olan yarımada Hicaz, Yəmən, Hədraməvt, Məhrə, Oman, Bəhreyn və Nəcd adlanan yeddi əsas coğrafi məntəqəyə ayırılmaqda idi. Bu yeddi məntəqə ilə birlikdə Yəmamə və Əhqaf adlanan iki böyük bölgə də mövcud olmuşdur.

Məkkə, Yəsrib (sonralar Mədinə) və Taif kimi şəhərlərin burada yerləşməsi, yarımadanın digər məntəqələrinə nisbətən münbit torpaqların və su mənbələrinin daha çox olması, şimal-cənub ticarət yollarını ehtiva etməsi baxımından Hicaz tarix boyu Ərəbistanın ən mühüm məntəqəsi hesab olunmuşdur.

Yəmən, dağlıq hissəsində su mənbələri, bitki örtüyü və münbit torpaqların çox olmasına baxmayaraq, Tihamə kimi bitki örtüyünün olmadığı, dözülməz istisi ilə məşhur səhralara da malikdir. Mə'rib, Nəcran, Ədən və Səna kimi şəhərlərin mövcud olduğu Yəmən yarımadanın xarici aləmlə ən çox təması olan hissəsidir. Həbəşilər və Sasanilər yarımadanın bu hissəsini bir müddət öz hakimiyyətləri altında saxlaya bilmişdilər. Bir vaxtlar burada ərəb mənşəli Səba və Himyər dövlətləri də qurulmuşdur.

Hədraməvt Yəmənlə Oman arasındakı dağlıq ərazidir. Bura hələ qədim dövrdən bəri Ad qövmünün vətəni kimi tanınmaqda idi. Erkən orta əsrlərdə burada Şəbam və Tərim şəhərləri mövcud olmuşdu.

Məhrə yarımadanın Hədraməvtlə Oman arasındakı hissəsini təşkil edirdi.

Oman yarımadanın Hindistana ən yaxın ərazisidir. Hind okeanı, İran körfəzi və Hörmüzd boğazı ilə əhatə olunmuşdur.

Bəhreyn Omanın şimalında İran körfəzi sahilini əhatə etməkdə idi. Hufuf, Qətif və Qətər şəhərləri bu ərazidə yerləşirdi.

Nəcd üç tərəfdən səhra ilə əhatə olunmuş, yarımadanın Hicaz və Yəmənlə qonşu olan hissəsidir. Hündür yerləri su mənbələri və bitki örtüyü ilə zəngindir. Məşhur cins ərəb atları Nəcddə yetişdirilirdi. Dəvənin də ilk dəfə Nəcddə əhilləşdirildiyi deyilir. Burada yaşayan ərəblər genetik baxımdan digər heç bir irq və millətlə qarışmamışdılar. Ən fəsahətli və bəlağətli ərəbcəni də Nəcd bədəviləri danışırdılar.

## İslamdan Əvvəl Ərəb Yarımadasındakı Siyasi, İqtisadi və İctimai Vəziyyət

Ərəblər tarix boyu Hirə, Qəssani, Main, Nəbati, Himyər və Səba kimi iri-li-xırdalı dövlətlər qurmuş olsalar da İslamın zühur etdiyi dövrdə yarımada-da dövlət adlandıra biləcəyimiz hər hansı bir siyasi təşəkkül mövcud deyildi. Qəbilələr qəbilə rəisləri tərəfindən idarə olunurdu. Qəbilələr bir neçə qohum nəslin təşkil etdiyi oymaqların birləşməsindən meydana gəlirdi. Şəhərlərdə, yəni bir neçə qəbilə və oymağın birlikdə yaşadığı yerlərdə isə qəbilə rəislərinin birgə şuraları mövcud idi və cəmiyyəti bu şuralar idarə edirdilər. Qəbilə rəisləri əsasən şəhər aristokratiyasına mənsub olurdular. Bunlar varlı tacirlər idilər və siyasi, iqtisadi, ictimai həyata bütünlüklə nəzarət edirdilər. Məkkə aristokratiyası şəhər həyatına demək olar ki, bütünlüklə nəzarət etməkdə idi. Yəni burada əslində şəhər-dövlət formasında bir siyasi qurumun, hegemoniyanın mövcud olduğunu söyləmək olar. Bədəvi qəbilə rəisləri isə idarə etdikləri oymaq və qəbilələr üzərində qəti və geniş səlahiyyətə sahib deyildilər. Qəbilə və oymaq üzvləri şəxsi keyfiyyətləri və sahib olduqları maddi zənginliklər səbəbiylə müəyyən bir şəxsi öz rəisləri kimi qəbul edirdilər. Rəislər qəbilə və oymağın yaşlı üzvlərinin yığıncaqlarında daha çox söz haqqına sahib olsalar da xüsusi imtiyazlara sahib deyildilər. Səlahiyyət və imtiyazlarının məhdudluğuna baxmayaraq qəbilə rəislərinin vəzifə və öhdəlikləri xeyli ağır idi. Bütün qəbilə üzvləri onlardan müharibədə öz həyatları bahasına, sülh şəraitində isə sahib olduqları maddi zənginliklərlə qəbiləyə dayaq olmalarını gözləyirdilər. Ərəb qəbilə rəisləri *şeyx* adlanırdılar. Onların yaşadıqları çadırın yanına nizə sancılırdı, beləcə şeyxin hansı çadırda yaşadığı bilinirdi. Qəbilə rəisliyi-şeyxlik atadan oğula keçirdi. Lakin bu həmişə belə olmurdu. Qəbilə üzvləri istəmədikləri şəxsin varis olmasına mane ola bilirdilər. Qəbilə rəisləri müharibə şəraitində öz qəbiləsindən olan döyüşçülərin komandanı olurdu. Sülh şəraitində isə qonaqların qəbulu və qəbilələrarası razılaşmalar kimi işləri icra edirdilər. Qəbilə və oymaq üzvləri arasındakı anlaşmazlıqların həllində şeyxlərin rolu böyük var idi.

Ümumiyyətlə ərəb millətinin ana yurdu, yəni ilk çıxış yeri Yəmən hesab olunur. Ərəblər soykökü etibarı ilə iki qismə bölünürlər. Qəhtani ərəblər və Ədnani ərəblər. Qəhtanilər təmiz və saf qanlı ərəblər, Ədnanilər isə *mütə'ərribə*, yəni sonradan ərəbləşmişlər hesab olunurlar. Ərəblərin bir qismi məskunlaşmış, mədəni yəni şəhərli (mədinə ərəb dilində şəhər deməkdir), bir qismi isə bədəvi yəni köçəri çöl ərəbləri idi. Ərəb cəmiyyəti o dövrdə qəbilə-oymaq sisteminə sahib idi. Qəhtanilər-Kəhlan, Xuzaə, Əzd adlanan qəbilə

birləşmələrinə bölünürdülər. Kəhlan qəbilə birliyinə aid olan qəbilələr: Qureyş, Təyy, Həmdan, Mudlic, Amilə, Cüzam, Bəni-Ləhm, Kində. Xuzaə tayfasına aid olan qəbilələr: Bəhrə, Tənuh, Cudeynə, Uzra, Bəni-Kəlb, Bali. Əzd tayfasına aid olan qəbilələr: Əvs, Xəzrəc, Dəvs, Qəssan, Mudar, Hudf, Qeys. Bunlar da öz aralarında Xuzeyl, Kinanə, Əsəd, Muzeynə, Dəbbə, Təmim, Rəbab, Bəcilə, Həvn, Qarrə, Ədiyy, Teym, Uqeyl, Səvr, Muqais, Qusay, Yərbu, Bəhdələ, Riyah, Sə'ləbə, Kuleyb, Ədvan, Qətəfan, Ə'sur, Suleym, Həvazin, Əbs, Zibyan, Fəzarə, Murrə, Bahilə, Bəni-Sə'd, Bəni-Nəsr, Səqif, Səlul, Bəni-Amir, Bəni-Hilal, Bəni-Numeyr, Bəni-Kə'b kimi oymaq və nəsillərə bölünürdülər. Bundan başqa yarımadada Bəni-Qaynuqa, Bəni-Nəzir və Bəni-Qureyzə kimi ərəbdilli yəhudi qəbilələri də yaşayırdılar.

Ümumiyyətlə ərəblərin İslamdan əvvəlki tarixinə *cahiliyyə dövrü* və ya *əyyamü'l-ərəb* deyilirdi. Cahiliyyə dövrü ərəblərinin böyük əksəriyyəti bütpərəst idi. Lakin zənn edildiyinin əksinə cahiliyyə dövrünün bütpərəst ərəbləri tək yaradıcı olan Rəbbin, yəni Allahın varlığını inkar etmirdilər. Onlar tək Allahın olduğuna inanırdılar. Rəbb olaraq sadəcə Allahı tanıyırdılar. Qur'ani-Kərim cahiliyyə dövrü ərəb cəmiyyətindəki dini-ictimai vəziyyəti dəqiqliklə əks etdirən ən mötəbər mənbədir. Qur'anın bir sıra ayələri vasitəsilə cahiliyyə dövrü ərəblərinin dini etiqadları barədə təsəvvür və qənaət sahibi olmaq mümkündür. Aşağıda qeyd etdiyimiz bu ayələrdən cahiliyyə ərəblərinin tək yaradan, ruzi verən, yağışı yağdıran, bitkiləri bitirənin aləmlərin Rəbbi olduğuna inandıqlarını təsbit etmək mümkündür.

وَلَئِن سَأَلْتَهُم مَّنْ خَلَقَ السَّمَاوَاتِ وَالْأَرْضَ وَسَخَّرَ الشَّمْسَ وَالْقَمَرَ لَيَقُولُنَّ اللَّهُ ۖ فَأَنَّىٰ يُؤْفَكُونَ

*"Əgər sən onlardan: "Göyləri və yeri yaradan, günəşi və ayı ram edən kimdir?"-deyə soruşsan, onlar mütləq: "Allahdır!"- deyəcəklər. Onlar necə də (haqdan üz) döndərilirlər!"* (Ənkəbut surəsi 61)

وَلَئِن سَأَلْتَهُم مَّن نَّزَّلَ مِنَ السَّمَاءِ مَاءً فَأَحْيَا بِهِ الْأَرْضَ مِن بَعْدِ مَوْتِهَا لَيَقُولُنَّ اللَّهُ ۚ

*Əgər sən onlardan: "Göydən yağış endirib onunla yeri quruduqdan sonra canlandıran kimdir?"-deyə soruşsan, onlar mütləq: "Allahdır!"-deyəcəklər". (Ənkəbut surəsi 63)*

قُلْ مَن يَرْزُقُكُم مِّنَ السَّمَاءِ وَالْأَرْضِ أَمَّن يَمْلِكُ السَّمْعَ وَالْأَبْصَارَ وَمَن يُخْرِجُ الْحَيَّ مِنَ الْمَيِّتِ وَيُخْرِجُ الْمَيِّتَ مِنَ الْحَيِّ وَمَن يُدَبِّرُ الْأَمْرَ ۚ فَسَيَقُولُونَ اللَّهُ ۚ فَقُلْ أَفَلَا تَتَّقُونَ

*De: "Sizə göydən və yerdən ruzi verən kimdir? Qulaqlara və gözlərə hakim olan kimdir? Ölüdən diri çıxaran, diridən də ölü çıxaran kimdir? İşləri yoluna*

*qoyan kimdir?" Onlar deyəcəklər: "Allah!" De: "Bəs (belə olduğu halda Allahdan) qorxmursunuz?"* (Yunus surəsi 31)

Lakin cahiliyyə dövrü ərəbləri bütlərin təmsil etdikləri ruhaniyyətə sitayiş edir, onların qarşısında ibadət edir, onlar üçün qurban kəsir, onların vasitəçiliyi ilə dilək diləyirdilər. Yəni cahiliyyə dövrü ərəbləri rububiyyətdə deyil, uluhiyyətdə Allaha şərik qoşan müşriklər idilər. Onların sitayiş etdikləri ilahların özləri ilə Allah arasında vasitəçi olduqlarına inanmaları Qur'anın Zumər surəsi 3-cü ayəsində belə təsvir olunmuşdur:

أَلَا لِلَّهِ الدِّينُ الْخَالِصُ وَالَّذِينَ اتَّخَذُوا مِنْ دُونِهِ أَوْلِيَاءَ مَا نَعْبُدُهُمْ إِلَّا لِيُقَرِّبُونَا إِلَى اللَّهِ زُلْفَى إِنَّ اللَّهَ يَحْكُمُ بَيْنَهُمْ فِي مَا هُمْ فِيهِ يَخْتَلِفُونَ إِنَّ اللَّهَ لَا يَهْدِي مَنْ هُوَ كَاذِبٌ كَفَّارٌ

*"Bil ki, xalis din (sırf ibadət, təmiz itaət) ancaq Allaha məxsusdur. O kəslər ki, Allahın yaxınından (olduqlarna inandıqlarını) övliya (dostlar) əxz edirlər "Biz onlara yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik!" (deyirlər). Şübhəsiz ki, Allah ixtilafda olduqları məsələlər barəsində (qiyamət günü) onların arasında hökm edəcəkdir. Allah yalançı, nankor olan kimsəni doğru yola müvəffəq etməz!"*

Qur'an Əhqaf surəsinin 5-ci ayəsində bunu edənləri, yəni Allahdan başqasını, Allaha yaxın olduğunu düşünərək dua edib çağıranları yolunu azmış, zəlalətə düşmüşlər adlandırır:

وَمَنْ أَضَلُّ مِمَّنْ يَدْعُو مِنْ دُونِ اللَّهِ مَنْ لَا يَسْتَجِيبُ لَهُ إِلَى يَوْمِ الْقِيَامَةِ وَهُمْ عَنْ دُعَائِهِمْ غَافِلُونَ

*"Allahı buraxıb qiyamət gününədək özünə cavab verə bilməyənlərə yalvaran kimsədən daha çox azmış kim ola bilər? Halbuki onların yalvarışından xəbərsizdirlər".*

Çinki *mucib* sifəti, yəni duaya, yalvarışa, yardıma çağırışa icabət etmək, cavab vermək sadəcə Allaha xas bir sifətdir. Dua isə ibadətdir. Yəni birinə dua edən, yardıma çağıran həm də ona ibadət etməkdədir[14]. Cahiliyyə dövründə Məkkədəki Kə'bə ibadət və ziyarət yeri idi. Ərəblər bu evin İbrahim peyğəmbər (ə.s) və onun oğlu İsmayıl peyğəmbər (ə.s) tərəfindən tikildiyini bilir və buna inanırdılar. İlin müəyyən vaxtlarında, yəni zilhiccə ayında, yarımadanın hər tərəfindən ərəblər Kə'bəyə axışır, ziyarət edirdilər. Məkkə müşrikləri Allahla öz aralarına qoyduqları vasitəçi ilahların həmin səlahiyyəti Allahdan aldığına inanırdılar. IX əsrdə yaşamış hədis alimi Əbü'l-Hüseyn Müslim ibn əl-Həccac

[14] Ənəs ibn Malikdən (r.ə) Peyğəmbər (s.ə.v) buyurdu: (الدعاء مخ العبادة) "Dua ibadətin beyni, iliyidir". Ne'man ibn Bəşirdən (r.ə) Peyğəmbər (s.ə.v) buyurdu: (الدعاء هو العبادة) "Dua ibadətin özüdür ki, var" (Tirmizi, Sünən, Dua, 3371; 3372).

Nişapuri (821-875) özünün "*Müsnəd əs-Səhih"* adlı hədis külliyatında Abdullah ibn Abbasa (r.ə) istinadən qeyd edir ki, Məkkə müşrikləri Kə'bəni təvaf edərkən belə deyirdilər: "*Ləbbeyk lə şərikə lək illə şərikin huvə lək təmlikunu və ma mə-lək*"[15] (Hüzurundayam Allahım, sənin heç bir şərikin yoxdur. Yalnız bir şərikin vardır ki, onun da, onun bütün səlahiyyətlərinin də sahibi sənsən). Bunu nəql edən Abdullah ibn Abbas (r.ə) deyirdi ki, onlar "*Ləbbeyk lə şərikə lək*" (Hüzurundayam Allahım, sənin heç bir şərikin yoxdur) dedikləri vaxt Peyğəmbər (s.ə.v.): "*Vay halınıza! Bu qətidir, bu qətidir*" deyərdi.

Cahiliyyə dövrü ərəblərinin sitayiş etdikləri ilahlar haqqında Qur'anın Nuh surəsi 22-24-cü ayələrində də məlumat verilməkdədir:

**وَمَكَرُوا مَكْرًا كُبَّارًا وَقَالُوا لَا تَذَرُنَّ آلِهَتَكُمْ وَلَا تَذَرُنَّ وَدًّا وَلَا سُوَاعًا وَلَا يَغُوثَ وَيَعُوقَ وَنَسْرًا وَقَدْ أَضَلُّوا كَثِيرًا وَلَا تَزِدِ الظَّالِمِينَ إِلَّا ضَلَالًا**

*"Onların kafir başçıları mənim əleyhimə çox böyük bir hiylə qurdular və (tabeçiliyində olanlara) dedilər: "Öz tanrılarınızı tərk etməyin, (xüsusilə) Vəddi, Suvanı, Yəğusu, Yəuqu və Nəsri atmayın!" Onlar çoxlarını yoldan çıxartdılar. Sən də (ey Rəbbim!) ancaq onların zəlalətini artır!"*

IX əsrdə yaşamış alimlərdən Muhəmməd ibn İsmayıl Buxari (810-870) "*Cəmi'əs-Səhih*" adlı hədis külliyatında, Əbu Cəfər Muhəmməd ibn Cərir ət-Təbəri (838-923) isə "*Cəmi' əl-Bəyan fi Təfsir əl-Qur'an*" adlı təfsir əsərində Nuh surəsinin bu ayələrini şərh edərkən Peyğəmbərin (r.ə) əshabından olan Abdullah ibn Abbasın (r.ə) belə dediyini qeyd etməkdədirlər:

"*Nuh peyğəmbərin (ə.s) qövmünün bütləri sonradan cahiliyyə dövrü ərəblərinə də keçmişdi. Belə ki, Vədd adlı büt Dumətu'l-Cəndəldə idi və Kəlb qəbiləsinə məxsus idi. Suva bütü Xuzeyl qəbiləsinin idi. Yəğus bütü Mudar qəbiləsinə məxsus idi. Sonra Quteyf qəbiləsinin oldu. Səbə şəhərinə yaxın Carf adlı yerdə idi. Yəuq bütü Həmdan qəbiləsinin idi. Nəsr bütü Himyərdə, Zil-Kə'la qəbiləsinə məxsus idi. Bu büt adları əslində Nuhun (ə.s) qövmündən olan, ona ilk iman etmiş saleh insanlara məxsus adlar idi. İblis bu saleh insanlar öləndən sonra onların qövmünə belə təlqin etdi: "Bu saleh insanların yaşadıqları yerdə onların xatirəsini yad etmək üçün abidələr tikin". İnsanlar iblisin təlqininə uyub bu abidələri ucaltmışdılar. Əvvəllər bunlara ibadət etmirdilər. Fəqət vaxt keçdikcə, nəsillər dəyişdi. Onların həqiqi kimlikləri unuduldu və beləcə hər biri ibadət edilən bütə çevrildi*".

---

[15] (عن ابن عباس رضي الله عنهما قال كان المشركون يقولون لبيك لا شريك لك قال فيقول رسول الله صلى الله عليه وسلم ويلكم قد قد فيقولون إلا شريكا هو لك تملكه وما ملك)

Məkkə müşriklərinin Kə’bə ziyarəti onun ətrafında çılpaq qaçmaq, fit çalıb, əl çalmaq kimi ritualladan ibarət idi. Kə’bə və ətrafında 300-dən çox büt var idi. Lakin bunlardan başqa cahiliyyə dövründə yarımadanın bir çox yerində ərəblərin 100-ə yaxın məşhur bütü mövcud idi. Bütlərin bəziləri kişi, bəziləri qadın cinsinə aid edilirdi. Bəziləri isə insan bədənli və heyvan başlı təsvir olunurdular. Kə’bə xaricindəki bu bütlərə *tağut* da deyilirdi. Bunların ən məşhurlarından aşağıdakıların adlarını çəkə bilərik:

Uzza bütü: Kinanə və Süleym qəbilələrinin tağutu idi. Məkkə yaxınlığındakı Bətni-Nəxlə adlı yerdə, bir məbədin içində yerləşməkdə idi. İslamdan sonra Xalid ibn Vəlid (r.ə) tərəfindən dağıldılmışdı.

Lat bütü: Taif şəhəri yaxınlığında yerləşirdi. Bəni-Səqif qəbiləsinin bütü idi.

Mənat bütü: Yəsrib şəhəri yaxınlığındakı Kudeyf adlı yerdə bir məbəddə yerləşirdi. Əvs və Xəzrəc qəbilələrinin bütü idi. İslamdan sonra Əli ibn Əbu Talib (r.ə) tərəfindən dağıldılmışdı.

Hubəl bütü: Qureyş qəbiləsinin ilahı idi. Kə’bənin içində yerləşirdi. Hubəl cahiliyyə ərəblərinin ən ehtiram göstərilən ilahı, tağutu idi. Əslində Huvə-Bə’l (**هو بعل**), yəni “*o Tanrının özüdür*” mənasını ifadə edən bu ad Hubəl kimi tələffüz olunurdu. Bə’l qədim Mesopotamyada bütpərəstlərin sitayiş etdikləri ən böyük ilahı təmsil edən büt idi. Həmçinin Bə’l qədim Finikiyalıların sitayiş etdikləri ən böyük büt idi və İştar (Astarta) ilahəsi onun arvadı, El adlı ilah isə oğlu hesab olunurdu[16]. Ümumiyyətlə qədim Babildən qədim Misirə qədər orta şərq coğrafiyasının bir çox yerində bütpərəstlər Tanrını simvolizə etdiyinə inandıqları Bə’l adlı bütə sitayiş etmişdilər. Tövratın bəzi bölümlərində Bə’l bütü ilə bağlı rəvayətlər mövcuddur. Finikiyalılar və hetlər kimi bütpərəst qövmlərin təsiri altında qalaraq Bə’lə sitayiş etmiş bəzi yəhudi qəbilələrini bu şirkdən Davud (ə.s) və Süleyman (ə.s) peyğəmbərlər çəkindirmişdilər.

Qur’anın Saffat surəsi 123-125-ci ayələrindən İlyas (ə.s) peyğəmbərin qövmünün Bə’lə sitayiş etdiyi məlum olur.

**وَإِنَّ إِلْيَاسَ لَمِنَ الْمُرْسَلِينَ , إِذْ قَالَ لِقَوْمِهِ أَلَا تَتَّقُونَ, أَتَدْعُونَ بَعْلًا وَتَذَرُونَ أَحْسَنَ الْخَالِقِينَ**

*“Həqiqətən, İlyas da peyğəmbərlərdəndir! Bir zaman o öz qövmünə belə demişdi: “Məgər (bütlərə ibadət etməklə) Allahdan qorxmursunuz? Məgər siz yaradanların ən yaxşısını qoyub Bə’lə dua edirsiniz?”.*

[16] Baş tanrının arvadı və oğlunun olması yaxın və orta şərq, eləcə də Avropadakı paqan dinlərin bir çoxuda yayğın bir inanca çevrilmişdi. Qədim Yunanıstanda baş tanrı Zevs, onun arvadı Gera, oğlu isə Arqos hesab olunurdu. Qədim Romalılarda baş tanrı Yupiter, onun arvadı Alkmena, oğlu isə Herkules idi. Şübhəsiz ki, isəviliyin təhrif olunaraq təslis (üçlü birlik) inancının meydana çıxmasına bu qədim dini inancların təsiri olmuşdur.

Məlum olduğu kimi İlyas[17] peyğəmbər (ə.s) e.ə IX əsrdə indiki Livan ərazisində yerləşən Bə'lbək şəhərində yaşamış və baş tanrıları Bə'llə yanaşı digər bütlərə ibadət edən oradakı insanları tövhidə dəvət etmişdi. Bu şəhərin, yəni Bə'lbəkin adı da Bə'l bütü ilə əlaqəlidir. Bə'lbəkdəki bütpərəst məbədlərinin xarabalıqları indi də qalmaqdadır. Eramızın 32-ci ilində Bə'lin şərəfinə inşa edilmiş başqa bir ehtişamlı bütpərəst məbədinin xarabalıqları indiki Suriyanın Tədmur (Palmiriya) şəhərindədir. İbn Cərir ət-Təbəri öz təfsirlərdə İkrimə, Mücahid, Qatədə, Süddi və Abdullah ibn Abbasdan (r.ə) nəql olunan rəvayətləri qeyd edərək bildirir ki, qədim yəmənlilərin dilində Bə'l *Rəbb* mənasını ifadə edir. Kə'bədəki Hubəl əqiq daşından, insan surətində yonulmuşdu. Rəvayətə görə onu Şam diyarından Hicaza Xuzeymə ibn Müdrikə ibn İlyas ibn Mudar adlı şəxs gətirmiş və Kə'bənin içində yerləşdirmişdi. Bəzi rəvayətlərə görə isə Hubeli Məkkəyə Əmr ibn Luhey gətirmişdi. Hubel Kə'bəyə gətirilərkən sağ qolu sınmışdı və Qureyş müşrikləri onun üçün qızıldan qol düzəltdirmişdilər. Hubəlin qarşısında hər birinin üzərində ayrı-ayrı yazı olan yeddi ox olurdu. Müşrik ərəblər dünyaya gələn övladlarının özlərindən olub olmadığı barədə şübhəyə düşəndə, mühüm bir iş üçün yola çıxanda və ümumiyyətlə həyatlarına istiqamət verən hər bir işdə Hubelin qarşısındakı fal oxlarını çəkirdilər. Əvvəlcə Hubelə qurban kəsir, daha sonra onun qarşısına qoyulmuş sadaqdan üzərində yazı olan oxlardan birini çəkirdilər. Məsələn əgər müşrik bir ərəb anadan olmuş uşağının özündən olmadığı barədə şübhələnirdisə Hubelin qarşısındakı, birinin üzərində "*minkum*" (**منكم**), yəni "*sizdəndir*", digərinin üzərində isə "*minğeyrikum*" (**من غ كم**), yəni "*qeyrisindəndir*" sözləri yazılmış oxlardan birini çəkirdi. Hansı çıxsaydı ona görə qərar verirdilər.

Sə'd bütü: Bəni-Milkan qəbiləsinin ilahı idi.

Umeynis bütü: Həlvan qəbiləsinin ilahı idi.

Nəsr bütü: Himyərdə, Zil-Kə'la oymağının ilahı idi. Nəsrin başı kərkəs formasında idi.

Yəuq bütün: Yəmənli Həmdan qəbiləsinin sitayiş etdiyi büt idi. Yəuqun başı at başı formasında idi.

Yəğus bütü: Cureş oymağının yurdunda, Carfa adlı yerdə olan bu bütə Mudar və Quteyf qəbilələri sitayiş edirdilər. Yəğusun başı şir başı formasında idi.

Vədd bütü: Dumətu'l-Cəndəl adlı yerdə yerləşirdi. Bəni-Kəlb qəbiləsinin ilahı idi.

[17] Bu peyğəmbərin adı ibranicə dini mətnlərdə İlya, latınca dini mətnlərdə isə Elias olaraq qeyd olunur.

Suva bütü: Xuzeyl qəbiləsinin ilahı idi. Mədinə ətrafındakı Yənbu adlı yerdə, Ruhatə məbədində yerləşirdi.

Asəf və Nailə bütləri: Cahiliyyə dövrü əfsanələrinə görə Curhum qəbiləsinə mənsub bu aşiq və məşuq Kə'bənin içində cinsi əlaqədə olduqları üçün daşa dönmüşdülər. Əslində isə bu eşq macərasından ilham alan müşriklər onların bütlərini yonub Kə'bənin içinə qoymuşdular.

Zül-Xələsə məbədi: Dəvs və Bəcilə qəbilələrinin ibadət etdikləri bütpərəst məbədləri idi. Bu məbəddə oxlarla fala baxan kahinlər məskən tutmuşdular.

Fəls məbədi: Təyy qəbiləsinə məxsus bütpərəst məbədi idi. İslamdan sonra Əli ibn Əbu Talib (r.ə) tərəfindən dağıldılmışdı.

Riam məbədi: Yəməndə yerləşirdi. Himyər qəbiləsinə mənsub oymaqların ibadət etdikləri bütpərəst məbədi idi.

Zül-Qə'bat məbədi: Bəni-Bəkr ibn Vail, Təğlib və İyaz qəbilələrinə məxsus bütpərəst məbədi idi.

Cahiliyyə dövrü ərəbləri bütpərəst, müşrik olsalar da öz ilahlarına qarşı heç də həmişə ehtiramla davranmırdılar. Cahiliyyə dövrü poeziyasında bütləri həcv edərək məsxərəyə qoyan şeer nümunələrinə rast gəlindiyi kimi mənbələrdə buna dair rəvayətlər də mövcuddur. Cahiliyyə dövrünün məşhur şairlərindən İmr əl-Qeys öldürülmüş atasının qisasını almaq niyyətinə düşür və bunun üçün Zül-Xələsə məbədinə gedərək burada bu işi edib etməməsinə dair fal oxu çəkir. Bir neçə dəfə çəkdiyi fal oxları hər dəfə bu fikirdən daşınmalı olduğunu göstərdiyi üçün qəzəblənən İmr əl-Qeys fal oxlarını məbəddəki bütün başına çırparaq onu nalayiq söyüşlərlə təhqir edib "*əlbəttə, öldürülən sənin atan olsaydı belə qərar verməzdin*" demişdi. Bir başqa rəvayətdə isə dəvə sürüsünə sahib olan bir ərəb dəvələrini qorusun deyə onlardan birini qurban kəsmək niyyəti ilə sürünü Sə'd bütünün yanına gətirir. Üzərinə axıdılmış qurban qanları səbəbiylə əcaib və qorxunc bir forma almış Sə'd bütündən ürkən dəvə sürüsü səhrada pərən-pərən düşür. Bunu görən ərəb qəzəblənərək yerdən aldığı daşı bütə atmış və "*Allah bəlanı versin Sə'd, dəvələrimi ürkütdün*" demişdi. Cahiliyyə dövründəki müşrik ərəblərin inancları barədə Hişam ibn Muhəmməd əl-Kəlbi özünün "*Kitabu'l-Əsnam*" (Bütlər haqqında kitab) adlı əsərində geniş məlumat verməkdədir.

Qur'anın bir sıra ayələrindən[18] Məkkə müşriklərinin, eləcə də bütünlüklə cahiliyyə dövrü ərəblərinin axirət inancına sahib olmadıqları qənaəti hasil olmaqdadır. Mümkündür ki, onlar insan vücudunun sadəcə cəsəddən, maddədən ibarət olmadığına, həmçinin ruhunun da olduğuna inanmaqda idilər. Lakin İs-

[18] Yasin 78; Nəhl 38; Casiyə 23-24; Naziat 10-12.

lamın öyrətdiyi mənada bir axirət inancı cahiliyyə ərəbləri arasında mövcud deyildi. Yəni onlar qiyamət gününə, insanın əməlləri səbəbiylə haqq-hesaba çəkiləcəyinə inanmırdılar. Qeyd etdiyimiz ayələrdən onların həyatın sadəcə dünyadakı həyatdan ibarət olduğuna, ölümün isə təbii bir proses olaraq baş verdiyinə inandıqları nəticəsi hasil olmaqdadır. Tutduğu işlərdən, əməllərdən ötürü haqq-hesaba çəkilməyəcəyi inancının, düşüncəsinin insanı azğınlaşdırması qaçınılmazdır. Belə bir inanca, düşüncəyə sahib insanın ehtiraslarını məhdudlaşdıran, onlara sədd çəkən dünyəvi qanunlar mənzuməsi də mövcud deyilsə və ya həmin insan bu qanunlarıdan asanlıqla yan keçə bilirsə belə bir cəmiyyət həyatının tam mənası ilə fəlakətə çevrilməsi labüddür. Həm dünyəvi, həm də uxrəvi cəzasızlıqdan, məsuliyyətsizikdən əmin və arxayın insanların yaşadığı bir cəmiyyətdə güclünün zəifi əzməsi, istismar etməsi qaçınılmazdır. Sözü gedən dövrdə ərəb cəmiyyəti məhz belə və ya buna yaxın bir vəziyyətdə idi. İslam dini insana heç bir pis əməlin cəzasız qalmayacağı kimi, heç bir yaxşı əməlin də mükafatsız qalmayacağı inancını aşılamaqdadır. Hər cür pis əməl, başqalarının haqq və hüququna təcavüz etmək gizlin belə qalsa və ya bunu edən insan cəmiyyətdəki mövqeyi səbəbiylə bu dünyada cəzadan yayına bilsə də axirətdə mütləq haqq-hesaba çəkiləcək və ilahi cəzadan yaxa qurtara bilməyəcəkdir. Çünki Allahdan heç bir şey gizli qalmaz və Allah insanları ictimai mövqelərinə, sosial statuslarına görə deyil təqvalarına görə dəyərləndirir.

İslamdan əvvəl ərəb yarımadasında yaşamış peyğəmbərlər sadəcə İbrahim (ə.s) və oğlu İsmayıl (ə.s) deyildi. Ad və Səmud qövmlərini haqqa dəvət etmiş Hud (ə.s) və Saleh (ə.s) peyğəmbərlər də ərəb yarımadasında yaşamışdılar. İlahi dəvəti rədd edib fəlakətə uğrayaraq yurdları tarmar olmuş bu iki qövmün başına gələn müsibətlər haqqındakı dastanlar cahiliyyə dövrü ərəbləri arasında dildən-dilə dolaşmaqda idi. Saleh (ə.s) peyğəmbər Səmud qövmünə göndərilmiş bir peyğəmbər idi. Səmud qövmünün yurdu yarımadanın şimal-qərbində idi. "*Mədainü's-Salih*" adı ilə məşhur olan bu yerlər indi "*əl-Üla*" adlanır. əl-Üla cahiliyyə dövründə Yəsribin şimalındakı Vadiü'l-Qur'adan bir neçə kilometr şimalda yerləşirdi. Saleh peyğəmbər (ə.s) yarımadanın şimal-şərqindən indiki İordaniyanın mərkəzinə qədər uzanan vadidə yaşayan Səmud qövmünü tövhidə dəvət etmiş, nəticəsiz qalan dəvət sona çatandan sonra isə bu qövm fəlakətlərə uğrayaraq məhv olmuşdur. Onların xarabazara çevrilmiş yurdunun qalıqları cahiliyyə dövründə də mövcud idi və indiyə qədər qalmaqdadır. Qur'anın Şüara surəsi 149-cu ayəsində barələrində "*Dağlardan məharətlə evlər yonub düzəldəcəksiniz?*" deyilən qövm Salehin (ə.s) qövmü Səmuddur. Hud (ə.s) peyğəmbərin tövhidə dəvət etdiyi Ad qövmü isə bir zamanlar yarıma-

danın cənubunda, Ədən civarında məskun idi. Onların xaraba qalmış yurdları cahiliyyə ərəbləri tərəfindən yaxşı tanınırdı. Belə ki, yarımadanın cənubundan şimalına gedən ticarət karvanları məhv olmuş qövmlərin yurdlarından keçib gedirdi.

Bütpərəst bir cəmiyyət olmasına baxmayaraq İslam dininin meydana çıxması ərəfəsində ərəb yarımadasında hələ də İbrahim peyğəmbərin (ə.s) dininə inanan insanların yaşadığını mənbələr qeyd edirlər. Hətta bəzi tarixi rəvayətlərə görə İbrahimə (ə.s) nazil edilmiş kitabın qalıqları da yarımada mövcud olmuş, daha sonra nəsildən-nəslə ötürülərək Abbasilərdən Harun ər-Rəşidin (786-809) dövrünə qədər gəlib çıxmışdı. Əhməd ibn Abdullah adlı bir şəxs bu mətnləri kəldani dilindən ərəbcəyə tərcümə etmişdi. Belə mətinlərin varlığına Qur’ani-Kərimin Ə’la surəsi 19 və Nəcm surəsi 36-cı ayələrində də toxunulur. İslamdan əvvəl ərəb yarımadasında yaşayan və bütlərə ibadət etməyərək tövhidə inanan insanlara *“hənif”*, yəni təktanrılı deyilirdi. Bu insanlar bütlərə sitayiş etmir, müşrik həmvətənlərinin bütpərəst ayinlərində iştirak etmirdilər. Bunların sayı çox deyildi və bəziləri sonradan səmavi din olan xristianlığa meyl etmişdilər. Vərəqə ibn Novfəl, Ubeydullah ibn Cəhş, Osman ibn Huveyris, Əbu Səid Zeyd ibn Əmr, Səid ibn Zeyd İslamdan əvvəl yaşamış həniflərdir. Mənbələr İbrahimin (ə.s) dininə inanan Zeyd ibn Əmrin Kə’bəyə gələrək “*Ey Rəbbim! Səni razı edəcək bir ibadət bilsəydim sənə o cür ibadət edərdim*” dediyini qeyd edirlər.

Nəcm surəsi 19-21-ci ayələrdə isə deyilir:

أَفَرَأَيْتُمُ اللاتَ وَالْعُزَّىٰ وَمَنَاةَ الثَّالِثَةَ الْأُخْرَىٰ أَلَكُمُ الذَّكَرُ وَلَهُ الْأُنثَىٰ

“*(Ey müşriklər!) Bir deyin görək (sizin ibadət etdiyiniz) Lat və Uzza nəyə qadirdilər?! Digər üçüncü (büt) olan Mənat da həmçinin?! Məgər oğlanlar sizin, (bəyənmədiyiniz) qızlar Onundurmu?! (Allahındırmı)?!”*

Burada “*qızlar onundurmu?*” ifadəsi ilə mələklər nəzərdə tutulur. Çünki cahiliyyə dövrü ərəbləri mələkləri Allahın qızları adlandırırdılar. Özləri isə ailələrində qız uşaqlarının dünyaya gəlməsini istəmirdilər.

Cahiliyyə dövründə ərəblərin iki əsas qazanc mənbəyi var idi: 1-Ticarət, 2-Soyğunçuluq və talançılıq. Əksər hissəsi səhra olub əkinçilik və heyvandarlıq üçün əlverişli olmayan ölkənin insanlarının gəlir əldə edə biləcəkləri başqa mənbə də demək olar ki, yox idi. Bunlardan nisbətən asan olanı, xüsusi bir qabiliyyət, istedad və sərmayə tələb etməyəni şübhəsiz ikincisi idi.

Ərəb qəbilələri tez-tez bir-birlərinə hücum edərək pul, qiymətli əşya və mal-qaranı, eləcə də insanları əsir edib aparır və satırdılar. Belə hücumlar vaxtı mümkün qədər qan tökməməyə çalışırdılar. Çünki tökülmüş qanın qisası mütləq

alınırdı və bu da qəbilələrarası, sonu olmayan müharibələrin meydana çıxmasına səbəb olurdu. Bir ərəb üçün onun qəbiləsi hər şey demək idi. Çünki sığınacaq bir qəbiləsi olmayan şəxs heç kim tərəfindən müdafiə olunmurdu. Belə bir həyat şəraiti ərəblərə bir sıra yaxşı və pis xüsusiyyətlər qazandırmış, ənənələrin meydana çıxmasına səbəb olmuşdu. Əvvəla hər bir ərəb uşaq yaşlarından etibarən döyüşçü kimi böyüyürdü. Buna məcbur idi. Çünki qəbilə basqınları vaxtı hərə öz qolunun qüvvəsinə, çevikliyinə və silahdan istifadə etmə bacarığına güvənməli olurdu. Buna görə də gənclər at minmək, silahdan istifadə etmək kimi bacarıqlara yiyələnirdilər. Belə bir şəraitdə insanlar istər-istəməz cəsur, qorxmaz və mətin olmağı öyrənirdilər. Uzun müddətli ticarət səfərlərində ya da fiziki güc və dözümlülüyün tələb olunduğu silahlı basqınlarda təbii ki, kişilər iştirak edirdilər. Belə basqınlarda daha çox qadınlar və qız uşaqları əsir götürülür, qul kimi satılırdılar. Onların sonrakı aqibətindən isə danışmağa belə dəyəməzdi. Çünki sahibləri onları hər cür iş görməyə məcbur edirdilər. Buna görə də cahiliyyə dövrü ərəb ailəsində qız uşağının dünyaya gəlməsi ən arzuolunmaz hadisə idi. Beləcə anadan olan kimi qız uşaqlarının dərhal diri-diri torqağa basdırılması kimi bir adət meydana gəlmişdi. Bu adət daha çox Təmim və Bəni-Əsəd qəbilələrində yayılmışdı. Bu digər ərəb qəbilələrində çox yayılmış bir adət deyildi. Buna baxmayaraq qadınlar cahiliyyə dövrü ərəb cəmiyyətində demək olar ki, heç bir hüquqa malik deyildilər. Məsələn bir kişi maddi vəziyyətinə görə istədiyi sayıda qadınla evlənə bilərdi. Atası və ya qardaşı ailədəki qızı başlıq pulu alaraq istədikləri şəxsə ərə verə bilərdilər. Qadınların varislik hüququ yox idi. Qadın ölmüş atasının və ərinin mirasçısı ola bilmirdi. Ailə qurmuş bir qadın oğlan uşağı dünyaya gətirənə qədər gəlin getdiyi ailənin üzvü hesab olunmurdu və. s.

Məkkə, Yəsrib (sonralar Mədinə) və Taif kimi şəhərlərin Hicazda yerləşməsi, yarımadanın digər məntəqələrinə nisbətən münbit torpaqların və su mənbələrinin burada daha çox olması, şimal-cənub ticarət yolu üzərində yerləşməsi baxımından Hicaz tarix boyu Ərəbistanın ən mühüm məntəqəsi olmuşdur. Yuxarıda qeyd etdiyimiz kimi yaşadıqları həyat şəraiti ərəblərə bir sıra yaxşı və pis xüsusiyyətlər qazandırmış, ənənələrin meydana çıxmasına səbəb olmuşdu. Belə bir şəraitdə insanlar istər-istəməz cəsur, qorxmaz və mətin olmağı öyrənirdilər. Hər hansı bir dövlət qüvvəsi tərəfindən qorunmadığı, qorunmaq üçün arxasına sığına biləcəyi qala divarlarının olmadığı çöl şəraitində, çadırda yaşaması hər bir ərəbdə özünün, ailəsinin təhlükəsizliyini özü təmin etməli olduğu şüurunu formalaşdırmışdı. Belə çətin həyat şəraiti daim əli silahlı olmaq vərdişinə yiyələnməyi asanlaşdırırdı. Hegemoniyasına boyun əyməli olduğu

hər hansı bir dövlətin və qanunlar toplusunun olmaması bədəvi ərəblərin hürr və azad ruhlu olmasına səbəb olmuşdu. Cəsarət və qorxmazlıqları iradələrinin hürr, ruhlarının azad olmasından irəli gəlirdi. İslamın meydana çıxmasından sonra ərəblərin yuxarıda sadaladığımız xüsusiyyətləri İslamın cihad və şəhidlik məfkurəsi ilə yoğrulub yeni bir insan tipinin meydana gəlməsinə səbəb olmuşdu. Bununla belə sərt ictimai şərait və çətin həyat tərzi bədəvi ərəblərdə yıxıcı xüsusiyyətlərin də meydana çıxmasına səbəb olmuşdu.

Cahiliyyə dövrü ərəbləri haram aylarda müharibə etmir, vuruşmurdular. Bu aylar zilqədə, zilhiccə, məhərrəm və rəcəb ayları idi. Cahiliyyə ərəblərinin qan tökməyi haram qəbul etdikləri bu aylar Kə’bəni ziyarət və ticarət ayları idi. Buna görə də əmin-amanlığa, asayişin qorunmasına riayət edirdilər. Lakin cahiliyyə dövrü ərəblərinin dörd dəfə bu qaydanı pozduqları və bunun da uzunmüddətli qəbilə müharibələrinə səbəb olduğu məlumdur. “*Əyyamü’l-ərəb*”in bu məşhur hadisələrinə “*Ficar müharibələri*” deyilir. “*Ficar*” sözü fitnə-fücur çıxarmaq, aranı qarışdırmaq mənasını ifadə edir. Bu dörd müharibədən sonuncusu Qüreyş-Kinanə və Qeys-Əylan qəbilə ittifaqları arasında baş vermişdi.

Bu kimi vəziyyətlərdə zəif insanlar güclülərin zülmünə uğrayır və haqları qəsb olunurdu. Bu cür halların qarşısını almaq üçün Məkkədə yaşayan bütün ailə və oymaqlardan gənc və yaşlıların üzv olduqları bir təşkilat qurulmuşdu. Bu təşkilat “*Hilf əl-Füzul*”, yəni fəzilətli insanların yığıncağı adlanırdı. Hilf əl-Füzul üzvləri bu ictimai təşkilata qoşularkən belə and içirdilər: “*Allaha and olsun ki, biz hamımız zalımdan məzlumun haqqını alıb geri verənə qədər zalıma qarşı məzlumla birlikdə mübarizə aparıb bir yumuruq kimi olacağıq*”. Məkkəli Abdullah ibn Cud’anın evi “*Hilf əl-Füzul*”un toplandığı məkan idi. Muhəmməd (s.ə.v) də gəncliyində bu təşkilatın üzvü olmuşdu. O, hətta Allahın Elçisi (s.ə.v) olduqdan sonra belə bu təşkilatı və onun üzlərini xeyirlə yad edir, orada iştirak etdiyi üçün şərəf duyur və belə deyirdi: “*Mən bu şərəfi, qırmızı yunlu bir dəvə sürüsünə belə dəyişmərəm, indi çağırsalar yenə də çağırışlarına cavab verərdim*”.

Mənbələrdə nəql olunan hadisələrdən “*Hilf əl-Füzul*”un Məkkədə böyük nüfuza və gücə sahib olduğu anlaşılır. Məsələn Həs’əm qəbiləsinə mənsub bir yəmənli Kə’bə ziyarəti üçün öz qızı ilə birlikdə Məkkəyə gəlmişdi. Məkkənin zəngin və nüfuzlu şəxslərindən Nubeyh ibn əl-Həccac xoşuna gəldiyi üçün yəmənlinin qızını zorla öz evinə aparmışdı. Qızın atasına kömək üçün “*Hilf əl-Füzul*”a müraciət etməsi tövsiyə olunmuş və onun müraciətindən sonra Nubeyhin evi təşkilatın üzvləri tərəfindən mühasirəyə alınmışdı. Nubeyh başqa çarəsinin olmadığını görüb qızı atasına təhvil vermişdi. Bir başqa hadisədə isə

Əzd qəbiləsinə mənsub bir tacir Übey ibn Xələf adlı məkkəli tacirə mal satmış, amma Übey əzdli tacirin pulunu ödəmək istəməmişdi. Çarəsiz qalan əzdli tacir "*Hilf əl-Füzul*"a müraciət etmişdi. Oradakılar ona "*sən Übeyin yanına get və ona de ki, indicə "füzul"luların yanından gəlirəm, onlar dedilər ki, ya borcunu ödəsin, ya da bizim gəlişimizi gözləsin*" demişdilər. Əzdli tacirin bu xəbəri çatdırmasından sonra Übey dərhal borcunu ödəmişdi.

Yuxarıda qeyd etdiyimiz kimi cahiliyyə dövrü Ərəbistanında iqtisadi həyatın əsasını ticarət, daha doğrusu tranzit ticarət təşkil edirdi. Hindistan və Çindən gəlib Bizans, şimali Afrika və Avropaya gedən ticarət yolları ərəb yarımadasından keçirdi. Bu dövrdə yarımadadan keçən iki əsas ticarət yolu var idi. 1) Şərq yolu-Oman, hind və iranlıların ticarət mallarının daşınması üçün istifadə olunurdu. 2) Qərb yolu-Yəmən limanlarından başlayıb Hicazdan keçərək Suriya və Bizans bazarlarına gedən yol. Bu yol çinli, hindli, bizanslı sənətkarların hazırladıqları əmtəənin daşınması üçün istifadə olunurdu.

Ərəbistanda hazırlanan dəri, dəvə yunu, bal, cins ərəb atları kimi ticarət malları həm də ixrac edilirdi. Bundan başqa hər il haram aylarda yarımadanın müxtəlif yerlərində ticarət yarmarkaları qurulurdu. Bu yarmarkaların bəziləri beynəlxalq, yəni əcnəbi tacirlərin də iştirak etdikləri yarmarkalar idi. Qurulduqları yer və vaxt dəqiq bilindiyi və sabit olduğu üçün hər il bu yarmarkalarda çox sayıda tacir iştirak edirdi.

Bu yarmarkalardan ən məşhuru Taif ilə Məkkə arasındakı Nəxlə adalanan əraziyə çox yaxın olan U'kaz adlı məntəqədə qurulan "*U'kaz*" yarmarkası idi. Bu yarmarka hər il zilqədə ayının ortasında qurulub ayın sonuna qədər davam edirdi. Ərəb qəbilələri ilə yanaşı İran, Hirə, Misir və Həbəşistandan da bu yarmarkaya böyük ticarət karvanları gəlirdi. Həmin vaxt U'kazda sadəcə tacirlər deyil ərəblərin ən məşhur şair, ədib və xətibləri də toplaşırdılar. Onlar burada qurulan kürsülərdə öz ədəbi əsərlərini oxuyur, bir növ yarışırdılar. Ən mahir natiqlər burada ərəb dilinin fəsahət və bəlağət imkanlarını nümayiş etdirirdilər. Ən çox bəyənilən yeddi şeer Kə'bənin divarına asılır və bir il burada qalırdı. Buna "*muəlləqatu's-səb'ə*", yəni "yeddi asılmış" deyilirdi. Buna görə də bəzi şərqşünaslar VI əsrdən 746-cı ilə qədər demək olar ki, 250 ilə yaxın müddətdə hər il qurulan bu yarmarkanı "Ərəbistanın dilçilik akademiyası" adlandırmışdılar.

Digər bir ticarət yarmarkası "*Dumətü'l-Cəndəl*" idi ki, Hicazın şimalında, indiki Səudiyyə-İordaniya sərhəddinə yaxın yerləşən eyni adlı yerdə qurulurdu. Bu bazar rəbiələvvəl ayının ilk günündən ayın ortasına qədər davam edirdi. Həm ərəb, həm də əcnəbi tacirlər burada iştirak edirdilər. "*Muşəqqər*" yarmar-

kası Bəni-Təmim qəbiləsi rəisləri tərəfindən Bəhreyn yaxınlığında qurulur, cəmaziələvvəl ayının ilk günündən ayın ortasına qədər davam edirdi. Bu yarmarkaya əsasən yarımadanın müxtəlif yerlərindən ərəb tacirləri toplaşırdılar. Lakin burada ərəb qəbilələrinin hər hansı birinin himayəsi altında olan əcnəbi tacirlər də iştirak edirdilər. "*Suhar*" yarmarkası Omanda rəcəb ayında qurulurdu. "*Dəbbə*" yarmarkası Omanın eyni adlı limanında, şaban ayının ilk iki həftəsi fəaliyyət göstərirdi. "*Dəbbə*" yarmarkası beynəlxalq yarmarka idi, hindli və çinli tacirlər gəmilərlə gətirdikləri malları burada satırdılar. "*Ədən*" yarmarkası Yəmənin eyni adlı şəhərində qurulur və ramazan ayının ilk on günlüyündə fəaliyyət göstərirdi. "*Ədən*" yarmarkası beynəlxalq yarmarka idi və burada ərəblərlə yanaşı hindli, çinli, iranlı, bizanslı tacirlər də iştirak edirdilər. Bundan başqa "*Səna*", "*Rabiyyə*", "*Zül-Məcaz*", "*Nəbat*", "*Həcər*" yarmarkaları da ilin müəyyən vaxtlarında fəaliyyət göstərirdi.

*Cahiliyyə Dövründə Məkkə Şəhəri*

İndi Məkkə şəhərinin mövcud olduğu ərazidə hələ qədim zamanlardan bəri Curhum qəbiləsi yaşayırdı. Curhumlular məhv olmuş Ad və Səmud qövmlərinin qalıqları idi. Curhumluların yaşadıqları bu əraziyə təqribən 3750-4000 il bundan əvvəl (e.ə. XVIII əsr) İbrahim peyğəmbər (ə.s) kənizi Həcər və oğlu İsmayılla (ə.s) birlikdə gəlmişdi. İbrahim peyğəmbər (ə.s) qədim Babilistanın Ur şəhərində doğulmuş və böyümüşdü. Mesopatomiyada aşkar edilmiş gil kitabələrdə onun adı "*Damik-İlşu*" kimi qeyd olunmuşdur. Damik-İlşu qədim babillilərin dilində "Tanrının Sevimlisi" (yəni Xəlilullah) mənasını ifadə edirdi. İbrahim peyğəmbər (ə.s) məşhur Babil kralı, qanunnamələr müəllifi Hammurapinin (e.ə.1792-1750) müasiri idi. İslam dini mənbələrində bu kralın adı "*Nəmrud*" kimi qeyd olunmuşdur. İbrahim peyğəmbərin (ə.s) insanları təktanrılıq (tövhid) dininə çağırması kral Nəmrudun ona və ətrafındakılara qarşı təzyiq və təqib başlatmasına səbəb olmuşdu. Zalımca qanunları ilə özünü ilah yerinə qoyan Nəmrudun bu təzyiq və təqiblərindən sonra İbrahim peyğəmbər (ə.s) doğma yurdunu tərk etmək məcburiyyətində qalaraq hicrət etmiş və aramilərin ölkəsinə, indiki Qüds şəhərinin olduğu yerə getmişdi. Burada tövhidə dəvəti davam etdirmiş və aramilərdən xeyli sayıda inanan onun ətrafına toplanmışdı. Həmçinin burada evlənmiş, ailə və övlad sahibi olmuşdu. Kənizi Həcərlə oğlu İsmayılı (ə.s) curhumluların yaşadıqları əraziyə gətirəndən sonra geri qayıdan İbrahim peyğəmbər (ə.s) sonrakı illərdə bir neçə dəfə bu yerə gəlmişdi. Bu gəlişlərindən birində oğlu İsmayılla (ə.s) birlikdə Kə'bəni inşa etmişdi. İbrahim və İsmayıl peyğəmbərlər bu ərazidə yaşayan insanlar arasında tövhid dininin yayılması üçün çalışmışdılar. İsmayıl

(ə.s) Curhum qəbiləsinin rəisi Mudadın qızı Səidə ilə, daha sonra da bu qəbilədən Əmr adlı bir şəxsin Railə adlı qızı ilə evlənmişdi. Bu iki qadından onun 12 oğlu dünyaya gəlmişdi. Bu 12 nəfərin nəslindən törəyən qəbilələrə Ədnanilər deyilirdi ki, yuxarıda onlar haqqında qısaca məlumat vermişdik.

İllər və əsrlər ötdükcə bu qəbilələr arasındakı təktanrılıq inancına xələl gətirilmiş, tövhid aradan qalxmış və bütpərəstlik ənənələri meydana çıxmışdı. Buna baxmayaraq Kə'bə bütpərəst ərəb qəbilələrinin ziyarət yeri olaraq qalmışdı. Hər il buraya yarımadanın dörd bir tərəfindən minlərlə insan axın etməkdə idi. Bu qədər çox insanın hər il eyni vaxtda Məkkədə toplaşması ticari və iqtisadi həyata da təsir edir, canlandırırdı. Beləcə bu ticarət sayəsində varlanıb böyük sərmayə sahibinə çevrilmiş, Qüreyş qəbiləsinə mənsub, Məkkə oliqarxik aristokratiyası formalaşmışdı. Bütün ərəblərin ziyarət yeri olan Məkkə və Kə'bəni öz nəzarətləri altında saxladıqları üçün bu aristokrat sinifin bütün ərəb qəbilələri üzərində siyasi-iqtisadi üstünlüyü var idi. Şəhəri idarə edən bu zümrəyə mənsub şəxslər "*Daru'n-Nədvə*" adlı yerdə toplanır, buradakı iclaslarda şəhər həyatı ilə bağlı müxtəlif qərarlar alırdılar. Daru'n-Nədvənin on daimi üzvü vardı. Allah Rəsulu (s.ə.v) bu üzvlərin İslamı qəbul etməsi üçün çox çalışmışdı. Çünki onların İslamı qəbul edəcəkləri təqdirdə tövhid əqidəsinin bütün Məkkədə yayılmasının daha asan olacağını düşünmüşdü. Lakin bunlardan sadəcə ikisi, Əbu Bəkr (r.ə) və Ömər ibn Xəttab (r.ə) Peyğəmbərin (s.ə.v) dəvətinə cavab verərək iman etmişdilər. Digərləri isə sadəcə İslamı qəbul etməməklə kifayətlənməmiş, ona qarşı düşməncəsinə, qatı və sərt mövqe tutmuşdular.

*Cahiliyyə Dövründə Yəsrib (Mədinə) Şəhəri*

Yəsrib şəhəri hələ qədim zamanlardan Əmaliq qövmünün yurdu kimi tanınmışdı. Əzd qəbiləsinin bir qolu Sə'ləbə ibn Əmrin rəhbərliyi altında Yəməndən köçüb indiki Suriya ərazisində məskunlaşmışdı. Sə'ləbənin ölümündən sonra oğulları arasında qəbilə rəisliyi səbəbiylə meydana çıxan ziddiyyətlərdən ötürü qardaşlardan Harisə ibn Sə'ləbə öz tərəfdarları ilə birlikdə Əmaliq qövmünün yaşadığı əraziyə gəlmişdi. Əmaliq qövmü bu vaxt artıq demək olar ki, məhv olmuş, nəsli tükənmişdi. Harisənin tərəfdarları əsasən Əzd qəbiləsinin qolları olan Əvs və Xəzrəc qəbilələrinə mənsub idilər. Bu iki oymaq daha sonra Yəsrib şəhərində yaşayan iki əsas qəbiləyə çevrilmişdi.

Bundan başqa Yəsrib ətrafındakı Xeybər, Vadiü'l-Qura, Fədək kimi ərazilərdə Qaynuqa, Nəzir və Qureyzə adlı üç yəhudi qəbiləsi də yaşayırdı. Bunlar adı İslami mənbələrdə *Buxtunnəsr* kimi qeyd olunan Babil kralı II Nabu-Kodonosorun (e.ə.605-562) Qüdsü işğal edib xarabazara çevirməsi vaxtı törətdiyi

yəhudi qətliamından və yəhudilərin Mesopatomiyaya sürgün etdirməsindən canını qurtarıb ərəb yarımadasına qaça bilmiş yəhudi qəbilələri idi. Yəhudilər kənd təsərrüfatı və ticarətlə məşğul olan Əvs və Xəzrəc ərəblərinə faizlə borc verir, borcunu vaxtında ödəyə bilməyənlərin əlindəki daşınmaz əmlakı zəbt edirdilər. Beləcə yəhudilər sayca az olmaqlarına baxmayaraq Yəsrib şəhərinin siyasi-iqtisadi həyatında üstünlük əldə etmişdilər. Əvs və Xəzrəc qəbilələri arasında qəbilə təəssübkeşliyi səbəbiylə tez-tez silahlı toqquşma baş verirdi. Yəhudilər bu iki qəbilə arasındakı ziddiyyətlərin qızışdırılması üçün əllərindən gələni edir, beləcə iki ərəb qəbiləsinin öz güclərini birləşdirməsinin qarşısı alınırdı. Bu da onların Yəsribdəki siyasi-iqtisadi hegemonluğunu gücləndirirdi. Adı çəkilən üç yəhudi qəbiləsindən başqa ərəb qəbilələri arasında da ibrani dinini qəbul etmiş ailə və oymaqlar var idi. Sayıları az olan bu yəhudilər ərəb mənşəli idilər, fəqət iudaizmə sitayiş edirdilər. Ərəbdilli yəhudilər yarımadanın cənubunda, Yəməndə də kompakt halda yaşamaqda idilər. İudaizmin Yəməndə yayılması III-IV əsrlərə təsadüf edir. İudaizm əsasən yəsribli yəhudilərin təsiri ilə yəmənli ərəb qəbilələri arasında yayılmışdı. Əbu Qureyb əl-Əsəd (390-420) adlı yerli hakimin bütpərəstlikdən yəhudiliyə keçməsi iudaizmin Yəməndəki ərəb qəbilələri arasında intişar etməsində mühüm rol oynamışdı.

Məkkədən fərqli olaraq Yəsribdə Daru'n-Nədvəyə bənzər qurumlaşmış bir dövlət aparatı yox idi. Buna görə də hicrətdən sonra Yəsribdə ilahi mənşəli qanunlarla nizamlanan bir cəmiyyət həyatının təsis olunması nisbətən asan olmuşdu. Allah Rəsulu (s.ə.v) bu cəmiyyəti əslində Məkkədə qurmuşdu. Oradakı müsəlman icma bütün işlərində yeganə mərce', müraciət yeri kimi Allahı və onun Elçisini (s.ə.v) tanımış, Daru'n-Nədvə istibdadını rədd etmişdilər. Qüreyş müşrikləri tərəfindən zülm və əziyyətə məruz qalmalarının əsas səbəblərindən biri də bu idi. Qur'andan ilham alaraq Məkkədə qurulmuş müsəlman cəmiyyəti sadəcə torpaqdan məhrum idi ki, buna da hicrətdən sonra Yəsribdə qovuşmuşdu.

# I. FƏSİL

# MUHƏMMƏD PEYĞƏMBƏRİN (S.Ə.V) SOYU

Allahın yer üzündəki son elçisi Muhəmməd (s.ə.v) Qureyş qəbiləsinin Haşim ailəsinə mənsub idi. O, iyirmi ikinci nəsildən Ədnanın nəvəsi idi. Ədnan isə İbrahim peyğəmbərin (ə.s) oğlu İsmayılın (ə.s) övladlarından idi. Muhəmmədin (s.ə.v) şəcərəsi, soy ağacı mənbələrdə belə qeyd olunur: Ədnan oğlu Məədd oğlu Nizar oğlu Mudar oğlu İlyas oğlu Müdrikə oğlu Xuzeymə oğlu Kinanə oğlu Nəzir oğlu Malik oğlu Fihr oğlu Qalib oğlu Lüəyy oğlu Kə'b oğlu Murrə oğlu Kilab oğlu Qusəyy (Zeyd) oğlu Əbdumənaf (Muğirə) oğlu Haşim (Əmr) oğlu Əbdülmüttəlib (Şeybə) oğlu Abdullah oğlu Muhəmməd (s.ə.v). Onun ulu babalarından Qusəyy ləqəbli Zeyd Qureyş qəbiləsinin rəisi olduğu dövrdə Məkkədə hakimiyyət Xuzaə qəbiləsinin əlində idi. Xuzaəlilər icad etdikləri bəzi yeni qaydalarla Kə'bəni ziyarətə gələnlərə əziyyət verirdilər. Bu vəziyyət ərəb qəbilələri arasında xuzaəlilərə qarşı narazılıq yaratmışdı. Qusəyyin səyi nəticəsində Quyreş qəbiləsi xuzaəliləri məğlub edərək Məkkədən qovub çıxarmağa müvəffəq olmuşdu. Bu hadisədən sonra Kə'bə və ziyarətlə bağlı məsələlər Qureyşin nəzarətinə keçmişdi. Qusəyy Kə'bənin ziyarətini asanlaşdırmaq üçün bir sıra tədbirlər görmüş və Məkkədə abadlıq işləri aparmışdı. Həmin vaxta qədər Kə'bənin ətrafında ev tikmək uğursuzluq əlaməti sayılırdı. O, bu adəti aradan qaldıraraq Kə'bə ətrafında evlərin tikilməsinə izn vermişdi.

Qusəyyin nəvəsi Haşim tacir idi və tez-tez Şam diyarına ticarət səfərlərinə gedirdi. Belə səfərlərdən birində o, bir müddət Yəsribdə qalmış və burada Bəni-Nəccar ailəsindən Əmr adlı varlı bir əsilzadənin Səlma adlı qızı ilə evlənmişdi. Şam diyarına növbəti ticarət səfərində xəstələnən Haşim Qəzzədə vəfat etmişdi. Səlmanın Haşimdən bir oğlu dünyaya gəlmişdi və bu uşağa Şeybə adı vermişdilər. Uşaq yeddi yaşına qədər Yəsribdə, anası və onun ailəsinin yanında böyümüşdü. Daha sonra əmisi Müttəlibin xahişi ilə anası onun Məkkəyə gedib atasının əqrəbalarının yanında yaşamasına izn vermişdi. Qureyşlilər Müttəlibin yanında tez-tez gördükləri bu oğlan uşağını tanımadıqları üçün "*yəqin köləsidir*" demişdilər. Bu səbəbdən də Şeybə Əbdülmüttəlib (Müttəlibin köləsi, qulu) ləqəbi ilə tanınmışdı. Əbdülmüttəlibin 10 oğlu, 6 qızı olmuşdur. Oğulları: Abbas, Həmzə, Abdullah, Əbu Talib, Zübeyr, Haris, Xəcl, Muvəqqim, Dirar, Əbu Ləhəb. Qızları: Safiyyə, Bəyza (Umm Hakim), Atiqə, Umeymə, Ərva, Bərra.

Bunlardan Abdullah, Əbu Talib və Zübeyrin anaları Əmr adlı məkkəlinin qızı Fatimədir. Yəni bu üçü ata və ana bir qardaşdırlar.

### Muhəmməd Peyğəmbərin (s.ə.v) Dünyaya Gəlməsi, Uşaqlıq və Gənclik İlləri

Əbdülmüttəlibin oğlu Abdullah Yəsrib əsilzadələrindən Vəhbin qızı Aminə ilə evlənmişdi. Bu nikahdan Allah Rəsulu Muhəmməd (s.ə.v) dünyaya gəlmişdi. Abdullah tacir idi və o, da babaları kimi Yəmən-Suriya ticarət yolu ilə tez-tez səfərə çıxırdı. Evləndikdən bir müddət sonra Abdullah Yəsribdə vəfat etmişdi. Mənbələr Muhəmmədin (s.ə.v) yuxarıda haqqında bəhs etdiyimiz fil hadisəsindən 50 gün sonra, rəbiələvvəl ayının 12-si, miladi təqvimlə 20 aprel 571-ci ildə Məkkədə dünyaya gəldiyini qeyd edirlər. Onun doğumunun şərəfinə ziyafət verən babası Əbdülmüttəlibdən qonaqlar uşağın adını nə qoyacağını soruşmuşlar və o: "*mən ona Muhəmməd (təriflənmiş, mədh edilmiş, öyülmüş) deyəcəyəm. Diləyirəm ki, göydə Allah, yerüzündəki məxluqat da onu daim xeyirlə yad etsinlər*" deyə cavab vermişdi.

Atası Abdullah onun dünyaya gəlməsindən bir neçə həftə əvvəl vəfat etdiyi üçün babası Əbdülmüttəlib gəlini Aminə və nəvəsi Muhəmmədi (s.ə.v) öz himayəsinə götürmüşdü. Həmin dövrdə ərəblərdə belə bir adət vardı ki, yeni dünyaya gəlmiş körpələri süd analarına verirdilər. Bu süd anaları əksərən bədəvi ərəb qəbilələrinə mənsub qadınlar olurdular. Onlar ilin müəyyən vaxtlarında Məkkəyə gələrək burada varlı ailələrin uşaqlarına pul müqabilində süd analığı edirdilər və özləri ilə səhraya aparırdılar. Süd analığı üçün Məkkəyə gələn bədəvi qadınlar varlı ailələrin uşaqlarına baxmağa üstünlük verdikləri üçün ehtimal ki, yetim bir körpə ilə maraqlanmamışdılar. Əmisi Əbu Ləhəbin kənizi Suveybə bir müddət körpə Muhəmmədə (s.ə.v) baxmışdı. Suveybə Muhəmməddən (s.ə.v) bir neçə yaş böyük olan əmisi Həmzənin (r.ə) də süd anası olmuşdur. Bu səbəbdən Muhəmməd (s.ə.v) öz yaşıdı olan Həmzə (r.ə) ilə süd qardaşı sayılırdı. Həvazin qəbiləsinin Bəni-Sə'd oymağına mənsub bəzi bədəvilər bu vaxt Məkkəyə gəlmişdilər. Bunlardan Həlimə adlı kasıb bir qadın mindiyi heyvanın zəifliyi və astagəlliyi səbəbiylə Məkkəyə gec gəlmişdi. Zəngin ailə uşağı tapa bilməmiş və əli boş qayıtmamaq üçün körpə Muhəmmədi (s.ə.v) özü ilə aparmışdı. Həlimə sonralar bundan əsla peşmanlıq duymayacaqdı. Bu körpənin ailəsinə gəlməsindən sonra Həlimənin xeyir və bərəkəti artmışdı.

Muhəmməd (s.ə.v) altı yaşında ikən anası Aminə, zənci cariyə Umm Əymən Bərəkə və bir başqa kölə ilə birlikdə Məkkədən Mədinəyə, anasının əqrəbalarının yanına getmişdilər. Mədinədə Aminənin mənsub olduğu

Nəccar ailəsinə mənsub bir şəxsin evində qalmışdılar. Mədinədən Məkkəyə qayıdarkən Aminə qəflətən Əbva adlı yerdə vəfat etmişdi. Anasının vəfatı 6 yaşlı Muhəmmədi (s.ə.v) çox kədərləndirmişdi. Mənbələr sonrakı illərdə səfər vaxtı hər dəfə Əbvadan keçəndə Muhəmmədin (s.ə.v) anasının məzarını ziyarət edib onun üçün göz yaşı tökdüyünü qeyd edirlər.

Umm Əymən Bərəkə, Aminənin dəfnindən sonra azyaşlı Muhəmməd (s.ə.v) ilə birlikdə Məkkəyə gəlmiş və uşağı Əbdülmüttəlibə vermişdi. Umm Əymən Peyğəmbərin (s.ə.v) atası Abdullahın kənizi idi. Bu qadın ata-anasını itirmiş Muhəmmədə (s.ə.v) öz övladı kimi qayğı göstərmişdi. Allah Rəsulu (s.ə.v) Umm Əyməni (r.ə) daim xeyirlə yad edir, onun haqqında "*anamdan sonra mənim üçün ana olmuşdur*" deyirdi. Atasını və anasını itirmiş Muhəmməd (s.ə.v) bundan sonra 108 yaşında olan babasının qayğı və himayəsində yaşamışdı. Bu hadisədən iki il sonra Əbdülmüttəlib vəfat edərkən oğlu Əbu Talibə nəvəsinə qayğı göstərməsini vəsiyyət etmişdi. Əbu Talib künyəsi ilə tanınan Əbdumənaf ibn Əbdulmuttəlib kasıb, lakin yumuşaq ürəkli və şəfqətli bir insan idi. Azyaşlı Muhəmməd (s.ə.v) əmisinə kömək məqsədiylə məkkəlilər üçün muzdla çobanlıq etmişdi. Daha sonrakı yeniyetməlik illərində o, əmiləri Əbu Talib və Zübeyrlə birlikdə ticarət səfərlərinə çıxmağa başlamışdı. Yeniyetməlik illərində Muhəmməd (s.ə.v) məkkəli müşriklərin heç bir dini ayin və bayramlarında iştirak etməmiş, onların bütlərini ziyarət etməmişdi. Bir dəfə bibiləri Muhəmmədin (s.ə.v) Buvanə bayramında iştirak etməsi üçün təkid etmişdilər. Buvanə bayramı müşrik ərəblərin bütlərə qurban kəsib əyləndikləri dini mərasim idi. Mərasim yerinə yollanan gənc Muhəmməd (s.ə.v) qısa müddət sonra qorxudan rəngi ağarmış vəziyyətdə evə qayıtmış və daha əvvəl görmədiyi, tanımadığı adamların onu hədələyərək evə qayıtması barədə xəbərdarlıq etdiklərini bildirmişdi.

Ölkələrarası ticarət həm çox xərc tələb edən maddi baxımdan riskli, eyni zamanda təhlükəli bir iş olduğu üçün məkkəli zəngin tacirlərin heç də hamısı bu işə girişməzdilər. Muhəmməd (s.ə.v) gənclik illərində ticari fəaliyyətə başlamışdı. O, bir müddət Qeys ibnü's-Sa'ib adlı məkkəli tacirlə şərikli ticarətlə məşğul olmuşdu. Qeys çox uzun illər Muhəmmədi (s.ə.v) xeyirlə yad edib onun dürüstlüyünü və nəzakətini tərifləmişdi. "*Onunla səyahətə çıxakən əgər ona bir şey əmanət etsəm mənimlə tam hesablaşıb haqqımı ödəmədən evinə getməzdi. Səyahətdən qayıdanda digər ortaqlarım ilk olaraq işdən söhbət açarkən, Muhəmməd (s.ə.v) həmişə əvvəlcə xətrimi və halımı soruşardı*" deyə onu yad etmişdi Qeys.

Hər kəs uzaq ticarət səfərlərinə çıxa bilmədiyi üçün çox vaxt bir neçə varlı şəxs etibar etdikləri bir tacirə pul verərək onunla şərik olurdular. Yəni uzaq

səfərlərə çıxan tacirlər bir neçə varlı şəxsin öz sərmayələrini birləşdirmələri nəticəsində meydana çıxan sərmayəni işlədirdilər. Muhəmməd (s.ə.v) ilə məkkəli Əsəd qəbiləsinə mənsub varlı və dul qadın Xədicə (r.ə) arasındakı münasibətlər də bu zəmində başlamışdı. Onların ilk dəfə nə vaxt ticari ortaqlıq qurduqları dəqiq bilinmir, amma ilk dəfə Muhəmmədin (s.ə.v) Hubaşə və Curaş yarmarkalarında Xədicənin (r.ə) adına ticari fəaliyyətlə məşğul olduğu məlumdur. Xədicə (r.ə) böyük miqdarda əmtəə verərək Muhəmmədi (s.ə.v), öz köləsi Meysərə və qohumu Xuzeymə ilə birlikdə, Qüds yaxınlığındakı Busra qəsəbəsinə göndərmişdi. Xədicə (r.ə) bu ticari səfərdən gözlənilәndən iki qatı artıq qazanc götürmüşdü. Daha sonralar isə onların arasındakı iş və dostluq əlaqəsi daha da irəliləmiş, Xədicə (r.ə) Muhəmmədin (s.ə.v) ziyarətlərini qəbul etməyə başlamışdı. Zaman keçdikcə Xədicənin (r.ə) Muhəmmədə (s.ə.v) olan hörməti sevgiyə çevrilmiş və o, rəfiqəsi Nufeysə adlı bir qadın vasitəsi ilə ona evlənmə təklifi etmişdi. Muhəmməd (s.ə.v) bu vaxt 25 yaşlı yaraşıqlı bir gənc idi. O, vüqarlı, lakin təvazökar, xeyirxah, ümmi (oxuyub yazmağı bilməyən), lakin parlaq zəkalı və dürüst bir insan idi.

Şəmaili-Nəbi (peyğəmbərin zahiri görünüşünü) yazanlar Muhəmmədin (s.ə.v) iri qara gözlərinin və kəskin baxışının olduğunu, hətta Sürəyya bürcündəki ulduzları hər hansı bir vasitə olmadan saya biləcək qədər dəqiq görə bildiyini qeyd edirlər. Dərisinin rəngi ağ idi, mütanasib dodaqları vardı. Dişlərini isə müəlliflər "*yaqut bir qutunun içində sıra ilə düzülmüş mirvarilərə*" bənzədirdilər. Alnı geniş idi. Qaşları burnunun üstündə birləşəcək formada yay kimi idi. Burnu biraz uzun və gövsvari idi. Saçları nə düz, nə də qıvrım deyil, bu ikisinin arasında, dalğalı idi. Saç və saqqalının baxımına xüsusi diqqət göstərir, ətriyyatdan istifadə etməyi xoşlayır, saçlarını bəzən çiyinlərinə qədər uzadardı. Orta boylu idi. Şirin səsi, aydın və səlis nitqi var idi. O qədər yavaş danışardı ki, dinləyən tələffüz etdiyi sözləri saya bilərdi.

Xədicə (r.ə) əsilzadə və varlı olmaqla yanaşı gözəl bir qadın idi. Həyat yoldaşının vəfatından sonra onunla evlənmək istəyənlər olsa da o, bu cür təklifləri qəbul etməmişdi. Bəzi tarixi rəvayətlər Xədicənin (r.ə) bu vaxt 40 yaşında olduğunu qeyd etsələr də İbn Həbib əl-Bağdadi və Əhməd əl-Bəlazuri kimi müəlliflər bu vaxt Xədicənin (r.ə) 28 yaşında olduğunu yazırlar. Xədicə (r.ə) daha əvvəl Əbu Halə Nəbbaş ət-Təmimi adlı bir qüreyşli ilə evli olmuş, bu nikahdan Haris ibn Əbi Halə və Zubeyr ibn Əbi Halə adlı oğulları dünyaya gəlmişdir. Onların hər ikisi Peyğəmbərin (s.ə.v) dəvətinə icabət edərək müsəlman olmuşdular. İlk evlilikdən olan 2 övladının yaşını da nəzərə aldıqda Xədicənin (r.ə) Muhəmmədlə (s.ə.v) evləndiyi vaxt 40 yaşında olması mümkün-

süz görünür. Çünki həmin dövrdə ərəblərin adət-ənənələrinə görə qız uşaqları çox tez, büluğ yaşına çatanda evləndirilirdilər. Atası öldüyü üçün, Xədicə (r.ə) bu evliliyi gerçəkləşdirə bilməkdən ötürü əmisi Əmr ibn əl-Əsədin razılığını almalı idi. Belə anlaşılır ki, bu iş biraz çətinliklə başa gəlmiş, inadkar əminin öz qardaşı qızının istəyi ilə razılaşmaqdan başqa çarəsi qalmamışdı. Hicrətdən 28, risalətdən isə 15 il əvvəl, miladi tarixlə 595-ci ildə evlənən Muhəmməd (s.ə.v) ilə Xədicənin (r.ə) 6 övladı dünyaya gəlmişdi. İlk övladları yeriməyə başladığı çağlarda vəfat edən Qâsımdır. Daha sonra isə Zeynəb (r.ə), Ruqəyyə (r.ə), Umm Külsum (r.ə), Fatimə (r.ə) və Abdullah dünyaya gəlmişdilər. Abdullah da körpə ikən vəfat etmiş, onların bu nikahdan olan sadəcə qız uşaqları böyüyüb başa çatmışdılar. Həmin illərdə qıtlıq baş vermiş, böyük ailəsi olan Əbu Talib uşaqlarının dolanacağını təmin etməkdə xeyli çətinlik çəkmişdi. Muhəmməd (s.ə.v) maddi vəziyyəti daha yaxşı olan əmisi Abbasa Əbu Talibin uşaqlarından ikisini öz himayələrinə götürməyi təklif etmişdi. Beləcə Əbu Talibin oğullarından Cə'fər (r.ə) əmisi Abbasın, Əli (r.ə) isə öz əmisi oğlu Muhəmmədin (s.ə.v) evində böyüməyə başlamışdılar.

Ərəb yarımadasında ardı-arası kəsilməyən qəbilələrarası müharibələrdən birində Zeyd adlı bir yeniyetmə əsir düşmüş və satılıb əldən-ələ keçdikdən sonra Məkkəyə gətirilmişdi. Xədicə (r.ə) Zeydi satın almışdı. Evləndikdən sonra Xədicə (r.ə) köləsi Zeydi ərinə hədiyyə etmişdi. Bir müddət sonra Zeydin ailəsi onun yerini öyrənmiş, atası və əmisi fidyə pulu ilə Məkkəyə gələrək Muhəmmədə (s.ə.v) fidyəsini ödəyərək oğullarını özləri ilə aparmaq istədiklərini bildirmişdilər. Muhəmməd (s.ə.v) onlara "*Oğlunuz yanımda öz övladım kimi yaşayır, bunu istədiyiniz adamdan soruşa bilərsiniz, əgər özü getmək istəyirsə, fidyə ödəmənizə ehtiyac yoxdur, gedə bilər*" demişdi. Lakin Zeyd ibn Harisə (r.ə) "*Mən ondan gördüyüm yaxşılıqları dünyadakı hərkəsdən və hərşeydən üstün tuturam*" deyərək atası və əmisi ilə getmək istəməyib Muhəmmədin (s.ə.v) yanında qalmaq istədiyini bildirmişdi. Onun bu sözündən sonra Muhəmməd (s.ə.v) Kə'bəyə gələrək Zeydi köləlikdən azad etdiyini və oğulluğa götürdüynü elan etmişdi. Bir müddət sonra Muhəmməd (s.ə.v) Zeyd ibn Harisə ibn Şurahil əl-Kəlbini (r.ə) Umm Əymən Bərəkə (r.ə) ilə evləndirmişdi. Zeydin (r.ə) oğlu Usamə (r.ə) bu nikahdan dünyaya gəlmişdi.

**Risalətin Başlanması**

Miladi 605-ci ildə Kə'bənin buxurdanlıqlarında yanan xoş ətirli otlardan qopan köz küləyin təsiri ilə Kə'bənin ötürüsünə sıçrayaraq böyük bir yanğının meydana gəlməsinə səbəb olmuşdu. Bu hadisədən bir müddət sonra ya-

ğan şiddətli yağışın səbəb olduğu sel yanğından ağır ziyan görmüş binanın vəziyyətini daha da pisləşdirmişdi. Bu hadisələr baş verərkən Muhəmməd (s.ə.v) 35 yaşına qədəm qoymuşdu. Məkkənin zadəgan və ağsaqqalları məbədin yenidən inşası qərarını almışdılar. Şəhər əhalisi öz aralarında maddi vəsait toplayaraq bu işi görmək qərarına gəlmiş, lakin faiz, fahişəlik kimi peşələrdən gəlir əldə edənlərdən bu iş üçün vəsait almamaq barədə anlaşmışdılar. Bu vaxt Misirdən Yəmənə kilsə inşaatı üçün tikinti materialı daşıyan Bizans gəmisi Qırmızı dənizdə fırtınaya düşərək qəzaya uğramış və Məkkəyə yaxın olan Şuaybə sahillərinə sığınmaq məcburiyyətində qalmışdı. Məkkəlilər qəzazədələri qonaq edib onları çətin vəziyyətdən qurtarmış, gəmidəki mərmər, dəmir, ağac kimi tikinti materiallarını münasib qiymətə onlara satmaları barədə razılaşmışdılar. Qəzaya uğramış gəmidəkilərdən Kiprli usta Baqum geri qayıtmayıb Məkkədə qalmışdı. Kə'bənin yenidən inşa edilməsi üçün köhnə binanın tamamən dağıldılması lazım idi. Batil inancları olan məkkəli müşriklər bu məsələdə uzun müddət tərəddüd göstərmişdilər. Nəhayət İbrahim peyğəmbərin (ə.s) inşa vaxtı qoyduğu yaşıl rəngli təməl daşlarına çatana qədər Kə'bənin köhnə divarlarını yıxılmışdı. Qısa müddətdə Kə'bə əvvəl olduğu formada, kub şəklində yenidən tikilib inşası başa çatdırılmışdı. Kə'bənin inşasında Muhəmməd (s.ə.v) də işləmiş, daş və kərpic daşımışdı. Hacərü'l-Əsvədin (qara daş) yerinə qoyulması məsələsinə gəldikdə isə oymaq və ailələr arasında ciddi anlaşmazlıq və mübahisə meydana gəlmişdi. Hər ailə bu şərəfli işin özləri tərəfindən görülməsini arzu edirdi. Mübahisənin qızğın vaxtında Məkkənin zadəganlardan biri belə bir təkliflə çıxış etmişdi: "*Gözləyək, indi buraya ilk kim gəlsə qoy bu məsələdə qərarı o, versin və hər kəs onun qərarı ilə razılaşsın*". Allah bu şəxsin Muhəmməd (s.ə.v) olmasını murad etmişdi. Oradakılardan heç kim Muhəmmədin (s.ə.v) dürüstlüyünə şübhə etmədiyi üçün onun verdiyi qərarla razılaşmışdılar. Muhəmməd (s.ə.v) gətirib ortaya bir örtü sərmiş, hacərü'l-əsvədi örtünün üstünə qoymuş, sonra hər ailədən bir nəfər örtünün bir kənarından tutaraq daşı qoyulacağı yerə qədər daşımışdılar. Daşı indi olduğu yerə isə Muhəmməd (s.ə.v) öz əlləri ilə yerləşdirmişdi.

Kə'bənin inşası bitəndən sonra məkkəli müşriklər öz bütpərəst adətləri üzrə yenidən binanı bütlərlə təchiz etməyə başlamışdılar. Kə'bə və ətrafında 360-a yaxın büt mövcud idi. Binanı içinə isə İbrahim (ə.s), İsmayıl (ə.s), Məryəm (r.ə) və İsanın (ə.s) təsvir edildiyinə inanılan şəkilləri qoyulmuşdu. Beləcə tövhid əqidəsinə uyğun ibadət üçün təməli atılmış bu bina yenidən panteona dönmüşdü.

Heç vaxt öz həmvətənlərinin Allaha şərik qoşduqları bütlərə ibadət etməyən və bütpərəst ayinlərində iştirak etməyən, hənif olub tək Allaha inanan

Muhəmmədin (s.ə.v) həyatının bu mərhələsi onun ruhi və mənəvi təfəkkür və idrak dövrdür. O, vaxtilə babası Əbdülmüttəlibin etdiyi kimi ramazan ayında Məkkədəki evinin yaxınlığında dağdakı Hira mağarasına gedərək orada inzivaya çəkilirdi. O, coşğun ruh halını inzivaya çəkilərək tək başına qaldığı vaxtlarda təskin edə bilir, təsəlli tapırdı. Bəzən xanımı ona yemək göndərir, bəzən də o, özü qısa müddət üçün evinə gəlirdi. İllər keçdikcə hər ramazan ayında Hira mağarasında tək qaldığı müddətə gördüyü açıq və aydın röyaların sonradan həyatda bir-bir gerçəkləşməsi, qulağına qəribə səslərin gəlməsi, kimin isə ona adı ilə xitab edib salam verməsi kimi hallar Muhəmmədi (s.ə.v) təəccübləndirməklə yanaşı, həm də qorxudurdu. Miladi tarixlə 611-ci ilin ramazan ayından altı ay əvvəl Muhəmmədin (s.ə.v) qırx yaşı tamam olmuşdu. Həmin ilin ramazan ayında da o, adəti üzrə Hira mağarasında tək başına qalaraq, Allaha dua və təfəkkürlə məşğul olmuşdu. Ramazan ayının son on günündəki gecələrdən birində Muhəmməd (s.ə.v) mağarada o vaxta qədər görmədiyi və eşitmədiyi bir varlıq gördü. Mənbələr onun özünün bu hadisəni belə nəql etdiyini qeyd edirlər: "*Mənə özünün Cəbrayıl (ə.s) olduğunu və Allahın yer üzündə son elçisi olaraq məni seçdiyini bildirmək üçün gəldiyini söylədi. O, mənə necə dəstəmaz alıb paklanmaq lazım olduğunu öyrədəndən sonra mənə "oxu" deyə nida etdi. Mən "oxumağı bacarmıram" deyəndən sonra məni qollarının arasına alıb sıxdı*". Bu hal üç dəfə təkrarlanandan sonra Cəbrayıl (ə.s) aşağıdakı cümlələri söyəldi:

**اقْرَأْ بِاسْمِ رَبِّكَ الَّذِي خَلَقَ. خَلَقَ الْإِنسَانَ مِنْ عَلَقٍ. اقْرَأْ وَرَبُّكَ الْأَكْرَمُ. الَّذِي عَلَّمَ بِالْقَلَمِ. عَلَّمَ الْإِنسَانَ مَا لَمْ يَعْلَمْ.**

*(Yoxdan var edib) yaradan Rəbbinin adı ilə oxu! O, insanı ələqdən (embriondan) yaratdı. Oxu! Sənin Rəbbin ən böyük kərəm sahibidir! O Rəbbin ki, qələmlə (yazmağı) öyrətdi. (O Rəbbin ki) insana bilmədiklərini öyrətdi.*

Allah Rəsulu Muhəmmədə (s.ə.v) vəhy olunan bu ilk ayələr Qur'ani-Kərimin Ələq surəsinin ilk beş ayəsi idi. Daha sonrakı günlərdə Məzzəmmil və Müddəssir surələrinin ayələri vəhy edilmişdi. İlk ayələr nazil olarkən Allah Rəsulunun (s.ə.v) özündən başqa vəhyin necə gerçəkləşdiyini görən olmamışdı. Lakin Qur'ani-Kərimin nazil olaraq tamamlandığı sonrakı 23 il ərzində vəhyin necə baş verdiyi bir çoxları tərəfindən görülmüş, Allah Rəsulundan (s.ə.v) soruşulmuş və müşahidə edilmişdi. Vəhyin necə baş verdiyini soruşanlara Allah Rəsulu (s.ə.v) demişdi: "*bəzən (metal bir cismə vurularkən çıxan) zınqırov səsinə bənzər bir səs eşidirəm ki, bu vəhyin ən şiddətlisidir. Səs kəsiləndən sonra (mələk tərəfindən) deyilmiş hər şeyin yaddaşıma həkk olunduğunun şahidi oluram*". Bəzən isə mələk Cəbrayıl (ə.s) insan qiyafəsində Allah Rəsuluna

(s.ə.v) görünərək onunla danışmışdır. Bəzən vəhy gələrkən Allah Rəsulunun (s.ə.v) bədəninin qıc olduğu, dodaqlarının tərpəndiyi və vəhy kəsilənə qədər bu şəkildə qaldığı görünmüşdür. Bəzən isə vəhy gələrkən o çiynindəki örtüsünü başına çəkərək o vəziyyətdə qalır, bu vaxt üzü qızarır, alından şiddətlə tər axırdı. Dəvənin belində səyahət edərkən vəhy gəldiyi vaxt isə hevyan ağırlığa dözə bilmir, böyürərək yerə otururdu. Zeyd ibn Sabitin (r.ə) "*bir gün bir neçə adamla birlikdə oturmuşduq. Mən Allah Rəsulunun (s.ə.v) yanında oturmuşdum, belə ki, dizi dizimin üstündə idi. Birdən elə bir ağırlıq hiss etdim ki, sanki çanaq sümüyüm sınacaqdı. Əgər bu Allah Rəsulu (s.ə.v) yox başqa bir adam olsaydı, qışqırıb ayağa qalxardım*" dediyi nəql olunur.

Vəhyin başladığı ilk dövrlərdə Allah Rəsulu (s.ə.v) eşitdiklərini yüksək səslə təkrarlayardı. Ancaq Yəsribə hicrətdən qısa müddət əvvəl Qiyamət surəsinin 16-cı və Taha surəsinin 114-cü ayələrindəki xəbərdarlıqla bu vərdişindən əl çəkdi. Vəhy tamamən sona çatana qədər səssiz və sakit durur, sonra ilahi xəbəri ətrafındakılara çatdırmaq üçün vəhy katiblərinə yazdırırdı.

İlk vəhyə məzhər olduğu vaxtlarda Allah Rəsulu (s.ə.v) o dərəcədə qorxmuşdu ki, bunun şeytanın bir aldatmacası olduğunu belə zənn etmişdi. Xanımı Xədicənin (r.ə) "*Qorxma, Allah səni əsla darda qoymaz, Allahdan sənə ancaq yaxşılıq gələcəkdir, çünki sən yaxınlarına kömək edir, ailənə baxırsan, dürüstlüklə qazanırsan, yetimlərə sığınacaq verirsən, doğru söz danışırsan, əmanətə xəyanət etmirsən, köməyə çağırana yardıma tələsirsən, kasıblara qarşı şəfqətli və nəzakətlisən*" deyərək ona təskinlik vermişdi. Daha sonra Xədicənin (r.ə) tövsiyəsi ilə Allah Rəsulu (s.ə.v) dostu Əbu Bəkrlə (r.ə) birlikdə Xədicənin (r.ə) qardaşı oğlu Vəraqənin yanına getmişdi. İsəvi olan Vəraqə bu vaxt artıq gözləri tutulmuş yaşlı bir adam idi. Allah Rəsulu (s.ə.v) ona baş verənləri danışandan sonra Vəraqə "*Xeyr, bu eynən Musanın (ə.s) başına gələn şeydir. Bu əsla şeytani bir hal ola bilməz, əgər mən həyatda olsam ilahi təbliğ vaxtı rastlaşacağın çətinliklərdə sənə əlimdən gələn köməyi edəcəyəm*" demişdi. Bir başqa vaxt isə Xədicə (r.ə) ona "*mələyi gördüyün vaxt mənə söylə*" demişdi və bir gün Allah Rəsulu (s.ə.v) xanımına "*o, buradadır*" dediyi vaxt Xədicə (r.ə) ərinin gəlib sağ tərəfində oturmasını istəmişdi. Daha sonra Xədicə (r.ə) onun sol tərəfində və qaşısında oturmuş və hər dəfə də "*onu hələ də görürsənmi?*" sualına "*bəli, görürəm*" cavabını almışdı. Daha sonra Xədicə (r.ə) ərini mehribanlıqla qucaqlayıb eyni sualı verdikdə Allah Rəsulu (s.ə.v) "*xeyr, onu atıq görmürəm*" deyə cavab vermişdi. Bu hadisədən sonra Xədicə (r.ə) Allah Rəsuluna (s.ə.v) "*mən artıq onun həqiqətən mələk olduğuna əminəm, çünki şeytan bizi bu məhrəm vəziyyətimizdə əsla tərk etməzdi*" demişdi.

Mənbələr ilk vəhy dövrü ilə ikinci vəhy dövrü arasında bir fasilə dövrünün olduğunu qeyd edirlər. Bu dövr Allah Rəsulu (s.ə.v) üçün bir mənəvi və ruhi kamilləşmə dövrü olmuşdu. Lakin məkkəli müşriklərin Allah Rəsuluna (s.ə.v) "*şeytanın səni tərk etdi*" kimi sözlərlə sataşmaları onun hüzn və kədərə qapılmasına səbəb olmuşdu. Bu dövrdə yaxınları, qohumları ilə olan əlaqələri demək olar ki, qopmuş və o, bir çox dəfə Kə'bənin həyətində gecələməli olmuşdu. Buna baxmayaraq o, ibadətlərlə daim ruhunu, qəlbini təmizləməklə və insanlara yaxşılıq etməklə məşğul olmuşdu. Belə bir həyat tərzi onun arzu və istəkləri ilahi iradənin içində əriyib getmiş insan kimi kamilləşməsini təmin etmişdi. İlk vəhydən xeyli müddət sonra müşrik həmşəhərlilərinin istehzalarına cavab olaraq Cəbrayıl (ə.s) Duha surəsini vəhy etmək üçün gəldi:

**وَالضحَى وَاللَّيْلِ إِذَا سَجَى مَا وَدعَكَ رَبكَ وَمَا قَلَى وَلَلْآخِرَةُ خَيْرٌ لَكَ مِنْ الْأُولَى وَلَسَوْفَ يُعْطِيكَ رَبكَ فَتَرْضَى أَلَمْ يَجِدْكَ يَتِيمًا فَآوَى وَوَجَدَكَ ضَالًّا فَهَدَى وَوَجَدَكَ عَائِلًا فَأَغْنَى فَأَما الْيَتِيمَ فَلَا تَقْهَرْ وَأَما السائِلَ فَلَا تَنْهَرْ وَأَما بِنِعْمَةِ رَبكَ فَحَدثْ**

*"And olsun səhərə, and olsun sakitləşməkdə olan gecəyə ki, sənə vəhy nazil etməməklə Rəbbin səni nə tərk etdi, nə də sənə acığı tutdu. Şübhəsiz ki, axirət sənin üçün dünyadan daha xeyirlidir! Həqiqətən, Rəbbin sənə bəxş edəcək və sən (Ondan) razı qalacaqsan! Məgər O, səni yetim ikən tapıb sığınacaq vermədimi?! Səni şaşqın vəziyyətdə tapıb yol göstərmədimi?! Səni yoxsul ikən tapıb dövlətli etmədimi?! Elə isə yetimə zülm etmə! Dilənçini də (qapıdan) qovma! Və Rəbbinin sənə olan nemətindən söhbət aç!"*

Allah Rəsulu (s.ə.v) qatı bütpərəst, Allaha şərik qoşaraq ibadət etməyi nəsillərdən bəri adət halına gətirmiş insanları islah etməklə ilahi vəzifəni yerinə gətirmək məcburiyyətində idi. Bu səbəbdəndir ki, Qur'anın ilk vəyh olunan ayələri əsasən bu iki problem üzərində durmaqda idi: 1-Heçbir şəriki olmayan, qüdrət və qüvvəti nəhayətsiz və hər şeydən xəbərdar olan Allaha iman, 2-Sadəcə xeyirli və gözəl işlər görməklə, saleh əməllər işləməklə sırati-müstəqimdə, yəni doğru yolda irəliləmək.

Allah Rəsulundan (s.ə.v) əvvəl də ərəb cəmiyyətində həniflər, yəni sadəcə tək Allaha ibadət edən şəxslər olmuşdu. Bunlar haqqında yuxarıda söhbət açmışdıq. Lakin bu insanlarla Allah Rəsulu (s.ə.v) arasında mühüm bir fərq var idi. Onların şəxsi həyatlarında bütlərə sitayiş etməmələri, Allaha şərik qoşaraq ibadət etməmələri, hətta bəzən öz həmvətənlərinin inanclarını tənqid edən söz söyləmələri cəmiyyətdə təlatümə səbəb olmamış, bu fəaliyyətləri fərdi planda qalmışdı. Lakin Allah Rəsulu (s.ə.v) bütpərəstlik, Allaha şərik qoşaraq ibadət

etmənin aradan qaldırılması üçün açıq təbliğ və dəvət vəzifəsinə təhkim edilmişdi. İlk vəhy dövründən sonrakı üç il ərzində onun Allah Rəsulu (s.ə.v) olduğuna iman gətirmiş sadəcə bir neçə nəfər var idi. Bunlar xanımı Xədicə (r.ə), oğulluğu Zeyd ibn Harisə (r.ə), hələ yeniyetmə yaşlarında olan əmisi oğlu Əli (r.ə) və dostu Əbu Bəkr (r.ə) idilər. İkinci vəhy dövündəki dönüş nöqtəsi Şüəra surəsinin 214-cü ayəsinin vəhy olması ilə başladı.

وَأَنذِرْ عَشِيرَتَكَ ٱلْأَقْرَبِينَ

“*Və ən yaxın qohumlarına xəbərdarlıq et!*”

Ayə açıq təbliğ və dəvəti əmr edirdi. Mənbələrə görə Allah Rəsulu (s.ə.v) bu ayənin nazil olmasından sonra bir ay boyunca evindən çıxmamış, belə ki, xəstələndiyini zənn edən bibiləri evinə gələrək onun əhvalından xəbərdar olmaq istəmişdilər. Onun məqsədindən xəbərdar olan bibiləri ona qeyzlənməmiş, hətta yaxın qohumlarını toplayaraq onlarla söhbət etməyi öyüdləmişdilər. Lakin əmisi Əbu Ləhəbi çağırmamağı tövsiyə etmişdilər. Allah Rəsulunun (s.ə.v) evində ziyafətə toplaşan yaxın qohumları mühüm bir mövzu üçün toplandıqlarını ağıllarına belə gətirmədən dağılışıb getmişdilər. Allah Rəsulu (s.ə.v) ikinci dəfə eyni məqsəd üçün təşəbbüs etmiş, bu dəfə çağırılmadığı halda Əbu Ləhəb də bu qonaqlıqda iştirak etmişdi. Belə görünür ki, bibiləri tövsiyələrində haqlı imişlər. Çünki Allah Rəsulu (s.ə.v) Allah tərəfindən elçilik vəzifəsi ilə vəzifələndirildiyini və bunun mahiyyətini açıqlayan kimi Əbu Ləhəb ayağa qalxaraq ona qarşı ağır sözlər söyləmiş və onun insanları ata-babalarının yolundan azdırmaq istədiyini, bunun ilahların qəzəbinə səbəb olacağını bildirərək evi tərk etmişdi. Bu uğursuz cəhd Allah Rəsulunu (s.ə.v) məyus etmişdisə də ruhdan düşürməmiş, əksinə daha əmin şəkildə ilahi göstərişi yerinə yetirməyə təşəbbüs göstərmişdi.

Bu hadisədən bir müddət sonra Allah Rəsulu (s.ə.v) Kə’bə yaxınlığındakı Safa təpəsinə çıxaraq, məkkəlilərin köhnə ənənəsinə uyğun olaraq, çox mühüm bir xəbərinin olduğunu deyib insanların onu dinləməsini istəmişdi. Burada Allah Rəsulu (s.ə.v) “*Əgər mən sizə bu təpənin arxasında şəhəri istila etmək istəyən bir düşmən ordusunun düşərgə salmış olduğunu desəm mənə inanarsınızmı?*” sualına həmşəhərlilərinin “*Sənin əsla yalan danışmadığını bilirik və sənin söyləyəcəyin hər şeyə inanarıq*” deyə cavab verməlİərindən sonra onlara belə müraciət etmişdi: “*Elə isə bilin ki, Allah məni siz müəyyən şeylərdən uzaq durasınız deyə sizi xəbərdar etməm və əgər siz mənə qulaq asmasanız sizi qəzəbi ilə hədələdiyini bildirməyim üçün göndərmişdir*”. Allah Rəsulu (s.ə.v) burada da əmisi Əbu Ləhəbin kəskin reaksiyası ilə qarşılaşmışdı. Əbu Ləhəb qardaşı

oğlunun sözünü kəsərək "*Bu mənasız və boş sözlərinə qulaq asmağmız üçün bizi narahat edib vaxtımızı alırsan?*" demişdi. Əbu Ləhəb bundan daha çirkin vasitələrə əl ataraq gecənin qaranlığında Allah Rəsulunun (s.ə.v) evini daşlayır, evinin önünə zibil və nəcasət atırdı. Bu işdə canfəşanlıq edənlərdən biri də Əbu Ləhəbin arvadı Umm Cəmil idi. Umm Cəmil Məkkənin zənginlərindən Əbu Süfyan Səxr ibn Hərb ibn Uməyyənin bacısı idi. O, da İslama, müsəlmanlara və Allah Rəsuluna (s.ə.v) qarşı hərəkət etməkdə ərindən geri qalmırdı. Qur'anın 111-ci, Təbbət surəsinin vəhy edilib insanlara oxunmasından sonra isə Əbu Ləhəb və arvadının azğınlığı daha da artmışdı. Umm Cəmil Allah Rəsulunun (s.ə.v) qızları ilə nişanlı olan iki oğlundan dərhal nişanlarını pozmalarını tələb etmiş və buna nail olmuşdu. Artıq bütün şəhər əhalisi Allah Rəsulundan (s.ə.v), onun tövhidə dəvətindən və öz həmşəhərlilərindən bəzilərinin bu çağırışa qulaq verərək müsəlman olduqlarından xəbər tutmuşdu. Artıq hər kəs İslamın mahiyyətindən xəbərdar olmağa başlamışdı. Bu dövrdə Qur'anın ilk ayələri əsasən aşağıdakı mövzulara təmas edirdi: Diri (həyy) və mütləq qüdrət sahibi olan, heç bir şəriki olmayan, nə atası, nə anası, nə də övladı olmayan, ölümdən sonra yenidən dirildərək insanları haqq-hesaba çəkəcək olan, onları dünyadakı əməlləri səbəbiylə mükafatlandıracaq və ya cəzalandıracaq olan Allah yalnız birdir, təkdir. İlk vəhy olunan ayələr həm də sadəcə Allaha xas olan sifətləri Allahdan qeyrisinə yaraşdırmanın, yəni Allaha şərik qoşmağın nə qədər mənfur və iyrənc bir şey olduğunu vurğulayır, Adəm övladının öz əli ilə düzəltdiklərinə sitayiş etməsinin insan heysiyətinə sığmayan bir şey olduğunu dilə gətirirdi. Allah Rəsulu (s.ə.v) həm ayrı-ayrı fərdləri, həm də insan kütlələrini İslama dəvət edərkən əvvəlcə o gözəl səsi ilə Qur'anın ecazkar ayələrini oxuyur, sonra da bunları təfsir edərək insanlara anlatırdı. Bu əlbəttə ki, xeyli çətin və həmin dəqiqə müsbət nəticə verməyən bir fəaliyyət idi.

*Müsəlmanlara Qarşı Təzyiq və Təqiblər*

Xədicə (r.ə), Əbu Bəkr (r.ə), Əli (r.ə) və Zeyddən (r.ə) sonra İslamı qəbul edən şəxs Ğifar qəbiləsinə mənsub Əbu Zərr (r.ə) olmuşdu. O, bütlərə ibadət etməyən bir hənif idi. Məkkədə tövhidə dəvət edən bir peyğəmbərin ortaya çıxdığından xəbər tutandan sonra əvvəlcə qardaşını oraya göndəmişdi. Qardaşının gətirdiyi xəbərlərdən sonra özü də Məkkəyə gəlmiş, lakin Muhəmmədi (s.ə.v) axtardığı üçün məkkəli müşriklər tərəfindən huşunu itirənə qədər döyülmüşdü. Təqribən bir ay sonra gecə vaxtı Kə'bənin yaxınlığında Allah Rəsulu (s.ə.v) və Əbu Bəkrlə (r.ə) rastlaşaraq tanış olmuşdu. Əbu Bəkr (r.ə) onu evinə aparmış və qonaq etmişdi. Səhəri gün Əli (r.ə) onu Əbu Bəkrin (r.ə) evindən

Allah Rəsulunun (s.ə.v) yanına aparmışdı. Beləcə Əbu Zərr əl-Ğifari (r.ə) iman etmişdi. Lakin məkkəli və qüreyşli olmadığı üçün hər hansı bir nüfuzlu ailədən "*əman*" alaraq himayə edilmədən Məkkədə uzun müddət qalması mümkün deyildi. Buna görə də Allah Rəsulu (s.ə.v) onunla bir neçə gün söhbət edib iman məsələlərini izah etdikdən sonra onun öz qəbiləsinin yanına qayıdıb oradakıları İslama dəvət etməsini istəmişdi. İslamı qəbul etmiş altıncı şəxs Sə'd ibn Əbu Vəqqas (r.ə) olmuşdu. Onun gənc yaşlarında İslamı necə qəbul etdiyi barədə təfərrüatlı məlumat yoxdur. Lakin mənblərdə Məkkənin varlı və nüfuzlu tacirlərindən olan Əbu Bəkrin (r.ə) bütün varlığı, ruhu və sərvəti ilə özünü İslami dəvətə həsr edərək bir çox nüfuzlu ailəyə mənsub şəxslərin İslamı qəbul etməsində vasitəçi olduğu qeyd olunur. Əbu Bəkrin (r.ə) dəvət və təbliği ilə İslamı qəbul etmiş şəxslərdən Sə'd ibn Əbu Vəqqas (r.ə), Zübeyr ibnü'l-Əvvam (r.ə), Əbdürrəhman ibn Əvf (r.ə), Təlhə ibn Übeydullah (r.ə), Osman ibn Əffanın (r.ə) adını çəkə bilərik. Bunların hamısı Məkkənin varlı və nüfuzlu ailələrinə mənsub gəncələr idilər. İslamı qəbul etdikləri üçün kimisi öz ailəsi tərəfindən rədd edilmiş, kimisi də işgəncəyə məruz qalmışdı. Salnaməçilər İslama qarşı şiddətlə mübarizə aparan, müsəlmanlara qarşı təzyiq, təqib, işgəncə və zülm etmək üçün heç bir fürsəti əldən verməyən müşriklərin adlarını öz kitablarında qeyd etmişdilər. Maraqlıdır ki, bunların hamısının yaxın qohumları arasında müsəlmanlar var idi və əziyyət, işgəncə etdikləri insanlar öz qardaşları, oğulları, bacısı və ya qardaşı oğulları idilər. İslamı qəbul etmiş kölələrin vəziyyəti daha acınacaqlı idi. Onlar amansızca döyülür, yayın istisində çılpaq vəziyyətdə qızmar qumların üzərinə yatırılır, qadın-kişi fərq etmədən boyunlarına ip keçirilib Məkkənin küçələrində süründürülürdülər. Bəziləri isə İslamı qəbul etmiş kölələrinin bədənini qızmar dəmirlərlə dağlamaqdan çəkinməmişdilər. Bunlardan bəziləri ağır işgəncələrə tab gətirə bilməyib ölmüşdülər. Bilal Həbəşi, Amir ibn Fuheyrə, Umm Ubeys, Zinnirə, Nahdiyyə, Lübeynə kimi İslamı qəbul etmiş kölələri Əbu Bəkr (r.ə) öz vəsaiti ilə sahiblərindən satın alıb azad etmişdi. Bəzi varlı müşriklər isə hətta dəyərindən daha çox pul təklif edilməsinə baxmayaraq öz müsəlman kölələrini satmaqdan imtina etmişdilər.

Allah Rəsulunun (s.ə.v) özü də tez-tez təhqir, təzyiq və əziyyətlərə məruz qalırdı. Məkkəli müşriklərin liderlərindən Əbu Cəhl onun Kə'bədə ibadət etməsini qadağan etmişdi. Lakin onun bu qadağasına məhəl qoymayan Allah Rəsulu (s.ə.v) bir gün namaz qılarkən Əbu Cəhlin qızışdırdığı Uqbə ibn Əbi Muayt səcdə halında onun başına kəsilmiş dəvənin içalatını boşaltmışdı. Uqbə ibn Əbi Mu'ayt başqa bir gün Kə'bənin həyətində namaz qılan Allah Rəsuluna (s.ə.v) arxadan yaxınlaşaraq əbasının ətəyini boğazına atıb boğmağa çalışmış-

dı. İnsanlarla söhbət edərkən açıq-aşkar təhqiramiz sözlərlə təzyiq göstərmək və tövhidi anlatmasına mane olmaq isə hər gün baş verən hadisələrdən idi.

Allah Rəsulunun (s.ə.v) insanları şirkdən çəkindirib tövhidə dəvət etməsindən dərin narahatlıq duyan Məkkə müşriklərinin liderləri bu haqda onun əmisi və mənsub olduğu Haşim soyunun başçısı Əbu Talibə şikayətlər edir, qardaşı oğlunu ərəbləri ata-baba dinlərindən döndərməyə çalışmaqdan əl çəkməyə məcbur etməsini tələb edirdilər. Lakin Əbu Talib onların bu tələblərinə məhəl qoymayaraq qardaşı oğlunu müdafiə edirdi. Qüreyşli müşrik zadəganlar Əbu Talibin yanına gələrək ona "*Ey Əbu Talib! Sənin qardaşının oğlu bizim sitayiş etdiyimiz ilahlarımızı alçaldır, dinimizi pisləyir, ata-babalarımızın zəlalət və sapğınlıq içində ölüb getdiklərini iddia edir, ya ona mane ol, ya da bu işə qarışma, biz nə edəcəyimizi bilirik, bilirik ki, sən də onun bu iddialarına qarşısan*". Əbu Talib hər dəfə onları gülər üz və səmimi sözlərlə sakitləşdirib özündən uzaqlaşdırırdı.

Məkkədə Allah Rəsulunu (s.ə.v) və ona iman gətirənləri təzyiq və təqiblərə məruz qoyanlar bunlar idi: Əbu Cəhl[19] Əmr ibn Hişam, Əbu Ləhəb ibn Əbdülmüttəlib, Əsvəd ibn Əbdiyəğus, İbn Qaytələ Haris ibn Qeys, Vəlid ibn Muğirə, Uməyyə ibn Xələf, Übeyy ibn Xələf, Əbu Qeys ibn Fakə, As ibn Vail, Nəzir ibn Haris, Münəbbih ibn Haris, Zuheyr ibn Əbi Uməyyə, Saib ibn Əbi Saib, Əsvəd ibn Əbdüləsəd, As ibn Said, Əbü'l-Buxtəri As ibn Hişam, Uqbə ibn Əbi Muayt, İbnü'l-Əsdə, Həkəm ibn Əbü'l-As, Ədiyy ibn Həmra, Əsvəd ibn Müttəlib, Əbu Süfyan Səxr ibn Hərb, Əbu Süfyan ibn Haris, Hənzələ ibn Əbu Süfyan, Müaviyə ibn Muğirə, Əsəd ibn Əbdüluzza, Əbu Zəm'a ibn Əsvəd, Seyf ibn Saib, Əmr ibn əl-As, Nübeyh ibn Həccac, Üneys ibn Miyər, Tuamə ibn Ədiyy, Rükanə ibn Əbdiyəzid, Malik ibn Tuatilə, Hubeyrəb ibn Əbi Vəhb, Mut'im ibn Ədiyy. Bunlardan Əbu Cəhl, Əbu Ləhəb və Uqbə ibn Əbi Muayt İslama və müsəlmanlara qarşı azğınlıqları və zalımlıqları ilə xüsusilə seçilirdilər. Utbə ibn Rəbiə, Şeybə ibn Rəbiə, Əbu Süfyan Səxr ibn Hərb, Əbu Süfyan ibn Haris, Mut'im ibn Ədiyy və Əbü'l-Buxtəri kimi varlı Qüreyş tacirləri isə nisbətən daha mülayim idilər. Hətta Əbu Süfyan ibn Hərb, Əbu Süfyan ibn Haris, Əmr ibn əl-As, Həkəm ibn Əbü'l-As çox sonralar İslamı qəbul etmişdilər. Əsvəd ibn Müttəlib, Əsvəd ibn Əbdiyəğus, Vəlid ibn Muğirə, As ibn Vail kimi qüreyşli müşriklər öz tikanlı sözləri, acı dilləri və istehzaları ilə Allah Rəsulunu (s.ə.v) çox üzürdülər, Peyğəmbər (s.ə.v) bunların dilindən çox əziyyət çəkmişdi.

---

[19] Bu şəxsin künyəsi əslində "Əbü'l-Həkəm" idi, İslama, Rəsulullaha və müsəlmanlara qarşı ifrat düşmənliyi və zalımlığı səbəbiylə "Əbu Cəhl", yəni cəhalətin, cahilliyin atası ləqəbi ilə tanınmışdı.

Uqbə ibn Əbi Muayt və Əbu Ləhəb Peyğəmbərin (s.ə.v) qonşuları idilər. Allah Rəsulunun (s.ə.v) evi onların evlərinin arasında idi. Bu iki qonşusu əllərinə keçirdikləri hər cür məişət tullantısını, kəsilmiş heyvan içalatını gecələri gətirib Allah Rəsulunun (s.ə.v) qapısının önünə tökürdülər. Allah Rəsulu (s.ə.v) hər səhər qapısının ağzında onların tökdükləri şeyləri görəndə onlara "*Ey Əbdimənafın oğulları! Bu necə qonşuluqdur?*" deyirdi. Bir gecə Əbu Ləhəb topladığı zibillər əlində olaraq gizlincə Peyğəmbərin (s.ə.v) qapısına yaxınlaşarkən qəflətən doğma qardaşı Həmzə (r.ə) ilə rastlaşmışdı. Həmzə (r.ə) onun əlindəki zir-zibili alıb başından aşağı boşaltmışdı. Başına zibil tökülən Əbu Ləhəb qardaşının bu hərəkətinə qəzəblənərək xeyli deyinmişdi.

Əbu Ləhəbin arvadı Umm Cəmil də Allah Rəsuluna (s.ə.v) əziyyət verməkdə ərindən geri qalmırdı. Müsəlmanlara xüsusi nifrəti ilə seçilən bu qadın gündüzlər topladığı tikanlı ağac budaqlarını axşam olan kimi Allah Rəsulunun (s.ə.v) evinə gedərkən keçdiyi yola səpələyirdi.

Əbu Ləhəb və arvadı bütün bunlarla da kifayətlənməyərək Allah Rəsulu (s.ə.v) ilə aralarında qurulmuş qohumluq əlaqəsini də pozmuşdular. Allah Rəsulunun (s.ə.v) qızlarından Umm Külsum Əbu Ləhəbin oğlu Uteybə, digər qızı Ruqəyyə isə Əbu Ləhəbin digər oğlu Utbə ilə hələ bi'sətdən əvvəl nişanlanmışdılar. Ata və analarının təkidi ilə hər iki qardaş bu nişanı qaytarmışdılar. Uteybə Allah Rəsulunun (s.ə.v) yanına gəlib yaxasından yapışmış "*mən sənin çağırdığın dinə gəlməyəcəm, qızından da ayrıldım, artıq səndən məmnun deyiləm, sən də məndən məmnun olma*" dedikdən sonra dartaraq köynəyini cırmışdı. Bu hadisədən bir müddət sonra Şam diyarına ticarət səfərinə çıxan Uteybəni gecə vaxtı Zərqa adlanan yerdə bir yırtıcı heyvan parçalayaraq öldürmüşdü.

Bir gün başlarında Əbu Cəhl, Uqbə ibn Əbi Muayt, Üməyyə ibn Xələf olmaqla bir neçə qüreyşli müşrik zadəgan Allah Rəsulunun (s.ə.v) Kə'bənin yaxınlığında namaz qıldığını gördülər. Bu hal müşrikləri o qədər qəzəbləndirmişdi ki, Əbu Cəhlin "*Bunun əməlinə baxın. Aranızda o gördüyümüz dəvə içalatını gətirib bunun üstünə tökə bilən heç kim yoxdur?*" sözünə Uqbə ibn Əbi Muayt "*mən eləyərəm*" deyə cavab verərək yerindən qalxmışdı. Uqbə ibn Əbi Muayt gətirdiyi dəvə içalatını Allah Rəsulu (s.ə.v) səcdədə ikən onun üstünə atmışdı. Üzü qoyulu yerə yıxılan Peyğəmbər (s.ə.v) üzərindəkilərdən qurtulub yerindən qalxmaq üçün çalışarkən köməyinə kiçik qızı Fatimə (r.ə) gəlmişdi. Bu vaxt Əbu Cəhl və dostları onlara baxıb qəhqəhə çəkərək gülür, əylənirdilər. Kiçik yaşlarında olan xanım Fatimə (r.ə) onların qarşısına gəlib acıqla məzəmmət etmiş, müşriklər Peyğəmbərin (s.ə.v) qızının sözlərinə heç bir cavab verməyərək susmuşdular. Onların əməlindən əziyyət görən Allah Rəsulu (s.ə.v) Kə'bəyə

yaxınlaşaraq uca səslə bu müşrikləri Allaha həvalə etmişdi. Geyimi və bədəni dəvə içalatına batmış Allah Rəsulu (s.ə.v) oradan uzaqlaşarkən Əbü'l-Buxtəriyə rast gəlmişdi. Əbü'l-Buxtəri onun son dərəcə kədərli olduğunu görüb nə olduğunu soruşdu. Allah Rəsulu (s.ə.v) ona heç bir şey demək istəməsə də Əbü'l-Buxtəri onun əlini buraxmayaraq təkidlə nə baş verdiyini soruşmuşdu. Baş verənlərdən hali olan kimi Əbü'l-Buxtəri Kə'bəyə tərəf addımlayaraq Əbu Cəhlin qarşısında dayanmış və "*Ey Əbü'l-Həkəm! Muhəmmədin (s.ə.v) üstünə dəvə içalatı tökülməsinə sən göstəriş vermisən?*" demiş və əlindəki dəyənəklə Əbu Cəhlin başına möhkəm bir zərbə vurmuşdu. Bu hadisə Əbu Cəhllə Əbü'l-Buxtərinin mənsub olduqları Məxzum və Əsəd ailələrindən orada olanlar arasında əlbəyaxa davaya səbəb olmuşdu. Onların bu halını görən Əbu Cəhl dava-dalaşı yatırmaq üçün "*Vay sizin halınıza olsun! Görün Muhəmməd (s.ə.v) aranıza necə düşmənlik toxumu səpib, özünə inanları sizdən qoruyur*" demişdi.

Bir başqa hadisədə isə Uqbə ibn Əbi Muyat Kə'bənin həyətində namaz qılan Allah Rəsuluna (s.ə.v) arxadan yaxınlaşıb paltarını onun boynuna dolayaraq boğmağa başlamışdı. Bunu görən Əbu Bəkr (r.ə) Uqbə ibn Əbi Muyatı tutaraq Allah Rəsulundan (s.ə.v) uzaqlaşdırmışdı.

Bir qrup qüreyşli müşrik Kə'bənin Hicr adlanan yerində toplaşıb Peyğəmbər (s.ə.v) haqqında danışır və "*Qüreşin bu adamın əməllərinə dözdüyü qədər heç nəyə dözdüyü görülməmişdir. O, bizim müdriklərimizi ağılsız hesab edir, ata-babalarımızın inandıqlarını pisləyir, ilahlarımızı alçaldır, ailələrimizi bölüb parçalayır, biz isə onun etdiklərinə qarşı layiqli cavab verə bilmədik*" deyirdilər. Onlar bu söhbətlərinə davam edərkən Allah Rəsulu (s.ə.v) Kə'bəyə gələrək təvaf etməyə başlamışdı. Peyğəmbər (s.ə.v) hər dəfə onların yanından keçərkən oradakı müşriklər ona söz atır, sataşırdılar. Onların bu hərəkəti Peyğəmbəri (s.ə.v) qeyzləndirmişdi. Nəhayət Allah Rəsulu (s.ə.v) onların yanında ayaq saxlayıb belə dedi: "*Ey Qüreyş camaatı! Məni eşidirsinizmi? Canım əlində olan Allaha and olsun ki, küfrünüzə qarşılıq olaraq Allahın həlak xəbərini sizə çatdırmaq mənə əmr olundu*". Bunu eşidən müşriklər tutulub qaldılar və heç bir şey söyləyə bilmədilər. Nəhayət Əbu Cəhl ona xitab edərək "*Ey Əbü'l-Qasım! Öz yolunu necə bilirsən elə get*" dedi. Səhəri gün eyni yerdə toplaşan müşriklər dünən baş verənləri müzakirə edərək Peyğəmbərə (s.ə.v) lazımı cavab vermədiklərini deyir və bir-birlərini onun əleyhinə təşviq edirdilər. Nəhayət adəti üzrə Allah Rəsulu (s.ə.v) Kə'bəyə namaz qılmaq üçün gələndə ona yaxınlaşıb "*Dünən o sözləri deyib bizi Allahın əzabı ilə hədələyən sən idin?*" sualına "*Bəli, mən idim*" cavabını alan kimi onun yaxasından yapışıb vurmağa başlamışdılar. Bu vəziyyəti görən Əbu Bəkr (r.ə) Peyğəmbəri

(s.ə.v) onların əlindən alıb qışqıraraq "*Vay olsun sizin halınıza. Siz "Rəbbim Allahdır" deyən bir adamı bundan ötürü öldürəcəksiniz?*" demişdi. Müşriklər Peyğəmbəri (s.ə.v) buraxıb bu dəfə Əbu Bəkrin (r.ə) üstünə düşmüş, onun saçından və saqqalından tutaraq vurmağa başlamışdılar.

Bir çox hallarda müsəlmanlar mənsub olduqları ailələr, yaxın qohumları tərəfindən əzab və işgincəyə məruz qalırdılar. Təlhə ibn Übeydullahın (r.ə) qardaşı Osman yaxın dostu olan və Qüreyşin ən qüvvətli pəhləvanlarından sayılan Novfəl ibn Xüveylidlə köməkləşib bir gün qardaşı Təlhəni (r.ə) Əbu Bəkrlə (r.ə) birlikdə ibadət edərkən yaxalamış və onların ikisini kəndirlə bir dirəyə bağlamışdı. Osman ibn Əffanı (r.ə) isə əmisi Həkəm ibn Əbi'l-As əllərini və ayaqlarını bağlayaraq günlərlə evdən buraxmamışdı. Zübeyr ibn Əvvam (r.ə) da dəfələrlə əmisi və əmisi oğulları tərəfindən döyülərək işgəncə edilmişdi.

Ən pis və dözülməz vəziyyətdə olanlar isə heç şübhəsiz İslamı qəbul etmiş kölələr, yoxsullar və kimsəsiz insanlar idilər. Uməyyə ibn Xələf köləlari olan Əbu Fükeyhə (r.ə) və Bilalı (r.ə) hər gün çılpaq soyunduraraq ayaqlarını və əllərini iplə bağlatmış və Məkkənin küçələrində sürütmüşdü. Sonra isə günəşin ən qızmar olduğu saatlada onları gətirib Rəmda adlanan, heç bir kölgəliyin olmadığı yerə atmış, üztlərinə iri qaya parçaları qoydurmuşdu. Əbu Fükeyhə (r.ə) və Bilal (r.ə) huşunu itirənə qədər bu cür işgincələrə məruz qalırdılar. Həbəşistana hicrət etdiyi günə qədər onlar hər gün bu cür işgəncələrə məruz qalmışdılar. Buna baxmayaraq heç biri İslamdan dönməmiş və imanlarını açıqlamaqdan çəkinməmişdilər.

Ən dəhşətli işgəncələrə məruz qalmış müsəlmanlardan biri də Həbbab ibn Ərət (r.ə) idi. Həbbab (r.ə) Məkkənin zingin müşrik qadınlarından olan Umm Ənmarın köləsi idi və ağası onu köləlikdən azad etmişdi. Dəmirçi olan Həbbab (r.ə) Allah Rəsulunun (s.ə.v) tövhidə dəvətinə icabət etmiş və müsəlman olduğunu gizlətməyərək açığa vurmuşdu. Məkkədə qərib olan Həbbabı (r.ə) himayə edəcək ailəsinin olmamasını fürsət bilən müşriklər ona dəmirdən düzəldilmiş geyim geydirərək səhrada, qızmar günəşin altında saxlayıb işgəncə verir və imanından imtina etməsini istəyirdilər. Bir gün qüreyşli bir dəstə müşrik Həbbabı (r.ə) yaxalayaraq soyundurdular, dəmirçi ocağındakı közləri yerə tökdülər və onu arxası üstə közün üstünə uzatdılar. Qalxıb qutula bilməsin deyə ayaqları ilə onun sinəsindən basırdılar. Onun imanı uğrunda necə zülümlərə məruz qaldığını bütün müsəlmanlar bilirdilər. Uzun illər keçməsinə baxmayaraq müsəlmanlar sırf Allaha şərik qoşmadıqları və insanları şirkdən çəkindirdikləri üçün onlara edilmiş zülm və işgəncələri unutmur, keçmiş günlərin məşəqqətlərini xatırlayırdılar. Xəlifə olduğu dövrdə Ömər ibn Xəttab (r.ə) Həbbabdan (r.ə) ona edilən işgincələr haqqında

soruşmuşdu. Həbbab (r.ə) cavab olaraq xəlifəyə kürəyindəki yaraları göstərmiş və "*üzərinə uzadıldığım közləri mənim kürəyimdən axan yağ söndürmüşdü*" demişdi. Miqdad ibn Əmr (r.ə), Suheyb ibn Sənan ər-Rumi (r.ə), Abdullah ibn Məs'ud (r.ə), Əmmar ibn Yasir (r.ə), onun atası Yasir ibn Amir (r.ə) və anası Süməyyə (r.ə) də Məkkədə müşriklərin əzab və işgəncələrinə məruz qalmış müsəlmanlardan idilər. Allah Rəsulu (s.ə.v) haqq dəvətə könül vermiş möminlərə, öz əshabına qarşı çox mərhəmətli və şəfqətli idi. İman edənlərin öz imanları uğrunda düçar olduqları bu məşəqqətlərdən ötürü çox kədərlənir, çox üzülürdü. Allah Tövbə surəsi 128-ci ayəsində Elçisinin (s.ə.v) bu halını bəyan etməkdədir:

لَقَدْ جَاءَكُمْ رَسُولٌ مِنْ أَنْفُسِكُمْ عَزِيزٌ عَلَيْهِ مَا عَنِتُّمْ حَرِيصٌ عَلَيْكُمْ بِالْمُؤْمِنِ رَءُوفٌ رَحِيمٌ

"*Sizə özünüzdən elə bir Elçi gəldi ki, sizin əziyyətə düşməyiniz ona ağır gəlir. O sizə qarşı qayğıkeş, möminlərə şəfqətli, rəhmlidir*"

Məkkənin varlı tacirlərindən və azğın İslam düşmənlərindən biri olan Nəzir ibn Haris isə Allah Rəsulunun (s.ə.v) İslama dəvətinə qarşı, İblisin təlqini ilə, özünəməxsus formada mübarizə aparmışdı. Nəzir ibn Haris tacir olduğu üçün tez-tez ticari səfərlərə çıxır, İraq və İranın şəhərlərində olurdu. O, Sasanilərin iri şəhərlərindən olan Hirədə olarkən buradakı musiqili əyləncə məclislərində iştirak etmiş, iranlıların Rüstəmi-Zal haqqındakı əsatirlərini dinləmiş, hətta burada ud çalmağı da öyrənmişdi. Bu cür əyləncələrə düşkün olan Nəzir ibn Haris Hirədən iki müğənni kənizi də satın alıb Məkkəyə gətirmişdi. Allah Rəsulu (s.ə.v) adətən insanları tövhidə dəvət edərkən onlara Ad, Səmud, Əmaliq kimi məhv olmuş millətlərin başına gələn müsibətləri xatırladırdı. Bu adı çəkilən qövmlərin bir vaxtlar yaşadıqları məntəqələr yarımadanın müxtəlif yerlərində idi və ərəblər bunu bilirdilər. Allah Rəsulu (s.ə.v) hansı qəbiləyə, soya, ailəyə gedib insanları şirkdən çəkindirib İslamı izah edirdisə Nəzir ibn Haris dərhal öz müğənni qadınları ilə həmin insanların yanına gedirdi. O, həmin camaata qədim İran əsatirləri və nağıl qəhrəmanları haqqında danışır, müğənni qadınlar isə nəğmə oxuyurdular. Sonra isə Nəzir ibn Haris əyləndirdiyi camaata xitab edərək belə deyirdi: "*Deyin görüm kimi sözləri daha gözəldir? Mənim yoxsa Muhəmmədin (s.ə.v)?, mən də eşitdiyimi oxuyuram, o da, mənim ondan nəyim əskikdir?*". Bu çirkin əməlindən ötürü Allah Qur'anda Nəzir ibn Haris və onun timsalında olanları əzabla müjdələmişdi:

وَمِنْ النَّاسِ مَنْ يَشْتَرِي لَهْوَ الْحَدِيثِ لِيُضِلَّ عَنْ سَبِيلِ ا بِغَيْرِ عِلْمٍ وَيَتَّخِذَهَا هُزُوًا أُولَئِكَ لَهُمْ عَذَابٌ مُهِ

"*İnsanlar içərisində eləsi də vardır ki, nadanlığı üzündən Allah yolundan (İslam dinindən) döndərmək və bu minvalla onu məsxərəyə qoymaq üçün*

*mənasız (oyun-oyuncaq) sözləri satın alarlar. Məhz belələrini alçaldıcı bir əzab gözləyir*" (Qur'an, Loğman surəsi 6).

Bir gün Allah Rəsuluna (s.ə.v) rast gələn Nəzir ibn Haris ona : "*Sən deyirmişsən ki, Qüreyş yaxın zamanda Allahın qəzəbinə uğrayaraq diz üstə çökəcək eləmi?*" demişdi. Allah Rəsulu (s.ə.v) ona belə cavab vermişdi: "*Bəli, deyirəm və sən onlardan biri olacaqsan*". Hicrətdən sonra baş verən Bədr döyüşündə müsəlmanların əlinə əsir düşən müşriklərdən biri də Nəzir ibn Haris idi. Əli ibn Əbu Talib (r.ə) Nəzirin boynunu qılıcla vuraraq başını bədənindən ayırmışdı.

Allah Rəsulunun (s.ə.v) Kə'bənin həyətində iman etmiş insanlarla birlikdə camaat namazı qılması elə böyük bir iğtişaşa səbəb olmuşdu ki, Xədicənin (r.ə) oğlu Haris ibn Əbi Halə (r.ə) bu qarışıqlıqda qətlə yetirilmişdi. Beləcə Haris (r.ə) İslam uğrunda şəhid olmuş ilk səhabə olmuşdu.

İbn Hişam və Bəlazuri kimi salnaməçilər Sə'd ibn Əbu Vəqqasın (r.ə) dilindən aşağıdakı hadisəni nəql etmişdirlər: "*İslamı qəbul etdikdən sonra bir il bunu gizlətdim, namazlarımızı qapılarımızı bağlayaraq evlərimizdə və ya şəhərin kənarındakı dağlara gedərək gözdən iraq yerlərdə qılırdıq. Bir gün namaz üçün Əbu Dubb dağındakı dar keçidlərdən birinə getmişdik. Dəstəmaz alıb heç kimin bizi görməməsi üçün tədbirli davranaraq namaz qılmağa başladıq. Lakin Əbu Süfyan və Əhnəs ibn Şərik başda olmaqla bir qrup qüreyşli müşrik bizi təqib edərək yerimizi öyrənmişdilər. Nalayiq sözlərlə təhqir edərək üstümüzə hücum çəkib bizi vurmağa başladılar. Bu vaxt mən yerdən əlimə keçən bir dəvə sümüyü ilə müşriklərdən birini vurub yamanca yaraladım, bundan sonra onlar qaçıb getdilər. Beləcə Allah yolunda ilk qan tökən müsəlman mən oldum*".

Bütün bu təzyiq və təqiblər Məkkə cəmiyyətində İslama olan meyli və marağı azaltmamış, əksinə artırmışdı. Allah Rəsulunun (s.ə.v) əmisi Həmzə (r.ə) bu zülmün qarşısına çıxaraq müsəlman olduğunu elan etmiş şəxslərdən biri idi. O, gününü çöllərdə və meşələrdə ov etməklə keçirən cəsur və qorxmaz bir insan idi. Bir gün ovdan qayıdarkən adəti üzrə evinə getməmişdən əvvəl Kə'bəni ziyarət etmək üçün gəlmişdi. Orada rastlaşdığı kölələrdən biri həmin gün Əbu Cəhlin onun qardaşı oğluna qarşı etdiyi təhqiramiz hərəkətləri Həmzəyə (r.ə) xəbər vermişdi. Bundan qəzəblənən Həmzə (r.ə) dərhal Əbu Cəhlin yanına gedərək əlindəki dəmir yayı ilə vurub Əbu Cəhli yaralamış və "*sən həqiqətən zənn edirsən ki, qohumları Muhəmmədi (s.ə.v) tənha qoyublar? Eşit və bil ki, mən də İslamı qəbul etmişəm. İndi sən və ya sənin kimilərdən kim istəyirsə qarşıma çıxsın*" demişdi.

Qur'an özünün e'cazı ilə insanların diqqətini çəkir, hətta bəzi İslam düşmənləri gizli-gizli belə olsa Allah Rəsulunun (s.ə.v), eləcə də digər müsəlmanların Qur'an oxumalarını dinləyirdilər. Əbu Bəkr (r.ə) öz həyətində kiçik bir məscid inşa etmiş və orada namaz qılarkən insanlar onun Qur'an oxumasını dinləmək üçün evinin yaxınlığına toplaşırdılar. Heç kim tərəfindən görülməmək üçün gecələr Əbu Cəhl, Əbu Süfyan Səxr və Əhnəs ibn Şərik kimi məkkəli müşriklərin liderləri belə bəzən Peyğəmbərin (s.ə.v) evinin önünə gələrək onun Qur'andan oxuduğu ayələri dinləyirdilər.

Allah Rəsulu (s.ə.v) ailəsinin müşriklər tərəfindən narahat edilməməsi üçün evini tərk edərək qüreyşli səhabələrdən Ərqam ibn Əbil-Ərqamın (r.ə) evində məskunlaşmış və burada tövhidə dəvət etdikləri insanlara İslam dini öyrətməyə başlamışdı. Ömər ibn Xəttab (r.ə) da İslamı Ərqamın (r.ə) evində qəbul etmişdi. O, İslamı qəbul edən qırxıncı şəxs idi. İslamın gizlin olaraq təlim edildiyi *Daru'l-Ərqam,* Ərqamın evi İslam tarixindki ilk mktb hesab olunur.

Məkkənin küçələrində təhqir və hədə-qorxu ilə üzləşən Allah Rəsulu (s.ə.v) onu təqib edənlərdən yaxa qurtarmaq üçün bəzən Əbu Süfyan Səxr ibn Hərbin evinə sığınırdı. İslama düşmən belə olsa Əbu Süfyan ona pənah gətirdiyi üçün Allah Rəsuluna (s.ə.v) öz evində müvəqqəti sığınacaq verirdi. Allah Rəsulu (s.ə.v) Əbu Süfyanın bu alicənab hərəkətini əsla unutmamış, Məkkənin fəthi vaxtı insanlara "*silahı yerə qoyub müqavimət göstərməyənlərə əman verilmişdir, Əbu Süfyanın evinə sığınanlara əman verilmişdir*" deyə səslənmişdi. İslamın Məkkədəki ilk illəri müsəlmanlara qarşı zülmün və ədalətsizliyin zirvədə olduğu bir dövr idi. Bununla yanaşı məkkəli müşriklər arasında müsəlmanlara qarşı daha mülayim və tolerant rəftar edənlər də var idi. Əbu Talib ələndən gəldiyi qədər qardaşı oğlu Muhəmmədi (s.ə.v) öz müşrik həmşəhərlilərinin zülmündən qorumağa çalışırdı. Bu dövrdə məkkəli müşriklərin liderlərini bir elçi heyətini Əbu Talibin yanına göndərərək onun qarşısında ultimativ bir bəyanatla çıxış etmişdilər; Əbu Talib ya qardaşı oğlunun fəaliyyətinə mane olmalı, ya da onu Qüreyş müşriklərinə təslim etməli idi. Əks təqdirdə artıq öz dili ilə desə belə onlar Əbu Talibin onların ata-babalarının dinində olduğuna inanmayacaqdılar. Gələnlərdən biri belə demişdi: "*Sən Muhəmmədi (s.ə.v) bizə təhvil ver. Biz onun tuttuğu yoldan əl çəkəcəyinə inanmırıq, qoy onu öldürək. Biz sənə aramızdan birinin ən yaraşıqlı və ağıllı oğlunu onun əvəzində övladlıq kimi verərik*". Əbu Talib onların bu təklifinə iztehza ilə cavab verərək "*sizcə sizin mənim oğlumu öldürməniz, mənim isə sizin oğlunuzu öz evimdə yedirib içirməm ədalətə sığarmı?"*. Onlara xeyli mübahisə etdikdən sonra Əbu Talib Allah Rəsulunu (s.ə.v) çağıraraq vəziyyəti və gələnlərin tələbini izah etmişdi. Əmisindən gör-

düyü dəstəyin də itib getmək üzrə olduğunu görən Allah Rəsulu (s.ə.v) gözyaşları içində əmisinə belə demişdi: "*Əmican, sən də məni tərk etmək istəyirsən? Canım əlində olan Allaha and olsun ki, bu ilahi təbliğdən əl çəkməyim üçün mükafat olaraq günəşi sağ, ayı da sol əlimə versələr belə, hətta sən də məni tərk etsən, mən İslama dəvətdən əl çəkməyəcəm. Rəbbim olan Allah mənə kifayət edər*". O, bu sözləri deyəndən sonra məclisi tərk edib getmişdi. Bundan sonra Əbu Talib sağ olduğu müddətcə qardaşının oğlunu himayə etməkdən geri durmayacağını və onların da əllərindən nə gəlirsə etmələrini söyləyərək gələnləri evindən çıxarmışdı.

Məkkənin nüfuzlu insanlarından bəzilərinin İslamı qəbul etməsi Qüreyş müşriklərinin liderlərini narahat etmişdi. Bir gün onlar Kə'bə yaxınlığında toplaşıb söhbət edərkən Allah Rəsulunun (s.ə.v) da onlardan biraz aralı oturduğunu gördülər. Bu vaxt onlar Həmzənin (r.ə) müsəlman olması barədə danışırdılar. Əbu Süfyan Səxrin qaynatası və müşriklərin ağsaqqallarından olan Əbü'l-Vəlid Utbə ibn Rəbiə digərlərinə "*Əgər izin versəniz mən gedib Muhəmmədlə (s.ə.v) biraz danışmaq istəyirəm, ona bəzi təkliflərim olacaq, əgər mənim təklif edəcəyim şərtləri qəbul etsə onunla barışıq edərik. O, da bizə qarşı çıxmaqdan uzaq durar*" dedi və qalxıb Allah Rəsulunun (s.ə.v) yanına getdi. Peyğəmbərin (s.ə.v) yanına oturan Utbə ibn Rəbiə sözə başladı: "*Ey qardaşımın oğlu! Sən özünün nəsil-nəcabət baxımından üstün olduğunu bilirsən. Lakin sən öz həmyerlilərinin başına müsibət gətirdin. Aramıza ayrıseçkilik saldın. Sən öz millətini axmaq yerinə qoydun, onun dinini və inandıqlarını pislədin. İddia edirsən ki, biz də kafirik, əcdadımız, ata-babalarımız da kafir olublar. İndi mənə diqqətlə qulaq as, mənim sənə bəzi təkliflərim olacaq*". Allah Rəsulu (s.ə.v) "*Danış ey Əbü'l-Vəlid, eşidirəm səni*" deyəndən sonra Utbə ibn Rəbiə yenidən sözə başladı: "*Ey qardaş oğlu! Girişdiyin bu işdə məqsədin varlanmaqdırsa biz öz aramızda səni ən zənginimiz edənə qədər mal-dövlət toplayıb sənə verək. Yox əgər məqsədin böyüklük, liderlik etməkdirsə biz səndən icazə almadan heç bir iş görmərik, səni öz başçımız bilərik. İstəsən səni özümüzə kral da seçərik. Gəl səni Məkkənin ən gözəl və zadəgan qızı ilə evləndirək. Bəlkə xəstəsən? Əgər səni cinlər narahat edirsə biz öz aramızda pul yığıb ən yaxşı təbibi tapıb gətirərik və səni müalicə etdirərik*". Səssiz və diqqətlə onu dinləyən Allah Rəsulunun (s.ə.v) "*deyəcəklərin bitdimi ey Əbü'l-Vəlid?*" sualına Utbə ibn Rəbiənin "*bəli*" deyə cavab verməsindən sonra Peyğəmbər (s.ə.v) "*indi də sən mənə qulaq as*" dedi və Qur'ani-Kərimin Fussilət surəsini oxumağa başladı. Allah Rəsulu (s.ə.v) ayələri oxuyur, səssizcə onu dinləyən Utbə ibn Rəbiə Qur'anın ecazı qarşısında rəng alıb rəng verirdi. Uzaqdan ona baxan dostları

"*nə oldu görəsən? Utbə qızarıb bozarır*" deyirdilər. Allah Rəsulu (s.ə.v) isə Fussilət surəsini oxumağa davam edirdi və nəhayət 13-cü surəyə gəlib çatdı:

فَإِنْ أَعْرَضُوا فَقُلْ أَنذَرْتُكُمْ صَاعِقَةً مِّثْلَ صَاعِقَةِ عَادٍ وَثَمُودَ

*(Ya Peyğəmbər!) Əgər (Məkkə müşrikləri sənin bu sözlərindən sonra haqdan, imandan) üz döndərsələr, de: "Mən sizi Ad və Səmud ildırımı kimi bir ildırımla (bu tayfaları məhv etmiş tükürpədici bir səslə, müdhiş bir əzabla) xəbərdar edirəm!"*

On üçüncü ayəyə çatanda Utbə ibn Rəbiə əlini uzadıb Peyğəmbərin (s.ə.v) ağzını tutdu və "*Allahın xətri üçün bu millətə yazığın gəlsin*" dedi. O, Allah Rəsulunun (s.ə.v) ağzından çıxan xəbərdarlıq və duaların yerinə yetdiyini bilirdi. Bundan başqa ərəblər Ad və Səmud qövmlərinin necə məhv olduqlarından da xəbərdar idilər. Bu səbəbdən də buna bənzər bir bəla ilə Qüreyşin hədələnməsi Utbəni bərk qorxutmuşdu. O, qalxıb dostlarının yanına gəldi və onlar soruşdular:

- *Muhəmməd (s.ə.v) sənə nə dedi? Danış görək!*

- *Allah haqqı üçün deyirəm, mən daha əvvəl buna oxşar heç bir söz eşitməmişəm. Allaha and olsun ki, bu şeer deyil, sehr və kahin işi də deyil. Ey Qüreyşin böyükləri! Mənə qulaq asın, onu rahat buraxın, qoy bildiyini eləsin. Onun sözləri öz təsirini göstərəcək. Fərz edək ki, ərəblər toplaşıb onun öhdəsindən gəldilər. Belədə sizin əliniz qardaş qanına batmamış olar. Yox əgər o, üstün olsa onun ərəblər üzərindəki iqtidarı elə sizin iqtidarınızdır. Onun sahib olduğu izzət və şərəf elə sizin də izzət və şərəfinizdir.*

- *Ey Əbü'l-Vəlid! Muhəmməd (s.ə.v) sehirli sözləri ilə səni də əfsunladı, eləmi?*

- *Mən öz fikrimi dedim, nə edəcəyinizi özünüz bilin.*

Utbə ibn Rəbiənin Allah Rəsuluna (s.ə.v) etdiyi təklif və irəli sürdüyü şərtlər əslində inkarçılarla şərik qoşanların dəyişməz məntiqini əks etdirir. Onlar Muhəmmədə (s.ə.v) vəhy endiyinə inanmırdılar. Vəhyə inanmamaqla yanaşı onlar axirəti də inkar edirdilər. Onların inandıqları həyat yaşadıqları dünya həyatı idi. Dünya həyatının mənfəətlərdən ötürü etməyəcəkləri heç bir iş yoxdur. Başqa sözlə, etdikləri hər bir şey dünya həyatının maddi mənfəətlərini əldə etmək üçündür. Bu səbəbdən də, söz yerində isə, hər şeyi öz arşınları ilə ölçürdülər. Onlar üçün mənəvi dəyəri olan heç bir şey yoxdur əslində. Onlar Allah Rəsulu (s.ə.v) və onun tövhidə dəvətinə icabət etmiş möminlərin mütləq surətdə bu işdən maddi mənfəət güddüklərini düşünürdülər. Allah Rəsuluna (s.ə.v) var-dövlət, liderlik, gözəl qadın təklif etmələri də bu düşüncədən irəli

gəlirdi. Bu müşrik və inkarçı məntiqini Utbə ibn Rəbiənin timsalında bariz şəkildə müşahidə etmək mümkündür. Utbə və onun timsalında olan Qüreyş zadəganları maddi mənfəətlərini qorumaq naminə illər boyu cəmiyyət üzərindəki zülm və istibidad qamçılarını əldən qoymamışdılar. Öz tanrılarına, bütlərinə sıx bağlı idilər. Çünki yer üzündə öz əlləri ilə düzəltdikləri bu tanrılar onlara insanlara zülm etməməyi, onların əməyini istismar etməməyi, zəifi əzməməyi, maddi zənginliklərin bir qrup şəxsin əlində toplanmasını qadağan etmirdilər. Onların tanrıları mərhəməti, acı doyurmağı, çılpağı geydirməyi də əmr etmirdilər. Muhəmmədə (s.ə.v) vəhy edən, aləmlərin Rəbbi olan Allah isə zülmü qadağan edib ədaləti əmr edirdi. Ona görə də ona düşmən kəsilmişdilər. Üstəlik Utbə inkarçıların əksəriyyətinin olduğu kimi təkəbbürlü və ədəbsiz idi. O, edilən təklifləri qəbul etməyəcəyi təqdirdə Allah Rəsulunu (s.ə.v) əqli cəhətdən qüsurlu olmaqla suçlamaqdan və beləcə ona sataşmaqdan da çəkinməmişdi. Yəni bu təklifləri qəbul etməyən insanda ağıl olmaz demək istəyirdi. Bu səbəbdən ona müalicə olmağı təklif edirdi.

Utbə ibn Rəbiənin oğlu Əbu Huzeyfə (r.ə) İslamı ilk qəbul edən səhabələrdən idi. O, İslamı köləsi Salimlə (r.ə) birlikdə qəbul etmişdi. Salim (r.ə) əslən İranın İstəxr şəhərindən olan qeyri-ərəb səhabələrdən idi. Əsir düşmüş və kölə kimi satılıb əldən ələ keçərək Məkkəyə gəlmişdi. Burada Qureyşin zənginlərindən Utbə ibn Rəbiənin oğlu Əbu Huzeyfə (r.ə) tərəfindən satın alınmışdı. Salimlə (r.ə) Əbu Huzeyfə (r.ə) Məkkədə İslamı qəbul etmişdilər və Əbu Huzeyfə (r.ə) Salimi (r.ə) köləlikdən azad etmişdi. Artıq onlar ağa və kölə deyil qardaş idilər. Salim (r.ə) Qur’an hafizi olan səhabələrdən idi. Onlar birlikdə İslamı qəbul etmiş, birlikdə hicrət etmiş və Əbu Bəkrin (r.ə) xilafəti dövründəki irtidad hadisələri zamanı Yəmamə döyüşündə şəhid olmuş və yanaşı dəfn edilmişdilər.

Qəribədir ki, Məkkə müşriklərinin liderləri Utbə ibn Rəbiənin etdiyi təklifə qarşı aldığı cavabdan sonra, belə demək mümkündürsə, ümidlərini itirməmişdilər. Onlardan Vəlid ibn Muğirə, As ibn Vail, Əsvəd ibn Muttəlib və Uməyyə ibn Xələf bir gün Allah Rəsulu (s.ə.v) ilə söhbət edərkən dedilər: “*Ey Muhəmməd (s.ə.v)! Biz sənin həqiqətən qeybdən xəbər aldığına, sənə vəhy edildiyinə inanacağıq və bunu inkar etməyəcəyik. Biz səninlə birlikdə sənin kimi ibadət edərik. Amma sən də bizim ilahlarımızı inkar etmə. Lat, Uzza və Mənatı təzyif etməkdən əl çək, sən də əcdadımızın ibadət etdiyi bu ilahlara bizimlə birlikdə ibadət et*”.

Onların bu təklifinə Allah Təala Qur’ani-Kərimin Kafirun surəsini nazil edərək cavab vermişdi:

بِسْمِ اللَّهِ الرَّحْمَنِ الرَّحِيمِ

قُلْ يَاأَيُّهَا الْكَافِرُونَ . لَا أَعْبُدُ مَا تَعْبُدُونَ . وَلَا أَنْتُمْ عَابِدُونَ مَا أَعْبُدُ . وَلَا أَنَا عَابِدٌ مَا عَبَدْتُمْ . وَلَا أَنْتُمْ عَابِدُونَ مَا
أَعْبُدُ . لَكُمْ دِينُكُمْ وَلِيَ دِينِ

*“Mərhəmətli, rəhmli Allahın adı ilə!*
*1 - (Ey Peyğəmbər!) de: “Ey kafirlər!*
*2 - Mən sizin ibadət etdiklərinizə ibadət etmərəm!*
*3 - Siz də mənim ibadət etdiyimə (Allaha) ibadət etməzsiniz!*
*4 - Mən sizin ibadət etdiklərinizə ibadət edən deyiləm!*
*5 - Siz də mənim ibadət etdiyimə ibadət edən deyilsiniz!*
*6 - Sizin öz dininiz var, mənim də öz dinim!”*

Kafirun surəsi ilə Allah İslamın əqidə əsaslarına əlavə və dəyişiklik edilə biləcəyi və ya onun paralelində ikinci bir haqq dinin olduğuna dair iddia və fikirləri çürütmüşdü. Allah Rəsulunun (s.ə.v) ard-arda nazil olan Qur’an ayələrini oxuyaraq tövhid inancını yayması məkkəli müşriklərin liderlərini təlaşlandırmaqda idi. Aldıqları bütün tədbirlərə rəğmən Allah Rəsuluna (s.ə.v) iman gətirənlərin sayı azalmırdı, əksinə artıdı. Artıq növbəti həcc mövsümü yaxınlaşırdı və tezliklə yarımadanın dörd bir tərəfindən insanlar Məkkəyə axın edəcəkdilər. Allah Rəsulu (s.ə.v) və ona inanan insanlar əlbəttə ki, bu insanların bir çoxu ilə təmas quraraq onları İslama dəvət edəcəkdilər. Bununla da İslama çağırış Məkkə şəhəri ilə məhdudlaşmayaraq yarımadanın dörd bir tərəfində yayılacaqdı. Məkkəli müşriklərin liderləri bunun qarşısı almaq üçün tədbirlər düşünməyə başlamışdılar. Bu məqsədlə onlar həmişəki kimi Daru’n-Nədvədə toplanıb məsələni müzakirə etmişdilər. Onlar Allah Rəsulunun (s.ə.v) İslamı təbliğ etməsinin qarşısını əks-təbliğat və qaralama kampaniyası ilə almaq barədə razılaşmışdılar. Lakin bunu necə edəcəkdilər, əsas nəyi vurğulayacaqdılar? Bu məsələdə yekdil olmalı idilər. Darü’n-Nədvədə Məkkənin zənginlərindən Vəlid ibn Muğirə söz alaraq belə demişdi: “*Muhəmməd haqqında eyni fikir ətrafında birləşməyimizə ehtiyac var, bu mövzuda ixtilafa düşməməliyik. Yoxsa bir-birimizi yalançı çıxarmış və sözlərimizin bir qismi digər qismini təkzib etmiş olar. Bu da nəticədə bizim nüfuzumuzu zədələyər. Gəlin Muhəmməd barədə həmfikir olaq və hamı Məkkəyə ziyarətə gələnlərə onunla bağlı eyni şeyi söyləsin*”.

Bəziləri “*Gəlin onun bir kahin olduğunu söyləyək*” dedilər. Vəlid:

- *“Xeyr, Allaha and olsun ki, o bir kahin deyildir. Biz kahinləri yaxşı tanıyırıq. Muhəmmədin dediyi sözlər kahinlərin züm-züməsinə oxşamır, bunu hamımız yaxşı bilirik”.*

- *“Elə isə biz də onun dəli olduğunu deyərik”*
- *“Xeyr, o, dəli də deyil. Muhəmmədin halı dəlilərin söylədikləri hədyana da oxşamır. Dəlidən belə ağıllı sözlər çıxmaz”.*
- *“Bəlkə onun şair olduğunu deyək?”*
- *“Ərəblər şeerin hər növünü gözəl bilirlər. Onlar şairlərin halına bələddirlər. Onun söylədikləri şeer deyildir”.*
- *“Ey Əbduşşəms (Vəlid ibn Muğirə) elə isə nə deyək? Sənin təklifin nədir? Allaha and olsun ki, sən öz fikrini bildirmədikcə buradakılar razı qalmayacaqlar”.*
- *“Allaha and olsun ki, onun sözlərində tamamilə başqa bir şirinlik və cazibə var. Onun nitqinin başlanğıcı nəhəng bir xurma ağacının gövdəsi və budaqlarına, sonrası isə o ağacın meyvələrinə bənzəyir. Biz hər kəsə onun sehirbaz olduğunu söyləyəcəyik. Onun insanları ovsunladığını, onun bu ovsununun təsiri ilə ailələrin parçalandığını, oğulun atadan, qardaşın qardaşdan ayrıldığını söyləyəcəyik. Ərəblər sehr və osundan qorxurlar”.*

Sonrakı hadisələr göstərdi ki, Məkkə aristokratiyasının insanları qorxutmaq məqsədiylə çirkin ad qoyaraq Allah Rəsulu (s.ə.v), İslam və müsəlmanlar haqqında apadıqları bu iftira və qaralama kampaniyası gözlədikləri nəticəni verməmiş, tam əksinə bu İslami çağırışdan yarımadadakı bütün ərəblərin xəbərdar olmasına səbəb olmuşdu.

*Allah Rəsulunun (s.ə.v) Hikmətli Dəvət Metodu*

İnsanlardan zorla bir çox şeyi əldə etmək olar. Lakin zorla insanların qəlbinə girmək, onların könlünü ələ almaq mümkün deyil. Özü qəlbinin qapılarını açmadığı müddətcə heç bir insanın qəlbinə daxil ola bilmək mümkün deyil. Bir insanın İslam dəvətçisinə öz qəlbinin qapısını açması üçün həmin insanın vəziyyətinə və içində olduğu şərtlərə diqqət yetirmək, hər dəfə bunu mütləq surətdə nəzərə almaq vacibdir. İslamla yeni tanış olan şəxsi fikri cəhətdən dəvətə hazırlamaq lazımdır ki, anlatılanları qavramaq onun üçün çətin olmasın. Allah Rəsulu (s.ə.v) İslama dəvət edərkən əsla sərt davranmaz, insanlara sərt sözlərlə xitab etməzdi. Allah öz Elçisinin (s.ə.v) bu davranışını Ali-İmran surəsinin 159-cu ayəsində təqdir etməkdədir:

فَبِمَا رَحْمَةٍ مِنَ ا ـِ لِنتَ لَهُمْ وَلَوْ كُنتَ فَظًّا غَلِيظَ الْقَلْبِ لَانفَضوا مِنْ حَوْلِكَ

“*Allahın mərhəməti sayəsində sən onlarla mülayim rəftar etdin. Əgər sən kobud və daş qəlbli olsaydın, onlar hökmən sənin ətrafından dağılışardılar*”

Allah Rəsulunun (s.ə.v) müxtəlif qəbilə, oymaq və icmalara göndərdiyi dəvətçi səhabələr Peyğəmbərin (s.ə.v) bu mövzudakı davranış və rəftarını nümunə götürməkdə idilər. Hətta insanların onların tövhidə dəvətini xoş qarşılamayıb bəzən təhqir və hədələrə qədər çatan sərt münasibətlərinə baxmayaraq Allah Rəsulu (s.ə.v) və onun əshabından olan dəvətçilər kobudluq və qaba davranışa yol verməzdilər. Çünki insanları Allahın yoluna çağıranların, dəvətçilərin, hətta niyyətləri yaxşı olsa belə, xətaya yol verməyə haqqları yoxdur. Mülayimlik və rifq insanların duyğularına daha çox təsir edir.

وَلَا تَسْتَوِي الْحَسَنَةُ وَلَا السَّيِّئَةُ ادْفَعْ بِالَّتِي هِيَ أَحْسَنُ فَإِذَا الَّذِي بَيْنَكَ وَبَيْنَهُ عَدَاوَةٌ كَأَنَّهُ وَلِيٌّ حَمِيمٌ

"*Yaxşılıqla pislik eyni ola bilməz. Sən (pisliyi) yaxşılıqla dəf et! O zaman səninlə ədavət aparan kimsə sanki yaxın bir dost olar*" (Fussilət surəsi 34).

Qarşısındakına nifrət edən bir insanın qəlbində ülfət meydana gətirmək çox çətindir. Gözəl nəsihət, Qur'andakı anlatılan keçmiş millətlərin aqibəti kimi mövzulardan söhbət açıb insanların daxili aləminə təsir edən hadisələr, nəbilərin qissələri, saleh insanların və onlarla yoldaşlıq etmişlərin həyat hekayələri ilə insanları Allahın onlara verdiyi səlim ağıl, obyektiv düşüncəyə sövq etmək hikmətli dəvətin ən təsirli yollarındandır. Allahın yoluna dəvətdə bu metod Qur'anın Yusif surəsi 108-ci ayəsində belə tövsif olunur:

قُلْ هَٰذِهِ سَبِيلِي أَدْعُو إِلَى اللَّهِ عَلَىٰ بَصِيرَةٍ أَنَا وَمَنِ اتَّبَعَنِي وَسُبْحَانَ اللَّهِ وَمَا أَنَا مِنَ الْمُشْرِكِينَ

*"De: "Bu mənim (təbliğ, dəvət) yolumdur. Mən və mənə tabe olan (möminlər) açıq-aşkar bir dəlillə (insanları) Allaha çağırırıq. Allah pakdır, müqəddəsdir. Mən isə müşriklərdən deyiləm!"*

Allah Rəsulu (s.ə.v) müşriklərlə düşüncə zəminində mübarizə apararkən onların bildikləri və qəbul etdikləri dəlillərlə onlara müraciət edirdi. Allah yolunun dəvətçiləri müşriklərlə sərt rəftar etməməli, onların izzəti-nəfslərini incitməməli, onları həqir görməməlidirlər. Dəvətçi unutmamalıdır ki, burada məqsəd qarşısındakı insan üzərində fikri baxımdan qələbə çalmaq deyil, əsas məqsəd həqiqəti anlatmaq, gerçəyi çatdırmaqdır. Çünki təkəbbürlülük və inadcıllıq insanın təbiətində var. Müdafiə etdiyi fikir puç bir düşüncə belə olsa onu zorla bu düşüncəsindən vaz keçirmək mümkün deyil. Lakin onun nəfsində məğlubluq hissini qabartmadan, həqiqəti mülayim və yumuşaq şəkildə çatdırmaqla üzərində təkid etdiyi düşüncədən əl çəkməsi təmin edilə bilər. Belə ki, hər bir insanın qənaəti onun özünə xoş gəlir, o qənaət onun "doğru"sudur. Bu "doğru"sundan əl çəkməsi onun özünə olan hörmətinin və ləyaqətinin itirilməsi kimi qəbul edilə bilər. Buna əsla yol verilməməlidir. Fikri zəmində qarşısındakı

insanla mübarizə aparan şəxs daim özünü haqlı bilir. Öz dəyərlərinin üstün olduğuna inandığı üçün onları müdafiə edir. Allah yolunun dəvətçisi isə həqiqətin ortaya çıxması və insanların hidayətə qovuşması üçün mücadilə edir. Özünün qalib gəlməsi və qarşısındakı insanın fikrini puça çıxarmaq əsas məqsəd deyildir. Məhz gözəl nəsihət və hikmətli münasibət daim pislikləri əmr edən, təkəbbürlü nəfsi yola gətirə bilir.

*Şəqqu'l-Qəmər və Məkkədəki Bəzi İhtida Hadisələri*

Bəşər tarixi boyunca Allah insanlara öz əmr və qadağalarını elçiləri vasitəsi ilə çatdırmışdır və hər elçiyə, elçiyini sübut edəcək bir sənəd vermişdir. Bu sənədi insanların təqlid etməyə imkanları olmadığı üçün buna möcüzə deyirlər. Möcüzə, yəni onu görən insanı "*əcz*", acizlik içində buraxan, hər gün şahidi ola biləcəyimiz qəbildən olmayan, fövqəltəbii hadisələrə deyilir. Möcüzəni görən hər bir insan, o şəxsin Allahın elçisi olduğuna şübhə etməz. Buna baxmayaraq bəzi insanlar Allahın elçilərinin möcüzəsini gördükləri halda ona iman gətirməzlər. Buna səbəb ya cəmiyyətdən təcrid olunmaları ya da əlində olan maddi imkanları itirə biləcəkləri qorxusudur. Belə ki, Firon Musanın (ə.s.) Allahın elçisi olduğuna şübhə etməməsinə baxmayaraq onu Allahın elçisi kimi qəbul etməmişdir. Qur'ani-Kərimin Nəml surəsi 13-14-cü ayələrində bu haqda belə deyilir:

فَلَمَّا جَاءَتْهُمْ آيَاتُنَا مُبْصِرَةً قَالُوا هَٰذَا سِحْرٌ مُبِينٌ وَجَحَدُوا بِهَا وَاسْتَيْقَنَتْهَا أَنْفُسُهُمْ ظُلْمًا وَعُلُوًّا فَانْظُرْ كَيْفَ كَانَ عَاقِبَةُ الْمُفْسِدِينَ

"*Dəlillərimiz bütün açıqlığı ilə onlara gəldiyi vaxt: "Bunlar açıq aydın sehrdir" dedilər. Bunlara ürəkdən inandıqları halda zalımlıqlarından və təkəbbürlərindən ötürü, onlara qarşı inkarçılıq etdilər*".

Möcüzəni dilədiyi şəxsi elçi olaraq vəzifələndirən Allah gerçəkləşdirir. O, nə vaxt istəsə möcüzəni o vaxt yaradar. Qur'ani-Kərimin Mu'min (Ğafir) surəsi 78-ci ayəsində buyurulduğu kimi:

وَمَا كَانَ لِرَسُولٍ أَنْ يَأْتِيَ بِآيَةٍ إِلَّا بِإِذْنِ ا ـ

"*Heç bir elçi (rəsul), Allahın izni olmadan möcüzə gətirə bilməz*"

Məkkəli müşriklərin get-gedə mənasız şəkil almağa başlayan möcüzə tələbləri gün keçdikcə artmışdı. Qur'ani-Kərimdə bununla bağlı bir sıra ayələr var. Onlar Allahı zatı ilə göstərmək, göydən yerə mələk endirmək, Məkkənin ətrafındakı dağları uzaqlaşdırmaq, Məkkənin ətrafında axan çaylar meydana gətirmək, yerdən göyə ucalan nərdivan yaratmaq, qızıldan dağlar meydana

gətirmək, ölüləri diriltmək kimi istəklər irəli sürməkdə idilər. Allah Rəsulunun (s.ə.v) onlara cavabı belə olurdu: "*Allah hə şeyə qadirdir, qüdrəti sonsuzdur, onun hər şeyi etməyə gücü çatar, lakin mən sizə bu istəklərinizi etmək üçün göndərilməmişəm. Mənim ilahi vəzifəm sizi doğru yola, hidayətə dəvət etmək, Allahın əmr və buyuruqlarını sizə çatdırmaqdır*". Allah Rəsulu (s.ə.v) ilə müşrik həmşəhərliləri arasında bu qəbildən olan fikir münaqişələri tez-tez baş verirdi. Bir gecə vaxtı baş verən belə mübahisələrdən birində onun ətrafına toplaşmış bir qrup məkkəli ondan səmadakı ayı iki yerə parçalamağı tələb etdilər. Allahın istəyi ilə onun Rəsulu (s.ə.v) əlini aya doğru uzadıb iki barmağının arasını ayırdı və bu vaxt Allah səmadakı ayı iki yerə parçaladı, sonra yenidən birləşdirdi. Bu hadisənin şahidi olanlardan bir neçəsi ona iman gətirmişdi. Lakin çoxu onun çox bacarıqlı bir sehirbaz, gözbağlayıcı olduğu haqqındakı fikirlərini təkrarlayıb ətrafından dağılışıb getmişdilər. Bəzi təfsirçi alimlər Qur'anın Qəmər surəsinin 1-3-cü ayələrində bu hadisənin təsvir edildiyini bəyan etmişdirlər.

Allah Rəsulu (s.ə.v) bütün bu baş verənlərin fonunda ilahi təbliğ və dəvət vəzifəsini əzmlə yerinə yetirirdi. Mənbələdə bununla bağlı bir sıra əhəmiyyətli məlumatlar mövcuddur. Məkkədə yaşayan Rukanə adlı bir pəhləvanın Allah Rəsulu (s.ə.v) tərəfindən İslama dəvət edilməsi də belə hadisələrdən biridir. Rukanə Məkkənin məşhur pəhləvanlarından biri idi. İri cüssəli Rukanə bir gün Məkkə yaxınlığında qoyun sürüsü otararkən Allah Rəsulu (s.ə.v) onunla rastlaşmış və adəti üzrə onu İslama dəvət etmişdi. İslamın zühurundan xəbərdar olan Rukanə ona "*Sənin dinini qəbul edəcəyəm, amma bir şərtim var, mənimlə güləşməlisən. Əgər mənim kürəyimi yerə vura bilsən İslamı qəbul edərəm*". Onun bu şərtini qəbul edən Allah Rəsulu (s.ə.v) Rukanə ilə üç dəfə güləşmiş və hər dəfə də Rukanə məğlub olmuşdu. Bu hadisədən sonra Rukanə İslamı qəbul etmişdi.

Bu dövrdə İslamı qəbul edərək müsəlman olan başqa biri də Bəni-Ədiyy ailəsinin məşhur şəxslərindən olan Ömər ibn Xəttabdır (r.ə). Boyunun hündürlüyü ilə seçilən Ömər ibn Xəttab (r.ə) həmçinin Məkkə şəhərinin idarəsində məs'ul şəxslərdən biri idi. Onun boyu o qədər hündür idi ki, hətta başı, hicrətdən sonra Mədinədə tikilmiş, Məscidu'n-Nəbəvinin tavanına dəyirdi. Atəşli bir məzaca sahib olan Ömər ibn Xəttab (r.ə) qabiliyyətli, bacarıqlı və məğrur bir insan idi.

Bütün təzyiq və təqiblərə baxmayaraq Allah Rəsulunun (s.ə.v) mənsub olduğu ailə onu tərk etməmiş və düşmənlərinin qarşısında himayəsiz qoymamışdı. Bu vəziyyət Qüreyş müşriklərini son dərəcə hiddətləndirməkdə idi. Belə

ki, onlar bu məsələnin ancaq Muhəmmədin (s.ə.v) öldürlməsi ilə həll ediləbiləcəyini barədə həmfikir olmuşdular. Ömər ibn Xəttab (r.ə) həmin gün yaxın qohumlarından olan Nueym ibn Abdullah ən-Nəhhamla (r.ə) rastlaşmış və aralarındakı söhbətdə Ömər ibn Xəttab (r.ə) Nueymə (r.ə) məkkəli müşriklərin son olaraq gəldikləri qənaət barədə daşımışdı. Nueym ibn Abdullah (r.ə) İslamı gizli qəbul edib imanını açıqlamayan şəxslərdən idi. Ömər ibn Xəttabın (r.ə) sözləri onu narahat etmişdi. Buna görə də o, Ömər ibn Xəttaba (r.ə) "*Əgər Muhəmməd (s.ə.v) öldürülsə bu şəhərdəki parçalanmanı dərinləşdirəcək, bu onun ailəsi ilə digər ailələr arasında müharibə başlamasına səbəb olacaq. Yaxşısı budur sən Məkkənin məsələlərindən daha çox öz ailəndəki məsələlələ maraqlanasan. Sənin bacın və qayının İslamı qəbul ediblər*". Nueymin (r.ə) bu sözlərindən sonra qəzəblə öz bacısının evinin yolunu tutan Ömər ibn Xəttab (r.ə) qapıya yaxınlaşanda içəridə Qur'an oxunduğunu eşitdi və qapını döyməyə başladı. Bu vaxt evdə başqa bir müsəlman var idi və ev sahiblərinə Qur'anın yeni nazil olmuş ayələrini oxuyurdu. Ev sahibləri hər şeydən əvvəl Həbbab (r.ə) adlı bu müsəlman müəllimi gizlətdilər. Daha sonra Qur'an səhifələrini qoltuğunda gizlədən Ömər ibn Xəttabın (r.ə) bacısı Fatimə (r.ə) qapını açıb qardaşını içəriyə buraxdı. İçəridə onun şübhələndirəcək heç bir şey qalmasa da Ömər ibn Xəttab (r.ə) görünüşə aldanmadı və ev sahibləri ilə mübahisə etməyə başladı. Nəticədə o, həm əmisi oğlu, həm də yeznəsi olan Səid ibn Zeydi (r.ə) vurmağa başladı. Qardaşına mane olmağa çalışan Fatimə (r.ə) də bir neçə zərbə aldı. Lakin ən az qardaşı qədər cəsur olan Fatimə (r.ə) ona "*nə istəyirsən bizdən? Bəli biz İslamı qəbul etdik, bundan əsla əl çəkməyəcəyik, indi nə bacarırsan et*" dedi. Bacısın üzündən axan qanı görəndə Ömər ibn Xəttab (r.ə) tutduğu işdən çox peşman oldu və onun könlünü almaq istədi. Bacısına yaxınlaşaraq "*biraz əvvəl oxuduqlarınızı mənə ver baxım*" dedi. Yaxın qohumlarının öz əcdadlarının dinini tərk etməsinin səbəbini öyrənmək üçün tələsən Ömər ibn Xəttab (r.ə) Fatimədən (r.ə) aldığı səhifələri oxumağa başladı. Qur'anın Taha surəsini oxuyan Ömər ibn Xəttab (r.ə) "*necə də gözəl və hikmətli kəlamlardır*" dedi. Onun Qur'an ayələrindən təsirlənmiş olduğunu görən Həbbab (r.ə) artıq gizlənməsinə ehtiyac qalmadığını hiss edib çıxdı və Ömər ibn Xəttaba (r.ə) "*And olsun ki, daha dünən Allah Rəsulu (s.ə.v) ya Əbu Cəhl, ya da Ömərlə İslamı qüvvətləndirməsi üçün dua edib Allaha yalvarmışdı. Ümid edirəm ki, bu dua sənin üzərində təcəlli edəcək. Allahdan qorx ey Ömər!*". Allah Rəsulunun (s.ə.v) yerini öyrənən Ömər (r.ə) Ərqam ibn Əbil-Ərqamın[20] evinin yolunu tut-

[20]Daha çox Ərqam ibn Əbil-Ərqam adı ilə tanınan Əbdimənaf ibn Əsəd əl-Məxzumi əl-Qurəşi İslamı ilk qəbul etmiş məkkəlilərdən biri idi.

du. Allah Rəsuluna (s.ə.v) Ömər ibn Xəttabın (r.ə) başdan ayağa silahlanmış olaraq gəldiyini xəbər verdilər. Allah Rəsulu (s.ə.v) "*çəkinməyin, onu buraya gətirin*" dedi. Ömər ibn Xəttab (r.ə) Allah Rəsulunun (s.ə.v) hüzurunda və hər kəsin yanında İslamı qəbul etdiyini açıqladı. Bir qədər sonra namaz vaxtı gəldikdə Allah Rəsulu (s.ə.v) əshabı ilə birlikdə evdə namaz qılmaq üçün hazırlaşarkən Ömər ibn Xəttab (r.ə) oradakılara: "*Artıq belə gizli ibadət etməyə ehtiyac yoxdur. Hamımız birlikdə Kə'bədə namaz qılmaq üçün çıxaq*" dedi. Məkkə müşrikləri müsəlmanların heç kimdən çəkinmədən Kə'bədə namaz qılmaq üçün birlikdə şəhərin küçələrindən keçərək getdiklərini və Ömər ibn Xəttabın (r.ə) da onları qorumaq üçün yanlarında olduğunu gördükləri vaxt çox heyrət etmişdilər. Buna görə də bir çox səhabə deyirdi ki, "*Ömərin (r.ə) İslamı qəbul etməsinin özü bir fəth idi*". Ömər ibn Xəttab (r.ə) Allahın Elçisinin (s.ə.v) hüzurunda imanını bəyan etdiyi günün səhəri dayısı Əbu Cəhlin evinə getmişdi. Əbu Cəhl bacısı oğlunu mehibanlıqla qarşılayıb hal-əhval tutandan sonra Ömər ibn Xəttab (r.ə) ona "*Mən Muhəmmədin (s.ə.v) həqiqətən Allahın elçisi olduğuna və Allahın ona vəhy etdiyinə inanıram. Buraya ona görə gəldim ki, bunu mənim öz dilimdən eşidəsən*". Bacısı oğlunun İslamı qəbul etdiyini eşidən kimi Əbu Cəhl onu həqarətlə evindən qovmuşdu.

*Həbəşistana Hicrət*

Yuxarıda haqqında danışdığımız hadislər baş verərkən Məkkə müşriklərinin müsəlmanlar üzərindəki təzyiq və təqibləri davam edirdi. Məkkədəki hər qəbilə və hər ailədə İslamı qəbul etmiş insanların olmasına baxmayaraq müşriklər öz yaxın qohumlarına qarşı amansızca davranmaqdan geri durmurdular. Təzyiq və təqiblərin şiddətini artırdığı bir vaxta Allah Rəsulu (s.ə.v) ona iman gətirmiş insanlara hicrət etməyi təklif etdi və onlara dedi: "*əgər istəyirsinizsə və buna gücünüz çatacaqsa Həbəşistana pənah aparın. Çünki oranı ölkəsində heç kimə zülm edilməyən bir hökmdar idarə etməkdədir. Allah işlərimizi asanlaşdırana qədər bu ölkəyə mühacirət edin*". Beləcə 614-cü ildə dördü qadın, onbiri kişi olmaqla 15 müsəlman Məkkəni tərk edərək Həbəşistana mühacirət etdimşdilər. İlk gedənlərin Həbəşistanda yaxşı qəbul edilmələri səbəbiylə sonradan bir çox müsəlman Həbəşistana hicrət etmişdi. Bunların arasında Allah Rəsulunun (s.ə.v) kürəkəni Osman ibn Əffan (r.ə), onun zövcəsi Ruqəyyə (r.ə), Allah Rəsulunun (s.ə.v) əmisi oğlu Cə'fər ibn Əbu Talib (r.ə) də var idilər. Cə'fər ibn Əbu Talib (r.ə) Allah Rəsulunun (s.ə.v) Həbəşistan kralı Negus Aşameyə (Nəcaşi)[21] yol-

[21] İslami yazılı ədəbiyyatda Nəcaşi adı ilə tanınan bu qaradərili isəvi kral 614-cü ildən 630-cu ildə vəfatına qədər indiki Sudan, Eriteriya və Efiopiya ərizilərinin bir qismini əhatə edən Aksum krallığını idarə etmiş

ladığı məktubu da özü ilə aparmışdı. Ümumilikdə Həbəşistana 113 müsəlman hicrət etmişdi ki, bunlardan 19-u qadın idi. Bu vəziyyət məkkəli müşikləri xeyli narahat etmişdi. Onlar öz yurdlarından didərgin düşmələrinə səbəb olduqları müsəlman həmvətənlərinin hətta bu qərib diyarda belə öz dinlərini rahat yaşaya bilmərinə qarşı dözümsüz idilər. Bu məqsədlə bir qrup məkkəli müşrik Əmr ibn əl-Asın başçılığı ilə kral Negusun hüzuruna gedərək məkkəli müsəlmanları öz ölkəsindən çıxarmasını istədilər. Lakin kral Negus onların bu istəyinə mənfi cavab verdi. Əmr ibn əl-As Qureyşin müşrik liderlərinin təkidi ilə ikinci dəfə də eyni istəklə həbəş kralının hüzuruna getmiş, lakin eyni cavabı alaraq geri qayıtmışdı. Bu şəkildə məqsədlərinə çata bilməyən məkkəli müşriklər İslam tarixində "*ğəraniq hadisəsi*" olaraq bilinən hadisənin ortaya çıxmasına səbəb oldular. Müsəlmanların bir qismi Həbəşistanda mühacirətdə ikən də vəhy davam edir, nazil olan ayələr Allah Rəsulu (s.ə.v) tərəfindən insanlara oxunur və izah olunurdu. Bir gün Allah Rəsulu (s.ə.v) Kə'bənin yaxınlığında müsəlmanlara namaz qıldırarkən Nəcm surəsinin yeni nazil olmuş ayələrini oxumuşdu. Mə'lum olduğu kimi Nəcm surəsinin 19-22-ci ayələrdə məkkəli müşriklərin sitayiş etdikləri bütlərdən üçünün adı çəkilir və ayələrdə belə deyilir:

أَفَرَأَيْتُمُ اللاتَ وَالْعُزَّىٰ وَمَنَاةَ الثَّالِثَةَ الْأُخْرَىٰ أَلَكُمُ الذَّكَرُ وَلَهُ الْأُنثَىٰ تِلْكَ إِذًا قِسْمَةٌ ضِيزَىٰ

*"Gördünüzmü siz Lat və Uzzanı? Həmçinin üçüncü olan Mənatı da? Məgər oğlanlar sizin, qızlar Onun(Allahın)durmu? Onda bu ədalətsiz bölgü olardı!"*

Allah Rəsulu (s.ə.v) bu ayələri və Nəcm surəsini sonuna qədər oxumuş, sondakı səcdə ayəsindən sonra isə səcdə etmişdi. Öz bütlərinin Qur'anda anılmasını fəzilət zənn edən bəzi məkkəli müşriklər də müsəlmanlarla birlikdə səcdəyə qapanmışdılar. Daha sonra məkkəli müşriklər bu vəziyyətdən məkrli bir şəkildə əks-təbliğat, qarayaxma vasitəsi kimi istifadə etməyə başlamış, Muhəmmədin (s.ə.v) artıq onların ilahlarını şəfaətçi, Allahla insanlar arasındakı vasitəçi tanrılar kimi qəbul etdiyi şayiəsini yaymağa başlamışdılar. Məkkəli müşriklər bu şayiələrin Həbəşistandakı mühacirlərə qədər gedib çatmasını təmin etmişdilər. Beləcə Həbəşistanda mühacirətdə olan müsəlmanların bir qismi müşriklərlə müsəlmanlar arasında Məkkədə bir qarşılıqlı anlaşmanın, sülh sazişinin meydana gəldiyini düşünüb vətənlərinə geri qayıtmışdılar. Lakin tezliklə bunun müşriklərin əks-təbliğat məqsədiylə ortaya atdıqları növbəti məkrli uydur-

Əshəm ibn Əbcərdir. Nəcaşi Əshəmin adı xristian mənbələrdə Negus Aşame olaraq qeyd olunmuşdur. İslami mənbələrdə kral Əshəmin İslamı qəbul etdiyi və vəfat xəbərini eşidən Allah Rəsulunun (s.ə.v) onun cənazə namazını qıldığı barədə məlumatlar mövcuddur.

ma olduğu üzə çıxmışdı. Bu hadisədən sonra müşriklərin müsəlmanlara qarşı təzyiq və təqibləri daha da şiddətlənmişdi.

Yuxarıda bəhs olunan hadisə bəzi tarixi mənbələrdə "*ğəraniq hadisəsi*" olaraq qeyd edilmişdir. Bu hadisəni öz əsərində ilk nəql edən şəxs "*Kitabu'l-Əsnəm*" müəllifi Hişam əl-Kəlbidir (öl. 819). Hişam əl-Kəlbidən əvvəlki mənbələrin heç birində sözü gedən hadisə Hişam əl-Kəlbinin qeyd etdiyi şəkildə yazılmamışdır. Daha sonra əl-Vaqidi, Təbəri, İbn Sə'd, Zəməxşəri kimi tarixçi və təfsirçilər də Hişam əl-Kəlbiyə istinadən öz əsərlərində bu hadisəyə yer vermişdilər. Hişam əl-Kəlbi öz əsərində bu hadisəni müşriklərin uydurduqları şəkildə qeyd etmişdi. Daha doğrusu məkkəli müşriklərin Nəcm surəsinin 19-22-ci ayələrinə öz xeyrlərinə əlavə edərək yaydıqları şayiəni olduğu kimi qeyd etmişdir. Güya Allah Rəsulu (s.ə.v) ayəni "*Gördünüzmü siz Lat və Uzzanı, həmçinin üçüncüləri olan Mənatı? Bunlar uca qu quşlarıdır və bunların şəfaətləri umulur*" deyə oxumuşdu. Halbuki Allah Rəsulunun (s.ə.v) heç bir səbəbdən bu ayəni bu şəkildə oxuması mümkün deyil. Çünki bu sonuncu uydurulan qism məkkəli müşriklərin cahiliyyə dövründəki dualarından biri idi. Onlar adı çəkilən bütlərini ziyarət edərkən "*Lat, Uzza və Mənat, uca qu quşlarıdırlar və Allahın yanında bizim şəfaətçilərimizdirlər*" deyə dua edirdilər. Cahiliyyə dövründə, öz müşrik həmvətənləri arasında yaşadığı üçün Allah Rəsulunun (s.ə.v) bunu bilməməmsi mümkün deyildi. Bu səbədən də məkkəli müşriklər məhz bu şəkildə uydurub şayiə yaymışdılar. Daha sonralar isə güya şeytanın vəhyə qarışaraq bunu Allah Rəsuluna (s.ə.v) bu şəkildə oxutduğu iftirasını yaymağa başlamışdılar. Təsadüfi deyil ki, Buxari kimi mötəbər hədisçilər öz əsərlərinə Hişam əl-Kəlbinin nəql etdiyi versiyanı daxil etməmişdilər. Çünki Hişam ibn Muhəmməd əl-Kəlbi mühəddislər arasında mətruk, rəvayətləri tərk edilmiş ravilərdən biridir. Bunun əsas səbəbi isə güman ki, Hişam əl-Kəlbinin Peyğəmbərin (s.ə.v) əshabına qarşı ifrat dərəcədə kin və nifrət bəsləyən firqəyə mənsub olmasıdır. Müasir tədqiqatlar da Hişam əl-Kəlbinin yalan rəvayət nəql etməkdə usta bir şəxs olduğunu təsbit etməyə imkan verir.

Yuxarıda qeyd etdiyimiz kimi Həbəşistana hicrət edənlərin bir qisminin Məkkəyə qayıtmasından sonra müsəlmanlara qarşı müşriklərin təzyiqləri daha da artmışdı. Bu təzyiqlər, zülm və işgəncələr o dərəcədə dözülməz hal almışdı ki, hətta Məkkənin nüfuzlu insanlarından, keçmişdən bəri şəhəri idarə edən 10 nəfərlik hey'ətin üzvü olan Əbu Bəkr (r.ə) belə müvəqqəti olaraq Məkkəni tərk edib Yəməndəki Qaarə bölgəsinə getmək məcburiyyəti hiss etmişdi. Qaarə bölgəsinin hakimi olan İbn Duğunnə hələ İslamdan çox əvvəl Əbu Bəkrlə (r.ə)

dostluq edirdi. İbn Duğunnə həm də qüreyşlilərin hərbi müttəfiqi idi. Əbu Bəkrlə (r.ə) birlikdə Məkkəyə gələn İbn Duğunnə onun hamisi və qoruyucusu olduğunu elan etmişdi. Bir müddət sonra məkkəli müşriklər İbn Duğunnə vasitəsilə Əbu Bəkrə (r.ə) təsir göstərmək istəmişdilər. İbn Duğunnə məkkəli müşriklərin istəyilə Əbu Bəkrə (r.ə) məktub yazıb həyətində uca səslə Qur'an oxumamasını, bunun küçədən keçən kişi, qadın və uşaqları cəlb etdiyini, məkkəlilərin isə bundan narahat olduqlarını bildirmişdi. Əbu Bəkr (r.ə) köhnə dostuna yazdığı cavabda Allahın himayəçi olaraq ona yetərli olduğunu və belə şərtlərlə İbn Duğunnənin himayəçiliyinə ehtiyacı olmadığını ona bildirmişdi. Əbu Bəkr (r.ə) Məkkəni tərk etməyərək doğma şəhərində qalmağa qərar verdi. Çünki artıq Allah Rəsulunun (s.ə.v) özü müşriklərin əsas hədəfinə çevrilməyə başlamışdı.

Məkkəli müşriklər,ələlxüsus nüfuzlu və zəngin insanların İslamı qəbul etməsindən əndişə duyurdular. Məkkənin müşrik zadəganlarından olan Əbu Cəhl hər hansı bir nüfuzlu şəxsin və ya zəngin tacirin İslamı qəbul etdiyini eşidən kimi onun yanına gedərək hədələyir, təhqirlər yağdırır, onu zərərə uğradaraq müflis edəcəkləri ilə qorxudurdu. Əgər müsəlman olan şəxs zəif biri olurdusa Əbu Cəhl və onun timsalında olanlar bu şəxsi döyməkdən və işgəncə verməkdən çəkinmirdilər.

Məkkənin müşrik liderlərini dərindən narahat edən əsas məsələlərdən biri də Həbəş kralının onların tələbini rədd edərək öz ölkəsinə pənah gətirmiş müsəlman mültəcilərə sığınacaq verməsi idi. Bu hal məkkəli müşrikləri o dərəcədə qeyzləndirmişdi ki, onlar növbəti yığıncaqlardan birində Allah Rəsulunun (s.ə.v) mənsub olduğu Bəni-Haşim ailəsi və bu ailənin müttəfiqlərinə qarşı boykot qərarı almışdılar. Bu boykot qərarına görə Bəni-Haşim ailəsi və bu ailənin dostları ilə dialoq qurulub danışılmayacaq, onlarla eyni məclislərdə iştirak edilməyəcək, evlilik yolu ilə onlarla qohumluq əlaqəsi qurulmayacaq, onlarla hər hansı bir formada ticari əlaqə saxlanmayacaq, Muhəmməd (s.ə.v) öldürülənə qədər onlarla heç bir sülh və əmin-ananlıq anlaşmasına gedilməyəcəkdi. Məkkə müşrikləri bu məsələdə son dərəcə qərarlı idilər. Belə ki, yuxarıda sadalanan boykot şərtlərini yazılı halda Kə'bənin qapısından asmışdılar. Bu boykot qərarı bir neçə il davam etmişdi. Allah Rəsulu (s.ə.v), onun xanımı Xədicə (r.ə), əmisi Əbu Talib, müsəlman və müşrik olmalarından aslı olmayaraq bütün Haşim övladı və onların qohumları Məkkədən sürgün edilərək şəhər kənarında Əbu Talibə məxsus əraziyə sığınmaq məcburiyyətində qalmışdılar. Allah Rəsulunun (s.ə.v) əmisi Əbu Ləhəb istisna, çünki o, bu məsələdə müşrik Məkkə zadəganlarının tərəfində idi, hətta bu işdə digərlərindən daha əzimli idi. Təcrid edilənlər acınacaqlı vəziyyətə düşmüşdülər. Belə ki, fəqirlik

və aclıq fəlakət dərəcəsinə çatmışdı. Həmin boykot illərində müsəlmanların körpələri acından ağlaya-ağlaya ölmüşdülər. Sonrakı dövrlərdə həmin illəri yada salanlar çoxdan kəsilmiş heyvanın qurudulmuş dərisindən necə yemək bişirib böyük bir sevinclə onu yediklərini xatırlayırdılar. Müsəlmanlar Rəbbləri tərəfindən iman yolunda çox çətin bir şəkildə sınanmışdılar. Onlar bu sınaqdan üzüağ çıxmışdılar. Acından ölmə hadisələrinin belə olmasına baxmayaraq heç kimin imanından döndüyü görülməmişdi. Xədicənin (r.ə) Məkkədəki bacısı oğullarından bir gəncin xalasına kiçik bir səbətdə ərzaq göndərməsi şəhərdə qanlı davaya səbəb olmuşdu. Təcrid edilən müsəlmanlar sadəcə haram aylarda yarımadanın digər yerlərindən Kə'bədəki bütləri ziyarətə gələn ərəblərdən ərzaq satın ala bilirdilər. Əllərindəki pul tükənəndən sonra artıq bu imkandan da məhrum olmuşdular. Öz ərazilərində ona və iman gətirənlərə sığınacaq verə biləcək insanların sorağında olan Allah Rəsulu (s.ə.v) haram aylarda Məkkəyə axın edən ərəblərlə ünsiyyət quraraq onları İslama dəvət edirdi.

Bu vaxt bəzi məkkəli zadəganlar müsəlmanlara qarşı yeridilən bu boykot tədbirindən əl çəkmək, bu mümkün deyilsə tədbiri heç olmasa biraz yumuşaltmaq təşəbbüsü ilə çıxış etməyə başlamışdılar. Bunun əsas səbəbi boykot qərarının həm də məkkəli müşrik tacirlərə böyük ziyan vurması olmuşdu. Buna görə də boykot qərarında müəyyən güzəştlərə getmək qərarı alınmışdı.

Bu vaxt Haşim ailəsinin rəisi və Allah Rəsulunun (s.ə.v) hamisi olan Əbu Talib ölmüşdü. Bundan bir müddət sonra isə Allah Rəsuluna (s.ə.v) ilk iman gətirmiş insan olan xanımı Xədicə (r.ə) vəfat etmişdi. Məlum olduğu kimi ölüm və yas bir çox kin və düşmənçiliklərin üzərində xətt çəkib tərəflərin bir-birlərinə qarşı olan sərt mövqeyinin yumuşalmasına səbəb olur. Qardaşı Əbu Talibdən sonra Haşim ailəsinin rəisi olan Əbu Ləhəbin də bu hadisədən sonra qardaşı oğlu Muhəmmədə (s.ə.v) qarşı daha mülayim olduğu müşahidə olunmuşdur. Bunun səbəbi Əbu Ləhəbin Allah Rəsuluna (s.ə.v) iman etməsi və ya onun dəvətinə icabət etməsi deyildi. Qədim ərəb ənənələrinə uyğun olaraq qəbilə və soy rəisləri öz qəbilədaş və soydaşlarını qoruyub himayə etmək məcburiyyətində idilər. Əbu Ləhəbin də Allah Rəsuluna (s.ə.v) qarşı mövqeyini yumuşaltmasının səbəbi bu idi. Lakin bu hal Məkkənin müşrik zadəganlarının xoşuna gəlməmiş və onlar hər fürsətdə Əbu Ləhəbi Allah Rəsuluna (s.ə.v) qarşı təhrik etmişdilər. Söhbətlərin birində Əbu Cəhl dostu Əbu Ləhəbə qardaşı oğlundan ölmüş əcdadlarının aqibəti barədə soruşmağı tövsiyə etmişdi. Allah Rəsulu (s.ə.v) əmisinin bu mövzudakı sualına "*bütlər və onlara sitayiş edənlər cəhənnəmlikdirlər*" deyə cavab vermişdi. Bu da Əbu Ləhəbin son dərəcə qəzəblənərək qardaşı oğlundan yenidən üz çevirməsinə və düşmənliyinin qı-

zışmasına səbəb olmuşdu. Dayaz düşüncəli Əbu Ləhəb unudurdu ki, onun əcdadı həm də Allah Rəsulunun (s.ə.v) əcdadı idi, Allah Rəsulu (s.ə.v) bununla heç kimi təhqir etmək məqsədi güdə bilməzdi və nəsil təəssübü ilahi təbliğ gerçəyinin dəyişməsi üçün səbəb ola bilməzdi. Əbu Ləhəbin bu düşməncəsinə mövqeyi və qardaşı oğlunu himayə etməkdən imtina etməsi Allah Rəsulunun (s.ə.v) Məkkədə bir çox təhlükələrlə üzləşməsinə səbəb olmuş və o, Məkkə xaricində sığınacaq bir yer axtarmaq məcburiyyətində qalmışdı. Bu məqsədlə Allah Rəsulu (s.ə.v) Məkkədən Taifə getmişdi. Taifdə yaşayan Əbdi-Yəlil ailəsi Allah Rəsulunun (s.ə.v) anasının əmilərinin mənsub olduğu bir ailə idi. Yəni aralarında qohumluq əlaqəsi var idi. Bundan başqa Allah Rəsuluna (s.ə.v) qarşı müsbət münasibəti olan və özü ilə həmyaş olan əmisi Abbasın (r.ə) Taifdə dostları və ticarət ortaqları var idi. Bunları nəzərə alaraq Allah Rəsulu (s.ə.v) Məkkədən iki günlük məsafədə olan Taifə yollanmışdı. Taifdə o, aralarında qohumluq əlaqəsi olan üç oymaq rəisi ilə görüşərək gəliş məqsədini anlatmışdı. Onlardan biri Allah Rəsulunun (s.ə.v) himayə və sığınacaq istəyini sərt sözlərlə rədd etmiş, digər ikisi isə onu ələ salaraq istehza etmişdilər. Taifli qəbilə rəislərinin cavabından sonra Allah Rəsulu (s.ə.v) onlardan bu barədə heç kimə danışmamağı xahiş etdikdən sonra ayrılıb getmişdi. Lakin həmin üç şəxs şəhərin uşaqları və səfillərini öyrədərək Allah Rəsulunun (s.ə.v) üstünə göndərmişdilər. Bu səfil dəstəsi Allah Rəsulunu (s.ə.v) təqib edərək onu daşa tutmuşdular. Atılan daşlardan qorunmaq üçün Allah Rəsulu (s.ə.v) Taif yaxınlığındakı bir meyvə bağçasına sığınmış və burada xristian bağban tərəfindən səfillərin hücumundan qorunmuşdu. Allah Rəsulunu (s.ə.v) dinləyən xristian bağban onun İslama dəvətini anlayışla qarşılamışdı. Taifli küçə uşaqları və səfillərin şərrindən bağçada sığınacaq tapan Allah Rəsulu (s.ə.v) əllərini səmaya qaldırıb bu zülm və işgəncəni Allaha şikayət edərək onu və ona iman gətirənləri darlıqdan genişliyə, çətinlikdən asanlığa çıxarması, bir sığınacaq yer nəsib etməsi üçün dua etmişdi. Taifli oymaq başçılarının Allah Rəsuluna (s.ə.v) qarşı bu cür münasibətlərinin arxasında güman ki, Qüreyşin müşrik liderləri dayanmaqda idilər. Çünki Qureyş zadəganların bir çoxu Tafidə mülk sahibi idilər. Taif Məkkədən fərqli olaraq əkinə yararlı, münbit torpaqlara sahib bir yer idi və Məkkə zadəganlarının burada əraziləri var idi. Onlar taiflilər arasında də nüfuz sahibi idilər.

Taifdən Məkkəyə qayıdan Allah Rəsulu (s.ə.v) yorğun və taqətsiz vəziyyətdə şəhər ətrafındakı təpəliklərə çatmış, lakin şəhərə girməkdən çəkinmişdi. Buna səbəb Əbu Ləhəbin onu yenidən təcrid edərək ailəsinin himayəsindən məhrum etməsi idi. Buna görə də Allah Rəsulu (s.ə.v) şəhərə adam göndərərək bir neçə

nüfuzlu şəxsdən onu himayə etməsini istəmişdi. Ən son müraciət etdiyi Müt'im ibn Ədiyy onun bu istəyinə müsbət cavab vermişdi. Müt'im ibn Ədiyy boykot tədbirinin yumuşaldılmasını təklif edən məkkəli tacirlərdən biri idi. Oğulları ilə birlikdə silahlanmış olaraq Allah Rəsulunun (s.ə.v) olduğu yerə gələn Müt'im onu öz evinə aparmış, sonra da bütün şəhərə Muhəmmədin (s.ə.v) bundan sonra onun himayəsində olduğunu car çəkdirmişdi. Vəfakarlığı dillər əzbəri olan Allah Rəsulu (s.ə.v) Müt'imin bu yaxşılığını əsla unutmamışdı.

*Me'rac (İsra) Hadisəsi*

İlahi təbliğ və tövhidə dəvətə başladığı gündən bəri ən çətin sınaqlardan keçərkən Allah Rəsulunun (s.ə.v) izdirab və məşəqqətləri artaraq çoxalmışdı. Məkkəli zadəganların zülmünə uğramış, onun tövhidə etdiyi çağırışa könül vermiş əshabından bir çoxu Həbəşistana hicrət etmiş, həyat yoldaşı, xanımı Xədicəni (r.ə) və himayədarı, əmisi Əbu Talibi itirmiş, sığınacaq umduğu Taifdən təhqiramiz şəkildə qovulmuşdu. Sınaq və imkansızlıq halqası hər keçən gün daralmışdı. Lakin o, Allaha olan sonsuz inamını və Allahın kəlamını üstün etmək yolundakı əzmini itirməmiş, sarsılmaz iradə ilə bu yolda heç bir şəxsi mənafe gözləmədən mübarizəsini davam etdirərək çətinliklər qarşısında əsla məyusluğa düçar olmamışdı.

"Göyə yüksəlmək" mənasında istifadə olunan "*me'rac*" kəlməsi Allah Rəsulunun (s.ə.v) peyğəmbər olaraq möcüzələrindən birinə verilən addır. Me'rac hadisəsi Allah Rəsulunun (s.ə.v) Məkkədən Mədinəyə hicrətindən bir il əvvəl, yəni miladi təqvimlə 621-ci ildə baş vermişdi. Qur'ani-Kərimin İsra surəsinin 1-ci, Nəcm surəsinin 13-14-cü, Təkvir surəsinin 23-cü ayələrində bu möcüzədən qısaca danışılır. Lakin hədis və tarix kitablarında bu mövzu haqqında ətraflı məlumat verilməkdədir. Xüsusilə Ənəs ibn Malik (r.ə), Ayşə bint Əbu Bəkr (r.ə), Malik ibn Sə'sə (r.ə), Əbu Zərr əl-Ğifari (r.ə), Əbu Hureyrə (r.ə), Ömər ibn Xəttab (r.ə), Abdullah ibn Abbas (r.ə), Əbu Səid əl-Xudri (r.ə), Huzeyfə ibnü'l-Yəman (r.ə) kimi səhabədən nəql olunan bir çox hədisdə me'rac hadisəsi təfərrüatı ilə təsvir olunmuşdur. Bu hədislərdə bir gecə Allah Rəsulu (s.ə.v) Buraq adlanan miniyin üzərində, Cəbrayılın (ə.s) müşayəti ilə, Məscidi-Həramdan əl-Əqsa məscidinə getmişdi. Daha sonra isə səmanın təbəqələrini keçərək Aləmlərin Rəbbi olan Allahın hüzuruna çıxmışdı. Allahın öz Peyğəmbərini (s.ə.v) belə bir möcüzəyə məzhər etməsinin səbəbi, İsra surəsinin birinci ayəsində də deyildiyi kimi, özünün bəzi ayələrini, yəni kəskin dəlillərini, digər insanların görə bilməyəcəklərini ona göstərmək idi. İslamın təməl ibadətlərindən olan hər gün beş vaxt namaz qılınmasının hər

bir müsəlmana fərz buyurulması da İsra gecəsində, yəni me'rac hadisəsinin baş verdiyi gecədə olmuşdur. Həmin vaxta qədər də Allah Rəsulu (s.ə.v) və möminlər namaz qılırdılar. İsra gecəsindən sonra isə İslamın bu təməl ibadəti bir müntəzəmlik çərçivəsinə oturmuşdu. İsra gecəsində Allah öz Elçisinə (s.ə.v) cənnəti və cəhənnəmi göstərmişdi. Allah Rəsulunun (s.ə.v) me'racla bağlı xəbərləri verməsi möminlərin imanlarını qüvvətləndirmişdisə, daha əvvəl ayın yarılması hadisəsiylə belə inkarçılıqlarından əl çəkməyən məkkəli müşriklər üçün yeni istehza mövzusu olmuşdu. Bununla yanaşı daha əvvəl iman gətirmiş, lakin imanda zəif olan bir neçə şəxs şübhə və tərəddüdə düşərək yenidən küfrə irtidad etmiş, dönmüşdülər. Bu mənada me'rac hadisəsi həm də şəksiz və səmimiyyətlə iman gətirənlərlə digərlərinin saf çürük edilərək bir-birindən ayırd edilməsini təmin etmişdi.

*Bəzi Yəsriblilərin İslamı Qəbul Etməsi və Əqəbə Beyətləri*

Hər il zilhiccə ayında yarımadanan müxtəlif yerlərində yaşayan ərəb qəbilələrinə mənsub insanlar dəstə-dəstə Məkkəyə gəlir, buradakı bütləri ziyarət etdikdən sonra şəhər ətrafında qurulan U'kaz, Zi-Micnə kimi yarmarkalarda ticarətlə məşğul olub tərtib edilən şeer yarşmalarından iştirak edirdilər. Yuxarıda qeyd etdiyimiz kimi Allah Rəsulu (s.ə.v) hər fürsətdə Məkkəyə gələn, yarımadanın müxtəlif yerlərindəki qəbilələrə mənsub ərəblərlə görüşərək onları tövhidə dəvət edir, bununla yanaşı onlardan özü və ona iman gətirənlər üçün sığınacaq istəyirdi. Məkkə müşrikləri bütün üsullara əl ataraq bu dəvət fəaliyyətinə əngəl törədirdilər. Əbu Ləhəb Allah Rəsulunun (s.ə.v) görüşüb söhbət etdiyi qəbilə mənsubları ilə ondan dərhal sonra görüşərək öz qardaşı oğlu Muhəmmədin (s.ə.v) əqlində qüsur olduğunu bildirir və söylədiklərini ciddi qəbul etməmələrini tövsiyə edirdi. Allah Rəsulu (s.ə.v) Yəsribdən (Mədinə) Məkkəyə ittifaq tələbi ilə gəlmiş, başlarında Əbül-Xeysər Ənəs ibn Rafinin olduğu Əvs qəbiləsi mənsubları ilə də görüşmüşdü. Yəsrib ərəbləri əsasən iki ərəb qəbiləsi mənsublarından ibarət idilər; Əvs və Xəzrəc qəbilələri. Bu iki qəbilə uzun illərdən bəri, artıq 120 il idi ki, bir-birinə düşmən idilər və aralarında tez-tez silahlı toqquşma olurdu. Belə silahlı toqquşmalardan biri də Bu'as döyüşüdür ki, məkkəli müşriklərin müsəlmanlara tətbiq etdikləri boykot dövrünə təsadüf etmişdi. Bu iki qəbilə öz düşməni qarşısında daha güclü mövqeyə malik olmaq üçün Yəsrib xaricindəki ərəb qəbilələri arasında özlərinə müttəfiq axtarırdılar. Əvs qəbiləsinə mənsub bəzi şəxslər də bu məqsədlə Məkkəyə gəlmiş və ən güclü ərəb qəbilələrindən biri hesab olunan Qüreyşlə ittifaq qurmaq istəmişdilər. Lakin onların bu cəhdi boşa çıxmışdı. Allah Rəsulu (s.ə.v) da bu

fürsətdən istifadə edərək əvslilərlə görüşmüş, onları İslama dəvət etmişdi. Lakin gələn hey'ət Allah Rəsulunun (s.ə.v) dəvətinə soyuq yanaşmışdı. Bir müddət sonra Allah Rəsulu (s.ə.v) Məkkədən Minaya gedən yol üzərindəki Əqəbə adlı yerdə 6 nəfər xəzrəcli ilə görüşərək onlarla söhbətləşmiş və İslama dəvət etmişdi. Xəzrəcli ərəblər onun bu dəvətinə icabət edərək İslamı qəbul etmişdilər. Bir müddət sonra eyni yerdə, bu dəfə, 2-si əvs, 10-u isə xəzrəcli olan, 12 nəfər yəsribli Allah Rəsulu (s.ə.v) ilə görüşərək onun dilindən tövhid əqidəsini və Qur'andan oxuduğu ayələri dinləmiş, İslamı qəbul etmişdilər. Başlarında Əsəd ibn Zurarənin (r.ə) olduğu bu 12 nəfər həmin yerdə Allah Rəsulunun (s.ə.v) hüzurunda sədaqət andı içmiş, yəni beyət etmişdilər. Bu birinci Əqəbə beyəti idi. Yəsriblilər Allah Rəsulundan (s.ə.v) özləri ilə onlara İslamı öyrədəcək bir şəxs göndərməyi də xahiş etmişdilər. Onların bu istəyini qəbul edən Allah Rəsulu (s.ə.v) əshabından Mus'ab ibn Umeyri (r.ə) İslamı yeni qəbul etmiş yəsriblilərlə birlikdə onların şəhərinə göndərmişdi. Mus'ab ibn Umeyrlə (r.ə) birlikdə öz şəhərlərinə qayıdan yəsribli müsəlmanlar böyük bir şövqlə İslamı anlatmış və gözlənilən rəsulun gəldiyini bildirmişdilər. Yəsribli ərəblər, məkkəlilərdən fərqli olaraq, nübuvvət haqqında məlumatlı və daha dərin anlayışa sahib idilər. Belə ki, Yəsribdə, irəlidə haqqında ətraflı məlumat verəcəyimiz, böyük bir yəhudi icması yaşayırdı və yəhudilər səmavi din sahibi olduqları üçün risalət və müqqəddəs mətnlər barədə bilik sahibi idilər. Bu səbəbdən peyğəmbərlik və ilahi ismarıc kimi anlayışlar onlarla əsrlərdən bəri ünsiyyətdə olan Əvs və Xəzrəc qəbiləsinə mənsub ərəblərə yad deyildi. Tövhidə dəvət Yəsribdə sürətlə yayılmış və bir çox insan öz qəbilədaşlarının bu dəvətinə könül vermişdi.

Birinci Əqəbə beyətindən bir il sonrakı həcc mövsümündə Mus'ab ibn Umeyr (r.ə) yəsriblilərdən böyük bir qrupla Məkkəyə gəlmişdi. Məkkəyə çatandan sonra onlar yenidən Əqəbədə Allah Rəsulu (s.ə.v) ilə görüşmək üçün razılaşdılar. Bir gecə vaxtı, diqqət və şübhə cəlb etməmək üçün kiçik qruplarla Əqəbəyə gələn yəsriblilər bu dəfə 2-si qadın olmaqla, 73 nəfər idilər. Bunlardan 62-si xəzrəcli, 11-i isə əvsli idi. Allah Rəsulu (s.ə.v) özü ilə təqribən yəmyaş olan əmisi Abbas ibn Əbdülmüttəliblə birlikdə yəsriblilər ilə görüşməyə gəlmişdi. Abbas hələ ki, İslamı qəbul etməmişdi, lakin Allah Rəsulu (s.ə.v) ona etibar edirdi. Çünki böyük qardaşı Əbu Talibin ölümündən sonra Abbas qardaşı oğlunun təhlükəsizliyinin təmini üçün əlindən gələni etmişdi. Abbas yəsriblilərə xitab edərək belə dedi: "*Bildiyiniz kimi Muhəmməd (s.ə.v) indi öz vətənində və ailəsinin himayəsindədir. Sizinlə birlikdə olmaq üçün Məkkəni tərk etmək istəyir. Əgər vədinizi yerinə yetirə biləcəyinizə inanırsınızsa bu məsuliyyəti üstünüzə götürün. Yox əgər bu işin öhdəsindən gələ*

*bilməyib onu tərk edəcəksinizsə indidən onu öz yanınıza dəvət etməkdən əl çəkin*". Yəsriblilər bu deyilənləri anladıqlarını bildirdikdən sonra bu haqda Allah Rəsulunun (s.ə.v) nə deyəcəyini eşitmək istədiklərini söylədilər. Allah Rəsulu (s.ə.v) onlara Qur'andan bəzi ayələri oxuyub bir daha tövhidə dəvət etdikdən sonra dedi: "*Ailənizi, qadınlarınızı və uşaqlarınızı qorduğunuz kimi məni də qorumanız şərti ilə əlimi beyət üçün sizə uzadıram*". Bu vaxt Bəra ibn Mə'rur (r.ə) adlı yəsribli bir gənc ayağa qalxaraq Allah Rəsuluna (s.ə.v) yaxınlaşıb onun əlindən tutdu və dedi: "*Ey Allahın Rəsulu (s.ə.v) səni öz elçisi olaraq bizə göndərən Allaha and olsun ki, öz ailələrimizi necə qoruyuruqsa səni də elə qoruyacağıq. Biz döyüşkən kişilərin övladıyıq, əlimiz silah tutur və bu ənənə bizə əcdadımızdan qalmışdır. Hamımız sənə beyət edirik*". Onlardan Əbül-Heysəm Malik ibn Tihyan (r.ə) adlı bir şəxsin "*Ey Allahın Rəsulu (s.ə.v) Allahın yardımı ilə müvəffəq olandan sonra bizi buraxıb öz qövmünün yanına qayıdacaqsanmı?*" sualına Allah Rəsulu (s.ə.v) belə cavab vermişdi: "*Əksinə, qanınız qanım, sizin yaxınlarınız mənim yaxınlarım sayılır. Mən sizdənəm, siz də məndənsiniz. Kiminlə vuruşsanız onunla vuruşacağam, kiminlə barışsanız onunla barışacağam*". Bu sözdən sonra ilki Bəra ibn Mə'rur (r.ə) olmaqla yəsribli hey'ət bir-bir Peyğəmbərin (s.ə.v) əlini tutub sədaqət andı içdilər. Daha sonra Allah Rəsulu (s.ə.v) onların öz aralarında bir neçə nəfərlik hey'ət seçmələrini istədi. Bu şəxslər Yəsribdə Allah Rəsulunun (s.ə.v) naibləri, təmsilçiləri olacaqdılar. Yəsriblilər 3-ü Əvs, digərləri Xəzrəc qəbiləsindən olmaqla 12 nəfərlik naiblər hey'ətini seçdilər. Bəra ibn Mə'rur (r.ə), Əsəd ibn Zərarə (r.ə), Sə'd ibn Rəbi' (r.ə), Sə'd ibn Ubadə (r.ə), Abdullah ibn Rəvaha (r.ə), Ubadə ibn Samit (r.ə), Rafi' ibn Malik (r.ə), Abdullah ibn Əmr (r.ə), Munzir ibn Əmr (r.ə), Useyd ibn Hudeyr (r.ə), Sə'd ibn Heysəmə (r.ə), Əbü'l-Heysəm Malik ibn Tihyan (r.ə) Allah Rəsulunun (s.ə.v) naibləri olmuşdular. Allah Rəsulu (s.ə.v) bunlara başçı olaraq Əsəd ibn Zurarəni (r.ə) təyin etmişdi. Bu hadisə mənbələrdə ikinci Əqəbə beyəti olaraq qeyd edilməkdədir.

Məkkəli müşriklər səhər açılanda keçən gecə Əqəbədə baş verənlər haqqında söz-söhbətlər eşitməyə başlamışdılar. Bunun doğru olub olmadığını dəqiqləşdirmək üçün Minaya gəldilər və yəsribliləri hədələyərək həqiqətən nə baş verdiyini öyrənməyə çalışdılar. Yəsribli müsəlmanlar susmağa üstünlük verdilər. Onların müşrik həmyerliləri isə and içərək dünən gecə nə baş verdiyindən bixəbər olduqlarını bildirdilər. Məkkəli müşriklər məsələdən xəbərdar olana qədər yəsribli müsəlmanlar Məkkədən uzaqlaşıb öz şəhərlərinin yolunu tutmuşdular. Bir qrup qüreyşli onları təqib etmiş və Sə'd ibn Ubadəni (r.ə) yaxalayaq Məkkəyə gətirmişdilər. Məkkəli müşriklərin təhqir və

hədələrinə məruz qalan Sə’di (r.ə), daha əvvəl Peyğəmbəri (r.ə) himayə etmiş Mut’im ibn Ədiyyin oğlu Cübeyr və digər bir qüreyşli tacir Haris ibn Üməyyə öz həmşəhərlilərinin əlindən alaraq qorumuşdular. Çünki Sə’d ibn Ubadə (r.ə) yaxınları ilə birlikdə daim onların şimal istiqamətinə gedən ticarət karvanlarını Yəsrib yolunda soyğunçulardan qoruyurdu.

*İlk Müsəlman Qadınlar*

Hədis külliyatlarında Allah Rəsulunun (s.ə.v) qadınlara, analara təqdiredici ifadələrlə necə böyük dəyər verdiyi haqqında bir çox hədis qeyd olunmuşdur. “*Cənnət anaların ayaqları altındadır*” deyən Muhəmməd (s.ə.v) qadınların cəmiyyətdəki mövqeyini hər zaman ucaltmaq istəmiş, bununla da o, öz ümmətinə bizləri dünyaya gətirən, körpə ikən öz qoynunda bəsləyib böyüdən, tərbiyə edib yetişdirənlərə daima hörmətlə yanaşmağı əmr etmişdir. İslamdan əvvəlki dövrdə ərəb yarımadasında, eləcə də bütün dünyada, qadının ikinci növ bir insan kimi rəftar gördüyü, qədim Yunanıstan kimi cəmiyyətlərdə kişilərin öz həyat yoldaşları və qızlarını sahib olduqları kölələrlə eyni səviyyədə tutduqları bilinməkdədir. İslam meydana gəldiyi ilk günündən bəri qadına layiq olduğu dəyəri vermişdir. Bu da təsadüfi deyildi, belə ki, Allah Rəsuluna (s.ə.v) ilk iman etmiş insan qadındır, bu onun ömür-gün yoldaşı, zövcəsi Xədicə (r.ə) idi. Bu səbəbdəndir ki, Xədicə (r.ə), eləcə də Allah Rəsulunun (s.ə.v) digər zövcələri Allah tərəfindən “*ummu’l-muminin*”, yəni möminlərin anası kimi şanı uca bir ada layiq görülmüşdürlər.

İslamı ilk qəbul edən qadınlardan biri də Ummü’l-Fəzl ləqəbi ilə tanınan Lübabə bint əl-Harisdir (r.ə). Bu qadın Peyğəmbərin (s.ə.v) əmisi Abbasın xanımı idi və ərindən çox daha əvvəl İslam dinini qəbul etmişdi. Lübabə (r.ə) Qüreyş qəbiləsinin zadəgan ailələrindən birinə mənsub idi. Bu möminə qadın məşhur səhabə, ilk dövr İslam alimlərindən Abdullah ibn Abbasın (r.ə) anasıdır. Lübabə (r.ə) həmçinin ummü’l-muminin Meymunənin (r.ə) bacısı idi.

Umm Şərik Quzeyyə (r.ə) adlı ilə tanınan bədəvi qadın da Məkkədə İslamı qəbul etmiş ilk qadınlardandır. O, öz fəallığı ilə seçilir və qadınların arasında İslamın yayılması üçün əlindən gələni edirdi. Qüreyşli müşriklər bu möminə qadını Məkkədən sürgün edərək uzaqlaşdırmışdılar.

Yuxarıda Fatimə bint Xəttab (r.ə) haqqında, onun ilk müsəlmanlardan olduğu və qardaşı Ömər ibn Xəttabın (r.ə) İslamı qəbul etməsinə dolaylı olaraq səbəb olduğu haqqında məlumat vermişdik.

Bundan başqa Şəfa bint Abdullah (r.ə), Sə’də bint Kureyz (r.ə), Umm Həbibə bint Əbu Süfyan Səxr (r.ə), Səvdə (r.ə) kimi bəzi qureyşli xanımlar da

Allah Rəsulunun (s.ə.v) dəvətinə icabət edib İslamı qəbul etmiş ilk müsəlman qadınlardır. İlk müsəlman qadınlar haqqında danışarkən ikinci Əqəbə beyətində iştirak etmiş yəsribli xanımlardan Nəsibə bint Kə'b (r.ə) və Əsma bint Əmrin (r.ə) adını çəkmək yerinə düşəcəkdir. Məkkənin ilk müsəlman qadınlarından, Əmmar ibn Yasirin (r.ə) anası Suməyyə (r.ə) Əbu Cəhl tərəfindən qətlə yetirilmiş, şəhid olmuşdu.

**Mədinəyə Hicrət**

İkinci Əqəbə beyətindən sonra artıq Mədinə yolu Məkkəli müsəlmanların üzünə açılmışdı. İllər boyu Məkkədə qüreyşli müşriklərin hər cür zülm və işgəncəsinə məruz qalıb məşəqqətlərə dözən müsəlmanlar doğma şəhərlərini gizlicə tərk edərək Mədinəyə köçmüşdülər.

Mədinəyə ilk hicrət edənlərdən biri Əbu Sələmə (r.ə) idi. O, xanımını və azyaşlı oğlunu dəvəsinə mindirərək Mədinə yoluna çıxmışdı. Fəqət çox getmədən xanımının soyu olan Bəni-Muğirədən bəzi müşriklər onların qarşısını kəsərək "*özün istədiyin yerə gedə bilərsən, lakin qızımızı özünlə aparmağına izn verməri*k" deyib zorla xanımı Umm Sələməni[22] (r.ə) dəvədən düşürmüşdülər. Beləcə Umm Sələmə azyaşlı oğlu ilə Məkkədə qalmışdı. Bu dəfə də Əbu Sələmənin (r.ə) mənsub olduğu Əbdüləsəd soyundan bəzi müşriklər onun ailəsinin yanına gələrək "*siz qardaşımızın arvadı olan qızınızı aldınız, oğlumuzu yanımızda saxlamaq da bizim haqqımızdır*" deyib azyaşlı oğlu Sələməni onun əlindən almışdılar. Beləcə ilk müsəlman qadınlardan olan Umm Sələmə (r.ə) həm həyat yoldaşından, həm də azyaşlı oğlundan ayrı qalmağa məcbur olmuşdu. Umm Sələmə (r.ə) beləcə bir il ərindən və oğlundan ayrı qalaraq hər gün Əbtah adlanan yerə gedib Mədinə yollarına baxaraq göz yaşı tökmüşdü. Əmisi oğullarından biri onun bu halına acıyaraq qardaşlarına "*bu zavallını daha nə qədər ərindən və oğlundan ayıracaqsınız?*" deyib xahiş etdikdən sonra ailəsi onun ərinin yanına getməsinə izn vermişdi.

Qüreyşli müşriklərin hicrətinə mane olmaq istədikləri şəxslərdən biri də Allah Rəsuluna (s.ə.v) ilk iman etmiş məkkəlilərdən Əbu Yəhya Suheyb

[22] Umm Sələmə Hind bint Suheyl ibn Muğirə əl-Məxzumi əri Əbu Sələmə Abdullah ibn Əbdiəsədlə birlikdə İslamı ilk qəbul edən məkkəlilərdən idilər. Həbəşistana birlikdə hicrət etmiş, daha sonra Məkkəyə geri qayıtmışdılar. Əbu Sələmə (r.ə) Bədr və Uhud döyüşlərində iştirak etmiş, Uhudda bir neçə ağır yara almış, uzun müalicədən sonra sağalmışdı. Uhuddan sonrakı bir hərbi yürüşdə iştirak edəndən sonra yaralarının iltihablanması nəticəsində vəfat etmişdi. Onun vəfatından sonra Allah Rəsulu (s.ə.v) dul qalmış Umm Sələmə (r.ə) ilə nikahlanmışdı. Əbu Sələmə Abdullahın (r.ə) anası Peyğəmbərin (s.ə.v) bibisi Bərra bint Əbdulmuttəlib idi.

ibn Sənan ər-Rumi (r.ə) idi. Onlar Suheybin (r.ə) qarşısını kəsərək ona belə demişdilər:

- "*Sən zavallı, didərgin bir kasıb ikən bu şəhərə gəlmişdin, halın pərişan və yoxsul idin. Burada, bizim məmləkətimizdə pul, var-dövlət qazanıb sərvət sahibi oldun və bu günlərə gəlib çatdın. İndi də həm canını, həm də malını alıb gedirsən? Hardandır bu bolluq? İnan ki, biz buna yol verməyəcəyik*".

Onları görən Suheyb (r.ə) dəvəsindən enərək yayını almış və sadağından bir ox çıxararaq müşriklərə belə demişdi:

- "*Mənim Məkkədəki ən sərrast oxçulardan biri olduğumu bilirsiniz. Allaha and olsun ki, oxum tükənənə qədər mənə yaxınlaşa bilməyəcəksiniz. Oxum bitəndən sonra isə qılıncımla öhdənizdən gələcəyəm. Lakin mən Məkkədəki mal-dövlətimin yerini sizə deyəcəyəm, siz də mənim yolumdan çəkilin*".

Məkkəli müşriklər onun bu təklifi ilə razılaşaraq getməsinə mane olmamışdılar. Allah Təala bu hadisədən sonra Bəqərə surəsinin 207-ci ayəsini endirərək Allah Rəsulunun (s.ə.v) səhabəsinin bu hərəkətini mədh etmişdi: "*İnsanların eləsi də vardır ki, Allahın razılığını qazanmaq yolunda (Allah rizası üçün) özü-özünün satın alar. Allah öz bəndələrinə qarşı çox mehribandır*!". Bu vəhydən sonra Allah Rəsulu (s.ə.v) Suheybə (r.ə) üzünü tutaraq "*ticarətində qazandın ey Əbu Yəhya, ticarətində qazandın*" demişdi.

Ömər ibn Xəttab (r.ə) hicrət edəcəyi gün zirehini geyib qılıncını qurşanmış və Kə'bəni təvaf etdikdən sonra oradakı müşriklərə meydan oxuyaraq belə səslənmişdi: "*Budur, bu mənəm, dinimi hifz etmək üçün Allah yolunda hicrət edirəm. Arvadını dul, övladını yetim qoymaq istəyən varsa getdiyim yolda qarşıma çıxsın*".

622-ci ilin rəbiələvvəl ayında ki, bu miladi təqvimlə həmin ilin sentyabr ayına təqabül edir, artıq Məkkədə demək olar ki, heç müsəlman qalmamışdı. Lakin Allah Rəsulu (s.ə.v) Əbu Bəkr (r.ə) və Əli (r.ə) ilə birlikdə Məkkədə idilər. Allah Rəsulu (s.ə.v) özünün hicrətiylə bağlı ilahi əmr gəlmədən Məkkəni tərk etməmişdi.

Bütün bunlar baş verərkən qüreyşli müşriklər müsəlmanların hər hərəkətinə göz qoyur, ətraflı məlumat toplayırdılar. Onlar narahat idilər. Çünki qüreyşli müsəlmanların hicrət etdikləri Mədinə şəhəri Məkkədən şimalda, yəni onların ticarət yolunun üzərində yerləşirdi və müşriklər gələcəkdə bunun onların əleyhinə ola biləcəyini təxmin edirdilər. Ən əsası isə Allah Rəsulunun (s.ə.v) dəvəti ilə Mədinədə İslamı qəbul edənlərin sayının artacağı onları əndişələndirirdi. Bu səbəbdən də onlar Allah Rəsulunun (s.ə.v) Məkkədən Mədinəyə hicrət etməsini qətiyyən istəmirdilər. Qüreyş müşriklərinin liderləri baş verənləri dəyərləndirmək və görəcəkləri tədbirləri müzakirə etmək üçün Daru'n-Nədvədə toplaşmışdılar. Əbu Cəhl Əmr ibn Hişam, Üməyyə ibn Xələf,

Utbə ibn Rəbiə, Cübeyr ibn Mut'im, Əbü'l-Buxtəri As ibn Hişam, Nəzir ibn Haris, Hakim ibn Hizam, Hişam ibn Əmr, Əbu Süfyan Səxr kimi qüreyşli müşrik zadəganlar Daru'n-Nədvədə yekdil qərara gələ bilmək üçün bu məsələni müzakirə etməyə başlamışdılar. Allah Rəsulunu (s.ə.v) həbs etəmək təklifi qəbul edilmədi. Çünki mənsub olduğu soydan insanların onu azad etməyə cəhd edəcəklərini, bunun isə qan tökülməsinə səbəb olacağını bilirdilər. Hişam ibn Əmr "*ən yaxşısı Muhəmmədi (s.ə.v) öz istədiyimiz yerə sürgün edək*" dedi. Lakin bu təklif də ağlabatan hesab olunmadı. Nəhayət azğınlıq və zalımlıqda hər kəsdən öndə olan Əbu Cəhl belə bir təkliflə çıxış etdi: "*Qüreyşin hər oymağından cəsur və qüvvətli bir gənc seçək və onları kəskin qılınclarla silahlandıraq. Qoy onların hamısı Muhəmmədə (s.ə.v) eyni vaxtda qılınc zərbəsi vurub öldürsünlər. Beləcə onun qanı sadəcə bir şəxsin boynunda qalmaz. Bəni-Haşim ailəsi isə bu qədər ailədən eyni vaxtda qan intiqamı almağa cəsarət etməz. Sona biz ailəsinə qan diyəti təklif edərik. Beləcə həm Muhəmməddən (s.ə.v) qurtulmuş olarıq, həm də bu məsələ bu yolla bağlanıb gedər*". Əbu Cəhlin bu təklifi yekdilliklə qəbul olundu. Hər şeydən xəbərdar olan Allah Təala həmin gün öz Elçisinə (s.ə.v) hicrət izni verdi və müşriklərin məkrli pusqusundan onu xəbərdar etdi. Allah Rəsulu (s.ə.v) sadiq dostu Əbu Bəkri (r.ə) hicrət iznindən xəbərdar edib yol üçün hazırlıq görməsini tapşırdı. Əbu Bəkr (r.ə) əvvəlcədən hazırladığı iki dəvəni Allah Rəsuluna (s.ə.v) təqdim edərək dilədiyini seçməsini istədi. Digərinə isə Əbu Bəkrin (r.ə) yol üçün hazırladığı ərzağı və digər ləvazımatı yığıb gecə vaxtı yola çıxmışdılar. Əbu Bəkr (r.ə) Abdullah ibn Ureyqit adlı bir sarvana xeyli miqdarda pul verərək onlara bələdçilik etməsini də təmin etmişdi. Allah Rəsulu (s.ə.v) ona sui-qəsd planı hazırlamış müşrikləri şübhələndirməmək üçün öz evində gecə qaranlığının çökməsini gözləmiş və Qüreyşin ən igid gənclərindən biri olan əmisi oğlu Əli ibn Əbu Talibə (r.ə) həmin gecə onun yatağına girib əbası ilə örtünməsini tapşırmışdı. Gecədən xeyli keçmiş sui-qəsdçilər artıq onun evinin ətrafında pusquya yatmışdılar. Allah Rəsulu (s.ə.v) Yasin surəsinin ilk ayəsindən 9-cu ayəsinə qədər oxuyaraq əlindəki torpağı pusqudakılara tərəf atmışdı.

وَجَعَلْنَا مِنْ بَيْنِ أَيْدِيهِمْ سَدًّا وَمِنْ خَلْفِهِمْ سَدًّا فَأَغْشَيْنَاهُمْ فَهُمْ لَا يُبْصِرُونَ

"*Biz onların önlərinə və arxalarına sədd çəkib gözlərini bağlamışıq. Buna görə də artıq görməzlər*".

Sözləşdikləri vaxtda və yerdə Əbu Bəkrlə (r.ə) görüşən Allah Rəsulu (s.ə.v) Mədinəyə doğru yola çıxmışdı. Pusqudakılar isə onun evinin içinə gizlicə göz qoyaraq yatağında yatdığını düşünürdülər. Səhərə yaxın evdən Muhəmmədin (s.ə.v)

deyil Əlinin (r.ə) çıxdığını görüb "*Muhəmməd (s.ə.v) haradadır?*" sualına ondan "*bilmirəm*" cavabını aldıqda müşriklər nəyə uğradıqlarını anlamışdılar. Onlar bütün şəhərdə Allah Rəsulunu (s.ə.v) axtarsalar da heç bir nəticə əldə edə bilmədilər. Onun Məkkədən çıxıb getdiyini anlamışdılar. Sui-qəsdi tərtib edənlər Muhəmmədi (s.ə.v) tapan və ya yerini aşkar edib deyən üçün mükafat təyin etdilər.

Allah Rəsulu (s.ə.v) həmin gecə evinin ətrafında pusquya yatmış müşriklərin arasından keçib Əbu Bəkrlə (r.ə) əvvəlcədən razılaşdığı yerdə görüşmüş, birlikdə piyada Məkkədən bir qədər aralıda olan Səvr dağında doğru getmişdilər. Məkkə müşriklərinin onları axtarıb tapmaqdan ümidlərini kəsənə qədər bu dağdakı mağarada gizlənmək istəyirdilər. Çünki birbaşa Mədinəyə doğru yola çıxsaydılar qüreyşli müşriklər onları təqib edib tapa bilərdilər. Dağın başındakı mağaraya doğru gedərkən Əbu Bəkr (r.ə) bəzən Allah Rəsulunun (r.ə) önündə bəzən də arxasında yeriyirdi. Allah Rəsulu (s.ə.v) bunun səbəbini soruşduqda Əbu Bəkr (r.ə) : "*Ey Allahın Elçisi (s.ə.v)! Müşriklərin səni təqib etdiyini düşündükçə arxanda, sənə pusqu quracaqlarını düşündükcə də önündə yeriyirəm*" deyə cavab vermişdi. Allah Rəsulunun (s.ə.v): "*Məni gözləyən bir müsibətin sənin başına gəlməsini istəyərsənmi?*" sualına isə Əbu Bəkr (s.ə.v): "*Bəli! Səni haqq din ilə peyğəmbər olaraq göndərən Allaha and olsun ki, səni gözləyən müsibətin mənim başıma gəlməsini istəyərəm*".

Allah Rəsulu (s.ə.v) sadiq dostu Əbu Bəkrlə (r.ə) birlikdə gəlib mağaraya çatmışdı. Əbu Bəkrin (r.ə) mağaranı təmizləyib içəridəki dəlik deşikləri tıxamasından sonra Allah Rəsulu (s.ə.v) mağaraya girmiş və birlikdə orada gözləməyə başlamışdılar. Bu vaxt Əbu Bəkr (r.ə) mağaradakı ilan yuvalarından birinin açıq olduğunu görüb Allah Rəsulunu (s.ə.v) bundan qorumaq üçün dabanı ilə dəliyi tıxamış və ilan onun dabanını çalmışdı. Ömər ibn Xəttabın (r.ə) xəlifəliyi dövründə bəzi insanların onun Əbu Bəkrdən (r.ə) daha üstün olduğunu dediklərini eşitdiyi zaman Ömər (r.ə) belə demişdi: "*Vallahi, Əbu Bəkrin (r.ə) mağaradakı o gecəsi Ömərin bütün sülaləsindən daha xeyirlidir. Rəsulullah (s.ə.v) mağaraya getmək üçün evindən çıxdığı vaxt Əbu Bəkr (r.ə) onun yanında idi*".

Bu vaxt Allahın təqdiri ilə bəzi möcüzəvi hadisələr baş vermişdi. Allah Rəsulu (s.ə.v) və sadiq dostu Əbu Bəkrin (r.ə) sığındıqları mağaranın girişinə hörümçək tor hörmüş, iki çöl göyərçini də hörümçək torunun önündə yuva qurmuşdu. Səhər açıldığı vaxt müşriklər Allah Rəsulunu (s.ə.v) hər yerdə axtarmağa başlamışdılar. Əbu Cəhl bir dəstə müşriklə birlikdə Əbu Bəkrin (r.ə) evinə gəlib onu çağıranda qarşısına Əbu Bəkrin (r.ə) qızı Əsma (r.ə) çıxmışdı. Əbu Cəhlin "*Atan haradadır?*" sualına Əsma (r.ə) "*Harada olduğunu bilmirəm*" deyə ca-

vab vermiş və Əbu Cəhl qızcığazın yanağına elə möhkəm bir sillə vurmuşdu ki, qulağındakı sırğa çıxıb yerə düşmüşdü. Məkkə müşikləri Allah Rəsulunu (s.ə.v) hər yerdə, şəhərdə, şəhərin ətrafındakı dağlarda, su quyularının olduğu yerlərdə axtarmaq üçün atlılar göndərmişdilər. Onun izinə düşmək üçün Kurz və Suraqə adlı iki təcrübəli ləpirçiyə pul ödəmişdilər. Suraqə izlərin Səvr dağına doğru apardığını Məkkə müşriklərinə bildirmişdi. Suraqə və Kurz dağın hər bucağını axtarmış və nəhayət mağaraya yaxınlaşmışdılar. Lakin mağaranan ağzındakı göyərçin yuvasını görüb geri qayıtmışdılar. Suraqə “*o mağaranın girişində göyərçinlər yuva qurublar, hörümçək toru da yırtılmayıb, orada heç kim yoxdur*” deyərək oradakı qüreyşliləri geri qaytarmışdı. Bəziləri qaytmayıb mağaranın içinə baxmaq istəyəndə Uməyyə ibn Xələf bunun artıq vaxt itkisi olduğunu düşünüb: “*Sizin heç ağlınız yoxdur? Üzərini qatbaqat hörümcək toru örtmüş o mağarada nə işiniz var?”* deyərək onları bu fikirdən daşındırmışdı. Səvr dağını qarış-qarış gəzərkən Əbu Cəhl yoldaşlarına “*bilirəm ki, o, buralarda, lap yaxınımızdadır, lakin o sehirli sözləri ilə yəqin bizi əfsunlayıb gözlərimizi bağlamışdır*” demişdi.

Əbu Bəkr (r.ə) başını qaldırıb mağarının tavanındakı yarıqlardan yuxarı baxdıqda onları axtaran qüreyşli müşriklərin ayaqlarını görürdü. Müşriklərin ayaqlarının altına baxacaqları təqdirdə onları görə biləcək qədər yaxın olduğunu gördükcə Əbu Bəkr (r.ə) əndişələnirdi. O, müşriklərin onun yanında ikən Allah Rəsuluna (s.ə.v) bir xətər yetirə biləcəklərini düşündükcə dərin hüznə qapılırdı. Allahın Elçisi (s.ə.v) onun bu halını gördükcə ona təsəlli verir, Allahın onlarla birlikdə olduğunu və qorduğunu deyirdi. Allah öz kitabında bu hadisəni belə vəsf etmişdi:

إِذْ هُمَا فِي ٱلْغَارِ إِذْ يَقُولُ لِصَاحِبِهِ لَا تَحْزَنْ إِنَّ ا َ مَعَنَا فَأَنزَلَ ا ُ سَكِينَتَهُ عَلَيْهِ وَأَيَّدَهُ بِجُنُودٍ لَّمْ تَرَوْهَا وَجَعَلَ كَلِمَةَ
ٱلَّذِينَ كَفَرُوا ٱلسُّفْلَىٰ وَكَلِمَةُ ا ِ هِيَ ٱلْعُلْيَا وَا ُ عَزِيزٌ حَكِيمٌ

“*Hər ikisi mağarada olduğu və öz dostuna (Əbu Bəkrə): “Hüzünlənmə, Allah bizimlədir!”-dediyi zaman Allah ona bir arxayınlıq (rahatlıq) nazil etmiş, onu sizin görmədiyiniz (mələklərdən ibarət) əsgərlərlə müdafiə etmiş, kafirlərin sözünü alçaltmışdı. Yalnız Allahın sözü ucadır. Allah yenilməz qüvvət, hikmət sahibidir!”* (Tövbə surəsi 40).

Allah Rəsulu (s.ə.v) peyğəmbərliklə müşərrəf olarkən qırx yaşında idi. Onun bi’sətdən hicrətə qədər Məkkədə qaldığı müddət on üç il olmuşdu. İkinci Əqəbə beyəti zilhiccə aynında baş vermişdi. Allah Rəsulu (s.ə.v) həmin zilhiccə ayını və ondan sonrakı məhərrəm və səfər aylarını da Məkkədə keçirmişdi.

Bu üç ay ərzində onun tövhidə dəvətinə icabət etmiş məkkəli möminlər doğma yurdlarını tərk edərək Mədinəyə hicrət etmişdilər. Sonra isə Allah Rəsulu (s.ə.v) öz sadiq dostu Əbu Bəkrlə (r.ə) birlikdə hicrət etmişdi. Onlar Məkkəni tərk edib Səvr mağarasına rəbiələvvəl ayının ilk cümə axşamı günü gəlmişdilər. Burada üç gün və üç gecə keçirmişdilər. Bu məddət ərzində onları hər yerdə axtaran məkkəli müşriklər onların yerini deyənə və ya öldürənə yüz dəvə mükafat verəcəklərini və'd etmişdilər. Əbu Bəkrin (r.ə) Abdullah adlı gənc və zirək oğlu gündüzlər Məkkədə gəzərək eşitdiyi və gördüyü hər şeyi yadında saxlayır, gecə isə Səvr mağarasına gələrək şəhərdəki bütün yenilikləri Allah Rəsuluna (s.ə.v) və atasına danışırdı. Dan yeri ağarmamış isə Abdullah Məkkəyə qayıdırdı. Beləcə Allah Rəsulu (s.ə.v) və Əbu Bəkr (r.ə) Qüreyş müşriklərinin nə etdiklərindən və etmək istədiklərindən xəbərdar olurdular. Əbu Bəkrin (r.ə) heyvanlarını otaran çobanı Amir ibn Fuheyrə (r.ə) isə hər səhər məkkəli digər çobanlarla birlikdə heyvanları otlağa çıxarır, axşam isə yubanaraq onlardan geriyə qalır, sürünü Səvr dağına tərəf gətirərək bir neçə qoyunun südünü sağıb Allah Rəsulu (s.ə.v) və Əbu Bəkrə (r.ə) verirdi. Daha sonra sürünü Abdullahın gəlib getdiyi cığırla Məkkəyə tərəf sürərək onun izlərinin də qarışıb itməsini təmin edirdi.

Məkkənin varlı tacirlərindən biri olan Əbu Bəkr (r.ə) İslamı qəbul edərkən 40 min dirhəm gümüş pula sahib idi. O, sərvətinin bir qismini Məkkədə müşriklərdən zülm görən müsəlman kölələri sahiblərindən satın alaraq azad etməyə sərf etmişdi. Onun bu şəkildə azad etdiyi möminlərdən biri də Bilal Həbəşi idi. Hicrət vaxtı isə Əbu Bəkrin (r.ə) 5-6 min dirhəmi var idi. Səvrdə ikən o, bu pulların yerini oğlu Abdullaha deyərək özü ilə Mədinəyə aparmaq üçün mağaraya gətirtmişdi.

Allah Rəsulu (s.ə.v) və Əbu Bəkr (r.ə) cümə, şənbə və bazar gecəsini Səvr mağarasında keçirdikdən sonra bazar ertəsi dan yeri ağaranda bələdçi Abdullah ibn Ureyqit Əbu Bəkrin (r.ə) tapşırığı ilə əvvəlcədən razılaşıldığı kimi hazırladığı iki dəvəni mağaranın yaxınlığına gətirdi. Qəsva adlı dəvəyə Allah Rəsulu (s.ə.v), digər dəvəyə isə Əbu Bəkr (r.ə) və Amir ibn Fuheyrə (r.ə) minərək İbn Ureyqitin bələdçiliyində yola çıxdılar. Həzvərə adlanan yüksəkliyi aşarkən Allah Rəsulu (s.ə.v) doğma şəhərinə baxdı və Kə'bəni görərkən "*Vallahi, heç şübhəsiz bilirəm ki, sən Allahın yaratdığı ən xeyrli yersən və dünyada Allaha səndən daha sevimli yer yoxdur. Mənimçün də səndən daha gözəl və sevimli bir yer yoxdur. Bu qövm məni səndən çıxarmasaydı, mən səni tərk etməzdim*" demişdi. Əbu Bəkr (s.ə.v) isə öz həmşəhərlilərini nəzərdə tutaraq "*İnna lillahi inna ileyhi raciun, onlar Allahın Elçisini (s.ə.v) qovdular, şübhəsiz bu əməlləri*

*səbəbiylə məhvə uğrayacaqlar*" deyərək doğma yurdundan ayrılırdı. Bu vaxt Allah öz Elçisinin (s.ə.v) yurd həsrətini təsəlli etmək üçün İsra surəsinin 80-ci ayəsini vəhy etmişdi:

وَقُلْ رَبِّ أَدْخِلْنِي مُدْخَلَ صِدْقٍ وَأَخْرِجْنِي مُخْرَجَ صِدْقٍ وَاجْعَلْ لِي مِنْ لَدُنْكَ سُلْطَانًا نَصِيرًا

"*De ki: "Ey Rəbbim! Məni daxil edəcəyin yerə (Mədinəyə) xoşluqla daxil et, məni çıxaracağın yerdən (Məkkədən) də xoşluqla çıxart. Öz dərgahından mənə kömək edə bilən bir dəlil ver!*"

Abdullah ibn Ureyqit Usfan adlanan yerə çatandan sonra karvan yolundan çıxıb heç kimin getmədiyi səhra yolu ilə Mədinəyə tərəf irəliləməyə başlamışdı. Karvan yolları hər kəs tərəfindən tanınırdı, lakin heç kimin getmədiyi səhralıq əraziləri keçmək üçün mütləq o yerləri yaxşı tanıyan təcrübəli bələdçiyə ehtiyac var idi. Peyğəmbər (s.ə.v) və Əbu Bəkr (r.ə) də təqib olunacaqları təqdirdə izlərinə düşülə bilməsin deyə vaxtaşırı istiqamət dəyişərək bəzən karvan yolu, bəzən də səhralıqla hərəkət etmişdilər. Karvan yolunda daim hərəkət olurdu və bələdçi bunu Allah Rəsulu (s.ə.v) və Əbu Bəkrin (r.ə) tanınmasından ehtiyatlanaraq etmişdi. Əbu Bəkr (r.ə) ticarət səfərlərinə çıxarkən Məkkədən şimala gedən yoldan bir çox dəfə keçmişdi və yol üzərindəki məntəqələrdə onu tanıyanlar var idi. O, Allah Rəsulunun (s.ə.v) arxasınca gedirdi. Yolda görüşdüyü onu tanıyan insanlar Allah Rəsulunu (s.ə.v) göstərərək "*bu kimdir?*" deyə soruşanda isə "*mənə doğru yolu göstərən bələdçimdir*" deyirdi. O, bunu Allah Rəsulunu (s.ə.v) qüreyşli müşriklərdən qorumaq üçün edirdi. Çünki bu yolu gedən insanların bir çoxu Məkkədən keçirdilər. Əbu Bəkr (r.ə) bununla həm onu qoruyur, həm də əslində doğru söyləyirdi. Çünki Allah Rəsulu (s.ə.v) ona və bütün möminlərə doğru yolu göstərən bələdçidir.

İbn Ureyqit Allah Rəsulu (s.ə.v) və Əbu Bəkri (r.ə) əsas karvan yolundan ayrı bir yolla aparsa da su quyuları və axar suların olduğu yerlərdən keçib gedirdilər. Beləcə həm özləri, həm də minik heyvanlarının su ehtiyaclarını görmüş olurdular. Beləcə onlar Əməc adlanan yerdən keçib Qudeyd adlanan yerə gəldilər. Məkkə ilə Mədinənin demək olar ki, tən ortasında, fəqət nisbətən Mədinəyə yaxın olan Qudeydə qədər fasilə vermədən getmişdilər. Qudeyddə Əbu Bəkr (r.ə) ətrafı gözdən keçirib Allah Rəsulunun (s.ə.v) dincələ biləcəyi kölgəlik bir yer axtadı. Çölün ortasında iri bir qaya vardı və Əbu Bəkr (r.ə) həmin qayanın kölgəsində Peyğəmbər (s.ə.v) üçün dincələ biləcəyi bir yer hazırladı. Allah Rəsulu (s.ə.v) onun hazırladığı kölgəlik yerdə bir qədər yatıb dincəldi. Əbu Bəkr (r.ə) bu vaxt yaxınlıqda heyvanlarını otarmaqda olan bir çobandan yoldaşları ilə birlikdə içmək üçün bir qədər süd satın almışdı.

Qudeydin çöllük ərazisində Xuzaə qəbiləsinin Əmr ibn Rəbiə soyuna mənsub Əbu Mə'bəd Əqsəm ibn Cəvn adlı bir şəxs yaşayırdı. Ətrafda yaşayan bədəvilər tez-tez Əbu Mə'bədin yurduna gəlir və ondan ərzaq satın alırdılar. Abdullah ibn Ureyqit, Allah Rəsulu (s.ə.v), Əbu Bəkr (r.ə) və Amir ibn Fuheyrəni (r.ə) ərzaq satın almaq üçün Əbu Mə'bədin çadırının yanına gətirdi. Əbu Mə'bəd evində yox idi. Onları onun xanımı Umm Mə'bəd Atiqə qarşıladı. Lakin onlara sata biləcəyi heç bir şeyin qalmadığını bildirdi. Belə ki, həcc mövsumu yeni bitmişdi və Məkkəyə gəlib gedənlər ala biləcəklərini almış və satılıq ərzaq ehtiyatı tükənmişdi. Heyvanları isə otlaqda idi. Çadırın yanındakı bir qoyun isə sürüylə gedə bilməyəcək qədər yaşlı və taqətsiz idi. Allah Rəsulu (s.ə.v) Umm Mə'bəddən həmin qoyunu sağmağa icazə verib verməyəcəyini soruşanda qadın "*əgər bu yaşlı heyvandan süd gələcəyinə inanırsansa sağa bilərsən*" deyə cavab vermişdi. Allahın öz Elçisinə (s.ə.v) lütfü və kərəmi sayəsində Allah Rəsulu (s.ə.v) sahibinin ümidini kəsdiyi bu qoyundan bir çanaq süd sağdı. Belə ki, həm yoldaşları doydular, həm də ev sahibinə xeyli süd qaldı. Umm Mə'bəd bu hadisəni böyük təəccüb və heyrətlə axşam evinə gələn Əbu Mə'bəd Əqsəmə danışmışdı. Allah Rəsulunun (s.ə.v) hicrətindən bir müddət sonra Əqsəm və Atiqə İslamı qəbul edərək kiçik oğulları Mə'bədlə birlikdə Mədinəyə mühacirət etmişdilər.

Bu vaxt Qüreyş müşrikləri Allah Rəsulunun (s.ə.v) sadiq dostu ilə birlikdə Mədinə yolunda olduğunu öyrənmiş və çöldə onu axtarmağa başlamışdılar. Mədinə yolçularının Əbu Mə'bədin çadırından ayrılmasından bir müddət sonra bir qrup məkkəli müşrik oraya gələrək onları sorğu-suala tutmuşdular. Onlar həmçinin ətraf ərazilərdə yaşayan bədəvi ərəb qəbilələrinə Muhəmməd (s.ə.v) və yoldaşlarını tutan və ya öldürənə yüz dəvə mükafat veriləcəyini elan etməkdə idilər.

Qüreyş müşriklərinin göndərdikləri carçılardan biri də Qudeyddə yurd salmış Bəni-Mudlic oymağına gələrək Muhəmməd (s.ə.v) və Əbu Bəkri (r.ə) tutan və ya öldürənə mükafat olaraq yüz dəvə veriləcəyini car çəkmişdi. Mudlic soyunun igidlərindən olan Suraqə ibn Malik ibn Cu'şəm bir əyləncə məclisində ikən Qudeyddə dörd nəfər yolçunun yol getməkdə olduğundan xəbər tutmuşdu. Dərhal zirehini geyib silahlanan Suraqə ibn Malik atını dördnala çaparaq bu qərib Mədinə yolçularının getdiyi istiqamətə üz tutmuşdu. Ardlarınca bir süvarinin çaparaq gəldiyini görən Əbu Bəkr (r.ə) bunu dərhal Allah Rəsuluna (s.ə.v) xəbər vermişdi. Allah Rəsulu (s.ə.v) dostunu təskin edərək yoluna davam etməkdə idi. Mahir süvari olan Suraqə ibn Malik Mədinə yolçularına çatarkən üç dəfə atından yıxılmış, hər dəfə də inadla atına minərək yenidən çapıb onlara

yetişməyə çalışmışdı. Lakin Allah Rəsulu (s.ə.v) və yoldaşlarına onların danışıqlarını eşidəcək qədər yaxınlaşanda qəflətən Suraqənin atının qabaq ayaqları dizə qədər səhranın qumuna batdı. Çox çalışsa da Suraqə atı yerindən tərpədə bilmədi. At çapmaqdakı məharətinə rəğmən üç dəfə atından yerə yuvarlanmasına dərin təəccüb edən Suraqə ibn Malik bu dəfə bunun artıq təsadüf olmadığını anlamış və qəsd etmək istədiyi bu insanın həqiqətən Allahın Elçisi (s.ə.v) olduğu qənaətini hasil etmişdi. Buna görə də o, Mədinə yolçularının ardınca bağırmağa başladı: "*əl-Aman! Mən Suraqə ibn Malik ibn Cu'şəməm. Dönüb mənə baxın. Sizinlə sadəcə danışmaq istəyirəm. Allaha and olsun ki, məndən sizə bir zərər gəlməz artıq. Ey Muhəmməd (s.ə.v)! Bu başıma gələnlərin səndən sarı olduğuna inandım. Allahdan məni bu vəziyyətdən qurtarmasını dilə. Sizi arxanızdan gələnlərdən qorumaq boynumun borcu olsun*". Daha sonra söhbət edərkən Suraqə ibn Malik (r.ə) Allah Rəsuluna (s.ə.v) öz dəvə və inəklərindən götüməyi təklif etdi, lakin Allah Rəsulu (s.ə.v) onun bu təklifini qəbul etmədi. O, Allah Rəsuluna (s.ə.v) ərzaq və ehtiyacları olan ləvazımat vermək istədi. Peyğəmbər (s.ə.v) ondan heç bir istəyi olmadığını bildirdi. Lakin ona onları təqib edən hər kimi görsə yoldan azdırmasını və bu yerdən keçmədiklərini bildirməsini istədi. Səhər Allah Rəsulunun (s.ə.v) canına qəsd etmək üçün yola çıxan Suraqə ibn Malik (r.ə) günorta onun silahlı mühafizinə çevrilmişdi. Suraqə (r.ə) onlardan ayrılıb getmək istəyərkən Allah Rəsulu (s.ə.v) ona: "*Ey Suraqə (r.ə) Kəsranın bilərziklərini qollarına, kəmərini belinə və tacını başına taxacağın vaxt necə olacaqsan?*" dedi. Suraqə (r.ə) heyrətlə: "*Şahlar şahı Hörmüzün oğlu Kəsramı?*" deyə soruşdu. Allah Rəsulu (s.ə.v) "*bəli*" deyə cavab verdi. Heyrətlənən Suraqə (r.ə) heç bir şey demədən uzaqlaşıb öz yurduna qayıtmışdı. Ömər ibn Xəttabın (r.ə) xilafəti dövründə (634-643) Sasani imperiyasının paytaxtı Mədain fəth edildiyi vaxt şahın xəzinəsi müsəlmanların əlinə keçmiş və bu sərvət karvanlarla Mədinəyə daşınmışdı. Əşyaların arasında Sasani şahı III Yəzdigərdin qızıldan düzəldilib qiymətli daşlarla bəzədilmiş şəxsi əşyaları da var idi. Xəlifə Ömər (r.ə) bunların necə göründüyünə baxmaq üçün Suraqə ibn Malikə (r.ə) şahın paltarını, tacını, bilərziklərini və kəmərini geyindirmişdi. Xəlifə onu bu qiyafədə görüb: "*Allahu Əkbər! Özünü insanların Rəbbi zənn edən şah Kəsranın paltarını Mudlicin bədəvisi Suraqə ibn Malikə geyindirən Allaha həmd olsun*" demişdi.

Allah Rəsulu (s.ə.v) və yoldaşları Cuhfə adlanan yerdən etibarən Məkkədən Mədinəyə gedən karvan yoluna çıxaraq yollarına davam etmişdilər. Artıq Məkkədən xeyli uzaqlaşmışdılar və onları təqib edən casusların təhlükəsi sovuşmuşdu. Cuhfədən bir qədər irəlidə yerləşən Ğəmim adlı yerdə Allah Rəsulu

(s.ə.v) ərəblər arasında şücaəti və xeyirxahlığı ilə tanınan Bureydə ibn Huseyblə rastlaşdı. Dincəlmək üçün kölgəlik bir yer axtaran Bureydənin yanında öz soyuna mənsub silahlı süvarilər var idi. Ehtimal ki, Bureydə daha əvvəl Allah Rəsulu (s.ə.v) və onun tövhidə dəvəti haqqında eşitmişdi. Onlar bir qədər söhbət etdilər və Peyğəmbər (s.ə.v) onu İslama dəvət etdi. Bureydə ibn Huseyb (r.ə) və yoldaşları tərəddüd etmədən İslamı qəbul etdilər və Ğəməmdə Allah Rəsulu (s.ə.v) ilə birlikdə məğrib namazını qıldılar. Mədinəyə doğru yoluna davam edən Allah Rəsulu (s.ə.v) və yoldaşları Şam diyarından gəlib Məkkəyə getməkdə olan ticarət karvanı ilə qarşılaşdılar. Allahın Mədinəyə hicrət iznindən əvvəl Şam diyarına ticarət səfərinə çıxmış Allah Rəsulunun (s.ə.v) əshabından olan Təlhə ibn Übeydullah (r.ə) və Zübeyr ibnü'l-Əvvam (r.ə) da bu karvanın içində idilər. Allah Rəsulu (s.ə.v) ilə görüşüb söhbətləşən Təlhə (r.ə) və Zübeyr (r.ə) Peyğəmbərə (s.ə.v) Şam diyarından gətirdikləri paltarlardan hədiyyə etdilər. Sonra isə Məkkədəki işlərini tamamlayıb Mədinəyə qayıtmaq üçün yola davam etdilər. Mədinə yolçuları da yollarına davam edib Ğifar qəbiləsinə məxsus əl-Qəhha adlanan yerdən keçib Ərc adlanan yerə gəldilər. Allah Rəsulu (s.ə.v) və Əbu Bəkrin (r.ə) dəvələri artıq yorulmuşdular və minikləri dəyişmək lazım idi. Ərcdə Əvs ibn Hucr əl-Əsləmi (r.ə) Allah Rəsuluna (r.ə) öz dəvələrindən birini verdi və Məs'ud ibn Huneyd adlı nökərini ona xidmət etməsi üçün yanında göndərdi. Yolda Allah Rəsulu (s.ə.v) və yoldaşları namaz üçün fasilə verdikcə Məsud ibn Huneyd onlara baxır və bu yeni dinlə maraqlanırdı. Nəhayət Allah öz dininin sevgisini onun qəlbinə yerləşdirdi və Məs'ud ibn Huneyd (r.ə) Allah Rəsulunun (s.ə.v) qarşısında kəlməyi-şəhadət deyib İslamı qəbul etdi.

Allah Rəsulu (s.ə.v) nübuvvətinin on dördüncü ilində, rəbiələvvəl ayının 12-si, bazar ertəsi günü (23 sentyabr 622) yoldaşları ilə birlikdə Mədinə yaxınlığındakı Quba adlanan yerə çatdı. O, burada Əmr ibn Əvf oymağından olan Külsüm ibn Xudmun (r.ə) evində qonaq qaldı. Allah Rəsulundan (s.ə.v) əvvəl Məkkədən hicrət etmiş Əbu Ubeydə Amir ibn Abdullah ibn Cərrah (r.ə), Miqdad ibn Əmr (r.ə), Suheyl ibn Bəyza (r.ə), Səfvan ibn Bəyza (r.ə), İyaz ibn Zuheyr (r.ə), Abdullah ibn Məhrəmə (r.ə), Vəhb ibn Sə'd (r.ə), Mə'mər ibn Əbi Şərh (r.ə), Əmr ibn Əbi Əmr (r.ə), Umeyr ibn Əvf (r.ə) kimi bəzi səhabələr də Mədinəyə gedərkən Qubada Külsüm ibn Xudmun (r.ə) evində qalmışdılar. Peyğəmbər (s.ə.v) Qubada Külsüm ibn Xudmun (r.ə) evində qalır və buradakı müsəlmanlarla söhbət etmək üçün Sə'd ibn Heysəmənin (r.ə) evinə gedirdi. Sə'd ibn Heysəmə (r.ə) subay idi. Subay olan mühacirlər onun evində qalırdılar. Allah Rəsulu (s.ə.v) Qubada ikən İslamı ilk qəbul etmiş mədinəlilərdən olan Əsəd ibn Zurarəni (r.ə) görə bilmədiyi üçün onun harada olduğu ilə maraqlan-

mışdı. Allah Rəsulunun (s.ə.v) qaldığı ev əvslilərin məhəlləsində idi. Xəzrəcli olan İbn Zurarə (r.ə) Bu’as döyüşündə bir əvslini qətlə yetirmişdi. Hicrətin ilk günlərində Əvs və Xəzrəc qəbilələri arasındakı qan düşmənçiliyi hələ ki, davam edirdi. Allah Rəsulu (s.ə.v) bunu öyrənəndən sonra əvsli müsəlmanlardan birinin Əsəd ibn Zurarəni (r.ə) öz himayəsinə almasını istədi. Həmin axşam İbn Zurarə (r.ə) tanınmamaq üçün üzünü və başını örtərək Allah Rəsulu (s.ə.v) ilə görüşməyə gəlmişdi. Allah Rəsulu (s.ə.v) bir daha onun təhlükəsizliyinin təmini üçün himayə istədi. Əvslilər Peyğəmbərə (s.ə.v) “*ey Allahın Elçisi (s.ə.v) onu sən himayənə al, sənin himayə etdiyini biz də himayə edərik*” deyə cavab vermişdilər. Sə’d ibn Heysəmə (r.ə) Əsəd ibn Zurarənin (r.ə) evinə gedərək onunla birlikdə öz məhəllələrinə qayıtmış və onu himayə etdiyini bildirmişdi. Sə’din (r.ə) sözündən sonra əvsli müsəlmanların hamısı bir nəfər kimi Əsədin (r.ə) hamisi olduqlarını bildirmişdilər. Beləcə Əqəbə beyətində Allah Rəsuluna (s.ə.v) beyət etmiş mədinəli ilk müsəlmanlardan olan Əsəd ibn Zurarə (r.ə) istədiyi vaxt Allah Rəsulunu (s.ə.v) görməyə gələ bilmişdi.

Allah Rəsulu (s.ə.v) Qubada qaldığı müddətdə iştirak etdiyi cənazə mərasimlərində, xəstələri ziyarət edərkən hər fürsətdə insanları İslama dəvət edir, tövhidə çağırırdı. Hələ Allah Rəsulu (s.ə.v) Məkkədə ikən ilk hicrət edənlərdən biri olan Əbu Sələmə Abdullah ibn Əbdüləsədin (r.ə) təşəbbüsü ilə Qubada müsəlmanların camaat halında namaz qıla bilmələri üçün kiçik bir məscid tikilmişdi. Allah Rəsulunun (s.ə.v) izni ilə Salim (r.ə) bu məsciddə ilk cümə namazını qıldırmış və xütbə oxumuşdu. Məkkədə ikən Allah Rəsulu (s.ə.v) Qüreyş müşriklərinin təzyiqləri və qadağaları səbəbiylə Kə’bədə cümə namazı qıldırıb xütbə oxuya bilməmişdi. Əmmar ibn Yasir (r.ə) həm müsəlmanların Allah Rəsulu (s.ə.v) ilə birlikdə camaatla namaz qıla bilmələri, həm də Peyğəmbərin (s.ə.v) dincələ bilməsi üçün Qubada yeni bir məscid tikilməsi təşəbbüsü ilə çıxış etmişdi. Allah Rəsulu (s.ə.v) İbn Xudmə (r.ə) məxsus bir ərazini pulla satın alaraq burada məscid inşa etdirməyə başladı. Peyğəmbər (s.ə.v) əshabı ilə birlikdə məşhur Quba məscidini inşa etmişdi. Qubada qaldığı on dörd gün müddətində Allah Rəsulu (s.ə.v) əshabına bu məsciddə namaz qıldırmış və onu ziyarətə gələn insanlarla görüşüb söhbətləşmişdi. Sonrakı illərdə Allah Rəsulu (s.ə.v) hər şənbə günü Mədinədən Qubaya gələr və bu məsciddə namaz qılardı. Ömər ibn Xəttab (r.ə) da xəlifəliyi müddətində hər həftə Quba məscidinə gedib orada camaata namaz qıldırmışdı. Quba məscidi sonrakı əsirlərdə xəlifələr, hökmdarlar, müsəlman dövlət xadimləri tərəfindən bir çox dəfə təmir və yenidən inşa etdirilmişdi.

Allah Rəsulunun (s.ə.v) əmin və etibarlı insan olduğunu bildikləri üçün Məkkə müşrikləri bəzi əmanətlərini ona verir və saxlamasını istəyirdilər. Al-

lah Rəsulu (s.ə.v) Məkkəni tərk edərkən Əli ibn Əbu Talibə (r.ə) əmanətləri sahiblərinə qaytarmasını tapşırmışdı. Peyğəmbərin (s.ə.v) hicrətindən sonra üç gün və üç gecə Məkkədə qalan Əli ibn Əbu Talib (r.ə) şəhərə çıxaraq kimin Peyğəmbərdə (s.ə.v) əmanəti varsa gəlib almasını elan etmişdi. Əmanətləri sahiblərinə qaytarandan sonra isə özü Mədinəyə doğru yola çıxmışdı. Əli (r.ə) gecələr yol gedir, gündüzlər isə bir kölgəlikdə istirahət edirdi. Əli (r.ə) rəbiələvvəl ayının ortalarında Qubaya gəlib çatmışdı. O, bütün yolu piyada gəldiyi üçün ayaqları şişmiş, qabarları yarılmış və qanamışdı. Allah Rəsulu (s.ə.v) onun gəldiyini eşidən kimi yanına çağırdı. Lakin Əli ibn Əbu Talibin (r.ə) artıq yeriyə bilməyəcək qədər taqətsiz olduğu deyiləndə Allah Rəsulu (s.ə.v) özü qalxıb olun yanına getdi. Ayaqlarının vəziyyətini görəndə Əliyə (r.ə) olan şəfqətindən ötürü kövrəldi və onu qucaqlayaraq ağladı.

Məlum olduğu kimi Allahın yer üzündəki son elçisinin, Xatəmü'l-Ənbiyanın (s.ə.v) gələcəyi Qur'andan əvvəlki bütün səmavi kitablarda xəbər verilmişdir. Kitab əhli olan yəhudilər də son peyğəmbərin gələcəyini bilir və onu gözləyirdilər. Lakin bu son peyğəmbərin ərəb olması yəhudilər üçün gözlənilməz idi. Çünki daha əvvəlki peyğəmbərlər Bəni-İsraildən idilər və yəhudilər son peyğəmbərin də öz qövmlərindən çıxacağı qənaətində idilər. Allah Rəsulu (s.ə.v) Qubada ikən Mədinə yəhudiləri Allahın Elçisinin (s.ə.v) nübuvvəti haqqında eşitmişdilər. Bəni-Nəzir yəhudilərilərinin liderlərindən olan Əbu Yasir ibn Əxtab və Huyey ibn Əxtab adlı iki qardaş Qubada Allah Rəsulunu (s.ə.v) görüb söhbət etmək üçün onun yanına gəlmişdilər. Onlar bir gün səhərdən axşama qədər Allah Rəsulu (s.ə.v) ilə söhbət etmişdilər. Geri qayıdarkən hər iki qardaş məyus və qeyzli idilər. Belə ki, peyğəmbər olduğunu söyləyən şəxsin yalançı və saxtakar deyil, həqiqətən Allahın yer üzündəki son Elçisi (s.ə.v) olduğundan əmin olmuşdular. Yəhudilərin kitablarında bilidirilən əlamətlərin hamısını onda müşahidə etmişdilər. Lakin qövm təəssübkeşliyi önlərinə sədd çəkib onların iman etməsinə mane olmuşdu. Bu iki qardaş yaşadıqları müddətcə Allah Rəsuluna (s.ə.v) düşmənlik etməkdən geri durmamış, başçılıq etdikləri Nəzir yəhudiləri də bu işdə onlara yardım etmişdilər.

Allah Rəsulunun (s.ə.v) Qubaya gəlişinin ilk günlərindən etibarən burada bir neçə nəfərdən ibarət münafiq qrupu da meydana gəlmişdi. Bunlar üzdə iman etdiklərini desələr də gizli-gizli Peyğəmbərə (s.ə.v) və möminlərə qarşı düşmənçilik edirdilər. Onlar özünün hənif olduğunu iddia edən Əbu Amir əl-Fasiqlə görüşərək mühacirlərin gəlişindən duyduqları narahatlığı dilə gətirmişdilər. Əbu Amir əl-Fasiq Mədinə münafiqlərinin lideri olan Abdullah ibn Übeyy ibn Səlulun bibisi oğlu idi. Əbu Amir özünün İbrahimin (ə.s) dininə

mənsub bir hənif olduğunu iddia edirdi və “ər-Rahib” nisbəsi ilə tanınmışdı. Lakin Əbu Amirin İslama və müsəlmanlara qarşı törətdiyi fisq və fücur səbəbiylə Allah Rəsulu (s.ə.v) onu “ər-Rahib” deyil “əl-Fasiq” nisbəsi ilə anmışdı. Əbu Amir əl-Fasiqin oğlu Hənzələ (r.ə) isə Allaha və Rəsuluna (s.ə.v) iman etmiş, Uhud döyüşündə şəhid olacaq səmimi bir mömin idi. Əbu Amir əl-Fasiq Qubada Peyğəmbərin (s.ə.v) yanına gələrək onu İslam barədə sorğu-sulala tutmuş və demişdi:

- *Bu sənin öyrətdiyin din nədir belə?*
- *İbrahimin (ə.s) insanlara öyrətdiyi hənifliyi öyrədirəm.*
- *O dinə mənsub olan mənəm.*
- *Xeyr, sən İbrahimin (ə.s) dininə mənsub deyilsən.*
- *Xeyr, ey Muhəmməd (s.ə.v), sən hənifliyə daha əvvəl onda olmayan şeyləri əlavə edirsən.*
- *Mən İbrahimin (ə.s) dininə yeni heç bir şey əlavə etmirəm. Əksinə onu saf və təmiz olaraq öyrədirəm.*
- *Yalançını Allah yurd-yuvasından didərgin salıb qərib olaraq öldürsün.*
- *Bəli, qoy uca Allah yalançının canını, sənin dediyin kimi, didərgin və qərib olaraq alsın.*

Əbu Amir əl-Fasiq bu bədduası ilə Allah Rəsuluna (s.ə.v) və mühacirlərə sataşmaq məqsədi güdürdü. Çünki Qüreyş müsəlmanları öz müşrik həmvətənlərinin zülmündən ötürü doğma yurdlarından didərgin düşərək hicrət edib Mədinəyə pənah gətirmişdilər. Lakin hər şeyə qadir olan Allah etdiyi bədduanı Əbu Amir əl-Fasiqin öz üzərinə döndərmişdi. Əbu Amir əl-Fasiq Bədr müharibəsində Məkkə müşriklərinin tərəfinə keçərək müsəlmanlara qarşı vuruşmuş, Uhud və Xəndək döyüşlərində də qüreyşli müşriklərə yardım etmişdi. Məkkə fəth olunduğu vaxt Taifə qaçmış, taiflilərin İslamı qəbul etməsindən sonra isə Şam diyarına qaçaraq orada didərgin həyatı sürmüş, xristianlığı qəbul etmiş və qəriblikdə ölmüşdü. Əbu Amir əl-Fasiqi qızışdıraraq Allah Rəsulu (s.ə.v) ilə mübahisəyə təşviq edən münafiqlər gecələrdən birində Peyğəmbərin (s.ə.v) yatdığı evi daşlamaqdan da çəkinməmişdilər.

Allah Rəsulu (s.ə.v) Qubada keçirdiyi on dörd gündən sonra babası Əbdülmüttəlibin ana tərəfdən əqrabaları olan Bəni-Nəccar oymağına yanına gəlmələri üçün xəbər göndərmişdi. Qubaya yaxın yerdə yaşayan Bəni-Nəccardan bir qrup müsəlman gənc süvari silahlanaraq Qubaya, Allah Rəsulunun (s.ə.v) yanına gəldilər. Allah Rəsulu (s.ə.v) Əbu Bəkrin (r.ə) ona verdiyi Qəsva adlı dəvəyə minərək, Bəni-Nəccarlı süvarilərin müşayəti ilə Mədinəyə doğru yola çıxdı. Allah Rəsulu (s.ə.v) onun getməsinə kədərlənən Qubadakı möminlərə

təsəlli verərək Allahın ona hicrət edib Mədinədə məskunlaşmağı əmr etdiyini bildirdi.

Allah Rəsulu (s.ə.v) Qubadan Mədinəyə doğru yola çıxıb Ranunə adlı yerə çatdığı vaxt cümə namazının vaxtı idi. Peyğəmbər (s.ə.v) burada onu müşayət edən təqribən yüz nəfərdən ibarət müsəlman camaata cümə xütbəsi oxudu və cümə namazı qıldırdı. Bu Allah Rəsulunun (s.ə.v) Mədinədə qıldırdığı ilk cümə namazı idi. Mənbələrdə onun burada irad etdiyi xütbənin mətni nəql olunmaqdadır:

*"Ey insanlar! Özünüz üçün əvvəlcədən axirət azuqəsi hazırlayın. Bildiyiniz kimi əlbəttə hər bir insan öləcəkdir. Sonra Rəbbi ona arada bir tərcüman olmadan: "Mənim elçim gəlib sənə əmrlərimi bildirmədimi? Mən sənə dünya malından verdim, yaxşılıqlar etdim. Sən axirətin üçün nə göndərdin?" deyə buyuracaq. O, da sağına, soluna baxacaq və heç bir şey görməyəcək. Sonra önünə baxacaq və qabağında cəhənnəmin alovundan başqa heç bir şey görməyəcək. Elə isə sizdən sadəcə yarım xurma ilə sədəqə verməyə gücü çatan belə cəhənnəmin odundan özünü qorumaq üçün dərhal o yaxşılığı etsin. Buna gücü çatmayan gözəl, xoş söz danışsın və özünü belə qorusun. Çünki Allah bir yaxşılığın əvəzini on mislindən yeddi yüz mislinə qədər savabla ödəyər.*

*Allahın salamı, rəhməti və bərəkəti sizin üzərinizə olsun! Həmd sadəcə Allaha məxsusdur. Sadəcə Allaha həmd edir və ondan yardım diləyirəm. Nəfslərimizin şərrindən və əməllərimizin bəlasından Allaha sığınırıq. Allahın doğru yola istiqamətləndirdiyini heç kim yolundan azdıra bilməz. Allahın yoldan azdırdığını da heç kim doğru yola gətirə bilməz. Şahidlik edirəm ki, Allahdan başqa heç bir ilah yoxdur. O, birdir, Onun şəriki yoxdur. Şübhəsiz sözlərin ən gözəli uca Allahın kitabıdır. Allah kimin qəlbini Qur'anla bəzəmişsə və onu küfrdən sonra İslama daxil etmişsə, o, da Qur'anı insanların sözlərindən üstün tutursa, bax həmin kimsə fəlah tapmış, qurtulmuşdur.*

*Şübhəsiz Allahın kitabı olan Qur'an sözlərin ən gözəli, ən bəlağətlisidir. Allahın sevdiyini siz də sevin. Allahı bütün qəlbinizlə sevin. Allahın kəlamından və Allahı zikr edib anmaqdan usanmayın. Allahın kəlamı qəlblərinizdəki qaranlığı və darlığı söküb atar. Çünki Allahın kəlamı hər bir şeyin üstün olanını, əməllərin xeyrlisini, Allahın seçilmiş bəndələrini (peyğəmbərləri) və qissələrin ən yaxşılarını yada salır. Allahın kitabı halal və haram olan hər şeyi bəyan edir. Artıq sadəcə Allaha ibadət ediniz və ona ibadət edərkən heç bir şeyi şərik qoşmayın. Allahdan layiqincə qorxun. Dilinizin söylədiyi gözəl sözlərlə Allaha imanınızı təsdiq və iqrar edin. Allahın sizə ehsan etdiyi mərhəmət duyğuları ilə birbirinizi sevin. Bilin ki, şübhəsiz Allah əhdin pozulmasına qəzəblənər. Allahın sizə etdiyi yaxşılıqlarla siz də bir-birinizə yaxşılıq edin. Allahın düşmənləri*

*ilə siz də düşmən olun. Onun yolunda layiqincə cəhd edib çalışın. Kim Allahla münasibətlərini yaxşılaşdırarsa, Allah da onun insanlarla münasibətlərini yaxşılaşdırar. Çünki insanlar Allahın üzərində deyil, Allah insanların üzərində hökm sahibidir. İnsanlar Allah üzərində təsərrüf sahibi deyillər, Allah insanların üzərində təsərrüf sahibidir. Ən böyük, ən uca olan Allahdır. Şübhəsiz Allahdan başqa yenilməz qüvvət və qüdrət sahibi heç kim yoxdur".*

Bu xütbəni irad edib cümə namazını tamamladıqdan sonra Allah Rəsulu (s.ə.v) dəvəsinə minib yoluna davam etdi. Yüyəni dəvənin boynuna dolamışdı. Əbu Bəkr (r.ə) onun ardınca, Nəccar oymağından olan süvarilər isə onları əhatələrinə alaraq Mədinəyə doğru gedirdilər. Mədinəyə çatdığı vaxt bütün şəhər əhalisi yollara və evlərinin damına çıxaraq Allahın Elçisini (s.ə.v) salamlayır, sevinirdilər. Əvs və Xəzrəc qəbiləsinə mənsub olan hər bir müsəlman ailə Peyğəmbərin (s.ə.v) onların yurdunda dəvəsindən enməsini, onların yanında qalmasını arzu edir və onu öz evlərinə dəvət edirdilər. Allah Rəsulu (s.ə.v) onların bu təklif və dəvətlərinə təbəssümlə belə cavab verirdi: "*Allah sahib olduqlarınızı xeyrli və bərəkətli etsin, siz dəvənin yolunu açın, harada yerə çökməsi ona əmr olunmuşdur*". Qəsva Mədinənin bir sıra məhəllələrindən keçərək nəhayət Bəni-Nəccar məhəlləsinə gəldi. Burada Nəccar oymağına mənsub Səhl və Süheyl adlı iki yetim gənc qardaşa məxsus ərazidə yerə çökdü. Lakin Peyğəmbər (s.ə.v) onun üzərindən yerə enmədi. Dəvə ayağa qalxıb bir qədər getdikdən sonra dövrə vurub yenidən əvvəl çökdüyü yerə gəldi, yerə çökdü, boyunu yerə qoyub böyürdü. Allah Rəsulu (s.ə.v) "*İnşaAllah, mənzil buradır*" deyib dəvənin üzərindən yerə endi. Mədinəli müsəlmanlar onu əhatəyə alıb hər biri təkidlə öz evinə dəvət edirdilər. Allah Rəsulu (s.ə.v) gecəni babası Əbdülmüttəlibin dayılarının mənsub olduğu Bəni-Nəccardan birinin evində qalacağını bildirib kimin evinin ən yaxın olduğunu soruşdu. Dayandıqları yerə ən yaxın Əbu Əyyub Xalid ibn Zeyd əl-Ənsarinin (r.ə) evi idi və Peyğəmbər (s.ə.v) Əbu Əyyubun (r.ə) evinə gedib ona qonaq oldu. Allah Rəsulu (s.ə.v) Əbu Əyyub əl-Ənsarinin (r.ə) evinin alt mərtəbəsində, Əbu Əyyub əl-Ənsari (r.ə) isə üst mərtəbədə ailəsi ilə qalırdı. Lakin Əbu Əyyub (r.ə) buna heç cür vərdiş ola bilmir və Allah Rəsuluna (s.ə.v) üst mərtəbədə qalmağı təklif edirdi. Peyğəmbər bir neçə dəfə onun bu təklifindən imtina etdi. Lakin Əbu Əyyub əl-Ənsarinin (r.ə) "*ey Allahın Elçisi (s.ə.v)! Mən sənin başının üzərində yeriyə bilmirəm, sən burada olduğun müddətcə mən evimin üstünə çıxa bilməyəcəm*" deməsindən sonra Peyğəmbər (s.ə.v) onu təklifini qəbul etdi və evin üst mərtəbəsində qalmağa başladı. Allah Rəsulu (s.ə.v) bu evdə yeddi ay qalmışdı.

Əsəd ibn Zurarə (r.ə) Allah Rəsuluna üzəri həsirlə hörülmüş bir çarpayı hədiyyə etmişdi və Peyğəmbər (s.ə.v) bunun üzərində yatırdı. Allah Rəsulu (s.ə.v) vəfat etdiyi vaxt bu çarpayının üzərində cənazə namazı qılınmışdı. Bu çarpayı möminlərin anası, Peyğəmbərin (s.ə.v) xanımı Ayşəyə (r.ə) miras olaraq qalmışdı. Allah Rəsulunun (s.ə.v) xəlifələri Əbu Bəkr (r.ə) və Ömərin (r.ə) də cənazə namazları bu həsirli çarpayının üzərində qaldırılaraq dəfn edilmişdilər.

Bir müddət sonra Allah Rəsulu (s.ə.v) özünün və Əbu Bəkrin (r.ə) ailəsini Mədinəyə gətirmələri üçün Zeyd ibn Harisə (r.ə) və Əbu Rafini (r.ə) Məkkəyə göndərmişdi. Zeyr (r.ə) və Əbu Rafi (r.ə) Peyğəmbərin (s.ə.v) xanımı Səvdə (r.ə), qızları Fatimə (r.ə) və Umm Külsüm (r.ə), həmçinin Əbu Bəkrin (r.ə) xanımı və iki qızını Məkkədən Mədinəyə gətirmişdilər. Məkkəli müşriklər bu vaxt hələ ki, müsəlman xanımlara toxunacaq qədər azğınlaşmamışdılar. Bu səbəbdən də qadınları gətirən bu kiçik dəvə karvanına müdaxilə etməmişdilər.

*Hicrət Ərəfəsində Mədinədə Siyasi və İctimai Vəziyyət*

Mədinə şəhəri dəniz səviyyəsindən 916 m yüksəklikdə, Qırmızı dənizin 100 km şərqində yerləşir. Sözü gedən dövrdə Məkkənin təqribən yarısı böyüklüyündə və Uhud dağının cənub ətəyində idi. Ərəb yarımadasının bir çox yerindən fərqli olaraq Mədinənin suyu bol, torpağı isə əkinə əlverişli idi. Şəhər əhalisi meyvə və tərəvəz əkib becərə bilirdi. Rəvayətə görə Nuh (ə.s) tufanından sonra Nuhun (ə.s) nəvəsi İrəmin nəvəsi İmliq (**عمليق**) gəlib yarımadada məskunlaşmışdı. Onun soyundan törəyən qövmə Əmaliq, yəni İmliqlər deyirdilər. İmliqin soyundan olan Lavz adlı bir şəxs oğlu Yəsriblə (**يثرب**) birlikdə Mədinə şəhərinin yerində məskunlaşmış və yaşayış məskəni onun adı ilə Yəsrib adlanmışdı.

Hicrətdən əvvəl Yəsrib adlanan bu şəhər Peyğəmbərin (s.ə.v) buraya hicrət etməsindən sonra *Mədinətu'n-Nəbi*, yəni Peyğəmbərin (s.ə.v) şəhəri adlanmağa başlamış və Mədinə adı ilə tanınmışdı. Hər şeydən əvvəl qeyd etmək lazımdır ki, Məkkə ilə Mədinə arasındakı fərq birincinin demoqrafik baxımdan ikinciyə nəzərən daha homogen olmasından ibarət idi. Belə ki, Məkkədə əsasən sadəcə Qüreyş qəbiləsi məskun idi və bu qəbilənin zadəganları şəhərin istər siyasi, istərsə də iqtisadi həyatına hakim idilər. Bu zadəgan zümrəsinin əsas məşğuliyyəti ticarət idi. Mədinədə isə ulu əcdadı Yəməndən köçərək burada məskunlaşmış Bəni-Harisə qəbiləsinin Əvs və Xəzrəc adlanan iki qolu yaşayırdı. Əvs və Xəzrəc qəbilələrinin hər biri müxtəlif oymaqlardan və soylardan ibarət idi. Əvs qəbiləsinə Nəbit və Əmr ibn Əvf, Xəzrəc qəbiləsinə isə Nəccar, Cuşəm, Saidə, əl-Haris və Əvf oymaqları daxil idilər.

Bununla yanaşı Mədinədə həmçinin üç yəhudi qəbiləsi məskun idi. Qaynuqa, Qureyzə və Nəzir adlı yəhudi qəbilələrinin burada nə vaxt məskunlaşdığı haqqında ətraflı məlumat olmasa da güman edilir ki, bunlar vaxtilə babillilərin və romalıların qılıncından canını qurtara bilmiş yəhudilərin törəmələri idilər. Müsəlman salnaməçilərin öz əsərlərində adını Buxtunnəsr kimi qeyd etdikləri Babil kralı II Nabu-Kodonosor (e.ə.605-562) Qüdsü işğal edib xarabazara çevirmiş, onun ordusunun törətdiyi yəhudi qətliamından və yəhudilərin Mesopatomiyaya sürgün etdirməsindən canını qurta bilmiş yəhudilərin bir qismi ərəb yarımadasına sığınmışdılar. Məlum olduğu kimi bundan çox sonralar, eramızın 70-ci ilində, yəhudi qiyamını yatırmaq üçün romalı sərkərdə Tit Livi böyük bir ordu ilə hücum edərək Qüdsü işğal etmiş və romalılar şəhərdə böyük qırğın törətmişdilər. 130 mindən çox yəhudi öldürülmüş və 60 mindən çoxu əsir alınaraq qul bazarlarında satılmışdı. Minlərlə yəhudi Afrikaya, mədənlərdə işlədilmək üçün, sürgün edilmişdilər.

İslamın meydana çıxdığı dövrdə ərəb yarımadasında yəhudilərin yaşamadığı yeganə məskən bəlkə də Məkkə idi. Çünki Yəməndən Bəhreynə qədər yarımadanın bir çox yerində yəhudi icmaları mövcud idi və bunların böyük əksəriyyəti ticarətlə məşğul idilər. Mədinə yəhudiləri əkin-biçinlə məşğul olan mədinəli ərəblərə faizlə borc pul verirdilər. Vaxtında ödənilməyən borclar səbəbiylə şəhər ətrafındakı bir çox münbit torpaq sahəsi və hərbi istehkam yəhudilərin əlinə keçmişdi. Bunlar ərəblərə məxsus idi və borc əvəzində girov olaraq qoyulmuşdu. Coğrafi şəraitinin əlverişliliyi, torpağı məhsuldar və suyu bol olduğu üçün mədinəli ərəblər ticarətdən daha çox əkin-biçin işləri ilə məşğul olurdular. Mədinənin iqtisadi həyatına isə şəhərin yəhudiləri hakim idilər.

Mədinədəki qəbilə və icmaların idarə edildiyi vahid mərkəzi hakimiyyət və bu hakimiyyətin tətbiq etdiyi qanunlar mövcud deyildi. İstər ərəb, istərsə də yəhudi, hər qəbiləni həmin qəbilənin üzvləri tərəfindən seçilmiş qəbilə rəisləri idarə edirdilər. Bu səbəbdən də Məkkədən fərqli olaraq Mədinədə hər hansı bir şəhər-dövlətdən danışmaq mümkün deyildi. Qəbilə rəisləri də öz qəbilələrini yazılı bir mətnlə, hüquq normaları ilə deyil, şəxsi rəyləri və qəbilə ağsaqqallarının məşvərəti ilə idarə edirdilər. Hicrətdən bir müddət əvvəl baş vermiş Bu’as döyüşü Xəzrəc qəbiləsinin Əvs qəbiləsi üzərində üstünlüyü ilə sona çatmışdı. Mədinədə yaşayan ailə və oymaq başçılarından bir çoxunun öldürüldüyü bu döyüşdə Mədinə yəhudiləri xəzrəcliləri dəstəkləmişdilər. Xəzrəclilərin təşəbbüsü ilə bu qəbiləyə mənsub oymaqlardan birinin başçısı olan Abdullah ibn Übeyy ibn Səlul Yəsrib kralı olmaq iddiası ilə çıxış edirdi. Hicrət ərəfəsində o, bu məqsədinə nail olmağa o qədər yaxın idi ki, hətta zərgərlərə özü üçün tac da sifariş vermiş-

di. Əvs qəbiləsi isə bu haldan heç şübhəsiz böyük narahatlıq duyurdu. Bu'asda xəzrəcliləri dəstəkləmələrinə baxmayaraq Mədinə yəhudiləri də bu təşəbbüsü məmnuniyyətsizliklə qarşılamışdılar. Allah Rəsulu (s.ə.v) Mədinəyə gəlişinin ilk günlərindən birində Abdullah ibn Übeyyin Bəni-Hubla məhəlləsindəki evinə gedib onunla səmimi münasibət qurmaq və beləcə kral olmaq ümidləri hicrət səbəbiylə boşa çıxmış bu adamı təsəlli etmək istəmişdi. O, Abdullah ibn Übeyyin yüksək hasarla əhatələnmiş evinin yanına gələndə onun hasarın önündə oturduğunu görmüş və söhbət etmək istəmişdi. Lakin Abdullah ibn Übeyy onunla söhbətdən kobudluqla imtina edərək "*get səni kimlər dəvət ediblərsə onlarla söhbət et*" demişdi. Rəsulullah (s.ə.v) bütün ömrü boyu Mədinə münafiqlərinə başçılıq edəcək bu şəxsin ədəbsizliyini səbr və səbatla qarşılamışdı.

*Hicrətdən Sonra Mədinədə Cəmiyyətin Yenidən Formalaşdırılması*

Əqəbə beyətində Allah Rəsuluna (s.ə.v) ilk beyət edənlərdən və onu Mədinəyə dəvət edənlərdən biri olan Bəra ibn Mə'rur (r.ə) Peyğəmbərin (s.ə.v) Mədinəyə gəlişindən bir ay əvvəl vəfat etmişdi. O, ölüm yatağında ikən dəfn ediləndə üzünün Kə'bəyə çevrilməsini vəsiyyət etmişdi. Allah Rəsulu (s.ə.v) Mədinəyə gələndən qısa müddət sonra Bəra ibn Mə'rurun (r.ə) qəbrini ziyarət etmiş, əshabı ilə birlikdə onun cənazə namazını qılmış və onun üçün Allaha dua etmişdi. Bəra ibn Mə'rur (r.ə) müsəlman olaraq vəfat etdikdən sonra üzü qibləyə çevrilərək dəfn edilən və cənazə namazı qılınan ilk müsəlman olmuşdu.

Allah Rəsulunun (s.ə.v) Mədinəyə hicrətindən sonra mədinəli təqribən 180 müsəlman 30 nəfərlik qruplarla Əbu Əyyub əl-Ənsarinin (r.ə) evində Peyğəmbərə (s.ə.v) beyət etmiş, sədaqət andı içmişdilər. 300-dən çox mədinəli müsəlman qadın da bir evdə toplanaraq Peyğəmbərə (s.ə.v) beyət etmişdilər. Onların beyətini Peyğəmbərin (s.ə.v) əvəzinə Ömər ibn Xəttab (r.ə) qəbul etmişdi. Hicrətdən sonrakı bir il ərzində Əvs qəbiləsi Vaqif, Xatmə, Vail və Üməyyə ailələri istisna olmaqla, bütünlüklə İslamı qəbul etmişdi. Mədinəli müsəlman qadınlar və kişilər Allah Rəsulunu (s.ə.v) ziyarətə gəlir, onunla həmsöhbət olub ona hədiyyələr verirdilər. Bəni-Nəccar ailəsinə mənsub Umm Suleym (r.ə) adlı möminə bir dul qadın da Allah Rəsulu (s.ə.v) ilə görüşəndən sonra yanında gətirdiyi 10 yaşlı oğlu Ənəs ibn Maliki (r.ə) Peyğəmbərə (s.ə.v) təqdim edərək "*Ey Allahın Elçisi (s.ə.v) mənim sənə verə biləcəyim hədiyyəm yoxdur. Bu oğlum kiçik Ənəsdir. Qoy sənə xidmət etsin. Onun üçün Allaha dua et*" demişdi. Allah Rəsulu (s.ə.v) "*Allahım! Onun malını və övladını çoxalt. Ona verdiyin şeyləri bərəkətli et*" deyə dua etmişdi. Ənəs (r.ə) Peyğəmbərin (s.ə.v) vəfatına qədən onun yanından ayrılmamış, onun xidmətində olmuşdu.

Uzun illər sonra Ənəs ibn Malik (r.ə) bu hadisəni xatırlayarkən demişdi: "*Allah Rəsulu (s.ə.v) mənim üçün üç xüsusda dua etmişdi. Bu gün mən çox zənginəm, övladlarımın, nəvə-nəticələrimin sayı yüzdən çoxdur. Üçüncüsünü isə axirətdə Allahdan diləyirəm*".

Allah Rəsulu (s.ə.v) Mədinə yəhudilərini də İslama dəvət edirdi. O, hicrətdən bir müddət sonra Mədinədəki yəhudi məbədinə, sineqoqa getmişdi. Yəhudilər onu öz məbədlərində görməyi xoşlamadılar. Allah Rəsulu (s.ə.v) onlara öz kitabları olan, İmranın oğlu Musaya (ə.s) vəhy edilmiş Tövratdakı bəzi ayələri xatırladıb gözlədikləri son peyğəmbərin özü olduğunu təbliğ edərək İslama dəvət etmişdi. Mədinə yəhudiləri arasında Tövratı və şərhin bilən bəzi alimlər vardı. Bunlardan Abdullah ibn Səlam (r.ə), Sə'ləbə ibn Sa'yə (r.ə), Useyd ibn Sa'yə (r.ə), Əsəd ibn Ubeyd (r.ə) onun gözlənilən son elçi olduğunu anlayaraq iman etmiş, müsəlman olmuşdular. Bu yəhudi alimləri öz qəbilələri və ailələri tərəfindən rədd edilərək qovulmuşdular. Mədinə yəhudilərinin əksəriyyəti sırf mənşəcə yəhudi deyil, ərəb olduğu üçün Allahın yer üzündəki son Elçisinə (s.ə.v) iman etməmiş, əksinə ona qarşı amansız bir mübarizəyə girişmişdilər. Hicrətdən sonra Yəsrib yəhudiləri hər fürsətdə Allah Rəsuluna (s.ə.v) müxalif olur, onu təkzib edib yalanlamaq üçün əllərindən gələni edirdilər.

اتَخَذُوا أَحْبَارَهُمْ وَرُهْبَانَهُمْ أَرْبَابًا مِنْ دُونِ ا ـ وَالْمَسِيحَ ابْنَ مَرْيَمَ وَمَا أُمِرُوا إِلا لِيَعْبُدُوا إِلَٰهًا وَاحِدًا لَا إِلَٰهَ إِلا هُوَ
سُبْحَانَهُ عَما يُشْرِكُونَ

"*Onlar Allahı qoyub alimlərini (hahamlarını) və rahiblərini, Məryəm oğlu Məsihi özlərinə ilahlar (rəbblər) qəbul etdilər. Halbuki onlara ancaq bir olan Allaha ibadət etmək əmr olunmuşdu. Ondan başqa heç bir ilah yoxdur*" (Tövbə surəsi 31)

Bu ayəni eşidən Mədinədəki bəzi yəhudilər "*Muhəmməd (s.ə.v) bizim öz hahamlarımıza sitayiş etdiyimizi söyləmişdir, halbuki belə bir şey yoxdur, biz onları özümüzə Rəbb görmürük*" demişdilər. Bu söz Allah Rəsuluna (s.ə.v) çatdırılanda belə cavab vermişdi: "*Şübhəsiz onlar din xadimlərinə və ulularına sitayiş etmirlər, lakin onların haram buyurduğunu haram, halal buyurduqlarını halal qəbul edirlər*". Bununla da Allah Rəsulu (s.ə.v) haram və halalın müəyyən edilməsi, bu kimi şeylərin əmr və qadağa olunması işinin sadəcə Allaha aid olduğunu bəyan etmiş, Allahdan qeyri bunu edənlərin özlərini Rəbb yerinə qoyduqlarını, onlara itaət edənlərin isə bu saxta rəbblərə sitayiş etdiklərini buyurmuşdur.

Hicrətdən sonra artıq öz şəhərlərində dərin narahatlıq duyduqları tövhidə dəvəti eşitməsələr də Qüreyş müşriklərinin Allah Rəsulu (s.ə.v) və ona iman

edənlərə qarşı düşmənliklərindən heç bir şey əskilməmiş, əksinə artmışdı. Qüreyşli müşriklər tez-tez Əvs və Xəzrəc qəbilələrinin liderlərinə hədə-qorxu dolu xəbərdarlıqlar göndərək Allah Rəsulu (s.ə.v) və iman edənləri Mədinədən qovub çıxarmaları üçün onlara təzyiq göstərirdilər. Bunu etməyəcəkləri təqdirdə bütün ərəb qəbilələrinin onların üstünə qalxacağı ilə hədələyirdilər. Həqiqətən də qüreyşli müşriklər yarımadada yaşayan bütün ərəb qəbilələrinə xəbər göndərərək onları əvsli və xəzrəcli müsəlmanların əleyhinə təşviq edirdilər. Mədinədə qorxulu vəziyyət yaranmışdı. Ələlxüsus şəhərdəki müsəlmanlar gecələr ətrafdakı müşrik qəbilələrin silahlı basqınına məruz qalmaq qorxusu ilə keçirirdilər. Ətrafındakı münafiqlərlə birlikdə silahlanmış Abdullah ibn Übeyy qüreyşli müşriklərin bu hədələrini bəhanə edərək Allah Rəsulunu (s.ə.v) Mədinədən çıxarmağa cəhd etmişdilər. Lakin Peyğəmbər (s.ə.v) onlara "*Qüreyşlilərin sizə etdiyi hədə-qorxudan daha çox sizin bizimlə vuruşmaq istəyinizin sizə zərəri toxunar*" deyərək onları bu fikirdən daşındırmışdı. Sə'd ibn Əbu Vəqqas (r.ə) gecələri silahlı olaraq Allah Rəsulunun (s.ə.v) qapısında növbə tuturdu.

Hicrətdən sonrakı ilk dövrlərdə mühacirlərin Mədinədəki vəziyyəti heç də ürəkaçan deyildi. Öz müşrik həmvətənlərinin, qəbilə və ailə üzvlərinin təzyiq və işkəncələrindən qurtulmuşdular, dinlərini sərbəst yaşaya bilirdilər, amma maddi baxımdan xeyli çətin vəziyyətdə idilər. Belə ki, mühacirlərin bir çoxu hicrət edərkən sahib olduqları maddi imkanları, hətta bəziləri ailə üzvlərini tərk etmək məcburiyyətində qalaraq Mədinəyə gəlmişdilər. Allah Rəsulunun (s.ə.v) təşviqilə mədinəli müsəlman qardaşları, ənsar onların imdadına yetişmişdi. Peyğəmbərin (s.ə.v) təşəbbüsü ilə 186 mühacirlə 186 ənsar arasında müəxat, yəni qardaşlıq əqdi bağlandı. Mədinəli müsəlmanlar özlərinin evlərini, ticarət mallarını, bağlarını, bağçalarını, əkinlərini hicrət etmiş din qardaşları ilə paylaşaraq onların maddi darlıqdan iztirab çəkmələrinə imkan vermədilər. Onlar Allah yolunda öz yurd-yuvalarını tərk etmiş insanlara yardım əllərini uzatdılar. Bu səbəbdən də mədinəli müsəlmanlar ənsar, yəni yardım edənlər adını almışdılar. Qardaşlıq əqdi, mənsub olduqları qəbilə, oymaq və soydan aslı olmayaraq Mədinədəki bütün müsəlmanları birləşdirmiş, onları digərlərindən ayrı bir icma halına gətirmişdi. Allah Qur'anda səhabənin bu yardımlaşmasını mədh edərək buyumuşdur:

إِن الذينَ آمَنُوا وَهَاجَرُوا وَجَاهَدُوا بِأَمْوَالِهِمْ وَأَنفُسِهِمْ فِي سَبِيلِ ا ـ وَالذينَ آووا وَنَصَرُوا أُوْلَئِكَ بَعْضُهُمْ أَوْلِيَاءُ بَعْضٍ

وَالذينَ آمَنُوا وَهَاجَرُوا وَجَاهَدُوا فِي سَبِيلِ ا ـ وَالذينَ آوَوْا وَنَصَرُوا أُولَئِكَ هُمُ الْمُؤْمِنُونَ حَقًّا لَهُمْ مَغْفِرَةٌ وَرِزْقٌ كَرِ ٌ

"*İman gətirib hicrət edənlər, Allah yolunda malları və canları ilə cihad edənlər (mühacirlər) və (Peyğəmbərlə mühacirlərə) sığınacaq verib kömək edənlər (ənsar) – məhz onlar bir-birinə dostdurlar. İman gətirib (Məkkədən Mədinəyə) hicrət edənlər, Allah yolunda cihad edənlər (mühacirlər) və (Peyğəmbərlə mühacirlərə) sığınacaq verib kömək edənlər (ənsar)-məhz onlar həqiqi möminlərdir. Onları (axirətdə) bağışlanma və tükənməz (gözəl, minnətsiz) ruzi gözləyir!*". (Ənfal surəsi 72; 74).

Hicrət etmiş məkkəli müsəlmanların bir çoxu bacarıqlı və təşəbbüskar insanlar idilər. Onlardan kimi öz doğma şəhərində mal-mülk sahibi olan bacarıqlı tacir, kimi də sənət, peşə sahibi qabiliyyətli insanlar idilər. Buna görə də onların Mədinəyə, bu yeni İslam yurduna alışmaları və maddi cəhətdən dirçəlmələri elə də çətin olmamışdı. Məkkəli tacirlərdən Əbdürrəhman ibn Əvf (r.ə) müəxat əqdi bağladığı ənsardan Sə'd ibn Rəbi'nin (r.ə) mal və mülkünün yarısını ona vermə təklifini qəbul etməyərək "*etdiyin yaxşılığa görə sənə təşəkkür edirəm, Allah malına bərəkət versin, lakin sən mənə bazarın yerini göstər*" demişdi. Mədinədəki Qaynuqa yəhudilərinin bazarına gələn Əbdürrəhman ibn Əvf (r.ə) aldığı az miqdar borc pulla ticarətə başlayaraq qısa müddətdə yenidən zəngin tacirə çevrilmişdi. Həmin bazarda Əbu Bəkr (r.ə) paltar, Osman ibn Əffan (r.ə) isə meyvə ticarəti ilə məşğul olaraq maddi cəhətdən imkanlarını genişləndirmişdilər.

Məscidin İslam dinində yeri və əhəmiyyətinin böyüklüyü şübhəsizdir. Səcdə edilən yer, ibadət məkanı olmaqla yanaşı məscid bütün İslam tarixi boyu müsəlmanların ictimai, siyasi və mədəni həyatında mühüm rol oynamışdı. Bura möminlərin toplanma yeri idi. Allah Rəsulu (s.ə.v) burada onun İslama dəvətinə icabət etmiş insanlarla görüşür, onlarla birlikdə gündəlik ibadətləri yerinə yetirir, onlara namaz qıldırır, uzaq diyarlardan onun görüşünə gələn insanlarla görüşüb söhbətləşir, onları İslamı qəbul etməyə təşviq edirdi. Daha əvvəl Qubada bir məscidin inşa edildiyinə dair məlumat vermişdik. Mədinədə isə sırf ibadətlərin icra edilməsi üçün inşa edilmiş bir bina yox idi. Buna görə də Allah Rəsulu (s.ə.v) Mədinədə məscid inşa edilməsi təşəbbüsü ilə çıxış etmişdi. Yuxarıda Allah Rəsulunun (s.ə.v) Qubadan Mədinəyə gəlişi haqqında danışarkən onun mindiyi dəvənin Mədinədə Nəccar oymağına məxsus məhəllədə yerə çökdüyü haqda məlumat vermişdik. Qəsva Mədinənin bir sıra məhəllələrindən keçərək nəhayət Bəni-Nəccar məhəlləsinə gəlmiş, burada iki dəfə nəccarlı Səhl və Süheyl adlı iki yetim gənc qardaşa məxsus ərazidə yerə çökmüşdü. Dəvə ikinci dəfə eyni yerə çökəndən sonra Allah Rəsulu (s.ə.v) "*inşaAllah, mənzil buradır*" deyərək dəvənin üzərindən yerə enmişdi. Məscid inşa etmək fikri ortaya çıxandan sonra Allah Rəsulu (s.ə.v) bu iki gənc qardaşa həmin ərazini satmalarını təklif etmişdi.

Lakin bu iki gənc müsəlman ərazini satmayaraq məscid inşası üçün bağışlamaq istəmişdilər. Allah Rəsulu (s.ə.v) bu təklifi qəbul etməyərək ərazinin qiymətini söyləmələrini istəmişdi. Qardaşlar da qiymət söyləməyərək ərazini Allah Rəsuluna (s.ə.v) hədiyyə olaraq verməkdə təkid etmişdilər. Allah Rəsulu (s.ə.v) ərazini hədiyyə olaraq almayacağını bildirib gənc qardaşların mənsub olduğu oymağın başçıları ilə bu məsələni müzakirə etmişdi. Nəccar oymağına mənsub müsəlmanlar da ərazini hədiyyə olaraq verməyi təklif etmişdilər. Nəhayət Allah Rəsulu (s.ə.v) onları ərazini satmaları üçün razı salmış və on dinar qızıl pula ərazi Əbu Bəkr (r.ə) tərəfindən satın alınmışdı. Həmin ərazinin bəzi yerlərində ağaclar və daha əvvəl ölmüş müşriklərə aid qəbirlər vardı. Ağaclar kəsilib qəbirlər başqa yerə köçürüldü. Daha sonra ərazidəki hündür və çökək yerlər düzəldilib inşaat üçün uyğun hala gətirildi. Məscidin təməli bir neçə metr daşla hörüldükdən sonra divarlar kərpicdən inşa edilərək üstü xurma ağacının budaqları ilə örtüldü. Məscidin şimal divarına yaxın yerində xurma ağacının gövdəsindən yonulmuş bir neçə dirək də qoyulmuşdu. Qiblə məscidin Qüdsdəki əl-Əqsa məscidinə baxan tərəfində idi. Allah Rəsulu (s.ə.v) və möminlər Məkkədə ikən Kə'bəyə doğru namaz qılmaqda idilər. Hicrətdən sonra isə bütpərəstlərin əlində qalmış Kə'bəyə tərəf deyil Qüdsdəki əl-Əqsa məscidinə doğru namaz qılınmışdı. Bu hicrətdən sonra təqribən bir il altı ay beləcə davam etmiş, Bəqərə surəsinin 144-cü ayəsinin nazil olmasından sonra isə qiblə dəyişmiş, Allah Rəsulu (s.ə.v) və möminlər üzlərini Kə'bəyə tutaraq namazlarını qılmışdılar. Məscidin üç qapısı vardı. Biri qiblə ilə üz-üzə, digərləri isə yan divarlarda idi. Məscidin döşəməsi çınqıl daşları və qumla örtülmüşdü. Məscidin təməli qoyularkən ilk daşı Allah Rəsulu (r.ə) qoymuşdu. Sonra onun istəyi ilə Əbu Bəkr (r.ə) ikinci daşı qoymuş, onun ardınca da Ömər ibn Xəttab (r.ə) və Osman ibn Əffan (r.ə) təməl daşı qoymuşdular. Allah Rəsulu (s.ə.v) əshabı ilə birlikdə məscidin inşaatında iştirak etmişdi. Güclü və qüvvətli bir insan olan Əmmar ibn Yasir (r.ə) bəzən daş və kərpicləri hamı kimi bir-bir deyil, iki-iki daşıyırdı. Allah Rəsulu (s.ə.v) ona yaxınlaşıb əli ilə üstünün tozunu çırpdı və "*ey Suməyyənin oğlu! Hamı bir səvab qazanarkən sən iki səvab qazandın*" dedi. Əmmar (r.ə) isə kərpicləri ona verənləri nəzərdə tutaraq zarafatyana "*ey Allahın Elçisi (s.ə.v) bunlar özləri daşıya bilmədiklərini mənə daşıtdırırlar. Məni öldürəcəklər*" dedi. Allah Rəsulu (s.ə.v) dini üçün çox əziyyətlər çəkmiş səhabəsinin bu sözünə "*heyf, ey Suməyyənin oğlu! Səni öldürən onlar olmayacaq. Səni azğın bir güruh öldürəcək*" deyərək Allahın ona bildirdiyi gələcəyə dair bir xəbəri də vermişdi. Əmmar ibn Yasir (r.ə) Əli ibn Əbu Talibin (r.ə) xilafəti dövründə baş vermiş Sıffin (h. 37 səfər/m. 657 iyun-avqust) döyüşündə qətlə yetirilmişdi.

Beləcə Məscidu'n-Nəbi, yəni Peyğəmbər məscidi inşa edilmişdi. İnşaat bitəndən sonra Allah Rəsulu (s.ə.v) əshabı ilə birlikdə gündəlik ibadətləri burada yerinə yetirir, cümə xütbələrini burada oxuyaraq cümə namazlarını da bu məsciddə qıldırıdı. Allah Rəsulu (s.ə.v) ilk vaxtlarda cümə xütbələrini qiblə tərəfdəki bir xurma ağacı kötüyünə söykənərək oxuyurdu. Daha sonra bəzi mədinəli möminə xanımlar onun məsciddə üzərinə çıxıb əshabına xitab etməsi üçün ağacdan üç pilləli bir minbər düzəltdirib Peyğəmbərə (s.ə.v) göndərmişdilər. Allah Rəsulu (s.ə.v) bu minbərin üzərində cümə xütbələrini oxuyudu. Raşid xəlifələrdən Əbu Bəkr (r.ə), Ömər (r.ə) və Osman (r.ə) da bu minbərin üzərində cümə xütbələrini oxumuşdular. İslamı qəbul edənlərin sayı günbəgün artdığı üçün bir neçə il sonra artıq möminlərin camaatı məscidə sığmırdı. Əshabdan Osman ibn Əffan (r.ə) ətrafdakı bəzi əraziləri sahiblərindən 25 min dirhəm gümüş pula satın alaraq məscidə bağışlamış və məscid genişləndirilmişdi.

Mədinədə kasıb və kimsəsiz müsəlmanlar da var idi. Bunların əksəriyyəti ərəb yarımadasının müxtəlif yerlərindəki qəbilələrə mənsub insanlar idi və Allah Rəsulunun (s.ə.v) İslama dəvətini eşidərək Mədinəyə gəlmişdilər. Onlar iman edəndən sonra öz yurdlarını tərk edərək Mədinəyə hicrət etmişdilər. Bunların əksəriyyəti subay gənclər idilər. Məscid inşa ediləndən sonra məscidin yanında bu insanların qalmağı üçün bir yer tikilmişdi ki, buraya Suffə deyilirdi. Suffədə qalan müsəlmanlar yeməklə, geyimlə təmin edilmiş və suffə əshabı adlanmışdılar. Onlar burada Qur'ani-Kərimi əzbərləyir, İslam dinini öyrənir və öyrədirdilər. Əksəriyyəti Qur'an hafizi olan suffə əshabından bir çoxunu Peyğəmbər (s.ə.v) İslamı yeni qəbul etmiş ərəb qəbilələrinə dinlərini öyrətmələri üçün göndərmişdi. Suffə İslam tarixindəki ilk məktəb, mədrəsə idi.

Sübh və işa namazları vaxtı qaranlıq olduğu üçün məscidin içində qurumuş budaq və yarpaqlar yandırılaraq məscid işıqlandırılırdı. Təmim əd-Dari[23] (r.ə) adlı bir müsəlman tacir Şam diyarından aldığı çıraqları Mədinəyə gətirmiş və məscidə bağışlamışdı. Bu çıraqların içində zeytun yağı yandıraraq məscid işıqlandırılırdı. O, qulluqçularından birinə hər səhər və hər axşam bu işi görməsini tapşırmışdı. Peyğəmbər (s.ə.v) bu çıraqları görəndə sevinmiş və Təmim əd-Dariyə (r.ə) "*sən İslamı və məscidimizi nurlandırdın. Allah da sənin dünyanı və axirətini nurlandırsın*" deyərək dua etmişdi. Peyğəmbər (s.ə.v) Təmim əd-Darinin (r.ə) sübh və işa namazlarında məsciddəki çıraqları yandıran Fəth adlı qulluqçusunu da Sirac, yəni işıq adlandırmışdı.

[23]Bəni-Ləhm qəbiləsinə mənsub zəngin tacir Əbu Ruqayyə Təmim ibn Əvs ibn Xaricə əd-Dari xristian din xadimi idi, daha sonra İslamı qəbul etmişdi. Onun mənsub olduğu qəbilə əslən Yəmənli olsa da Fələstində məskunlaşmışdı.

Məscidu'n-Nəbidə ibadət etməyin böyük savabı vardır. Allah Rəsulu (r.ə) Məkkədəki Məscidü'l-Həram, Qüdsdəki əl-Əqsa məscidi və öz məscidi olan Mədinədəki Məscidu'n-Nəbidən başqa hər hansı bir məsciddə ibadət üçün xüsusi səfər etməyi qadağan etmişdi.

Məscidin şərq divarının yanında Allah Rəsulu (s.ə.v) və ailəsinin qalması üçün iki otaqlı ev də inşa edilmişdi. Peyğəmbər (s.ə.v) bu ev tikilənə qədər Əbu Əyyub əl-Ənsarinin (r.ə) evində qalmışdı. Daha sonra xanımı və övladları ilə birlikdə bu evə köçmüşdü.

Məscidin tikintisinin başa çatmasından sonra hər gün beş namaz vaxtının möminlərə necə xəbər veriləcəyi ilə bağlı məsələ ortaya çıxmışdı. Bu məsələ ilə bağlı müxtəlif təkliflər irəli sürülmüşdü. Kimi xristianlar kimi zəng, kimi yəhudilər kimi şeypur çalaraq, kimi də atəşpərəstlər kimi hündür bir yerdə od yandıraraq insanları ibadətə çağırmağı təklif etmişdi. İlk vaxtlar müsəlmanlardan bir neçə nəfər namaz vaxtı çatan kimi Mədinənin küçələrində qaçaraq insanları namaza səsləyirdilər. Lakin bir gün mədinəli müsəlmanlardan Abdullah ibn Zeyd ibn Əbdirəbbih əl-Ənsari (r.ə) və Ömər ibn Xəttabın (r.ə) bununla bağlı eyni gecədə gördükləri eyni yuxunu Allah Rəsuluna (s.ə.v) danışmalarından sonra məsələ həll olmuşdu. Abdullah əl-Ənsari (r.ə) röyasında göydən enən bir varlığın ona əzanın sözlərini oxuduğunu bildirmişdi. Allah Rəsulu (s.ə.v) ona bu sözləri dərhal Bilal Həbəşiyə (r.ə) öyrətməsini istəmişdi. Beləcə İslamda ilk əzan oxunmuş, Peyğəmbər məscidinin müəzzini Bilal Həbəşi (r.ə) olmuşdu. Bəzən də İbn Umm Məqtum (r.ə) əzan oxuyardı. Daha sonra Allah Rəsulu (s.ə.v) Quba məscidinin müəzzini Sə'd əl-Qurazini Mədinəyə gətirtərək əzan oxumaq işini ona tapşırmışdı.

Hicrətin baş verdiyi dövrdə Mədinədə 10 mindən artıq insan yaşayırdı. Bunlardan cəmi 500-dən biraz artığı müsəlman idi. Əhalinin geri qalanı isə Əvs və Xəzrəc qəbiləsinə mənsub müşrik ərəblər, Qaynuqa, Qureyzə, Nəzir qəbilələrinə mənsub yəhudilər, az sayıda xristiandan ibarət idi. Bununla yanaşı hicrətdən sonra o vaxta qədər müsəlmanlar arasında mövcud olmayan zümrə, münafiqlər peyda olmuşdular. Bunlar zahirdə İslamı qəbul etdiklərini söyləsələr də, daxilən kafir olan insanlar idilər. Münafiqlər bu halları ilə müşriklərdən daha betər və qorxulu idilər. Belə ki, Allah Rəsulu (s.ə.v) və möminlərə qarşı düşmənçilik etmək üçün heç bir fürsəti əldən vermirdilər.

Əvs və xəzrəclilər illərdən bəri bir-biri ilə düşmənçilik etmişdilər. Mədinə yəhudiləri bu iki ərəb qəbiləsi arasındakı qan düşmənçiliyini daim qızışdırır, təşviq edirdilər. Qaynuqa qəbiləsi xəzrəclilərin, Qureyzə isə əvslilərin müttəfiqi idi. Adı çəkilən yəhudi qəbilələri də hər zaman mehriban deyildilər, öz arala-

rında da ixtilaf və çəkişmə vardı. Mədinədə yaşayan xristianların isə hər hansı bir icması yox idi. Burada ayrı-ayrı müşrik ərəblərin xristianlığı qəbul etdiyi görülmüşdü ki, sayıları bir neçə nəfərdən ibarət idi.

Ərəb qəbilələri, eləcə də yarımadada yaşayan yəhudi qəbilələri arasında qan düşmənçiliyi ənənəsi vardı. Yəni öldürülən hər hansı bir şəxsin haqqı mənsub olduğu qəbilənin digər fərdləri tərəfindən tələb edilir, intiqamı alınırdı. Bu da bir çox hallarda ard-arda gələn qətllər və nəticə etibariylə qəbilələr arası müharibələrə səbəb olurdu ki, bunlardan Ficar və Bu'as kimi müharibələr haqqında yuxarıda məlumat vermişdik. Belə qəbilələrarası müharibələr fasilələrlə illər boyu davam edə bilirdi. Bu səbəbdən də cahiliyyə dövrü ərəbləri "qan diyəti", yəni öldürülmüş şəxsin ailəsinə qanı əvəzində təzminat ödənməsi ənənəsini düşünüb icad etmişdilər. Bunun üçün hər qəbilədə ortaq bir büdcə təşkil olunurdu. Qatilin mənsub olduğu qəbilə öldürülənin ailəsinə öz aralarında topladıqları məbləği ödəyərək sülh əldə edir, beləcə qan düşmənçiliyinin illər boyu davam etməsinin qarşısını alırdılar. Yarımadanın digər yerlərində olduğu kimi Mədinədə də hər qəbiləni qəbilə rəisi, şeyx idarə edirdi. Qəbilə ağsaqqalarının toplaşaraq müştərək qərar qəbul etdikləri məsələlər olurdu. Lakin heç bir qəbilə özündən daha yüksəkdə duran bir hegemoniyanı, dövlət adlandırıla biləcək bir qurumu qəbul etmirdi. Belə bir ənənə yarımadadakı qəbilələr arasında mövcud deyildi. Mədinə şəhəri hərbi-strateji baxımdan da əlverişli coğrafi mövqeyə sahib deyildi. Məkkə kimi dağlar və yüksəkliklərlə əhatə olunmamışdı. Şəhər ətrafındakı düzənliklər onu hücuma açıq vəziyyətdə saxlayırdı. Şəhər qala divaları ilə də əhatə olunmamışdı. Sadəcə hər qəbilənin ya yaşadığı məhəllədə, ya da şəhər kənarında özünə məxsus müdafiə qurğuları, istehkamları vardı. Şəhərdəki kişi əhali müharibə üçün şəhərdən kənara çıxanda ailələri, mal və mülkləri müdafiəsiz qalmasın deyə onları bu istehkamlara köçürürdülər.

Mədinə ərəbləri arasında oxuma-yazma çox yayılmamışdı. Məkkə ərəbləri bu işdə onlardan daha irəli idilər. Mədinədə yaşayan yəhudilər arasında da savadlılıq dərəcəsi ərəblərə nisbətən daha yüksək idi. Yarımadada məskunlaşmış bütün yəhudilər kimi Mədinə yəhudiləri də ibrani dilini bilmir, ərəb dilində danışır və yazırdılar. Lakin onlar ərəb dilini ibrani əlifbası ilə yazırdılar. Yəhudilər arasında oxuma-yazmanın səviyyəsinin daha yüksək olmasının səbəbi güman ki, bu qövmün səmavi bir kitaba sahib olması idi. Yəhudilər öz dini ədəbiyyatlarını oxuyub anlamağa ehtiyac duyduqları üçün bunu öyrənmək məcburiyyətində qalırdılar.

Allah Rəsulu (s.ə.v) Mədinəyə hicrət etdiyi vaxt bu şəhərdə ədliyyə, maliyyə, təhsil, hərbi, dini və s. bu kimi işləri yoluna qoyub idarə edəcək hər hansı

bir qurum mövcud deyildi. Qəbilələr arasındakı əlaqələr xeyli zəif idi. İstər qəbilələrarası, istər dinlərarası əlaqələr möhkəm, sarsılmaz bir təməl üzərinə bina edilməmişdi. Allah Rəsulunun (s.ə.v) əsas məqsədi hər zaman insanları İslama dəvət etmək, tövhidi yayıb şirklə mübarizə aparmaq kimi dini işlər olsa da cəmiyyətdəki ictimai və siyasi əlaqələrin hər bir insanın həyatına birbaşa təsir etməsi səbəbiylə Peyğəmbər (s.ə.v) buradakı münasibətlərin nizama salınmasının vacibliyini dərk edirdi. Ən azından təhlükəsizliyin, asayişin təmin edilməsi üçün bu istiqamətdə müəyyən addımlar atılmalı idi. Allah Rəsulu (s.ə.v) əvvəla öz əshabından rəy sahibi olanlarla məşvərət etdi. Bu məşvərət məclisində iştirak edənlərin hamısı yazılı bir mətnlə Mədinə daxilindəki münasibətlərin nizamlanmasının vacibliyi barədə həmfikir olmuşdular. Daha sonra Allah Rəsulu (s.ə.v) Mədinə və ətrafında yaşayan bütün qəbilə və oymaq başçılarını toplayıb onlarla söhbət edərək niyyətini açıqladı. Onun yazılı bir mətn tərtib edərək münasibətləri buna görə nizamlamaq fikri demək olar ki, hamı tərəfindən bəyənilmişdi. İstər ərəb, istərsə də yəhudi bütün qəbilələr ara müharibələrindən, qan düşmənçiliklərindən yorulmuş və bezmişdilər. Üstəlik Qüreyş müşriklərinin hədə-qorxuları bitmirdi. Onlar Peyğəmbər (s.ə.v) və əshabının himayədən məhrum edilərək Mədinədən çıxarılması tələblərini təkidlə təkrarlayırdılar. Buna görə də qəbilə və oymaq başçılarının Allah Rəsulunun (s.ə.v) bu təklifini qəbul etmələri elə də çətin olmamışdı.

Beləcə Allah Rəsulunun (s.ə.v) bu təklifi qəbul edilmiş və bəşər tarixindəki ilk yazılı əsas qanunlardan, konstitusiyalardan biri onun təşəbbüsü və tərtibi ilə qələmə alınmışdı. Bu əsas qanun 47 maddədən ibarət idi:

*Rəhman və Rəhim Olan Allahın Adı İlə*

*1. Bu yazı Allahın Elçisi Muhəmməd (s.ə.v) tərəfindən qüreyşli və yəsribli möminlər və müsəlmanlar, onların tabeliyində olanlar, sonradan onlara qoşulacaq olanlar və onlarla birlikdə cihad edənlər üçün tərtib edilmişdir.*

*2. Burada adı sadalananlar digər insanlardan ayrı olaraq bir ümməti təşkil etməkdədirlər.*

*3. Qüreyşli mühacirlər öz ənənələrinə müvafiq olaraq qan diyətinin və möminlərdən olan hərbi əsirlərin qurtuluş fidyəsinin (məbləğinin) ədalətli və münasib əsaslara görə ödənilməsində iştirak edəcəklər.*

*4. Bəni-Əvf öz ənənələrinə müvafiq olaraq qan diyətini və hərbi əsirlərin qurtuluş fidyəsini möminlər arasında ədalətli və münasib görülən əsaslara görə ödənilməsində iştirak edəcək.*

*5. Bəni-Haris eyni hökmə tabedir.*

*6. Bəni-Saidə eyni hökmə tabedir.*

*7. Bəni-Cuşəm eyni hökmə tabedir.*

*8. Bəni-Nəccar eyni hökmə tabedir.*

*9. Bəni-Əmr ibn Əvf eyni hökmə tabedir.*

*10. Bəni-Nəbit eyni hökmə tabedir.*

*11. Bəni-Əvs eyni hökmə tabedir.*

*12. Möminlər öz aralarında ağır maliyyə məsuliyyəti altında olan heç kimi tərk etməyəcək, qurtuluş fidyəsi və qan diyəti kimi borcları ədalətli və münasib görülən əsaslara görə birlikdə ödəyəcəklər. Heç bir mömin müəxat əqdi bağladığı möminin əleyhinə olan başqa bir əqd bağlamayacaqdır.*

*13. Təqva sahibi möminlər öz aralarında təcavüzkara və haqsız bir fəaliyyət planlayana yaxud hər hansı bir cinayət, haqqa təcavüz və yaxud da möminlər arasında qarışıdurma qəsdi ilə iş görən kəsə qarşı olacaqlar və bu şəxs onlardan birinin övladı belə olsa hamısı yekdil olaraq ona qarşı ayağa qalxacaqlar.*

*14. Heç bir mömin bir kafir üçün başqa bir mömini öldürə bilməz və bir möminin əleyhinə kafirə kömək edə bilməz.*

*15. Allahın himayəsi və təminatı təkdir. Möminlərdən ən zəifinin belə verdiyi himayə möminlərin hamısı üçün hökmdür. Çünki möminlər digər insanlardan ayrı olaraq bir-birlərinin mövlası, qardaşıdırlar.*

*16. Yəhudilərdən bu əqdə daxil olanlar tərəfimizdən yardım və dəstək haqqı qazanacaqlar.*

*17. Sülh möminlər arasında vahiddir. Heç bir mömin Allah yolunda girişilən bir müharibədə digər möminlərdən ayrı olaraq hər hansı bir sülh müqaviləsi bağlaya bilməz. Sülh sadəcə möminlərin yekdil və ədalətli əsaslarla alınmış qərarına görə bağlancaqdır.*

*18. Bizimlə birlikdə hərbi əməliyyatlarda iştirak edən qruplar bir-birləriylə növbələşərək hərəkatlarda iştirak edəcəklər.*

*19. Möminlər bir-birlərinin Allah yolunda axmış qanlarının intiqamını alacaqlar.*

*20. Təqva sahibi möminlər ən yaxşı və ən doğru yoldadırlar. Heç bir müşrikin istənilən Qüreyş müşrikinin malına və canına verdiyi himayə tanınmayacaqdır və bu xüsusda heç bir möminə mane oluna bilməz.*

*21. Hər hansı bir kəsin bir möminin ölümünə səbəb olduğu qəti dəlillərlə sübuta yetirilərsə, əgər öldürülənin vəlisi (ailəsi) qan diyəti ödənməsinə razı deyilsə, qisas tətbiq olunar. Qisas tələb etmək sadəcə məqtulun vəlisinə halaldır (ailəsinin haqqıdır).*

*22. Bu əhdnamənin əhatə etdiyi hökmləri qəbul edən, Allaha və axirət gününə inanan heç bir möminin hər hansı bir qatilə kömək etməsi və ona sı-*

*ğınacaq verməsi halal deyildir. Haqsız yerə qan tökmüş qatilə yardım edən və sığınacaq verən qiyamət günü Allahın lənəti və qəzəbinə uğrayacaqdır.*

*23. Bu əhdnaməyə daxil olan hər bir kəs ixtilafa düşdüyü məsələlərlə bağlı Allaha və Rəsuluna (s.ə.v) müraciət edəcəkdir.*

*24. Yəhudilər hərbi əməliyyatlar vaxtı, möminlərin etdikləri kimi, öz hərbi xərclərini özləri ödəyəcəklər.*

*25. Bəni-Əvf qəbiləsindən olan yəhudilər möminlərlə birlikdə eyni cəmiyyətə mənsubdurlar. Fəqət yəhudilərin dinləri özlərinə, möminlərin dinləri isə özlərinədir. Bu həm onların özlərinə, həm də himayələri altında olanlara aiddir. Haqsız təcavüz edən və cinayət törədən isə özünə və hamisinə zərər vermiş olacaqdır.*

*26. Bəni-Nəccar qəbiləsindən olan yəhudilər eyni hökmə tabedirlər.*

*27. Bəni-Haris qəbiləsindən olan yəhudilər eyni hökmə tabedirlər.*

*28. Bəni-Saidə qəbiləsindən olan yəhudilər eyni hökmə tabedirlər.*

*29. Bəni-Cuşəm qəbiləsindən olan yəhudilər eyni hökmə tabedirlər.*

*30. Bəni-Əvs qəbiləsindən olan yəhudilər eyni hökmə tabedirlər.*

*31. Bəni-Sə'ləbə qəbiləsindən olan yəhudilər eyni hökmə tabedirlər.*

*32. Cəfnə oymağı Sə'ləbə qəbiləsinin bir qoludur və Sə'ləbə qəbiləsi ilə eyni hökmə tabedir.*

*33. Bəni-Şuteybə oymağından olan yəhudilər də eyni hökmə tabedirlər.*

*34. Sə'ləbə qəbiləsinin mövlaları (azad edilmiş kölələri, himayəsində olanlar) Sə'ləbə qəbiləsi mənsubu kimi qəbul olunurlar və eyni hökmə tabedilər.*

*35. Yəhudilərin sığınacaq verdiyi qəriblər həmin yəhudilərlə eyni hökmə tabedirlər.*

*36. Yəhudilər Muhəmmədin (s.ə.v) izni olmadan möminlərlə birlikdə hərbi səfərlərdə iştirak edə bilməzlər. Hər hansı bir yaralamanın qisasını almaq qadağan edilməyəcəkdir. Şübhəsiz adam öldürən şəxs həm özünü, həm də öz ailə fərdlərini məsuliyyət altında qoyar. Bunun əksini iddia etmək haqsızlıqdır. Allah bu əhdnaməyə səmimi şəkildə riayət edənlərlə birlikdədir.*

*37. Müharibə vəziyyətində yəhudilər özlərinin, möminlər də özlərinin hərbi xərclərini ödəyəcəklər. Bu əhdnaməyə daxil olanlar müharibə vəziyyətində öz aralarında maddi baxımdan əlbəttə köməkləşəcəklər. Onların arasında daim xeyirxahlıq və xoş davranış olacaqdır. Müəyyən olunmuş qaydalara riayət olunacaq, bu qaydalara zidd hərəkətlərə yol verilməyəcək. Heç kim öz müttəfiqinə qarşı cinayətə əl ata bilməz. Bu halda zülmə uğrayana kömək ediləcəkdir.*

*38. Yəhudilər müsəlmanlarla birlikdə hərbi səfərlərdə iştirak etdikləri müddətcə hərbi xərcləri ödəyəcəklər.*

*39. Bu əhdnaməyə daxil olanlar üçün Yəsrib (Mədinə) vadisinin daxili cəvf (qan tökülməsi haram olan) yerdir.*

*40. Himayə altındakı kimsə eynən himayə edən kimsə kimidir. Ona zülm edilməz və haqsızlığa məruz qalmaz.*

*41. Himayə vermək sadəcə himayə haqqına sahib olanlara məxsusdur.*

*42. Bu əhdnaməyə daxil olanlar hər hansı bir qətl və yaralama təhlükəsi ilə bağlı Allaha və Rəsuluna (s.ə.v) müraciət edəcəkdirlər.*

*43. Qüreyş müşrikləri və onlara kömək edənləri heç kim öz himayəsi altına ala bilməz və ona sığınacaq verə bilməz.*

*44. Yəsribə hücum olsa müsəlmanlar və yəhudilər öz aralarında köməkləşəcəkdirlər.*

*45. Yəhudilər möminlər tərəfindən hər hansı bir tərəf ilə sülh müqaviləsi bağlamağa dəvət edilsələr bunu qəbul edəcəklər. Möminlər yəhudilər tərəfindən hər hansı bir tərəf ilə sülh müqaviləsi bağlağa dəvət edilsələr onlar da bunu qəbul edəcəkdirlər. Dini səbəblərlə meydana çıxan müharibələr bundan istisnadır. Hər bir qrup öz nəzarəti altında olan məntəqənin müdafiəsi üçün məsuliyyət daşıyır.*

*46. Haqsız qazanc əldə etməyə çalışanlar bunu öz əleyhlərinə etmiş olarlar. Bu əhdnamədə müəyyən edilmiş şərtlərə möhkəm və tam bir mühafizəkarlıqla əməl ediləcəkdir. Bu şərtlərə zidd hərəkətlərə əsla yol verilməyəcəkdir. Bunun əksini edənlər özlərinə zərər vermiş olacaqlar. Allah bu yazıda müəyyən edilmiş şərtlərə diqqət və doğruluqla əməl edənlərlə birlikdədir.*

*47. Bu yazı haqsız əməl və cinayət törədənlərin cəzalandırılmasına mane deyildir. İstər hərbi səfərə çıxsın, istərsə də Mədinədə otursun, bu əhdnaməyə daxil olanların təhlükəsizliyi təmin olunacaqdır. Allah və Rəsulu Muhəmmədin (s.ə.v) himayəsi bu yazıya diqqət və sədaqətlə əməl edənlərin üzərində olacaqdır.*

Hər şeydən əvvəl qeyd etmək lazımdır ki, bu 47 maddəlik əhdnamənin ortaya çıxmasını həmin dövrdə Mədinədəki ictimai və siyasi şərtlər tələb edirdi. Mədinə əhdnaməsinə qədər İslam sadəcə ictimai mahiyyət daşımaqda idi. Mədinə əhdnaməsi ilə İslam və müsəlman icması siyasi-hüquqi xarakter və sima qazanmış oldu. Əhdnamə nəticəsində formalaşmış cəmiyyətə, mühacir və ənsarla yanaşı, müharibə olacağı halda müsəlmanlarla yanaşı vuruşmağı öz öhdələrinə götürmüş qeyri-müsəlmanlar da daxil idilər. Həmin dövrə qədər qəbilə başçısından başqa iqtidar tanımayan bu insanlar mərkəzləşdirilmiş siyasi hakimiyyətlə tanış olmuşdular. Mədinə əhdnaməsilə cəmiyyətdəki hüquqi məsələlər, ələlxüsus ədalətin bərqərar olması məsələsi artıq fərdi və qəbilədaxili məsələ olmaqdan çıxaraq mərkəzi hakimiyyət tərəfindən tənzimlənən bir mə-

sələyə çevrilmişdi. Əhdnamə cəmiyyətdəki fərdlərə soydaş, qəbilədaş, qan qohumu kimi anlayışların üstündə bir vətəndaşlıq anlayışı aşılayırdı. Belə ki, cinayətkar hətta ən yaxın əqrəba belə olsa heç kim tərəfindən himayə olunmayacaq və cəzalandırılacaqdı. Əhdnamədə ədalətin yeganə mənbəyi olaraq Allah, ilahi mənşəli ədalət və hüququn icraçısı olaraq isə Allahın yer üzündəki Elçisi (s.ə.v) göstərilmişdi. Həqiqət budur ki, təşri', qanunvericilik haqqına kim sahibdirsə gerçək hakim, həqiqi hökmdar da odur. Peyğəmbərin (s.ə.v) Mədinədə formalaşdırdığı cəmiyyətdə qanunvericilik haqqı bütünü ilə və sadəcə Allaha aid idi. Peyğəmbər (s.ə.v) və ondan sonra gələn xəlifələr isə bu qanunların icra ediciləri idilər. Bununla yanaşı mühakimə haqqına da sahib idilər.

Ayrı-ayrı fərdlərin, soy və ailələrin ağır maliyyə məsuliyyəti altında əzilməmələri üçün ictimai sığorta mahiyyətində bir maddi yardımlaşma ənənəsi bərqərar edilmişdi. Bununla da ailələr və qəbilələr arası çəkişmə və silahlı toqquşmaların qarşısı alınmışdı. Əhdnamə ilə kitab əhli olan yəhudilərə din və vicdan hürriyyəti tanınmışdı. Lakin İslama və Allah Rəsuluna (s.ə.v) düşmənlik edən Qüreyş müşrikləri hər cür yardım və himayədən məhrum buraxılmışdılar. Bu əhdnamə ilə xilafətin beşiyi olan Mədinə şəhər dövlətinin əsası qoyulmuşdu.

Mədinə əhdnaməsilə şəhərdə ictimai-siyasi intizam və sabitliyin təmin edilməsindən sonra Allah Rəsulu (s.ə.v) iqtisadi məsələlərin də yoluna qoyulması üçün mühüm tədbirlər görmüşdü. Ənsar özlərinə məxsus əkinə yararlı ərazilər və meyvə bağlarının bir hissəsini mühacirlərə verilməsi üçün Allah Rəsuluna (s.ə.v) bağışlamışdı. Peyğəmbər (s.ə.v) bu tarla və bağları mühacirlər arasında bölüşdürüb onlar üçün mülkiyyət sənədi yazdırıb təsdiq etmişdi. Mədinədə ticari həyat demək olar ki, bütünüylə yəhudilərin əlində idi. Müsəlman tacirlər ki, bunların əksəriyyəti mühacir idilər, yəhudilərə məxsus bazarda ticarətlə məşğul idilər. Bazarın şərtləri əlbəttə ki, yəhudilər tərəfindən müəyyən edilirdi. Allah Rəsulu (s.ə.v) əvvəlcə Zübeyr ibn Əvvama (r.ə) məxsus ərazidə müsəlman tacirlər üçün bazar yeri təsis etdi. Lakin Mədinə yəhudilərinin liderlərindən olan və İslama qarşı düşmənliyi ilə seçilən Kə'b ibn Əşrəf bu əraziyə gələrək çadırların iplərini kəsmiş və burada bazarın qurulmasına imkan verməyəcəyini bildirmişdi. Həmin ərazi yəhudi məhəlləsinə yaxın idi. Allah Rəsulu (s.ə.v) həmin yerdə bazar qurulması üçün təkid etmədi. O, Bəni-Saidə qəbiləsinə məxsus köhnə qəbristanın bazar yerinə çevrilməsi üçün bu qəbilənin ağsaqqallarından izn istədi. Saidə övladı biraz tərəddüdlə də olsa bu təklifi qəbul etmiş və həmin yerdəki qəbirlər köçürülərək ərazi bazar yerinə çevrilmişdi. Bu barədə irəlidə daha ətraflı məlumat veriləcəkdir.

Allah Rəsulu (s.ə.v) Mədinədə İslam cəmiyyətini möhkəm təməllər üzərində qurmuşdu. Onun Allahın əmr və qadağaları ilə formalaşdırdığı, tənzimlədiyi yeni cəmiyyət həyatı özünün bütün cəhətləri ilə köhnə, cahiliyyə cəmiyyətindən fərqlənirdi. Bu fərqlilik özünü bütün adət-ənənələr, vərdiş və xüsusiyyətlərdə büruzə verməkdə idi. Allah Rəsulu (s.ə.v) Yəsribə hicrət edəndən sonra bu şəhərin əhalisinin ilin iki günündə bayram şənlikləri tərtib etdiklərini görmüşdü. Bu bayramlar Sasanilərin bölgədəki nüfuzu nəticəsində ərəblərə də sirayət etmiş Novruz və Mehrigan bayramları idi. Qədim məcusi münəccimlərinin hesablamalarına görə martın 21-dən etibarən günəş Həml bürcünə daxil olur, bu vaxt onlar Novruz bayramını qeyd edirdilər. Sentyabrın 21-dən etibarən günəş Mizan bürcünə daxil olanda isə məcusilər Mehrigan bayramını qeyd edərdilər. İlin bu iki günündə gecə ilə gündüz bir-birinə bərabər olurdu. Ənəs ibn Malik (r.ə) deyirdi ki, Peyğəmbər (r.ə) yəsriblilərdən bu iki günün mənasını soruşanda onlar "*biz keçmiş cahiliyyə günlərindən bəri bu iki gündə əylənirik*" deyə cavab vermişdilər. Bunu xoşlamayan Peyğəmbər (s.ə.v) onları bundan çəkindirmək məqsədiylə "*Allah bu iki bayramınızı öz nəzdində onlardan daha xeyrli olan iki günlə dəyişdirdi, bu Qurban və Fitr (Ramazan) bayramlarıdır*" deyə buyurmuşdu[24].

**Məkkə Müşrikləri İlə Münasibətlər**

Yuxarıda qeyd etdiyimiz kimi Məkkə müşrikləri Allah Rəsulu (s.ə.v) və möminləri Mədinədə də rahat buraxmır, onların buradan sıxışdırılıb çıxarılması və ya Peyğəmbərin (s.ə.v) öldürülməsi üçün bütün vasitələrə əl atırdılar. Onlar Əvs və Xəzrəc qəbilələrinin, o cümlədən Mədinədəki yəhudi qəbilələrinin liderlərinə hədə-qorxu dolu məktublar yazaraq Muhəmmədi (s.ə.v) öldürmələrini və ya öz yurdlarında qalmasına izn verməmələrini tələb edirdilər. Mədinəli müsəlmanlar Məkkə müşriklərinin bu hədələrinə heç bir əhəmiyyət vermirdilər. Yəhudilər Peyğəmbərin (s.ə.v) və müsəlmanların Mədinədə olmalarından məmnun deyildilər, lakin Mədinə əhdnaməsinə yeni qoşulmuşdular və öz əleyhlərinə çevriləcəyi əndişəsilə onun şərtlərinə xələl gətirmək istəmirdilər. Abdullah ibn Übeyy ibn Səlulun liderliyindəki Mədinə münafiqləri isə Məkkə müşrikləri ilə bu mövzuda əməkdaşlıq etmək istəmişdilər. Lakin Peyğəmbərin (s.ə.v) onlarla danışıb onları yola gətirməsindən sonra bu təşəbbüslərindən əl çəkmişdilər. Hədə-qorxuların fayda vermədiyini görən Qüreyş müşrikləri bu dəfə başqa yollara əl atmağa başladılar. Onlar Əvs və Xəzrəcdən olan ərəblərin Kə'bə ziyarətlərinə, o

---

[24] Hədis buradakı mətni ilə Əbu Davud və Nəsainin "Sünən" adlı əsərlərində qeyd olunmuşdur. (وعن أنسٍ رَضِيَ اللّهُ عَنْه قال: قَدِمَ رَسُولُ اللّهِ صلى الله عليه وسلم وَلَهُمْ يَوْمَانِ يَلْعَبُونَ فِيهِمَا فَقَالَ: مَا هذَانِ الْيَوْمانِ؟ قَالُوا: كُنَّا نَلْعَبُ فِيهِمَا في الْجَاهِلِيَّةِ. فقَالَ: قَدْ أَبْدَلَكُمُ اللّهُ خَيْراً مِنْهُمَا: يَومَ ا'ضْحى وَيَوْمَ الْفِطْرِ.)

cümlədən Mədinəli tacirlərin yarımadanın müxtəlif yerlərində qurulan yarmarkalarda iştirakına mane olurdular. Məlum olduğu kimi yarımadadakı, ələlxüsus Hicaz bölgəsindəki iqtisadi-ticari vəziyyətə demək olar ki, tamamilə Qüreyşin müşrik tacirlər nəzarət edirdilər. Onların Mədinəni iqtisadi-ticari baxımdan təcrid etmələri şəhərdəki yəhudi və münafiqlər üçün bəhanə oldu. Mədinə yəhudiləri və münafiqlər Mədinə əhalisi arasında belə təbliğat aparırdılar: "*Muhəmmədin (s.ə.v) gəlib bizim aramızda yaşaması bizə böyük fəlakətlər gətirdi. Bütün ərəblər bizə düşmən oldular. Yollarımız kəsildi, ailələrimiz ac qaldı, ərzaq tapmaq belə müşkülə çevrildi*". Mədinəli müsəlmanlardan Sə'd ibn Muaz (r.ə) hələ İslamdan əvvəl ticarət əlaqəsi və dostluğu olan məkkəli müşriklərdən Uməyyə ibn Xələfə qonaq getmişdi. Onlar birlikdə təvaf üçün Kə'bəyə gedərkən Əbu Cəhllə rastlaşmışdılar. Əbu Cəhl qəzəblə Sə'd ibn Muaza (r.ə) "*Siz o sabiiləri (müsəlmanları nəzərdə tutur) himayəniz altına almısınız. Bu səbəbdən də biz sizin gəlib Kə'bəni təvaf etmənizə icazə verməyəcəyik. Allaha and olsun əgər Uməyyənin qonağı olmasaydın səni öldürərdim*" demişdi. Sə'd ibn Muaz (r.ə) da ona "*Əgər siz bizim Kə'bəni ziyarətimizə mane olsanız, biz də sizin torpaqlarımızdan keçib gedən karvanlarınıza mane olarıq*" deyə cavab vermişdi.

Allah Rəsulu (s.ə.v) Qüreyş müşriklərinin hədə-qorxu sovuraraq bütün ərəb qəbilələrini Mədinədəki müsəlman icmaya qarşı ayağa qaldırmasına qarşı tədbirlər almağa başlamışdı. O, Mədinə ətrafında yaşayan Dəmrə, Cuheynə və Muzeynə qəbilələrinin rəisləri ilə şəxsən görüşərək bu qəbilələrlə qarşılıqlı təhlükəsizlik və sülh müqavilələri bağladı. Allah Rəsulu (s.ə.v) hicrət vaxtı onu və Əbu Bəkri (r.ə) yaxalamaq istəryərkən gördüyü möcüzələr qarşısında iman gətirmiş Suraqə ibn Maliklə (r.ə) görüşərək onun mənsub olduğu Mudlic qəbiləsi ilə də sülh və təhlükəsizliyə dair əhdnamə bağlamışdı.

Allah Rəsulunun (s.ə.v) bu qəbildən olan sülh məqsədli tədbirləri Məkkə müşriklərinin liderlərini daha da azğınlaşdırırdı. Onlar hazırladıqları süvari dəstəni Kurz ibn Cabirin[25] başçılığı altına gizlicə Mədinəyə göndərmişdilər. Kurz ibn Cabirin süvari dəstəsi Mədinənin kənar məhəllələrindən birinə qəfil basqın təşkil edərək bir neçə nəfəri öldürmüş, Zulcərd otlağındakı heyvanları da sürüb aparmışdı. Peyğəmbərin (s.ə.v) əmri ilə Kurzun süvari dəstəsi təqib edilsə də heç bir nəticə hasil edilməmişdi. Kurzun dəstəsinin quldur basqını, eləcə də şəhərdəki münafiqlər və yəhudilərin əks-təbliğatının əsas məqsədi

[25]Məkkənin hərbi işdəki bacarığı ilə tanınan simalarından biri olan Əbu Əbdurrəhman Kurz ibn Cabir ibn Huseyl əl-Fıhri daha sonrakı illərdə İslamı qəbul etmiş və hicrət edərək Mədinədə məskunlaşmışdı. İslamı qəbul etdikdən sonra onun zöhd sahibi, çox ibadət edən səhabələrdən biri olduğu bildirilmişdir. Kurz ibn Cabir (r.ə) Peyğəmbərin (s.ə.v) əmri ilə bir sıra hərbi yürüşlərdə mücahidlərə əmirlik etmişdi.

müsəlmanları zəif göstərmək və Mədinə əhdnaməsinə qoşulan qəbilə və oymaqların arasında əhdnamənin faydasız olduğu fikrinin yayılması idi. Allah Rəsulu (s.ə.v) səhabələrin qabaqcılları ilə məşvərət edərək buna qarşı bəzi tədbirlər aldı. Hər şeydən əvvəl Mədinə ətrafında patrul xidməti göstərmək üçün silahlı süvari dəstələri təşkil olundu. Bu dəstələrdəki mücahidlərin sayı 5 nəfərdən 400 nəfərə qədər olurdu. Müsəlmanların süvari dəstələri tez-tez Mədinə ətrafındakı ərazilərə qısa müddətli yürüşlərə çıxırdı. Belə yürüşlər "*səriyyə*" adlanırdı. Allah Rəsulunun (s.ə.v) vəfatına qədər 47 səriyyə təşkil olunmuşdu. Bunlardan 28-inə şəxsən Allah Rəsulu (s.ə.v) özü başçılıq etmişdi ki, belə səfərlərə də "*qəzvə*" deyilirdi. Səriyyələrin əsas məqsədi Məkkə müşriklərinə aid ticarət karvanlarının Mədinə əhdnaməsinə qoşulmuş qəbilələrin torpaqlarından keçməsinə mane olmaq idi. Qüreyş müşriklərinin mədinəlilərə qarşı tərtib etdikləri iqtisadi-ticari təcrid tədbirlərinə bununla tutarlı cavab verilmişdi. Allah Rəsulu (s.ə.v) Əbu Cəhlin başçılıq etdiyi, Qüreyş müşriklərinə məxsus 300 dəvədən ibarət ticarət karvanının Cuheynə qəbiləsinə məxsus ərazidə düşərgə saldığı xəbərini alan kimi dərhal Qızmızı dənizə yaxın həmin əraziyə əmisi Həmzənin (r.ə) başçılığı altında 30 süvaridən ibarət silahlı dəstə göndərmişdi. Sifu'l-Bəhr adlanan bu yürüşdə iştirak etmiş 30 nəfərlik hərbi dəstənin hamısı mühacirlərdən ibarət idi. Cuheynə qəbiləsinin rəisi Məcdi ibn Əmrin həm Qüreyşin müşrik zadəganları, həm də Allah Rəsulu (s.ə.v) ilə əhdnaməsi vardı. Buna görə də o, əlindən gələni edərək öz qəbiləsinə məxsus ərazidə tərəflər arasında qanlı toqquşmanın baş verməsinin qarşısını almışdı. Lakin bu yürüşdən sonra Əbu Cəhl və qüreyşli müşriklər necə böyük bir təhlükə ilə üz-üzə qaldıqlarının fərqinə varmışdılar.

Sifü'l-Bəhr hərbi yürüşündən bir neçə həftə sonra Allah Rəsulunun (s.ə.v) əmri ilə Ubeydə ibnü'l-Harisin (r.ə) başçılğı altındakı 60 nəfərlik dəstə yeni bir hərbi səfərə çıxmışdı. Bu dəfə hədəf Əbu Cəhlin oğlu İkrimənin başçılğı altında Şam diyarından Məkkəyə gedən ticarət karvanı idi. Murrə təpələri adlanan ərazidə karvana rast gələn müsəlmanlar ona hücum etmədilər, lakin karvandakılar hücumun baş verəcəyi əndişəsinə qapılaraq qorxu hissi keçirdilər. Məkkəlilərin bu karvanında Miqdad ibn Əmr əl-Bəhri (r.ə) və Utbə ibn Ğəzvan əl-Mazini (r.ə) adlı iki müsəlman da var idi. Bu iki səhabə ticari məqsədlər üçün həmin karvana qoşulmuşdular. Onlar karvanı təqib edən süvari dəstənin müsəlmanlardan ibarət olduğunu öyrənən kimi karvandan ayrılıb onların yanına gəlmiş, onlarla birlikdə Mədinəyə getmişdilər.

Hicrətin ikinci ilində Məkkə müşrikləri ilə müsəlmanlar arasındakı münasibətlər günbəgün gərginləşmişdi. Bu gərginlik Məkkə ilə Mədinə arasında yaşayan bədəvi ərəb qəbilə və oymaqlarına da sirayət edirdi. Onlar əslində

Qüreyşin ticarət karvanlarının öz torpaqlarından keçməsindən məmnun idilər. Çünki bu ticarət karvanları onlara bəzi maddi mənfəətlər qazandırırdı. Məsələn heyvanlara ot-ələf, karvandakılara ərzaq məhsulları sataraq güzaranlarını təmin edirdilər. Öz ərazilərində Qüreyşin ticarət karvana bir xətər yetişməsini istəmirdilər. Çünki Qüreyş zadəganlarının qəzəbinə tuş gəlməkdən çəkinirdilər. Onların bu qorxularını aradan qaldırmaq üçün Allah Rəsulu (s.ə.v) Dəmrə, Mudlic kimi qəbilələrin rəislərini şəxsən ziyarət edərək onları qorumaq üçün söz vermişdi. Allah Rəsulu (s.ə.v) 150 nəfərlik silahlı süvari ilə mudliclilərin yurdunda ikən Qüreyşə məxsus böyük bir karvan yaxınlıqdan keçib Şam diyarına getmişdi. Allah Rəsulu (s.ə.v) dərhal Mədinəyə qayıdaraq hicri 2-ci ilin cəmaziyəlaxir ayında (dekabr 623) iki nəfər casusu bu karvanı Şam diyarına gedib qayıdarkən təqib etmək üçün göndərdi. Daha sonra isə Məkkədən cənuba doğru olan karvan yolundakı fəaliyyətlər haqqında müntəzəm məlumat almaq üçün bir tədbir gördü. Abdullah ibn Cəhşi (r.ə) mihacirlərdən ibarət 8 nəfərlik süvari dəstəyə başçı təyin edərək Nəcdə tərəf göndərdi. Yola çıxarkən Abdullah ibn Cəhşə (r.ə) möhürlü bir yazı verdi və yazını iki gün yol gedəndən sonra açıb oxumasını əmr etdi. Həmin möhürlü məktubda dəstəyə verilən tapşırıq yazılmışdı. Bunu etməklə Allah Rəsulu (s.ə.v) səfərin məqsədinin Mədinədə heç kim tərəfindən bilinməməsini təmin etmişdi. Abdullah ibn Cəhş (r.ə) öz dəstəsi ilə iki gün yol gedəndən sonra məktubu açıb oxudu, orada belə yazılmışdı: "*Məkkə ilə Taif arasındakı Nəxləyə get, orada qal, qüreyşlilərin hərəkətlərini müşahidə et və mənə məlumat göndər*". Abdullah ibn Cəhş (r.ə) dərhal əmri yerinə yetirərək Nəxləyə getdi və münasib bir yerdə düşərgə quraraq Məkkə ilə Taif arasındakı yolu müşahidə etməyə başladı. Onlar bir müddət sonra ehtimal ki, Yəməndən Məkkəyə getməkdə olan Qüreyşə aid, dəri, kişmiş, şərab kimi mallarla yüklü kiçik bir ticarət karvanı ilə rastlaşdılar. Nə edəcəklərinə dair həmfikir ola bilmədilər və dəstədəkilərdən biri karvandakılardan birini oxla vurub öldürdü, iki nəfəri isə əsir götürdü. Karvandakı digərləri malları qoyub qaçaraq canlarını qurtardılar. Bu hadisə hicri 2-ci il rəcəb ayının son günü (26 yanvar 624) baş vermişdi. Abdullah ibn Cəhşin (r.ə) süvariləri əsir və qənimətlərlə birlikdə Mədinəyə qayıtdılar. Lakin Allah Rəsulunun (s.ə.v) qəzəbi ilə üzləşdilər. Peyğəmbər (s.ə.v) onları "*mən sizə sadəcə müşahidə edib xəbər göndərmənizi tapşırmışdım*" deyərək məzəmmət etmişdi. İnananlara qarşı öz zülümkar əməllərini unudan Qüreyş müşrikləri bu hadisədən sonra müsəlmanları haram aylardan olan rəcəb ayında qan tökməklə günahlandıraraq bütün ərəb qəbilələri arasında əks-təbliğat aparmağa başladılar. Mədinədəki münafiqlər də bu qaralama kampaniyasına dəstək vermişdilər.

Allah müşriklərlə münafiqlərin bu fitnəsinə Qur'ani-Kərimin Bəqərə surəsi 217-ci ayəsi ilə cavab vermişdi:

يَسْأَلُونَكَ عَنْ الشَّهْرِ الْحَرَامِ قِتَالٍ فِيهِ قُلْ قِتَالٌ فِيهِ كَبِيرٌ وَصَدٌّ عَنْ سَبِيلِ ا ـ وَكُفْرٌ بِهِ وَالْمَسْجِدِ الْحَرَامِ وَإِخْرَاجُ أَهْلِهِ مِنْهُ أَكْبَرُ عِنْدَ ا ـ وَالْفِتْنَةُ أَكْبَرُ مِنْ الْقَتْلِ وَلَا يَزَالُونَ يُقَاتِلُونَكُمْ حَتَّى يَرُدُّوكُمْ عَنْ دِينِكُمْ إِنْ اسْتَطَاعُوا وَمَنْ يَرْتَدِدْ مِنْكُمْ عَنْ دِينِهِ فَيَمُتْ وَهُوَ كَافِرٌ فَأُوْلَئِكَ حَبِطَتْ أَعْمَالُهُمْ فِي الدُّنْيَا وَالْآخِرَةِ وَأُوْلَئِكَ أَصْحَابُ النَّارِ هُمْ فِيهَا خَالِدُونَ

*"(Ey Rəsulum!) Haram olan ayda döyüş haqqında səndən soruşanlara söylə: "O ayda döyüşmək böyük günahdır, lakin Allah yolunu (insanların üzünə) qapamaq, onu inkar etmək, Məscidü'l-Hərama (Kə'bəyə) girməyə mane olmaq və oradakıları qovub çıxarmaq Allah yanında daha böyük günahdır. (Din naminə) fitnə salmaq isə (həmin ayda) vuruşmaqdan daha betərdir"! (Ey möminlər!) Onlar (Məkkə müşrikləri) əgər bacarsalar, sizi dininizdən döndərincəyə qədər sizinlə vuruşmaqda davam edəcəklər. Sizdən hər kəs öz dinindən dönüb kafir olaraq ölərsə, belə kimsələrin bütün əməlləri (vaxtilə gördüyü yaxşı işləri) dünya və axirətdə heçə gedər. Onlar cəhənnəmlikdirlər və orada əbədi qalacaqlar!".*

Allah Rəsulu (s.ə.v) iki əsiri azad etdi və Məkkəyə xəbər göndərərək qənimət kimi alınmış ticarət mallarını sahiblərinə qaytardı. Öldürülən qüreyşli müşrikin ailəsinə isə qan diyəti ödənərək məsələ yatırılmışdı.

Hicri 2-ci il şaban ayında (fevral 624) Qur'ani-Kərimin Bəqərə surəsi 183-184-cü ayələri nazil olmuş və Ramazan ayında oruc tutmaq müsəlmanlara fərz qılınmışdı.

يَاأَيُّهَا الَّذِينَ آمَنُوا كُتِبَ عَلَيْكُمْ الصِّيَامُ كَمَا كُتِبَ عَلَى الَّذِينَ مِنْ قَبْلِكُمْ لَعَلَّكُمْ تَتَّقُونَ . أَيَّامًا مَعْدُودَاتٍ فَمَنْ كَانَ مِنْكُمْ مَرِيضًا أَوْ عَلَى سَفَرٍ فَعِدَّةٌ مِنْ أَيَّامٍ أُخَرَ وَعَلَى الَّذِينَ يُطِيقُونَهُ فِدْيَةٌ طَعَامُ مِسْكِينٍ فَمَنْ تَطَوَّعَ خَيْرًا فَهُوَ خَيْرٌ لَهُ وَأَنْ تَصُومُوا خَيْرٌ لَكُمْ إِنْ كُنتُمْ تَعْلَمُونَ

*"Ey iman gətirənlər! Oruc tutmaq sizdən əvvəlki ümmətlərə vacib edildiyi kimi, sizə də vacib edildi ki, (bunun vasitəsilə) siz pis əməllərdən çəkinəsiniz! (Oruc tutmaq) sayı müəyyən olan (bir ay) günlərdir. (Bu günlərdə) sizdən xəstə və ya səfərdə olanlar tutmadığı günlər qədər başqa günlərdə oruc tutmalıdırlar. Oruc tutmağa taqəti olmayanlar isə (hər günün əvəzində) bir yoxsulu doyuracaq qədər fidyə verməlidirlər. Hər kəs könüllü xeyir iş görərsə (həm oruc tutub, həm də fidyə verərsə), bu onun üçün daha yaxşı olar. Bilsəniz oruc tutmaq sizin üçün nə qədər xeyirlidir!"*

*Bədr Döyüşü*

Yuxarıda Allah Rəsulunun (s.ə.v) Mudlic qəbiləsinin liderləri ilə görüşərkən Qüreyşə məxsus böyük bir ticarət karvanının Şam diyarına getdiyini və Peyğəmbərin (s.ə.v) iki nəfərə bu karvanı izləyərək məlumat toplamağı tapşırdığını qeyd etmişdik. Allah Rəsulu (s.ə.v) Məkkə müşriklərinin təqribən 1000 dəvədən ibarət bu karvanı yola çıxarmaq üçün hazırlaşdıqları bilirdi. Peyğəmbər (s.ə.v) mütəşəkkil və diqiq işləyən bir istixbarat, kəşfiyyat şəbəkəsi təşkil etmişdi. Hicazın hər bir tərəfində baş verən hadisələrdən müntəzəm olaraq xəbər tutan Allah Rəsulu (s.ə.v) xüsusilə Məkkədə baş verən hər hadisədən dərhal xəbərdar edilirdi. Məkkə müşrikləri ard-arda edilən hədə-qorxu dolu xəbərdarlıqların Mədinəyə pənah aparmış Allah Rəsulu (s.ə.v) və möminlərin oradan qovulub çıxarılmaları üçün kifayət etmədiyini görürdülər. Üstəlik Allah Rəsulunun (s.ə.v) təşəbbüsü ilə Qüreyşə məxsus karvanlar üçün Mədinə və ətraf ərazilər artıq təhlükəsiz bir keçid yeri deyildi. Məkkənin müşrik zadəganları bütün Qüreyşin iştirak edəcəyi böyük bir hərbi kampaniya ilə Mədinədəki İslam təhlükəsini aradan qaldırmaq qərarına gəlmişdilər. Bu məqsədlə onlar Məkkədəki hər ailənin pul qoyduğu 500 min dirhəm sərmayəli, təqribən 1000 dəvədən ibarət böyük bir ticarət karvanını Şam diyarına doğru yola çıxarmışdılar. Bu karvandan əldə ediləcək gəlirlə Mədinəyə hücum edəcək ordu üçün hərbi təchizat və silah təmin ediləcəkdi. Allah Rəsulu (s.ə.v) bundan xəbərdar idi. Buna görə də karvanı təqib etdirmişdi. Karvanın geri qayıtdığı xəbərini alan kimi Allah Rəsulu (s.ə.v) Təlhə ibn Ubeydullah (r.ə), Ubeydə ibnü'l-Haris (r.ə) və Səid ibn Zeyddən (r.ə) ibarət kəşfiyyat dəstəsini yola çıxarmışdı. Kəşfiyyata çıxanlar Mədinənin şimalındakı Havra adlanan yerə çatanda karvanı gördükləri xəbərini göndərdilər. Allah Rəsulu (s.ə.v) dərhal ordusunu hazırlayıb Mədinədən yola çıxdı. Şam diyarından Məkkəyə qayıdan karvana Əbu Süfyan Səxr ibn Hərb ibn Uməyyə başçılıq edirdi. Karvanı 30-40 nəfərlik mühafizəçidən ibarət dəstə qoruyurdu. Əbu Süfyan müsəlmanların karvanı rahat buraxmayacağını bildiyi üçün biraz irəli kəşfiyyatçılar göndərmişdi. Karvan Mədinənin şimalında Təbük adlanan yerə çatanda kəşfiyyatçılar həyəcanlı xəbərlərlə qayıtdılar. Əbu Süfyan vəziyyətin təhlükəli olduğunu anlayandan sonra Damdam ibn Əmr əl-Ğifari adlı bir çaparı Təbükdən Məkkəyə göndərdi. Əbu Süfyan karvanın xilas olması üçün Məkkədən kömək istəmişdi. Özü isə karvanı yoldan ayırıb Qırmızı dəniz sahilinə üz tutmuş və sahil yolu ilə cənuba irəliləmişdi.

Bu hadisələr baş verərkən Peyğəmbərin (s.ə.v) Məkkədə yaşayan bibisi Atiqə bint Əbdülmuttəlib (r.ə) bir gecə gördüyü röyanı qardaşı Abbasa danışmışdı: "*Yuxumda gördüm ki, dəvəsinə minmiş bir şəxs Məkkəyə gələrək "Ey*

*vəfasız camaat! Üç gün sonra vurularaq öldürüləciyiniz yerlərə tələsin"* deyə *bağırır və Məkkənin bütün məhəllələrini gəzir. Sonra o, Əbu Qubeys dağına çıxdı, burada da eyni sözləri çığırmağa başladı. Daha sonra dağdan Məkkəyə doğru bir qaya parçası yuvarlatdı. O qaya parçası dağdan aşağı diyirlənərək şəhərə çatanda parçalandı və Məkkədə qaya parçasının dəymədiyi ev qalmadı*". Abbas ibn Əbdülmuttəlib bacısının bu röyasını birinə danışmış və bu xəbər bütün Məkkəyə yayılmışdı. Bu məsələ Əbu Cəhlin qulağına da çatmışdı və o, Abbası görəndə ona "*Bəni-Haşimin bu qadın peyğəmbəri nə vaxt törədi? Deyəsən sizin nəslinizə kişi peyğəmbər azlıq etdi, indi də qadınlarınız qeybdən xəbər verməyə başlayıblar. Madam belədir biz üç gün gözləyərik, heç bir şey olmasa özünüzdən küsün*" dedi.

Əbu Cəhl arıq, orta boylu bir adam idi. Daim qaşqabaqlı və iki qaşının arası düyünlü olardı. Tez-tez üzünü turşudan, təkəbbürlü, acı dilli idi və insanlar onun acı, tikanlı sözlərini eşitməmək üçün onunla az ünsiyyətdə olmağa çalışardılar. Abbas da əslində onunla üz-üzə gəlib bu məsələni müzakirə etmək istəməmişdi. Üç gün sonra Abbas Kə'bənin həyətinə daxil olanda uzaqdan Əbu Cəhli görmüş və Haşim ailəsinin qadınları haqqında dediyi sözlərə görə cavabını vermək üçün üstünə getmişdi. Lakin Əbu Cəhl birdən qalxaraq oradan uzaqlaşmışdı. Abbas onun qəsdən qalxıb getdiyini düşünmüşdü. Məgər ki, Əbu Cəhl Abbasın eşitmədiyi carçı səsini eşidib həmin səsə tərəf gedirmiş. Əbu Süfyanın çaparı Damdam əl-Ğifari Məkkəyə çatmışdı. O, dəvəsinin burnunu kəsmiş, palanını tərs çevirmiş, yaxasını cıraraq var gücü ilə belə bağırırdı: "*mədəd, mədəd ey Qüreyş! Muhəmməd (s.ə.v) dostları ilə karvanınızın qabağını kəsdi. Varınız-yoxunuz əlinizdən getdi. Əbu Süfyanın imdadını çatacağınızı zənn etmirəm*".

Məkkə zadəganları dərhal müharibə hazırlıqlarına başladılar. Qısa müddətdə onlar 950 nəfərlik təpədən dırnağa qədər silahlanmış ordu hazırladılar. Ordudakıların demək olar ki, hamısı süvari idi. 100-ü ata, 700-ü isə dəvəyə minmişdi. Atlılar zirehli idilər. Müşrik ordusu iki gün ərzində hazırlığı tamamlayıb Mədinəyə doğru yola çıxdı. Yolda ikən Əbu Süfyanın göndərdiyi ikinci çaparla rastlaşdılar. Əbu Süfyan başqa yolla apararaq karvanı xilas etdiyini və silahlı yardıma artıq ehtiyacı olmadığını bildirirdi. Bəziləri geri, Məkkəyə qayıtmağı təklif etdilər. Lakin Əbu Cəhl bu hərbi səfəri müsəlmanlara dərs vermədən başa vurmaq istəmirdi. Buna görə də o, hərbi səfəri davam etdirməkdə təkid etmişdi. Əhnəs ibn Şərik Əbu Cəhlə qulaq asmayaraq başçılıq etdiyi Zuhrə oymağına mənsub əsgərlərlə geri qayıtmışdı.

Bu vaxt Allah Rəsulu (s.ə.v) Məkkədən Əbu Süfyanın imdadına yetişmək üçün ordunun yola çıxdığı xəbərini aldı. Allah Rəsulu (s.ə.v) Mədinədən

yola çıxarkən öz ordusuna hədəfin Qüreyşə məxsus ticarət karvanı olduğunu söyləmişdi. İndi isə vəziyyət başqa idi. Ya karvanı təqib etməyə davam edəcəkdilər, ya da Qüreyş müşriklərinin ordusu ilə qarşılaşmaq üçün yürüşü davam etdirəcəkdilər. Allah Rəsulu (s.ə.v) yaranmış vəziyyəti müzakirə etmək üçün əshabı ilə məşvərət etdi. O, Allahın təcavüzkara qarşı vuruşmaları üçün möminlərə izn verdiyini söylədi, aşağıdakı qital ayələrini xatırlatdı.

**وَقَاتِلُوا فِي سَبِيلِ ا ـِ الذِينَ يُقَاتِلُونَكُمْ وَلَا تَعْتَدُوا إِنَ ا َ لَا يُحِب الْمُعْتَدِينَ**

*“(Ey möminlər!) Sizinlə vuruşanlarla siz də Allah yolunda vuruşun, lakin həddən kənara çıxmayın. Allah həddi aşanları sevməz!”* (Bəqərə surəsi 190).

**أُذِنَ لِلذِينَ يُقَاتَلُونَ بِأَنهُمْ ظُلِمُوا وَإِن ا َ عَلَى نَصْرِهِمْ لَقَدِيرٌ . الذِينَ أُخْرِجُوا مِنْ دِيَارِهِمْ بِغَيْرِ حَق إِلا أَنْ يَقُولُوا رَبنَا ا ُ**

*“Zülmə məruz qaldıqlarına görə vuruşanlara (kafirlərə qarşı Allah yolunda döyüşməyə) izin verilmişdir. Allah onlara kömək etməyə, əlbəttə, qadirdir! O kəslər ki, haqsız yerə, ancaq “Rəbbimiz Allahdır”-dediklərinə görə yurdlarından (Məkkədən) çıxarıldılar.* (Həcc surəsi 39-40-cı ayələr).

Daha sonra Allah Rəsulu (s.ə.v) orduya xitabən “*Sizin üçün hansı daha məqsədə müvafiqdir? Karvanı təqib etmək yoxsa Qüreyşin ordusunun qarşısına çıxmaq?*” dedi. Oradakılardan bəzilərinin karvanı təqib etməkdə israrlı olmaları Allah Rəsulunu (s.ə.v) qeyzləndirdi. O, eyni sualı bir daha təkrarladı. Bu dəfə də eyni səslərin çıxmaması üçün Əbu Bəkrlə (r.ə) Ömər ibn Xəttab (r.ə) Qüreyşin ordusu ilə qarşılaşmaq arzusunda olduqlarını bildirdilər. Miqdad ibn Əmr əl-Bəhri (r.ə) ayağa qalxdı və dedi: “*Ey Allahın Elçisi (s.ə.v)! Sən Allahın sənə əmr etdiyi istiqamətdə get. Biz sənə tabeyik. Bəni-İsrailin Musaya (ə.s) dediyi kimi “sən get Rəbbinlə birlikdə vuruş” demərik sənə. Biz sənin yanında və sənin əmr etdiyin yerdə vuruşacağıq*”. Lakin Allah Rəsulu (s.ə.v) Mədinəli müsəlmanların, ənsarın fikrini də öyrənmək istəyirdi. Çünki Əqəbə beyətlərində onlar Peyğəmbəri (s.ə.v) Mədinədə qorumağa söz vermişdilər. Mədinə xaricindəki hər hansı bir yerdə onunla birlikdə döyüşə girişmək barədə söz verməmişdilər. Bunu hiss edən ənsarın liderlərindən Sə’d ibn Muaz (r.ə) ayağa qalxıb belə demişdi: “*Ey Allahın Elçisi (s.ə.v)! Biz sənə inanmışıq. Allahın səninlə göndərdiyinin haqq olduğuna etiqad və etimad etmişik. Sənə itaət edirik. Sən necə istəyirsənsə elə et. Allaha and olsun ki, əgər sən dənizi göstərib onun dərinliklərinə baş vursan, biz də səninlə birlikdə baş vurarıq. Heç birimiz səndən geri qalmarıq. Düşmənlə qarşılaşmaqdan da çəkinmərik. Döyüş vaxtı*

*düşmənə kürəyimizi çevirmərik. Səbr və səbat edib sənə olan sədaqətimizdən ayrılmarıq. Dərhal sənin göstərdiyin tərəfə irəliləyək*". Mühacir və ənsarın yekdil olaraq müşrik ordusu ilə döyüşmək üçün hazır olduqlarını görəndən sonra Allah Rəsulu (s.ə.v) onlara dedi: "*Elə isə haydı, Allahın yardımı ilə yola çıxın. Allah sizə ikisindən birini (zəfər və ya şəhadət) şübhəsiz və'd etmişdir. Vallahi, mən Qüreyşin igidlərinin vurulub öləcəkləri yerləri görürəm*".

Beləcə Allah Rəsulu (s.ə.v) möminlərdən ibarət ordusu ilə Mədinədən 130 km cənub-qərbdə yerləşən Bədr adlanan yerə gəldi. Bədr şimal-cənub karvan yolu üzərində dayanacaq yeri idi. Burada su quyuları var idi. Bəzən də burada qısamüddətli yarmarkalar qurulurdu. Bədrə çatmamışdan əvvəl Allah Rəsulu (s.ə.v) ordusunu təftiş etdi. O, hər şeydən əvvəl yeniyetmələri ordudan ayırıb geri, Mədinəyə göndərdi. Sə'd ibn Əbu Vəqqas (r.ə) qardaşı Umeyri (r.ə) gözdən yayınmağa çalışarkən görmüş və "*sənə nə olub qardaşım?*" deyə soruşmuşdu. Çox gənc olan Umeyrin (r.ə) boyu da balaca idi. Belinə bağladığı qılıncının ucu yerə sürtünürdü. Umeyr (r.ə) böyük qardaşına "*Allah Rəsulunun (s.ə.v) məni geri Mədinəyə göndərməsindən qorxuram. Halbuki mən vuruşmaq və şəhid olmaq istəyirəm*" deyə cavab vermişdi. Gizlənməyə çalışsa da Peyğəmbərin (s.ə.v) gözündən yayına bilməmişdi Umeyr ibn Əbu Vəqqas (r.ə). Peyğəmbər ona (s.ə.v) "*sən də geri qayıt*" deyəndə o, ağlayaraq qalmaq üçün təkidlə icazə istədi və istəyinə nail oldu. Umeyr ibn Əbu Vəqqas Bədrdə şəhid olduğu vaxt 16 yaşlı yeniyetmə idi. Allah ondan razı olsun.

Allah Rəsulunun (s.ə.v) ordusu 305 nəfərdən ibarət idi. Bunlardan 64-ü mühacir, geri qalanı isə ənsardan idi. Orduda 3 at, 70 dəvə var idi. Mücahidlər yürüş vaxtı dəvələrə növbələşərək minirdilər. Allah Rəsulu (s.ə.v) Əli ibn Əbu Talib (r.ə) və Zeyd ibn Harisə (r.ə) ilə növbələşərək dəvəyə minirdi. Bu iki gəncin piyada gedərək onun dəvəyə minməsində israr etmələrinə isə Peyğəmbər (s.ə.v) "*Allah yolunda piyada getmək üçün mən sizdən daha aciz deyiləm*" deyə cavab vermişdi. Allah Rəsulu (s.ə.v) Mədinədən çıxarkən vəkalətən Əbu Lübabəni (r.ə) öz yerinə şəhərdə qoymuşdu.

İslam ordusu üç günlük yürüşdən sonra Bədr quyularına çatmışdı. Peyğəmbər (s.ə.v) dəvəsindən enib qərargah üçün yer göstərdi və ordunun düşərgə qurmasını əmr etdi. Cahiliyyə dövründən döyüş və hərbi işdə təcrübəsi çox olan Əbu Ömər Hubab ibn Munzir əl-Xəzrəci (r.ə) Peyğəmbərə (s.ə.v) "*burada düşərgə qurmanı Allah əmr etdi yoxsa öz rəyin və məsləhətin olaraqmı qərar verdin?*". Peyğəmbərin (s.ə.v) burada düşərgə qurulmasının öz rəyi olduğunu söyləməsindən sonra Hubab (r.ə) "*Ey Allahın Elçisi (s.ə.v) bura düşərgə və qərargah qurmaq üçün münasib yer deyil. Biz düşmənə ən yaxın olan su qu-*

*yusunun ətrafında düşərgə quraq. Orada hovuz düzəldək. Geri qalan bütün su quyularını dolduraq. Beləcə yeganə su mənbəyi bizim nəzarətimizdə olacaq. Biz sudan istədiyimiz kimi faydalanacağıq. Düşmən isə susuz qalacaq*". Allah Rəsulu (s.ə.v) Hubab ibn Munzirin (r.ə) təklifini bəyəndi və onun hərbi taktikası istiqamətində hərəkət edildi. Ümumiyyətlə Allah Rəsulu (s.ə.v) dünyəvi işlərdə hər zaman yaxın ətrafı, dostları və əshabı ilə məşvərət edər, hər bir işi o işin ərbabına, əhlinə tapşırardı.

Sə'd ibn Muaz (r.ə) Allah Rəsulu (s.ə.v) üçün kölgəlik bir yer düzəltdilmiş və o, ordunu buradan idarə etmişdi. Peyğəmbər (s.ə.v) dərhal düşmən ordusunun sayı və təchizatı ilə bağlı məlumatlar toplamağa başlamışdı. Qüreyş ordusunda hər gün 9-10 dəvənin kəsildiyini öyrənəndən sonra düşmən ordusunun 900 ilə 1000 nəfər arasında olduğunu təxmin etmişdi. Ələ keçirilən 2 əsirdən orduda Qüreyş zadəganlarından kimlərin iştirak etdiyini öyrənəndən sonra Peyğəmbər (s.ə.v) "*Məkkə ciyərparalarını qarşımıza çıxardı"* demişdi. Dualarında: "*Allahım! Əgər bu bir ovuc mömin məğlub olsa, artıq yer üzündə sənə ibadət edəcək heç kim qalmayacaqdır*" deyən Allah Rəsulu (s.ə.v) Allahdan möminlər üçün zəfər diləyirdi. Allah Rəsulu (s.ə.v) döyüşdən bir gün əvvəl Ömər ibn Xəttabı (r.ə) düşmən ordugahına sülh təklifi ilə göndərmişdi. Hakim ibn Hizamın "*bu insaflı bir təklifdir, gəlin onu qəbul edək*" sözünə Əbu Cəhl "*Allah bizə onlardan qisas almaq fürsətini vermiş ikən, intiqamımızı almadığımız müddətcə geri qayıtmayacağıq. Onlara elə bir dərs verəcəyik ki, bundan sonra qarşımıza nə bir əli silahlı çıxara biləcəklər, nə də karvanlarımıza mane ola biləcəklər*" deyə cavab vermişdi. Daha sonra Əbu Cəhl dua etmiş və belə demişdi: "*Ey Allahım! Bu iki ordudan hansı səninçün daha əziz və daha qiymətlidirsə ona zəfər nəsib et*". Sonra isə Əbu Cəhl Nəxlədə Abdullah ibn Cəhşin (r.ə) mücahidlərindən biri tərəfindən öldürülmüş Əmr ibn Hədrəminin qardaşı Amir ibn Hədrəmiyə səsləndi. Amir ibn Hədrəmi qardaşının qisasının alınması üçün ağı deyib çığırmağa başladı. Onun sözləri Qüreyş müşriklərini döyüşə təşviq etmişdi.

Allah Rəsulu (s.ə.v) İslam ordusunu üç əsas qrupa ayırmış və hər birinə bayraqdar təyin etmişdi. Mühacirlərin bayrağını Mus'ab ibn Umeyr (r.ə), əvslilərin bayrağını Sə'd ibn Muaz (r.ə), xəzrəclilərin bayrağını isə Hubab ibn Munzir (r.ə) daşıyırdı. Peyğəmbər (s.ə.v) İslam ordusuna döyüş nizamı verərkən mücahidləri arxaları şərqə üzləri qərbə tərəf düzmüşdü. Beləcə səhərin ilk işığında günəş şüaları düşmənin gözünə düşəcəkdi. Sonra isə onları təlimatlandırmışdı: "*Döyüş nizamını pozmayın, səflərinizi sıx və düzgün tutun. Mənim əmrim olmadan hərəkət etməyin. Düşmən çox uzaqda ikən ox atıb israf*

*etməyin. Yaxınlaşanda onları oxa və daşa tutun. Daha sonra nizələrinizlə hücum edin. Üzbəüz qalanda isə qılınclarınızı işə salın*".

Bədr döyüşünün baş verdiyi hicri 2-ci il ramazan ayının 17-si (13 mart 624) günü Qüreyş müşriklərindən ilk meydana çıxan Amir ibn Hədrəmi olmuşdu. O, döyüşmək üçün üstünə gələn Mihcəyə (r.ə) ox atmış və ox Mihcənin (r.ə) boğazına girmişdi. Mihcə (r.ə) bu ox yarasından şəhid olmuşdu. Ömər ibn Xəttabın (r.ə) azad etdiyi kölələrindən olan Mihcə (r.ə) Bədrin ilk şəhidi idi.

Daha sonra ərəblərin qədim adətinə müvafiq olaraq təkbətək cəngavər döyüşləri başladı. Utbə ibn Rəbiə, oğlu Vəlid və qardaşı Şeybə ilə birlikdə meydana çıxaraq İslam ordusundan cəngavər istədilər. Ənsardan Müəvvəz (r.ə) və Muaz (r.ə) adlı iki qardaş və Abdullah ibn Rəvahə (r.ə) onlarla döyüşmək üçün meydana çıxdılar. Lakin Utbənin onlara "*bizim sizinlə işimiz yoxdur, qoy bizimkilərdən* (yəni qüreyşli müsəlmanlardan) *çıxsınlar*" deməsindən sonra Allah Rəsulu (s.ə.v) mənsub olduğu Haşim ailəsindən əmisi və əmisi oğullarına səsləndi. Ubeydə ibn Haris (r.ə), Həmzə ibn Əbdulmuttəlib (r.ə) və Əli ibn Əbu Talib (r.ə) Qüreyşin müşrik cəngavərlərinin qarşısına çıxdılar. Qısa müddətdə Əli (r.ə) və Həmzə (r.ə) düşmənlərinin cəsədini yerə sərdilər. Utbə isə Ubeydəni (r.ə) ağır yaraladı[26]. Lakin Həmzə (r.ə) köməyə yetişib Utbəni qılıncla vuraraq öldürdü. Təkbətək döyüşlərdən sonra ümumi döyüş qızışmışdı. Bir neçə saat davam edən Bədr döyüşü İslam ordusunun parlaq qələbəsi ilə başa çatmışdı. Qüreyş müşrikləri döyüş meydanında 70 ölü və bir o qədər əsir qoyaraq qaçmağa məcbur olmuşdular.

İslam ordusundan 14 mücahid şəhid olmuşdu. Bədr şəhidlərinin adları belədir: Uqeyl ibnü'l-Bukeyr, Əvf ibn Haris, Harisə ibn Süraqə, Mihcə ibn Saleh, Mübəşşir ibn Əbdimunzir, Müəvviz ibn Haris, Rəfi' ibnü'l-Müəlla, Sə'd ibn Heysəmə, Səfvan ibn Vəhb, Ubeydə ibn Haris, Umeyr ibn Əbu Vəqqas, Umeyr ibnü'l-Hümam, Yəzid ibn Haris, Züşimaleyn ibn Əbdiəmr. Allah onlardan razı olsun. Allah Rəsulu (s.ə.v) şəhidləri Bədrdə dəfn etdirmişdi.

Hicrətdən əvvəl Məkkədə İslama olan düşmənlikləri ilə seçilən bəzi Qüreyş zadəganları da Bədrdə öldürülmüşdülər. Əbu Cəhl ibn Hişam, Əbü'l-Buxtəri ibn As, Uməyyə ibn Xələf, Utbə ibn Rəbiə, Şeybə ibn Rəbiə, Zəma' ibn Əsvəd, Nubeyh ibn Həccac bunlardandır.

Əbü'l-Buxtəri ilə əmisi Abbasın öldürülməmələri üçün Allah Rəsulu (s.ə.v) döyüşdən əvvəl mücahidlərə təlimat vermişdi. Çünki bu iki şəxs və eləcə də digər bəziləri Qüreyşin tənəsinə tuş gəlməmək üçün Bədrə məcburən, könülsüz gəlmişdilər. Bundan başqa istər Abbas ibn Əbdülmuttəlib, istərsə də Əbü'l-Buxtəri

[26]Peyğəmbərin (s.ə.v) əmisi Haris ibn Əbdulmuttəlibin oğlu olan Ubeydə (r.ə) Bədr döyüşündə aldığı bu yara səbəbiylə çox qan itirərək şəhid olmuşdu.

Məkkədə ikən Allah Rəsulu (s.ə.v) və möminlərə zülm etməkdən çəkinmiş, bəzi hallarda isə hətta yardım da etmişdilər. Mücahidlərdən Mücəzzər ibn Ziyad (r.ə) Qüreyş ordusu məğlub olub qaçarkən Əbü'l-Buxtəri ilə Cünadə ibn Müleyhanın qarşısını kəsərək ikincisini öldürmək, birincisini isə əsir götürmək istəmişdi. O, Əbü'l-Buxtəriyə Allah Rəsulunun (s.ə.v) ona toxunulmaması barədə təlimat verdiyini bildirmişdi. Lakin Əbü'l-Buxtəri yanındakı dostu Cünadənin öldürülüb özünün əsir götürülməsi ilə razılaşmamışdı. Əbü'l-Buxtəri "*mən "dostunu ölümə tərk etdi" deyə özümü Məkkə qadınlarının dilinə sala bilmərəm*" deyib dostu ilə birlikdə Mücəzzər ibn Zeydlə (r.ə) döyüşə girişmiş və Mücəzzər (r.ə) hər ikisini öldürənə qədər onlarla vuruşmuşdu. Mücəzzər ibn Zeyd (r.ə) döyüşdən sonra hadisəni olduğu kimi Allah Rəsuluna (s.ə.v) danışmışdı.

Başçısı olduğu oymağın müşrik gəncləri Bədrdə Əbu Cəhlin ətrafında sıx halqa qurub qorusalar da ənsardan Muaz ibn Əfra (r.ə) və Muaz ibn Əmr (r.ə) adlı iki gənc mücahid onu ağır şəkildə yaralaya bilmişdilər. Qureyş ordusu vahimə içində qaçarkən isə Abdullah ibn Məs'ud (r.ə) döyüş meydanında Əbu Cəhlə rast gəlmişdi. Yaralı Əbu Cəhl yıxılıb qalmışdı. Abdullah ibn Məs'ud (r.ə) ayağı ilə onun boynunu tapdalayıb "*ey Allahın düşməni, Allah səni necə rəzil və rüsvay etdi gördünmü?*" dedi. Daha sonra isə Əbu Cəhlin qiymətli daşlarla bəzədilmiş kəskin qılıncını əlindən alıb həmin qılıncla başını bədənindən ayıraraq onu öldürmüşdü. Allah Rəsulu (s.ə.v) Əbu Cəhlin öldürüldüyü xəbərini eşidəndə "*Allahu Əkbər*" deyib təkbir gətirmişdi.

Qureyş müşriklərinin liderlərindən olan Ubeydə ibn Səid ibn əl-As başdan ayağa zirehə bürünərək vuruşsa da Zübeyr ibn Əvvamın (r.ə) nizəsindən canını qurtara bilməmişdi. Zübeyr (r.ə) atdığı nizəni onun gözünə saplayaraq öldürmüşdü.

Qüreyş ordusu qaçmağa üz tutanda Üməyyə ibn Xələf döyüş meydanında Əbdürrəhman ibn Əvfə (r.ə) rast gələrək oğlu ilə birlkidə dərhal ona təslim olmuşdu. Əbdürrəhman ibn Əvf (r.ə) İslamdan əvvəl onunla ticarət ortağı olmuşdu. Ona əsir düşməklə Üməyyə canını labüd ölümdən qurtamaq istəmişdi. Lakin qəflətən Bilal ibn Rəbah Həbəşiyə (r.ə) rast gəldilər. Bilal Həbəşi (r.ə) Məkkədə ikən Üməyyənin köləsi olmuşdu. Üməyyə İslamı qəbul etdiyi üçün bu qaradərili köləsinə ağla gəlməyən üsullarla işgəncələr vermişdi. Buna görə də Əbdürrəhman ibn Əvfin (r.ə) səyləri Üməyyəni Bilalın (r.ə) əlindən xilas edə bilmədi. Bilal Həbəşi (r.ə) Üməyyə ibn Xələfi görən kimi "*küfrün başı Üməyyə, vallahi, sən canını qurtarsan mən özümə ölüm diləyəcəm*" deyərək ona hücum etmiş, yanında ənsardan olan bir neçə mücahid də ona qoşulmuşdu. Onlar Üməyyə ilə oğlunu dövrəyə alıb qılıncları ilə doğrayıb öldürmüşdülər.

Məkkənin müşrik zadəganlarından bir çoxu da əsir olaraq müsəlmanların əlinə keçmişdilər. Əsirlərin arasında Peyğəmbərin (s.ə.v) əmisi Abbas, Əli ibn Əbu Talibin (r.ə) qardaşı və Peyğəmbərin (s.ə.v) əmisi oğlu Uqeyl ibn Əbu Talib, Peyğəmbərin (s.ə.v) kürəkəni, qızı Zeynəbin (r.ə) əri Əbül-As ibn Rəbiə də vardı. Allah Rəsulu (s.ə.v) 70 nəfər olan müşrik əsirləri təftiş etdi, sonra isə mücahidlərə onların arasından Uqbə ibn Əbi Muayt ilə Nəzir ibn Harisi ayrmalarını əmr etdi. Bunların hər ikisi qatı İslam düşməni idilər. Uqbə ibn Əbi Muayt Allah Rəsulu (s.ə.v) ilə möminlərə zülm və işkəncə verməkdən xüsusi zövq alır, Nəzir ibn Haris isə əyləncə məclisləri təşkil edərək İslamı, Allah Rəsulunu (s.ə.v) və möminləri ələ salaraq istehza edirdi. Nəzir ibn Harisi Əli ibn Əbu Talib (r.ə), Uqbə ibn Əbi Muaytı isə Asim ibn Sabit (r.ə) boyunlarını vuraraq edam etmişdilər. Allah Rəsulu (s.ə.v) mücahidlərə digər əsirlərlə xoş rəftar etməyi, özlərinin yedikləri və içdiklərindən onlara da vermələrini əmr etmişdi. Hətta mücahidlər Mədinəyə qayıdarkən əsirlərlə növbələşərək miniklərinə minmişdilər. Əsirlərdən Süheyl ibn Əmr bundan istisna idi. Süheyl, Malik ibn Duhşumun əsiri idi. O, yolda Malik ibn Duhşumu ayaqyoluna çıxmaq bəhanəsilə aldadaraq qaçmağa təşəbbüs etmiş, lakin uzağa qaça bilmədən yaxalanmışdı. Malik də cəza olaraq onun əllərini boyunun ardına bağlayaraq Mədinəyə qədər piyada getməyə məcbur etmişdi.

Döyüşdən əvvəl Allah Rəsulu (s.ə.v) əshabından bir qrupla Bədri gəzərkən Qüreyşin müşrik liderlərinin öldürəcəkləri yerləri bir-bir göstərmişdi. Döyüşdən sonra əshabı onun bir peyğəmbər olaraq verdiyi bu xəbərin eynilə gerçəkləşdiyinin şahidi olmuşdular. Həqiqətən də Peyğəmbərin (s.ə.v) göstərdiyi yerlərdə onun bildirdiyi müşriklərin cəsədləri aşkar edilmişdi. Buna görədir ki, Allah Rəsulu (s.ə.v) döyüşdən sonra bu cəsədlərə səslənərək Allahın öz Elçisinə (s.ə.v) verdiyi və'din həqiqət olduğunu, ölüb uxrəvi aləmi görəndən sonra onunla düşmənlik edən müşriklərin də artıq buna şahid olduğunu söyləmişdi. Bədrdə öldürülən müşriklərin cəsədləri burada qazılan quyulara atılaraq üstləri torpaqla örtülmüşdü. Bunlardan 24-ünün cəsədi isə Bədrdə qurumuş bir su quyusuna atılmışdı. Döyüşdən sonra Allah Rəsulu (s.ə.v) əshabından bir neçəsi ilə birlikdə döyüş meydanını gəzərkən həmin quyunun başına gəlmiş və oradakılara belə səslənmişdi: "*ey Utbə ibn Rəbiə, ey Şeybə ibn Rəbiə, ey Əbu Cəhl, ey Uməyyə ibn Xələf....Allah Rəsulunun (s.ə.v) sizə verdiyi sözün haqq olduğunu gördünüzmü? Çünki mən Allahın mənə verdiyi sözün haqq olduğunu gördüm*". Ömər ibn Xəttabın (r.ə): "*ey Allahın Rəsulu (s.ə.v), ruhsuz cəsədlərləmi danışırsan?*" sualına o, belə cavab vermişdi: "*Söylədiklərimi onlar sizindən pis eşitmirlər. Amma onlar sizdən fərqli olaraq mənə heç bir şəkildə cavab verə bilməzlər*".

Qüreyş müşrikləri qaçarkən döyüş meydanında xeyli qənimət qoyub getmişdilər. Bu qənimət malları toplanmış və Peyğəmbərin (s.ə.v) əmri ilə Abdullah ibn Kə’bin (r.ə) nəzarətinə verilmişdi. Mədinəyə qayıdarkən Səyər adlanan yerdə düşərgə quruldu. Burada qənimət malları 5 hissəyə bölündü. Beşdə biri beytülmala, yəni dövlət xəzinəsinə keçirildi. Geri qalan beşdə dörd hissə isə mücahidlər arasından bərabər şəkildə bölündü. Şəhidlərə düşən hissə isə varislərinə verilmişdi.

Mədinəyə gələndən sonra Allah Rəsulu (s.ə.v) əsrilər haqqında Əbu Bəkr (r.ə) və Ömərdən (r.ə) “*bu əsrlər haqqında fikriniz nədir?*” deyə soruşmuşdu. Əbu Bəkr (r.ə) “*ey Allahın Elçisi (s.ə.v)! Bunlar bizim əmi oğlularımız və qohumlarımızdır. Onları öldürməyib qurtuluş fidyəsi almağımızı münasib görürəm. Beləcə kafirlərə qarşı güclənmiş olarıq. Bəlkə Allah gələcəkdə onlara da müsəlman olmağı nəsib edər*” deyə cavab vermişdi. Peyğəmbər (s.ə.v) “*sənin fikrin nədir ey Xəttabın oğlu?*” deyə soruşanda Ömər ibn Xəttab (r.ə): “*xeyr! Vallahi, ya Rəsulallah (s.ə.v) mən bu mövzuda Əbu Bəkrlə (r.ə) həmfikir deyiləm. İcazə ver onların boyunu vuraq. Uqeyli qardaşı Əliyə (r.ə) ver boynunu vursun, mənim qohumumu da mənə ver boynunu vurum. Çünki bunlar kafirlərin liderləri və qabaqcıllarıdır*” deyə cavab vermişdi. Ənsarın liderlərindən Sə’d ibn Muaz (r.ə) da bu qədər çox əsir alınmasının əleyhinə idi. Ümumiyyətlə bu mövzuda əshabın yarısı Əbu Bəkrin (r.ə), yarısı isə Ömərin (r.ə) fikrini mənimsəməkdə idi. Peyğəmbər (s.ə.v) Əbu Bəkrin (r.ə) fikrini bəyənmiş və əsirlərdən istəyənlər 4000 dirhəm qurtuluş fidyəsi ödəyərək xilas olmuşdular. Bir neçə gün sonra Ömər (r.ə) Peyğəmbərin (s.ə.v) Əbu Bəkrlə (r.ə) birlikdə oturub ağladığını görüb demişdi: “*ey Allahın Rəsulu (s.ə.v) mənə de, sən və dostun niyə ağlayırsınız? Əgər ağlamağa dəyər bir şey varsa mən də sizinlə birgə ağlayaram*”. Allah Rəsulu (s.ə.v): “*dostumuzun əsirlərdən fidyə alanması haqqında mənə bildirdiyi bu fikirdən ötürü ağlayıram. Çünki əzabın bu ağacdan daha yaxın gəldiyi mənə göstərildi*”. Allah öz elçisinə Ənfal surəsinin 67 və 68-ci ayələrini nazil etmişdi

**مَا كَانَ لِنَبِيٍّ أَنْ يَكُونَ لَهُ أَسْرَى حَتَّى يُثْخِنَ فِي الْأَرْضِ تُرِيدُونَ عَرَضَ الدُّنْيَا وَا ُ يُرِيدُ الْآخِرَةَ وَا ُ عَزِيزٌ حَكِيمٌ . لَوْلَا**
**كِتَابٌ مِنْ ا ِ سَبَقَ لَمَسَّكُمْ فِيمَا أَخَذْتُمْ عَذَابٌ عَظِيمٌ**

*“Heç bir peyğəmbərə yer üzündə qırmayınca əsir götürmək yaraşmaz. Siz dünya mənfəətlərini istəyirsiniz, Allah isə axirəti (qazanmağınızı) istəyir. Allah yenilməz qüvvət sahibi, hikmət sahibidir! Əgər Allah tərəfindən əzəldən yazılan bir hökm olmasaydı aldığınız (fidyə) müqabilində sizə böyük bir əzab toxunardı”.*

Bu mövzuda Ömər ibn Xəttabın (r.ə) fikrinə şərik olan səhabələr Bədr döyüşündə məkkəli müşriklər üzərində əldə edilmiş zəfərin sona qədər davam et-

dirilməsi, müşriklərin silahlı gücünün, canlı qüvvəsinin mümkün qədər çox məhv edilməsi və hətta mümkün olarsa zəfərin Məkkənin fəthi ilə tamamlanaraq Beytullahın müşrik istilasından xilas edilməsini arzu edirdilər. Allah Rəsulu (s.ə.v) hərbi əsirlərin savadlı olanlarından qurtuluş fidyəsi almayaraq onların hər birinin 10 mədinəli müsəlman uşağa yazıb oxumaq öyrədəndən sonra evlərinə qayıda biləcəkləri şərtini qoymuşdu. Məkkədə zəngin ailələrin sayı çox idi. Buna görə də məkkəli gənclərin əksəriyyəti savadlı idilər. Allah Rəsulu (s.ə.v) müsəlmanların uşaqlarının da savadlanması üçün belə mütərəqqi bir addım atmışdı.

Həmin dövrə qədər ərəblər arasındakı döyüşlər qəbilə və soy təəssübü səbəbiylə baş verirdi. Bədrdə isə iki ordu inancları, əqidələri, idealları uğrunda qarşı-qarşıya gəlmişdilər. Üstəlik döyüş meydanında bir-biri ilə vuruşanlar atalar, oğullar, əmilər, qardaşlar idilər. Zəfər xəbərinin Mədinəyə çatmasından qısa müddət sonra xəstə yatağında yatan Allah Rəsulunun (s.ə.v) qızı, Osman ibn Əffanın (r.ə) xanımı Ruqəyyə (r.ə) vəfat etmişdi.

Bədr döyüşünün müsəlmanların tam və parlaq qələbəsi ilə başa çatması Mədinədəki münafiqləri və yəhudiləri son dərəcə kədərləndirmişdi. Hətta münafiqlər ordu şəhərə qayıdarkən Allah Rəsulunun (s.ə.v) dəvəsinin belində Zeyd ibn Harisəni gördükləri üçün "Muhəmməd öldürüldü" şayiəsini də yaymaqdan çəkinməmişdilər. Ordularının məğlub olaraq rəzil və pərişan bir vəziyyətdə qaçdığı xəbəri Məkkəyə gəlib çatanda Qüreyş müşrikləri də eşitdiklərinə inana bilməmişdilər. Əbu Cəhlin yerinə Əbu Süfyan Qüreyş qəbiləsinin liderliyini ələ almışdı. O, Bədrdə tökülən qanların qisası alınmadıqca yuyunmayacağına, arvadı Hind isə ətir vurmayacağına dair and içmişdi. Əbu Süfyanın Şam diyarından gətirdiyi karvandan əldə edilən gəlir yeni bir ordunun qurulması üçün deyil Mədinədəki əsirlərin xilası üçün qurtuluş fidyəsi olaraq xərclənmişdi. Əbu Süfyan andını yerinə yetirmək üçün kiçik bir süvari dəstəsi ilə Mədinə yaxınlığındakı Ureydə qədər soxularaq buradakı iki müsəlman çobanı öldürmüş, evlərini yandırmışdı.

Peyğəmbərlə (s.ə.v) təqribən yaşıd olan əmisi Abbas ibn Əbdulmüttəlib (r.ə) xanımı Umm Fəzl (r.ə) və digər ailə fərdləri ilə birlikdə Bədr döyüşündən bir müddət əvvəl İslamı qəbul etmişdi. Hətta İslamı qəbul etmiş Əbu Rafi' (r.ə) adlı köləsini də köləlikdən azad etmişdi. Oğlu Abbas (r.ə) isə bu vaxt üç-dörd yaşlarında idi. Lakin Məkkədə yaşayan Abbas (r.ə) imanını açıqlamamışdı. Buna səbəb onun xeyli miqdarda nəğd pulunun ya borcda, ya da Qüreyşin müşrik tacirləri ilə müştərək ticarət dövriyəsində olması idi. Abbas (r.ə) imanını açıqlayacağı zaman artıq Məkkədə qala bilməyib məcburən hicrət etməli olacaqdı. Belədə isə öz müşrik həmşəhərlilərində olan pulunu onlardan ala bilmə-

yəcəkdi. Hal belə ikən Qüreyş müşrikləri Bədr döyüşü üçün səfərbərliyə başlamış və Abbası (r.ə) da buna təşviq etmişdilər. Abbas ibn Əbdülmüttəlib (r.ə) bu səfərbərlikdən heç cür yayına bilməmiş, məcburən, könülsüz olaraq onlara qatılmalı olmuş və yuxarıda qeyd etdiyimiz kimi əsir düşmüşdü. Peyğəmbərin (s.ə.v) İslam düşmənliyi ilə ad çıxarmış digər əmisi, daha çox Əbu Ləhəb künyəsi ilə tanınan Əbduluzza ibn Əbdulmüttəlib isə Bədr səfərinə çıxmayıb öz yerinə muzdla tutduğu As ibn Hişam adlı bir nəfəri göndərmişdi. Bədrdəki məğlubiyyət xəbəri Qüreyşin müşrik ordusundan daha əvvəl Məkkəyə çatmış və Əbu Ləhəb bu xəbəri eşidəndə dərin kədərə qərq olmuşdu. Nəhayət məğlub ordu Məkkəyə çatanda o, qardaşı oğlu Əbu Süfyan ibn Haris ibn Əbdulmüttəlibi yanına çağırıb bu işin necə baş verdiyi barədə onu sorğu-suala tutmuşdu. Bu vaxt böyük bir izdiham onların ətrafına yığılıb diqqətlə Əbu Süfyanı dinləməyə başlamışdı. Əbu Süfyan ibn Haris "*biz onlarla döyüş meydanında qarşılaşanda onlar bizi dilədikləri kimi öldürməyə və əsir etməyə başladılar, bu iş necə oldu bilmirəm, lakin qaçdıqları üçün bizimkiləri qınaya bilmirəm, onlar tərəfdən üstümüzə daha əvvəl heç yərdə rastlaşmadığımız ağ bənizli döyüşçülər gəlməkdə idilər ki, onlarla vuruşmaq mümkün deyildi*". Əbu Süfyan ibn Harisin bu sözündən sonra Abbasın (r.ə) azad etdiyi müsəlman köləsi Əbu Rafi' (r.ə) "*vallahi, onlar mələklər idi*" demişdi. Əbu Ləhəb bu sözü eşidən kimi Əbu Rafi'nin (r.ə) sifətinə möhkəm bir sillə vurmuşdu. Əbu Rafi' də cavabsız qoymayıb Əbu Ləhəbin üstünə atılmışdı. Lakin Əbu Ləhəb arıq və çəlimsiz Əbu Rafi'ni (r.ə) üstündən yerə atıb sinəsinə çökmüş və üz-gözünə vurmağa başlamışdı. Bu vaxt Abbasın (r.ə) xanımı Umm Fəzl (r.ə) "*ağası burada olmadığı üçün zavallını sahibsiz zənn etmisən?*" deyərək əlinə keçirdiyi dəyənəklə Əbu Ləhəbin başına möhkəm bir zərbə endirərək başını yarmışdı. Əbu Ləhəb başındakı qanı axan yarasını əlilə tutub evinə getmişdi. Bədrdə baş verənlərin xəbəri Əbu Ləhəbə ağır təsir etmişdi, qəhər və qəzəb boğazında düyünlənib onu boğmaqda idi. Bu hadisədən bir həftə sonra Əbu Ləhəb "ədəsə" adlanan dəri xəstəliyinə tutularaq evində ölmüşdü. Qıc olan bədənini qabarcıqlar bürümüşdü. Cahiliyyə ərəbləri yoluxucu ədəsə xəstəliyindən taundan qorxduqları qədər qorxurdular. Buna görə də heç kim Əbu Ləhəbin cəsədinə yaxın getmək istəmirdi. İki-üç gün evdə qalan cəsəd iylənmiş, üfunət evdən kənarda da hiss edilməyə başlamışdı. Nəhayət insanlar Əbu Ləhəbin oğullarını bundan ötürü qınamağa və ayıblamağa başlayanda onların pulla tutduqları adamlar Əbu Ləhəbin cəsədini bir parçanın üzərinə qoyub hərə bir tərəfdən tutaraq şəhərdən çıxarmışdılar. Məkkə yaxınlığında bir çuxur qazıyaraq cəsəd oraya atılmış və üstü torpaqla örtülmüşdü.

Səfvan ibn Üməyyə Bədrdə öldürülən atası və qardaşının qisasını almaq üçün Peyğəmbərə (s.ə.v) sui-qəsd tərtib etmək istəmişdi. Umeyr ibn Vəhbin oğlu Bədrdə müsəlmanların əlinə əsir olaraq keçmişdi. Fəqət Umeyrin öz oğlu üçün qurtuluş fidyəsini ödəməyə gücü çatmırdı. Səfvan ibn Üməyyə onun bütün borclarını, həmçinin oğlunun qurtuluş fidyəsini ödəməyə və ailəsinə baxmağa söz verərək sui-qəsd üçün Mədinəyə göndərmişdi. Umeyr ibn Vəhb Mədinədə Allah Rəsulu (s.ə.v) ilə görüşərkən Peyğəmbər (s.ə.v) ona: "*oğlunun fidyəsini ödəmək bəhanədir. Səninlə Səfvan arasındakılardan xəbərdaram*" demişdi. Bu sözləri eşidən Umeyr yerində donub qalmışdı. O, "*mən daim sənin Allahdan vəhy alma məsələnə istehza edərdim. Fəqət biz Səfvanla danışarkən orada ikimizdən başqa heç kim yox idi. Gətirdiyin dini qəbul edirəm. Sən həqiqətən Allahın Elçisisən. Bu vaxta qədər dininin yayılmasının qarşısı almaq üçün əlimdən gələn hər şeyi etmişəm, bundan sonra isə İslamın yayılması üçün əlimdən gələn hər şeyi edəcəm*" deyərək müsəlman olmuşdu. Umeyr ibn Vəhb (r.ə) Məkkəyə qayıtmış, lakin müsəlman olduğunu açıqlamamışdı. O, bundan sonra İslamın Məkkədə yayılması üçün həqiqətən böyük işlər görmüşdü.

Adətən bütün silahlı toqquşmalardan sonra tərəflər arasında soyuq müharibə, təbliğat müharibəsi aparılır. Bədr döyüşünün müsəlmanların qələbəsi ilə bitməsindən sonra da belə olmuşdu. Xüsusən də yəhudilər müsəlmanların mövqeyinin bu şəkildə güclənməsindən dərin narahatlıq duymuşdular. Mədinədəki yəhudi zadəganlardan Kə'b ibn Əşrəf Qüreyş müşriklərinin Bədrdəki aqibəti haqqında eşidəndə "*artıq torpağın altında yatmaq üstündə gəzməkdən daha xeyirlidir*" deyərək kədərini büruzə vermişdi. O, Bədr döyüşündən sonra Qüreyş müşriklərinin kədərinə şərik olmaq üçün Məkkəyə getmiş, onları qisas almaları üçün yeni müharibəyə təşviq etmişdi. Bəni-Nəzir yəhudilərinin liderlərindən olan Kə'b ibn Əşrəf zəngin tacir olmaqla yanaşı həm də şair idi. Məkkədə Bədrdə öldürülən müşriklər üçün mərsiyələr deyir, Qüreyş müşriklərini ağladırdı. Kə'b ibn Əşrəf Qüreyş müşrikləri Mədinəyə yeni hücum haqqında qərar verənə qədər Məkkədə qalmışdı. O, Mədinəyə qayıdandan sonra müsəlman qadınların və qızların iffət və namuslarına sataşan şeerlər deyərək başına toplaşanları əyləndirirdi. Əshabdan bir neçə nəfər Kə'bin cəzalandırılması üçün öz aralarında razılaşmış və plan qurmuşdular. Onlar bu haqda Peyğəmərə (s.ə.v) danışmış və Allah Rəsulu (s.ə.v) onların planını təsvib etmişdi. Kə'b ibn Əşrəf girov əvəzində faizlə borc verirdi. Ənsardan Muhəmməd ibn Məsləmə (r.ə) əvvəlcədən qurduqları plana uyğun olaraq dostlarından bəziləri ilə birlikdə Kə'bin yanında getmiş və Peyğəmbərə (s.ə.v) kömək etdikləri üçün maddi baxımdan ehtiyac içində olduqlarını və biraz borc pul almaq istədiklərini bil-

dirmişdi. Kə’b onlara “*əlbəttə ki, gec-tez Muhəmməddən (s.ə.v) bezəcəkdiniz. Sizə borc pul verərəm, amma arvadlarınızı və uşaqlarınızı mənim yanımda girov qoyun*” demişdi. Kə’b bunu qəsdən, İbn Məsləmə (r.ə) və onunla birlikdə olan müsəlmanlara sataşmaq məqsədiylə söyləmişdi. İbn Məsləmə (r.ə) belə bir şeyin mümkün olmadığını bildirəndən sonra isə Kə’b onlardan silahlarını və zirehlərini girov qoymalarını tələb etdi və İbn Məsləmə (r.ə) onunla razılaşdı. Gecə İbn Məsləmə (r.ə) yoldaşları ilə birlikdə Kə’b ibn Əşrəfin evinin qarşısına gəlib onu girov əşyaları götürməsi üçün çağırdı. Yəhudi tacirin kiçik bir qalanı xatırladan evinə daxil olan kimi İbn Məsləmə (r.ə) yanındakı yoldaşları ilə onun üzərinə atılıb qətlə yetirmişdi. Kə’b ibn Əşrəfin qətlində Haris ibn Əvs, Əbbad ibn Bişr, Əbu Əbs ibn Cəbr və Əbu Nailə ibn Silkan iştirak etmişdilər. Radiyallahu ənhum əcməin. Əbu Nailə ibn Silkan (r.ə) mənşəcə yəhudi olub İslamı qəbul etmişdi və Kə’b ibn Əşrəfin süd qardaşı idi. Kə’b ibn Əşrəfin öldürülməsi Qüreyş müşrikləri ilə əməkdaşlıq edən Mədinədəki digər zəngin yəhudi zadəganlarının gözünü qorxutmuş və bir müddət üçün onları bu işdən çəkindirmişdi.

Lakin sonrakı hadisələrdən belə məlum olur ki, Mədinə yəhudiləri Kə’b ibn Əşrəfin öldürülməsindən lazım olduğu qədər ibrət götürməmişdilər. Onlar hər fürsətdə istər Allah Rəsulu (s.ə.v), istərsə də möminlərə sataşmaqdan, istehza və təhqir etməkdən çəkinmirdilər. Onlar Peyğəmbər (s.ə.v) və müsəlmanlarla görüşəndə sanki onları salamlayırmış kimi “*əs-samu əleykum*”, yəni “*ölüm üzərinizə olsun*” deyirdilər. Bunu bilməyən müsəlmanlar isə onlarla salamlaşırdılar. Allah Rəsulu (s.ə.v) onların bu xəbis istehzalarından xəbərdar olduqda onu bu şəkildə salamlayan yəhudilərə sadəcə “*əleykum*”, yəni “*elə sizin də üzərinizə olsun*” deyə cavab verirdi. Mədinə yəhudiləri kitab əhli olduqları halda Qur’ana iman gətirmiş müsəlmanlardansa özlərini müşriklərə daha yaxın hesab etmişdilər. Onlar Allaha şərik qoşanları tövhid əhli olan müsəlmanlardan daha üstün tuturdular. Halbuki Peyğəmbər (s.ə.v) hər fürsətdə onlara qarşı hörmət və ehtiramla davranırdı. Allah Rəsulu (s.ə.v) yəhudilərin cənazələrini görəndə ayağa qalxır, onlara baş sağlığı verirdi. O, yəhudilərin öz aralarında düşdükləri anlaşmazlıqlarını öz kitabları olan Tövratın hökmlərinə görə yoluna qoyurdu. Bütün bunlara baxmayaraq yəhudilər İslam əleyhinə müşriklərlə əməkdaşlıq etməkdən çəkinməmişdilər. Onların bu halı Qur’ani-Kərimdə, Nisa surəsi 51-ci ayədə öz əksini belə tapmışdı:

أَلَمْ تَرَ إِلَى الَّذِينَ أُوتُوا نَصِيبًا مِّنَ الْكِتَابِ يُؤْمِنُونَ بِالْجِبْتِ وَالطَّاغُوتِ وَيَقُولُونَ لِلَّذِينَ كَفَرُوا هَٰؤُلَاءِ أَهْدَىٰ مِنَ الَّذِينَ
آمَنُوا سَبِيلًا

*“Kitabdan (Tövratdan) bir pay verilənləri (yəhudiləri) görmürsənmi? Onlar Cibt*[27] *və Tağuta*[28] *inanır və (müşrik) kafirlər üçün də: “Bunlar möminlərdən daha doğru yoldadırlar” - deyirlər*”.

Mədinə yəhudilərinin İslama qarşı girişdikləri fəaliyyətlərdən biri də Qur’ani-Kərimin Ali-İmran surəsi 72-ci ayəsində öz əksini belə tapmışdı:

وَقَالَتْ طَائِفَةٌ مِنْ أَهْلِ الْكِتَابِ آمِنُوا بِالَّذِي أُنْزِلَ عَلَى الَّذِينَ آمَنُوا وَجْهَ النَّهَارِ وَاكْفُرُوا آخِرَهُ لَعَلَّهُمْ يَرْجِعُونَ

*“Kitab əhlindən (yəhudilərdən) bir dəstə (bir-birinə) dedi: “Möminlərə nazil edilənə (Qurana) günün əvvəlində (səhər vaxtı) inanın, həmin günün axırında (axşam vaxtı) isə onu inkar edin! Bəlkə, (möminlər öz dinlərindən) üz döndərsinlər”.*

Bədrdən sonra müsəlmanların mövqeyi xeyli möhkəmlənmişdi və İslamı qəbul edənlərin sayı sürətlə artmaqda idi. Yəhudilərin arasında da İslamı qəbul edənlər var idi. Bu yəhudilərin liderlərini və din xadimlərini narahat edirdi. Buna görə də yəhudi din xadimlərinin təşviq və təlimatı ilə bəzi yəhudilər güya İslamı qəbul edir, Peyğəmbərin (s.ə.v) yanına gedərək onun risalətinə iman gətirdiyini bildirir, lakin qısa müddət sonra İslamı tərk etdiklərini bəyan edirdilər. Səbəbini isə İslamda gözlədiklərini görə bilmədiklərini, etiqadın tutarsız olduğunu və o cümlədən Peyğəmbərin (s.ə.v) şəxsi vəziyyətini bəyənmədiklərini söyləyərək izah edirdilər. Beləcə onlar, öz ağıllarına görə, güya İslamı qəbul edənlərin zehnində şübhə və müəmma yaratmağa nail olurdular.

Onların ifşa edilən bu kimi hal və davranışlarına, söz yerində isə, dözmək mümkün idi. Allah Rəsulu (s.ə.v) yəhudilərə daxil olduqları Mədinə əhdnaməsini xatırladaraq onları müsəlmanlara qarşı bu kimi davranışlardan çəkindirməyə çalışır, onları yumuşaq dillə haqq və ədalətə dəvət edirdi. Lakin əsas məşğuliyyətləri zərgərlik olan Qaynuqa yəhudilərinin törətdikləri bir əməl belə demək mümkünsə müsəlmanların səbr kasasını daşıran son damla olmuşdu. Bir gün bir müsəlman qadın Qaynuqa bazarında bir zərgər dükanına girib bəzək əşyalarına baxmışdı. Yəhudi zərgər, etməyəcəyini bilə-bilə sataşmaq məqsədiylə müsəlman qadına boynunu və üzünü örtən örtünü açıb sırğa və

[27] İslam dini terminologiyasında “cibt” sehirbazlıq, münəccimlik, gələcəkdən, qeybdən xəbər vermə, kahinlik kimi şeylərə deyilir. Allah Rəsulu (s.ə.v) hədislərindən birində quşların səsindən, heyvanların hərəkətindən güya nəticə çıxararaq gələcəkdən xəbər vermə kimi əməlləri, eləcə də kəhanət qəbilindən olan digər şeyləri də cibt adlandırmışdır. Belə olan halda cibtin batil inanc, xürafə ilə eyni şey olduğunu söyləmək olar. Cahiliyyə dövründə yəhudilərin arasında bu kimi işlərlə məşğul olanların sayı kifayət qədər idi və yəhudilər onlara böyük ehtiram bəsləyirdilər.

[28] Ərəbcədə “tağut” kəlməsinin lüğət mənası qoyulmuş həddi aşan hər kəsə aid edilir. Qur’anda Allah bu kəlməni Allahın qoyduğu hədləri aşan hər bir kəs üçün, ələlxüsus Allahın qulu olan insanları özünün qulu hesab edən kəslər üçün istifadə etmişdir.

boyunbağıları taxıb bax biləcəyini söyləmişdi. Müsəlman qadın bundan imtina edib bəzək əşyasına baxaraq bəyənərkən dükandakı yəhudilərdən biri gizlicə onun belindən aşağısını örtən örtüsünü mismarla yerə sancmışdı. Qadın addım atan kimi belindən aşağısını örtən örtüsü açılıb düşmüş və oradakı yəhudilər bununla əylənərək gülmüşdülər. Qadın örtüsünü yerdən toplayıb ağlayaraq dükandan çıxarkən yolda əqrəbası olan bir müsəlmana rast gəlmiş və baş verənləri ona danışmışdı. Həmin şəxs də qəzəblə dükana girib zərgəri vuraraq öldürmüşdü. Lakin bazardakı digər yəhudilər də həmin müsəlmanı qətlə yetirmişdilər. Allah Rəsulu (s.ə.v) bu hadisədən sonra Bəni-Qaynuqa məhəlləsinə gedərək onların liderləri ilə görüşüb söhbət etmiş, yenidən əhdnamə şərtlərini onlara xatırlatmışdı. Allah Rəsulunun (s.ə.v) məsələni tərəflərə qan diyəti ödəyərək, sülhlə yoluna qoymaq təklifinə Bəni-Qaynuqanın liderləri həyasızcasına "*ey Muhəmməd! Müharibə etməyi bacarmayan, hərbdən başı çıxmayan Qüreyşə qarşı qazandığın zəfər səni çaşdırmasın, biz sizinlə döyüş meydanında qarşılaşanda müharibənin necə olduğunu görəcəksiniz*" deyə cavab vermişdilər. Bu açıq bir meydan oxuma və müharibə elan etmək idi ki, Qaynuqa qəbiləsi əslində bununla əhdnamədən çıxdığını bəyan etmişdi. Allah Rəsulu (s.ə.v) onlarla görüşü başa vurub möminlərə silahlanaraq döyüşə hazırlaşmağı əmr etmişdi. Qaynuqa yəhudiləri də dərhal səfərbər olaraq özlərinə məxsus istehkamlarda mövqe tutmuşdular. Mücahidlərin 15 günlük mühasirəsindən sonra Qaynuqa yəhudiləri təslim olmuşdular. Əhdnaməyə xəyanət edən və müharibəyə səbəb olan liderləri edama məhkum edilmişdilər. Lakin Peyğəmbər (s.ə.v) onları əfv edib hicri 2-ci ilin şəvval ayının ortalarında (aprel 624) Qaynuqa qəbiləsini Mədinədən sürgün etdi. Bəni-Qaynuqa əvvəlcə Mədinənin şimalındakı Vadiü'l-Quraya, daha sonra isə Sina yarımadasındakı Ezriata köçürülmüşdü.

Məkkəlilərin həyatı ticarətlə sıx bağlı idi. Həm əsirlərin qurtuluşu üçün fidyənin ödənilə bilməsi, həm də məişət ehtiyacalarının təmin edilməsi üçün yeni bir karvanın yola çıxması zəruri idi. Qırmızı dəniz sahili və Mədinə ətrafındakı karvan yolları müsəlmanların nəzarəti altında olduğu üçün qüreyşlilər xeyli müşkül vəziyyətə düşmüşdülər. Səfvan ibn Üməyyənin başçılığı altında böyük bir ticarət karvanı İraqa doğru yola çıxmışdı. Lakin bu dəfə sahil yolunu deyil, Nəcd yolunu seçmişdilər. Bu vaxt Əşca qəbiləsinə mənsub Nueym ibn Məs'ud Məkkədə idi. Nueym Mədinədəki bir müsəlman dostunu məsələdən xəbərdar etmişdi. Qaradə adlanan yerdə Allah Rəsulunun (s.ə.v) Zeyd ibn Harisənin (r.ə) başçılığı altında göndədiyi 100 nəfər süvari mücahid karvana yetişmişdi. Zeyd ibn Harisə (r.ə) karvanı ələ keçirib Mədinəyə gətirmişdi. Bu xəbəri eşidən qüreyşlilər hövsələdən çıxmışdılar. Onlar Əbu Süfyandan dərhal

Mədinəyə hücum etmək üçün yeni bir ordunun hazırlanmasını tələb etdilər. Məkkə müşriklərinin yeni bir hərbi kampaniyaya başladıqları xəbərini alan Allah Rəsulu (s.ə.v) da Mədinədə müvafiq tədbirləri almağa başlamışdı.

Yuxarıda haqqında danışılanlarla yanaşı hicrətin ikinci ilində (04 iyul 623-23 iyun 624) İslam tarixində digər bir sıra mühüm hidəsələr də baş vermişdi. İslamın beş şərtindən biri olan zəkat möminlərə fərz qılınmışdı. İslamda ilk bayram namazı da hicri 2-ci ildə qılınmışdı. Həmin ildə Allah Rəsulu (s.ə.v) kiçik qızı Fatiməni (r.ə) öz əmisi oğlu Əli ibn Əbu Taliblə (r.ə) evləndirmişdi. Fatimə (r.ə) evlənmə çağına yetişəndə bir çoxları Allah Rəsuluna (s.ə.v) onun üçün elçi gəldilər. Lakin Peyğəmbər (s.ə.v) aralarında Əbu Bəkr (r.ə) və Ömər (r.ə) kimi əşrafdan olan elçilərə müsbət cavab verməmişdi. Nəhayət yaxın qohum-əqrəbasının təşviqi ilə Əli ibn Əbu Talib (r.ə) Allah Rəsulundan (s.ə.v) Fatiməni (r.ə) istəmişdi. Peyğəmbər (s.ə.v) qızını onunula evləndirməyə razı olmuşdu. Rical və tarix kitabları Əlinin (r.ə) öz dilindən bu hədisəni nəql edirlər. Əli ibn Əbu Talib (r.ə) demişdi: "*nəhayət mən Allah Rəsulunun (s.ə.v) hüzuruna getdim. O, bütün mənəvi heybəti və vüqarı ilə oturmuşdu. Mən gedib onun qarşısında oturdum, lakin bir kəlmə belə danışa bilmədən susub qaldım. Allah Rəsulu (s.ə.v) mənə dedi:*

- *Sən nə üçün gəldin? Bir istəyin var? Deyəsən sən Fatiməni (r.ə) istəməyə gəldin, elədirmi?*
- *Bəli*
- *Fatiməyə (r.ə) mehr olaraq verməyə nəyin var?*
- *Sadəcə atım və zirehim var.*
- *Atın sənə lazım olar, zirehini sat*".

Əli ibn Əbu Talib (r.ə) zirehini 480 dirhəmə Osman ibn Əffana (r.ə) satmışdı. Osman ibn Əffan (r.ə) həmin zirehi artıq bacanağı olan Əli ibn Əbu Talibə (r.ə) evlilik hədiyyəsi olaraq geri vermişdi. Allah Rəsulu (s.ə.v) bunu biləndə Osman (r.ə) üçün Allaha dua etmişdi. Peyğəmbər (s.ə.v) həmin pulla Fatimə (r.ə) üçün ətir və cehiz aldırmışdı.

*Uhud Döyüşü*

Qüreyş müşriklərinin liderləri Bədrdəki məğlubiyyətin qisasını almaq üçün intiqam alovu ilə yanırdılar. Bu məğlubiyyət onların ərəb qəbilələri arasındakı etimadına ağır zərbə vurmuşdu. Əbu Süfyanın müsəlmanların əlindən xilas edərək Məkkəyə gətirdiyi karvandan əldə edilən 50 min dinar qızıl pulun bir hissəsi Bədrdə müsəlmanlara əsir düşmüş qüreyşlilərin qurtuluşu üçün xərclənmişdi. Qalan hissəsi isə İslama qarşı hazırlanacaq yeni ordunun xərclərinə

ayrılmışdı. Bu məbləğin yarısı ilə muzdlu əsgərlər cəlb edilmişdi. Bundan başqa Məkkə müşrikləri ən məharətli şairlərinə və natiqlərinə də bol miqdarda pul verərək yarımadadakı digər müşrik ərəb qəbilələrinə göndərmişdilər. Bu şair təbliğatçılar bədəvi ərəblərin təəssüb hisslərinə xitab edərək onları öz bütləri uğrunda döyüşməyə təşviq etməkdə idilər. Bunların arasında Qüreyşin ən məşhur şair və natiqlərindən biri olan Əbu Əzzə də var idi. Məkkədə ikən öz şeerləri ilə müşrikləri Allah Rəsulu (s.ə.v) və müsəlmanlara qarşı təşviq edən Əbu Əzzə müsəlmanların əlinə əsir düşmüşdü. Lakin bir daha İslam əleyhdarı çıxışlar etməyəcəyinə dair and içdiyi üçün Allah Rəsulu (s.ə.v) onu sərbəst buraxdırmışdı. Lakin Əbu Əzzə tezliklə andını pozub əvvəlki nadanlıqlarına davam etməyə başlamışdı.

Əsasən Kinanə, Tihamə, Səqif kimi qəbilələrdən iki minə yaxın döyüşçü toplanmışdı. 3000 nəfərdən biraz çox olan müşrik ordusunun geri qalan qismini isə qüreyşlilər təşkil edirdilər. Orduda 700 zirehli süvari var idi. Bundan başqa 200 at və 3000 dəvə səfərbərlik üçün tədarük edilərək hazırlanmışdı. Müşrik ordusuna komandanlıq edən Əbu Süfyan ibn Hərblə yanaşı İkrimə ibn Əbu Cəhl, Haris ibn Hişam, Səfvan ibn Üməyyə, Əmr ibn əl-As, Təlhə ibn Əbi Təlhə, Haris ibn Süfyan kimi qüreyşli zadəganlar öz yanlarında arvadlarını da hərbi səfərə aparmışdılar. Onlarla yanaşı Bədrdə yaxın əqrəbası öldürülmüş daha bir çox Qüreyşli müşrik qadın da səfərbərliyə qoşulmuşdu. Onların əsas məqsədi kişilərin döyüş meydanından qaçmalarının qarşısını almaq idi. Qadınlar özləri döyüş meydanında ikən kişilərin qaçmaqdan ar edəcəklərini düşünmüşdülər.

Bədrdə əsir düşüb qurtuluş fidyəsi ödəyərək azad olan Abbas ibn Əbdülmuttəlib (r.ə) Məkkədəki bu hərbi hazırlıqlardan qardaşı oğlu olan Allah Rəsulunu (s.ə.v) vaxtında xəbərdar etmişdi. O, bir çapara pul ödəyərək onu məktubla Mədinəyə yola salmışdı. Allah Rəsulu (s.ə.v) Sə’d ibn Rəbi’nin (r.ə) evində ikən məktubu Übey ibn Kə’bə (r.ə) oxutdurmuş, hadisələrdən xəbərdar olandan sonra ev sahibinə və məktubu onun üçün oxuyan Übey ibn Kə’bə (r.ə) bu məktub barədə heç kimə bir söz deməmələrini tapşırmışdı. Lakin evdə danışılanları eşidən Sə’din (r.ə) arvadı bu haqda digər qadınların yanında söhbət etdiyi üçün xəbər tezliklə bütün Mədinəyə yayılmışdı.

Allah Rəsulu (s.ə.v) dərhal Məkkə istiqamətinə bir neçə kəşfiyyatçı göndərdi. Onlar gələn xəbərləri təsdiqləyərək ordunun artıq Mədinəyə yaxınlaşdığını bildirmişdilər. Peyğəmbər (s.ə.v) dərhal səhabənin böyüklərini məşvərət məclisində topladı və vəziyyəti onlara bildirdi. Məşvərət məclisində iki əsas fikir meydana çıxmışdı, birincisi Mədinədə qalıb şəhəri müdafiə etmək, ikincisi isə şəhər xaricinə çıxıb düşmən ordusunu döyüş meydanında qarşılamaq. Allah

Rəsulu (s.ə.v) ilə birlikdə əshabın yaşlı və təcrübəli olanları şəhərdə qalıb müdafə olunmağın tərəfdarı idilər. Lakin əksəriyyət döyüş meydanında düşmənlə üz-üzə gəlmək arzusunda olduqlarını bildirir, "*müşriklərə "qabağımızdan qaçıb şəhərdə gizləndilər" demə fürsətini verməyək*" deyərək bu fikirlərində təkid edirdilər. Bu fikirdə olanların çoxu gənc müsəlmanlar idi. Allah Rəsulu (s.ə.v) bu hadisədən bir müddət əvvəl bir röya görmüşdü. O, röyasında əyninə möhkəm bir zireh geydiyini, qılıncını yerə vurduğunu, qılıncının ağzının sındığını, bir öküzlə bir qoçun başının kəsildiyini görmüşdü. Peyğəmbər (s.ə.v) bu gördüyü yuxunu belə yozmuşdu ki, möhkəm zireh Mədinədir, qılıncının əlində sınması yaxın qohumlarından, ailə fərdlərindən birini itirəcəyinə işarədir, başı kəsilən öküzlə qoç isə əshabından bəzi böyük insanların qətlə yetiriləcəyinə işarədir. Buna görə də Peyğəmbər (s.ə.v) Mədinədə qalıb müdafiə olunmağa üstünlük verirdi. Allah Rəsulu (s.ə.v) barəsində Allahın vəhyi olmayan məsələlərdə müşvirə edir və müsəlmanların çoxluğunun fikrini qəbul edirdi. Bu məsələdə də özü əksini düşünsə də çoxluğun fikrini ilə razılaşmışdı. Lakin əshabın qabaqcılları Allah Rəsulunun (s.ə.v) yaranmış vəziyyətdən məmnun olmadığını görürdülər. Allah Rəsulu (s.ə.v) müşavirə məclisindən sonra evinə getdi. Bu vaxt müsəlmanlar səf-səf düzülərək onun gəlişini gözləyirdilər. Sə'd ibn Muaz (r.ə) və Useyd ibn Hudeyr (r.ə) Peyğəmbərin (s.ə.v) məmnun olmadığı fikrin üzərində təkid edənləri məzəmmət etdilər. Onlardan dərhal üzr istəyib "*sən necə əmr etsən biz o şəkildə vuruşarıq*" deməlırini istədilər. Onlar bu haqda danışarkən Peyğəmbər (s.ə.v) əynində zirehi, qılıncını belinə bağlayıb qalxanını çiyninə taxmış, hərbi səfərə hazır vəziyyətdə əshabının yanına qayıtdı. Əshab üzrxahlıq edərək Mədinədə qalıb şəhəri müdafiə etmək fikri ilə razılaşdıqlarını bildirdilər, lakin Allah Rəsulu (s.ə.v) onlara belə dedi: "*bir peyğəmbərə zirehini geyəndən sonra müşriklərlə qarşılaşıb onlarla vuruşmadığı və Allah onunla düşmənləri arasında öz hökmünü vermədiyi müddətcə zirehini əynindən çıxarması yaraşmaz. Artıq sizə nə əmr edirəmsə onu yerinə yetirin, Allahın adı ilə irəliləyin. Səbr və səbat edəcəyiniz təqdirdə Allahın köməyi sizinlədir*".

Qüreyş müşriklərinin ordusu Mədinə yaxınlığındakı Uhud dağı ətrafına çatıb burada düşərgə qurmuş və iki gün burada qalmışdılar. Allah Rəsulu (s.ə.v) cümə namazından sonra səfərə hazır olan ordusu ilə Mədinədən çıxıb Uhud dağına tərəf yollandı. Şeyxeyn adlı yerdə dayanıb ordusunu təftiş etdi. Allah Rəsulu (s.ə.v) hərbi iş üçün yaşı kiçik olduğu halda Allah yolunda vuruşmaq və şəhid olmaq üçün orduya qoşulmuş yeniyetmə müsəlmanları burada ordudan ayırıb Mədinəyə geri göndərdi. Yaşları 12-15 arasında olan Üsamə ibn Zeyd (r.ə), Abdullah ibn Ömər (r.ə), Zeyd ibn Sabit (r.ə), Əbu Səid əl-Xudri (r.ə),

Bəra ibn Azib (r.ə), Əmr ibn Həzm (r.ə), Useyd ibn Zuheyr (r.ə), Zeyd ibn Ərqam (r.ə), Arəbə ibn Əvs (r.ə), Ne'man ibn Bəşir (r.ə) Peyğəmbərin (s.ə.v) əmri ilə Mədinəyə geri qayıtdılar. Lakin Peyğməbər (s.ə.v) onların silahlı olaraq qalıb şəhər əhalisinin təhlükəsizliyi üçün xidmət etmələrinə icazə vermişdi. Allah Rəsulu (s.ə.v) gözdən əlil olan səhabəsi İbn Umm Məqtumu (r.ə) hərbi səfər müddətində Mədinədə öz yerinə canişin təyin etmişdi.

Şeyxeyndə münafiqlər Abdullah ibn Übeyyin ətrafında toplaşaraq ordudan ayrılıb Mədinəyə qayıtmaq üçün uyduracaqları bəhanəni müzarkirə etməyə başlamışdılar. Nəhayət onlar Abdullah ibn Übeyyə "*bu adam sənin kimi ali məqama sahib bir insanın sözünə deyil bir dəstə gəncin sözünə qulaq asıb buraya gəldi*" deyərək onunla birlikdə ordugahı tərk etdilər. Abdullah ibn Übeyy də Mədinədə qalıb müdafiə olunmağın tərəfdarı idi və bu haqda fikrini bəyan etmişdi. Lakin əgər şəhərdə qalıb müdafiə olunulsa idi də münafiqlər başqa bir bəhanə tapıb xəyanətlərini gerçəkləşdirəcəkdilər. Təqribən 300 münafiq Allahdan və Rəsulundan (s.ə.v) üz çevirərək ordudan ayrılıb Mədinəyə qayıtmışdı. Allah Qur'anın Ali-İmran surəsi 166-167-ci ayələrində onların ikiüzlülüklərini belə üzlərinə vurmuşdu:

**وَمَا أَصَابَكُمْ يَوْمَ الْتَقَى الْجَمْعَانِ فَبِإِذْنِ ا ـ وَلِيَعْلَمَ الْمُؤْمِنِ ـَ . وَلِيَعْلَمَ الذِينَ نَافَقُوا وَقِيلَ لَهُمْ تَعَالَوْا قَاتِلُوا فِي سَبِيلِ ا ـ أَوِ ادْفَعُوا قَالُوا لَوْ نَعْلَمُ قِتَالًا لَاتَّبَعْنَاكُمْ هُمْ لِلْكُفْرِ يَوْمَئِذٍ أَقْرَبُ مِنْهُمْ لِلْإِ ـَانِ يَقُولُونَ بِأَفْوَاهِهِمْ مَا لَيْسَ فِي قُلُوبِهِمْ وَا ـُ أَعْلَمُ بِمَا يَكْتُمُونَ**

*"(Uhud müharibəsində) iki ordunun qarşılaşdığı gündə başınıza gələn fəlakət də Allahın izni ilə oldu ki, möminləri ayırd etsin. Və münafiqləri onlardan fərqləndirsin. Onlara: "Gəlin Allah yolunda vuruşun, yaxud müdafiədə bulunun! (Düşmənin hücumunu dəf edin!) – deyildi. Onlar: "Əgər biz vuruşa bilsəydik, sizin ardınızca gələrdik" – deyə cavab verdilər. Onlar o gün imandan çox küfrə yaxınlaşmışdılar, ürəklərində olmayan şeyi dillərilə deyirlər. Halbuki, Allah onların (bütün) gizlətdiklərini çox yaxşı bilir!"*

Münafiqlərin bu şəkildə ordugahı tərk etməsindən sonra İslam ordusunda 700 mücahid qalmışdı. Onlardan 200-ü zirehli idi. Zirehli piyadalara Zübeyr ibn Əvvam (r.ə), ordunun geri qalanına isə Həmzə ibn Əbdülmuttəlib (r.ə) başçılıq edirdi. İslam ordusunun demək olar ki, hamısı piyadalardan ibarət idi. Allah Rəsulu (s.ə.v) Əbu Heysəmə adlı bələdçinin göstərdiyi kəsə yolla ordusunu Uhud dağının yaxınlığına gətirdi. İslam ordusu Uhud dağının ətəyində, arxası dağa tərəf mövqe tutdu. Ordunun sağ tərəfində Mədinə şəhəri, sol tərəfində isə Uhud və Əyneyn dağları arasındakı dərə var idi. Döyüş bayrağını Mus'ab

ibn Umeyr (r.ə) daşıyırdı. Düşmən süvarilərinin Əyneyn dağının ətrafından dolanıb hücum etmələri İslam ordusunun sol cinahını xeyli çətin vəziyyətə sala bilərdi. Buna görə də Allah Rəsulu (s.ə.v) Abdullah ibn Cubeyrin (r.ə) əmrinə 50 nəfər sərrast oxçunu verərək onlara Əyneyn keçidində möhkəmlənməyi tapşırdı. Bu oxçuların əsas vəzifəsi vadidən keçmək istəyən düşmən süvarilərini ox atışlarıyla geri qayıtmağa məcbur etmək idi. Peyğəmbər (s.ə.v) onları belə təlimatlandırmışdı: "*siz bizi arxadan qoruyacaqsınız. Kimin məğlub, kimin qalib gəlməyindən aslı olmayaraq, mənim əmrim olmadığı müddətcə mövqeyinizi tərk etməyin. Bizim düşmən ordusunu yarıb içinə girdiyimizi, qırılıb məhv olduğumuzu görsəniz də yerinizdən tərpənməyin, hətta qarağa-quzğunun meyitlərimizi dimiklədiyini görsəniz belə sadəcə burada qalıb düşmənə ox yağdırın*".

Uhud dağı ətəyində döyüş başlamamışdan əvvəl Əbu Amir əl-Fasiq təqribən 15 nəfər yoldaşı ilə birlikdə meydana çıxaraq ənsara müraciət etmişdi. Əbu Amir vaxtilə Mədinədə özünün İbrahimin (r.ə) dininə mənsub hənif olduğunu iddia edərək Peyğəmbərlə (s.ə.v) mübahisəyə girişmiş, daha sonra isə küfrdə ona yoldaşlıq edən bir neçə nəfərlə birlikdə Məkkəyə müşriklərin yanına köçüb getmişdi. O, İslam ordusundakı ənsarın onun səsinə səs verəcəkləri kimi səfeh bir zənnə qapılaraq onlara müraciət etmiş və onları Muhəmmədə (s.ə.v) kömək etməkdən çəkindirməyə çalışmışdı. Qüreyş müşrikləri Əbu Amirin öz qövmü arasında nüfuzlu bir şəxs olduğunu düşünərək onu önə çıxarmışdılar. Lakin ənsarın onu lənətləyərək bəddua etmələrini eşidəndə Əbu Amiri geri çəkdilər. Bu dəfə də müşrik ordusunun komandanı Əbu Süfyan Səxr ibn Hərb ibn Uməyyə irəli çıxıb ənsara müraciət etdi: "*ey Əvs və Xəzrəc! Bizimlə əmioğullarımızın işinə qarışmayın, siz bizim aramızdan çəkilin ki, biz də sizdən uzaq duraq. Biz sizinlə vuruşmaq üçün gəlməmişik*". Lakin ənsarın Əbu Süfyana cavabı da ağır olmuşdu.

Bu vaxt Həvazin qəbiləsindən olan müşrik süvariləri iki dağ arasındakı dərədən keçərək İslam ordusuna arxadan və soldan hücum etmək istəmiş, lakin Abdullah ibn Cübeyrin (r.ə) oxçuları tərəfindən düşmənin hücumu dəf edilmişdi. Uhudda da döyüş Bədrdəki kimi cəngavərlərin bir-birlərinə meydan oxumaları ilə başlamışdı. İlk ortaya çıxan müşrik ordusunun bayraqdarı Təlhə ibn Əbi Təlhə olmuşdu. O, meydana çıxaraq: "*sizin qılıncınızla bizi cəhənnəmə göndərdiyinizi, bizim qılıncımızla isə cənnətə getdiyinizi deyirsiniz. Aranızda mənim qılıncımla cənnətə getmək ya da öz qılıncı ilə məni cəhənnəmə göndərmək istəyən varmı?*" deyə hayqırmağa başlayanda Əli ibn Əbu Talib (r.ə) "*mən varam*" deyib onun üstünə şığıdı və bir neçə qılınc zərbəsində sonra Təlhəni yerə sərdi. Təlhənin qardaşı Osman ibn Əbi Təlhəni də Həmzə (r.ə) öldürdü. Daha sonra öldürülən bu iki nəfərin başqa bir qardaşı Əbu Səid ibn Əbi

Təlhə meydana çıxdı. Onun da Sə'd ibn Əbu Vəqqas (r.ə) başını bədənindən ayırmışdı. Öldürülən bu üç nəfərin mənsub olduğu Əbduddar soyundan daha 4 müşrik cəngavər döyüş meydanında Quzman, Zübeyr ibn Əvvam (r.ə), Asim ibn Sabit (r.ə) adlı İslam ordusundakı cəngavərlərin əlində can vermişdilər.

Bunlardan Quzman müsəlman deyildi. O, münafiqlərlə birlikdə Şeyxeyndə ordudan ayrılıb Mədinəyə qayıtmışdı. Lakin Mədinədə özünün mənsub olduğu Bəni-Zəfər ailəsinin qadınlarının tənəsinə dözə bilməyib geri döyüş meydanına yollanmışdı. Quzman iri cüssəli, güclü və qılınc oynatmaqda mahir bir insan idi. O, hələ İslamdan əvvəl Yəsribdəki qəbilə müharibələrində öz şücaətilə ad çıxarmışdı. Uhuddan qayıdıb evinə gələndə qadınların ona "*ey Quzman! Nəslindəki kişilərin hamısı döyüş meydanındadır. Sən isə evdəsən, gəl bizimlə birlikdə otur, çünki sənin artıq bizdən bir fərqin yoxdur*" deyib etdikləri tənələrə dözə bilməyən Quzman yenidən silahlanıb Uhuda yollanmışdı. Müşrik ordusundakı Siv'ab əl-Həbəşi adlı zənci bir cəngavəri təkbətək döyüşdə öldürmüşdü. Döyüş boyunca isə səkkiz müşrik Quzmanın qılıncı ilə can vermişdi. Nəhayət Quzman ağır yaralanaraq döyüş meydanından çıxarılmışdı. Mücahidlər ona "*gözün aydın Quzman, şəhid olub cənnətə gedəcəksən*" deyəndə Quzman onlara "*mən sadəcə özümün və nəslimin şərəfi üçün vuruşdum, cənnət umacağım və ya cəhənnəm qorxum yoxdur*" deyə cavab vermişdi. Yarasının verdiyi ağrılar şiddətlənəndə isə Quzman tez ölüb ağrıdan qurtulmaq üçün oxunun ucu ilə damarını kəsmiş və sonra da qılıncını sinəsinə qoyub özünü qılıncın üstünə ataraq intihar etmişdi.

Mədinədəki Bəni-Nəzir yəhudilərinin alimlərindən və zənginlərindən biri olan Müxeyriq hələ hicrət vaxtı Allah Rəsulunun (s.ə.v) həqiqətən Allahın elçisi olduğuna iman gətirmişdi. O, Muhəmmədin (s.ə.v) əvvəlki peyğəmbərlər tərəfindən gələcəyi xəbər verilən son elçi olduğunu bilirdi. Lakin öz qövmündən qorxduğu üçün imanını açıqlaya bilmirdi. Uhud döyüşünün baş verdiyi gün Müxeyriq öz yaxınlarına "*siz də yaxşı bilirsiniz ki, Muhəmməd (s.ə.v) haqq peyğəmbərdir. Ona yardım etmək bizim boynumuzun borcudur*" deyərək onları imana təşviq etməyə çalışmışdı. Lakin heç kimin onu dinləmədiyini görəndə silahlanıb tək başına Uhuda yollanmış və burada Allah Rəsulunun (s.ə.v) hüzurunda imanını açıqlamışdı. Müxeyriq Uhudda vuruşub şəhid olanlardan idi. Allah ondan razı olsun. O, bütün əmlakını yazdığı vəsiyyətnamə ilə Allah Rəsuluna (r.ə) hədiyyə etmişdi. Peyğəmbər (s.ə.v) Müxeyriqin (r.ə) miras qalan bütün əmlakını müsəlmanların ümumi istifadəsi üçün vəqf etmişdi.

Qüreyş ordusundan Uhudda meydana çıxıb döyüşmək üçün cəngavər istəyənlərdən biri də Əbu Bəkrin (r.ə) oğlu Əbdürrəhman idi. O, başdan ayağa zirehə bürünmüşdü. Əbu Bəkr (r.ə) oğlunu görən kimi qılıncını sıyırıb onun

üstünə yerimək istəmişdi. Lakin Peyğəmbərin (s.ə.v) "*qılıncını qınına qoy və yerəni qayıt*" deməsindən sonra öz oğlunu Allah yolunda öldürmək fikrindən daşınmışdı.

Döyüşün qızğın vaxtında Xalid ibn Vəlidin başçılıq etdiyi müşrik süvariləri yenidən iki dağ arasındakı dərədən keçmək istəmişdilər. Lakin Əyneyn dağındakı oxçuların oxlarına tuş gəlib itgi verərək geri çəkilmişdilər.

Allah Rəsulu (s.ə.v) öz qılıncı olan Zülfiqarı qaldırıb "*haqqını ödəmək şərti ilə bu qılıncı kim alıb vuruşmaq istəyir?*" deyəndə bir çox mücahid Peyğəmbərin (s.ə.v) qılıncı ilə döyüşmək üçün irəli atılmışdı. Əbu Dücanə (r.ə) "*ey Allahın Elçisi! Onun haqqı nədir?*" deyə soruşanda Peyğəmbər (s.ə.v) ona "*bu qılıncın haqqı əlində sınana qədər vuruşmaqdır. O əlində ikən kafirin qabağından qaçmamaqdır. Onunla müsəlman öldürməməkdir. Allah sənə ya qələbə ya da şəhidlik nəsib edənə qədər Allah yolunda vuruşmaqdır bu qılıncın haqqı*" deyib Zülfiqarı Əbu Dücanəyə (r.ə) vermişdi. Zülfiqarın üzərində bu sözlər həkk edilmişdi: "*döyüşdə səbrü-səbat edənər üçün şan və izzət, qorxaqlar üçün isə ar və zillət vardır. Kişi qorxaqlığı ilə canını qədərin əlindən qurtara bilməz*". İgidliyi və şücaəti ilə tanınan Əbu Dücanə (r.ə) Uhud döyüşündə Zülfiqarla çox müşriki cəhənnəmə yollamış, düşmənin ordugahına qədər soxulmuşdu. Qəflətən Əbu Süfyanın arvadı Hind bint Utbə ilə qarşılaşmışdı. Hind Əbu Dücanənin (r.ə) onu öldürəcəyi qorxusu ilə fəryad edib çığırmağa başlayanda Əbu Dücanə (r.ə) Zülfiqarı onun başına toxundurub onu sərbəst buraxmışdı. Peyğəmbərin (s.ə.v) bibisi Safiyyənin (r.ə) oğlu Zübeyr ibn Əvvam (r.ə) Zülfiqarı almaq üçün can atanlardan biri idi. Allah Rəsulunun (s.ə.v) öz qılıncını Əbu Dücanəyə (r.ə) verməsindən sonra Zübeyr (r.ə) ona bir şey olarsa Peyğəmbərin (s.ə.v) qılıncı düşmən əlinə keçməsin deyə döyüş meydanında Əbu Dücanənin (r.ə) yanından ayrılmamışdı. Əbu Dücanənin (r.ə) Hindi öldürmədiyini görəndə dəf çalıb nəşid oxuyaraq müşrikləri döyüşə təşviq edən bu qadını niyə sərbəst buraxdığını soruşmuşdu. Əbu Dücanə (r.ə) "*qılıncı ona yaxınlaşdıranda necə qışqırdığını eşitdim. Vallahi mən Allah Rəsulunun (s.ə.v) qılıncı ilə bir qadını vurub öldürməkdən çəkindim*" deyə ona cavab vermişdi.

Əbu Süfyanın özü isə döyüş meydanında gənc mücahidlərdən Hənzələ ibn Əbu Amirlə (r.ə) qarşılaşmış və Hənzələ (r.ə) vurub onu atından yerə salmışdı. Hənzələ (r.ə) yerə yıxdığı Əbu Süfyanın sinəsinə çöküb qılıncını boğazına dayayaraq başını kəsmək istəyir, Əbu Süfyan isə bir yandan onunla boğuşur, bir yandan da var gücü ilə bağırıb müşrikləri köməyə çağırırdı. Əsvəd ibn Əbi Əsvəd adlı bir müşrik onun imdadına yetişib Hənzələ ibn Əbu Amiri (r.ə) arxadan vurub şəhid etmişdi. Hənzələ (r.ə) Əbu Amir əl-Fasiqin oğlu idi. O, Uhud

döyüşündən bir gün əvvəl Mədinədə Abdullah ibn Ubeyy ibn Səlulun qızı Cəmilə (r.ə) ilə evlənmişdi.

Mücahidlərin ard-arda gerçəkləşdirdikləri həmlələrlə düşmən ordusunun cərgələri dağılmış, bu dağınıqlıq daha sonra vahimə və çaxnaşmaya çevrilmişdi. Bir neçə saat davam edən döyüşdən sonra intizamı pozulan müşrik ordusunun əsgərlərinin hər biri artıq öz canını hayına düşərək geri qaçmağa başlamışdılar. Ordudakı qadınların cəhdləri də bu qaçışın qarşısını almağa kifayət etməmişdi. Mücahidlər öz ordugahlarından xeyli aralanaraq bəziləri qaçanları təqib edir, bəziləri isə müşriklərin döyüş meydanında qalmış əşyalarını qənimət olaraq toplayırdılar. Qaçan müşriklərdən Siba ibn Umm Ənmar adlı biri Həmzə ibn Əbdülmüttəlibin (r.ə) gözünə dəymişdi. Həmzə (r.ə) dərhal onu təqib edərək "*ey qadın sünnətçisinin oğlu Allaha və Rəsuluna (s.ə.v) meydan oxuyan sən idinmi?*" deyib qılıncını onun boynunun ardına endirdi və Siba kötük kimi yerə yıxılıb qaldı. Siba döyüşdən əvvəl meydanda qılıncını havada fırladaraq "*sizlərdən mənim qabağıma çaxa bilən varmı?*" deyə meydan oxumuşdu. Sibanı qətlə yetirən Həmzə (r.ə) Cubeyr ibn Mut'imin zənci köləsi Vəhşi ibn Hərbi görən kimi onun üstünə şığımış, lakin ayağı bir çuxura düşərək arxası üstə yıxılmışdı. Yıxılarkən Həmzənin (r.ə) zirehi qarın hissəsindən açılmış və Vəhşi bunu fürsət bilərək əlindəki nizəni həmin yerə sancmışdı. Nizənin ucu Həmzənin (r.ə) onurğasından çıxmış və o, şəhid olmuşdu. Peyğəmbərin (s.ə.v) əmisi Əsədullah, yəni Allahın aslanı ləqəbi ilə tanınan Həmzə ibn Əbdülmüttəlib (r.ə) mərdliyi, şücaəti və qorxmazlığı ilə ad çıxarmış bir igid idi.

Uzaqdan müşrik ordusunun qaçmağa üz qoyduğunu görən Əyneyn dağındakı oxçular artıq qəti qələbə qazanıldığını düşünərək döyüş meydanına yetişmək üçün dağdan aşağı enməyə başladılar. Başçıları olan Abdullah ibn Cübeyrin (r.ə) Peyğəmbərin (s.ə.v) təlimatını xatırladıb ciddi cəhdlə onları döyüş mövqelərinə qaytarmağa çalışmasının faydası olmadı. Abdullah ibn Cübeyrin (r.ə) yanında onun əmrinə itaət edən sadəcə on mücahid qaldı. Xalid ibn Vəlidin başçılıq etdiyi müşrik süvariləri bunu fürsət bilərək dərhal hücuma keçdilər. Abdullah ibn Cübeyr (r.ə) yanındakı on oxçu ilə onlara ox yağdırdı. Süvarilərlə üzbəüz qalanda isə onlar hamısı şəhid olana qədər qılıncları ilə düşmənə müqavimət göstərdilər. Süvarilərinin İslam ordusuna soldan və arxadan hücum etdiyini görən Əbu Süfyan müşrik ordusunun piyadalarını geri qayıdıb hücuma keçməyə təşviq etdi. Beləcə öz ordugahlarından xeyli aralanmış mücahidlər düşmən məngənəsində qaldılar. Bu dəfə İslam ordusunda çaxnaşma və təlaş başladı. Hətta o səviyyəyə çatdı ki, müchidlərdən bəziləri bir-birini düşmənlə səhv salaraq vurub öldürmüşdülər. İslam ordusu pərən-pərən oldu.

Belə ki, Allah Rəsulunun (s.ə.v) ətrafında sadəcə on dörd mücahid qalmışdı. Onlar Peyğəmbərin (s.ə.v) ətrafında sıx halqa qurub onu ox, nizə, daş hücumundan qoruyurdular. Bu on dörd nəfərin mühacirdən olanları Əbu Bəkr (r.ə), Əli ibn Əbu Talib (r.ə), Əbdürrəhman ibn Əvf (r.ə), Sə'd ibn Əbu Vəqqas (r.ə), Təlhə ibn Übeydullah (r.ə), Əbu Ubeydə Amir ibn Abdullah ibn Cərrah (r.ə), Zübeyr ibn Əvvam (r.ə), ənsardan olanları isə Hübab ibn Munzir (r.ə), Əbu Dücanə (r.ə), Asim ibn Sabit (r.ə), Haris ibn Simmə (r.ə), Sə'd ibn Muaz (r.ə), Useyd ibn Hudeyr (r.ə), Səhl ibn Huneyf (r.ə) idilər. Allah onların hamısından razı olsun. Mus'ab ibn Umeyri (r.ə) şəhid etmiş müşrik onun Peyğəmbər (s.ə.v) olduğunu zənn edərək "*Muhəmmədi öldürdüm, Muhəmmədi öldürdüm*" deyə bağırmağa başlayanda İslam ordusundakı çaxnaşma son həddinə çatdı. Allah Rəsulu (s.ə.v) yaralı idi. Alt çənəsinin sağ tərəfində bir dişi sınmış, dəbilqəsinə dəyən zərbə ilə dəbilqənin iki halqası yanaqlarının üst hissəsinə batmışdı. Onun öldüyü xəbərini eşidən bəzi mücahidlər artıq vuruşmağın faydası olmadığını düşünmüşdülərsə, bəziləri də Ənəs ibn Nəzir (r.ə) kimi "*Muhəmmədin (s.ə.v) olmadığı həyatda mənim də yaşamağımın bir mənası yoxdur*" deyib şəhid olana qədər vuruşmuşdular. Ənəs ibn Nəzirın (r.ə) bədənində 70-ə qədər yara izi var idi.

Peyğəmbər (s.ə.v) onun öldürüldüyü barədə yalan xəbərin çaxnaşmanı qızışdırdığını görüb "*ey Allahın qulları, ey Allahın qullari*" deyib uca səslə mücahidlərə səslənməyə başladı. Onun səsini tanıyanlar dərhal ətrafında toplaşmağa başlayaraq döyüş nizamını bərpa etməyə çalışmışdılar. Kə'b ibn Malikin (r.ə) Peyğəmbərin (s.ə.v) səsini eşidib "*Allahın Elçisi buradadır*" deyə gur səsi ilə bağırması ilə İslam ordusundakı dağınıqlıq böyük ölçüdə aradan qalxmışdı. Allah Rəsulu (s.ə.v) ətrafında toplanan mücahidlərlə müşriklərin mühasirəsini yararaq döyüş meydanından Uhud dağına tərəf çəkilməyə çalışırdı. Nəhayət onlar Uhuddakı yüksəkliklərdən birinə çıxıb mövqelərini möhkəmləndirə bilmişdilər. Peyğəmbər (s.ə.v) mücahidlərin əhatəsində Uhuddakı yüksəkliyə tərəf irəliləyərkən Übeyy ibn Xələf adlı məkkəli müşrik "*ey Muhəmməd! Əgər sən qurtulsan mənə qurtuluş yoxdur*" deyə bağıraraq onlara tərəf gəlməkdə idi. Übeyy ibn Xələf Bədrdə əsir düşüb qurtuluş fidyəsi ödəyərək azad olan Qüreyş zadəganlarından idi. O, qurtuluş fidyəsini ödəyib Mədinədən getməyə hazırlaşarkən Peyğəmbərə (s.ə.v) "*ey Muhəmməd, bilirsənmi? Mənim bir atım var, onu hər gün özüm yemləyirəm, bir gün o atın belində sənə hücum edib öldürəcəyəm*" demiş, Allah Rəsulu (s.ə.v) da ona "*xeyr! Bəlkə inşaAllah mən səni öldürdüm*" deyə cavab vermişdi. Übeyy Məkkədən Uhuda yola çıxarkən Peyğəmbəri (s.ə.v) öldürmək üçün and içmiş dörd müşrikdən biri idi. İndi bu andını yerinə yetirmək üçün həmin atın belində Peyğəmbərə (s.ə.v) tərəf

çapmaqda idi. Mücahidlər "*ey Allahın Elçisi! Bizdən birinin onunla vuruşmasını istəyirsənmi?*" deyəndə Peyğəmbər (s.ə.v) "*xeyr, buraxın onu gəlsin*" deyərək Haris ibn Simmənin (r.ə) qısa nizəsini alaraq Übeyyin üstünə getdi. Muhəmmədin (s.ə.v) heybətindən qorxan Übeyy birdən birə atını döndərib geri qaçmağa başladı. Peyğəmbər (s.ə.v) "*ey yalançı! Hara qaçırsan?*" deyib nizəni ona atdı. Nizə Übeyyin dəbilqəsi ilə zirehi arasındakı açıq yerdən boyunu kəsib keçdi. Übeyy böyürərək atından yerə yıxıldı və bir neçə qabırğasını sındırdı. Sonra da ağrıdan zarıya-zarıya özünü müşrik dostlarına çatdırdı. Dostları onun yarasına baxıb bu yüngül yaradan ötürü bu qədər zarımağa dəymədiyini deyəndə Übeyy "*Uzzaya and olsun Muhəmməd (s.ə.v) mənə tərəf elə gəldi ki, üstümə tüpürsəydi öləcəkdim*" deyə cavab vermişdi. Yarası iltihablanan Übeyy Məkkəyə çatmamış yolda ölmüşdü.

Qüreyşin müşrik qadınları şəhid mücahidlərin bədən üzvlərini kəsmişdilər. Hind bint Utbə Bədrdə atasını öldürmüş Həmzə ibn Əbdülmuttəlibin (r.ə) sinəsini yararaq ciyərini çıxarıb çeynəmiş və şəhidlərin kəsilmiş qulaq və burunlarından boyunbağı düzəldib boynuna asmışdı. Peyğəmbərin (s.ə.v) bibisi Safiyyə (r.ə) qardaşı Həmzənin (r.ə) başına gələnləri eşidəndə Uhuda gəlib cənazəsini görmək istəmişdi. Peyğəmbər (s.ə.v) Zübeyr ibn Əvvama (r.ə) "*ananı qoyma qardaşının başına gətiriləni görsün*" dedi. Zübeyrin (r.ə) "*anacan, Peyğəmbər (s.ə.v) sənin cənazəni görməni istəmir, geri qayıtmanı istəyir*" sözünə Safiyyə (r.ə) "*niyə geri qayıdım? Mən qardaşımın cəsədinin başına gətirilənləri eşitmişəm. O, Allah yolunda bu müsibətə uğrayıb. Biz buna razıyıq. Mən mükafatını Allahdan umaraq inşaAllah buna səbr edəcəyəm*" deyə cavab vermişdi. Allah Rəsulunun (s.ə.v) iznindən sonra Zübeyr (r.ə) anasını öz dayısının cəsədinin yanına gətirdi. Safiyyə (r.ə) qardaşı Həmzənin (r.ə) parçalanmış cəsədinə baxıb "*inna lillahi və inna ileyhi raciun*" demişdi.

Hicrətin üçüncü ili şəvval ayının 11-i (26 mart 625) Uhud dağı ətəyində baş vermiş bu döyüşdə 70 mücahid şəhid olmuşdu. Müsəlmanlardan müşriklərə təslim olan və əsir düşən olmamışdı. Döyüş meydanında müşriklərdən 22-sinin cəsədi qalmışdı. Müşriklər ölülərini dəfn edəndən sonra Uhud dağı ətrafından çəkilib getmişdilər. Onlar rahatlıqla müdafiəsiz qalmış Mədinəyə girib şəhəri işğal edə və şəhərdəki müsəlmanlara qanlı divan tuta bilərdilər. Lakin Allahın lütfü olaraq müşriklər belə bir fikrə düşmədilər. Hətta döyüşün olduğu gün orada gecələmədən Məkkəyə doğru yola çıxdılar. Bəlkə də müsəlmanların yenidən toplanıb gecə vaxtı onlara basqın edə biləcəklərindən ehtiyat etmişdilər. Müşrikələrin çəkilib getməsindən sonra Allah Rəsulunun (s.ə.v) əmri ilə şəhidlər Uhud dağı ətəyində dəfn edildilər. İslam ordusu məğlub, yorğun və

döyüşçülərinin əksəriyyəti yaralı olaraq Mədinəyə geri qayıtmışdı. Mədinədəki müsəlman ailələrdə kədər və yas vardı. Yəhudilər və münafiqlər isə sevinc içində idilər. Onların məmnuniyyəti üzlərindən bilinir və dilə gətirdikləri sözlərində əks olunurdu. Mədinədə nifaq və fitnə-fəsad qazanı qaynamağa başlamışdı. Abdullah ibn Übeyy əgər onlar da Şeyxeyndən geri qayıtsaydılar bütün bunların başlarına gəlməyəcəyini söyləyirdi. Mədinə yəhudiləri isə sevindiklərindən az qala bayram edəcəkdilər.

**إِنْ تَمْسَسْكُمْ حَسَنَةٌ تَسُؤْهُمْ وَإِنْ تُصِبْكُمْ سَيِّئَةٌ يَفْرَحُوا بِهَا وَإِنْ تَصْبِرُوا وَتَتَّقُوا لَا يَضُرُّكُمْ كَيْدُهُمْ شَيْئًا إِنَّ اللَّهَ بِمَا يَعْمَلُونَ مُحِيطٌ**

*“Sizə bir mənfəət yetişəndə onlar qəmgin olur, sizə bir zərər toxunanda isə ona sevinirlər. Əgər səbr edib özünüzü qorusanız (Allahdan qorxsanız), onların hiyləsi sizə heç bir zərər yetirməz. Şübhəsiz ki, Allah onların nə etdiklərini biləndir”.* (Ali-İmran surəsi 120)

**وَإِنَّ مِنْكُمْ لَمَنْ لَيُبَطِّئَنَّ فَإِنْ أَصَابَتْكُمْ مُصِيبَةٌ قَالَ قَدْ أَنْعَمَ اللَّهُ عَلَيَّ إِذْ لَمْ أَكُنْ مَعَهُمْ شَهِيدًا وَلَئِنْ أَصَابَكُمْ فَضْلٌ مِنَ اللَّهِ لَيَقُولَنَّ كَأَنْ لَمْ تَكُنْ بَيْنَكُمْ وَبَيْنَهُ مَوَدَّةٌ يَا لَيْتَنِي كُنْتُ مَعَهُمْ فَأَفُوزَ فَوْزًا عَظِيمًا**

*“Aranızda elələri də (münafiqlər) vardır ki, (siz cihada çıxdıqda) ağır tərpənər və əgər sizə bir müsibət üz versə: “Allah mənə lütf etdi ki, onlarla birlikdə (döyüşdə) olmadım”, - deyər. Əgər Allah tərəfindən sizə bir nemət (qalibiyyət) yetişərsə, o zaman guya aranızda heç bir dostluq yoxmuş kimi: “Kaş ki, mən də onlarla birlikdə olub böyük bir qənimət əldə edəydim!” (söyləyərlər)”.* (Nisa surəsi 72-73)

Allah Rəsulu (s.ə.v) həm zəif və məğlub görünüb daxildəki düşmənləri sevindirməmək, həm də ətraf qəbilələr nəzdindəki nüfuzunu qorumaq məqsədiylə İslam ordusunu yenidən səfərbər edib yola çıxdı. Mücahidlərdən əksəriyyəti kimi ağır, kimi yüngül dərəcədə yaralı idilər. Buna baxmayaraq əzmlə Qüreyş ordusunun ardınca getdilər. Bu vaxt Qüreyş müşriklərinin ordusu Rəvha adlanan yerə çataraq düşərgə qurmuşdu. Yavaş-yavaş ağılları başlarına gələn müşrik liderlərindən İkrimə ibn Əbu Cəhl “*nə əldə etdik ki, geri qayıdırıq? Qələbə bizim ikən hamısının işini niyə bitirmədik? Birazdan onlar yenə özlərinə gələcəklər. Gəlin geri qayıdıb Mədinəni talan edək*” deyirdi. Əbu Süfyan isə ona belə cavab vermişdi: “*bu qədər adamını itirən Əvs və Xəzrəc bizi görən kimi qisas almaq üçün əlindən gələn hər şeyi edəcəkdir. Geri qayıtsaq öz ayağımızla ölümə getmiş olarıq. Məncə əldə etdiyimizlə Məkkəyə qayıtsaq hamı üçün yaxşı olacaq*”. Lakin Əbu Süfyan istəksiz olaraq çoxluğun fikrinə görə əməl

etdi və geri Mədinəyə qayıtmağa qərar verdi. Bu vaxt Mədinə istiqamətindən Məkkəyə doğru getməkdə olan Mə'bəd əl-Xuzai adlı bir şəxs Rəvhaya çatmış və Əbu Süfyanla görüşmüşdü. Əbu Süfyan ondan Mədinədəki vəziyyəti xəbər alanda Mə'bəd dedi:

- *"Muhəmməd (s.ə.v) böyük bir ordu ilə yola çıxıb üstünüzə gəlir. Uhudda iştirak edə bilməyənlər də qisas odu ilə yanaraq ona qoşulub gəlirlər".*

- *Bu necə ola bilər? Onlarda taqət qalıb ki, bizi təqib də edirlər?*

- *Necə olub bilmirəm, amma mən onların süvarilərini Həmraü'l-Əsvəddə gördüm, çox keçməz buraya çatarlar.*

Əbu Süfyan müşkül vəziyyətə düşmüşdü. Ordusundakıların bir çoxu müharibədə üstünlük qazandıqları halda heç bir məqsədə nail olmadan Məkkəyə qayıtmaq istəmirdi. Lakin ikinci bir döyüşə girib məğlub olmağı da arzu etmirdilər. Qəti qərara gəlmək üçün vaxta ehtiyacı var idi və Əbu Süfyan "*Qüreyş ordusu geri qayıdıb Mədinəyə basqın edəcək*" şayiəsini yayıb nəticəsini gözləməyə başladı. Əgər müsəlmanlar bu xəbəri eşidib Mədinəni müdafiə etmək üçün qayıtsalar deməli yeni bir meydan döyüşünə cəsarət edə bilməyəcək qədər zəifdirlər. Yox əgər yerlərində qalsalar deməli yeni bir döyüş üçün kifayət qədər güclüdülər. Allah Rəsulu (s.ə.v) Əbu Süfyanın hiyləsinin anlamışdı. Buna görə də şayiə gəlib çatandan sonra ordusu ilə üç gün Həmraü'l-Əsvəd adlanan yerdəki düşərgədə qaldı. Xüsusilə gecələr çox sayıda ocaq yandırtaraq müsəlman döyüşçülərin sayının çox olduğu fikrini təlqin etməyə çalışdı. Əbu Süfyan Mədinəyə qayıtmağın təhlükəli olacağından əmin olandan sonra Məkkə yolunu tutdu.

Müşrik ordusunun bu şəkildə təqib edilməsi faydalı olmuşdu. Bu həm mücahidlərin əhval ruhiyyəsinə müsbət təsir göstərib onların zehnindəki məğlubluq düşüncəsini dağıltmış, həm də müsəlmanların ətraf qəbilələr üzərindəki nüfuz və etimadını bərpa etmişdi. Buna baxmayaraq müsəlmanlar Uhud döyüşündən lazımi dərsi almışdılar. Allah Rəsulunun (s.ə.v) rəyindən fərqi fikirlə hərəkət etmənin cəzasının nə qədər ağır olduğunu hər biri şəxsən yaşamış, şahidi olmuşdular. Allah Rəsulunun (s.ə.v) aldığı qərara əks olaraq açıq döyüş tələb etmənin, daha sonra da zəfər sevincinə qapılaraq Peyğəmbərin (s.ə.v) təlamatını unudub döyüş mövqeyini tərk etmənin necə ağır hadisələrlə nəticələnməsi hamıya dərs olmuşdu.

وَمَا أَصَابَكُمْ مِنْ مُصِيبَةٍ فَبِمَا كَسَبَتْ أَيْدِيكُمْ وَيَعْفُو عَنْ كَثِيرٍ

*"Sizə üz verən hər bir müsibət öz əllərinizlə qazandığınız günahların (etdiyiniz əməllərin) ucbatındandır! (Bütün bunlara baxmayaraq) Allah (günahlarınızın) çoxunu əfv edər".* (Şura surəsi 30).

Qur'ani-Kərimin Ali-İmran surəsində Uhud döyüşü ilə bağlı altımışdan çox ayə mövcuddur. İllər sonra Misvər ibn Məhrəmə (r.ə) Uhud döyüşü haqqında soruşanda Əbdürrəhman ibn Əvf (r.ə) ona "*Ali-İmran surəsini 120-ci ayəsindən sonra oxu, bizimlə birlikdə Uhudda olmuş kimi olarsan*" deyə cavab vermişdi.

Uhud döyüşünə qədər müsəlmanlar ölənlərin qoyduqları mirasa köhnə cahiliyyə ənənəsinə uyğun olaraq sahib olurdular. Uhud döyüşündə şəhid olmuş Sə'd ibn Rəbi'nin (r.ə) mirası ilə bağlı meydana gəlmiş məsələ uca Allahın öz Rəsuluna (s.ə.v) Nisa surəsinin 11-12-ci ayələrini vəhy etməsi ilə həllini tapmış, beləcə İslam miras hüququnun təməli təsbit edilmişdi. Həmin il həmçinin sərxoşluq verən hər maddənin haram edilməsinə və müşrik qadınlarla evlənmənin qadağan edilməsinə dair ayələr də nazil edilmişdi. Peyğəmbərin (s.ə.v) qızı Fatimə (r.ə) ilə Əlinin (r.ə) ilk övldları Həsən (r.ə) də həmin il dünyaya gəlmişdi.

*Rəci və Məunə Hadisələri*

Qüreyş müşriklərinin Uhuddakı qələbəsi Mədinə ətrafında yaşayan bəzi müşrik bədəviləri cürətləndirmişdi. Onlar müsəlmanların artıq Mədinəni müdafiə edə bilməyəcək qədər zəif və gücsüz olduğu zənninə qapılaraq şəhərə hücum etmək həvəsinə düşmüşdülər. Qüreyş zadəganlarının təşviqi də onların bu qafilliyini artırmışdı. Bəni-Əsəd qəbiləsinin Xüveylid oymağına mənsub müşriklərin Mədinəyə silahlı basqın təşkil edəcəkləri xəbəri göndərilən casuslar tərəfindən doğrulanmışdı. Allah Rəsulu (s.ə.v) dərhal öz bibisi oğlu Əbu Sələmə Abdullahın (r.ə) əmrinə 150 mücahid verərək Xüveylid oymağına göndərdi. Su quyularının olduğu Qutna yerdə Əbu Sələmə Abdullahın (r.ə) mücahidlərilə Xüveylid oymağına mənsub silahlılar arasında döyüş baş vermiş və müşrik bədəvilər məğlubiyyətə uğrayaraq qaçıb dağılışmışdılar. 10 gün davam etmiş Qutna səriyyəsindən sonra Əbu Sələmə (r.ə) Mədinəyə qayıtmışdı. Lakin bir müddət sonra onun Uhudda aldığı yaralar iltihablanmış və qanaxmanı dayandırmaq mümkün olmamışdı. Əbu Sələmə (r.ə) bir neçə ay evində bu vəziyyətdə xəstə yatandan sonra vəfat etmişdi.

Qutna səriyyəsindən qısa müddət sonra Lihyan qəbiləsinin rəisi Xalid ibn Süfyanın Mədinəyə silahlı basqına hazırlaşdığı xəbəri gəlmişdi. Allah Rəsulu (s.ə.v) əshabından Abdullah ibn Üneysi (r.ə) Xalid ibn Süfyanla danışıq üçün göndərmişdi. Xalid Abdullah ibn Üneyslə (r.ə) danışarkən hədə-qorxu gələrək basqına hazırlaşdığını gizlətməmişdi. Abdullah ibn Üneys (r.ə) Xalidlə tək qaldığı vaxt fürsətdən istifadə edib onu öldürmüş və Mədinəyə qayıtmışdı. Beləcə qığılcım alova çevrilmədən söndürülmüşdü.

Ədl və Qarrə qəbilələrinə mənsub bir neçə nəfər Mədinəyə gələrək Peyğəmbərlə (s.ə.v) görüşmüşdülər. Onlar qəbilədaşlarının İslamı öyrədəcək insanlara ehtiyac duyduqlarını bildirib Peyğəmbərdən (s.ə.v) bir neçə dəvətçi istəmişdilər. Allah Rəsulu (s.ə.v) bu cür istəkləri heç vaxt rədd etməzdi, çünki əsas məqsədi tövhidə dəvət və İslamın yayılması idi. Buna görə də suffa əshabından altı nəfər hafizi onlarla göndərmişdi. Ədl və Qarrə qəbilələrinə mənsub elçilər Mədinə yaxınlığındakı Rəci adlanan yerə çatanda altı nəfər müsəlman dəvətçini Lihyan qəbiləsinə mənsub 200 nəfərlik silahlı dəstəyə təslim etdilər. Dəvətçilər xəyanətə uğradıqlarını anlayıb müqavimət göstərdilər. Lihyanlılar dəvətçilərdən üçünü şəhid edib digər üçünü əsir götürdülər. Onlar əsir aldıqları müsəlmanları qüreyşlilərə satmaq üçün Məkkəyə aparmışdılar. Yolda müsəlman dəvətçilərdən biri qaçmağa müvəffəq oldu, lakin yaxalanıb şəhid edildi. Hubeyb ibn Ədiyy (r.ə) və Zeyd ibn Dəsinnə (r.ə) adlı müsəlman dəvətçiləri Qüreyş müşrikləri satın almışdılar. Zeydi (r.ə) Səfvan ibn Üməyyə Bədrdə öldürülmüş atası Üməyyə ibn Xələfin əvəzinə qətlə yetirmək üçün satın almışdı. O, planladığı bu cinayəti Qüreyş zadəganlarının gözünün qabağında törətmək üçün onları toplamışdı. Edam edilməzdən əvvəl müşriklərdən birinin Zeydə (r.ə) "*düzünü de, indi sənin yerinə Muhəmmədin olmasını və sənin qurtulmanı istəyərdinmi?*" deyə verdiyi suala Zeyd (r.ə) "*mənim yerimə öldürülməsinə deyil, mənim könlüm Muhəmmədin (s.ə.v) ayağına bir tikanın belə batmasına razı olmaz*" deyə hayqıraraq cavab vermişdi. Zeyd (r.ə) xaincəsinə Səfvan ibn Üməyyə tərəfindən şəhid edilmişdi. Hubeybi (r.ə) isə Haris ibn Amirin qisasını almaq üçün şəhid etmişdilər. Edamdan əvvəl iki rəkat namaz qılmaq üçün icazə istəyən Hubeyb (r.ə) "*əgər ölümdən qorxduğu üçün namazı uzadır deməyəcəyinizi bilsəydim uzun uzadı namaz qılmaq istəyərdim*" deyib şəhadətə qovuşmuşdu. İnsanlara Allahın dinini öyrətmək üçün evlərindən çıxan bu altı dəvətçinin faciəsi müsəlmanları son dərəcə mütəəssir etmiş, kədərləndirmişdi. Əshabın şairlərindən olan Həssan ibn Sabit (r.ə) bu altı dəvətçinin uğradığı xəyanəti tərənnüm edən acı bir qəsidə söyləmişdi.

Rəci faciəsinin ağrı-acısı unudulmadan müsəlmanlar daha böyük bir xəyanətə uğramışdılar. Yarımadadakı ən böyük ərəb qəbilələrindən olan Kilab qəbiləsinin Amir ibn Sə'sa oymağının başçısı Əbu Bəra Amir ibn Malik ibn Cəfər Mədinəyə gələrək Peyğəmbərlə (s.ə.v) görüşüb söhbət etmişdi. Əbu Bəra Kilab qəbiləsinin zəngin və möhtərəm adamlarından biri idi. O, Allah Rəsuluna iki at və iki dəvə hədiyyə də gətirmişdi. Lakin Peyğəmbər (s.ə.v) onun hədiyyəsini qəbul etməyərək belə dedi: "*ey Əbu Bəra! Mən müşrikdən hədiyyə almıram. Əgər bu hədiyyələrini qəbul etməmi istəyirsənsə iman et, müsəlman*

*ol*”. Daha sonra Allah Rəsulu (s.ə.v) Əbu Bəraya Qur’andan ayələr oxuyaraq ona İslamı izah edib tövhidə dəvət etdi. Əbu Bəranın vəziyyəti qəribə idi. O, nə İslamı qəbul etmiş, nə də ondan üz çevirmişdi. Peyğəmbərin (s.ə.v) dəvətinə cavab olaraq Əbu Bəra dedi: “*ey Muhəmməd (s.ə.v)! Mən sənin bu işini (İslamı) çox bəyənirəm və onu şərəfli bir iş sayıram. Mənim el-obam mənə arxa-dayaqdır. Nə desəm sözümə əməl edərlər. Sən əshabından bəzilərini Nəcdə göndər, qoy oradakı ərəbləri İslama dəvət etsinlər. Ümid edirəm ki, mənim qövmüm sənin dəvətinə qulaq verər. Onlar sənin dəvətinə icabət edəndən sonra sənin bu işin çox qüvvətlənər. Sən istədiyin şəxsləri Nəcdə göndər*”. Peyğəmbər (s.ə.v) Rəci hadisəsini nəzərə alaraq Əbu Bəraya bədəvilərin yanına yenidən dəvətçi göndərməkdən çəkindiyini söyləmişdi. O, müsəlman dəvətçilərə yenə xətər yetirilə biləcəyindən ehtiyat edirdi. Lakin Əbu Bəra dəvətçiləri öz himayəsi altına alaraq təlükəsizliklərinə cavabdeh olduğunu söyləmiş və Peyğəmbər (s.ə.v) də onun bu təklifini qəbul etmişdi. Nəcd ərəbləri, ələlxüsus Kilab qəbiləsi və bu qəbilənin oymaqları arasında böyük nufuza sahib olan Əbu Bəranın belə əminliklə zəmanət verməsindən sonra Allah Rəsulu (s.ə.v) əshabından Qur’an hafizi olan bəzi şəxsləri seçib Nəcd bədəvilərini irşad üçün göndərdi. Mənbələr İslam dəvətçilərinin sayı haqqında müxtəlif məlumatlar verməkdədir. Onların 30, 40 və 70 nəfər olduqlarına dair məlumatlar qeyd edilməkdədir. Lakin tarixçilərin əksəriyyətinin fikrincə Kilab qəbiləsinə İslamı öyrətmək üçün göndərilən dəvətçilərin sayı dördü mühacirdən, geri qalanı isə ənsardan olmaqla 40 nəfər idi. Müttəlib əs-Süleyminin bələdçiliyində yola çıxan mürşidlər Məkkə ilə Usfan arasında yerləşən, Bəni-Amir qəbiləsinin yurdu ilə Bəni-Süleym qəbiləsinin yurdu arasında olan Məunə su quyularına gəlib çatdılar. Onlar dəvələrini buradakı otlağa buraxıb Əmr ibn Üməyyə (r.ə) və Munzir ibn Muhəmmədi (r.ə) gözətçi qoydular. Digərləri isə dincəlmək üçün Məunədəki mağaralardan birinə yığışdılar. Aralarından Hiram ibn Milhan (r.ə) Allah Rəsulunun (s.ə.v) məktubunu vermək və gəlişlərinin məqsədini açıqlamaq üçün Bəni-Amirin yurduna getdi. Bu qəbilənin rəisi Amir ibn Tufeyl ibn Malik, Əbu Bəranın qardaşının oğlu idi. Amir ibn Tufeyl Peyğəmbərin (s.ə.v) məktubunu heç açıb oxumadı belə. Hiram ibn Milhan (r.ə) onunla söhbətə başlayarkən o, əvvəlcədən hazırladığı adamına işarə etdi. Həmin şəxs də Hiramın (r.ə) arxasına keçib nizəsini onun kürəyinə sancaraq ucunu sinəsindən çıxardı. Hiram ibn Milhan (r.ə) sadəcə “*Allahu Əkbər! Kə’bənin Rəbbinə and olsun ki, udan mən oldum*” deyə bildi və üzüqoyulu yıxılıb şəhid oldu. Amir ibn Tüfeyl öz qəbilədaşlarına Hiramın (r.ə) tək olmadığını söyləyib onunla birlikdə olan müsəlmanları da öldürmək lazım gəldiyini desə də onlar Əbu

Bəranın himayə etdiyi şəxslərə toxunmaqdan çəkindilər. Belədə Amir ibn Tüfeyl Bəni-Süleym qəbiləsinə mənsub Ri'l, Zəkvan və Usəyyə oymaqlarından topladığı müşriklərlə birlikdə Məunə quyularının yanında düşərgə salmış müsəlman dəvətçiləri tapıb mühasirəyə aldı. Dəvətçilər onları əhatəyə almış müşriklərə buraya gəlməkdə məqsədlərinin sadəcə onları irşad etmək olduğunu söyləsələr də faydası olmadı. Müsəlmanlar zirehsiz, silahsız və təchizatsız idilər. Bəzilərinin yanında sadəcə yalın qılıncı vardı. Allah Rəsulunun (s.ə.v) dəvətçiləri son nəfəslərinə qədər müşriklərlə mübarizə apararaq hamısı şəhid olmuşdular. Dəvələri otarmaqda olan Əmr ibn Üməyyə (r.ə) və Munzir ibn Muhəmməd (r.ə) düşərgəyə qayıdanda yoldaşlarının uğradıqları müsibəti gördülər. Munzir ibn Muhəmməd (r.ə) "*mən onların şəhid olduqları yedən sağ qayıdıb ölüm xəbərlərini verə bilmərəm*" deyib dostlarının qatili olan müşrikləri axtarmaq üçün getmiş, onlara çatanda isə şəhid olana qədər Amir ibn Tüfeylin adamları ilə vuruşmuşdu. Əmr ibn Üməyyə (r.ə) isə müşriklərə əsir düşmüşdü. Onlar Mədinəyə gedib baş verənləri danışsın deyə Əmri (r.ə) öldürməyib sağ buraxdılar. Bu hadisə Uhud döyüşündən təqribən dörd ay sonra, hicri 4-cü il səfər ayının ortalarında (21-31 iyul 625) baş vermişdi. Əbu Bəra bu hadisəni eşidəndə son dərəcə mütəəssir olmuşdu. O, oğlu Rəbiəyə öz xain qardaşı oğlunu öldürməyi tapşırdı. Rəbiə əmisi oğlu Amir ibn Tufeyli vurub ağır şəkildə yaralasa da o, bu yaradan ölməyib sağ qalmışdı.

Məunə qətliamından qısa müddət sonra Əbu Süfyanın muzdla tutduğu bir sui-qəsdçi Mədinəyə gələrək Allah Rəsulunu (s.ə.v) öldürməyə təşəbbüs etmişdi. Lakin Peyğəmbərin (s.ə.v) Allahın lütfü ilə onu hər kəsin arasında ifşa etməsilə sui-qəsd baş tutmamışdı. Bədəvi ərəb qəbilələrindən birinə mənsub bu şəxsi Allah Rəsulu (s.ə.v) əvf etmiş, həmin şəxs də İslamı qəbul edərək müsəlman olmuş və yurduna geri qayıtmışdı.

*Yəhudi İcmaları İlə Münasibətlər*

Uhud döyüşü, Rəci və Mənunə hadisələri Mədinədəki münafiqləri və yəhudiləri xeyli cəsarətləndirmişdi. Mədinə yəhudiləri sanki əhdnaməni unutmuşdular. Onlar Qüreyş müşrikləriylə əvvəlki tək sərbəst əlaqə saxlayır, ticarət edir, fürsət düşdükcə onları müsəlmanların əleyhinə təşviq edirdilər. Bəni-Nəzir yəhudiləri Əbu Süfyanın təşviqilə Allah Rəsuluna (s.ə.v) sui-qəsd təşkil etmək istəmişdilər. Onlar öz alimlərilə dini mövzuda müzakirə və münazirə etmək bəhanəsilə Allah Rəsulunu (s.ə.v) üç nəfər bilikli səhabəsi ilə birlikdə öz məhəllələrinə dəvət etmişdilər. Plana görə burada əvvəlcədən hazırlaşmış bir neçə nəfər sui-qəsdçi xəncərlərlə Peyğəmbərin (s.ə.v) üstünə atılaraq onu öldürəcəkdilər. Lakin onların

sui-qəsd planı baş tutmadı. İslamı qəbul edib imanını öz qövmündən gizləyən yəhudi mənşəli müsəlman bir qadın Allah Rəsulunu (s.ə.v) Bəni-Nəzirin bu çirkin oyunundan xəbərdar etmişdi. Peyğəmbər (s.ə.v) məsələdən xəbərdar olan kimi Bəni-Nəzir məhəlləsinə getmək fikrindən daşınmışdı.

Məunə faciəsində canını sağ qurtara bilmiş Əmr ibn Üməyyə (r.ə) Mədinəyə gələrkən yolda Bəni-Amir qəbiləsindən olan iki nəfəri vurub öldürmüşdü. Halbuki Məunə quyusu yaxınında müsəlmanları qətliama uğradan Bəni-Amir qəbiləsi mənsubları deyil, Bəni-Süleym qəbiləsinə mənsub bədəvilər idilər. Yuxarıda Bəni-Amir bədəvilərinin Əbu Bəradan çəkinərək bu mövzuda öz rəislərinə itaət etmədiklərini qeyd etmişdik. Əmr ibn Üməyyənin (r.ə) öldürdüyü şəxslərin qan diyətinin ödənməsi lazım idi. Mədinə əhdnaməsinin şərtlərinə müvafiq olaraq Bəni-Nəzir yəhudiləri də məbləğin ödənməsində iştirak etməli idilər. Allah Rəsulu (s.ə.v) hicri 4-cü ilin rəbiələvvəl ayında (10 avqust-9 sentyabr 625) bir şənbə günü adəti üzrə Quba məscidində əshabına namaz qıldırandan sonra Mədinəyə qayıdarkən Bəni-Nəzir yəhudilərinin məhəlləsinə getdi. Yanında əshabdan Əbu Bəkr, Ömər ibn Xəttab, Əli ibn Əbu Talib, Zübeyr ibn Əvvam, Təlhə ibn Übeydullah, Sə'd ibn Muaz, Useyd ibn Hudeyr və Sə'd ibn Ubadə vardı. Allah onların hamısından razı olsun. Peyğəmbərin (s.ə.v) əsas məqsədi məbləğin ödənməsində iştirak etməkdən boyun qaçıran Bəni-Nəzir yəhudilərinə əhdnamənin şərtlərini xatırlatmaq idi. Bəni-Nəzir yəhudiləri danışıq üçün hazır olduqlarını bildirərək Allah Rəsulunu (r.ə) kölgəlik bir yerə dəvət edib oturdular. Peyğəmbər (s.ə.v) Əbu Bəkr (r.ə), Ömər ibn Xəttab (r.ə), Əli ibn Əbu Taliblə (r.ə) birlikdə bir evin divarına söykənərək oturmuş, Bəni-Nəzirin liderləri ilə söhbət edirdi. Lakin Peyğəmbər (s.ə.v) gözlənilmədən yenidən qalxaraq məclisi tərk etdi. Əshabı onun qısa müddət üçün çıxdığını və qayıdacağını düşünərək yəhudilərlə oturmağa davam etdilər. Lakin Allah Rəsulunun (s.ə.v) qayıtmadığını görəndə onlar da məclisi tərk edərək onun axtarmağa başladılar. Peyğəmbərin (s.ə.v) artıq Mədinədə, məsciddə olduğunu öyrənəndə oraya getdilər. Peyğəmbər (s.ə.v) onlara Cəbrailin (r.ə) ona Allahın dərhal həmin məclisi tərk etməsini əmr etdiyi xəbərini gətirdiyini bildirdi. Bəni-Nəzir yəhudilərindən bir qrup Əmr ibn Cəhhaşın başçılığı ilə Peyğəmbərə (s.ə.v) sui-qəst təşkil etmişdilər və məqsədlərinə nail olmağa çox az qalmışdı. Əmr ibn Cəhhaş Peyğəmbərin (s.ə.v) divarına söykəndiyi evə girərək dama qalxmalı və burada gizlətdiyi böyük bir daşı Allah Rəsulunun (s.ə.v) başına ataraq onu öldüməyə cəhd etməli idi. Lakin Allahın öz Elçisini (s.ə.v) bundan xəbərdar etməsi Bəni-Nəzirin planını pozmudu. Allah Rəsulu (s.ə.v) ənsardan Muhəmməd ibn Məsləməni (r.ə) çağırıb Bəni-Nəzir yəhudilərinin yanına gönərdi. Peyğəmbər (s.ə.v) on gün içində on-

ların Mədinəni tərk edərək şəhərdən şimaldakı Xeybərə və ya Şam diyarına getmələrini tələb etməkdə idi. Muhəmməd ibn Məsləmə (r.ə) onlara bu xəbəri gətirəndə Bəni-Nəzirin liderləri bu xəbəri təəccüblə qarşılayıb etiraz etməyə başlamışdılar. Lakin Muhəmməd ibn Məsləmə (r.ə) Allah Rəslunun (s.ə.v) onların qurduqları plandan xəbərdar olduğunu söyləyəndə yəhudilər başlarını aşağı salıb susmuşdular. Allah Rəsulunun (s.ə.v) tələbini qəbul edərək Mədinəni tərk etməkdən başqa çarələrinin olmadığını anlamışdılar. Buna görə də köç hazırlıqlarına başladılar. Lakin münafiqlərin lideri Abdullah ibn Ubeyy ibn Səlul məsələdən hali olan kimi onlara yerlərindən tərpənməyərək müqavimət göstərmələri barədə xəbər göndərmişdi. Abdullah ibn Ubeyy özünün də iki min nəfər döyüşçü ilə onların müdafiəsinə gələcəyini bildirməsindən sonra Bəni-Nəzir ürəklənərək köç fikrindən daşınmış və müharibəyə hazırlaşmağa başlamışdı. Bəni-Nəzirin lideri olan Huyey ibn Əxtab "*biz yurdumuzu və əmlakımızı tərk edib getməyəcəyik, əlindən gələni edə bilərsən*" deyə Peyğəmbərə (s.ə.v) xəbər göndərdi. Sonra isə yəhudilər istehkamlarında möhkəmlənib ərzaq, su, silah və.s təchizat toplayaraq döyüşə hazırlaşmağa başladılar. Bəni-Nəzir yəhudilərinin din xadimlərindən və alimlərindən olan Əbu Ğənəm Səllam ibn Mişkəm, Huyey ibn Əxtaba "*belə etmə ey Huyey! Sən də çox yaxşı bilirsən ki, Muhəmməd (s.ə.v) həqiqətən hamımızın gəlişini gözlədiyi Allahın elçisidir. Əgər onunla vuruşsaq Allah ona yardım edəcək. Bu istehkamlar və divarlar səni Allahın qəzəbindən qoruya bilməyəcək. Canımız da, malımız da, şərəfimiz də əlimizdən gedəcək*" deyərək silaha əl atmaqdan çəkindirmək istədisə də bunun heç bir faydası olmadı, münafiqlərlə müşriklərə arxanan Huyey ibn Əxtabı fikrindən daşındıra bilmədi.

Allah Rəsulu (s.ə.v) kitab əhli olan yəhudi və xristianları İslama dəvət edərkən onların din xadimlərindən risalət məsələsi barədə öz kitablarında yazılanlara əməl etməyə, kitablarında yazılı olanları insanlardan gizləməməyə, bu mövzuda insaflı və ədalətli olmağa çağırırdı. Bu haqda Allah kitab əhlinə Qur'anın Maidə surəsi 15-ci ayəsində belə deyilirdi:

يَا أَهْلَ الْكِتَابِ قَدْ جَاءَكُمْ رَسُولُنَا يُبَيِّنُ لَكُمْ كَثِيرًا مِمَّا كُنْتُمْ تُخْفُونَ مِنَ الْكِتَابِ وَيَعْفُو عَنْ كَثِيرٍ قَدْ
جَاءَكُمْ مِنَ اللَّهِ نُورٌ وَكِتَابٌ مُبِينٌ

"*Ey kitab əhli! Sizə kitabda (Tövratda və İncildə) gizlətdiyiniz şeylərin bir çoxunu bildirən, bir çoxunu da sizə bağışlayıb üstünü vurmayan Peyğəmbərimiz gəldi. Artıq Allah tərəfindən sizə bir nur və açıq-aydın bir Kitab (Qur'an) gəldi*".

Allah Rəsulu (s.ə.v) onları başqa bir şeyə məcbur etmir, sadəcə öz kitablarında risalət və son peyğəmbər barədəki xəbərləri gizləməmələrini, açıqlamalarını və təsdiqləmələrini istəyirdi. Allah Rəsulu (s.ə.v) bilirdi ki, hahamlar və rahiblər onun həqiqətən Allahın son Elçisi (s.ə.v) olduğunu insanlar arasında ən yaxşı bilənlərdir. Allah Qur'anda bunu gözəl bir bənzətmə ilə bəyan etməkdədir. Bəqərə surəsi 146-cı ayədə əhli-kitabın din alimlərinin onu bir atanın öz oğlunu tanıdığı kimi yaxşı tanıdıqlarını, lakin bunu gizlədiklərini bildirilməkdədir:

الذِينَ آتَيْنَاهُمُ الْكِتَابَ يَعْرِفُونَهُ كَمَا يَعْرِفُونَ أَبْنَاءَهُمْ وَإِنَّ فَرِيقًا مِّنْهُمْ لَيَكْتُمُونَ الْحَقَّ وَهُمْ يَعْلَمُونَ

"*Kitab (Tövrat və İncil) verdiyimiz şəxslər onu (Muhəmmədi) öz oğullarını tanıdıqları kimi tanıyırlar. (Buna baxmayaraq) onların bir qismi, şübhəsiz ki, həqiqəti bilə-bilə gizlədir*".

Allah Rəsulu (s.ə.v) Bəni-Nəzirin döyüşə hazırlaşdığı xəbərini alan kimi dərhal müsəlmanlara səfərbərlik əmri verdi. Hicri 4-cü ilin rəbiələvvəl ayının 12-sində (21 avqust 625) İslam ordusu Mədinədən çıxaraq Bəni-Nəzir istehkamlarını mühasirəyə aldı. 20 gün davam edən döyüşlər müsəlmanların qələbəsilə başa çatmışdı. Nə münafiqlər, nə də müşriklər vəd etdikləri köməyi göstərmədilər. Bəni-Nəzir döyüşçülərinin arxasına sığındıqları istehkam divarları bir-bir mücahidlər tərəfindən zəbt edildi. Peyğəmbər (s.ə.v) ələ keçirilən istehkamlardan bəzilərini yıxdırdı. Yəhudilərə göz dağı vermək üçün onlara məxsus xurmalıqlarının bir hissəsi doğranaraq yandırıldı. Bu onların Mədinədə qala bilmə ümidlərinin bitməsi üçün edilmişdi. Gücü tükənib iradəsi sınan Bəni-Nəzirin liderləri sülh istəyib Peyğəmbərin (s.ə.v) əvvəlcə etdiyi köç təklifini qəbul etdiklərini bildirdilər. Münafiqlərin lideri Abdullah ibn Ubeyy onların sülh istəklərini qəbul edib canlarını bağışlaması üçün Peyğəmbərə (s.ə.v) yalvarıb yaxarmışdı. Allah Rəsulu (s.ə.v) üç nəfərin bir dəvəyə əşyasını yükləmələri və silah-sursatlarını qoyub getmələri şərtilə onların sülh istəyini qəbul etdi. Bəni-Nəzir yəhudiləri daşıya bildikləri bütün əşyalarını 600 dəvəyə yüklədilər. Ələlxüsus sahib olduqları xeyli miqdarda qızıl, gümüş və qiymətli əşyaları özləriylə götürməyə çalışmışdılar. Tərk etdikləri evlərini isə müsəlmanların əlinə salamat keçməsin deyə damlarını uçuraraq istifadəyə yarasız hala salmışdılar. Bəni-Nəzir yəhudiləri sürgündən ötürü kədərlənmədiklərini göstərmək üçün bər-bəzəkli geyinib təbil-zurna çalaraq Mədinəni tərk etmiş, bu şəhərin 200 km şimalındakı Xeybərdə məskunlaşmışdılar. Onlardan 340 ədəd qılınc, 50 ədəd dəbilqə və zireh döyüş qəniməti olaraq müsəlmanların əlinə keçmişdi. Bundan başqa Bəni-Nəzirə məxsus əkin əraziləri, su quyuları, evlər, mülklər, istehkamlar da beytülmala keçmişdi. Allah Rəsulu (s.ə.v) onlardan qalan daşınmaz əmlakı mühacir və ənsardan

olan kasıb müsəlmanların arasında bölmüşdü. Peyğəmbər (s.ə.v) qənimət alınan daşınmaz əmlakı mühacir müsəlmanlara verməzdən əvvəl ənsarı toplamış, onlara xitab etimişdi. Allah Rəsulu (s.ə.v) ənsarın etdiyi yaxşılıqları sayıb, onların xeyir əməllərini yad etmiş, onlar üçün Allaha xeyir-dua etdikdən sonra qənimət olaraq alınan daşınmaz əmlakı mühacirlərə vermək istədiyini bildirmiş və onların fikrini soruşmuşdu. Peyğəmbər (s.ə.v) hicrətin ilk günlərində ənsarın mühacirlərə verdiyi əmlakın geri qaytarılmasını da istəmişdi. Lakin ənsar yurdlarını tərk edib gəlmiş mömin qardaşlarına verdiklərindən heç bir şeyi geri almayacaqlarını bildirərək qənimət olaraq alanımış daşınmaz əmlakın da onlara verilməsinə razı olduqlarını bildirmişdi.

Bəni-Nəzir qəzvəsi müsəlmanları maddi baxımdan dirçəltməklə yanaşı Uhud, Rəci və Məunə hadisələrinin verdiyi acını və kədəri də unutdurmuşdu. Bundan başqa bu qələbə münafiq və müşriklərin müsəlmanların əleyhinə olan ümidlərini də söndürmüşdü. Bu hadisələr Qur’ani-Kərimin Həşr surəsi 2-4-cü ayələrində öz əksini tapmışdır.

Sərxoşluq verən maddələrin haram qılınması Bəni-Nəzir qəzvəsi ilə eyni vaxta, hicri 4-cü ilin rəbiələvvəl ayına (avqust-sentyabr 625) təvafüq etməkdədir. Bu qadağadan əvvəl istər Mədinədə, istərsə də digər ərəblər arasında busr, fətx, biti, qubeyra adı ilə tanınan və üzüm, xurma, buğda, arpa, bal kimi maddələrdən hazırlanan alkoqollu, spirtli içkilər istehlak edilməkdə idi. Sərxoşluq verən məddələrin istehlakı üç mərhələdə, Bəqərə surəsi 219, Nisa surəsi 43 və Maidə surəsi 90-91-ci ayələrinin nazil olması ilə haram qılınmışdı. Maidə surəsi 90-91-ci ayələrinin nazil olmasından sonra sərxoşlq verən maddələrin istehlakı qəti olaraq haram qılınmışdı. Bu ayənin nazil olmasından sonra Allah Rəsulu (s.ə.v) “*Şübhəsiz ki, Allah içkiyə, onu hazırlayana, hazırlandığı yerə, içənə, içirənə, daşıyana, satana, satın alana, satışından əldə edilən qazancı yeyənə lənət etmişdir*” deyə buyurmuşdur.

*Bəzi Təhlükəsizlik Tədbirləri*

Yarımadadakı müşrik ərəb qəbilələri müsəlmanları əzərək yox etmək üçün heç bir fürsəti dəyərləndirməkdən çəkinmirdilər. Allah Rəsulu (s.ə.v) Ənmar, Sə’ləbə və Qətəfan qəbilələrinə mənsub müşriklərin Mədinəyə hücum etmək üçün şəhərə iki günlük məsafədə olan Zatürriqa adlanan yerdə öz qüvvələrini səfərbər edib toplamaqda olduqları xəbərini almışdı. Peyğəmbər (s.ə.v) Mədinədə öz yerinə Əbu Zərr əl-Ğifari künyə və nisbəsi ilə tanınan Cundəb ibn Cənadəni (r.ə) canişin qoyaraq dərhal 400 mücahidlə birlikdə hicri 5-ci ilin məhərrəm ayının 10-da (10 iyun 626) Mədinəni tərk edərək Zatürriqa yürüş

etdi. Müşriklər hərbi hazırlıqlarını tamamlarkən qəflətən mücahidləri qarşılarında görmüşdülər. Qəlblərinə qorxu düşən müşriklər döyüşməyə cəsarət edə bilməyərək qaçıb dağılışmış və ətrafdakı yüksəkliklərə sığınmışdılar. Zatürriqa qəzvəsi döyüşsüz, lakin müsəlmanların qəbələsi ilə başa çatmışdı.

Uhud döyüşünün müsəlmanların məğlubiyyəti ilə başa çatmasından sonra Allah Rəsulu (s.ə.v) və bir dəstə mücahid səhabə Uhuddakı yüksəkliklərdən birinə çıxıb mövqelərini möhkəmləndirə bilmişdilər. Müşrik ordusu Uhudu tərk edərkən Əbu Süfyan müsəlmanlara tərəf "*gələn il görüşəcəyimiz yer Bədrdir*" deyə bağıraraq səslənmişdi. O, bununla Bədr məğlubiyyətinin intiqamını elə həmin yerdə almaq istədiyini bildimişdi. Ömər ibn Xəttab (r.ə) da Peyğəmbərin (s.ə.v) göstərişi ilə ona "*İnşaallah gələn il qarşılaşıb döyüşəcəyimiz yer Bədr olsun*" deyə cavab vermişdi. Zatürriqa qəzvəsindən Mədinəyə qayıdandan sonra Allah Rəsulu (s.ə.v) əshabına yeni səfər üçün hazırlıq əmrini verdi. O, Əbu Süfyana verdiyi sözü yerinə yetirmək niyyətində idi. Qüreyş müşrikləri də hərbi səfər üçün hazırlaşmaqda idilər. Lakin Əbu Süfyan bu hərbi səfər üçün xeyli istəksiz davranırdı. Bununla belə verdiyi sözü yerinə yetirməyərək adına qorxaqlıq damğası vurulmasından çəkinirdi. Məkkədə hərbi səfər üçün hazırlıqlar gedərkən Nueym ibn Məs'ud əl-Əşcai adlı bir müşrik Məkkəyə Kə'bədəki bütləri ziyarətə gəlmişdi. O, Məkkəyə gələrkən qısa müddət Mədinədə qalmışdı. Əbu Süfyan onunla görüşüb Mədinədə hansı yeniliklərin olduğunu soruşdu. Nueym ona Muhəmməd (s.ə.v) və əshabının hərbi yürüş üçün səfərbər olduğunu bildirdikdə Əbu Süfyanın əhvalı tamamilə korlanmışdı. O, Allah Rəsulunun (s.ə.v) ordusu ilə qarşılaşmaq istəmirdi. Lakin söz verilən vaxtda söz verilən yerdə olmamağı da özünə sığışdıra bilmir, bunun müsəlmanlar tərəfindən olmasını gözləyirdi. Buna görə də Əbu Süfyan hiyləyə əl atdı. O, Nueym ibn Məs'uda Mədinəyə qayıdıb burada Qüreyşin böyük bir ordu təşkil edərək Bədrə getmək üçün hazırlaşdığı xəbərini yaymasını tapşırdı. Bu şayiə müsəlmanların iradə və qətiyyətinə təsir etməli idi. Müsəlmanları ikinci Bədr səfərinə çıxmaq fikrindən daşındırması müqabilində Əbu Süfyan Nueym ibn Məs'uda 20 dəvə mükafat verməyi və'd etmişdi. O, vədinə zəmanətçi olaraq Süheyl ibn Əmri göstərmiş və o, da zamin olduğunu bildirmişdi. Həqiqətən Nueym Mədinəyə gəlib burada şayiə yaymağa başladı. O, müsəlmanların yanında "*Qüreyş elə bir ordu hazırlayıb ki, sizi ondan yalnız qaçıb qurtulmaq xilas edə bilər*" kimi sözlər deyərək insanların qəlbinə qorxu və tərəddüd toxumu səpməyə başlamışdı. Münafiqlər bu şayiələrin qısa müddətdə bütün Mədinəyə yayılaraq hər evdə danışılmasına nail olmuşdular. Lakin Allah Rəslunun (s.ə.v) cəsarəti və qətiyyəti müsəlmanların qəlbindəki qorxu və tərəddüd hisslərini sil-

mişdi. Peyğəmbər (s.ə.v) "*əgər ardımca heç kim gəlməsə belə Allaha and olsun ki, mən Bədrə tək gedərəm*" deyərək öz iradəsini ortaya qoymuşdu. Peyğəmbər (s.ə.v) piyadalardan ibarət 1500 nəfərlik İslam ordusu ilə yola çıxaraq və'd edilən vaxtda Bədrə gəldi və düşərgə quraraq gözləməyə başladı. Bu vaxt Əbu Süfyanın başçılıq etdiyi 2000 nəfərlik müşrik ordusu da Məkkədən yola çıxaraq Bədrə doğru irəliləməkdə idi. Əbu Süfyan Usfana gəlib çatanda orduya istirahət verdi. Burada ona Muhəmmədin (s.ə.v) əshabı ilə birlikdə artıq onları Bədrdə gözlədiyi xəbərini gətirdilər. Bu xəbərdən son dərəcə məyus olan Əbu Süfyan, Nueym ibn Məs'udun əks-təbliğatının gözlənilən nəticəni vermədiyini anladı. O, ordudakı Qüreyş zadəganlarını toplayaraq onları vəziyyətdən hali etdi və indiki halda hərbi səfəri davam etdirmənin məqsədə müvafiq olmadığını dedi. Əbu Süfyan həmin il quraqlıq və qıtlıq olduğu üçün ordudakı əsgərlərin ərzaq, hevyanların isə ot-ələf sarıdan korluq çəkəcəyindən ehtiyatlandığını bildirərək fikrini əsaslandırmağa çalışmışdı. Allah onların qəlblərinə qorxu və tərəddüd salmışdı. Qüreyş zadəganları arasında iki fikirlilik yarandı. Bəziləri hərbi yürüşü döyüşlə başa çatdırmağın vacib olduğunu, geri qayıdılsa bunun qorxaqlıq və zəiflik sayılacağını, bunun həmçinin müsəlmanların mövqeyinin möhkəmlənməsinə xidmət edəcəyini deyirdilər. Digərləri isə zəif və tərəddüdlü halda döyüşə girməyin təhlükəli olduğunu bildirir, bunun məğlubiyyət riskini artırdığını düşünürdülər. Nəhayət onlar yekdil qərar qəbul edərək Əbu Süfyanın fikri ilə razılaşdılar. Qüreyş müşriklərinin ordusu Usfandan geri, Məkkəyə qayıtdı. Onların Usfandan geri qayıtdıqları xəbəri Bədrdə müsəlmanlara çatdı. Allah Rəsulu (s.ə.v) öz əshabı ilə səkkiz gün Bədrdə Qüreyş müşriklərinin yolunu gözləyəndən sonra geri Mədinəyə qayıtmışdı. *Bədru'l-məv'id*, yəni vədələşdirilmiş Bədr səfəri adlanan bu hərbi yürüş cəmi on altı gün davam etmiş və müsəlmanların üstünlüyü ilə sona çatmışdı.

Qüreyş zadəganlarının nüfuzu sadəcə ərəb yarımadası ilə məhdud deyildi. Onlar regional və beynəlxalq ticari əlaqələrə malik olduqları üçün yarımada xaricində də dostları və müttəfiqləri var idi. Əsasən Yəmən limanlarından aldıqları malları Şam diyarına daşıyaraq satdıqları üçün bu yerlərdə nüfuzları daha qüvvətli idi. Mədinədəki yəhudi tacirlər də müsəlmanların Mədinənin iqtisadi həyatında getdikcə daha çox paya sahib olmalarından dərin narahatlıq duyurdular. Hicrətə qədər Mədinənin iqtisadi-ticari resurslarının demək olar ki, tamamına zəngin yəhudilər nəzarət edirdilər. Hicrətdən sonra istər mühacir, istərsə də ənsardan olan tacirlər Suriya və İraq bazarları ilə əlaqələr quraraq böyük ticarət dövriyyəsi yarada bilmişdilər. Şam diyarındakı ticarət məntəqələrinə nəzarət edən Qudaə, Qəssan və Kində qəbilələrinin liderləri Qüreyş

zadəganlarının, həmçinin Mədinədəki zəngin yəhudilərin dostları idilər. Adı çəkilən bu qəbilələr əsasən xristian dininə sitayiş edirdilər. Müsəlman tacirlər də Şam diyarına gedərək buradakı bazarlarda ticarətlə məşğul olurdular. Lakin Qüreyş müşrikləri və yəhudi tacirlər dostları olan qəbilə rəislərindən müsəlman tacirlərin bu bazarlardakı ticarətinə əngəl törətmələrini təkidlə tələb etməkdə idilər. Bu səbəbdən bir çox müsəlman tacirin malları əllərindən alınmış, özləri isə təhqir və hədələrə məruz qalmışdılar. Xüsusilə Kində qəbiləsinin Dumətü'l-Cəndəldə məskun olan oymaqlarından birinə başçılıq edən Uqeydir ibn Əbdülməlik əl-Kindi müsəlmanlara qarşı amansız rəftarı ilə məşhur olmuşdu. Uqeydir və qəbiləsi xristian idilər. Dumətü'l-Cəndəl bazarı onların nəzarətində idi. Dumətü'l-Cəndəl Mədinədən 15, Dəməşqdən isə 5 günlük məsafədə, indiki İordaniya ərazisində yerləşirdi. Allah Rəsulu (s.ə.v) hazırladığı süvari qüvvə ilə hicri 5-ci ilin rəbiələvvəl ayında (avqust 626) Mədinədən yola çıxmışdı. Hərbi səfərin ediləcəyi ərazini və oraya gedən gizli yolları yaxşı tanıyan Məzkur əl-Uzri adlı bələdçi İslam ordusuna yol göstərməkdə idi. Düşmənə qəfil hücum etmək lazım idi. Həm bu səbəbdən həm də havanın çox isti olması səbəbiylə mücahidlər gecələr yol gedir, gündüzlər gizlənirdilər. Bələdçi İslam ordusunu Dumətü'l-Cəndəl əhalisinin otlaqlarına gətirib çıxardı. Mücahidlər orada rast gəldikləri kindəlilərə hücum etdilər. Qəfil hücuma uğrayan və sayca az olan düşmən qaçıb dağılmış, bir neçə nəfər əsir düşmüşdü. Dumətü'l-Cəndəl əhalisinin bütün mal-qarası qənimət olaraq ələ keçirildi. Daha sonra Dumətü'l-Cəndələ hücum edildi. Lakin oradakılar müsəlmanların hücumundan xəbərdar olan kimi yurdlarını tərk edib qaçmışdılar. Allah Rəsulu (s.ə.v) Uqeydir ibn Əbdülməlik əl-Kindinin yaxalanması üçün mücahidləri təlimatlandırmışdı. Lakin ətraf əraziləri gəzən mücahidlər kindəlilərdən heç kimə rast gələ bilmədilər. Allah Rəsulu (s.ə.v) Dumətü'l-Cəndəl hərbi səfərini qarşıya qoyulmuş əsas məqsədləri həyata keçirə bilmədən başa vurub təcili Mədinəyə qayıtmalı olmuşdu.

Məkkə ətrafındakı Xuzaə qəbiləsindən olan casuslar vasitəsilə Qüreyşin Mədinə üzərinə yeni və daha geniş çaplı bir hərbi səfərə hazırlaşdığı xəbəri alınmışdı. Bir müddət Dumətü'l-Cəndəldə qalan İslam ordusu alınan qənimətlərlə geri qayıtdı. Dumətü'l-Cəndəl qəzvəsindən qayıdan Allah Rəsulu (s.ə.v) hicri 5-ci il rəbiəlaxir ayının 21-i (18 sentyabr 626) Mədinəyə çatmışdı. Dumətü'l-Cəndəl səfəri nəticəsində şimal ticarət yolu müsəlman tacirlərin üzünə açılmış, ticarət yolu üzərində və Şam diyarında məskun olan qəbilələr müsəlmanların ticarət karvanlarına toxunmaqdan çəkinmişdilər. Bu hərbi səfər Qüreyşin təşviqilə şimaldan Mədinəyə hücum etmək istəyən Qudaə və Qəssan qəbilələrinin də gözünü qorxutmuş və onları bu fikirdən daşındırmışdı.

Mədinədən cənubda, Qırmızı dəniz sahillərinə yaxın Mureysi su quyusu ətrafında yaşayan Bəni-Mustəliq qəbiləsinin rəisi Haris ibn Əbi Dirar Mədinəyə hücum etmək üçün hazırlıqlara başlamışdı. Bəni-Mustəliq Xuzaə qəbiləsinin qollarından biri idi. Qonşu müşrik bədəvi qəbilələrindən bəziləri də Haris ibn Əbi Dirarın ordusunda qatılmaq üçün döyüşçü göndərmişdilər. Bu xəbər Mədinəyə gəlib çatanda Allah Rəsulu (s.ə.v) əshabından Büreydə ibn Huseyb əl-Əsləmini (r.ə) vəziyyəti aydınlaşdırmaq və xəbərləri dəqiqləşdirmək üçün Bəni-Mustəliq qəbiləsinin yurduna göndərmişdi. Büreydə ibn Huseyb (r.ə) müsəlman olduğunu gizlədərək mənsub olduğu Əsləm qəbiləsindən də müsəlmanlarla döyüşmək istəyən çox sayıda adamın olduğunu söyləyərək Haris ibn Əbi Dirarı inandırmışdı. Haris ibn Əbi Dirar ona inanaraq niyyətini və planlarını açıqlamışdı. Büreydə (r.ə) Harisə gedib ən qısa müddətdə köməkçi qüvvələrlə qayıdacağını bildirərək Mədinəyə qayıtmış və topladığı məlumatları Peyğəmbərə (s.ə.v) çatdırmışdı. Allah Rəsulu (s.ə.v) dərhal 30-u süvari olmaqla 700 nəfərlik ordu hazırladı. Lakin o, hərbi səfərbərliyin gerçək məqsədini hamıdan gizlədərək orduya tamamilə əks istiqamətdə, şimala doğru hərəkət əmrini verdi. Əshabdan sadəcə bir neçə nəfər səfərin əsl hədəfindən xəbərdar idilər. Digər səfərlərdən fərqli olaraq bu səfərə çox sayıda münafiq qatılmışdı. Buna görə də Allah Rəsulu (s.ə.v) münafiqlərin casusluq fəaliyyətinin qarşısını ala bilmək üçün səfərin əsl məqsədini açıqlamamışdı. Həmin gün axşama qədər yol gedəndən sonra Allah Rəsulu (s.ə.v) ordunun düşərgə salmasını istədi. Səhərsi gün isə istiqamət dəyişdirildi və ordu Bəni-Müstəliq yurduna tərəf irəliləməyə başladı. Yolda Bəni-Müstəliqin bir kəşfiyyaçısı ələ keçirildi. Casus dindirəndən sonra ona İslamı qəbul etmək təklif olundu. Lakin o, imtina etdi və edam edildi. Qəflətən İslam ordusunu öz yurdunda görən Bəni-Müstəliq qəbiləsi qorxuya düşmüşdü. Müharibə üçün hazırlıq görən əsgərlərin bir hissəsi qaçıb dağılmış, bir hissəsi isə mücahidlərlə döyüşə girişmiş və qısa müddətdə məğlub olmuşdular. Döyüşdə Bəni-Müstəliq qəbiləsindən 10 nəfər öldürülüb 600 nəfər əsir alındı. Bundan başqa onlara məxsus 2000 dəvə və 5000-dən çox mal-qara qənimət olaraq ələ keçirildi. Bu döyüşdə sadəcə Hişam ibn Subabə əl-Kəlbi (r.ə) adlı bir mücahid şəhid olmuşdu. Allah Rəsulu (s.ə.v) beşdə birini beytülmal üçün ayırandan sonra geri qalan qənimət və əsirləri mücahidlərin arasında böldürmüşdü.

Ordugah Mureysi su quyusunun yaxınında qurulmuşdu. Mücahidlər öz istifadələri və heyvanlarını suvarmaq üçün suyu qıt olan bu quyudan növbə ilə su dartırdılar. Suyu dəri tuluqları iplə quyuya salaraq çıxarırdılar. Dəri tuluqların hamısı bir-birinə oxşadığı üçün quyudan çıxan dolu tuluğa görə Cəhcəh ibn Məs’ud ilə Sənan ibn Vəbər adlı mücahidlər arasında mübahisə yaranmışdı.

Ğifar qəbiləsindən olan Cəhcəh, Ömər ibn Xəttabın (r.ə) muzdlu mehtəri idi. Hərbi səfərə də mühacirlərlə birlikdə könüllü olaraq çıxmışdı. Sənan ibn Vəbər isə Cuhən qəbiləsindən idi və ənsarla birlikdə hərbi səfərə çıxmışdı. Sənan ibn Vəbər səmimi müsəlman olsa da hələ İslamdan əvvəl Abdullah ibn Ubeyy ibn Səlulla dostluq etməkdə idi. Quyudan çıxan dolu su tuluğunun kimə məxsus olması səbəbiylə yaranan mübahisə Cəhcəhin Sənanı vurması ilə qızışaraq dalaşmaya çevrilmiş, nəticədə tərəflər qılınclarına əl atmışdılar. Hər iki tərəf də yüksək səslə öz yaxınlarını, biri mühaciri, digəri isə ənsarı köməyə çağırmışdı. Ənsarla mühacirdən olan möhtərəm insanların müdaxiləsi ilə məsələnin böyük bir fitnəyə çevrilməsinin qarşısı alınmışdı. Onlar tərəfləri barışdırmağa çalışdılar. Lakin Sənan və yaxınları bu haqda mütləq Allah Rəsuluna (s.ə.v) şikayət edəcəklərini, yalnız onun istəyilə barışacaqlarını bildirmişdilər. Məsələdən xəbərdar olan Allah Rəsulu (s.ə.v) "*bu cahiliyyə dava-dalaşı nədir belə? Bu insanların dərdi nədir? Artıq bu cahiliyyə mübahisələrini buraxın, bunlar köhnəlmiş, qaxsımış mübahisələrdir*" demişdi. Peyğəmbərin (s.ə.v) bu sözlərindən sonra Cəhcəh və Sənan barışaraq halallaşmışdılar. Lakin ordugahda bu məsələnin belə asanca və yumuşaqlıqla həllinə razı olmayanlar vardı. Başda Abdullah ibn Ubeyy ibn Səlul olmaqla münafiqlər bu məsələni fürsət bilmişdilər. Abdullah ibn Səlul öz münafiq dostlarının əhatəsində mühacirlər və Allah Rəsulu (s.ə.v) haqqında çirkin sözlər işlədərək ənsarı onların əleyhinə təşviq etməyin lazım gəldiyini bildirmişdi. Abdullah ibn Ubeyy münafiq dostlarına belə demişdi: "*onlar gəlib bizim yurdumuzda məskunlaşdılar. Artıb çoxaldılar, zənginləşdilər. Necə deyərlər, köpəyi bəslə ətini didsin. Bütün bunların təqsiri sizdədir. Onlarla hər şeyinizi bölüşdünüz. Siz onlar üçün döyüşlərdə canınızı belə verdiniz. Evərinizi, bağlarınızı, tarlalarınızı, malınızı, pulunuzu onlara peşkəş etdiniz. Əgər siz vaxtında onlardan mal-mülkünüzü əsirgəsəydiniz şübhəsiz onlar çıxıb başqa yerə gedərdilər. Amma eybi yoxdur, Mədinəyə qayıdan kimi güclü və şərəfli olanlar, zəif və şərəfsiz olanları oradan çıxaracaqlar*". Onun bu sözlərini ənsardan Zeyd ibn Ərqam (r.ə) adlı bir gənc müsəlman eşitmişdi. Onlar bu haqda danışarkən gənc Zeydin (r.ə) yanlarında olduğuna diqqət yetirməmişdilər. Zeyd (r.ə) münafiqlərin məclisindən qalxıb Allah Rəsulunun (s.ə.v) yanına gəlmiş və eşitdiklərini ona bildirmişdi. Bu vaxt Peyğəmbərin (s.ə.v) yanında həm mühacir, həm də ənsardan bəzi mötəbər şəxslər var idi. Zeydi (r.ə) dinləyərkən Allah Rəsulunun (s.ə.v) üzünün rəngi dəyişdi. O, dönə-dönə Zeyddən (r.ə) bəlkə səhv eşitdiyini, Abdullah ibn Ubeyyə qarşı şəxsi kininin olub olmadığını soruşmuşdu. Oradakılardan bəziləri də çox gənc olan Zeydin (r.ə) mübaliğə etdiyini düşünməkdə idilər və

buna görə də Zeydi (r.ə) qınamışdılar. Lakin Zeyd (r.ə) "*vallahi, mənə Abdullah ibn Ubeyydən sevimli olan heç kim yox idi. Amma bu sözləri mənim doğma atam belə desəydi ona da münasibətim eyni olardı*" deyə cavab verəndən sonra bu haqda Abdullah ibn Ubeyyin özündən soruşulmuşdu. Abdullah ibn Ubeyy Peyğəmbərin (s.ə.v) yanına gələrək çox gənc yaşda olan birinin deyil öz qəbiləsi arasında əvvəldən bəri mötəbər bir şəxs olan özünün sözlərinə inanılmasının lazım gəldiyini bildirmiş, Allah Rəsulunun (s.ə.v) yanında böyük andlar içərək belə sözlər demədiyini söyləmişdi. Lakin əshabdan bir çoxu and içməyinə baxmayaraq ona inanmadılar. Ömər ibn Xəttab (r.ə) Peyğəmbərdən (s.ə.v) Abdullah ibn Ubeyyin boynunun vurulması üçün icazə istədi. Lakin Allah Rəsulu (s.ə.v) "*bu necə olar ey Ömər? İnsanlar "Muhəmməd öz dostlarını öldürtür" deməzlərmi?*" deyərək bundan imtina etdi. Çünki Abdullah ibn Ubeyyin münafiq olduğunu Peyğəmbər (s.ə.v) və yaxınında olanlar bilirdilər. İnsanların əksəriyyəti isə onun həqiqətən səmimi müsəlman olduğunu zənn edirdilər. Abdullah ibn Ubeyyin Abdullah (r.ə) adlı bir oğlu vardı. Bu gənc Allahı və Rəsulunu (s.ə.v) sevən səmimi müsəlman idi. O, atasının öldürülməsi təklifini eşidən kimi Peyğəmbərin (s.ə.v) yanına gələrək "*əgər atam öldürülməlidirsə icazə verin onu mən öldürüm. Atam öz qəbiləsində hörmət sahibi insandır. Əgər onu başqa biri öldürsə atamın qatilindən qisas almadığım üçün insanlar məni qınayarlar*". Lakin Allah Rəsulu (s.ə.v) heç kimin atasını öldürməyi düşünmədiyini deyərək onu sakitləşdirmişdi. Bütün bunlar baş verərkən bəzi insanlar Zeyd ibn Ərqamı (r.ə) təqsirkar görməkdə idilər. Onu bilmədiyi şeyləri danışmaqla məzəmmət edirdilər. Bu hal Zeydi (r.ə) son dərəcə məyus etmişdi və o, yalançı olmadığını təsdiq etməsi üçün yalvararaq Allaha dua edirdi. Hərbi səfərdən Mədinəyə qayıdarkən Allah öz Elçisinə (s.ə.v) Qur'ani-Kərimin 63-cü, Münafiqun surəsini vəhy edərək Zeyd ibn Ərqamı (r.ə) böhtançı damğasından xilas etmişdi. Allah Rəsulu (s.ə.v) həmin axşam və bütün gecəni orduya dincəlməyə imkan vermədən yürüş etdirmişdi. Səhər açılıb günəşin hərarəti artmağa başlayanda isə orduya istirahət verildi. Mücahidlər yorğun və yuxusuz olduqları üçün dərhal yuxuya dalmışdılar. Peyğəmbər (s.ə.v) bunu insanların baş verənləri danışıb müzakirə etmək fürsətinin olmaması üçün etmişdi. Çünki fitnə alovunun yenidən qızışmasını istəmirdi. Mədinəyə çatıb ordu şəhərə girərkən isə Abdullah (r.ə) atası Abdullah ibn Ubeyyin qarşısını kəsərək "*izzət və şərəfin Allaha və Rəsuluna (s.ə.v) məxsus olduğunu öz dilinlə söyləyənə qədər bu şəhərə addımını atmayacaqsan. Bu insanların arasında əziz kimdir, zəlil kimdir mən sənə öyrədəcəm. İzzət və qüdrətin Allaha və Rəsuluna (s.ə.v) aid oluduğunu etiraf et, yoxsa qılıncım boynuna enər*" demişdi. Abdullah ibn

Ubeyy ibn Səlul tərəddüd edib oğlunu dilə tutmağa çalışsa da onun qərarının qəti olduğunu görüb "*mən şahidlik edirəm ki, izzət və qüvvət Allaha, Rəsuluna (s.ə.v) və möminlərə aiddir*" deməyə məcbur olmuşdu. Allah Rəsulu (s.ə.v) bu gənc səhabəyə "*Allah səni xeyirlə mükafatlandırsın*" deyərək artıq atasının yolundan çəkilməsini söyləmişdi.

Abdullah ibn Ubeyy, eləcə də münafiq dostları bu baş verən hadisədən son dərəcə hiddətlənmişdilər. Çünki Abdullah ibn Ubeyy Yəsribin möhtərəm və zəngin insanlarından biri idi. Hamının qabağında, üstəlik öz oğlu tərəfindən, belə bir rəftara məruz qalmaqla özünü alçaldılmış və təhqir olunmuş saymışdı. Bunun intiqamını almaq üçün yanıb yaxılırdı. Buna görə də Mədinəyə gələn kimi yeni bir iftira uydураraq böyük bir fitnə-fəsadın meydana gəlməsinə səbəb oldu. Elə bir fitnə-fəsad ki, hətta səmimi müsəlmanlardan belə bəziləri qeyri-ixtiyari bu fitnədən kənarda qala bilməmişdilər. Allah Rəsulu (s.ə.v) şəxsən iştirak etdiyi qəzvələrə çıxarkən, aralarında püşk ataraq, zövcələrindən birini də özü ilə hərbi səfərə aparardı. Bəni-Müstəliq qəzvəsində Ayşə (r.ə) Peyğəmbərlə (s.ə.v) birlikdə hərbi səfərə getmişdi. Ayşə (r.ə) bütün səfər boyu bir dəvənin üzərində qurulmuş kəcavənin içində səyahət etmişdi. Səhrada gecə səfəri vaxtı verilən fasilələrdən birində Ayşə (r.ə) kəcavəsindən çıxaraq təbii ehtiyacı üçün hərbi düşərgədən bir qədər aralanmışdı. Geri qayıdanda isə boyunbağısını itirdiyinin fərqinə vararaq onu axtararkən yubanmışdı. Bu vaxt səhərin alaqaranlığında ordu hərəkət edərək yola çıxmış, gənc və arıq olan Ayşənin (r.ə) kəcavədə olmadığının fərqinə varılmadan kəcavə dəvəyə yüklənmişdi. Ayşə (r.ə) düşərgə yerinə qayıdanda ordunun getmiş olduğunu görmüşdü. Kəcavədə olmadığı bilinən kimi onu axtarmaq üçün geri qayıdılacağını bilirdi. Buna görə də düşərgə yerində oturub gözləməyə başlamışdı. Günəş doğanda isə İslam ordusundan geri qalan mücahidlərdən Səfvan ibn Müəttəl (r.ə) onu görərək tanımış və dəvəsini çökdürüb Ayşəni (r.ə) öz dəvəsinə mindirərək növbəti düşərgə yerində orduya çatmışdı. Səfvan (r.ə) dəvəsini çökdürüb Ayşəyə (r.ə) "*dəvəyə min*" deməkdən başqa bütün yol boyu onunla bir tək kəlmə belə danışmamışdı. Lakin Ayşənin (r.ə) Səfvanın (r.ə) dəvəsində, Səfvanın (r.ə) isə dəvəsinin ipindən tutaraq piyada olaraq növbəti düşərgə yerinə çatdığını orduda bir çoxları, o cümlədən Abdullah ibn Ubeyy də görmüşdü. Ordu geri, Mədinəyə qayıdarkən bu hadisə insanların diqqətini cəlb edən mühüm bir hadisə hesab edilməmişdi. Lakin Mədinəyə qayıdan kimi Abdullah ibn Ubeyy "*artıq nə o adam Ayşədən, nə də Ayşə o adamdan qurtular*" deyərək Mədinədə güya Ayşə (r.ə) ilə Səfvanın (r.ə) bütün gecə boyunca birlikdə qaldığı kimi çirkin və alçaq bir iftiranın, böhtanın dedi-qodusunu yaymağa başlamışdı. Abdullah ibn Ubey-

yin münafiq dostları bu çirkin iftiranın dildən-dilə dolaşması üçün əllərindən gələni etmişdilər. Bütün Mədinə, bütün müsəlman icması bu çirkin iftira ilə çalxalanmağa başlamışdı. Möninlərin anası Ayşə (r.ə) bu iftiradan ən gec xəbər tutanlardan biri olmuşdu. O, özü haqqında uydurulan bu böhtanı eşidəndə kədərindən xəstələnmiş və Allah Rəsulunun (s.ə.v) iznilə atası Əbu Bəkrin (r.ə) evinə gedərək orada bir neçə həftə xəstə yatağında yatmışdı. Bu müddətdə anası Umm Ruman (r.ə) onun qayğısına qalmışdı. Mənbələrdə "*ifq hadisəsi*" olaraq qeyd edilən bu fitnə-fəsad uca Allahın Nur surəsinin bəzi ayələrini vəhy edərək böhtan bəlasına düçar olanları təmizə çıxarana qədər davam etmişdi:

*"Həqiqətən, (Ayşə barəsində) o ağır iftiranı uyduranlar öz içərinizdə olan bir zümrədir (münafiqlərdir). Onu (o xəbəri) pis bir şey zənn etməyin. O, bəlkə də, sizin üçün xeyirlidir. O zümrədən olan hər bir şəxsin qazandığı günahın cəzası vardır. Onlardan günahın böyüyünü öz üstünə götürəni (Abdulah ibn Ubeyyi) isə (qiyamət günü) çox böyük (şiddətli) bir əzab gözləyir! Məgər o yalan sözü eşitdiyiniz zaman mömin kişilər və qadınlar öz ürəklərində (özləri haqqında yaxşı fikirdə olduqları kimi, dostlarının da əhli-əyalı barəsində) yaxşı fikirdə olub: "Bu, açıq-aydın bir böhtandır!"-deməli deyildilərmi? (Ayşəyə iftira yaxanlar) nə üçün özlərinin doğru olduqlarını təsdiq edəcək dörd şahid gətirmədilər? Madam ki, şahid gətirmədilər, deməli, onlar Allah yanında əsl yalançıdırlar! Əgər Allahın dünyada və axirətdə sizə neməti və mərhəməti olmasaydı, o yalan sözünüzə görə sizə şiddətli bir əzab toxunardı. O zaman ki, siz (münafiqlərin yaydığı) yalanı dilinizə gətirir, bilmədiyiniz sözü ağzınıza alır və onu yüngül (asan, insana günah gətirməyən) bir şey sanırdınız. Halbuki bu (Peyğəmbərin əhli-əyalı haqqında nalayiq söz danışmaq) Allah yanında çox böyük günahdır! Məgər siz onu eşitdiyiniz zaman: "Bizə bunu (bu yalanı) danışmaq yaraşmaz. Aman (Allah)! Bu, çox böyük bir böhtandır!"- deməli deyildinizmi? Allah sizə öyüd-nəsihət verir ki, əgər möminsinizsə, bir daha belə şeylər etməyəsiniz. Və Allah sizin üçün ayələrini (belə ətraflı, açıq-aydın) izah edir. Allah (hər şeyi) biləndir, hikmət sahibidir!"* (Nur surəsi, 11-18-ci ayələr)

Beləcə bu ayələrlə uca Allah səmimi müsəlmanları mömin və möminələr haqqındakı böhtanı müzakirə etməmək, bunu edənlərin isə əslində fitnə atəşinin qızışmasına kömək etmiş olacaqları barədə xəbərdar etmişdi. Burada həmçinin, Qur'anın bir çox ayəsində olduğu kimi, Allah münafiqlərin maskasını yırtaraq onların əsl simasını ortaya çıxarmışdı. Kim idi münafiqlər? Onları münafiq olmağa nə vadar etmişdi? Bu insanlar ictimai-mənəvi baxımdan hansı əhval-ruhiyyədə idilər? Bunlara açıqlıq gətirmək yerinə düşəcəkdir. Bu vaxt Mədinədə

olan münafiqlərin demək olar ki, hamısı yaşlı və maddi baxımdan zəngin insanlar idilər. İslamdan əvvəl bu insanlar Yəsribin iqtisadi-ticari həyatında mühüm yer tutmuş, böyük paya sahib olmuşdular. Dünyəvi xeyrlərindən başqa bir şey haqqında düşünməyən bu insanların yaşadıqları həyat onlara bütün məsələlərdə sadəcə şəxsi mənfəətləri istiqamətində hərəkət etməyi öyrətmişdi. Lakin şəxsi mənfəəti hər şeyin önünə qoymaları İslamla qarşılaşarkən onları qəribə bir ziddiyyət qarşısında qoymuşdu. Yəni iki mümkün qərar və ya nəticədən birini qəbul etmək məcburiyyətində idilər, ya iman ya da küfr. İslam Mədinədə yayılmağa başlayarkən əksəriyyətin səmimiyyət və şövqlə İslamı qəbul etməsi bu insanları xeyli narahat etmişdi. Onlar tövhid dinini açıq-aydın rədd edə bilmirdilər. Çünki şəhər əhalisinin əksəriyyəti, o cümlədən onların ailə üzvlərinin, övladlarının, əqrəbalarının bir çoxu İslama səmimi qəbldən bağlı idilər. Haqqı inkar edib küfr və şirkdə təkid etsəydilər hörmət və ehtiramlarını, cəmiyyətdəki mötəbər mövqelərini itirər, bu da nəticədə maddi zənginliklərinin azalıb yox olmasına səbəb ola bilərdi. Əgər səmimi olaraq İslamı qəbul edib malları və canları ilə Allahın dininə kömək etsəydilər İslam güclənərdi. Onlar isə nə mallarına nə də canlarına heç bir şeyin olmasını, əskilməsini istəmirdilər. Əslində onlar İslamı Mədinədə müvəqqəti, keçib gedici bir həvəs olaraq görmüşdülər. Düşünmüşdülər ki, bir müddət sonra bu din ya özü-özünə, ya da müşrik ərəb qəbilələrinin ittifaq halında təzyiqinə tab gətirməyərək aradan qalxacaqdır. Bu ehtimal varkən isə ona düşmənlik edib uduzmağa dəyməzdi. Şəxsi mənfəəti güdmə duyğusu onların gözlərini o dərcədə kor etmişdi ki, dürüstlük, vicdan kimi duyğulardan da sıyrılmış, çirkin iftira və böhtan uydurmaqdan geri durmamışdılar. Onların da əslində, eynən Qüreyş müşrikləri kimi, küfr və şirkə belə səmimi bağlılıqları yox idi. Bu səbəbdən də sahib olduqları maddi zənginlikləri itirmək qorxusu ilə namaz qılır, oruc tutur, nadir hallarda da olsa hərbi səfərlərdə iştirak edirdilər. Allah onları Qur'anın Münafiqun surəsində "*divara söykədilmiş odunlar*"a bənzətmişdi. Bəzi müfəssirlər bu ayəni təfsir edərkən odunun əslində inşaat işində faydalı olduğunu, lakin divar dibinə yığılmış odunun isə oda atılıb yandırılmaqdan başqa heç bir işə yaramadığını bildirərək təşbihi izah etməyə çalışmışdılar. Münafiqlər Allaha və Rəsuluna (s.ə.v) inanmayıb İslama səmimiyyətlə bağlı olmadıqları halda müsəlman icmasında da maddi nemətlərdən ən çox faydalananların özləri olmasını istəyirdilər. Allah Rəsulu (s.ə.v) zəkat mallarından öz ailəsi və qohumlarına heç bir şey ayırmırdı. Bu mallar həqiqətən ehtiyacı olanlara ədalətli bir şəkildə paylanırdı. Zəkat və qənimət mallarından kimsəsiz, yetim və dul qadınlara düşən paylara belə göz dikən münafiqlər Allah Rəsulunu (s.ə.v) ədalətsizlikdə ittiham edərək

tikanlı sözləri, acı dilləri ilə ona əziyyət verirdilər. Allah Qur'anın Əhzab surəsi 18-19-cu ayələrində onların bu eybəcər xislətini açıqlamışdı.

Bəni-Müstəliq qəzvəsi vaxtı bu qəbilədən xeyli sayıda əsir alınmışdı. Əsirlərin arasında qəbilə rəisi Haris ibn Əbi Diraranın qızı Cüveyriyyə də vardı. Onun əri döyüş vaxtı öldürülənlər arasında idi. Qənimət malları və əsirlər mücahidlər arasında bölüşdürülərkən Cüveyriyyə Sabit ibn Qeysin (r.ə) hissəsinə düşmüşdü. Əsir qalmağı izzətinə sığışdıra bilməyən bu gənc qadın Sabit ibn Qeysə (r.ə) qurtuş fidyəsi təklif etmişdi. O, Sabit ibn Qeyslə (r.ə) əsirlikdən qurtuluşu üçün lazım olan məbləği müəyyənləşdirmişdi, lakin Mədinədə ikən həmin məbləği ödəyəcək imkana sahib deyildi. Buna görə də həmin məbləğin özünə borc olaraq ödənməsi üçün Allah Rəsuluna (s.ə.v) müraciət etmişdi. Allah Rəsulu (s.ə.v) onun qurtuluş fidyəsini Sabit ibn Qeysə (r.ə) ödəyərək əsirlikdən azad etmişdi. Atası Cüveyriyyəni aparmağa gələnə qədər o, Mədinədə qalmış və İslamı öyrənmişdi. Atası borcunu ödəyərək onu aparmaq istəyəndə isə Allah Rəsulu (s.ə.v) Cüveyriyyəyə İslamı qəbul etməyi və özü ilə ailə qurmağı təklif etmişdi. Cüveyriyyə (r.ə) bu təklifi qəbul etmişdi. Müsəlmanlar artıq möminlərin anası olan Cüveyriyyənin (r.ə) qohumlarını əsirlikdə saxlamağın onlara yaraşmayacağını bildirərək heç bir qurtuş məbləği tələb etmədən Bəni-Müstəliqdən olan əsirləri azad etmişdilər. Onların bir çoxunun əsirlik müddətində İslamı tanımaq fürsəti olmuşdu. Bu hadisə Bəni-Müstəliq qəbilsənin böyük əksəriyyətinin İslamı qəbul etməsinə səbəb olmuşdu.

*Qadın Hüquqları Sahəsində Mütərəqqi Dəyişikliklər*

Hicrətdən sonrakı bir neçə il ərzində Allah Rəsulu (s.ə.v) daha çox Mədinədə yeni qurulmuş müsəlman icmasının təhlükəsizliyi və müdafiəsi üçün lazımi tədbirlərinin alınması ilə məşğul olmuşdu. Bu təhlükəsizlik tədbirləri icmanın idarəsinin təkmilləşərək və qurumlaşaraq bir dövlət aparatına çevrilməsi ilə müşayət olunmaqda idi. Bunun isə heç şübhəsiz hüquqi təməllər üzərinə inşa edilməsi lazım idi. "*Haqqlar*" mənasını ifadə edən hüquq Mədinə İslam dövlətinin təməlini və əsasını təşkil etmişdi. Bu dövlətin hüquq anlayışı ilahi mənşəli hüquq anlayışı idi və Allah hər kəsə haqqı olan sərbəstliyi vermişdi. İslam hüququ, bəşər mənşəli hüquq anlayışından fərqli olaraq, insanın Allahla, insanın insanla və insanın bütünlükdə cəmiyyətlə olan münasibətlərini tənzimləməkdədir.

Ərəblər arasında miras bölgüsü əsrlərdən bəri gələn və ənənəyə çevrilmiş əsaslara görə aparılırdı. Ölən şəxsin yetkinlik yaşına çatmış böyük oğlu bütün bacı və qardaşlarını, o cümlədən anasını mirasdan məhrum edərək atasının bütün tərəkəsini mənimsəyə bilirdi. Ölən şəxsin yetkinlik yaşına çatmış oğlu olmayanda isə onun ən böyük qardaşı ölən qardaşının bütün mirasına sahib

olur, geri qalan hər kəsi mirasdan məhrum buraxa bilirdi. Ölənin qardaşı olmayanda isə qardaşı oğulları, atası və ya nəslindəki ən yaxın kişi qohumu mirasına yiyələnirdi. Əshabdan Sə'd ibn Rəbi' (r.ə) Uhud döyüşündə şəhid olmuşdu. Sə'd (r.ə) maddi cəhətdən imkanlı adam idi və qardaşı Haris ibn Rəbi' ondan qalan bütün mirasa yiyələnərək Sə'din (r.ə) iki azyaşlı qızını ilə hamilə olan xanımı Amirəni (r.ə) mirasdan məhrum etmişdi. Amirənin (r.ə) düşdükləri vəziyyəti Allah Rəsuluna (s.ə.v) bildirməsindən sonra Peyğəmbər (s.ə.v) "*hər halda Allah bu haqda öz hökmünü verəcəkdir*" deyib ona səbrlə gözləməyi tövsiyə etmişdi. Bir müddət sonra Nisa surəsinin 11-12-ci ayələri vəhy olunmuşdu. Allah Rəsulu (s.ə.v) tərəfləri öz hüzuruna çağırıb Haris ibn Rəbi'yə "*Sə'ddən (r.ə) miras qalan malların üçdə ikisini iki qızına, səkkizdə birini isə qızların anasına ver, bundan geri qalanlar sənindir*" demişdi. Bu ərəb cəmiyyətində qadın hüquqları sahəsində böyük bir inqilabi dəyişiklik, islahat idi.

*Xəndək Döyüşü*

Mədinədən sürgün edilən Bəni-Nəzir yəhudilərinin liderləri İslam əleyhinə fəaliyyətlərini davam etdirmişdilər. Onlardan bir qrupu Məkkəyə gedərək Əbu Süfyan başda olmaqla Qüreyşin müşrik liderlərilə görüşmüşdülər. Bu görüşlərdə yəhudi liderlər digər bütün ərəb qəbilələrinə müraciət edərək onları Mədinədəki müsəlman icmasının əleyhinə təşviq etməyə söz vermişdilər. Qüreyş müşrikləri də özlərilə müttəfiq olan bədəvi ərəbləri yeni hərbi səfər üçün səfərbər olmağa çağırmışdılar. Bəni-Nəzirin liderləri Qətəfan, Bəni-Əsəd, Süleym, Bəni-Sə'd, Lihyan, Fəzarə, Murrə, Əşca, Kinanə, Səqif kimi ərəb qəbilələri liderlərinin hər biri ilə ayrı-ayrılıqda görüşərək onları Qüreyşin hazırladığı hərbi kampaniyada iştirak etməyə çağırmışdılar. Beləcə hicri 5-ci ilin şəvval və zilqədə aylarında (fevral-mart 627) davam etmiş, mənbələrdə Xəndək və ya Əhzab müharibəsi olaraq qeyd edilən hərbi səfər üçün hazırlıqlar başlamışdı. Qüreyş müşrikləri Məkkə ətrafındakı müttəfiq bədəvi qəbilələrindən topladıqları əsgərlərlə birlikdə 4000 nəfərlik ordu hazırlamışdılar. Əbu Süfyanın başçılıq etdiyi müşrik ordusu Məkkədən şimala doğru yola çıxmışdı. Qüreyş müşrikləri irəlilədikcə ətraf qəbilələrdən piyada və süvarilər gəlib onlara qoşulurdular. Bəni-Nəzir yəhudiləri də Əhzab ordusuna qoşulmaq üçün öz döyüşçülərini göndərmişdilər. Mədinəyə yaxınlaşanda müşrik ordusunun sayı 12 minə çatmışdı.

Məkkədə hərbi səfər üçün hazırlıqların başlandığı xəbərini alan kimi Allah Rəsulu (s.ə.v) əshabın qabaqcıllarını məşvərət üçün toplayaraq onları mövcud vəziyyətdən xəbərdar etmiş və görüləcək tədbirləri müzakirə etmişdi. Meydan döyüşündən qaçınılaraq Mədinənin müdafiə edilməsi barədə hər kəs həmfikir

olmuşdu. Lakin əldəki məhdud imkanlarla şəhər necə müdafiə ediləcəkdi? Müdafiə xəttinin yarılması fəlakətlə nəticələnə bilərdi. Düzənlik ərazidə yerləşən Mədinə dörd tərəfdən hücuma açıq vəziyyətdə idi. Şəhərin bəzi kənar məhəllələrindəki evlər bir-birinə həm çox yaxın, həm də divarları hündür idi. Düşmənin buradan şəhərə soxulması ehtimalı az idi. Belə bir təşəbbüsün qarşısını almaq da çətin olmayacaqdı. Digər bir qismi isə sıx meyvə bağlarından ibarət idi və düşmən sürvarisinin burada sərbəst manevr edib uğur qazanması xeyli çətin olacaqdı. Lakin hücuma tamamən açıq vəziyyətdə olan şəhərin qərb hissəsindəki kənar məhəllələrin müdafiəsinin möhkəmləndirilməsi zəruri idi. Səhabələrdən Salman əl-Farsinin (r.ə) dahiyanə təklifi hamını məmnun etmişdi. Salman (r.ə) vətəni İranda qalaların ətrafına müdafiə xəndəklərinin qazıldığını görmüşdü. Burada da belə bir xəndəklə düşmən süvarilərinin qarşısını almaq mümkün idi. Lakin vaxt çox məhdud idi. Buna görə də Allah Rəsulu (s.ə.v) dərhal əshabını on nəfərlik qruplara ayıraraq xəndək qazılacaq xətti onların arasında qismlərə böldü. Peyğəmbər (s.ə.v) özü də xəndək qazıma işində iştirak etmişdi. Beləcə bəzi yerlərdə eni 9, dərinliyi isə 4,5 metrə çatan xəndək 6 gündə qazılıb bitirilmişdi. Xəndək qazılarkən səhabələr qarşılarına çıxan iri bir qaya parçasını Allah Rəsulunun (s.ə.v) köməyi olmadan sındıra bilməmişdilər. Peyğəmbər (s.ə.v) bu iri qaya parçasına külünglə zərbə endirərkən əshabını Yəmən, İran və Rum ölkələrinin fəthi ilə müjdələmişdi. Lakin həmin vaxt münafiqlər sayca düşməndən az və zəif olan möminlərə istehza edirərək "*düşmən qarşısına çıxıb vuruşmağa halları yoxdur, Muhəmməd (s.ə.v) isə bunlara Kəsranın xəzinlərini və'd edir*" deyirdilər. Lakin irəlidə görəcəyimiz kimi tarix Peyğəmbərin (s.ə.v) bu müjdəsinin onun vəfatından cəmi bir neçə il sonra gerçəkləşdiyini göstərəcəkdi.

Xəndək qazıma işinin başa çatmasından qısa müddət sonra düşmən ordusunun avanqard qüvvələri üfüqdə görünmüşdü. Müşrik ordusu bəzisi muzdlu, bəzisi könüllü olmaqla müxtəlif qəbilələrdən toplanmış əsgərlərdən ibarət idi. Buna görə də bu orduya həmçinin əhzab, hizblər, yəni qruplar ordusu deyilmişdi. Uhuddakına bənzər bir döyüş üçün yola çıxan düşmən ordusu müsəlmanlarla döyüş meydanında qarşılaşa bilməyib həvəslənərək birbaşa Mədinəyə tərəf irəliləmişdi. Məqsəd süvarilərin sürətli hücumu ilə müdafiə xəttini yararaq şəhəri ələ keçirmək idi. Lakin düşmən süvariləri dərin və enli xəndəklə qarşılaşında çaşıb qaldılar. Nə edəcəklərini bilmirdilər. Çünki daha əvvəl belə bir müdafiə taktikası ilə qarşılaşmamışdılar. Dəvə və atları xəndəkdən keçirmək cəhdləri müsəlman oxçuların şiddətli müqavimətilə nəticəsiz qalmışdı. Şəhərin digər qismlərində isə mücahidlər düşmən piyadalarının hücumunu uğurla dəf etməkdə idələr. Bir neçə

günlük döyüş üçün hazırlıq görüb yola çıxmış müşrik ordusu məqsədə tezliklə nail ola bilməyəcəyini anlayıb Mədinəni mühasirəyə aldı. Soyuq havada davam edən uzun mühasirə müşrik döyüşçülərin ərzaqı və heyvanların yemləri ilə birlikdə qələbə ümidlərini də tükəndirmişdi. Düşmən ordusundakı muzdlu əsgərlər aldıqları muzdun belə uzun bir mühasirə üçün kifayət etmədiyini söyləyərək narazılıqlarını bildirirdilər. Xəndəyi keçəmək üçün göstərilən bütün cəhdlər uğursuzluğa düçar olmuşdu. Bəni-Nəzir yəhudiləri bu müharibənin müşriklərin əleyhinə nəticələnməsilə heç cür razılaşmaq istəmirdilər. Mühasirə belə davam edəcəyi təqdirdə Qüreyş müşriklərinin uğursuzluğu qaçınılmaz olacaqdı. Buna görə də şəhərin içindən müşriklərə kömək göstərmək lazım idi. Bəni-Nəzirin liderləri Mədinədə hələ ki, bağladıqları əhdnaməyə xəyanət etməmiş Bəni-Qureyzə yəhudilərini müsəlmanların əleyhinə təşviq etmişdilər. Bəni-Qureyzə döyüşçüləri şəhəri müdafiə edən mücahidlərə arxadan hücum edəcəkdilər. Allah Rəsulu (s.ə.v) bundan xəbərdar olan kimi dərhal Zeyd ibn Harisə (r.ə) ilə Sələmə ibn Əsləmin (r.ə) əmrinə verdiyi 500 mücahidi Bəni-Qureyzə məhəlləsinə göndərmişdi. Buradakı müsəlman döyüşçülər gecə gündüz Bəni-Qureyzə məhəlləsini nəzarət altında saxlayıb hər hansı bir hərəkət etmələrinin qarşısını almışdılar.

Mühasirənin ən şiddətli günlərində döyüş vaxtı namaz qılmağa belə fürsət tapmayan mücahidlər zöhrlə əsr, məğriblə işa namazlarını birləşdirmiş və növbə ilə namaz qılmışılar. Allah Rəsulu (s.ə.v) Bəni-Qureyzə ilə müşrik ordusu arasındakı qarşılıqlı etimadı pozmaq üçün hərbi təxribat tədbirinə əl atmışdı. O, bu planı həyata keçirməyi Əşca qəbiləsinə mənsub Nueym ibn Məs’uda (r.ə) tapşımışdı. Nueym ibn Məs’ud (r.ə) İslamı yeni qəbul etmişdi. Öz qəbilədaşları arasında onun İslamı qəbul etdiyini bilən yox idi. Nueym (r.ə) əvvəlcə Bəni-Qureyzə yəhudilərinin yanına gedərək onlara “*Qüreyş ordusu mühasirədən bezdi və geri qayıtmaq niyyətindədir. Siz isə Muhəmmədlə (s.ə.v) olan əhdnamənizə xələl gətirdiniz. İndi sizin vəziyyətiniz necə olacaq? Qüreyşin Mədinəni ələ keçirmədən getməsinin qarşısını almağın tək yolu var. Siz Qüreyşdən tələb edin ki, bəzi tanınmış adamlarını sizin yanınıza girov olaraq göndərsinlər. Siz də rahatca onlara kömək edin*” dedi. Daha sonra Nueym (r.ə) qüreyşlilərin yanına gələrək onlara “*xəbəriniz varmı? Qureyzəlilər Muhəmmədlə (s.ə.v) olan əhdlərini pozmalarına peşman olublar. Onunla yenidən razılaşmaq üçün fürsət axtarırlar. Muhəmmədə (s.ə.v) sizin böyüklərinizdən bir neçəsini ələ keçirib müsəlmanlara təhvil verməyə söz veriblər. Əgər inanmırsınızsa onlara xəbər göndərin qoy bu şənbə günü sizinlə birlikdə hücuma keçsinlər*” demişdi. Mədinə yəhudilərin davranışlarından onsuz da şübhələnən Əbu Süfyan onlara “*biz sizin böyüklərinizin təşviqi və yardım və’di ilə buraya gəldik, lakin bu vax-*

*ta qədər və'd edilən yardımı görmədik. Burada uzun müddət qalmağımız mümkün deyil. Heç olmasa bu şənbə günü birlikdə, eyni vaxtda hücuma keçək*" deyə xəbər göndərdi. Bəni-Qureyzə yəhudilərinin inanclarından ötürü şənbə günü heç bir iş görə bilməyəcəklərini bildirmələri və girov tələb etmələri Əbu Süfyanın şübhələrini daha da artırmışdı. O, Nueymin (r.ə) gətirdiyi xəbərin doğru olduğuna inanmışdı. Qüreyşin liderləri buna son dərəcə qəzəblənmişdilər. Əbu Süfyan onlara "*nə sizdən kömək istəyirik, nə də sizə girov göndəririk. Necə isəyirsiniz elə də edin. Biz buradan gedəndən sonra görək sizi müsəlmanlardan kim qoruyacaq?*" deyə xəbər göndərmişdi.

Mühasirənin 27-ci günü gecə yarısı şiddətli bir fırtına qopmuşdu[29]. Fırtına o qədər şiddətli idi ki, müşrik ordugahındakı bütün çadırları söküb dağıltmış, ərzaqı və yemi zay, heyvanları tələf etmişdi. Səhər açılan kimi Əbu Süfyan mühasirənin dayandırılması və ordunun geri qayıtması əmrini verdi. Onlar geri çəkilərkən arxadan edilə biləcək hücumlara qarşı 200 nəfərlik süvari dəstəsi biraz geri qalmışdı. Xəndək döyüşündə cəmi 5 mücahid şəhid olmuşdu. Müşriklərdən isə 8-i öldürülmüşdü. Mühasirənin ləğv edilib düşmən ordusunun geri çəkilməsindən əmin olana qədər mücahidlər döyüş mövqelərini tərk etməmişdilər. Lakin Allah Rəsulu (s.ə.v) onlara belə bir əmr verdi: "*heç biriniz əsr namazını Bəni-Qureyzə yurduna çatmadan qılmasın*". Növbəti hədəf xəyanətkarın aradan qaldırılması idi. Əli ibn Əbu Talibin (r.ə) başçılıq etdiyi mücahidləri öz yurdunda görən Bəni-Qureyzə dərhal istehkamlarına çəkilərək müdafiə tədbirləri görməyə başlamışdılar. 3000 mücahid 900 yəhudi əsgərini 25 gün boyunca bu istehkam divarları arasında mühasirədə saxlamışdı. Bəni-Qureyzənin liderləri tutduqları əməldən peşman idilər. Danışıq aparmaq istəyirdilər. Onlar danışıq üçün müsəlmanlardan Sə'd ibn Muaza (r.ə) etimad etdiklərini bildirdilər. Əvs qəbiləsinin lideri olan Sə'd ibn Muaz (r.ə) Xəndək döyüşlərində yaralanmışdı və yatağında yatırdı. Lakin Allah Rəsulunun (r.ə) çağırışına icabət edib gəldi və yəhudilərlə danışığa başladı. Sə'din (r.ə) onlara verdiyi "*barənizdə Qur'anın yoxsa Tövratın hökmü ilə qərar verilməsini istəyirsiniz?*" sualına cavab olaraq yəhudilər Tövratın hökmü ilə mühakimə olunmaq istədilərini bildirdilər. Beləcə Tövratın hökmünə görə Bəni-Qureyzənin əli silah tuta bilən kişiləri edam olunmuş, qadın və uşaqları əsir, malları isə qənimət alınmışdı. Sə'd ibn Muaz (r.ə) Xəndək döyüşündə aldığı yaralar səbəbiylə Bəni-Qureyzə qəzvəsindən qısa müddət sonra şəhid olmuşdu.

---

[29]Qur'anın Əhzab surəsi 9-cu ayəsi və sonrasında bu hadisələrdən bəhs edilir.

*Xəndək Döyüşündən Hudeybiyyə Sülhünə Qədər*

Müşrik ərəb qəbilələrinin bütün qüvvələrini səfərbər edərək hazırladıqları böyük ordunun Xəndək döyüşünündə uğursuzluğa düçar olması və döyüşün müsəlmanların üstünlüyü ilə başa çatması bir sıra hadisələrə səbəbiyyət vermişdi. Əhzab ordusunun təbii fəlakətə uğramasını, gözlənilməyən bir fırtınaya düşərək pərişan olmasını müşriklərdən bəziləri müsəlmanların həqiqətən haqq yolda olmaları səbəbiylə Allahın bu orduya qəzəb etməsi kimi dəyərləndirmişdilər. Bundan başqa Xəndək döyüşündən üstünlük qazanaraq çıxmaları müsəlmanların hərbi və siyasi mövqeyini xeyli möhkəmləndirmiş, möminlərin iradəsini və mənəviyyatını sarsılmaz etmiş, əhval-ruhiyyələrini yüksəltmişdi. Mədinə ətrafında yaşayan və Əhzab ordusunda iştirak etmiş müşrik ərəb qəbilələrini isə qorxu hissi bürümüşü. Bütün bunlar yarımadadakı ərəblər arasında dini-mənəvi ab-havanı dəyişmiş və bir çoxları İslama meyl etməyə başlamışdılar.

Bəni-Suleym qəbiləsinin müdriklərindən və alimlərindən hesab olunan Qeys ibn Nuşbə uzun müddətdən bəri haqqında eşitdiyi Muhəmmədi (s.ə.v) görmək və onunla söhbət etmək üçün Mədinəyə gəlmişdi. Qeys yəhudi, xristian, məcusi dini kitablarını oxumuş, dini mövzularda xeyli bilikli bir şəxs idi. Verdiyi bütün suallara cavab alan Qeys ibn Nuşbə (r.ə) Allah Rəsulunun (s.ə.v) həqiqətən peyğəmbər olduğuna iman etmişdi. Qeysin müsəlman olması Suleym qəbiləsi arasında İslamın sürətlə yayılmasına səbəb olmuşdu. Belə ki, Qeys öz qəbiləsi arasında sözü dinlənilən və fikirlərinə etimad göstərilən müdrik və bilikli bir şəxs idi.

Əşca qəbiləsinin rəisi olan Məs’ud ibn Ruheylə özünün 400 döyüşçüsü ilə Əhzab ordusuna qatılmış və Xəndək müharibəsində iştirak etmişdi. Lakin Xəndək döyüşündən öz yurduna qayıdandan sonra Məs’ud ibn Ruheylənin İslama qarşı fikir və qənaətlərində dəyişiklik olmuşdu. Bir müddət sonra o, Muhəmmədin (s.ə.v) həqiqətən Allahın elçisi olduğuna inanmış və öz qəbiləsinin ağsaqqallarıyla məsləhətləşəndən sonra yanındakı 100 nəfərlə birlikdə gəlib Mədinə yaxınlığında düşərgə qurmuşdu. Məs’ud buradan Allah Rəsuluna (s.ə.v) xəbər göndərərək niyyətini bildirmiş və onunla görüşmək istəmişdi. Güman ki, yenicə bitən Xəndək döyüşündə düşmən səflərində iştirak etmiş Məs’ud öz dostları ilə birlikdə Mədinəyə gəlmək istəməmişdi. Allah Rəsulu (s.ə.v) onun dəvətinə cavab olaraq hazırlatdığı hədiyyələri də yanında aparmış və bəzi səhabələri ilə birlikdə əşcalıların düşərgəsinə getmişdi. Məs’ud ibn Ruheylə (r.ə) Əhzab döyüşündə iştirak etdikləri üçün dərin peşmançılıq keçirdiyini, ərəb qəbilələri tərəfindən qınanıb tənə eşitməmək üçün Əbu Süfyanın ordusu-

na qatıldığını bildirmiş və Allah Rəsulunun (s.ə.v) hüzurunda kəlməyi-şəhadət gətirərək İslamı qəbul etmişdi. Onunla birlikdə gələnlər də İslamı qəbul etmiş və Əşca qəbiləsinin böyük əksəriyyəti qısa müddətdə İslamı mənimsəmişdi.

Yuxarıda haqqında ətraflı məlumat verdiyimiz kimi Bəni-Kilab qəbiləsinin liderlərindən olan Amir ibn Tüfeyl öz qəbilədaşları ilə birlikdə Məunə quyusu yaxınlığında müsəlman dəvətçiləri şəhid edərək ağır bir qətliam törətmişdi. Hicri 6-cı il məhərrəm ayının 10-u (31 may 627) Muhəmməd ibn Məsləmə (r.ə) Allah Rəsulunun (s.ə.v) əmri ilə 30 nəfərlik süvari dəstənin başında Kilab qəbiləsini cəzalandırmaq üçün Mədinədən yola çıxmışdı. Mücahidlər Peyğəmbərin (s.ə.v) təlimatına uyğun olaraq gündüzlər daldalanmış, gecələr yol getmişdilər. Beləcə həm müşriklərin hərbi səfərdən xəbər tutmalarının qarşısı alınmış, həm də mücahidlər döyüşəcəkləri yerə istidən yorulmuş olaraq çatmamışdılar. Yolda ikən İbn Məsləmənin (r.ə) mücahidləri yol gedən böyük bir dəstəyə rast gəlmişdilər. Bunlar Qətəfan qəbiləsinin Muharib oymağından idilər. Məlum olduğu kimi qətəfanlılar Əhzab ordusuna qatılaraq Xəndək döyüşündə iştirak etmişdilər. İbn Məsləmənin (r.ə) əmrilə mücahidlər bu dəstəyə hücum etdilər. Müqavimət göstərənlərin bir qismi döyüşdə öldürülmüş, digərləri isə qaçmışdılar. Geri qalanlar isə müsəlanların əlinə əsir düşmüşdülər. Əsir düşənlərin çoxu qadın və uşaqlar olduğu üçün mücahidlər bunlara toxunmayaraq sərbəst buraxıb yollarına davam etmiş və Kilab qəbiləsindən Bəni-Bəkr oymağının məskun olduğu Şərəbbə məntəqəsinə gedib çıxmışdılar. Abbad ibn Bişrin (r.ə) kəşfiyyata çıxıb qayıtmasından sonra mücahidlər müşriklərə qəfil basqın etdilər. Bəni-Bəkr qəbiləsinin döyüşçülərindən 10 nəfər öldürüləndən sonra digərləri qaçıb yüksəkliklərdə gizləndilər. Mücahidlər onların yurdundan ələ keçirdikləri qənimətləri toplayaraq geri Mədinəyə qayıtmışdılar. 19 gün davam edən bu səriyyədə 150 dəvə, 3000 baş mal-qara qənimət olaraq ələ keçirilmişdi.

Hicrətdən 4 il sonra (625) Qüreyş müşriklərinin təşviqi ilə Bəni-Hənifə qəbiləsindən muzdlu qatil Sumamə ibn Usal, Allah Rəsuluna (s.ə.v) suiqəsdə təşəbbüs etmiş, lakin bu təşəbbüsü uğursuzluqla nəticələnmişdi. Hicri 6-cı (627) ilin əvvəllərində Sumamə ibn Usal Məkkə yolunda ikən ətrafda kəşfiyyat aparan mücahidlərin əlinə keçmiş və Mədinəyə gətirilmişdi. Allah Rəsulu (s.ə.v) dustaq həyatı sürən Sumamənin yanına hər gün gəlib yedirilib içirilməsi ilə maraqlanır, sonra isə ona "*ey Sumamə! Müsəlman ol! Könlündəki nədir? Ürəyindən nə keçir?*" deyə soruşur, Sumamə də ona "*ey Muhəmməd! Ürəyimdən sənə "xeyr" demək keçir. Xeyr deyirəm. Əgər məni öldürtmək istəyirsənsə, çəkinmə öldürt, çünki mən buna layiq olan əli qanlı bir qatiləm.*

*Əgər məni bağışlamaq istəyirsənsə mən sənin bu yaxşılığını heç vaxt unutmaram, əgər məqsədin qurtuluş fidyəsidirsə, sərbəstliyim müqabilində sənə istədiyin qədər mal verərəm*" deyə cavab verir və Allah Rəsulu (s.ə.v) onun yanından çıxıb gedirdi. Bu vəziyyət bir müddət belə davam edəndən sonra Peyğəmbər (s.ə.v) Sumamənin azad edilməsini əmr etdi. Lakin Sumamə Mədinədən çıxıb getmədi. O, Allah Rəsulunun (s.ə.v) hüzuruna gedərək İslamı qəbul etmişdi. Sumamə ibn Usal əl-Hənəfinin (r.ə) mənsub olduğu Bəni-Hənifə qəbiləsi Yəmamədə məskun idi. Qüreyş qəbiləsi ərzaq mallarının böyük bir qismini Yəmamədən satın alırdı. Sumamə (r.ə) müsəlman olandan sonra Məkkəyə gəlmiş və Qüreyşin müşrik zadəganları onun müsəlman olduğunu öyrənəndən sonra onu təhqir edərək Kə'bəyə yaxın buraxmaq istəməmişdilər. Sumamə (r.ə) onlara "*ya hamınız bir nəfər kimi Muhəmmədin (s.ə.v) gətirdiyinə iman edəcəksiniz, ya da Yəmamədən sizə bir buğda dənəsi belə gəlməyəcək*" deyib öz yurduna qayıtmışdı. Öz qəbiləsində nüfuzlu şəxs olan Sumamə ibn Usal (r.ə) Yəmamə tacirlərinə Məkkəyə ərzaq malları satmağı qadağan etmişdi. Məkkədə böyük ərzaq qıtlığı meydana gəlmişdi. İş o yerə gəlib çatdı ki, Əbu Süfyan Mədinəyə gəlib Allah Rəsulundan (s.ə.v) Sumaməni (r.ə) tutduğu əməlindən əl çəkdirib Qüreyşi ərzaq embarqosundan xilas etməsini xahiş etdi. Peyğəmbər (s.ə.v) Sumaməyə (r.ə) öz adından məktub yazdıraraq qıtlıqdan körpə uşaqların əziyyət çəkdiyini və bu işə artıq son qoymasını istədi. Allah Rəsulunun (s.ə.v) vasitəçiliyindən sonra yəmaməlilər yenidən Məkkəyə ərzaq məhsulu satmağa başlamışdılar. Peyğəmbər (s.ə.v) qıtlıqdan əziyyət çəkən kasıb məkkəlilər arasında paylanmaq üçün beytülmaldan 500 dinar qızıl pul da ayıraraq göndərmişdi. Əbu Süfyan Peyğəmbərin (s.ə.v) müşrik belə olsalar öz qövmünə olan mərhəmətindən doğan bu addımını öz arşını ilə ölçələrək "*Muhəmməd (s.ə.v) gənclərimizin qəlbini pulla satın almaq istəyir*" desə də məcburiyyət qarşısında qalıb buna mane olmamışdı. Əbu Süfyanın özünə isə Allah Rəsulu (s.ə.v) Mədinənin xurma məhsulundan xeyli miqdarda hədiyyə olaraq göndərmişdi.

Yuxarıda Bəni-Lihyan qəbiləsinə mənsub müşriklərin Rəci adlanan yerdə İslam dəvətçilərini qılıncdan keçirib ikisini də qüreyşli müşriklərə əsir olaraq satdıqları haqqında danışmışdıq. Həmin iki nəfər müsəlman da Məkkədə edam olunaraq şəhid edilmişdilər. Şəhid dəvətçilərin qanı yerdə qalmamalı idi. Hicri 6-cı ilin cəmaziyələvvəl ayında (sentyabr-oktyabr 627) Allah Rəsulu (s.ə.v) 200 nəfər mücahidlə birlikdə Mədinədən yola çıxaraq şimal istiqamətində hərəkət etdişdi. Əsl hədəfi Mədinədən şərqdə məskun olan Lihyan qəbiləsi idi. Lakin səfərin məqsədinin Mədinədəki münafiqlər tərəfindən təxmin edilə

bilinməməsi üçün şimala getmişdi. Mücahidlər Mədinədən xeyli aralanandan sonra isə cənub-şərq istiqamətini götürərək gündüzlər daldalanmış, gecələr isə yol getmişdilər. Mümkün qədər qəfil basqın edilmək istənsə də lihyanlılar müsəlmanların onların üstünə gəldiklərindən xəbərdar olmuş və qaçıb ətrafdakı dağlıq ərazilərdə gizlənmişdilər. Buna görə də bu hərbi səfərdən lazımi nəticə alına bilməmişdi. Allah Rəsulu (s.ə.v) Lihyan yurdunda ikən Əbu Bəkrin (r.ə) əmrinə 10-15 süvari verərək Məkkənin yaxınlarına qədər soxularaq Qüreyşə göz dağı verməyi əmr etmişdi. Əbu Bəkr (r.ə) əmrindəki süvarilərlə Ğəmim adlanan yerə qədər irəliləmişdi. Bundan xəbər tutan Qüreyş müşrikləri müsəlmanların Məkkəyə basqın edəcəklərini düşünüb xeyli əndişələnmişdilər.

Hicri 6-cı ilin rəbiəlaxir ayında (avqust 627) Peyğəmbərin (s.ə.v) əmri ilə Muhəmməd ibn Məsləmə (r.ə) on nəfərlik süvari dəstəsi ilə Bəni-Sə'ləbə və Bəni-Uval qəbilələrinin yurdlarına kəşfiyyat səfəri etmişdi. Bir gecə yatıb dincələrkən yüzdən çox müşrik əsgəri kəşfiyyatçıların yerini müəyyən edərək onları mühasirəyə almış və üstlərinə ox yağdırmışdılar. Mücahidlər də oyanıb ox atmağa başlamış və gecənin qaranlığında qarşılıqlı ox atışları nəticəsində hər iki tərəfdən yaralananlar olmuşdu. Daha sonra müşriklər nizələrlə mücahidlərə hücum edərək hamısını şəhid etmişdilər. Muhəmməd ibn Məsləmə (r.ə) ağır şəkildə yaralanıb çoxlu qan itirdiyi üçün huşsuz vəziyyətdə qalmış, müşriklər onu da ölü zənn edərək silahını və paltarını soyub aparmışdılar. Səhər açılanda oradan təsadüfən keçən bir müsəlman şəhidlərin cənazələrini görərək yaxınlaşmış və Muhəmməd ibn Məsləmənin (r.ə) ölmədiyini görüb Mədinəyə gətirmişdi. Bu hadisədən bir neçə gün sonra Allah Rəsulunun (s.ə.v) əmri ilə Əbu Ubeydə Amir ibn Cərrahın (r.ə) əmrindəki 40 nəfər mücahid Zil-Qissə adlanan yerdə Sə'ləbə və Uval qəbilələrinə hücum edərək öldürülən kəşfiyyatçıların qisasını almışdılar.

Hava isti və quraqlıq olduğu üçün Mədinə ətrafındakı otlaqlar heyvanların bəslənməsi üçün əlverişsiz hala gəlmişdi. Əbu Zərr əl-Ğifarinin (r.ə) oğlu Zərr (r.ə) beytülmala məxsus iyirmiyə yaxın dəvəni Mədinədən şimalda yerləşən, Qabə adlanan otlağa aparmışdı və yanında ailəsi də var idi. Qətəfan qəbiləsinin Fəzarə oymağı da həmin yerin yaxınlığında yurd salmışdı. Fəzarə qəbiləsinin rəisi Uyeynə ibn Hısn əl-Fəzarinin oğlu Həbib ibn Uyeynə yanındakı qırx süvari ilə Qabəyə hücum edib Əbu Zərr əl-Ğifarinin (r.ə) oğlu Zərri (r.ə) öldürmüşdü. Basqınçılar bu vaxt orada olmayan Əbu Zərr əl-Ğifarinin (r.ə) gəlini, Zərrin (r.ə) xanımı Leylanı və dəvələri də özlərilə aparmışdılar. Qabədən sağ qurtulan müsəlmanlardan biri Mədinəyə xəbər aparmaq üçün yola çıxmış, lakin yolda basqından bir müddət əvvəl Qabədən Mədinəyə yola çıxmış, dəvələrin sağılmış südünü aparmaqda olan Sələmə ibn əl-Əkvaya (r.ə) rast gəlmişdi. Sələmə (r.ə)

baş verən hadisədən xəbər tutan kimi geri, Qabəyə qayıtmış və basqınçıları təqib etməyə başlamışdı. O, tək başına ox və daşla hücum edib basqınçılardan bir neçəsini öldürməyə müvəffəq olmuşdu. Bu vaxt Allah Rəsulu (s.ə.v) baş verəndən xəbər tutaraq tez Sə'd ibn Zeydi (r.ə) 8 nəfər süvari mücahidlə oraya göndərmiş, özü isə 400 nəfər süvari ilə onun ardınca Fəzarə yurduna yollanmışdı. Sə'd ibn Zeydin (r.ə) dəstəsindən Əbu Qatədə Haris ibn Rib'i (r.ə) basqınçılara yetişib onlarla döyüşə girmiş və Həbib ibn Uyeynəni bir neçə müşrik fəzarəli ilə birlikdə öldürmüşdü. Bu döyüşdə mücahidlərdən biri şəhid olmuşdu. Peyğəmbər (s.ə.v) başçılıq etdiyi 400 süvari ilə gəlib Zi-Qərəd su quyusu yaxınlığında mövqe tutmuşdu. Bir qədər sonra Sələmə ibn əl-Əkva (r.ə) basqınçıların əlindən ala bildiyi on dəvə və qənimət götürdüyü paltar və silahlarla Zi-Qərədə gəlmişdi. Fəzarəli basqınçılar aqibətlərinin yaxış olmayacağını anlayaraq dayanmadan qaçıb çöldə gizlənmişdilər. Əbu Zərr əl-Ğifarinin (r.ə) gəlini Leyla da aparılan dəvələrdən birinə minərək qaçıb xilas ola bilmişdi. Hicri 6-cı ilin rəbiəlaxir ayında (17 avqust-16 sentyabr 627) baş vermiş və beş günlük Zi-Qərəd qəzvəsindən sonra Allah Rəsulu (s.ə.v) Mədinəyə qayıtmışdı.

Hicri 6-cı il cəmaziyələvvəl ayında (sentyabr-oktyabr 627) Allah Rəsulu (s.ə.v) Zeyd ibn Harisənin (r.ə) başçılığı altındakı 170 nəfər mücahidə Şam diyarından Məkkəyə getməkdə olan Qüreyşə məxsus ticarət karvanın ələ keçirmək əmini verərək yola çıxarmışdı. Bu ticarət karvanındakı əmtəə və nəğd pulun əsas hissəsi Səfvan ibn Üməyyəyə aid idi. Mücahidlər İys adlı yerdə hücum edib mühafizləri zərərsizləşdirmiş və karvanı ələ keçirmişdilər. Karvandakıları da əsir edib Mədinəyə gətirmişdilər. Əsirlərin arasında Əbü'l-As ibn Rəbiə də vardı. Əbü'l-As Allah Rəsulunun (s.ə.v) qızı Zeynəbin (r.ə) əri idi. Onların Əli və Umamə adlı iki azyaşlı övladları da vardı. Əbü'l-As müşrik idi, lakin etibar və etimad sahibi bir tacir idi. Zeynəb (r.ə) hicrət edib övladları ilə birlikdə Mədinəyə gəlmiş, əri isə Məkkədə qalmışdı. Əsir düşən Əbü'l-As ibn Rəbiə Zeynəbə (r.ə) xəbər göndərərək özünün himayə edilməsini və canını edamdan qurtarmasını istəmişdi. Peyğəmbərin (s.ə.v) qızı Zeynəb (r.ə) onu himayəyə götürəndən sonra digər müsəlmanlar da Əbü'l-Asa aman haqqı tanımışdılar. Allah Rəsulu (s.ə.v) qızının himayə qərarı ilə razılaşmış, lakin Əbü'l-Asın müşrik olması səbəbiylə onların ər-arvad münasibətində ola bilməyəcəklərini qəti surətdə bəyan etmişdi. Peyğəmbərin (s.ə.v) qızı Zeynəb (r.ə) də əri müşrik olduğu müddətcə onunla ailə həyatı yaşamaq niyyətində deyildi. Sadəcə övladlarının atası olduğu üçün onu qorumaq istəmişdi. Mücahidlər Əbü'l-Asın Peyğəmbərin (s.ə.v) qızı Zeynəb (r.ə) tərəfindən himayəyə alındığını eşidəndə qənimət olaraq götürdükləri ona aid bütün malları geri vermişdilər. Allah

Rəsulu (s.ə.v) onun sadəcə canının bağışlandığını, mallarının isə mücahidlərin haqqı olduğunu söyləsə də heç bir mücahid Əbü'l-Asa aid əşyanı və ticarət malını özündə saxlamayıb geri qaytarmışdı. Əbü'l-As ona qaytarılan mallarla Məkkəyə gəlib şəriki olduğu hissədarlara ticarət mallarındakı hissələrini vermişdi. Sonra isə onlara "*Mədinədə ikən İslamı qəbul etdiyimi bəyan etmədim ki, heç kim mallara sahib olmaq üçün müsəlman olduğumu düşünməsin*" deyib İslamı qəbul etdiyini bəyan etmişdi. Bundan sonra Əbü'l-As Məkkədə çox qalmayıb Mədinəyə qayıtmışdı. Allah Rəsulu (s.ə.v) onunla qızı arasında yenidən nikah əqdi bağlamışdı.

Hicri 6-cı ilin rəcəb ayında (noyabr-dekabr 627) Zeyd ibn Harisənin (r.ə) başçılıq etdiyi müsəlmanlara aid ticarət karvanı Şam diyarına gedərkən Mədinənin şimalındakı Vadi əl-Qura adlı yerdə Fəzarə və Bədr qəbilələrindən olan müşriklərin silahlı basqınına məruz qalmışdı. Zeyd ibn Harisə (r.ə) və yoldaşları axıra qədər müşriklərlə vuruşmuş və şəhid olmuşdular. Basqınçı müşriklər karvandakıların hamısını öldürdüklərini düşünərək qarət etdikləri malları alıb oradan uzaqlaşmışdılar. Lakin Zeyd ibn Harisə (r.ə) ölməmiş, başına dəyən zərbədən huşunu itirmişdi. Müşriklər isə onu bədənindəki çoxlu ox və qılınc zərbələrinin izini gördükləri üçün öldüyünü düşünmüşdülər. Çox qan itirsə də Zeyd (r.ə) özünü Mədinəyə çatdıra bilmişdi. O, baş verənləri danışandan sonra fəzarəli müşriklərlə vuruşumadığı müddətcə ətir vurmayacağına and içmişdi.

Hicri 6-cı ilin şaban ayında (dekabr 627-yanvar 628) Allah Rəsulunun (s.ə.v) əmri ilə Əbdürrəhman ibn Əvf (r.ə) əmri altındakı 700 mücahidlə birlikdə Dumətü'l-Cəndələ hərbi səfərə çıxmışdı. Bu müsəlmanların Dumətü'l-Cəndələ ikinci hərbi yürüşləri idi. Ordugah Mədinə yıxınlığındakı Curf adlı yerdə qurulmuşdu. Əbdürrəhman ibn Əvf (r.ə) sübh namazını Mədinədə qılıb Curfa getmək və ordunu səfərə çıxarmaq niyyətində idi. Allah Rəsulu (s.ə.v) əshabına sübh namazını qıldırandan sonra Əbdürrəhmanı (r.ə) yanına çağırıb ona belə nəsihət etmişdi:

"*Ey ibn Əvf! Hamınız birlikdə Allah yolunda cihad edin. Allahın dinini (İslamı) inkar edənlərlə vuruşun. Qənimət malları mövzusunda xəyanət etməyin. Öldürdüklərinizin burun-qulağını kəsməyin. Uşaqları öldürməyin. Bunlar sizin üçün Allahın əhdi və Elçisinin (s.ə.v) sünnəsidir*".

Əbdürrəhman ibn Əvf (r.ə) Mədinədən 15-16 günlük məsafədə olan Dumətü'l-Cəndələ çatanda burada yaşayan xristian Bəni-Kəlb qəbiləsinə mənsub oymaqlara xəbər göndərərək onları İslama dəvət etdi. Onun ilk dəvət cəhdləri uğursuz oldu. Kəlb qəbiləsindən olan bəziləri öz qövmlərini müsəlmanlarla döyüşmək

üçün təhrik etməyə başladılar. Lakin Əbdürrəhman ibn Əvflə (r.ə) görüşən xristian qəbilə rəislərindən Əsbəğ ibn Əmr əl-Kəlbi İslamı qəbul edəndən sonra onun qəbilədaşlarının əksəriyyəti də iman etmişdilər. İslamı qəbul etməyib xristianlıqda qalan Bəni-Kəlb qəbiləsi mənsubları ilə illik 2500 dirhəm cizyə ödəmələri şərtilə əhdnamə bağlayan Əbdürrəhman ibn Əvf (r.ə) məktub yazaraq Allah Rəsulunu (s.ə.v) vəziyyətdən xəbərdar etmiş və Əsbağın qızı ilə evlənmək istədiyini bildirmişdi. Peyğəmbərin (s.ə.v) iznindən sonra Əbdürrəhman (r.ə) Əsbağ ibn Əmrin qızı ilə evlənmiş və Mədinəyə geri qayıtmışdı.

Mədinədəki müsəlmanlardan əli silah tutanların əksəriyyətinin hərbi səfərdə olduğunu öyrənən Fədək yəhudiləri Vadi əl-Qura və Teymədə yaşayan yəhudilərlə əlbir olub Mədinəyə hücum etməyi planlaşdırmışdılar. Onlar bu məqsədlə Bəni-Sə'd qəbiləsinin müşriklərindən yardım istəmişdilər. Bəni-Sə'd qəbiləsi Fədəkin bir illik xurma məhsulunun onlara verilməsi müqabilində 200 süvari ilə onlara kömək etməyi və'd etmişdilər. Allah Rəsulu (s.ə.v) bundan xəbər tutan kimi Əli ibn Əbu Talibin (r.ə) əmrinə 11 nəfər süvari mücahid verərək Mədinədən 2-3 günlük məsafədə olan Bəni-Sə'din üstünə göndərmişdi. O, mücahidlərə gündüzlər gizlənərək gecələr yol gedib düşmənə qəfil hücum etməyi tapşırmışdı. Mədinədən xeyli aralanandan sonra mücahidlər bir nəfərin onları güddüyünün fərqinə varıb həmin adamı yaxalamışdılar. Bu Bəni-Sə'din casusu idi. O, əvvəlcə heç bir şeyi etiraf etməsə də danışmağa məcbur ediləndən sonra canının bağışlanması şərtilə yardım edəcəyini bildirmişdi. Bəni-Sə'd bədəviləri müharibəyə hazırlıq gördükləri üçün yurd yerlərini dəyişmişdilər. Həmin şəxs bələdçilik edərək Əli ibn Əbu Talibin (r.ə) mücahidlərini Bəni-Sə'din yurduna aparmışdı. Qəfil hücuma uğrayan müşriklər üzərlərinə böyük bir ordunun gəldiyini zənn edərək qaçıb dağılmışdılar. Mücahidlər onlara məxsus malları qənimət olaraq ələ keçirib Mədinəyə qayıtmışdılar. Bəni-Sə'də məxsus 500 dəvə və 2000 baş mal-qara qənimət götürülmüş, beşdə biri beytülmala ayrılandan sonra geri qalanı yürüşdə iştirak edən 11 mücahid arasında bölünmüşdü. Beləcə bu yürüş nəticəsində Fədək yəhudilərinin planı pozulmuşdu.

Hicri 6-cı ilin ramazan ayında (yanvar-fevral 628) Allah Rəsulu (s.ə.v) artıq yaraları sağalmış Zeyd ibn Harisənin (r.ə) əmrinə böyük bir süvari dəstəsi verərək Fəzarə qəbiləsi müşriklərini cəzalandırmaq üçün göndərmişdi. Fəzarəlilərin Qabədə Əbu Zərr əl-Ğifarinin (r.ə) ailəsinə basqın edib oğlunu öldürdüyü haqda yuxarıda məlumat vermişdik. Bu yürüş gizli şəkildə gerçəkləşdirilsə də fəzarəlilər bundan xəbər tutduqları üçün yurdlarından köçmüşdülər. Lakin Zeyd ibn Harisənin (r.ə) süvari mücahidləri onlardan bəzi ailələrin gizləndikləri yeri aşkar edib mühasirəyə almış, onlarla vuruşaraq məğlub etmişdilər.

Liderlərindən Abdullah ibn Məs'adə və Qeys ibn Ne'man ibn Məs'adə ilə yanaşı bu qəbiləyə mənsub müşriklərin bəziləri döyüşdə öldürülmüş, bəziləri isə əsir alınmışdı. Əsirlərin arasında Fəzarə qəbiləsinin liderlərindən olan Malik ibn Huzeyfə ibn Bədrin qızı da var idi. Onu mücahidlərdən Sələmə ibn əl-Əkva (r.ə) əsir götürmüşdü.

*Hüdeybiyyə Sülh Müqaviləsi*

Mədinədəki İslam camaatının aktiv hərbi-siyasi fəaliyyəti Məkkə zadəganlarının iqtisadi-ticari fəliyyətinə ciddi zərbə vurmuşdu. Mədinə şimal-cənub ticarət dəhlizi üzərində olduğu üçün bu qaçınılmaz idi. Bu səbəbdən də Qüreyşin müşrik liderləri Mədinədən şimalda məskunlaşmış bədəvi Fəzarə və Qətəfan qəbilələrinin müşrik liderləri ilə, o cümlədən onlara qonşu olan Fədək, Teyma, Vadi əl-Qura yəhudilərilə razılıq əldə edərək müttəfiq olmuşdular. Mədinədən şimal istiqamətinə hərbi səfər olarsa məkkəli müşriklər cənubdan, cənub istiqamətinə hərbi səfər olduqda isə Mədinədən şimaldakı yəhudilər və onların müşrik bədəvi müttəfiqləri müdafiəsi zəifləyən Mədinəyə şimaldan yürüş edəcəkdilər. Mədinədən sürgün edilib Xeybərdə məskunlaşmış Bəni-Nəzir yəhudiləri bu işdə xüsusi canfəşanlıq edir, Mədinə İslam dövlətinə qarşı qurulmuş bu hərbi ittifaqa həm hərbi, həm də maddi yardım göstərirdilər. Bu Mədinədə ümumən gərgin bir atmosfer yaratsa da vəziyyət çıxılmaz deyildi. Belə ki, Allah Rəsulu (s.ə.v) məharətlə həyata keçirilən hərbi manevrlərlə müttəfiqlərin işinə mane ola bilirdi. Lakin vəziyyətin əsaslı surətdə dəyişməsinə ehtiyac var idi. Bunun üçün Mədinədəki İslam camaatı, eləcə də ərəb yarımadasının müxtəlif yerlərində yaşayan az saylı müsəlman camaatlar kifayət qədər hərbi və maddi resurslara sahib idilər. Xəndək mühasirəsində Mədinənin uğurla müdafiə edilib düşmənin geri oturdulması, eləcə də ondan sonra yarımadanın müxtəlif yerlərinə gerçəkləşdirilən uğurlu hərbi səfərlər müsəlmanları həm əhval-ruhiyyə, həm də maddi baxımdan qüvvətləndirmişdi. Allah Rəsulu (s.ə.v) qıtlıq və quraqlıq səbəbiylə yaranmış çətin vəziyyət vaxtı məkkəlilərə yardım əlini uzatmış, onların ticarət karvanlarının Mədinə ətrafından sərbəst keçişini təmin etmişdi. Xəndək mühasirəsinin uğursuzluqla başa çatmasından sonra Qüreyş müşrikləri artıq İslam camaatını hərbi güclə məhv edə bilməyəcəklərini anlamışdılar. Allah Rəsulu (s.ə.v) həm bunun, həm də özünün müsbət davranışlarının Qüreyş müşriklərini yumuşaltacağını düşünmüşdü. Beləcə iki tərəf arasındakı gərgin atmosfer yerini qarşılıqlı əlaqələrə buraxacaq, müşriklər İslam camaatının mövcudluğu ilə barışacaq, bu isə öz növbəsində vaxt keçdikcə insanların iman edərək şirkdən vazkeçmələrilə nəticələnəcəkdi. Qüreyşin müşrik

liderləri əlbəttə ki, Allah Rəsulunun (s.ə.v) bu strateji hədəfinin fərqində idilər və buna əsla yol verməK niyyətində deyildilər. Bu hadisələr cərəyan edərkən hicri 6-cı ilin şəvval ayında (fevral-mart 628) bir gecə Allah Rəsulu (s.ə.v) xoş bir röya gördü və bu röyasını əshabına danışdı. O, röyasında əshabı ilə birlikdə Kə'bəni ziyarət etdiyini, əshabından kiminin saçını qırxdırdığını, kiminin isə saçını qısaltdığını görmüşdü. Belə bir hadisənin gerçəkləşməsi məkkəli müşriklərlə İslam camaatı arasındakı münasibətlərin yumuşalması baxımından mühüm bir hadisə olacaqdı. Buna görə də Allah Rəsulu (s.ə.v) həmin il əshabı ilə birlikdə Kə'bəni ziyarət etmək istədiyini açıqladı. O, necə reaksiya verəcəklərini bilmək üçün bu niyyətindən Qüreyşin də xəbərdar olmasını istəyirdi. Buna görə də bu xəbərin ətrafda yayılmasını təmin etmişdi. Allah Rəsulu (s.ə.v) bu səfərin qəti surətdə müharibə niyyəti daşımadığını göstərmək üçün zəvvarın silahlanmadan yola çıxmasını istəmişdi. Ziyarətçilər yanlarında sadəcə özünü müdafə məqsədilə yalın qılınc götürmüşdülər. Bunun xaricində bütün hərbi təchizatlarını Mədinədə qoymuşdular. Hicri 6-cı ilin zilqədə ayında (mart-aprel 628) Allah Rəsulu (s.ə.v) əshabı ilə Mədinədən Məkkəyə doğru yola çıxmışdı. Peyğəmbər (s.ə.v) Mədinədə öz yerinə vəkil olaraq Numeylə ibn Abdullah əl-Leysini (r.ə) qoymuşdu. Təqribən 1400 müsəlman Allah Rəsulu (s.ə.v) ilə birlikdə Kə'bəni ziyarət üçün yola çıxmışdı. Bunlardan 200 süvari, geri qalanları isə piyada idilər. Yol boyu ətrafdakı bədəvi qəbilələrdən 100-ə yaxın müsəlman zəvvar da gəlib onlara qoşulmuşdu. Bunların əksəriyyəti Əsləm qəbiləsinə mənsub idilər. Zövcələrindən Umm Sələmə (r.ə) Allah Rəsulu (s.ə.v) ilə birlikdə bu səfərdə iştirak etmişdi. Həcc vaxtı qurban edilmək üçün 70 dəvə tədarük edilmişdi. Allah Rəsulu (s.ə.v) Sə'd ibn Zeydin (r.ə) başçılığı altındakı 20 süvarini zəvvar karvanının xeyli önündə tədbirli olmaq məqsədiylə göndərmişdi. Məkkə ətrafında Qüreyşin müttəfiqi olan bədəvi Əhabiş qəbilələri yaşayırdılar. Qüreyş bu qəbilələrin süvarilərindən müzdlu əsgər olaraq istifadə edirdi. Yolda əhabişlərin müsəlman zəvvarlara hücum etmək üçün hazırlaşdıqlarına dair xəbərlər gəlməyə başlamışdı. Ömər ibn Xəttab (r.ə) və Sə'd ibn Ubadə (r.ə) Peyğəmbərə (s.ə.v) silahsız və hərbi təchizatsız olaraq müsəlmanları məhv etmək üçün and içmiş insanların yurduna getməyin təhlükəli olduğunu bildirmişdilər. Allah Rəsulu (s.ə.v) "*bizə hücum edərlərmi bilmirəm, lakin mən umrə üçün niyyətlənib silahlı olaraq yola çıxa bilmərəm*" deyə cavab vermişdi. Peyğəmbər (s.ə.v) Məkkə yaxınlığındakı Zülxüleyfə adlanan yerə çatanda əshabına zöhr namazını qıldırdı. Sonra isə umrə üçün ehram geydi. Əshabı da onun etdiyi kimi ehramlarını geydilər. Allah Rəsulunun (s.ə.v) əshabı ilə birlikdə Kə'bəni ziyarət üçün Məkkəyə gəldiyi xəbərini alan kimi Qüreyş

müşriklərinin liderləri toplanıb məsələni müzakirə etmiş və buna qəti surətdə izn verməmək barədə həmfikir olmuşdular. Onlar Səfvan ibn Uməyyənin təklifi ilə 200 nəfər silahlı süvarini Xalid ibn Vəlid və İkrimə ibn Əbu Cəhlin əmrinə verib Qura əl-Ğəmim adlanan yerə göndərərək yolu kəsmək qərarına gəlmişdilər. Bundan başqa onlar müsəlmanların umrə bəhanəsilə Məkkəyə daxil olub şəhəri zəbt etmək istədiklərini bildirərək Məkkədə ümumi səfərbərlik elan etmiş, bütün yüksəkliklərə müşahidəçilər yerləşdirmiş, müttəfiqləri olan bədəvilərin də hərb üçün hazırlıq görmələrini buyurmuşdular. Allah Rəsulu (s.ə.v) Buşr ibn Süfyanı (r.ə) əvvəlcədən Məkkəyə kəşfiyyat üçün göndərmişdi. Müsəlman zəvvarlar Qadir əl-Əştat adlı yerdə düşərgə salıb oturarkən Buşr ibn Süfyan (r.ə) gəlib topladığı bütün məlumatları Allah Rəsuluna (s.ə.v) bildirmişdi. Ğəmim aldı yerə gəlib çatanda Allah Rəsulu (s.ə.v) əshabına xitab etmək məqsədiylə yüksək bir yerə çıxdı. Allaha həmd və səna edəndən sonra zəvvarları yaranmış vəziyyətdən xəbərdar etdi. Müsəlmanlar yollarına davam edərək Kə'bəni ziyarət üçün Məkkəyə gedə bilərdilər. Burada onlara mane olmaq istəyənlərə müqavimət göstərə bilərdilər. Ya da əllərində olan bütün imkanları səfərbər edib onların yolunu kəsmək istəyənlərin üstünə gedərək döyüşə girişə bilərdilər. Peyğəmbər (s.ə.v) əshabından bunların hansını etmək istədiklərini soruşmuşdu. Əbu Bəkr (r.ə): "*ey Allahın Elçisi (s.ə.v)! Sən Beytü'l-Həramı (Kə'bə) ziyarət üçün yola çıxmısan. Şübhəsiz ki, qan tökmək istəmirsən. Elə isə biz Məkkəyə doğru üz tutub gedək. Kim bizə Kə'bəni ziyarət etməyi qadağan etsə biz onlarla vuruşarıq. Şübhəsiz ki, Allah sənə yardım edəcəkdir*" deyib öz fikrini bəyan etmişdi. Əshabın hamısı yekdilliklə bu fikri mənimsəməkdə idi. Müsəlman zəvvarlar Məkkə yaxınlığındakı Hudeybiyyə adlanan yerə gəlib çatanda Qüreyşin müttəfiqi olan Xuzaə qəbiləsinin rəisi Budeyl ibn Vərqa Allah Rəsulu (s.ə.v) ilə görüşmək üçün gəlmişdi. Budeyl ibn Vərqa İslamı qəbul etməmişdi, lakin Allah Rəsuluna (s.ə.v) ehtiram bəsləyir və müsəlmanlarla yaxşı münasibəti var idi. Qüreyş liderləri də bunu bildikləri üçün onu göndərmişdilər. Budeyl Allah Rəsulu (s.ə.v) ilə söhbət edərkən Qüreyşin müsəlmanların bu səfərindən ötürü çox əndişəli olduğunu, Məkkəyə daxil olandan sonra oradan çıxmayacaqlarını düşündüklərini, onları heç bir halda Məkkəyə buraxmaq istəmədiklərini bildirmişdi. Allah Rəsulu (s.ə.v) ona cavab olaraq "*bizim əsla vuruşmaq niyyətimiz yoxdur. Kə'bəni ziyarət etmək, umrə etmək istəyirik. Əgər istəyirlərsə biz onlarla andlaşma imzalayaq. Umrəni yerinə yetirəndən sonra Məkkəni tərk edəcəyik. Bunu qəbul etsələr çox yaxşı olar. Əks halda Allaha and olsun ki, ziyarətimizə mane olsalar ölənə qədər onlarla vuruşacağam*" demişdi. Budeyl ibn Vərqa geri qayıdıb hər şeyi olduğu

kimi Qüreyşin liderlərinə anlatmışdı. Lakin Qüreyşin müşrik zadəganları buna əsla izn vermək istəmirdilər. Çünki İslam camaatının rahatlıqla Kə'bə ziyarətini gerçəkləşdirmələri onların digər ərəb qəbilələri nəzdindəki hörmət və ehtiramını zədələyəcək, digər tərəfdən bununla onlar İslam dini, tövhid əqidəsi və müsəlman icmasını rəsmən tanımış olacaqdılar. Bununla da İslamın digər ərəb qəbilələri arasında yayılmasının qarşısını almaq artıq mümkün olmayacaqdı. Qüreyş müşrikləri böyük məmnuniyyətlə hərbi təchizatı, döyüş ləvazımatı yanında olmayan, əyinlərində zirehləri deyil, ağ ehramları olan müsəlman zəvvarları məhv etməyə hazır idilər. Lakin haram aylardan olan, zilqədə ayı idi. Bu ayda qan tökmək, üstəlik ehrama bürünüb Kə'bəni ziyarət üçün gələn zəvvarların qanını tökmək Qüreyşin nüfuzuna və etibarlılığına böyük zərbə olacaqdı. Bu Qüreyşin müşrik zadəganlarının bütün ərəblərin nəzərində gözdən düşməsinə səbəb olacaqdı. Bütün bunları həm Qüreyşin liderləri, həm də Allah Rəsulu (s.ə.v) bilirdi. Buna görə də heç bir tərəf öz mövqeyindən geri addım atmaq istəmirdi. Budeyl ibn Vərqa Qüreyşin müşrik liderlərinin yanına qayıdanda onlar Allah Rəsulunun (s.ə.v) təklifini dinləmək belə istəməyib Budeyli susdurdular. Çünki onlar Budeyli Peyğəmbərin (s.ə.v) yanına onunla danışıb könüllü olaraq öz əshabı ilə birlikdə geri, Mədinəyə qayıtması üçün dilə tutmaq üçün göndərmişdilər. Qüreyşin müşrik liderlərindən Urvə ibn Məs'ud Budeylin söyədiklərinin axıra qədər dinləməsini, ondan sonra qərar verilməsini tələb edəndən sonra Budeyl ibn Vərqa Allah Rəsulundan (s.ə.v) eşitdiyi hər şeyi danışmışdı. Urvə ibn Məs'ud onu dinləyəndən sonra Qüreyşin liderlərindən Muhəmmədlə (s.ə.v) görüşmək üçün izn istədi. Onların razılığından sonra zəvvarların düşərgəsinə gələn Urvə Allah Rəsulu (s.ə.v) ilə söhbətə başlayaraq Qüreyşin bütün qüvvələrini səfərbər edərək vuruşmağa hazır olduğunu, onu və əshabını əsla Kə'bəyə yaxın buraxmamaq üçün and içtiklərini, ən yaxşısının müsəlmanların geri, Mədinəyə qayıtmaları olduğunu söyləyərək onu gah hədələməyə, gah da dilə tutmağa çalışmışdı. Allah Rəsulu (s.ə.v) Urvənin sözü bitənə qədər onu dinləyəndən sonra belə cavab vermişdi: "*ey Urvə! Allah üçün de görüm, bu gördüyün dəvələrin qurban edilməsinə, Kə'bənin təvaf edilməsinə mane olmaq heç rəvadırmı? Biz buraya döyüşmək üçün gəlməmişik. Umrəmizi yerinə yetirib, qurbanlarımızı kəsib geri qayıdacağıq. Sən onların yanına qayıt, onlar mənim də qövmümdürlər. Bilirəm ki, müharibə onları yorub əldən salmışdır. Onlar əslində müharibədən qorxurlar, çünki müharibənin onlara bir faydası yoxdur. Mənimlə girişəcəkləri müharibə onları yeyib tükədər. Gəl onlarla mənim aramda silahları yerə qoymaq üçün müddət müəyyən edək və razılaşaq. Beləcə bir-birimizdən əmin və arxayın olaraq yaşayarıq, nəsillər artar*

*çoxalar. İndi qoy mənimlə Beytullahın (Kə'bə) arasından çəkilsinlər, umrəmizi edək, qurbanlarımızı kəsək. Həm digər ərəblərlə mənim arama girməkdən də əl çəksinlər artıq. Vallahi nə qədər ki, başım bədənimin üstündədir mən gətirdiyim bu dinin uğrunda Allah öz hökmünü verənə qədər, aralarında heç bir fərq qoymadan insanlarla hər cür mübarizə aparacağam*". Urvə Allah Rəsulunu (s.ə.v) müharibə ilə hədələməyin faydasız olduğunu görəndə bu dəfə də oradakı müsəlmanlar haqqında yersiz sözlər danışmağa başladı. O, Allah Rəsuluna (s.ə.v) "*ətrafına toplanmış bu insanlara çox da güvənmə, onların hər biri başqa bir qəbilədən, başqa bir soydandır. Sənin təəssübünü çəkməzlər. Dara düşən kimi qaçıb ətrafından dağılışacaq, səni meydanda tək qoyacaqlar*" deyəndə cavabını Əbu Bəkr (r.ə) vermişdi: "*biz qaçıb dağılışacaq və onu tək qoyacağıq eləmi? Sən get ibadət etdiyin Latın ora-burasını yala!*". Nə yağlı dilin, nə də hədə-qorxunun bir faydasının olmadığını görən Urvə ədəbsizləşməyə başlamış və söhbət vaxtı əlini uzadıb Peyğəmbərin (s.ə.v) saqqalını tumarlamışdı. Bu vaxt Peyğəmbərin (s.ə.v) arxasında ayaq üstə dayanan Muğirə ibn Şu'bə (r.ə) onun qolundan tutub "*nə qədər ki, qolunu qılıncla dibindən qoparmamışam onu geri çək*" demişdi. Urvə Muğirənin (r.ə) atası Şu'bənin əmisi idi. Danışmağın artıq faydasız olduğunu görən Urvə ibn Məs'ud dəvəsinə minib geri qayıtmışdı. Urvə ibn Məs'ud Qüreyşin qoca qurdlarından idi. O, müsəlman zəvvarları diqqətlə müşahidə etmişdi. Dediyi sözləri və etdiyi hərəkətləri də boşuna etməmiş, əshabın əhval-ruhiyyəsini ölçmək istəmişdi. Buna görə də Qüreyşin liderlərini vəziyyətdən agah edərkən əshabının Muhəmmədə (s.ə.v) olan sədaqət, hörmət, ehtiram və bağlılığının son dərəcə yüksək olduğunu, hətta müşriklərin övladlarının öz atalarına bu dərəcədə sadiq və hörmətkar olmadığını bildirmişdi. Urvə ibn Məs'ud silaha əl atmağın qəti surətdə faydasız olacağını, hər iki tərəf üçün münasib şərtlərlə bir razılaşma əldə etməkdən başqa yol olmadığını Qüreyşin müşrik liderlərinə bildirmişdi. Allah Rəsulu (s.ə.v) Əbu Nueym Xiraş ibn Üməyyə əl-Xuzaini (r.ə) elçi olaraq Qüreyşin liderlərinin yanına göndərmişdi. Lakin onlar Xiraşın (r.ə) danışmasına belə imkan vermədilər. İkrimə ibn Əbu Cəhl onu mindiyi dəvəni kəsmiş, özünü də öldürmək istəmişdi. Lakin Xiraş ibn Üməyyənin (r.ə) Məkkədəki qohumları onu himayə edərək qorumuş, ölümdən xilas etmişdilər. Qüreyş müşriklərinin müttəfiqi olan bədəvi Əhabiş qəbilələrindən birinin rəisi olan Xuleys ibn Əlqamə öz təşəbbüsü ilə müsəlman zəvvarların düşərgəsinə gəlmiş, onların hamısının ehramlı, yanlarında da qurbanlıq heyvanları olduğunu görüb niyyətlərinin həqiqətən Kə'bəni ziyarət etmək olduğunu anlamışdı. Səmimi və ədalətli bir insan olan Xuleys ibn Əlqamə bu vəziyyətdən xeyli mütəəssir olmuşdu. O, Qüreyş müşriklərinin ya-

nına qayıdıb gördüyü vəziyyəti izah etmiş və bu insanlara Kə’bəni ziyarət etməyi qadağan etməyin qətiyyən doğru olmadığını demişdi. Lakin məkkəli müşriklərin təhqirləri ilə qarşılaşmışdı. Qüreyşlilər onu heç bir şeydən başı çıxmayan bisavad bədəvi adlandırmışdılar. Bundan hiddətlənən Xuleys “*biz sizinlə Beytullahı ziyarətə gələn zəvvarların qarşısını kəsmək üçün deyil, təcavüzə məruz qalanda sizi müdafə etmək üçün müttəfiq olmuşuq*” deyib qüreyşli müşriklərin müsəlman zəvvarlarla döyüşə girişəcəkləri təqdirdə heç bir əhabişlinin qəti surətdə bu döyüşdə iştirak etməyəcəyini bildirmişdi. Bu Qüreyşin mühüm bir silahlı qüvvədən məhrum olması demək idi. Allah Rəsulu (s.ə.v) Osman ibn Əffanı (r.ə) yanına çağırıb ona Məkkəyə getməyi, orada Qüreyşin liderləri ilə danışıb niyyətlərini onlara bir daha çatdırmağı, Məkkədə qalan müsəlmanlarla görüşüb onlara təsəlli verməyi tapşırmışdı. Osman ibn Əffan (r.ə) Məkkəyə gedərkən Bəldə adlanan yerdə bir qrup silahlı süvariyə rast gəlmişdi. Onlar Osmanı (r.ə) sorğu-suala tutub Məkkəyə hansı məqsədlə getdiyini öyrənmişdilər. Daha sonra da ona geri qayıtmağı tövsiyə etmişdilər. Lakin aralarından Əban ibn Səid ibn əl-As Osman ibn Əffanı (r.ə) mehribanlıqla qarşılayıb öz atına mindirmiş və Məkkəyə aparmışdı. Əban ibn Səid də Osman ibn Əffanın (r.ə) mənsub olduğu Üməyyə ailəsindən idi. Osman ibn Əffan (r.ə) Məkkədə Əbu Süfyan, Səfvan ibn Üməyyə kimi Qüreyşli zadəganlarla görüşüb Allah Rəsulunun (s.ə.v) sözlərini onlara çatdırmış, lakin hamısından da rədd cavabı almışdı. Daha sonra o, Məkkədə az sayıda olan, müşriklərin əlində girov kimi qalmış müsəlmanlarla görüşüb onlara biraz səbr etmələrini tövsiyə etmiş, Məkkənin fəthinə Allahın izni ilə az qaldığını Peyğəmbərin (s.ə.v) adından müjdələmişdi. Osman ibn Əffan (r.ə) sonralar bu haqda danışanda deyirdi ki, “*mən onlara Allahın Elçisinin (s.ə.v) bu müjdəsini çatdıranda onlar sevindiklərindən hönkürərək ağlamağa başladılar, o qədər ağladılar ki, öləcəklərini düşündüm*”. Osman ibn Əffan (r.ə) Məkkəni tərk edib zəvvarların yanına qayıtmaq istəyərkən məkkəli müşriklərdən bəziləri ona : “*gəlmişkən Kə’bəni də təvaf et, sonra Məkkəni tərk et*” deyə təklif etmişdilər. Lakin Osman (r.ə) “*Allahın Elçisi (s.ə.v) onu təvaf etmədiyi müddətcə mən onu təvaf etmərəm*” deyə cavab verərək Qüreyşin liderlərini qəzəbləndirmişdi. Onlar Osmanın (r.ə) Məkkədən çıxmasına mane oldular, sonra isə onu bir evdə həbs edib öldürüldüyü şayəsini yaydılar. Osman ibn Əffanın (r.ə) Məkkədə öldürüldüyü xəbəri müsəlmanlara çatanda bu böyük gərginliyə səbəb oldu. Allah Rəsulu (s.ə.v) “*madam belə oldu, mən bu qövmlə (Qüreyşlə) vuruşmadan buradan getməyəcəm*” deyib əshabından ona bey’ət etməsini istədi. Bu bey’ət Ridvan beyəti adlanır. Allah Rəsulu (s.ə.v) qılıncını qucağına qoyub bir saqqız ağacının

kölgəsində oturmuş, əshab isə dəstə-dəstə gələrək onun sağ əlini tutub "*ölənə qədər sənin qarşında vuruşacağıq*" deyə and içmişdilər. Müsəlman zəvvarların yalın qılıncdan başqa heç bir silahları və hərbi təchizatları yox idi. Çox qorxulu, təhlükəli bir vəziyyət yaranmışdı. Çünki Mədinədən xeyli uzaqda, Məkkənin bir neçə kilometrliyində, hərbi təchizatsız, hazırlıqsız idilər. Əllərindəki yalın qılıncları ilə say baxımından özlərindən qat-qat çox olan düşmənlə vuruşmağa and içmişdilər. Belə bir müharibə labüd ölüm demək idi. Hamı beyət edəndən sonra Allah Rəsulu (s.ə.v) sol əlilə özünün sağ əlini tutub "*Osman bu yola Allah və Rəsulu üçün çıxmışdı, bu da Osmanın əlidir, onun üçün bey'ət edirəm*" demişdi. Qüreyşin ən varlı, nüfuzlu ailələrindən birinə mənsub, Qüreşin lideri Əbu Süfyanın yaxın əqrəbası, özünün isə kürəkəni olan Osman ibn Əffana (r.ə) Peyğəmbərin (s.ə.v) inamı və etimadı böyük idi. Çünki o, iman etmiş ilk müsəlmanlardan idi. Allah və Rəsulu (s.ə.v) üçün var-dövləti, nüfuzu tərk edib hicrət edənlərin qabaqcıllarından biri idi. Allah Qur'anın Fəth surəsi 18 və 19-cu ayələrində Ridvan beyətində iştirak edənlər haqqında belə buyurur:

لَقَدْ رَضِيَ اللَّهُ عَنِ الْمُؤْمِنِينَ إِذْ يُبَايِعُونَكَ تَحْتَ الشَّجَرَةِ فَعَلِمَ مَا فِي قُلُوبِهِمْ فَأَنزَلَ السَّكِينَةَ عَلَيْهِمْ وَأَثَابَهُمْ فَتْحًا قَرِيبًا
وَمَغَانِمَ كَثِيرَةً يَأْخُذُونَهَا وَكَانَ اللَّهُ عَزِيزًا حَكِيمًا

*"Ey Peyğəmbər! And olsun ki, (Hüdeybiyyədə) ağac altında sənə beyət etdikləri zaman Allah möminlərdən razı oldu. (Allah) onların ürəklərində olanı (sənə sadiq qalacaqlarını, əhdə vəfa edəcəklərini) bildi, onlara (öz dərgahından) arxayınlıq (rahatlıq, səbir, səbat, mənəvi qüvvə) göndərdi və onları yaxın gələcəkdə qazanılacaq bir qələbə (Xeybərin fəthi) ilə mükafatlandırdı."*

Ridvan beyəti vaxtı müşriklərin adından Allah Rəsulunun (s.ə.v) yanına gəlmiş Suheyl ibn Əmr, Xuveytib ibn Əbdüluzza və Mikrəz ibn Həfs də orada idilər və baş verənlərə şahid olmuşdular. Müsəlmanların Allah Rəsulunun (s.ə.v) hüzurunda ölüm andı içmələri onları qorxutmuşdu. Onlar gördüklərini olduğu kimi Qüreyşin müşrik liderlərinə danışmışdılar. Allah Rəsulu (s.ə.v) zəvvarlara sübh namazını qıldırarkən bir qrup müşrik müsəlmanların düşərgəsinə hücum edib onlara daş və ox atmışdılar. Müsəlmanlar onların hamısını ələ keçirib əsir etmiş, üç gün düşərgədə saxlayandan sonra buraxmışdılar. Allah Rəsulu (s.ə.v) bunu etməklə niyyətlərinin həqiqətən Kə'bəni ziyarət etmək olduğunu göstərmək istəmişdi. Bu vaxt Osman ibn Əffan (r.ə) da sərbəst buraxılaraq müsəlman zəvvarların yanına qayıtmışdı.

Qüreyşin müşrik liderləri vəziyyətin bu şəkildə gərginləşməsindən əndişəyə qapıldılar. Onlar silaha əl atılmasınıdan çəkinirdilər. Bu səbəbdən də hər iki

tərəf üçün münasib şərtlər üzərində razılaşılması qərarına gəldilər. Özlərinin dəyişdirilməz şərtlərini bildirib Suheyl ibn Əmri tam səlahiyyətli vəkil təyin edərək Allah Rəsulunun (s.ə.v) yanına göndərdilər. Xuveytib və Mikrəzlə birlikdə müsəlman zəvvarların Hudeybiyyədəki düşərgəsinə gələn Suheyl ibn Əmr Allah Rəsulu (s.ə.v) ilə üzbəüz oturmuşdu. Əbbad ibn Bişr (r.ə) və Sələmə ibn Əsləm (r.ə) silahlanmış olaraq Peyğəmbərin (s.ə.v) arxasında ayaq üstə durmuşdular. Suheyl ibn Əmr sübh namazı vaxtı müsəlmanlara hücum edib ələ keçmiş müşriklərlə bağlı sözə başlamış, bu işlə heç bir əlaqələrinin olmadığını, bunun hadisəni törədənlərin öz təşəbbüsü olduğunu bildirmişdi. Suheyl ibn Əmr danışarkən amiranə tərzdə səsini qaldırırdı. Bu səbəbdən də Əbbad (r.ə) və Sələmə (r.ə) ona: "*Rəsulullahın (s.ə.v) hüzurunda səsini qaldırma*" deyə xəbərdarlıq etmişdilər. Suheyl ibn Əmr uzun-uzadı baş verənlərdən danışıb Qüreyş liderlərinin əsas şərtlərini bildirdi sonra isə "*haydı, qələm, mürəkkəb gətirt, sizinlə bizim aramızda bir yazı yazaq*" dedi. Allah Rəsulu (s.ə.v) ənsardan Əvs ibn Həvlənin (r.ə) katiblik etməsini istədi. Lakin Suheyl "*məncə bu iş üçün əmin oğlu Əli (r.ə) ya da kürəkənin Osman (r.ə) daha münasibdirlər*" deyəndən sonra Peyğəmbər (s.ə.v) Əli ibn Əbu Talibə (r.ə) yazmasını buyurdu. Əli (r.ə) onların ikisinin yanında oturandan sonra Allah Rəsulu (s.ə.v) dedi: "*yaz, Rəhman və Rəhim olan Allahın adı ilə!*". Suheyl yanındakı iki yoldaşı ilə birlikdə dərhal müdaxilə edib dedi:

- *"Allahın adı ilə"ni başa düşdük, lakin biz "Rəhman və Rəhim" nə deməkdir bilmirik.*

Allah Rəsulu (s.ə.v) dedi:

- *Necə yazılmasını istəyirsiniz?*

- *Bu zamana qədər necə yazırdıqsa elə yazaq. "Bismikə Allahummə" (Sənin adınla Allahım).*

Bu dialoq oradakı müsəlmanların əhvalını pozdu. Allah Rəsulu (s.ə.v) dedi:

- *Bu da yaxşıdır. Yaz ey Əli (r.ə) "Bismikə Allahummə. Bu, Allahın Elçisi (s.ə.v) Muhəmmədin Suheyl ibn Əmrlə şərtləri üzərində razılaşdığı sülhə dair yazıdır.*

- *Xeyr, belə yazma. Ey Muhəmməd! Biz sənin Allahın Elçisi olduğuna inansaydıq səninlə vuruşmazdıq, indi də sülh danışığı aparmağa ehtiyac olmazdı. Ən yaxşısı bizim dediyimiz kimi yazılsın.*

- *Siz necə yazılmasını istəyirsiniz?*

- *Öz adın və atanın adı yazılsın, Muhəmməd ibn Abdullah.*

- *Bu da yaxşıdır. Mən Abdullahın oğlu Muhəmmədəm. Qoy belə yazılsın. Lakin Allaha and olsun həqiqət budur ki, siz inansanız da inanmasanız da*

*mən gerçəkdən Allahın Elçisiyəm. Bu yazıda qeyd olunmaması mənim Allahın Rəsulu olduğum həqiqətini dəyişdirməz. Ey Əli! "Allahın Elçisi"ni sil, "Abdullahın oğlu Muhəmməd" yaz.*

Bu dəfə əshabdan bəziləri özlərini saxlaya bilmədilər, ayağa qalxıb səslənməyə başladılar. Sə'd ibn Ubadə (r.ə) və Useyd ibn Hudeyr (r.ə) Əli ibn Əbu Talibin (r.ə) sağ əlini tutaraq: "*Sən "Muhəmməd Rəsulullah"dan başqa heç nə yazma, yoxsa bu işi qılınc həll edəcək, biz niyə öz dinimiz uğrunda əskiklik və təhqir qəbul etməliyik?*". Allah Rəsulu (s.ə.v) əlilə onlara işarə edib susmalarını və yerlərinə oturmalarını buyurdu. Lakin Əli ibn Əbu Talib (r.ə) dedi:

- *Allaha and olsun ki, mən o kəlməni silməyəcəyəm. Vallahi, mən sənin adının yanındakı "Rəsulullah" sözünü heç vaxt silmərəm.*

Allah Rəsulu (s.ə.v) diqqətlə Əlinin (r.ə) üzünə baxıb dedi:

- *Ey Əli! Sənin də başına belə bir şey gələcək, sən də istəmədiyin bir şeyi qəbul etməyə məcbur olacaqsan. Sən "Rəsulullah" kəlməsinin yerini mənə göstər.*

Sonra isə Peyğəmbər (s.ə.v) öz mübarək əlilə "Rəsulullah" sözünü silib Əli ibn Əbu Talibə (r.ə) "Muhəmməd ibn Abdullah" sözünü yazdırdı. Beləcə Hudeybiyyədə iki tərəf arasındakı sülhün şərtləri müəyyən edildiyi şəkildə yazıdı. Müsəlmanların əleyhinə imiş kimi görünən şərtlərin xülasəsi aşağıdakı kimi idi:

*1. Müsəlmanlar Kə'bəni ziyarət etmədən Mədinəyə qayıdacaqlar, lakin bir sonrakı ildən etibarən hər il, üç gün Məkkədə qala bilmək surətilə Kə'bəni ziyarət üçün gələcəklər. Yanlarında qınına qoyulmuş qılıncdan başqa heç bir silah olmayacaq.*

*2. Mədinədən qaçıb Məkkəyə sığınanlar geri verilməyəcək. Lakin Məkkədən qaçıb Mədinəyə pənah aparanlar, ağaları və ya ailə rəislərinin tələbi halında, Məkkəyə geri veriləcəklər.*

*3. Bu sülh müqaviləsi 10 il müddətinə etibarlı hesab ediləcək. Hər iki tərəfin müttəfiqləri bu müqaviləyə qoşula biləcəklər. Tərəflər nəzarətləri altında olan torpaqlardan digər tərəfin sərbəst keçib getməsinə mane olmayacaqlar. Tərəflərdən biri başqa bir düşmən tərəflə vuruşanda digər tərəf bu müharibəyə heç bir şəkildə müdaxilə etməyəcək.*

Müqavilədən iki nüsxə yazıldı. Allah Rəsulu (s.ə.v) hələ Qüreyş nümayəndələri gələrkən "*qüreyşlilər bu gün məndən nə istəsələr razılaşıb, istədiklərini onlara verəcəyəm*" demişdi. Onun əsas məqsədi əvvəlcə Mədinənin şimalındakı düşmənləri zərərsizləşdirmək idi. Xeybər və ətraf ərazilərdə yaşayan yəhudilərin yaratdıqları təhlükə haqqında yuxarıda danışmışdıq.

Peyğəmbərin (s.ə.v) əsas məqsədi Xeybər yəhudilərini Məkkənin yardımından məhrum etmək idi. Beləcə onlarla məşğul olarkən Mədinəni cənubdan heç bir təhlükənin gözləmədiyindən əmin olacaqdı. Hudeybiyyə sülh müqaviləsilə bu təmin olunmuş, Qüreyş bu işin fərqinə belə varmamışdı. Mədinədəki İslam camaatı diplomatik qələbə qazanmışdı. Lakin müsəlmanların bir çoxu ilk baxışda əleyhlərinə görünən müqavilənin şərtlərilə heç cür razılaşmaq istəmirdilər və bu gərginliyə səbəb olmuşdu. Müqavilə mətnləri hələ möhürlərlə təsdiqlənməmiş gərginliyi artıran başqa bir hadisə baş verdi. Suheyl ibn Əmrin[30] müsəlman olan oğlu Əbu Cəndəl (r.ə) ayaqlarına vurulmuş qandalların zəncirlərini sürüyərək Hudeybiyyəyə gəlmişdi. Bədənində işgəncə izləri vardı. Suheyl oğlunu görən kimi ayağa qalxıb onun boyundan tutmuş, əlindəki ağacla sifətinə vuraraq demişdi:

- *Ey Muhəmməd! Budur bizdən qaçıb sizə pənah gətirənlərin ilki. Onu geri qaytaracaqsınız.*
- *Lakin biz hələ yazını möhürlərimizlə təsdiq etməmişik.*
- *Elədir, lakin biz onun mötəbərliyi üzərində şifahi razılaşıb yazdırmışıq.*
- *Mənim xətrim üçün Əbu Cəndəli bu müqavilənin hökmündən kənar tut.*
- *Xeyr, mümkün deyil, mən əsla onu sənin yanında qoymaram.*
- *Bunu mənim xətrim üçün edəcəksən.*
- *Xeyr, etməyəcəyəm.*

Allah Rəsulu (s.ə.v) Əbu Cəndəlin (r.ə) heç olmasa həbs və işgəncədən azad edilib himayəyə alınmasını istədi. Lakin atası buna da razı olmadı. Mübahisə qızışanda Mikrəz ibn Həfs ibn əl-Uxeyf "*ey Muhəmməd! Sənin xətrin üçün Əbu Cəndəli mən himayəmə alıb işgəncə edilməsinə mane olacağam*" deyə söz verdi. Suheyl öz oğlu Əbu Cəndəlin (r.ə) yaxasından tutub sürüyərkən Əbu Cəndəl (r.ə) ağlayaraq: "*ey müsəlmanlar! Siz mənim düşdüyüm bu halı görmürsünüzmü? Mən müsəlman olaraq sizin yanınıza gəldim. Yenidən işgəncə versinlər deyə məni bu müşriklərə təslim edirsiniz?*" dedi. Oradakı müsəlmanların bir çoxu Əbu Cəndəlin (r.ə) fəryadına dözməyərək ağlamışdılar. Allah Rəsulu (s.ə.v) ona belə səslənərək təsəlli etmişdi: "*ey Əbu Cəndəl! Allah rizası üçün əcr və səvabını Allahdan diləyərək buna biraz döz. Bu yazı yazıldı artıq. Heç şübhəsiz Allah ən yaxın zamanda sən və sənin timsalında olan zəif müsəlmanlar üçün qurtuluş yolu açıb sizi darlıqdan genişliyə çıxaracaqdır*". Əbu Cəndəlin

[30] Məkkənin fəthindən sonra İslamı qəbul edən Suheyl ibn Əmr Allah Rəsulu (s.ə.v) Mədinədə vəfat edərkən Məkkədə bəzi münafiqlərin çıxarmaq istədikləri qarışıqlığın qarşısının alınmasında mühüm rol oynamışdı. Ömər ibn Xəttabın (r.ə) xəlifəliyi dövründə Şam diyarının fəthində iştirak etmiş, Yərmuk döyüşündə şəhid olmuşdu.

(r.ə) başına gələn hadisə müqavilə şərtlərinə soyuq yanaşan əshabın əndişəsini daha da artırmışdı. Ömər ibn Xəttab (r.ə) yanında bir neçə nəfər müsəlmanla Peyğəmbərin (s.ə.v) hüzuruna getdi və dedi:

- *Ey Allahın Elçisi! Sən Allahın haqq peyğəmbəri deyilsənmi?*

- *Bəli, mən Allahın haqq peyğəmbəriyəm.*

- *Biz müsəlmanlar haqq üzərində, düşmənlərimiz isə batil üzərində deyillərmi?*

- *Bəli, belədir.*

- *Elə isə biz bu zilləti nə üçün qəbul edirik?*

- *Mən bu şərtləri qəbul etməklə Allaha üsyan etmiş olmadım. Allahın əmrinə itaət etdim. Kim bizim yanımızdan onların yanına getsə, qoy Allah onu bizdən uzaq etsin. Onların yanından bizim yanımıza gələnlər üçün isə Allah qurtuluş yolu açacaqdır.*

- *Sən bizə Kə'bəni təvaf edəcəyimizi deməmişdinmi?*

- *Mən sizə "Kə'bəni bu il təvaf edəcəksiniz" dedimmi?*

- *Xeyr, demədin.*

- *Elə isə təkrar edirəm, sən yaxın vaxtda Kə'bəyə gedib təvaf edəcəksən.*

Ömər ibn Xəttab (r.ə) Əbu Bəkrin (r.ə) yanına gedərək eyni sualları ona da vermiş və Əbu Bəkr (r.ə) ona belə cavab vermişdi: "*Dayan görək ey Ömər! Mən onun Allahın Elçisi (s.ə.v) olduğuna və etdiyi hər işi Allahın əmri ilə etdiyinə inanıram*". Ömər ibn Xəttab (r.ə) bu sorğu-sualından ötürü dərin peşmanlıq duyaraq istiğfar etmiş və bir çox saleh əməllər işləmişdi.

Danışıqlar bitib sülh müqaviləsi təsdiqlənəndən sonra Qüreyşin elçiləri geri, Məkkəyə qayıtmışdılar. Əbu Cəndəlin (r.ə) başına gələn hadisə səhabələri dərindən sarsıtmış, kədər və hüznə qərq etmişdi. Allah Rəsulu (s.ə.v) ayağa qalxıb əshabına səslənmişdi: "*ey insanlar! Qalxın, qurbanlarınızı kəsin, saçınızı qırxdırıb ehramdan çıxın*". Lakin Allah Rəsulu (s.ə.v) bu əmri üç dəfə təkrarlamaq məcburiyyətində qalmışdı. Çünki əshabı dərin kədər və hüzn içində onun üzünə baxır, lakin heç biri yerindən tərpənmirdi. İlk dəfə belə bir vəziyyətlə qarşılaşan Allah Rəsulu (s.ə.v) dönüb öz çadırına getmişdi. Xanımı Umm Sələmə (r.ə) Peyğəmbərin (s.ə.v) üzündə qeyz əlaməti görüb "*ey Allahın Rəsulu (s.ə.v), sənə nə olub?*" deyə soruşdu. Peyğəmbər (s.ə.v) ona "*ey Umm Sələmə! Bu insanlara nə olub belə, doğrusu heyrət edirəm, mən onlara təkrar-təkrar qurbanınızı kəsin, saçınızı qırxıb ehramdan çıxın deyirəm, onlar isə üzümə baxaraq yerlərindən tərpənmirlər, sanki məni eşitmirlər*" deyə cavab verdi. Umm Sələmə (r.ə) dedi: "*sən özün qurbanını kəs, saçını qırxdırıb ehramdan çıx. Onlar şübhəsiz ki, sənə uyacaqlar və etdiyini edəcəklər*". Həqiqətən

də Umm Sələmənin (r.ə) dediyi kimi olmuşdu. Allah Rəsulunun (s.ə.v) dəvə qurban etdiyini görən əshab dərhal qurbanlıq heyvanlarına tərəf tələsmişdilər. Onlar Peyğəmbərin (s.ə.v) etdiyi kimi saçlarını qırxdırıb, qurbanlarını kəsib ehramdan çıxmışdılar. Hudeybiyyədən Mədinəyə qayıdarkən Allah Qur’anın Fəth surəsini nazil edərək möminləri müjdələmişdi.

إِنَّا فَتَحْنَا لَكَ فَتْحًا مُبِينًا ▪ لِيَغْفِرَ لَكَ اللَّهُ مَا تَقَدَّمَ مِنْ ذَنْبِكَ وَمَا تَأَخَّرَ وَيُتِمَّ نِعْمَتَهُ عَلَيْكَ وَيَهْدِيَكَ صِرَاطًا مُسْتَقِيمًا ▪
وَيَنْصُرَكَ اللَّهُ نَصْرًا عَزِيزًا. هُوَ الَّذِي أَنْزَلَ السَّكِينَةَ فِي قُلُوبِ الْمُؤْمِنِينَ لِيَزْدَادُوا إِيمَانًا مَعَ إِيمَانِهِمْ وَلِلَّهِ جُنُودُ السَّمَاوَاتِ
وَالْأَرْضِ وَكَانَ اللَّهُ عَلِيمًا حَكِيمًا

“*Həqiqətən, Biz sənə (Hüdeybiyyə sülhü ilə) açıq-aşkar bir zəfər bəxş etdik! Allah (bununla) sənin əvvəlki və sonrakı günahlarını bağışlayacaq, sənə olan nemətini tamam-kamal edəcək və səni düz yola müvəffəq edəcəkdir! Allah sənə yenilməz qələbə verəcəkdir! Möminlərin imanı üstünə iman artırmaq üçün onların ürəklərinə əminlik, arxayınlıq göndərən Odur. Göylərdəki və yerdəki ordular Allahın ixtiyarındadır. Allah (hər şeyi) biləndir, hikmət sahibidir!*”.

Müsəlman zəvvarlar Mədinə yolunda ikən Məkkədən qaçan iki müsəlman qadın gəlib Allah Rəsuluna (s.ə.v) və möminlərə sığınmış, hicrət etmişdilər. Onları təqib edən əqrəbaları qısa müddət sonra gəlib geri verilmələrini tələb edəndə Peyğəmbər (s.ə.v) onlara müqavilədə sadəcə kişilərin nəzərdə tutulduğunu, qadınlarla bağlı heç bir hökm olmadığını bildirərək tələblərini rədd etdi və həmin iki müsəlman qadını əshabın arasındakı qohumlarına tapşırdı. Bir müddət sonra Qüreyşin müşrik liderlərindən Utbə ibn Əbi Muaytın müsəlman qızı Umm Kulsum (r.ə) da qaçıb qurtularaq Mədinəyə hicrət etmişdi. Atası onun geri qaytarılmasını tələb edərkən ona da eyni cavab verilmişdi.

İslamı qəbul etdiyi üçün Məkkədə işgəncəyə məruz qalan müsəlmanlardan biri də Əbu Bəsir ləqəbi ilə tanınan Utbə ibn Useyd əz-Zuhri (r.ə) idi. Əbu Bəsir Məkkədə həbs olunduğu yerdən qaçaraq özünü Mədinəyə çatdırmışdı. Lakin qısa müddət sonra Qüreyş müşriklərinin Huneys və Kövsər adlı iki təmsilçisi Allah Rəsulunun (s.ə.v) yanına gələrək ona məktub təqdim etdilər. Məktubda sülh müqaviləsinin şərtlərinə əməl edərək Əbu Bəsirin (r.ə) təslim edilməsi tələb olunurdu. Peyğəmbər (s.ə.v) Əbu Bəsiri (r.ə) yanına çağıraraq vəziyyətdən agah etmiş, lakin Əbu Bəsir (r.ə) buna etiraz edərək şirk və küfr yurduna geri qayıtmaq istəmədiyini bildirmişdi. Allah Rəsulu (s.ə.v) ona da Əbu Cəndələ (r.ə) söylədiyi sözlərlə təsəlli verərək Huneys və Kövsərlə birlikdə Məkkəyə geri qayıtmasını istədi. Buna könülsüz razı olmaq məcburiyyətində qalan Əbu Bəsir (r.ə) Məkkə yolunda ikən Zülxuleyfə adlı yerdə Huneysin qılıncını ələ keçirib

onu öldürmüşdü. Kövsər isə canını qurtarmaq üçün Məkkəyə deyil Mədinəyə qaçmışdı. Əbu Bəsir onu təqib edərək Mədinəyə gəlmişdi. Peyğəmbər (s.ə.v) Əbu Bəsiri (r.ə) görəndə "*bu necə bir adamdır?! Müharibə carçısı, döyüş qızışdırıcısıdır sanki. Yanında özü kimi bir neçə nəfər də olsa öhdəsindən gələ bilməyəcəyi iş yoxdur*" demişdi. Qoçaqlığını təqdir etməsinə baxmayaraq Allah Rəsulu (s.ə.v) Əbu Bəsirə (r.ə) Mədinəni tərk edib istədiyi yerə gedə biləcəyini söyləmişdi. Əbu Bəsir (r.ə) Qırmızı dəniz sahilindəki əl-İys adlı yerə gedib orada gizlənmiş və qaçaq həyatı sürməyə başlamışdı. Onun bu qoçaqlığı tezliklə Məkkədə dildən-dilə gəzməyə başlamışdı. Bundan sonra Qüreyş müşriklərinin zülmündən qaçan bütün müsəlmanlar, o cümlədən Əbu Cəndəl (r.ə) də, əl-İysə gələrək Əbu Bəsirin (r.ə) ətrafında toplaşmağa başlamışdılar. Əbu Bəsir (r.ə) ətrafındakı müsəlmanlardan silahlı dəstə təşkil edərək Qüreyşin Şam diyarına gedib-gələn ticarət karvanlarını qarət etməyə başlamışdı. Qüreyş müşrikləri vəziyyəti Allah Rəsuluna (s.ə.v) şikayət etməyə məcbur olmuşdular. Lakin Peyğəmbər (s.ə.v) onlara Əbu Bəsirin (r.ə) Mədinə İslam dövləti ilə heç bir əlaqəsi olmadığını, müstəqil hərəkət etidiyini bildirmişdi. Əbu Bəsirin (r.ə) fəaliyyəti elə bir həddə gəlib çatdı ki, Qüreyş müşriklərinin liderləri Allah Rəsulundan (s.ə.v) müqavilədəki iltica edənlərin geri verilməsi şərtindən əl çəkdiklərini və bu maddənin müqavilədən çıxarılmasını istədilər. Peyğəmbər (s.ə.v) onların bu təklifini qəbul etmişdi. Allah Rəsulu (s.ə.v) Əbu Bəsirə (r.ə) xəbər göndərək yanındakı müsəlmanlarla birlikdə Mədinəyə gəlməsini istədi. Lakin Əbu Bəsir (r.ə) xəstə idi. O, Mədinəyə gələ bilmədən vəfat etmişdi. Onun yanına əl-İysə toplaşmış 70-ə yaxın müsəlman Əbu Cəndəlin (r.ə) başçılığı altında Mədinəyə gəlmişdilər.

Hudeybiyyə əhdnaməsindən qısa müddət sonra ərəblərin sayca ən böyük qəbilələrindən biri olan Cüzam qəbiləsinin demək olar ki, əksəriyyəti İslamı qəbul etmişdi. Cüzam qəbiləsi bir çox oymaq və soylardan ibarət idi. Bunlardan Dubeyb oymağına mənsub Rifaə ibn Zeyd (r.ə) bir dəstə adamı ilə birlikdə, çeşidli hədiyyələrlə Mədinəyə gələrək Allah Rəsulu (s.ə.v) ilə görüşüb söhbət etmişdi. Rifaə və adamları Allah Rəsulunun (s.ə.v) hüzurunda İslamı qəbul etmişdilər. Peyğəmbər (s.ə.v) onları bir müddət Mədinədə qonaq etmiş, yurduna qayıdarkən bir məktub yazdırıb Rifaə ibn Zeydə (r.ə) vermişdi. Bu məktubda Allah Rəsulu (s.ə.v) Rifaəni (r.ə) Cüzam qəbiləsində öz təmsilçisi və bu qəbiləyə mənsub müsəlmanlarının əmiri təyin etdiyini bildirmiş, eyni zamanda bütün Cüzam qəbiləsini İslama dəvət etmişdi. Rifaə ibn Zeyd (r.ə) Allah Rəsulunun (s.ə.v) məktubunu oymaq-oymaq gəzərək oxumuşdu. Onun və dostlarının səyi ilə Cüzam qəbiləsinin böyük əksəriyyəti qısa bir zamanda İslamı qəbul etmişdilər.

Allah Rəsulunun (s.ə.v) İslama dəvət xəbəri Cüzam qəbiləsinin Fələstin torpaqlarında yaşayan oymaq və soylarına da çatmışdı. Bu vaxt Fələstin Bizans imperiyasının tərkibinə daxil idi. Xristian olan Fərvə ibn Əmr əl-Cuzami Bizansın Fələstin canişini idi. O, müsəlman dəvətçilərin gətirdikləri xəbərləri eşidəndən sonra İslamı qəbul etmiş və Allah Rəsuluna (s.ə.v) aşağıdakı məzmunda məktub yazmışdı: "*Allahın adı ilə, ey Allahın Elçisi Muhəmməd! Mən İslamı qəlbimlə qəbul və dilimlə təsdiq etdim. Allahdan başqa ilah olmadığına şahidlik edirəm. Və şahidlik edirəm ki, Muhəmməd Allahın Elçisidir. Sən həmin o, peyğəmbərsən ki, Məryəmin oğlu İsa (ə.s) gələcəyini müjdələmişdi. Allahın salamı sənin üzərinə olsun*". Məs'ud ibn Sə'd adlı elçi Fərvə ibn Əmrin (r.ə) məktubunu, göndərdiyi hədiyyələrlə birlikdə Mədinəyə gətirib Peyğəmbərə (s.ə.v) çatdırmışdı. Fərvə (r.ə) Allah Rəsuluna (s.ə.v) bir at, bir qatır və bir ulaq yükü qiymətli geyim hədiyyə etmişdi. Allah Rəsulu (s.ə.v) Fərvə ibn Əmr əl-Cuzamiyə (r.ə) aşağıdakı məzmunda cavab məktubu göndərmişdi: "*Allahın Rəsulu Muhəmməddən Fərvə ibn Əmr əl-Cuzamiyə. Allahın salamı üzərinə olsun. Səni hidayətə qovuşduran, özündən başqa ilah olmayan Allaha həmd olsun. Uca Allah səni özünün doğru yoluna istiqamətləndirmişdir. Allaha və Rəsuluna (s.ə.v) itaət etsən, namaz qılıb zəkat versən Allahın cənnətinə daxil olarsan. Allahın salamı üzərinə olsun*". Peyğəmbərin (s.ə.v) əmri ilə elçi Məs'ud ibn Sə'd məktub və hədiyyələrlə Fərvə ibn Əmrin (r.ə) yanına göndərilmişdi. Fərvənin (r.ə) xristianlıqdan çıxıb İslamı qəbul etməsi Bizansın hakim dairələrini narahat etmişdi. Çünki onun müsəlman olmasından sonra Fələstindəki ərəblərin İslamı qəbul etməsinin qarşısını almaq heç cür mümkün olmayacaqdı. Buna görə də imperatorun əmrilə canişinlikdən azad edilib həbsə göndərildi. Həbsdə ikən xristianlığa dönüb vəzifəsinə geri qayıtması üçün çox dilə tutuldu. Hətta bundan qat-qat artığını alacağı və'd edildisə də Fərvə ibn Əmr (r.ə) bütün bunlardan imtina etmişdi. Edama məhkum olunan Fərvə ibn Əmrin (r.ə) boynu vurularaq şəhid edilmiş və cənazəsi İordan çayına atılmışdı.

*Xeybərin Fəthi*

Hudeybiyyədən qayıdandan qısa müddət sonra Allah Rəsulu (s.ə.v) yeni hərbi səfərin hazırlıqlarını görməyə başlamışdı. Hədəf Mədinədən təqribən 150 km şimalda yerləşən Xeybər idi. Xeybər ərəb yarımadasında yəhudilərin kompakt yaşadıqları yer bir idi. Ətrafındakı Teymə, Fədək və Vadi əl-Qura məntəqələr də yəhudilərin sıx məskunlaşdığı yerlər idi. Bu yerlər suyu bol, torpağı münbit olduğu üçün məhsuldar bağ və bağçaları var idi. Bundan başqa yarımadadan şimala gedən ticarət yollarının üzəində yerləşirdi. Xəyanətlərinin

cəzası olaraq Mədinədən sürgün edilən Bəni-Nəzir yəhudilərinin mühüm bir qismi də gəlib burada məskunlaşmışdılar və həmin gündən bəri mütəmadi olaraq Mədinədəki İslam icmasının əleyhinə fəaliyyətlərini genişləndirmişdilər. Bəni-Nəzir qəbiləsinin liderlərinin təşəbbüsü ilə Xeybər və ətraf bölgələrdəki yəhudilər təşkilatlanmış, müştərək silahlı qüvvə meydana gətirmişdilər. Lakin bunun yetərsiz olduğunun fərqində olduqları üçün Məkkə müşrikləri ilə sıx əlaqə yaratmış, üstəlik ətrafda yaşayan, Qətəfan, Fəzarə kimi müşrik bədəvi ərəb qəbilələrini də öz ittifaqlarına cəlb etmişdilər. Hudeybiyyə sülhündən dərhal sonra Xeybər yəhudiləri də hərbi hazırlıqlara başlamışdılar. Çünki müsəlmanlarla silahlı toqquşmanın qaçınılmaz olduğunun bilirdilər. Buna görə də Qətəfan və Fəzarə qəbilələrinin liderlərinə Xeybərin bir illik xurma məhsulunun yarısını mükafat olaraq və'd edib onları hərbi səfərbərliyə dəvət etdilər. Qətəfan və Fəzarə bədəviləri süvari qüvvələrini Xeybərə göndərdilər. Beləcə Xeybərdə təqribən 10 min nəfərlik hərbi qüvvə toplanmışdı. Allah Rəsulunun (s.ə.v) tapşırığı ilə Abdullah ibn Rəvahə (r.ə) əmri altındakı 6 casusla əvvəlcədən Xeybərə gəlmiş və burada baş verən, danışılan hər şey haqqında məlumat toplayıb mütəmadi olaraq Peyğəmbərə (s.ə.v) bildirmişdi. Xeybər yeddi qalaçadan ibarət idi. Bu qalaçalar yüksəkliklərdə yerləşən möhkəm divarlara malik istehkamlardan ibarət idi. Allah Rəsulu (s.ə.v) hicri 7-ci ilin məhərrəm ayının (may-iyun 628) sonlarında 1600 nəfərlik ordu ilə Mədinədən çıxıb şimala doğru irəlilədi. Ordunun 200 nəfəri süvari, geri qalanı piyada mücahidlərdən ibarət idi. İslam ordusu səhər vaxtı Xeybərə yaxınlaşanda bağ və bağçalarına gedən yəhudilərlə qarşılaşmış və onlar çaşqınlıqla hay-küy salaraq qaçıb istehkamlara sığınmışdılar. Müsəlmanlar istehkamlara xeyli yaxın yerdə düşərgə saldıqları üçün ilk gün yəhudilərin atdıqları oxlardan 50-yə yaxın mücahid yaralanmışdı. Daha sonra düşərgənin yeri dəyişdirildi. İslam ordusunun qərargahı Xeybərdən bir qədər aralıda, Rəcidə quruldu. Döyüşlər əsasən Nətat qalası ətrafında getmişdi. Çünki yəhudilər hərbi güclərini Nətatda cəmləşdirmiş, digər istehkamlara isə ailələrini və var-dövlətlərini yerləşdirmişdilər. Yeddi gün davam edən döyüşlər heç bir nəticə verməmişdi. Mücahidlərin bütün hücumları uğursuzluqla nəticələnmiş və geri çəkilməyə məcbur olmuşdular. Səhabədən Amir ibn Əkva (r.ə) və Mahmud ibn Məsləmə (r.ə) kimi mücahidlər bu döyüşlərdə şəhid olmuşdular. Çox sayıda yaralı da vardı. Nətat qalasında Fəzarə və Qətəfan bədəvilərinin 4000-dən artıq döyüşçüsü vardı. Bunlara Utbə ibn Bədr və Uyeynə ibn Hısn başçılıq edirdilər. Sə'd ibn Ubadə (r.ə) Allah Rəsulunun (s.ə.v) tapşırığı ilə Uyeynə ibn Hısnla görüşüb danışıq aparmışdı. Uyeynə ibn Hısna qüvvələrini geri çəkməsi müqabilində Xeybərin bir illik xurma məhsulunun ha-

mısı və'd edilmiş, lakin Uyeynə bu təklifi qəbul etməmişdi. Nətatda döyüşlərin getdiyi vaxt bir gecə Qətəfan və Fəzarəlilərin arasında müdafiəsiz qalmış yurdlarının basqın və talana məruz qaldığı xəbəri yayılmışdı. Buna görə də Qətəfan və Fəzarə qəbiləsindən olan döyüşçülər dərhal Xeybəri tərk edib öz yurdlarına getmiş, lakin bu xəbərin yalan olduğunu görmüşdülər. Uyeynə ibn Hısn geri, Xeybərə qayıtmaq istəyəndə isə qəbilədaşları onunla razılaşmayıb bu fikrindən daşındırmışdılar. Beləcə Xeybər yəhudiləri mühüm hərbi dəstəkdən məhrum olmuşdular. Bu yəhudilər arasında narahatlığa və təlaşa yol açmışdı. Onlar əsas qüvvələrini gecə vaxtı Nətatdan çıxarıb Şəqq qalasına aparmışdılar. Bir gecə vaxtı Ömər ibn Xəttabın (r.ə) başçılıq etdiyi mühafizə dəstəsi müsəlmanların qərargahı yaxınlığında iki yəhudi döyüşçünü ələ keçirmişdi. Bu iki nəfər yəhudi döyüşçü qaçaraq müsəlmanların qərargahına pənah gətirmişdilər. Onlar Allah Rəsulu (s.ə.v) ilə görüşəndə özləri və ailələrinə toxunulmayacağı şərtilə qalalardakı müdafiə sistemi haqqında ətraflı məlumat vermişdilər. Peyğəmbər (s.ə.v) Nətata hücum edəcək mücahidlərə Əli ibn Əbu Talibi (r.ə) əmir təyin etmişdi. Bu vaxt Əli ibn Əbu Talib (r.ə) göz xəstəliyindən əziyyət çəkirdi. Allah Rəsulu (s.ə.v) onun gözlərinə üfürüb mübarək əllərilə gözəlrini sildi və onun üçün dua etdi. Sonra öz əlilə ona zirehini geyindirib Zülfiqarı belinə bağladı və İslam ordusunun döyüş bayrağını Əli ibn Əbu Talibə (r.ə) verdi. Nətatdakı yəhudi ordusuna Mərhab və Yasir adlı iki qardaş başçılıq edirdilər. Yasir qaladan çıxıb döyüşmək üçün cəngavər istəmiş, onun qarşısına Peyğəmbərin (s.ə.v) bibisi Safiyyənin (r.ə) oğlu Zübeyr ibn Əvvam (r.ə) çıxmışdı. Yasirlə Zübeyr (r.ə) arasındakı qızğın döyüş uzun çəkmiş, nəhayət Zübeyr (r.ə) Yasiri yerə sərmişdi. Yəhudilərin iki tanınmış cəngavərini də Əbu Dücanə (r.ə) və Muhəmməd ibn Məsləmə (r.ə) təkbətək döyüşdə öldürmüşdülər. Nəhayət Xeybər yəhudilərinin polad dəbilqəli, polad qalxanlı və dəmir zirehli sərkərdəsi, məşhur cəngavər olan Mərhab meydana çıxmışdı. O, qılıncını havada fırladaraq meydan oxuyur və qarşısına çıxacaq cəngavər istəyirdi. "*Anam mənə Heydər (erkək aslan) demişdir. Mənəm qorxunc meşələrin aslanı. Qılınca qılıncla cavab verməyi mən bilirəm*" deyən Əli ibn Əbu Talib (r.ə) meydana çıxmış və Mərhabla təkbətək döyüşə girmişdi. Bir qədər vuruşandan sonra Əlinin (r.ə) endirdiyi qılınc zərbəsi Mərhabın qalxanını parçalamışdı. Zülfiqarın ikinci zərbəsi isə Mərhabın başına enmiş, dəbilqəsini yarıb alt çənəsinə qədər işləmişdi. Bu elə qüvvətli zərbə olmuşdu ki, oradakı hər kəs Əlinin (r.ə) qılıncının şaqqıltısını və parçalanan dəbilqənin çıxardığı səsi eşitmişdi. Mərhabın meyidinin meydanda qalması yəhudi ordusunun inam və cəsarətini qırmışdı. On gün davam edən döyüşlər nəticəsində Nətat mücahidlər tərəfindən fəth edilmişdi. Sonrakı 20

gün ərzində də digər 6 qala müsəlmanların əlinə keçmişdi. Beləcə Əli ibn Əbu Talib (r.ə) Xeybər fatehi adını qazanmışdı. Allah Rəsulu (s.ə.v) təslim olanlara toxunulmamasını tapşırmışdı. Yəhudilərdən istəyənlərin öz yurdlarında qalmasına izn verilmiş, cizyə müqabilində əhdnamə bağlanmışdı. Xeybər yəhudiləri hər il kənd təsərrüfatından əldə etdikləri məhsulun yarısını beytülmala vermək mükəlləfiyətini qəbul etmişdilər.

Xeybər uğrunda döyüşlər gedərkən Həbəşistana hicrət etmiş müsəlmanların son dəstəsi də Peyğəmbərin (s.ə.v) əmisi oğlu Cə'fər ibn Əbu Taliblə (r.ə) birlikdə geri qayıtmışdı. Allah Rəsulu (s.ə.v) buna o qədər çox sevinmişdi ki, "*bilmirəm hansına sevinim, Xeybərin fəthinəmi, Cə'fərin gəlişinəmi?*". Cə'fər ibn Əbu Taliblə (r.ə) birlikdə Həbəşistandan 70-ə yaxın xristian din xadimi də Allah Rəsulunu (s.ə.v) görmək üçün Mədinəyə gəlmişdi. Peyğəmbər (s.ə.v) onlarla söhbət etmiş, onlara Qur'andan ayələr oxuyaraq İslama dəvət etmişdi. İsa (ə.s) peyğəmbərə səmimiyyətlə inanan bu insanlar dinlədikləri ayələrin Allahdan başqasının kəlamı ola bilməyəcəyini anlamışdılar. Bu səbəbdən də qısa müddət sonra hamısı İslamı qəbul edib müsəlman olmuşdular. Cəfər ibn Əbu Taliblə (r.ə) birlikdə Peyğəmbərin (s.ə.v) xanımlarından Umm Həbibə (r.ə) də Mədinəyə gəlmişdi. Umm Həbibə (r.ə) Əbu Süfyan ibn Hərbin qızı idi. İslamı qəbul edib Məkkədən Həbəşistana hicrət edənlərin arasında əri Übeydullah ibn Cəhş ilə birlikdə Umm Həbibə (r.ə) də var idi. Lakin Übeydullah ibn Cəhş Həbəşistanda ikən irtidad edərək xristianlığı qəbul etmiş və bir müddət sonra ölmüşdü. Xeybər səfərindən əvvəl Allah Rəsulu (s.ə.v) Xalid ibn Səid ibn əl-Ası (r.ə) öz elçisi olaraq Həbəş kralı Nəcaşinin yanına göndərmişdi. Xalid ibn Səid (r.ə) Peyğəmbərin (s.ə.v) məktubunu Nəcaşiyə gətirmişdi. Bu məktubda Allah Rəsulu (s.ə.v) Əbu Süfyanın dul qalmış müsəlman qızı Umm Həbibə (r.ə) ilə evlənmək istədiyini və nikah vəkili olaraq Xalid ibn Səidi (r.ə) göndərdiyini bildirməkdə idi. Umm Həbibənin (r.ə) razılığı ilə 400 dirhəm mehr müqabilində nikah əqdi bağlanmış, Umm Həbibənin (r.ə) nikah vəkili də kral Nəcaşi olmuşdu.

Allah Rəsulu (s.ə.v) fəthdən sonra bir neçə gün Xeybərdə qalmışdı. Bu vaxt yəhudi liderlərdən Harisin qızı Zeynəb qoyun kəsdirərək ətini qızardıb Peyğəmbəri (s.ə.v) qonaq etmişdi. Zeynəb Xeybər uğrunda gedən döyüşlərdə öldürülmüş yəhudi Səllam ibn Mişkəmin dul arvadı idi. Allah Rəsulu (s.ə.v) ilk loxmanı ağzına qoyan kimi ətin zəhərli olduğunu anlamışdı. Lakin mücahidlərdən Bişr ibnü'l-Bəra əl-Ənsari (r.ə) adlı biri qızardılmış ətdən ağzına qoyduğu tikəni udduğu üçün qurtula bilməyib ölmüşdü. Peyğəmbər (s.ə.v) atası, qardaşı və əri döyüşdə öldürülmüş Zeynəbi əvf etsə də Bişrin (r.ə) qohumları qisas tələb etmiş və hazırladığı zəhərli əti Zeynəbin özünə yedirərək onu öldürmüşdülər.

Xeybərin fəthindən sonra Allah Rəsulu (s.ə.v) Fədək yəhudilərinə məktub yazaraq onları İslamı qəbul etməyə və ya cizyə ödəyərək itaət etməyə dəvət etmişdi. Fədək yəhudiləri cizyə ödəməyi qəbul etmişdilər. Onların əraziləri sülh yolu ilə ələ keçirildiyi üçün qənimət hesab edilməyərək paylaşdırılmamış, buradan əldə edilən gəlir Peyğəmbərin (s.ə.v) ailəsinin, xanımlarının, həmçinin qonaqların, səfərdə olanların ehtiyacları üçün ayrılmışdı. Teymə yəhudilərilə də eyni şəkildə cizyə ödəmələri şərtiylə əhdnamə bağlanmışdı. Bu gün Mədinədən 150 km şimalda, Xeybərlə Mədinə arasında bir kənd olan Fədək bağlarından əldə olunan vergilərin dövlət xəzinəsinə, beytülmala aid edilməsi və buradan, başda Allah Rəsulunun (s.ə.v) ev əhli olmaqla, ehtiyacı olanlara xərclənməsi Qur'anın Həşr surəsi 6-7-ci ayələrinin hökmü ilə Allah Rəsulunun (s.ə.v) özü tərəfindən həyata keçirilmişdi.

وَمَا أَفَاء ا ُ عَلَى رَسُولِهِ مِنْهُمْ فَمَا أَوْجَفْتُمْ عَلَيْهِ مِنْ خَيْلٍ وَلَا رِكَابٍ وَلَكِن ا َ يُسَلِّطُ رُسُلَهُ عَلَى مَن يَشَاء وَا ُ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ مَا أَفَاء ا ُ عَلَى رَسُولِهِ مِنْ أَهْلِ الْقُرَى فَلِلَّهِ وَلِلرَّسُولِ وَلِذِي الْقُرْبَى وَالْيَتَامَى وَالْمَسَاكِ ـ وَابْنِ السَّبِيلِ كَيْ لَا يَكُونَ دُولَةً بَيْنَ الْأَغْنِيَاء مِنكُمْ وَمَا آتَاكُمُ الرَّسُولُ فَخُذُوهُ وَمَا نَهَاكُمْ عَنْهُ فَانتَهُوا وَاتَّقُوا ا َ إِنَّ ا َ شَدِيدُ الْعِقَابِ

*"Allahın onların (Bəni-Nəzir qəbiləsinin) mallarından Öz Peyğəmbərinə verdiyi qənimət üçün siz onların üstünə nə at, nə də dəvə sürdünüz. Lakin Allah Öz peyğəmbərini istədiyi kimsələr üzərində hakim edər. Allah hər şeyə qadirdir! Allah Öz Peyğəmbərinə (dinc yolla fəth olunmuş) məmləkətlərin əhalisindən verdiyi qənimət Allaha, Peyğəmbərə, əqrabaya, yetimlərə, yoxsullara və (yolda olan) müsafirə məxsusdur. Bu ona görədir ki, (həmin mal-dövlət) içərinizdəki zənginlər arasında əldən-ələ dolaşan bir sərvət olmasın (ondan yoxsullar da faydalansın). Peyğəmbər sizə nə verirsə, onu götürün; nəyi qadağan edirsə, ondan əl çəkin. Allahdan qorxun. Həqiqətən, Allahın cəzası çox şiddətlidir."*

Fədək və Teymə məhz bu ayədə zikr olunduğu kimi dinc yolla, silahsız fəth olunmuşdu və Allah Rəsulu (s.ə.v) ayənin hökmünü yerinə yetirmişdi. Allah Rəsulu (s.ə.v) vəfat edəndən sonra onun ev əhli, xanımları Osman ibn Əffanı (r.ə) xəlifə Əbu Bəkrin (r.ə) yanına göndərərək buraların onlara Peyğəmbərin (s.ə.v) mirasi olaraq verilməsini istəmişdilər. Miras tələb edənlərin arasında xəlifənin qızı Ayşə (r.ə) də var idi. İmam Muhəmməd ibn İsmayıl əl-Buxari (810-869) "*Cəmi'u's-Səhih*" adlı hədis külliyatının "*Fəraiz*" və "*İ'tisam*" qismlərində xəlifənin onlara belə cavab verdiyini qeyd etməkdədir: "*siz Allahdan qorxmursunuzmu? Rəsulullahın (s.ə.v) bu sözünü eşitməmisinizmi: "Biz Peyğəmbərlər miras qoyub getmərik. Bizim qoyub getdiyimiz sədəqədir"*. Bu

*mallar Muhəmmədin (s.ə.v) ailəsinin, ev əhlinin və müsafirlərin ehtiyacları üçün xəclənəcək. Mən öləndən sonra kim iş başında olsa bu gəlirlər onun təsərrüfündə olacaq*". Bir müddət sonra Peyğəmbərin (s.ə.v) qızı Fatimə (r.ə) xəlifənin yanına gələrək həmin yerlərin ona miras olaraq çatmalı olduğunu bildirmişdi. İmam Buxari həmin əsərinin "*Məğazi*" bölümündə bu mövzuda xəlifə ilə Fatimənin (r.ə) arasındakı dialoqu qeyd etmişdir. Fatimə (r.ə) Əbu Bəkrdən (r.ə) soruşmuşdu:

- *Sən öləndən sonra kimlər sənə varis olacaqlar?*

- *Ailəm və övladlarım.*

- *Bəs elə isə necə olur ki, Rəsulullaha (s.ə.v) bizdən başqası mirasçı olur?*

- *Ey Allah Rəsulunun (s.ə.v) qızı! Allaha and olsun ki, atandan geriyə nə qızıl, nə də gümüş miras qalmamışdır.*

- *Fədəkdən bizə çatanlar necə olacaq?*

- *Ey Allah Rəsulunun (s.ə.v) qızı! Mən Allah Rəsulunun (s.ə.v) "Bunlar mən həyatda ikən Allahın mənə yedirdiyidir. Məndən sonra bunlar müsəlmanların malıdır" dediyini eşitmişəm.*

Beləcə Əbu Bəkr (r.ə) Allahın hökmünü və Rəsulunun (s.ə.v) bunu tətbiqini davam etdirmişdi. Ondan sonra gələn digər xəlifələr dövründə də bu beləcə davam etmişdir. Ömər ibn Xəttab (r.ə), Osman ibn Əffan (r.ə) və Əli ibn Əbu Talib (r.ə) bu hökmün tətbiqində əsla dəyişiklik etməyərək davam etdirmişdilər. Əlalxüsus Əli ibn Əbu Talibin (r.ə) bunda heç bir dəyişiklik etməməsi Əbu Bəkrin (r.ə) öz ictihadında isabət etdiyini göstərməkdədir. Əks təqdirdə Əli ibn Əbu Talib (r.ə) Fədəkdəki əmlakı vəfat etmiş zövcəsi Fatimənin (r.ə) övladlarına miras olaraq verərdi.

Vadi əl-Qura yəhudiləri cizyə ödəmək və ya İslamı qəbul etmək təkliflərinin heç birini qəbul etmədikləri üçün Allah Rəsulu (s.ə.v) Mədinəyə qayıtmadan əvvəl Vadi əl-Quraya yürüş etmişdi. İslam ordusu Vadi əl-Quraya çatandan sonra Peyğəmbər (s.ə.v) eyni təklifi bir daha təkrarlamışdı, fəqət yəhudilərdən eyni cavabı almışdı. Bu səbəbdən mücahidlər yəhudilərin möhkəmləndikləri istehkamlara hücum etmişdilər. Döyüşün birinci günü 11 nəfər itki verən yəhudilər təklif olunan cizyə şərtini qəbul etdiklərini bildirmişdilər.

Xeybər səfərindən Mədinəyə qayıdarkən Allah Rəsulu (s.ə.v) yolda Safiyyə (r.ə) ilə evlənmişdi. Safiyyə (r.ə) Bəni-Nəzir yəhudilərinin liderlərindən Huyey ibn Əxtabın qızı idi, atası və qardaşı Nətat qalasının fəthi vaxtı öldürülmüş, özü isə əsir düşmüşdü. Allah Rəsulu (s.ə.v) onu əsirlikdən azad edib nikah əqdi bağlamışdı.

Mədinəyə geri qayıdarkən Peyğəmbər (s.ə.v) Xeybər yəhudilərinə yardım edən Fəzarə qəbiləsinin yurduna da uğrayaraq onları cəzalandırmaq istəmişdi. Lakin Fəzarə bədəviləri İslam ordusunun onların yurduna tərəf irəlilədiyi xəbərini alan kimi qaçıb dağılışımışdılar. Bu səbəbdən də bu müsəlmanlar burada heç bir silahlı toqquşma baş vermədən Mədinəyə geri qayıtmışdılar.

*Xeybərin Fəthindən Sonrakı Bəzi Hadisələr*

Xeybərin fəthindən sonra, Allah Rəsulu (s.ə.v) hələ Xeybərdə ikən, Tufeyl ibn Əmr (r.ə) Dəvs qəbiləsinə mənsub, İslamı qəbul etmiş 80-90 ailə ilə birlikdə onun yanına gəlmişdi. Tufeyl ibn Əmr (r.ə) və qəbilədaşları yeni müsəlman olmuşdular. Allah Rəsulu (s.ə.v) Xeybər qəzvəsində əldə edilmiş qənimətdən onlara da pay ayırmış və onları Mədinədə məskunlaşdırmışdı. İslamı qəbul edib Mədinədə məskunlaşmış bu dəvslilərin arasında Əbu Hureyrə[31] (r.ə) də vardı.

Müharibə xərcləri və şimal-cənub ticarət yolunun uzun müddət bağlı olması Məkkənin iqtisadi-ticari həyatına ağır zərbə vurmuşdu. Buna əlavə olaraq uzun müddət yağış yağmaması quraqlığa səbəb olmuşdu. Şəhərdəki qıtlıq ələlxüsus Məkkənin kasıb əhalisinin həyatına mənfi təsir etmişdi. Allah Rəsulu (s.ə.v) öz həmşəhərlilərinə yardım məqsədiylə taxıl və xurma yüklü karvanı Əmr ibn Uməyyənin (r.ə) əmrinə verib onu bir miqdar nəğd pulla Məkkəyə göndərmişdi. O, göndərilənlərin Əbu Süfyan, Suheyl ibn Əmr və Səfvan ibn Uməyyəyə təhvil verilib Məkkənin kasıb əhalisinə paylanmasını istəmişdi. Suheyl və Səfvan göndərilən yardıma yaxın durmamışdılar. Əbu Süfyan isə bu yardımı qəbul edib Məkkəli kasıb müşriklərə paylamışdı.

Həvazin qəbiləsinin Sə'd ibn Bəkr oymağı Xeybər yəhudilərinə dəstək olmaq üçün süvari ordu hazırlayıb Turəbə vadisində toplamış, lakin Xeybər fəth edildiyi üçün onların köməyinə yetişə bilməmişdilər. Turəbə vadisi Taif civarından başlayıb Nəcdə qədər uzanan böyük bir vadi idi. Burada Həvazin qəbiləsindən Sə'd ibn Bəkr, Cuşəm ibn Müaviyə ibn Bəkr, Səqf ibn Münəbbih ibn Bəkr, Nəsr ibn Müaviyə ibn Bəkr oymaqları məskunlaşmışdılar. Bəni-Hilal

---

[31] İslamdan əvvəlki adı Əbdüşşəms ibn Sərx əd-Dəvsi idi. Adının Əbduəmr olduğunu qeyd edən mənbələr də var. Əbdüşşəms, yəni günəşin bəndəsi adı İslamda bəyənilməyən adlardan olduğu üçün Allah Rəsulu (s.ə.v) onun adını Əbdürrəhman, yəni Rəhman olan Allahın qulu, bəndəsi olaraq dəyişdirmişdi. Əbasının qolunun içində kiçik bir pişik balası bəslədiyini gördüyü üçün Allah Rəsulu (s.ə.v) ona "Əbu Hüreyrə", yəni balaca pişiyin atası demiş, bu onun ləqəbinə çevrilmiş və Əbu Hureyrə ləqəbi ilə tanınmışdı. Mədinəyə hicrət etdiyi vaxt orada kimsəsi olmadığı üçün gənc Əbu Hureyrə Məscidu'n-Nəbəvinin suffəsində qalmış və əshabi-suffədən biri olmuşdu. Hicrətindən sonra daim Peyğəmbərin (s.ə.v) yanında olur, onun bütün söhbətlərində iştirak edirdi. Buna görə də müksir, yəni ən çox hədis nəql edən səhabədən sayılırdı. Muhəmməd peyğəmbərdən (s.ə.v) eşitdiyi 5374 hədisi nəql edən Əbu Hureyrə Əbdürrəhman ibn Sərx əd-Dəvsi (r.ə) 674-cü ildə Mədinədə vəfat etmişdi.

və Bəni-Amir qəbilələrindən də bəzi oymaqlar burada məskun idilər. Allah Rəsulu (s.ə.v) hicri 7-ci ilin şaban ayının (dekabr 628) əvvəllərində Ömər ibn Xəttabın (r.ə) əmrinə 30 nəfərlik süvari qüvvə verərək Mədinədən dörd günlük məsafədə olan Turəbə vadisinə göndərmişdi. Üzərlərinə süvari mücahidlərin gəldiyi xəbərini eşidən kimi Həvazin oymaqları qaçıb dağılışmışdılar. Turəbə vadisini bir neçə gün gəzsə də müşriklərin silahlı qüvvələrinə rast gəlməyən Ömər ibn Xəttab (r.ə) dəstəsilə Nəcdə doğru bir qədər gedib sonra Mədinə yolunu tutmuşdu.

Ömər ibn Xəttabın (r.ə) Mədinəyə qayıtmasından qısa müddət sonra Allah Rəsulu (s.ə.v) Əbu Bəkrin (r.ə) başçılığı altında bir dəstə mücahidi Nəcdə göndərmişdi. Peyğəmbərin (s.ə.v) tapşırdığı kimi gecələr yol gedib gündüzlər gizlənən müsəlmanlar bir gecə vaxtı buradakı həvazinlilərə qəfil basqın etmişdilər. Müqavimət göstərməyə fürsət tapa bilən həvazinlilərdən bəziləri öldürülmüş, bəziləri isə əsir alınmışdı. Əbu Bəkrin (r.ə) dəstəsi ələ keçirə bildikləri qənimətlə Mədinəyə qayıtmışdı.

Hicri 7-ci ilin şaban ayının (dekabr 628) sonlarında Bəşir ibn Sə’din (r.ə) başçılığı altındakı bir dəstə mücahid Peyğəmbərin (s.ə.v) əmri ilə Murrə qəbiləsi müşriklərini cəzalandırmaq üçün bu qəbilənin məskunlaşdığı Fədək civarındakı bir vadiyə hərbi səfər etmişdi. Murrə müşriklərindən 100 nəfər süvari rəisləri Haris ibn Əvfin başçılığı altında Xəndək mühasirəsində iştirak etmişdi. Bəşir ibn Sə’din (r.ə) hərbi yürüşünün əvvəli müsəlmanlar üçün uğurlu keçmişdi. Onlar əldə etdikləri qənimətlərlə Mədinəyə qayıdarkən bir gecə vaxtı öz tədbirsizlik və ehtiyatsızlıqları ucbatından murrəlilərin qurduqları pusquya düşmüşdülər. Gecə səhərə qədər ox ataraq vuruşan tərəflər səhərin ilk işığı ilə şiddətli döyüşə girişmişdilər. Müşriklər öz say çoxluğundan istifadə edərək mücahidləri mühasirəyə almışdılar. Bəşir ibn Sə’din (r.ə) dəstəsindəki mücahidlər son nəfəslərinə qədər vuruşaraq şəhid olmuşdular. Bəşirin (r.ə) özü isə aldığı qılınc və ox yaralarından ötürü çox qan itirmiş, huşsuz halda yıxılıb qalmışdı. Onun qana bələnmiş üzünü və bədənini görən müşriklər öldüyünü zənn etmişdilər. Mücahidlərdən sadəcə Utbə ibn Zeyd əl-Harisi (r.ə) yüngül yaralarla sağ qurtulub özünü Mədinəyə çatdırmış və bu acı xəbəri müsəlmanlara çatdırmışdı. Bəşir ibn Sə’d (r.ə) bir gün döyüş meydanında huşsuz qalandan sonra özünə gəlib sürünə-sürünə Fədəkə gəlmişdi. Burada bir yəhudi yaraları sağalıb yeriyə bilənə qədər onu evində saxlamışdı. Daha sonra Bəşir (r.ə) Mədinəyə gələ bilmişdi.

Qətəfan qəbiləsinin oymaqları olan Bəni-Sə’ləbə və Bəni-Uvala qarşı müsəlmanların əvvəlki hərbi səfərləri haqqında yuxarıda bəhs etmişdik. Bunlardan birincisində Muhəmməd ibn Məsləmənin (r.ə) başçılıq etdiyi 10 mücahid

şəhid olmuşdu. İkincisində isə Əbu Ubeydə Amir ibn Cərrahın (r.ə) əmrindəki 40 nəfər mücahid Zil-Qissə adlanan yerdə Sə'ləbə və Uval qəbilələrinə hücum edərək öldürülən müsəlmanların qisasını almışdılar.

Hicri 7-ci ilin ramazan ayında (yanvar 629) Allah Rəsulu (s.ə.v) Qalib ibn Abdullah əl-Leysinin (r.ə) əmrinə 10 nəfər mücahid verərək Meyfə adlı yerdə məskunlaşmış Bəni-Sə'ləbə müşriklərinin üzərinə göndərmişdi. Onlara Meyfəni çox yaxşı tanıyan Yəsar adlı bir müsəlman bələdçilik etmişdi. Yəsar bir vaxtlar Nəcd civarındakı Meyfədə çobanlıq etmiş zənci kölə idi. Əsir düşmüş, İslamı qəbul edəndən sonra Peyğəmbər (s.ə.v) onu əsirlikdən azad etmişdi. Yəsarın (r.ə) bələdçiliyi ilə Qalib ibn Abdullah əl-Leysinin (r.ə) dəstəsi çox gizlicə Sə'ləbə oymağının yurduna yaxınlaşmış və onlara qəfil basqın etmişdi. Oymağın liderlərindən bəzilərini öldürməyə müvəffəq olmuşdular. Geri qalanları isə qaçıb canlarını qurtarmışdılar. Qalib ibn Abdullahın (r.ə) dəstəsi aldıqları qənimətlərlə Mədinəyə qayıtmışdılar.

Hicri 7-ci ilin ramazan ayında (yanvar 629) baş vermiş mühüm hadisələrdən biri də əl-Hurqə səriyyəsidir. Əl-Hurqə Mədinə ətrafında məskun olan Cuheynə qəbiləsinin ən böyük oymaqlarından biri idi. Cuheynə qəbiləsilə Mədinə İslam dövləti arasında sülh əhdnaməsi mövcud idi və qəbilə bu əhdnaməyə əməl etməkdə idi. Lakin Cuheynə qəbiləsinə bağlı olan əl-Hurqə oymağı əhdnamə şərtlərini pozaraq Məkkə müşriklərinə yardım etməkdə idi. Allah Rəsulu (s.ə.v) öz oğulluğu Zeyd ibn Harisənin (r.ə) oğlu Usamə ibn Zeydi (r.ə) mühacir və ənsar gənclərindən ibarət kiçik bir silahlı dəstləyə əmir etəyin edərək əl-Hurqə oymağının yurduna göndərmişdi. Hicrətdən yeddi il əvvəl Məkkədə dünyaya gəlmiş Usamə ibn Zeyd (r.ə) bu vaxt 14 yaşlı gənc idi. Gənclik yaşlarına yeni qədəm qoymuş Usamə ibn Zeyd (r.ə) bu işin öhdəsindən uğurla gəlmişdi. O, öz mücahidlərilə bir səhər vaxtı əl-Hurqə yurduna qəfil basqın edərək əhdə vəfa etməyən bu qəbilə mənsublar ilə döyüşə girmişdi. Əl-Hurqəlilərin müqaviməti çox keçmədən qırılmışdı. Bu döyüş vaxtı Usamə ibn Zeyd (r.ə) onlara qarşı inadla müqavimət göstərənlərdən birinə həmlə etmişdi. Usamənin (r.ə) həmləsinə tab gətirməyən adam ölümün labüd olduğunu görəndə "*lə iləhə illallah*" deyə hayqırmış, lakin Usamə ibn Zeyd (r.ə) nizəsini onun sinəsinə sancaraq öldürmüşdü. Dəstə yürüşdən Mədinəyə qayıdandan sonra baş verənlər Allah Rəsuluna (s.ə.v) məruzə edildiyi vaxt bu hadisə də təfərrüatı ilə danışılmışdı. Allah Rəsulu (s.ə.v) Usamə ibn Zeydi (r.ə) yanına çağırıb "*ey Usamə! Sən "lə iləhə illallah" deyən bir adamı öldürdün?*" deyə soruşanda Usamə (r.ə) "*ey Allahın Rəsul! Həmin adam onu öldürməyim deyə qorxusundan bunu söylədi*" deyə cavab vermişdi. Onun bu cavabından sonra "*bunu haradan bilirsən? Qəlbinin içinəmi baxdın?*"

söyləyən Allah Rəsulu (s.ə.v) "*ey Usamə! Demək sən "lə iləhə illallah" deyən bir adamı öldürdün*" demiş və bunu dəfələrlə təkrarlamışdı. Usamə ibn Zeyd (r.ə) Allah Rəsulunun (s.ə.v) bu məzəmmətindən ötürü dərin peşmanlıq keçirmiş və kədərlənmişdi. Bu səbəbdəndir ki, Əli ibn Əbu Talibin (r.ə) xəlifəliyi dövründəki daxili çəkişmələrdə bir çox səhabə kimi Usamə ibn Zeyd (r.ə) də iştirak etməmişdi.

Casuslar Qətəfan və Fəzarə qəbilələrindən olan silahlıların Uyeynə ibn Hısnın başçılığı altında Mədinəyə basqın etmək üçün toplandıqları xəbərini gətirmişdilər. Allah Rəsulu (s.ə.v) Əbu Bəkr (r.ə) və Ömər ibn Xəttabla (r.ə) məşvərət etdikdən sonra yaraları artıq tamamən sağalmış Bəşir ibn Sə'di (r.ə) 300 nəfərlik mücahidə əmir təyin edərək hicri 7-ci ilin şəvval (fevral 629) ayında onların üzərinə göndərmişdi. Bəşir ibn Sə'd (r.ə) əvvəlcə qətəfanlıların yurduna hücum edərək talan etmiş daha sonra onların silahlılarının toplandığı yerə yollanmışdı. Cinab adlı yerdə tərəflər arasında baş vermiş şiddətli döyüş müsəlmanların qələbəsi ilə bitmişdi. Müşriklər döyüş meydanındakı cəsədlərini qoyub qaçmağa başlayanda mücahidlər onları təqib etmiş və bir neçə nəfəri yaxalayıb əsir almışdılar. Cinab döyüşü müsəlmanların tam qələbəsilə başa çatmış, onlar bol qənimətlə Mədinəyə qayıtmışdılar.

Hicri 7-ci ilin zilqədə ayında (mart 629) Hudeybiyyə əhdnaməsinin üzərindən bir il ötmüş və həcc mövsümü gəlib çatmışdı. Allah Rəsulu (s.ə.v) Mədinə və ətrafda yaşayan müsəlmanlara xəbər göndərərək umrə ziyarəti üçün hazırlaşmalarını tapşırmışdı. Umrə ziyarətini gerçəkləşdirmək üçün Məkkə yolunu tutan müsəlmanların sayı 2000-ə qədər idi. 70 qurbanlıq dəvə hazırlanmışdı. Allah Rəsulunun (s.ə.v) əmri ilə silah-sursat, zireh kimi bir sıra hərb təchizatı da hazırlanmışdı. Bu hərbi təchizat Bəşir ibn Sə'din (r.ə) silahlı dəstəsinə tapşırılaraq yola çıxarılmışdı. Əshabdan bəziləri sülhün şərtlərinə görə Məkkəyə silahsız daxil olmalı olduqlarını söyləyəndə Peyğəmbər (s.ə.v) bu hərbi təchizatla Məkkəyə girmək niyyətində olmadığını, bunları hər ehtimala qarşı hazırlatdığını bildirmişdi. Peyğəmbər (s.ə.v) 100 nəfər süvarini isə Muhəmməd ibn Məsləmənin (r.ə) başçılığı altında əvvəlcədən yola çıxarmışdı. Allah Rəsulu (s.ə.v) Əbu Zərr əl-Ğifarini (r.ə) Mədinədə öz yerinə vəkil təyin edəndən sonra digər müsəlman zəvvarlarla birlikdə yola çıxmışdı. Bəşir ibn Sə'din (r.ə) dəstəsi Məkkə yaxınlığındakı Mərr əz-Zəhran adlı yerdə Qüreyş müşriklərindən bir dəstə atlı ilə rastlaşmışdı. Onlar müsəlmanlardan səfərin səbəbini soruşub niyyətin umrə olduğunu öyrənsələr də silah-sursat yüklü dəvələri görüb qorxuya düşmüş və tez Məkkəyə qayıdıb oradakıları vəziyyətdən xəbərdar etmişdilər. Allah Rəsulu (s.ə.v) Mərr əz-Zəhrana çatanda Əvs ibn

Xavlə əl-Ənsariyə (r.ə) hərbi təchizatı Məkkədən 5 km aralı olan Bətni-Yə'cəcə aparıb 200 adamı ilə orada mühafizə etməyi tapşırdı. Müsəlmanlara məxsus silah-sursat yüklü dəvələrin Məkkə yaxınlığında olması Qüreyşi qorxuya salmışdı. Onlar Mikrəz ibn Həfs ibn əl-Uxeyfi Allah Rəsulunun (s.ə.v) yanına göndərərək sülh əhdnaməsinin şərtlərinə görə silahsız olaraq Məkkəyə daxil ola biləcəklərini xatırlatmışdılar. Allah Rəsulu (s.ə.v) onlara əhdnamə şərtlərini yaxşı bildiyini, hərbi təchizatla Məkkəyə girməyəcəyini söyləyərək Qüreyşi əndişədən xilas etmişdi. Məkkə müşriklərinin əksəriyyəti müsəlmanların Kə'bəni ziyarətini görmək istəmədikləri üçün şəhəri tərk edərək ətrafdakı dağların yüksək yerlərində çadır qurub oturmuşdular. Allah Rəsulu (s.ə.v) əshabı ilə birlikdə təlbiyyələrlə Məkkəyə daxil olub umrə ziyarətini qaydasına uyğun olaraq yerinə yetirmişdi. Allah Rəsulu (s.ə.v) Məkkədə qaldığı üç gün boyunca heç bir evdə yatmamış, qurdurduğu çadırda qalmışdı. Mühacirlər ənsardan olan qardaşlarına Allah, Rəsulu (s.ə.v) və İslam uğrunda hicrət edərkən bu şəhərdə tərk etdikləri evləri, köşkləri və mülklərini göstərmişdilər. Peyğəmbər (s.ə.v) Bilal Həbəşidən (r.ə) Kə'bənin üzərinə çıxıb əzan oxumasını istəmişdi. Əzan səsi Kə'bənin üzərindən dalğa-dalğa bütün Məkkəyə yayılmışdı. Əzanın səsi İkrimə ibn Əbu Cəhl, Səfvan ibn Üməyyə, Suheyl ibn Əmr kimi qüreyşli müşrikləri dərindən narahat etmişdi. Onlar üzlərini örtüb qulaqlarını əlləri ilə tıxmış, Bədrdə ölüb gedən atalarının bu günü görmədiklərinə şükür etmişdilər. Müşriklərin liderlərindən Xalid ibn Useyd Bilal Həbəşinin oxuduğu əzanı eşidəndə belə demişdi: "*Allah həqiqətən lütfkardır. Nə yaxşı ki, atam ölüb getdi və bu qara arvadın oğlunun Kə'bənin damında anqırdığını* (nəuzubillah) *eşitmədi*". Müsəlman zəvvarlar Məkkədə üç gün qalıb umrə ziyarətini başa vurduqdan sonra Mədinəyə geri qayıtmışdılar.

Müsəlmanların Məkkəyə daxil olub Kə'bəni ziyarət etmələri həmin günə qədər İslama və müsəlmanlara düşmən kəsilmiş bəzi insanların zehnində tərəddüd meydana gətirmişdi. Bunlardan biri də Xalid ibn Vəlid idi. Xalid ibn Vəlid yeniyetmə yaşlarından etibarən at belində əldə qılınc döyüşlərdə iştirak edən cəsur cəngavər, hərbi işdə ustalığı ilə tanınmış bir şəxs idi. O, Uhud döyüşünün Qüreyş müşriklərinin qələbəsilə bitməsində mühüm rol oynamışdı. Hudeybiyyə günü də müsəlman zəvvarların yolunu kəsən süvari dəstəyə başçılıq etmişdi. Müsəlman olub hicrət etmiş Vəlid ibn Vəlid (r.ə) qardaşı Xalidi şirk bataqlığından çıxarıb hidayətə qovuşdurmaq üçün çox çalışmışdı. Bu iki qardaş Qureyşin ən nüfuzlu və zəngin adamlarından, İslama qarşı şiddətlə mübarizə aparmış Vəlid ibn Muğirənin oğlu idilər. Vəlid ibn Muğirə Peyğəmbərin (s.ə.v) Mədinəyə hicrətindən üç ay sonra ayağında meydana gəlmiş yaranın iltihab-

lanması nəticəsində ölmüşdü. Əbu Süleyman Xalid ibn Vəlid ibn Muğirə əl-Məxzuminin tərəddüdləri hələ müşriklər üçün uğursuzluqla bitmiş Xəndək mühasirəsi vaxtı başlamışdı. Allah Rəsulunun (s.ə.v) möminlərlə birlikdə Kə'bəni ziyarət etməsindən sonra isə artıq könlündə sadəcə bir şey vardı, İslam. O, Allah Rəslunun (s.ə.v) hüzuruna çıxıb imanını açıqlamaq və müsəlmanlara qoşulub Məkkədən Mədinədən getmək istəyirdi. Lakin tərəddüdlü idi və çəkinirdi. Müsəlmanlar umrədən sonra Məkkəni tərk edərkən qardaşı Vəlidin (r.ə) onun üçün yazıb qoyduğu məktub bütün tərəddüdlərini silib-süpürmüş və Xalid hicrət etmək qərarına gəlmişdi. O, bu fikrini İkrimə ibn Əbu Cəhlə açıqladı, lakin İkrimə onu qınayıb bu fikrindən daşındırmağa çalışdı. Nəhayət o, özü ilə eyni fikirdə olan daha iki nəfərlə rastlaşdı, Əmr ibn əl-As və Osman ibn Təlhə. Beləcə bu üç nəfər birlikdə Mədinəyə gəlmiş, Allah Rəsulunun (s.ə.v) hüzurunda İslamı qəbul edib imanlarını açıqlamışdılar. Əbu Suleyman Xalid ibn Vəlid əl-Məxzumi (r.ə) Əbu Həfs Ömər ibn Xəttabın (r.ə) xəlifəliyi dövründə Qinnəsreyn valiliyi vəzifəsindən azad ediləndən sonra dörd il Şam diyarındakı Hums şəhərində yaşamış və hicri 21-ci (642) ilin ortalarında orada vəfat edərək dəfn edilmişdi. Bütün ömrü döyüş meydanlarında keçmiş bu şanlı komandan ömrünü xəstə yatağında başa vurmuşdu. Ruhunu təslim etməmişdən əvvəl söylədiyi sözlər bundan ötürü son dərəcə kədərli olduğunu göstərir: "*yüzdən çox döyüşdə iştirak etdim və hər zaman şəhid olmağı arzuladım. Bədənimin elə bir yeri yoxdur ki, orada ox, nizə, xəncər və qılınc yarası olmasın. Amma buna baxmayaraq qocalmış bir dəvə kimi yataqda can verirəm*". Allah Rəsulu (s.ə.v) Xalidə (r.ə) "*Seyfullah*" (Allahın qılıncı) ləqəbini vermişdi və Allah öz qılıncının düşmən əlində sınmasına izn verməyərək bu cəsur və şücaətli səhabəyə çox arzuladığı şəhidliyi bəxş etməmişdi.

Hicri 7-ci ilin zilhiccə ayının (aprel 629) sonlarında Allah Rəsulu (s.ə.v) Əhrəm ibn Əbül-Əşca əs-Süləmini (r.ə) öz qəbilədaşlarının, Süleym qəbiləsinin yanına göndərmişdi. Əhrəm ibn Əbül-Əşca (r.ə) əmri altındakı 50 mücahidlə Nəcdlə Vadi əl-Qura arasındakı ərazidə məskun olan Süleym qəbiləsinə mənsub oymaqların yurdlarına getmişdi. Süleym qəbiləsindən olan müşriklər casusları vasitəsilə müsəlmanların onların üzərinə gəldiyi xəbərini almış, lazımi tədbirləri görmüşdülər. Əhrəm (r.ə) onlardan bir qrup adamla görüşüb öz qəbilədaşlarını İslama dəvət etdi, lakin rədd cavabı aldı. Ətrafdakı bəzi bədəvilər də süleymli müşriklərin köməyinə gəlmişdilər. Əhrəmin (r.ə) mücahidləri ilə süleymli müşriklər arasındakı döyüş müsəlmanların məğlubiyyəti ilə bitmişdi. Buradakı 50 mücahidin demək olar ki, hamısı şəhid olana qədər müşriklərlə vuruşmuşdular.

Hicri 8-ci ilin səfər ayında (may 629) Allah Rəsulu (s.ə.v) Qalib ibn Abdullah əl-Leysi əl-Kinanini (r.ə) 20 nəfər mücahidlə Məkkə ilə Mədinə arasındakı Kədid adlı yerə göndərmişdi. Kədid Məkkədən 67 km şimalda yerləşirdi və burada Kinanə qəbiləsinin Bəni-Müləvvəh oymağı məskun idi. Qalib ibn Abdullahın (r.ə) dəstəsi bir səhər vaxtı Xəndək mühasirəsində canfəşanlıq etmiş Bəni-Müləvvəh oymağına qəfil basqın etmiş, müqavimət göstərənləri məğlub edib xeyli qənimətlə geri, Mədinəyə qayıtmışdı. Yolda Kinanə qəbiləsinin digər oymaqlardan toplanmış süvarilər mücahidləri təqib etsələr də onlara çata bilməmişdilər.

Yuxarıda Murrə qəbiləsi müşrikləri ilə müsəlmanlar arasında cərəyan etmiş bəzi döyüşlər haqqında məlumat vermişdik. Bu qəbilyə mənsub müşriklər Xəndək mühasirəsində də iştirak etmişdilər. Allah Rəsulu (s.ə.v) 200 nəfər mücahiddən ibarət dəstə hazırlamış və Zübeyr ibn Əvvamı (r.ə) onlara başçı təyin etmişdi. Hədəf Murrə qəbiləsi idi. Lakin bu dəstə yola çıxmağa hazırlaşarkən Qalib ibn Abdullah əl-Leysi (r.ə) Kədid səfərindən qayıtmışdı. Peyğəmbər (s.ə.v) onu Zübeyrin (r.ə) yerinə təyin edərək Murrə müşriklərinin üzərinə göndərmişdi. Qalib ibn Abdullah əl-Leysi (r.ə) Murrə qəbiləsinin yurduna çatanda mücahidləri bir neçə dəstəyə ayırdı. Onları diqqətli bir şəkildə təlimatlandırıb dəstə başçılarının əmirlərinə dəqiq əməl etməyi tapşırdı. Sonra onları Allah yolunda cihad üçün təşviq edən qısa nitq söylədi. Axşam vaxtı mücahidlər dörd bir tərəfdən Murrə qəbiləsinin yurduna hücum etdilər. Bir neçə saat davam edən şiddətli döyüş müsəlmanların qələbəsi ilə bitdi. Mürrəli müşriklərin əli silah tutanlarının bir çoxu bu döyüşdə öldürülmüşdü.

Həvazin qəbiləsinin Bəni-Amir oymağının başçısı Amir ibn Tufeylin Süleym qəbiləsinə mənsub Ri'l, Zəkvan və Usəyyə oymaqlarından topladığı müşriklərlə birlikdə Məunə quyusu yaxınlığında 40 nəfər müsəlman dəvətçinin başına gətirdiyi müsibət haqqında yuxarıda danışmışdıq. Allah Rəsulu (s.ə.v) hicri 8-ci ilin rəbiələvvəl ayında (iyul 629) Şüca ibn Vəhb əl-Əsədini (r.ə) 24 nəfər mücahidə başçı təyin edərək Bəni-Amir oymağının yurduna göndərmişdi. Şüca ibn Vəhb (r.ə) yoldaşları ilə birlikdə gizlicə Bəni-Amirin yurduna gəlmiş və bir səhər vaxtı onlara qəfil hücum edərək darmadağın etmişdi. Onlardan müqavimət göstərənlər öldürülmüş, geri qalanları isə yurdlarını qoyub qaçmışdılar. Mücahidlər oradan ələ keçirdikləri qənimətlər və əsirlərlə Mədinəyə geri qayıtmışdılar.

Hicri 8-ci ilin əvvəllərində (aprel-may 629) Allah Rəsulunun (s.ə.v) qızı Zeynəb (r.ə) Mədinədə vəfat etmişdi. O, Məkkədən Mədinəyə hicrət edərkən Xəbbar ibn Əsvəd adlı bir müşrik Zeynəbin (r.ə) oturduğu dəvə üzərindəki

kəcavəyə hücum etmiş və onu vurub kəcavədən yerə yıxmışdı. Zeynəb (r.ə) bu vaxt hamilə idi və yıxıldığı vaxt bətnindəki övladını düşürmüşdü. Həmin gündən vaxtaşırı olaraq davam edən qanaxmasını dayandırmaq mümkün olmamışdı. Allah Rəsulunun (s.ə.v) qızı Zeynəb (r.ə) həmin bu xəstəlik səbəbiylə vəfat etmişdi.

*Mutə Döyüşü*

Allah Rəsulu (s.ə.v) umrə ziyarətindən sonra Kə'b ibn Umeyr əl-Ğifarinin (r.ə) başçılığı altında 15 nəfər müsəlman dəvətçini indiki Suriya, İordaniya, Fələstin, Livan və İsrail dövlətlərinin ərazilərinin daxil olduğu Şam diyarının cənubuna, Zatu-İtlah adlanan yerə göndərmişdi. Onlara Qəssan qəbiləsinin oymaqlarını gəzərək buradakı, əksəriyyəti xristian olan ərəbləri İslama dəvət etmək tapşırılmışdı. Qəssanilər Bizans imperiyasının həm ərəb yarımadası, həm də Sasanilərlə olan sərhədlərində yaşayırdılar. Bizans dövləti bu yerlərdə daimi ordu saxlamırdı. İmperiyanın bu ərazilərinin mühafizəsi qəssanilərin silahlı qüvvələrinə həvalə edilmişdi. Bizans dövləti buradakı ərəblərin xristian dinindən dönməsindən böyük əndişə duyur, bu ərazilərin itirilməsi təhlükəsilə qarşılaşacağını düşünürdü. Bizansın Fələstin canişini Fərvə ibn Əmr əl-Cuzaminin (r.ə) aqibəti haqqında yuxarıda məlumat vermişdik. Bizans bu kimi hadisələrin bir daha təkrarlanmaması üçün Şam diyarındakı ərəb qəbilə rəislərinə qəti təlimat vermişdi. Bu səbəbdən də Qəssanilər Kə'b ibn Umeyr (r.ə) və yoldaşlarını öz yurdlarında görən kimi onlara hücum etmişdilər. Dəvətçilərin əksəriyyəti şəhid olana qədər onlarla vuruşmuş, qəssanilər də bu döyüşdə xeyli itgi vermişdilər. Bundan qısa müddət sonra da Qəssani qəbilə rəislərindən Şurahbil ibn Əmr yanına gələn Allah Rəsulunun (s.ə.v) elçisi Haris ibn Umeyr əl-Əzdini (r.ə) əvvəlcə həbs, sonra isə edam etdirmişdi. Elçinin öldürülməsi bütün hallarda müharibə səbəbi olduğu üçün Allah Rəsulu (s.ə.v) dərhal Mədinədə hərbi səfərbərlik elan etmişdi. Peyğəmbər (s.ə.v) hazırlanmış 3000 nəfərlik orduya Zeyd ibn Harisəni (r.ə) əmir, Cə'fər ibn Əbu Talibə (r.ə) Abdullah ibn Rəvahanı (r.ə) da ona vəkil təyin etmişdi. Biri şəhid olarsa digəri ordu komandanlığını ələ alacaqdı. İslam ordusu hicri 8-ci ilin cəmaziyələvvəl ayında (avqust-sentyabr 629) Mədinədən Şam diyarına tərəf hərəkət etmişdi. Bu hərbi səfərbərlik xəbərini öyrənən Şurahbil ibn Əmr özünün və Şam diyarındakı Bizans hərbi qüvvələrini toplayaraq 100 minlik ordu meydana gətirmişdi. Bizans imperatoru İraklinin (Heraklios/610-641) qardaşı Feodor (Theodoros) bu ordudakı yunan hərbi dəstələrinə komandanlıq etməkdə idi. Şurahbil İslam ordusunun sayı, təchizatı və hərəkət istiqaməti barədə məlumat

toplamaq üçün qardaşı Sə'dusun əmrinə 50 nəfərlik kəşfiyyatçı dəstəsi verərək irəli göndərmişdi. Bu dəstə Vadi əl-Qura yaxınlığında mücahidlər tərəfindən pusquya düşürülərək məhv edilmişdi. İndiki İordaniya ərazisindəki Məən qalası civarına çatanda İslam ordusunun kəşfiyyatçıları düşmən ordusu barədə xəbərlərlə Zeyd ibn Harisənin (r.ə) yanına qayıtmışdılar. İki ordu arasında xeyli say fərqi vardı. Üstəlik İslam ordusu düşmən ərazisində idi. Buna görə də Zeyd ibn Harisə (r.ə) ordudakı əmirlərlə müşvirə edib vəziyyəti məktubla Allah Rəsuluna (s.ə.v) bildirmək və ondan gələcək təlimata uyğun hərəkət etmək istədiyini bildirmişdi. Lakin Abdullah ibn Rəvahə (r.ə) onun fikrinə etiraz edərək belə demişdi: "*indi burada tərəddüd etdiyimiz şey əldə etmək üçün yola çıxdığımız şeydir, yəni şəhid olmaqdır. Biz ancaq şərəfimizi ucaldan İslam uğrunda cihad etməklə mükəlləfik. Əsas məqsədimiz qələbə deyildir. Məncə dərhal hərəkətə keçməliyik. Beləcə ikisindən birini əldə edərik, ya qazilik, ya da şəhidlik*". Onun bu çıxışı mücahidlərdə ruh yüksəkliyi yaratmışdı. 3000 nəfərlik İslam ordusu Mutə adlanan yerdə 100 min nəfərlik Bizans ordusu ilə qarşı-qarşıya durmuşdu. Altı gün davam edən ağır döyüşlərdə qəhrəmancasına döyüşən mücahidlər düşmən ordusuna ağır itgi verdirmiş, 11 mücahid şəhid olmuşdu. Şəhidlərin arasında Zeyd ibn Harisə (r.ə), Cə'fər ibn Əbu Talib (r.ə) və Abdullah ibn Rəvahə (r.ə) də var idi. Daim ön cərgələrdə qəhrəmanlıqla vuruşan Zeyd ibn Harisənin (r.ə) cənazəsi qanına boyanmışdı. O, özü ilə çiyin-çiyinə vuruşan gənc oğlu Usamə ibn Zeydin (r.ə) gözü qarşısında şəhid olmuşdu. Lakin bu igid gənc döyüşdə atasını itirməsinə baxmayaraq mətanət və cəsarətini itirməmişdi. Cəfər ibn Əbu Talib (r.ə) ağır yaralı olmasına baxmayaraq Allah Rəsulunun (s.ə.v) onlara verdiyi döyüş bayrağını yerə salmamış, yoldaşları götürənə qədər bayrağı dik saxlamışdı. Cə'fərin (r.ə) bədənində çox sayıda qılınc, ox və nizə yarası vardı. Orduya komandanlığı üzərinə götürmüş Abdullah ibn Rəvahənin (r.ə) də şəhid olmasından sonra əmirlərdən Əbül-Yusr Kə'b ibn Əmr əs-Süləmi (r.ə) və Sabit ibn Ərqam əl-Bədrinin (r.ə) təklifi ilə cəmi bir neçə ay əvvəl İslamı qəbul etmiş Əbu Süleyman Xalid ibn Vəlid əl-Məxzumi (r.ə) İslam ordusuna komandan seçilmişdi. Bacarıqlı sərkərdə olan Xalid ibn Vəlid (r.ə) hərbi hiyləyə əl atmışdı. O, döyüşün 6-cı gününün gecəsi bir dəstə süvarini ordudan ayıraraq xeyli arxaya göndərmiş və səhərin ilk işıqlarında çaparaq döyüş meydanına gəlmələrini tapşırmışdı. Süvarilərin səhrada qoparacağı toz-duman İslam ordusuna əlavə qüvvələrin köməyə gəldiyi düşüncəsini oyadaraq düşmənin qəlbinə qorxu salacaqdı. O, həm də dəstələrin də yerini dəyişmişdi. Sol cinah əsgərlərini sağa, sağ cinahı isə sola keçirmişdi. Ordunun arxasını qoruyan dəstəni isə önə keçirmiş və yeddinci günün səhəri düşmənə şiddətli hücum et-

mişdi. Onun planı baş tutmuşdu. Səhrada toz-dumanın qalxdığını və bir dəstə süvarinin arxadan gəlib İslam ordusuna qoşulduğunu görən düşmən böyük bir qüvvənin köməyə gəldiyi zənn etmişdi. Bu Bizans ordusunun onsuz da aşağı olan əhval-ruhiyyəsinə ağır zərbə olmuş və düşmən mücahidlərin şiddətli hücumu qarşısında geri çəkilmişdi. Xalid ibn Vəlid (r.ə) bütün Mutə döyüşü boyu ön cərgələrdə vuruşmuş, yeddi gün ərzində onun əlində 9 qılınc sınmışdı. Yeddinci günün gecəsi Xalid ibn Vəlid (r.ə) İslam ordusunu döyüş meydanından geri çəkmişdi. O, arxadan gələ biləcək qəfil zərbədən qorunmaq üçün bir dəstə süvari ayıraraq onlara ordunu təqibdən qorumaq tapşırığı vermişdi. Ordu Mutədən qayıdıb Mədinəyə daxil olanda bəzi müsəlmanlar mücahidləri döyüşdən qaçmaqla ittiham etmişdilər. Lakin Allah Rəsulu (s.ə.v) onlara haqsız olduqlarını, mücahidlərin qeyri-bərabər döyüdə qəhrəmanlıqla vuruşduqlarını bildirərək tənə etməkdən çəkindirmişdi.

Mutə döyüşündə şəhid olmuş Cə’fər ibn Əbu Talibin (r.ə) dul qalmış xanımı Umeyyis qızı Əsma (r.ə) deyir ki: “*həmin gün çörək bişirmək üçün xəmir yoğurmuşdum, uşaqlarımı yuyundurub onlara ətir vurmuşdum. Allah Rəsulu (s.ə.v) evimizə gəldi. Uşaqları gətirməyimi istədi. Peyğəmbər (s.ə.v) Cə’fərin (r.ə) uşaqlarını öpüb qoxladıqca mübarək gözlərindən yaş süzülürdü”. Dedim ki, “Sən niyə ağlayırsan ey Allahın Elçisi (s.ə.v)? Yoxsa Cə’fərgildən bir xəbər var?” . Dedi ki, “Bəli, onlar bu gün şəhid oldular”. Bunu eşidəndə ağlamağa başladım. Qadınlar başıma toplaşdılar. Peyğəmbər (s.ə.v) mənə “kədər səbəbiylə ağzından münasib olmayan bir söz çıxmasın” dedi və getdi. Sonra Peyğəmbərin (s.ə.v) qızı Fatimə (r.ə) yanıma gəldi. O, da ğalayırdı. Peyğəmbər (s.ə.v) müsəlmanlara Cə’fərin (r.ə) ailəsinə yardım üçün yemək bişirilməsini buyurdu. Ailəmiz üç gün boyunca müsəlmanların bişirdikləri yeməyi yedi, sonra bu sünnəyə çevrilmişdi*”.

Mutə döyüşündə Bizans ordusu səflərində Quzaə qəbiləsinin xristian rəisi Malik ibn Rafilə də öz dəstəsilə vuruşmuş və öldürülmüşdü. Mutə döyüşünün yeddinci gecəsi İslam ordusunun geri çəkilməsini hərbi hiylə zənn edən Bizans ordusu pusquya düşürülmək qorxusu ilə mücahidləri təqib etməmişdi. Lakin Bizans öz ərazilərində onlarla döyüşə girişmək cürətini göstərmələri və Mutədə onlara ağır itgi verdirmələri səbəbiylə müsəlmanlardan qisas almaq, onları cəzalandırmaq istəmişdi. Buna görə də bizansılar Quzaə qəbiləsini Malik ibn Rafilənin qisasını almaq üçün təşviq etmiş, onlara pul və hərbi təchizatla yardım etmişdilər. Allah Rəsulu (s.ə.v) Quzaə qəbiləsinin Mədinəyə hərbi yürüşə hazırlaşdığı xəbərini alan kimi 300 nəfərlik qüvvə hazırlayaraq hicri 8-ci ilin cəmaziyəlaxir ayında (sentyabr-oktyabr 629) Əmr ibn əl-Asın başçılı-

ğı altında Şam diyarına göndərmişdi. Əmr ibn əl-As kəşfiyyatçılarının gətirdiyi xəbərlərdən əmri altındakı qüvvələrlə düşmənə üstün gələ bilməyəcəyini anlayaraq ordusunu çölün dərinliklərinə çəkmiş, Allah Rəsulunu (s.ə.v) məktubla mövcud vəziyyətdən xəbərdar edərək əlavə qüvvə istəmişdi. Peyğəmbər (s.ə.v) dərhal Əbu Ubeydə Amir ibn Cərrahın (r.ə) başçılığı altında 200 nəfər mücahiddən ibarət hərbi qüvvəni kömək üçün göndərmişdi. Əbu Ubeydənin (r.ə) dəstəsində Ömər ibn Xəttab (r.ə), Əbu Bəkr (r.ə) kimi əshabın tanınmış simaları da var idi. Əbu Ubeydə (r.ə) qısa müddətdə Şam diyarına yetişib Əmr ibn əl-Asla qüvvələrini birləşdirmişdi. Əmr ibn əl-As ordusunun yeri və sayının düşmən kəşfiyyatçıları tərəfindən öyrənilməsinin qarşısını almaq üçün əsgərlərə ocaq yandırmağı qadağan etmişdi. Halbuki oktyabr ayı idi və gecələr səhra soyuq olurdu. Nəhayət Əmr ibn əl-As düşmən qüvvələrinə gizlicə yaxınlaşaraq onlara qəfil hücum etdi. Sayca və hərbi təchizat baxımından üstün olsalar da Quzaə qəbiləsinin ordusu mücahidlərin sərt, inadlı və ardıcıl həmlələri qarşısında duruş gətirə bilməmiş, xeyli itgi verəndən sonra döyüş meydanından qaçmışdılar. Mənbələrdə bu döyüş Zatu's-Səlasil (zəncirlər) döyüşü adlandırılmaqdadır. Buna səbəb döyüşdən qaçmalarına mane olmaq üçün düşmən döyüşçülərinin bu döyüşdə bir-birlərinə zəncirlərlə bağlanmaları idi. Əmr ibn əl-As süvari mücahidlərə düşməni təqib edib əzmək üçün izn verdi. Lakin süvarilərin ordunun əsas hissəsindən çox ayrılıb pusquya düşürülmək təhlükəsi var idi. Buna görə də o, əldə etdiyi qələbə ilə kəfayətlənərək, əsgərlərinin düşmən ərazisinin dərinliklərinə dalmasını istəməyib geri, Mədinəyə qayıtmışdı. Zatu's-Səlasil döyüşünün İslam ordusunun qələbəsilə bitməsi xəbərini Mədinəyə Əvf ibn Malik əl-Əşcai (r.ə) gətirmişdi.

*Məkkənin Fəthi*

Müsəlmanlarla Məkkə müşrikləri arasında bağlanmış Hudeybiyyə əhdnaməsinin şərtlərindən biri də bu idi ki, hər iki tərəfin müttəfiqləri bu müqaviləyə qoşula biləcəkdilər və tərəflərdən biri başqa bir düşmənlə vuruşanda digər tərəf bu müharibəyə heç bir şəkildə müdaxilə etməyəcəkdi. Həvazin qəbilələr birliyinə mənsub Bəni-Bəkr qəbiləsi Qureyş qəbiləsinin müttəfiqi idi və Hudeybiyyə sülhünə Qureyşin tərəfində daxil olmuşdu. Xuzaə qəbiləsi də Allah Rəsulu (s.ə.v) ilə ittifaqa girərək Hudeybiyyə əhdnaməsinə Mədinəli müsəlmanların tərəfindən qoşulmuşdular. Xuzaə qəbiləsinin Bəni-Kə'b oymağında xeyli sayda müsəlman var idi. Onlar bu əhdnaməyə qoşulmaqla Allah Rəsulunun (s.ə.v) himayəsinə daxil olmuş, Qüreyş və müttəfiqlərinə qarşı öz təhlükəsizliklərini təmin etmişdilər. Bu iki qəbilə, yəni Bəni-Bəkr ilə Xuzaə

arasında kökü hələ İslamdan əvvələ gedib çıxan düşmənçilik var idi. Xuzaə və Bəni-Bəkr qəbilələri qan düşməni idilər, aralarında bir neçə dəfə silahlı toqquşma olmuş və hər iki tərəfdən də insanlar ölmüşdü. Bəni-Bəkr qəbiləsinin Bəni-Di'l oymağının başçısı Novfəl ibn Müaviyə Hudeybiyyə əhdnaməsinin gətirdiyi arxayınlıqdan istifadə edərək xuzaəlilərdən qisas almaq fikrinə düşmüşdü. O, müttəfiqi olan Qureyşin nüfuzuna və gücünə güvənməkdə idi. Xuzaə qəbiləsi isə Hudiybiyyə əhdnaməsi səbəbiylə Bəni-Bəkrin onlara hücum etməyə cəsarət etməyəcəyini düşünüb arxayın olmuşdu. Onlar Qureyşin Bəni-Bəkrliləri müsəlmanlarla ittifaq halında olan bir qəbiləyə hücumdan çəkindirəcəyini düşünməkdə idilər. Novfəl ibn Müaviyə tək başına xuzaəlilərə hücum etmək istəmirdi. O, bunun əhdnamə şərtlərinin pozulması demək olduğunu bilirdi. Buna görə də bu iş üçün Qüreyşin dəstəyini təmin etməyə çalışmışdı. Bəni-Bəkrin Quşeyr oymağına mənsub nüfuzlu şəxslərindən Fərvə ibn Hubeyrə əl-Quşeyri tez-tez Məkkəyə gedərək Qureyş zadəganları ilə yaxın münasibət qurmuşdu. Novfəl Fərvənin Məkkədəki nüfuzundan istifadə etmək istədi. Onunla danışıb Məkkə yaxınlığında yaşayan Xuzaə qəbiləsinin oymaqlarına mənsub ərəblərin əslində Muhəmməd (s.ə.v) üçün casusluq etdiklərini bu səbəbdən də cəzalandırılmalarının vacib olduğuna onu inandırdı. Fərvə ibn Hubeyrə Novfələ kömək edəcəyinə söz verdi. Lakin Səfvan ibn Uməyyə, Suheyh ibn Əmr, Abdullah ibn Rəbiə kimi Qüreyş müşriklərinin başçıları ilə danışsa da bu mövzuda onların yardımını təmin edə bilməmişdi. Lakin bir müddət sonra baş verən bir hadisədən Bəni-Bəkrlilər bəhanə kimi istifadə etmişdilər. Ənəs ibn Zuleym əd-Di'li bir gün xuzaəlilərin yanında Allah Rəsulunu (s.ə.v) ələ salan və təhqir edən bir şeer söyləmiş, xuzaəli gənc bir müsəlman da bu səbəbdən onunla dalaşmışdı. İki nəfər arasındakı bu davada Ənəs əd-Di'linin başı yarılmışdı. Hicri 7-ci ilin şaban ayında (dekabr 628) bir qrup Bəni-Bəkrli Məkkəyə gələrək Qüreyşin müşrik zadəganları ilə danışmış, aralarındakı keçmiş qan düşmənçiliyinə görə xuzaəlilərdən qisas almaq istədiklərini və onların yardımına ehtiyacları olduğunu bildirmişdilər. Bəni-Bəkrin Nüfasə oymağına mənsub müşriklər bu işdə daha çox canfəşanlıq edirdilər. Nüfasəli müşriklər qüreyşli müşriklərin bu işdə onlara canlı qüvvə və silahla yardım edəcəkləri və'dini eşidəndə daha da həvəslənmişdilər. Novfəl ibn Müaviyə Bəni-Bəkrdən topladığı könüllülərlə birlikdə Məkkə yaxınlığındakı Vətr adlanan yerə gəlmişdi. Xuzaəlilərin Vətrdə məskən salmış ailələrinə gecə vaxtı hücum edən Bəni-Bəkrlilər onlardan sadəcə bir nəfəri öldürə bilmişdilər. Qəfil silahlı basqına uğrayan xuzaəlilər döyüşə hazır olmasalar da hücum edənlərə müqavimət göstərdilər və daha çox insan öldürülməsinin qarşısını ala bildilər. Bu gecə basqınında Qüreyş müşriklərindən

Səfvan ibn Uməyyə, Mikrəz ibn Həfs, Xuveytib ibn Əbduluzza, İkrimə ibn Əbu Cəhl, Suheyl ibn Əmr, Şeybə ibn Osman da öz adamları ilə iştirak etmişdilər. Ticarət məqsədiylə Şam diyasına getmiş Əbu Süfyan ibn Hərb bu vaxt Məkkədə yox idi. Bir qrup xuzaəli hücum edənlərdən canlarını qurtarmaq üçün həram bölgənin içinə girmişdilər. Bəni-Bəkrlilərin burada qan tökməkdən çəkinəcəklərini düşünmüşdülər, lakin yanılmışdılar. Novfəl ibn Müaviyə adamalarına həram bölgəyə əhəmiyyət verməyərək düşmənlərini öldürməyə təşviq etmişdi. Qaçıb Məkkəyə girən bir qrup xuzaəli Budeyl ibn Vərqa adlı qüreyşlinin evinə pənah aparmışdı. Bəni-Bəkrlilər onları burada yaxalayaraq 20-dən çox kişini öldürmüş, lakin qadın və uşaqlarına toxunmamışdılar. Qüreyş müşriklərindən Bəni-Bəkrlilərə kömək edənlər səhərin alaqaranlığında evlərinə getmişdilər. Onlar gecə olduğu üçün onların basqında iştirak etdiklərini heç kimin görmədiyini düşünürdülər. Lakin səhər açılanda Budeylin evinin qarşısında 20-dən çox xuzaəlinin cəsədinin boğazı kəsilmiş halda görülməsi Məkkəni ayağa qaldırdı. Məkkəli müşriklər bu mənzərədən dəhşətə gəlmişdilər. Gecə basqınında iştirak etmiş qüreyşlilərin də ürəyinə qorxu düşmüşdü. Onlar etdiklərinin gizli qalmayacağını başa düşmüşdülər. Çünki Məkkədə axıdılmış qanın məsuliyyətini onlar daşıyırdılar. Bəni-Bəkrlilər üç gün Budeyl ibn Vərqanın evinə sığınanlardan sağ qalmış xuzaəlilərin oranı tərk etmələrinə mane oldular. Onlar bu xəbərin yayılmasını və Mədinəyə çatmasını arzulamırdılar. Lakin nə oradakı çoxu qadın və uşaq olan xuzaəliləri öldürə bilmiş, nə də uzun müddət girov saxlaya bilmişdilər. Suheyl ibn Əmr Novfəl ibn Muaviyədən Budeylin evindəki xuzaəlilərə toxunmamağı və yurdlarına getməkdə onlara mane olmamağı tələb etdi. Novfəl onun bu tələbini yerinə yetirmişdi. Məkkəli zadəganlardan Haris ibn Hişam və Abdullah ibn Əbi Rəbiə, Suheyh ibn Əmr, İkrimə ibn Əbu Cəhl, Səfvan ibn Uməyyəni Bəni-Bəkrlilərə göstərdikləri yardımdan ötürü qınayaraq bunun əhdnaməyə xəyanət mənasını ifadə etdiyini və nəticəsinin ağır olacağını bildirmişdilər. Onlar bu hadisədən qısa müddət sonra Şam səfərindən qayıtmış Əbu Sufyanın yanına gedərək baş verənləri danışmışdılar. Onlar Əbu Süfyandan bu işi yoluna qoymasını, əhdnamənin öz hökmünü itirməməsi üçün Mədinəyə gedib Allah Rəsulu (s.ə.v) danışmasını istəmişdilər. Baş verənləri eşidəndə canına qorxu düşən Əbu Süfyan ibn Hərb bu hadisə ilə heç bir əlaqəsi olmadığını, səfərdə olduğu üçün hər şeydən bixəbər olduğunu və bu işin məsuliyyətini öz üstünə götürmək niyyətinin olmadığını bildirmişdi. Məkkə müşriklərinin liderləri məsələni müzakirə edərək belə nəticəyə gəlmişdilər ki, baş verənlərin xəbəri Mədinəyə çatmadan gedib Allah Rəsulu (s.ə.v) ilə görüşsünlər və Hudiybiyyə əhdnaməsini yeniləsinlər. Beləcə xuzaəlilərin qətliamından

sonra əhdnamə yenilənincə onlar tökülmüş qanın məsuliyyətindən xilas olacaqlarını düşünürdülər. Bu işi Əbu Süfyan ibn Hərbə həvalə etmişdilər. Lakin Allah öz Rəsulunu (s.ə.v) baş verənlərdən xəbərdar etmiş və qətliam gecəsinin səhəri Allah Rəsulu (s.ə.v) "*xuzaəlilərin başında bir iş var*" deyərək ətrafındakılar bildirmişdi. Həmin hadisədən üç gün sonra sübh namazının bitişindən dərhal sonra Əmr ibn Salim əl-Xuzai (r.ə) yanındakı 40 nəfər süvarilə Mədinəyə gələrək məscidə girmiş və Peyğəmbərin (s.ə.v) qarşısında dayanaraq öz qəbiləsinin başına gələnləri bir şeerlə anlatmışdı. Əmr ibn Salim (r.ə) gecə vaxtı, onlar namazda ikən hücuma uğradıqlarını, zülmə və haqsızlığa uğramış xuzaəli müsəlmanların Allah Rəsulu (s.ə.v) və Mədinədəki dindaşlarının yardımını gözlədiklərini bildirmişdi. Peyğəmbər (s.ə.v) bu işi kimin gördüyünü, kimin təşkil etdiyini soruşanda Əmr ibn Salim (r.ə) Bəni-Bəkr qəbiləsinə mənsub Bəni-Nüfasə oymağının bu qətliamı törətdiyini, Novfəl ibn Müaviyə əd-Di'linin isə bu qətliamı təşkil etdiyini bəyan etmişdi. Allah Rəsulu (s.ə.v) baş verənləri öyrəndiyi vaxt müsəlmanların uğradıqları xəyanət səbəbiylə hiddətlənmişdi. O, Əmr ibn Salimə (r.ə) özünü və ailəsini qoruduğu kimi xuzaəli müsəlmanları da qoruyacağına və kömək edicəyinə dair söz verdi. Allah Rəsulu (s.ə.v) Məkkə müşriklərinə məktub yazaraq baş verən bu hadisənin əhdə xəyanət, verilən sözün tapdalanması və sülh müqaviləsinin öz hökmünü itirməsi demək olduğunu bildirmiş, onlara üç şey təklif etmişdi. Qüreyş müşrikləri ya Bəni-Bəkrlə öz aralarındakı ittifaqı ləğv etməli, ya da öldürülənlərin qan diyətinin ailələrinə ödənilməsini təmin etməli idilər. İki təklifdən heç birinin qəbul olunmaması halında isə onlarla vuruşacağını bəyan etmişdi. Allah Rəsulunun (s.ə.v) məsələdən belə tez xəbər tutması Qüreyş müşriklərini məyus etmişdi. Lakin onlar özlərini sındırmayaraq nə müttəfiqlərini tək qoyacaqlarını, nə də başqasının törətdiyi əməldən ötürü qan diyəti ödəyəcəklərini bildirmişdilər. Müharibəyə isə həmişə hazır olduqlarını, döyüşdən çəkinmədiklərini söyləmişdilər. Allah Rəsulunun (s.ə.v) elçisi dərhal geri qayıdaraq onların cavabını Peyğəmbərə (s.ə.v) bildirmişdi. Lakin bir müddət sonra Qüreyşin müşrik liderləri elçini bu cür cavabla geri göndərdikləri üçün peşman oldular və dərhal Əbu Süfyanı vəziyyəti düzəltmək üçün Mədinəyə göndərmək qərarına gəldilər. Budeyl ibn Vərqa evində baş verənlərin məsuliyyətindən qurtulmaq üçün Əbu Süfyandan əvvəl Mədinəyə getmiş, baş verənləri olduğu kimi Allah Rəsuluna (s.ə.v) danışmış və öz günahsızlığını sübuta yetirmişdi. Budeyl Məkkəyə geri qayıdarkən yolda Əbu Süfyanla rastlaşmışdı. Əbu Süfyan ibn Hərb onun Mədinəyə gedib getmədiyini, Muhəmmədlə (s.ə.v) görüşüb görüşmədiyini təkidlə soruşsa da Budeyl ibn Vərqa Əbu Süfyanın suallarından yayınaraq Mədinəyə getdiyini

inkar etmişdi. Lakin Əbu Süfyan Budeylin Mədinədə olduğunu və müsəlmanların hər şeydən olduğu kimi xəbərdar olduqlarını anlamışdı.

Mədinəyə çatan Əbu Süfyan ibn Hərb hər kəsdən əvvəl, Peyğəmbərin (s.ə.v) xanımlarından biri olan qızı Umm Həbibənin (r.ə) evinə getmişdi. Atasını xoş qarşılayan Umm Həbibə (r.ə) atasının döşəyin üstündə oturmasına izn verməmişdi. Əbu Süfyanın "*qızım döşəyi mənə, yoxsa məni döşəyə layiq bilmədin?*" sualına Umm Həbibə (r.ə) "*xeyr, bu Allah Rəsulunun (s.ə.v) döşəyidir, sən isə müşriksən, Peyğəmbərin (s.ə.v) döşəyinin üstündə otura bilməzsən*" deyə cavab vermişdi. Qızının bu sözündən mütəəssir olan Əbu Süfyan "*vay halına qızcığazım, mənim evimdən çıxıb gedəndən sonra gör sən nə hala gəlmisən, necə də bədxasiyyət olmusan*" demişdi. Umm Həbibə (r.ə) atasına belə cavab vermişdi: "*xeyr, Allah mənə bəd xasiyyət deyil, İslamı nəsib etmişdir, sən isə hələ də ağacdan və daşdan yonulmuş ilahlarınıza sitayiş edirsən. Ata, sən Qüreyşin ən müdrik adamlarındansan, necə ola bilər ki, indiyə qədər İslamdan uzaq qalmısan?*". Qızının bu sözlərindən inciyən Əbu Süfyan "*heyf səndən qızım. Deməli mən səndən qınaq da eşidəkcəkmişəm. Sən mənim ata-babamın dinindən üz döndərib Muhəmmədə (s.ə.v) itaət etməyimi gözləyirsən?*" deyib Umm Həbibənin (r.ə) evini tərk etmiş və Peyğəmbəri (s.ə.v) görmək üçün məscidə getmişdi.

Məsciddə Allah Rəsulu (s.ə.v) ilə söhbət edən Əbu Süfyan dedi:

- *Ey Muhəmməd (s.ə.v)! Bilirsən, mən Hudeybiyyə əhdnaməsinin imzalanmasında iştirak etməmişəm. Gəl onu möhkəmlədək və müddətini də uzadaq.*

Peyğəmbər (s.ə.v) cavabında dedi:

- *Ey Əbu Süfyan! Sən Məkkədən bunun üçünmü gəlmisən?*

- *Bəli!*

- *Biz verdiyimiz əhdin üstündə durmuşuq. Yoxsa siz nəsə bir hadisə törədib əhdnamənin şərtlərini pozdunuzmu?*

- *Allah göstərməsin, xeyr. Belə bir hadisə baş verməyib. Biz də əhdimizin üstündə durmuşuq. Biz nə onu dəyişdirmişik, nə də verdiyimiz əhdə zidd iş tutmuşuq.*

- *Biz də verdiyimiz əhdi dəyişdirməmişik. Hudeybiyyə günü verdiyimiz sözün üstündə durmaqdayıq. Bundan sonra da nə onu dəyişməyəcəyik, nə də ona zidd iş tutmayacağıq.*

Əbu Sufyan təkidlə öz istəyini təkrarlasa da Peyğəmbər (s.ə.v) ona bundan artıq heç nə deməmiş və cavab verməmişdi. Allah Rəsulunu (s.ə.v) dilə tutub razılığını ala bilmədiyini görən Əbu Süfyan Mədinədəki nüfuzlu müsəlmanlarla ayrı-ayrılıqda görüşüb istəyini təkrarladı və Allah Rəsulunun (s.ə.v) razılığı-

nı almaq üçün vasitəçilik etmələrini istədi. Əbu Bəkr (r.ə), Ömər ibn Xəttab (r.ə), Sə'd ibn Ubadə (r.ə), Osman ibn Əffan (r.ə), Əli ibn Əbu Taliblə (r.ə) görüşən Əbu Süfyan onların hamısından eyni cavabı eşitdi: "*bu Allaha və Rəsuluna (s.ə.v) aid bir işdir*". Çarəsiz və çaşqın qalan Əbu Süfyan namaz vaxtı yenidən məscidə gələrək Peyğəmbərin (s.ə.v) yanında ayaq üstə durdu və üzünü müsəlmanlara tutaraq dedi: "*mən hər iki tərəfi öz əhdim və himayəm altına alıram. Əhdnamənin müddətini uzadıram və insanların arasında vasitəçi olacağam*". Sonra isə üzünü Peyğəmbərə (s.ə.v) tutaraq dedi:

- *Ey Muhəmməd! Zənn etmirəm ki, sən mənim bu əhd və himayə və'dimi rədd edəsən.*

Allah Rəsulu (s.ə.v) ona belə cavab verdi:

- *Ey Əbu Süfyan! Bu sadəcə sənin sözündür.*

Əbu Süfyan Mədinədə çarəsiz və çaşqın halda qaldığı üçün yubanmışdı. Gec gəlməsindən Məkkə müşrikləri narahat olaraq onun da müsəlman olduğu zənninə qapılmışdılar. Evinə gələndə arvadı Hind onu bu barədə xəbərdar etdi. Buna görə də Əbu Süfyan səhər Asəf və Nailə bütlərinin yanında saçını dibindən qırxdırıb qurban kəsdi və qurbanın qanını bütlərin üstünə axıtdı. Bununla o, öz həmşəhərlilərinə hələ də ata-babasının dini üzərində olduğunu bildirmək istəmişdi. Qüreyşin müşrik liderləri Əbu Süfyanın bu hərəkətini görüb zənnlərində yanıldıqlarından əmin oldular və Mədinədən hansı xəbərlə qayıtdığını soruşdular. Əbu Süfyan Mədinədə başına gələnləri olduğu kimi danışdı. Qüreyş müşrikləri bu uğursuz səfərindən ötürü onu qınadılar və müsəlmanların onu ələ salıb istehza etdiklərini dedilər. Çünki tək tərəfli verilmiş sözün heç bir hökmü ola bilməzdi.

Əbu Süfyanın Mədinəni tərk etməsindən dərhal sonra Allah Rəsulu (s.ə.v) hərbi səfər üçün hazırlıqlar görmək və səfərbərlik əmri verdi. Peyğəmbər (s.ə.v) bir dəstə müsəlmana silahlanaraq Mədinə ilə Məkkə arasındakı bütün yolları, keçidləri, vadiləri nəzarət altına almağı əmr etdi. Onlara Ömər ibn Xəttabı (r.ə) başçı təyin edərək bu işə ciddi nəzarət etməyi və Məkkəyə tərəf heç kimi buraxmamağı tapşırdı. Daha sonra müttəfiq qəbilələrə qasidlərlə xəbər göndərərək Ramazan ayının əvvəlində bütün hərbi təchizatları ilə Mədinədə hazır olmaq əmrini verdi. Ənsar və mühacirdən bu səfərdə iştirak etməyən heç kim olmamışdı və ümumi sayıları 4700 nəfər idi. Bunlardan 700-ü mühacir, 4000-i isə ənsardan idi. 4700 nəfərin 800-ü süvari, geri qalanı isə piyada mücahidlərdən ibarət idi. Ordugah Mədinədən bir qədər kənardakı Əbu İnəbə su quyuları yaxınlığında qurulmuşdu. Yarımadadakı müttəfiq qəbilə və oymaqlardan gələn mücahidlərlə birlikdə İslam ordusunun sayı 10 mini keçmişdi. On min nəfər

əsgərin mindən artığı süvari idi. Allah Rəsulu (s.ə.v) Mədinədə öz yerinə dini və idari işlər üçün vəkil olaraq Abdullah ibn Umm Məqtumu (r.ə) təyin etmişdi.

Hərbi səfər hazırlıqlarının gizli aparılması üçün bütün tədbirlər alınmışdı. Mühacirlərdən Xətib ibn Əbi Bəlta (r.ə) adlı bir şəxs Məkkəyə yola düşən Sara adlı bir cariyəyə on dinar ödəyərək məktub vermiş, bu məktubu Məkkədəki yaxınlarına çatdırmasını istəmişdi. Xətib ibn Əbi Bəlta (r.ə) məktubda əqrəbalarını Məkkənin fəthi vaxtı baş verə biləcək mümkün təhlükə barədə xəbərdar etmək istəmiş və Allah Rəsulunun (s.ə.v) səfər üçün hazırlıq əmri verdiyini bildirmişdi. Xətib (r.ə) Məkkəyə gedən karvan yolunun müsəlman gözətçilər və növbətçilər tərəfindən nəzarətdə saxlandığını bildiyi üçün cariyəyə gizli yolla getməyi tövsiyə etmişdi. Allah vəhylə öz Rəsulunu (s.ə.v) bu vəziyyətdən xəbərdar etmişdi. Allah Rəsulu (s.ə.v) Əli ibn Əbu Talib (r.ə), Zübeyr ibn Əvvam (r.ə) və Miqdad ibn Əsvədi (r.ə) çağıraraq onlara təcili olaraq yola çıxıb Xah adlanan xurma bağlarının arası ilə dəvəsinin üzərində getməkdə olan bir qadını saxlamağı əmr etdi. Peyğəmbər (s.ə.v) onlara qadındakı məktubu alıb özünü sərbəst buraxmağı tapşırmışdı. Əli (r.ə), Zübeyr (r.ə) və Miqdad (r.ə) çaparaq gedib Peyğəmbərin (s.ə.v) dediyi yerdə dəvəsinin belində yol gedən Saraya rast gəldilər. Onlar qadından yanında məktub aparıb aparmadığını soruşanda qadın bunu inkar etdi. And içərək məktubdan xəbərdar olmadığını deyən qadını dəvənin belindən endirib əşyalarını axtardılar, lakin heç bir şey tapa bilmədikləri üçün onu sərbəst buraxdılar. Lakin bir qədər aralanandan sonra Əli ibn Əbu Talibin (r.ə) istəyilə yenidən qayıdıb qadını saxladılar. Əli (r.ə) qadına "*Allaha and olsun ki, Allah Rəsulu (s.ə.v) səhv etməz və bu işdə biz də yanılmırıq. İndi sən o məktubu bizə özün ver, bizi məcbur etmə ki, sənin üstünü axtaraq*" deyəndə Sara "*siz necə belə bir iş tutarsınız? Məgər müsəlman deyilsiniz?*" deyə cavab vermişdi. Əli (r.ə) ona belə cavab verdi: "*biz əlbəttə müsəlmanıq. Lakin Allahın Elçisi (s.ə.v) bizə sənin məktub apardığını dedi. Ya o məktubu ver, ya da təpənə qılıncı endirərəm*". Asanlıqla yaxa qurtara bilməyəcəyini görən Sara, Əli (r.ə) və yoldaşlarının üzlərini kənara çevirmələrindən sonra saç hörgülərinin arasında gizlətdiyi məktubu çıxarıb onlara verməyə məcbur olmuşdu. Əli (r.ə) və yoldaşları Mədinəyə qayıdıb məktubu Allah Rəsuluna (s.ə.v) vermişdilər. Məktubun məzmunu ilə tanış olunandan sonra əshabdan bəziləri "*Xətib (r.ə) Allaha, Rəsuluna (s.ə.v) və möminlərə xəyanət etmişdir*" dedilər. Allah Rəsulu (s.ə.v) Xətib ibn Əbi Bəltanı (r.ə) yanına çağırdaraq məktubu onun yanında oxutdu və dedi:

- *Bunu sənmi yazmısan?*
- *Bəli mən yazmışam.*

- *Ey Xətib! Bu nə işdir tutmusan?*
- *Ey Allahın Elçisi (s.ə.v)! Bu mövzuda haqqımda hökm vermək üçün tələsməyin. Mən yəmənliyəm, Qüreyşli deyiləm. Məkkəyə köçüb gəlib orada yaşmışam, sonra Mədinəyə hicrət etmişəm. Mühacirlərin hər birinin Məkkədə yaxınları, qohumları var, onların orada qalmış mallarını və övladlarını qoruya biləcək kimsələri var. Amma mənim övladlarımın sığına biləcəkləri soy və qəbiləsi yoxdur. Mən onları qorumaq üçün xəbərdar etmək istədim. Yoxsa İslamdan sonra küfrə qayıtmamışam. Mən Allaha və Rəsuluna (s.ə.v) iman gətirəndən bəri bundan əsla şübhəyə düşməmişəm və müşriklərə qarşı qəlbimdə bir sevgi də yoxdur.*

Onun bu izahından sonra Allah Rəsulu (s.ə.v) "*bu söylədiklərində haqlısan*" deyə cavab versə də əshabdan bəziləri Xətibin (r.ə) xəyanət etdiyi üçün cəzalandırılması barədə təkid etmişdilər. Lakin Allah Rəsulu (s.ə.v) Xətibin (r.ə) Bədr, Uhud və Xəndək döyüşlərində onlarla çiyin-çiyinə döyüşdüyünü xatırladıb xain olmadığını vurğulayaraq məsələyə son nöqtəni qoymuşdu. Uca Allah, Qur'anın Mümtəhinə surəsinin 1-ci ayəsində bu mövzuya toxunaraq möminlərə bu kimi xüsuslarda xəbərdarlıq etməkdədir.

Allah Rəsulu (s.ə.v) hərbi yürüş üçün bütün hazırlıqların tamamlanmasından sonra 10 min nəfərlik İslam ordusu ilə hicri 8-ci ilin ramazan ayının əvvəllərində (629-cu il dekabr ayının sonu) Mədinədən Məkkəyə tərəf yola çıxmışdı. Ramazan ayı olduğu üçün səfərə çıxarkən bütün ordu oruclu idi. Allah Rəsulu (s.ə.v) orduya belə car çəkdirdi: "*istəyən orucunu tutsun, istəyən orucunu açsın*". Peyğəmbər (s.ə.v) özü orucunu tutdu, mücahidlər də oruclarını tutdular və bu vəziyyətdə Mədinədən uzaqlığı 11-12 km olan Sulsul adlı yerə qədər gəldilər. Allah Rəsulu (s.ə.v) 200 süvaridən ibarət ordu avanqardını (öncü qüvvə) Zübeyr ibn Əvvamın (r.ə) əmrinə verərək ordunun əsas hissəsindən irəli göndərmişdi. Zübeyrin (r.ə) dəstəsindəki kəşfiyyatçılar Ərc və Təlub adlanan yerlər arasında ikən dəvəyə minmiş bir adama rast gəlmişdilər. Həmin adamın onların gözündən yayınmaq istəməsindən şübhələnərək onu yaxalamışdılar. Zübeyr (r.ə) həmin adamı Allah Rəsulunun (s.ə.v) yanına göndərmişdi. Sorğuya çəkiləndən sonra bu adamın Qüreyş müşriklərinin müttəfiqi olan Həvazin qəbiləsinə mənsub bir casus olduğu aydınlaşdırılmışdı. Sorğu vaxtı casusun özündən müsəlmanlar üçün dəyərli olan xeyli məlumat alınmışdı. Casus Peyğəmbərin (s.ə.v) əmri ilə Xalid ibn Vəlidə (r.ə) təslim edildi və səfərin sonuna kimi ciddi nəzarətdə saxlanılması tapşırıldı.

Allah Rəsulu (s.ə.v) ordu Ərc adlanan yerə gəlib çatanda çox susadığı üçün başını və üzünü su ilə yudu. Əshabdan bəziləri "*ey Allahın Elçisi (s.ə.v) səfərdə*

*ikən oruc tutmaq insanlara ağır gəldi. Onlar sənin nə edəcəyini gözləyirlər*" dedilər. Allah Rəsulu (s.ə.v) Qudeyd adlı yerə gəlib çatanda orduya əsr namazını qıldırdı. Daha sonra hamı görə bilsin deyə dəvəsinin belinə oturandan sonra bir qab su alıb içərək orucunu açdı və müsəlmanlara da oruclarını açmalarını tapşırdı. Buna baxmayaraq orduda bəzilərinin hələ də oruclu olduğunu öyrənəndə Peyğmbər (s.ə.v) hamının orucunu açmasını təkidlə əmr etdi. Onlara "*sabah düşmənlə qarşılaşacaqsınız, indi orucunuzu açmanız sizi daha güclü edər*" dedi.

Cuhfə adlı yerə gəlib çatanda Peyğəmbərin (s.ə.v) əmisi Abbas ibn Əbdülmüttəlib (r.ə) Məkkəni tərk edərək ordugaha gəlmiş və Allah Rəsulu (s.ə.v) ilə görüşmüşdü. Abbas (r.ə) Bədr döyüşündə Məkkə müşriklərinin cərgəsində vuruşaraq əsir düşmüş, qurtuluş fidyəsi ödəyərək əsirlikdən qurtulub Məkkəyə qayıtmışdı. Abbasdan (r.ə) bir müddət sonra Peyğəmbərin (s.ə.v) həm süd qardaşı, həm də əmisi oğlu olan Əbu Süfyan ibn Haris ibn Əbdülmüttəlib və bibisinin oğlu Abdullah ibn Əbi Uməyyə birlikdə Allah Rəsulunun (s.ə.v) yanında gələrək İslamı qəbul etdiklərini bildirmişdilər. Bu iki şəxsin hər ikisi İslam düşməni olmuşdular. Onlar həm hicrətdən əvvəl, həm də sonra Allah Rəsuluna (s.ə.v) əlləri və dilləri ilə əziyyət etmiş insanlar idi. Çətin də olsa Allah Rəsulu (s.ə.v) özünə qarşı etdikləri əməllərə görə onları bağışlamışdı.

Qudeyddən yola çıxmamışdan əvvəl Allah Rəsulu (s.ə.v) İslam ordusunu döyüş nizamına salıb təftiş etdi. Dəstələri, birlikləri müəyyən edib hər birinə ənsar və mühacirdən əmirlər təyin etdi və hər dəstəyə onu digərlərindən ayırd edən döyüş bayrağı verdi. Mühacirlərə Əli ibn Əbu Talib (r.ə), Zübeyr ibn Əvvam (r.ə) və Sə'd ibn Əbu Vəqqas (r.ə) komandanlıq edirdilər.

İslam ordusu bir axşam vaxtı Məkkə yaxınlığındakı Mərru'z-Zəhran adlı yerə gəlib çatmış və ordunun burada gecələməsi qərarlaşdırılmışdı. Qaranlıq çökəndən sonra ordugahda mücahidlərin qaladıqları tonqallardan ordunun sayını təqribən müəyyən etmək mümkün idi. Qüreyş müşrikləri İslam ordusunun Məkkə həndəvərində olduğunu bilirdilər. Lakin hədəfin dəqiq hara olduğu barədə tərəddüd edirdilər. Onlar ümid edirdilər ki, Allah Rəsulu (s.ə.v) ətrafdakı bədəvi qəbilələrdən biri ilə vuruşmaq üçün səfərbər olmuşdur. Lakin tədbiri əldən verməyərək Əbu Süfyan ibn Hərb və Hakim ibn Hizamı Mərru'z-Zəhrana göndərdilər. Bu iki şəxsi göndərməkdə məqsədləri Allah Rəsulunun (s.ə.v) niyyətini öyrənmək idi. Əgər ordu Qüreyşin üzərinə gəlirdisə bu iki şəxs şəhərdəki müşrik əsilzadələr üçün aman və'di almalı idilər. Əbu Süfyan ordugahın ətrafındakı təpələrdən birinə çatanda gecənin qaranlığında sayrışan tonqalların sayını görüb, kişnəyən atların və böyürən dəvələrin səsini eşidəndə dəhşətə qapıldı. Bu böyük ordunun qarşısında Məkkə müşriklərinin əsla da-

vam gətirə bilməyəcəyini anladı. Ordugahın həndəvərinə gələn Əbu Süfyan ibn Hərb israrla Abbas ibn Əbdülmüttəlibi (r.ə) axtarmağa başladı. Nəhayət gecənin qaranlığında Abbas (r.ə) Əbu Süfyanı səsindən tanıyaraq ona yaxınlaşmışdı. Əbu Süfyan İslam ordusunun hədəfinin Məkkə oluduğunu öyrənəndə qorxusu daha artmış və Abbasdan (r.ə) ona yardım etməsini istəmişdi. Abbas (r.ə) ona yeganə qurtuluş yolunun dərhal Allah Rəsulunun (s.ə.v) yanına gedib onun himayəsini tələb etmək olduğunu bildirmişdi. Əks təqdirdə orduda onu tanıyanlardan birinə rast gələ və dərhal öldürülə bilərdi. Abbas (r.ə) Əbu Süfyanı öz qatırına mindirib ordugahın içindən keçirərək Allah Rəsulunun (s.ə.v) yanına aparırdı. Tonqalların işığında üzü göründüyü üçün Ömər ibn Xəttab (r.ə) onu tanıyaraq üstünə hücum çəkib öldürmək istəmişdisə də Abbas ibn Əbdülmüttəlib (r.ə) Əbu Süfyana aman verdiyini və himayəsinə aldığını bildirərək buna mane olmuşdu. Abbas (r.ə) Əbu Süfyanı Peyğəmbərin (s.ə.v) hüzuruna gətirərək vəziyyəti ona bildirmişdi. Daha sonra Hakim ibn Hizamla Budeyl ibn Vərqa Allah Rəsulunun (s.ə.v) yanına gələrək İslamı qəbul etdiklərini bildirmişdilər. Əbu Süfyan Peyğəmbərlə (s.ə.v) söhbət etmiş və Allah Rəsulu (s.ə.v) ona nəsihət edərək İslama dəvət etmişdi. Əbu Süfyan Allahdan başqa ilah olmadığına artıq qənaət gətirdiyini söyləmişdi. Lakin Peyğəmbərə (s.ə.v) "*ey Muhəmməd! Lakin vallahi, qəlbimdə sənin həqiqətən Allahın Elçisi olduğuna dair biraz şübhə var. Bəlkə mənə biraz möhlət verəsən*" demişdi. Onun bu sözündən sonra Peyğəmbər (s.ə.v) üzünü əmisi Abbasa (r.ə) tutaraq "*onu öz gecələdiyin yerə apar, səhər yanıma gətirərsən*" demişdi.

Əbu Süfyan ibn Hərb həmin gecəni Abbasın (r.ə) yanında keçirmişdi. Müəzzin sübh əzanını oxuduğu vaxt düşərgədəki müsəlmanlar oyanıb namaz üçün ayağa qalxmağa başlamışdılar. Əbu Süfyan bu haldan qorxuya düşərək insanların onu öldürmək üçün ayaqlandıqlarını zənn etdi. Lakin Abbas ibn Əbdülmüttəlib (r.ə) onu sakitləşdirərək bunun sadəcə namaza çağırış olduğunu bildirdi. Müsəlmanların namaz üçün Peyğəmbərin (s.ə.v) ətrafına toplaşmağa başladığını görəndə Əbu Süfyan Abbasa (r.ə) "*ey Əbül-Fəzl! Mən indiyə qədər nə iranlıların Kəsraya, nə də rumların Qeysərə belə itaət etdiklərini görməmişəm. Həqiqətən sənin qardaşının oğlu böyük bir səltənətə sahib olmuşdur*" dedi. Abbas (r.ə) isə ona "*xeyr, bu səltənət deyil, bu risalət(peyğəmbərlik)dir. Heyf səndən ey Əbu Süfyan. Sən də iman et artıq*" deyə cavab vermişdi. Əbu Süfyan möminlərin Allah Rəsulunun (s.ə.v) arxasında sübh namazını qılmalarına tamaşa edərkən bu möhtəşəm mənzərə qarşısında heyrətə qapılmışdı. Peyğəmbərin (s.ə.v) ardınca 10 min nəfər eyni anda rükuya gedir, eyni anda səcdə edirdilər. Namazdan sonra Əbu Süfyanla söhbət edən Allah Rəsulu (s.ə.v) ona belə dedi:

- *Heyf səndən ey Əbu Süfyan! Sənin üçün hələ də Allahdan başqa ilah olmadığını öyrənmənin vaxtı gəlməyibmi? Allah məni sizləri həm dünyada həm də axirətdə xoşbəxtliyə qovuşduracaq bir dinlə göndərmişdir. Müsəlman ol ki, salamatlığa çıxasan.*

Əbu Süfyan, Peyğəmbərin (s.ə.v) bu müraciətinə belə cavab verdi:

- *Bəs Uzza necə olsun? Onu nə edim?*

Onların söhbətini çadırın arxasından eşidən Ömər ibn Xəttab (r.ə) Əbu Süfyan Səxrə "*onun üstünə işəyərsən"* deyəndə bu söz Əbu Süfyana pis təsir etmiş və o, Ömərə (r.ə) "*ey Xəttabın oğlu! Sən də atan kimi sərt və qaba bir adamsan. Mən sənin yanına gəlməmişəm, qardaşımın oğlunun yanına gəlmişəm, onunla danışıram. Rahat burax onunla söhbət edim*" deyə səslənəndən sonra üzünü Peyğəmbərə (s.ə.v) tutub demişdi:

- *Atam, anam sənə fəda olsun. Sən həmişə alicənablığın, yumuşaq xasiyyətin, şərəfliliyin, yaxınlarını himayə etməyinlə bizim aramızda ən üstün olmusan. Vallahi, mən Allahdan başqa bir ilah olmadığına artıq inanıram. Çünki əgər Allahdan başqa ilah olsaydı o, əlbəttə məni qoruyar və faydalandırardı. Mən öz ilahlarımdan, sən isə Allahdan yardım dilədin və nə vaxt üz-üzə gəldiksə sən daim qalib gəldin. Mən şəhadət edirəm ki, Allahdan başqa heç bir haqq ilah yoxdur və sən həqiqətən onun Elçisisən!*

Beləcə Əbu Süfyan ibn Hərb (r.ə) Peyğmbərin (s.ə.v) hüzurunda kəlməyişəhadət gətirib müsəlman olmuşdu. Əbu Süfyanın (r.ə) İslamla şərəfləndiyini eşidən Abbas (r.ə) çox sevinmiş və Peyğəmbərə (s.ə.v) "*ey Allahın Rəsulu (s.ə.v)! Əbu Süfyan öz qövmünün əşrafından və möhtərəm adamlarındandır. Ona öz qövmünün arasında iftixar edəcəyi bir şey lütf etsəniz yaxşı olmazmı?*" demişdi. Əmisinin bu istəyinə Allah Rəsulu (s.ə.v) belə cavab vermişdi:

- *Əbu Süfyanın evinə daxil olub oraya sığınanlara aman verilmişdir*. Sonra isə Peyğəmbər (s.ə.v) sözünə belə davam etmişdi: "*Kə'bəyə daxil olub oraya sığınanlara aman verilmişdir. Məscidi-Hərama daxil olub oraya sığınanlara aman verilmişdir. Silahı yerə qoyana aman verilmişdir. Qapısını bağlayıb evində oturana aman verilmişdir*".

Beləcə Allah Rəsulu (s.ə.v) 20 ildən artıq İslama və müsəlmanlara düşmən kəsilib Allah və Rəsulu (s.ə.v) ilə mübarizə aparanlar üçün ümumi əvf elan etmişdi. Əbu Süfyan (r.ə) Peyğəmbərdən (s.ə.v) izn istəyərək Məkkəyə qayıtmaq istəyirdi. O, Məkkə müşriklərini müqavimət göstərməyin mənasız olduğuna, bunun sadəcə nahaq qan tökülməsinə səbəb olacağına inandırmaq istəyirdi. Allah Rəsulu (s.ə.v) ona izn vermişdi. Əbu Süfyan (r.ə) Məkkəyə qayıtmamışdan əvvəl Abbas ibn Əbdülmüttəliblə (r.ə) birlikdə bir təpənin üstündə dayana-

raq Mərrü'z-Zəhrandan nizamlı şəkildə keçib gedən İslam ordusunun ehtişamına tamaşa etmişdi.

İslam ordusu Zi-Tuva adlanan yerə gəlib çatanda dayanmış, Peyğəmbərin (s.ə.v) gəlib çatmasını gözləmişdi. Allah Rəsulu (s.ə.v) Zi-Tuvaya gəlib çatanda süvari mücahidlər onu dövrəyə almışdılar. Zi-Tuvadan artıq Məkkə aydın görünürdü. Allah Rəsulu (s.ə.v) Məkkəyə baxaraq: "*Vallahi, bilirəm ki, sən Allahın yaratdığı yerlərin ən xeyrlisi, Allah və mənim üçün də ən sevimli olan yersən. Əgər sənin əhalin məni zorla səndən çıxarmasaydı, mən əlbəttə ki, səni tərk etməzdim*" deyərək doğma şəhərinə olan sevgisini, onu tərk etməyin kədərini dilə gətirmişdi.

Bu vaxt Məkkə müşrikləri Səfvan ibn Üməyyə, İkrimə ibn Əbu Cəhl, Suheyl ibn Əmrin təhrikedici çıxışları ilə silahlanmağa başlamışdılar. Qüreyş müşrikləri Bəni Bəkr, Xuzeyl və Əhabiş qəbilələrindən olan müttəfiqlərini də öz ətraflarında toplamışdılar. Onlar silahlanaraq Məkkəni döyüşsüz Muhəmmədə (s.ə.v) təslim etməyəcəklərinə dair and içmiş və Xəndəmə adlanan yerdə düşərgə quraraq oraya toplaşmağa başlamışdılar.

Zi-Tuvada Allah Rəsulu (s.ə.v) İslam ordusunu yenidən təftiş etdi. Ordunu döyüş nizamına gətirərək dörd əsas qismə ayırdı. Sol cinah, sağ cinah, mərkəz və avanqard qolların hər birinə komandan təyin edilmişdi. Peyğəmbər (s.ə.v) ordunun sağ cinahına komandan təyin etdiyi Zübeyr ibn Əvvama (r.ə) Məkkəyə Quda adlanan yerdən daxil olmasını əmr etmişdi. Xalid ibn Vəlid (r.ə) sol cinah komandanı idi və Məkkəyə cənub istiqamətindən daxil olmalı idi. Əbu Ubeydə Amir ibn Cərrah (r.ə) mərkəzdəki zirehli piyadaların komandanı idi. Ona Məkkənin şimalındakı düzənlikdə mövqe tutmaq əmr edilmişdi. Daha sonra ənsardan olan mücahidləri belə təlimatlandırdı: "*Qüreyş bizim döyüş qabiliyyətimizi sınamaq üçün Məkkənin qaragüruhunu qızışdırıb üstümüzə göndərəcək, onlar sizə hücum etsələr onları ot biçən kimi biçin, lakin müqavimət göstərməyənlərə toxunmayın. Üstünüzə silah çəkməyənin üstünə silahla getməyin*". Daha sonra Allah Rəsulu (s.ə.v) mücahidləri təlimatlandıraraq Məkkədə bəzi insanların olduğunu, onları harada görsələr, hətta Kə'bənin qara örtüsünün altına sığınmış olsalar belə dərhal öldürmələrini əmr etmişdi. Bunların bəziləri müsəlmanların qanını tökmüş azğın İslam düşmənləri, bəziləri Allah, Peyğəmbər (s.ə.v), möminə qadınlar haqqında həcv yazaraq çirkin ifadələrlə onları məsxəyərə qoyan, şərəf və ləyqətlərini dillərinə dolayan şairlər, bəziləri də bu şeerlərə nəğmə qoşub məclislərdə oxuyan müğənni cariyələr idilər. Kimlər idi bunlar? İkrimə ibn Əbu Cəhl, Səfvan ibn Uməyyə, Abdullah ibn Zibarə, Vəhşi ibn Hərb, Haris ibn Tuleytula, Ənəs ibn Zuleym əd-

Di'li, Xəbbar ibn Əsvəd, Abdullah ibn Sə'd ibn Əbi Sərh, Miqyas ibn Subabə əl-Leysi, Huveyris ibn Nuqeyz, Abdullah ibn Hilal, Hind bint Utbə ibn Rəbiə, Abdullah ibn Xətəl və onun müğənni cariyələri Qureynə və Ərnəbə.

Əbu Süfyan, Hakim ibn Hizamla birlikdə Məkkəyə qayıdanda Qüreyş müşrikləri onun ətrafına toplaşaraq hansı xəbərlərlə qayıtdığını soruşmağa başlamışdılar. Əbu Süfyan (r.ə) var gücü ilə öz həmşəhərlilərinə səslənərək özünün İslamı qəbul etdiyini, Muhəmmədin (s.ə.v) ordusuna müqavimət göstərməyin mənasız olduğunu, bunun nahaq qandan başqa heç bir şeyə səbəb olmayacağını bildirmiş, Allahın Abbas ibn Əbdülmüttəlibin (r.ə) sayəsində Qüreyşi qoruduğunu bəyan etmişdi. Əbu Süfyan (r.ə) öz qövmünə sülhün və salamatlığın İslamı qəbul etməkdə olduğunu söyləmişdi. Onun bu sözlərindən qəzəblənən məkkəli müşriklərdən bəziləri Əbu Süfyana (r.ə) qarğış edərək lənət oxumağa başlamışdılar. Əbu Süfyanın (r.ə) bu halı ən çox arvadı Hindi qəzəbləndirmişdi. O, ərinin saqqalından tutaraq "*ey Qüreyş! Ata-babasının dinindən dönmüş bu qoca axmağı öldürün. O, öz qövmünün necə də pis bir gözətçisidir*" deyə qışqırmışdı. Əbu Süfyan (r.ə) arvadı Hində "*saqqalımı burax. And olsun ki, sən ya İslamı qəbul edəcəksən, ya da boynun vurulacaq, indi isə dərhal evinə get*" dedikdən sonra ətrafına toplanmış Məkkə müşriklərinə belə səslənmişdi:

- *Vay siniz halınıza! Siz indi bu etdiklərinizlə ancaq özünüzü aldadırsınız. Muhəmməd (s.ə.v) sizin qarşısında dayanmağa gücünüzün çatmayacağı ordularla başınızın üstünü almışdır. Mən sizin görmədiklərinizi gördüm. Saysız piyadalar, süvarilər, silahlar...gördüyümə çətin ki, sizin gücünüz çatsın.*

Daha sonra Əbu Süfyan (r.ə) Allah Rəsulunun (s.ə.v) elan etdiyi ümumi əvfi uca səslə təkrarladı:

- *Əbu Süfyanın evinə daxil olub oraya sığınanlara aman verilmişdir. Kə'bəyə daxil olub oraya sığınanlara aman verilmişdir. Məscidi-Hərama daxil olub oraya sığınanlara aman verilmişdir. Silahı yerə qoyana aman verilmişdir. Qapısını bağlayıb evində oturana aman verilmişdir.*

Onun bu sözlərindən sonra Qüreyş müşriklərinin böyük əksəriyyəti ətrafından dağılışıb getdilər. Kimisi öz evinə, kimisi də Məscidi-Hərama sığınaraq baş verəcəkləri gözləməyə başladılar. Bundan bir qədər sonra Abbas (r.ə) Allah Rəsulunun (s.ə.v) izni ilə onun qatırına minərək Məkkəyə gəldi və küçələrdən keçərkən uca səslə Allah Rəslunun (s.ə.v) onlara verdiyi aman və'dini təkrarladı.

Xalid ibn Vəlidin (r.ə) əmrindəki mücahidlər Məkkəyə doğru irəliləyərkən Xəndəmə təpəsinin ətəklərində Bəni-Bəkr və Bəni-Xuzeyl qəbilələrinə mənsub bir qrup silahlı müşrik onlara hücum etmişdi. Xalid ibn Vəlid (r.ə) hücum edənlərlə vuruşmağı, lakin qaçanları təqib etməməyi əmr etdi. Qısa çəkən

döyüşdə 23 müşrik öldürülmüş, geri qalanları isə qaçıb ətrafa dağılışmışdılar. Bir qədər sonra müşriklər yenidən toplaşaraq Xalid ibn Vəlidin (r.ə) əmrindəki dəstəyə ox atmağa başlamışdılar. Xalid (r.ə) ikinci dəfə onlara hücum əmrini verdi. Bunun xəbəri Allah Rəsuluna (s.ə.v) çatanda o, Xalid ibn Vəlidin (r.ə) yanına adam göndərərək dərhal döyüşü dayandırmağı əmr etmişdi. Bundan başqa Məkkədə İslam ordusuna qarşı heç bir ciddi müqavimət olmamış, ordular Allah Rəsulunun (s.ə.v) əmr etdiyi istiqamətlərdən şəhərə daxil olmuşdular. Allah Rəsulu (s.ə.v) Zi-Tuvadan Əbu Bəkr (r.ə) və Useyd ibn Hudeyrlə (r.ə) birlikdə Məkkəyə doğru hərəkət etdi. O, hicri 8-ci il ramazan ayının 14-ü (3 yanvar 630) dəvəsinin belində Fəth surəsini uca səslə oxuyaraq Məkkəyə daxil olmuşdu. Carçılar dayanmadan Allah Rəsulunun (s.ə.v) Məkkə əhalisinə verdiyi aman və'dini və ümumi əvfi təkrarlayırdılar. Məkkə müşrikləri silah-sursatlarını küçəyə, qapılarının qabağına ataraq evlərinə qapanırdılar. Mücahidlər küçələrdən keçərkən onların atdıqları silahları toplamışdılar.

Fəthdən sonra Məkkədə qaldığı müddətdə Allah Rəsulu (s.ə.v), təklif olunsa da, şəhərdəki evlərdən heç birində qalmaq istəməyib Həcun adlı yerdə qurdurduğu çadırında qalmışdı. Məkkənin fəthindən sonra ənsar Allah Rəsulunun (s.ə.v) artıq bundan sonra Mədinəyə qayıtmayıb öz doğma yurdunda qalacağı əndişəsinə qapılmışdı. Onların bu əndişəsindən xəbərdar olan Peyğəmbər (s.ə.v) Mədinəyə qayıtacağını və ənsarla birlikdə orada yaşayacağını söyləyərək onları sevindirmişdi.

Öldürülmələri barədə qəti hökm verilənlərdən Abdullah ibn Xətəl ət-Teymi daha əvvəl İslamı qəbul edərək hicrət etmişdi. Əsl adı Əbduluzza idi, lakin Peyğəmbər (s.ə.v) bu bütpərəst adı dəyişdirib ona Abdullah adını vermişdi. Allah Rəsulu (s.ə.v) onu zəkat məmurluğuna təyin etmişdi. Abdullah ibn Xətəl ətraf qəbilələrə gedərək buradakı müsəlmanlardan zəkat vergisi toplayırdı. Allah Rəsulu (s.ə.v) səyahət vaxt ehtiyaclarını görsün deyə ona kimsəsiz bir müsəlmanıköməkçi olaraq vermişdi. Bu şəxs azad edilmiş keçmiş kölə idi. Abdullah ibn Xətəl müxtəlif qəbilələrin yurduna zəkat vergisini toplamaq üçün vaxtaşırı səyahət edirdi. Belə səyahətlərindən birindən qayıdarkən Abdullah ibn Xətəl yeməyini vaxtında bişirib vermədiyi üçün köməkçisini döyərək öldürmüşdü. Bu əməlindən qorxuya düşən İbn Xətəl "*tutduğum bu işdən sonra Muhəmməd (s.ə.v) bu adamın qisasını məndən mütləq aldırar*" deyə düşünərək yanındakı zəkat mallarını da alıb Məkkəyə qaçmış, burada irtidad edərək müşrik olmuş, iman etdikdən sonra küfrə qayıtmışdı. Həmçinin şair olan İbn Xətəl mürtəd olduqdan sonra bəzi gecələr evində keyf, işrət məclisi qurur, müşrik dostlarını başına yığaraq sərxoşluq edir, Peyğəmbəri (s.ə.v) və möminləri təhqir

edən şeerlər söyləyirdi. Müğənni cariyələri isə bu şeerlərə nəğmə qoşaraq oxuyub qonaqları əyləndirirdilər. Məkkənin fəthi vaxtı Abdullah ibn Xətəl təpədən dırnağa silahlanmış olaraq atının belində Xəndəmədəki müşrik silahlılara qoşulmuş və şəhərə girən müsəlmanları qılıncı ilə doğrayacağına and içmişdi. Lakin Xəndəmədə müşrik dostlarının qaçıb dağıldıqlarını görəndə vəziyyətin qəliz olduğunu anlamışdı. Buna görə də qaçıb Kə'bənin həyətinə gəlmiş, zirehini və silahlarını çıxarıb Kə'bənin örtüsü altında gizlənmişdi. Kə'bənin örtüsü altına sığınmaq ərəblərin qədim adətinə görə labüd ölümdən qaçıb aman diləmək mənasını ifadə edirdi. Mücahidlərdən Əbu Bərzə əl-Əsləmi (r.ə) və Səid ibn Hureys əl-Məxzumi (r.ə) İbn Xətələ Kə'bənin qara örtüsünə bürünmüş halda rast gəlmişdilər. Onu oradan endirib bir qədər kənarda boyunun vuraraq edam etmişdilər. Onun müğənni cariyələrindən Ərnəbə də yaxalanaraq öldürülmüdü. Qureynə isə Məkkədən qaçıb uzun müddət səhrada gizlənə bilmişdi. Bir müddət sonra Allah Rəsulundan (s.ə.v) əvf diləyərək İslamı qəbul etdiyini və tutduğu əməllərindən ötürü peşman olduğunu bildirmişdi. Allah Rəsulunun (s.ə.v) onu əvf etməsindən sonra isə Qureynə Məkkəyə qayıtmışdı.

Haris ibn Tuleytula və Huveyris ibn Nuqeyzi Əli ibn Əbu Talib (r.ə) ayrı ayrılıqda ələ keçirərək öldürmüşdü. Miqyas ibn Subabə əl-Leysi da mürtədlərdən idi. Onun qardaşı Hişam ibn Sübabə (r.ə) İslamı qəbul edib hicrət etmiş bir müsəlman idi. Bəni-Müstəliq döyüşündə müsəlmanlardan biri Hişam ibn Sübabəni (r.ə) düşmən əsgəri zənn edib yanlışlıqla, qəsd olmadan öldürmüşdü. Allah Rəsulu (s.ə.v) bu işdə qəsd olmadığını dəqiq müəyyənləşdirəndən sonra qisas tətbiq etməyib qardaşının qan diyətinin Miqyasa ödənməsini təmin etmişdi. Müşrik olan Miqyas Mədinəyə gələrək qardaşının qan diyəti məbləğini almışdı. Lakin yalandan müsəlman olduğunu söyləyib geri qayıtmayıb Mədinədə qalmışdı. O, qardaşının qisasını almaq üçün qəsdən belə etmişdi. Qan diyəti məbləğini almasına baxmayaraq fürsət tapan kimi yanlışlıqla qardaşının ölümünə səbəb olmuş müsəlmanı qətlə yetirib Məkkəyə qaçmışdı. Miqyas ibn Subabə əl-Leysi mücahidlərdən Numeylə ibn Abdullah əl-Kinaninin (r.ə) əlinə keçmiş və öldürülmüşdü. Səfvan ibn Uməyyə Ciddəyə qaçaraq oradan Qırmızı Dəniz sahilinə getmiş və gəmi ilə Yəmənə qaçmışdı. İkrimə ibn Əbu Cəhl də Yəmənə qaçaraq canını qurtara bilmişdi.

Allah Rəsulu (s.ə.v) dəvəsi Qəsvanın belində Məscidu'l-Hərama daxil olmuş, əsası ilə Kə'bə ətrafındakı bütlərə bir-bir toxunaraq onları devirmişdi. Bütlər devrilərkən Allah Rəsulu (s.ə.v) "*Haqq gəldi, batil zay olub getdi*" (İsra surəsi 81) ayəsini oxumaqda idi. Daha sonra o, Osman ibn Təlhədən Kə'bənin açarını istədi. Kə'bənin ətrafındakı 360-a yaxın büt müsəlmanlar tərəfindən yı-

xılıb dağıldıldı. Allah Rəsulu (s.ə.v) Kə'bəni təvaf etdikdən sonra Ömər ibn Xəttaba (r.ə) Kə'bənin içinə girərək oradakı bütün bütləri çıxarıb bayıra atmasını, divarlardakı mələk və İbrahim (ə.s) təsvirlərini silməsini əmr etdi. Daha sonra özü Kə'bənin içinə girərək iki rəkat namaz qılandan sonra oradan çıxdı. Məscidu'l-Hərama toplaşmış insanlara fəth xütbəsini oxudu və xütbəsini Qur'anın Hücurat surəsinin 13-cü ayəsi ilə bitirdi. Allah Rəsulu (s.ə.v) daha sonra Kə'bənin açarını yenidən Osman ibn Təlhəyə qaytarmışdı. Daha sonra Allah Rəsulu (s.ə.v) Safa təpəsinə çıxdı. O, ilk dəfə Qüreyşi burada İslama dəvət etmişdi. Peyğəmbər (s.ə.v) Safa təpəsində ikən Məkkədə İslamı yeni qəbul edənlər, əvvlcə kişilər, sonra isə qadınlar dəstə-dəstə gələrək ona beyət etmişdilər. İslamı qəbul edib Allah Rəsuluna (s.ə.v) sədaqət andı içərək beyət edənlərin arasında vaxtilə Məkkə müşriklərinin liderləri olmuş şəxslərin xanımları da var idi. Əbu Süfyan ibn Hərbin (r.ə) arvadı Hind bint Utbə, İkrimə ibn Əbu Cəhlin arvadı Umm Hakim bint Haris ibn Hişam, Səfvan ibn Uməyyənin arvadı Fahitə bint Vəlid ibn Muğirə və başqaları. Qadınların beyətini qəbul edərkən Allah Rəsulunun (s.ə.v) yanında qızı Fatimə (r.ə) və Haşim ailəsinə mənsub digər müsəlman qadınlar var idi. Bir qədər irəlidə Ömər ibn Xəttab (r.ə) İslamı yeni qəbul etmiş Məkkəli qadınlara nəyin üzərinə sədaqət andı içməli olduqlarını, İslamın təməl şərtlərini bildirməkdə idi. Əbu Süfyanın (r.ə) arvadı Hind bir dəstə qadınla Allah Rəsuluna (s.ə.v) yaxınlaşanda dedi:

- *Ey Allahın Elçisi (s.ə.v) əlini tutub sənə beyət etməyə izn verirsənmi?*

- *Mən (məhrəm olmayan) qadınların əlini tutmuram. Ey Ömər (r.ə)! Onlara de, Allaha heç bir şeyi şərik qoşmamaqla onun elçisinə beyət edəcəklər.*

Hind:

- *Mən artıq başa düşmüşəm ki, Allahdan başqa bir ilah olsaydı bütün bunlar başımıza gəlməzdi.*

Allah Rəsulu (s.ə.v) bu cavabı eşidəndə Hində baxdı, sonra isə yenidən Ömərə (r.ə) səsləndi:

- *Onlara de, oğurluq etməyəcəklər.*

Hind:

- *Ey Allahın Rəsulu (s.ə.v)! Mənim ərim Əbu Süfyan xəsis adamdır. Mən ondan xəbərsiz malından alıb özümə və oğluma xərcləyirdim. Bilmirəm bu mənə haladır, yoxsa haramdır.*

- *Onun malından özünə və oğluna kifayət edən qədər ala bilərsən.*

Sonra Allah Rəsulu (s.ə.v) Hində özünə yaxınlaşmağa icazə verib ona dedi:

- *Deməli sən Utbənin qızı Hindsən, eləmi?*

Tanınıb hücuma məruz qalacağından qorxudğu üçün Hind Safa təpəsindəki beyət yerinə qədər üzünü niqabla örtərək gəlmişdi. O, niqabını aşağı salıb dedi:

- *Bəli, Allaha şükür olsun ki, o, seçdiyi dini üstün qıldı. Ey Muhəmməd (s.ə.v)! Mən artıq Allaha iman gətirmiş bir qadınam. Mən Utbənin qızı Hindəm. Allah keçmişi bağışlayandır. Sən də bağışla ki, Allah da səni bağışlasın.*

Allah Rəsulu (s.ə.v) Hindlə birlikdə gəlmiş, bir qədər kənarda dayanmış qadınlara eşitdirsin deyə Ömər ibn Xəttaba (s.ə.v) səsləndi:

- *Ey Ömər (r.ə)! Onlara de, zina etməyəcəklər.*

Hind:

- *Hürr (azad) qadın heç zina edərmi?*

Allah Rəsulu (s.ə.v) "*Xeyr, vallahi, hürr bir qadın əsla zina etməz*" buyurub yenidən Ömərə (r.ə) səsləndi:

- *Onlara de, övladlarını öldürməyəcəklər.*

Hind:

- *Siz Bədr döyüşündə bizdə öldürülməmiş övlad qoydunuz ki, biz onları öldürək? Vallahi, biz onlar kiçik ikən böyüdüb yetişdirdik, sonra siz onları Bədrdə öldürdünüz.*

Bunu eşidən Ömər (r.ə) güldü, Allah Rəsulu (s.ə.v) isə bu qadının hazırcavablığı qarşısında sadəcə gülümsədi. Allah Rəsulu (s.ə.v) beləcə İslamın təməl əsasları üzərinə məkkəlilərdən sədaqət andı almışdı. Fəth günü Allah Rəsulunun (s.ə.v) bir carçısı Məkkə əhalisinə səslənərək "*ey Allaha iman edənlər, evlərinizdə sındırılmamış, yandırılmamış büt qoymayın. Unutmayın ki, bütlər vasitəsilə qazanılmış pul haramdır*". Cahiliyyə dövründə, Kə'bə və ətrafında, eləcə də yarımadanın müxtəlif yerlərindəki məbədlərdəki bütlərlə yanışı hər bir müşrik ərəbin evində də onlara bənzər büt var idi. Evdə saxlana biləcək ölçüdə büt düzəldib satan və bundan pul qazanan insanlar var idi. Allah Rəsulunun (s.ə.v) əmri ilə bu bütlərin də hamısı məhv edilmişdi. Bundan başqa Peyğəmbərin (s.ə.v) göstərişilə şəhərdəki bütün şərab küpləri sındırılaraq içindəki sərxoşedici mayelər küçələrə axıdılmışdı. Peyğəmbər (s.ə.v) Məkkədə leş (ölü heyvan əti) və donuz ətinin satılmasını və istehlakını da dərhal qadağan etdirmişdi.

Allah Rəsulunun (s.ə.v) hətta Kə'bənin qara örtüsünə bürünmüş olsalar belə qətlə yetirilmələrini əmr etdiyi adamlardan bəziləri ələ keçirilərək öldürülmüşdülər. Lakin onlardan bəziləri qaçıb gizlənmiş və ya Məkkəni tərk etmişdilər. Bunların çoxu Məkkənin zəngin, nüfuzlu və zadəgan ailələrinə mənsub insanlar idilər. Bunlardan bəziləri öz yaxın müsəlman qohumlarını vasitəçi və şəfaətçi

edərək Allah Rəsulundan (s.ə.v) əvf və bağışlanma diləmişdilər. Bəziləri üçün isə dostları və ya yaxın müsəlman əqrəbalarının özləri bağışlanma tələb etmişdilər. Suheyh ibn Əmr oğlu Abdullahı (r.ə), Xuveytib ibn Əbdüluzza İslamdan əvvəl dostluq etdiyi Əbu Zərr əl-Ğifarini (r.ə) araya vasitəçi qoyaraq əvf edilmişdilər. İkrimə ibn Əbu Cəhl üçün İslamı yeni qəbul etmiş arvadı və əmisi qızı olan Umm Hakim, Haris ibn Hişam üçün Peyğəmbərin (s.ə.v) əmisi qızı Umm Hani bint Əbu Talib[32] (r.ə), Səfvan ibn Üməyyə üçün köhnə dostu Umeyr ibn Vəhb (r.ə) Allah Rəsuluna (s.ə.v) müraciət edərək əvf edilmələrinə nail olmuşdular. Əvf edilən bu şəxslər müşrik idilər və əvf ediləndən sonra kimisi tez, kimisi gec İslamı qəbul edərək müsəlman olmuşdular. Haris ibn Hişam Zübeyr ibn Əbu Üməyyə ilə birlikdə Əli ibn Əbu Talibin (r.ə) bacısı Umm Haninin (r.ə) evinə gəlib himayə və sığınacaq istəmişdi. Haris ibn Hişam Umm Haninin (r.ə) əri Hubeyrə ibn Əbi Vəhb əl-Məxzuminin qohumu idi. Əli ibn Əbu Talib (r.ə) fəth günü bacısının evinə gələndə müsəlmanlara çox əziyyət vermiş bu iki adamı orada görüb öldürmək istəmiş və onların üstünə getmişdi. Lakin Umm Hani (r.ə) çətinliklə də olsa qardaşına mane ola bilmişdi. Umm Haninin (r.ə) bu barədə Peyğəmbərə (s.ə.v) müraciət etməsindən sonra Allah Rəsulu (r.ə) Əliyə (r.ə) onlara toxunmamağı tapşırmışdı. Haris ibn Hişam Məkkənin fəthindən bir il sonra Peyğəmbər (s.ə.v) vida həcci üçün Məkkədə olarkən İslamı qəbul etmişdi. Sonralar İslam uğrunda bir çox döyüşlərdə iştirak etmiş Haris ibn Hişam (r.ə) İkrimə ibn Əbu Cəhllə (r.ə) birlikdə Yərmuk döyüşündə şəhid olmuşdu.

Əvf olunanlardan biri vardı ki, əvfi az qala ölümə bərabər idi. Bu Abdullah ibn Sə’d ibn Əbi Sərh idi. Abdullah ibn Sə’d əvvəllər İslamı qəbul edərək hicrət etmiş və Mədinəyə gəlmişdi. O, yazıb oxumağı bildiyi üçün Allah Rəsulunun (s.ə.v) etimadını qazanmış və vəhy katibi olmuşdu. Bir müddət sonra Abdullah ibn Sə’d orada-burada “*Muhəmmədin (s.ə.v) söylədiklərindən mən də söyləyə bilərəm, ona vəhy gəlirsə mənə də vəhy gəlir*” kimi sözlər söyləməyə başlamış və daha sonra irtidad etmişdi. Mürtəd olub imandan sonra küfrə dönən Abdullah ibn Sə’d ibn Əbi Sərh Mədinədən qaçıb Məkkəyə, Qureyş müşriklərinin yanına getmişdi. Məkkədə olduğu müddətdə müsəlmanların əleyhinə müşriklərə yardım edənlərin qabaqcıllarından birinə çevrilmişdi. Bu səbəbdən də Məkkənin fəthi vaxtı Allah Rəsulunun (s.ə.v) əmrilə qətli vacib olan insanların sırasına daxil edilmişdi. Fəth günü Abdullah ibn Sə’d etibarlı bir yerdə gizlənərək üzə çıxmamışdı. Nəhayət etibar etdiyi bir şəxslə Osman ibn Əffana (r.ə) xəbər göndərərək onunla

[32] Umm Hani bint Əbu Talib (r.ə) Allah Rəsulunun (s.ə.v) əmisi qızı, Əli ibn Əbu Talibin (r.ə) böyük bacısı idi. Umm Haninin (r.ə) əri Hubeyrə ibn Əbi Vəhb əl-Məxzumi, Haris ibn Hişamla eyni soydan olub yaxın qohum idilər.

görüşmək istədiyini bildirmişdi. Osman ibn Əffan (r.ə) Abdullah ibn Sə'din süd qardaşı idi. İbn Sə'din anası Osman ibn Əffanın (r.ə) dayəsi və süd anası olmuş, körpə ikən onu əmizdirmişdi. İbn Sə'dlə Osmanın (r.ə) uşaqlığı bir yerdə keçmiş, birlikdə böyümüşdülər. Buna görə də Abdullah ibn Sə'd Osmana (r.ə) güvənib etibar etmiş, onunla görüşəndə Allah Rəslundan (s.ə.v) əvf edilməsi barədə xahiş etməsi üçün Osman ibn Əffana (r.ə) yalvarıb yaxarmışdı. Çünki Allah Rəsulunun (s.ə.v) Osmanı (r.ə) çox sevdiyini və sevimli kürəkəninin heç bir xahişini yerə salmadığını bilirdi. Osman ibn Əffan (r.ə) ona birlikdə Peyğəmbərin (s.ə.v) yanına getməyi təklif edəndə Abdullah ibn Sə'd qorxusundan bu təklifi qəbul etmədi. Bu səbəbdən də Osman ibn Əffan (r.ə) ona ara sakitləşənə qədər bir müddət gözləməyi tövsiyə etmişdi. Bir müddət sonra Osman ibn Əffan (r.ə) tövbə edib haqqa qayıtmaq istəyən və əvf olunmağını diləyən Abdullah ibn Sə'din əlindən tutaraq Peyğəmbərin (s.ə.v) yanına gətirmişdi. Allah Rəsulu (s.ə.v) bu vaxt əshabdan bir dəstə insanla oturub söhbət etməkdə idi. Osman ibn Əffan (r.ə) İbn Sə'din əlindən tutmuş vəziyyətdə Peyğəmbərin (s.ə.v) yanına gətirdi və "*ey Allahın Elçisi (s.ə.v)! Bunun anası məni kürəyində daşımışdır, bunun südünü kəsib məni əmizdirmişdir, mənim üzərimdə bunun anasının haqqı çoxdur, indi bu tövbə edib əvf diləyir, məni vasitəçi qıldı, Qureyşə verdiyin əvf və aman haqqından buna da ver*" deyərək Abdullah ibn Sə'din biləyindən tutub əlini Peyğəmbərə (s.ə.v) uzatdı. Lakin Allah Rəsulu (s.ə.v) üzünü başqa tərəfə çevirib heç bir cavab vermədi. Osman (r.ə) yenə Peyğməbərin (s.ə.v) qarşısına keçib eyni sözləri təkrarladı, fəqət Allah Rəsulu (s.ə.v) yenə susaraq üzün başqa tərəfə çevirdi. Bu hal bir neçə dəfə təkrarlandı və hər dəfəsində Osman (r.ə) eyni xahişi israrla dilə gətirdi. Allah Rəsulu (s.ə.v) "*aman verdim*" sözünü dilə gətirmir və əshabdan kiminsə qalxıb Abdullah ibn Sə'di vurub öldürəcəyini gözləyirdi. Lakin heç kim yerindən tərpənməmişdi. Nəhayət Osman (r.ə) Allah Rəsulunun (s.ə.v) başını öpərək "*atam, anam sənə fəda olsun ya Rəsulullah (s.ə.v), bunun beyətini qəbul et*" deyəndən sonra Peyğəmbər (s.ə.v) başını aşağı salıb bir müddət susdu, daha sonra "*elə olsun!*" deyərək Abdullah ibn Sə'din onun əlindən tutub sədaqət andı içməsinə izn verdi. Osman ibn Əffan (r.ə) Abdullah ibn Sə'd ibn Əbi Sərhlə birlikdə oradan uzaqlaşandan sonra Allah Rəsulu (s.ə.v) oradakı əshabına üzünü tutub dedi:

- *Biriniz qılıncını sıyırıb bunun boynunu vurasınız deyə mən ona aman verməmək üçün susa bildiyim qədər susdum. Beyətini qəbul etmək istəmədiyimi görüb mən ona toxunulmazlıq üçün aman vermədən əvvəl biriniz bu fasiqi vurub öldürər deyə gözlədim. Aranızda bunu anlaya bilən heç kim olmadımı? Nə idi sizə mane olan?*

Sonra isə biraz kənarda ayaq üstə, bir əli qılıncının qınında, digəri isə dəstəyində, qılıncını sıyırmağa hazır vəziyyətdə dayanmış ənsardan olan səhabəyə baxaraq dedi:

- *Sən o etdiyin niyyətini yerinə yetirsəydin olmazdı?*

Həmin ənsarlı səhabə Abdullah ibn Sə'd ibn Əbi Sərh irtidad edib Mədinədən qaçanda onu ilk gördüyü yerdə boynunu vuracağına dair söz vermiş, niyyət etmişdi. Ənsarlı səhabə:

- *Ey Allahın Rəsulu (s.ə.v)! Mən iki əlim qılıncımda sənin onu öldürməm üçün mənə nə vaxt işarə edəcəyini gözləyirdim!*

Oradakı digər səhabələr də "*Ey Allahın Elçisi (s.ə.v)! Biz sənin qəlbindən nə keçir bilmirdik. Əgər gözünün ucu ilə bizə bir işarə versəydin biz onu öldürərdik*" deyəndə Peyğəmbər (s.ə.v) onlara belə cavab verdi:

- *Gözüylə işarə edib adam öldürtmək xainlikdir. Heç bir peyğəmbər belə bir iş tutmaz.*

Əvf olunub aman verilməsinə baxmayaraq Abdullah ibn Sə'd ibn Əbi Sərh Peyğəmbərlə (s.ə.v) üz-üzə gəlməmək üçün səy göstərərdi. Osman ibn Əffan (r.ə) bunu görürdü və bir gün Peyğəmbərə (s.ə.v) "*səni görəndə Abdullahın necə qaçıb uzaqlaşdığını bir görsəydin*" deyəndə Peyğəmbər (s.ə.v) gülümsəyərək ona cavab verdi:

- *Mən onun beyətini alıb ona aman vermədimmi?*

- *Elədir ey Allahın Elçisi (s.ə.v)! Lakin o, etdiyi günahın böyüklüyündən ötürü sənin üzünə baxmağa utanır.*

- *İslam özündən əvvəlki bütün pis əməlləri silib aparar.*

Osmanın (r.ə) bu sözləri çatdırmasından sonra Abdullah ibn Sə'd insanlarla birlikdə Peyğəmbərin (s.ə.v) yanına gələr və ona salam verərdi. Abdullah ibn Sə'd həqiqətən də sonrakı həyatını ibadət, zöhd və təqva ilə keçirmiş, ölənə qədər fasiqlərdən və fitnəkarlardan uzaq durmuşdu. İrəlidə daha ətraflı məlumat verəcəyimiz kimi o, Osman ibn Əffanın (r.ə) xəlifəliyi dövründə şimali Afrikanın fəthi üçün böyük işlər görmüşdü. Onun daima "*Allahım! Mənim son əməlim sübh namazı olsun*" deyə dua etdiyi deyilirdi. O, arzulayıb dua etdiyi kimi də canını vermişdi. Bir gün sübh namazını qılıb sol çiyninə salam verən kimi vəfat etmişdi.

Allah Rəsulu (s.ə.v) Məkkə fəth edilərkən mücahidlərə məkkəlilərin mallarından qənimət almağı qadağan etmişdi. Lakin ordunun maddi ehtiyacını qarşılamaq üçün pula ehtiyac var idi. Peyğəmbər (s.ə.v) Məkkənin İslamı yeni qəbul etmiş üç zəngin adamından Səfvan ibn Uməyyədən 50 min, Abdullah ibn Əbi Rəbiədən 40 min, Xuveytib ibn Əbduluzzadan 40 min dirhəm gümüş pul borc

alaraq ehtiyacı olan mücahidlərin hər birinə 50 dirhəm paylamışdı. Daha sonra Peyğəmbər (s.ə.v) alınan borcu sahiblərinə qaytarmışdı.

Fəthdən sonra Məkkədə Qureyşin Bəni-Məxzum oymağına mənsub zəngin və əsilzadə bir qadın oğurluq etmiş və oğurluq edərkən yaxalanmışdı. Qadının bu suçundan ötürü sağ əlinin biləyindən kəsiləcəyi məlum idi. Buna görə də qadının ailəsi Allah Rəsulunun (s.ə.v) övladlığa götürdüyü Zeydin (r.ə) oğlu Usaməyə (r.ə) müraciət edərək Peyğəmbərdən (s.ə.v) onun üçün əvf diləməsini xahiş etmişdilər. Usamə (r.ə) onların bu istəyini Peyğəmbərə (s.ə.v) çatdıranda o, Usaməyə (r.ə) demişdi:

- *Sən pis əməllərin qarşısını almaqdan ötürü Allahın qoyduğu bir cəzanın əvf edilməsi üçünmü mənimlə danışırsan?*

Həmin axşam Allah Rəsulu (s.ə.v) insanlara müraciət etdiyi xütbəsində belə demişdi:

- *Sizdən əvvəlki qövmləri məhv edən səbəblərdən biri də bu idi ki, onların arasından zəngin və əsilzadə bir ailəyə mənsub olan cinayət etdiyi vaxt onu cəzasız buraxırdılar, lakin aralarında fəqir, kasıb və zəif bir nəfər cinayət törədəndə onu cəzalandırırdılar. Varlığım qüdrətli əlində olan Allaha and olsun ki, hətta qızım Fatimə (r.ə) belə oğurluq etsəydi onun əlini kəsdirərdim!*

Həmin qadının əli biləyindən kəsilmişdi. Lakin o qadın tutduğu əməldən ötürü tövbə etmiş və ailə qurmuşdu. Bütün ömrü boyu Peyğəmbəin (s.ə.v) xanımı Ayşə (r.ə) ilə görüşər, ehtiyacını ona bildirərdi.

Allah Rəsulunun (s.ə.v) əmri ilə hicri 8-ci ilin ramazan ayı boyunca Məkkədən yola çıxan süvari mücahid dəstələri yarımadanın müxtəlif yerlərindəki Lat, Mənat, Uzza, Suva kimi bütləri dağıltmış və bütpərəst məbədləri oda verib yandırmışdılar.

Xalid ibn Vəlid (r.ə) Uzza bütünü və məbədini Peyğəmbərin (s.ə.v) əmri ilə dağıldıb Məkkəyə qayıdandan sonra Allah Rəsulu (s.ə.v) onun əmrinə 350 nəfərlik süvari dəstə verib Məkkədən cənuba bir günlük məsafədə, Qumeysa su quyularının yaxınlığında yaşayan, Kinanə qəbiləsinin Bəni-Cuzeymə oymağına göndərdi. Xalid ibn Vəlid (r.ə) onların yurduna yaxınlaşanda Bəni-Cuzeyməlilər silahlanaraq döyüş üçün hazır vəziyyət aldılar. Xalid ibn Vəlid (r.ə) onları İslama dəvət etdi. Onlardan bəziləri müsəlman olduqlarını söylədilər. Xalid (r.ə) onlara əgər həqiqətən İslamı qəbul ediblərsə silahı yerə qoyub döyüş nizamından çəkilmələrini söylədi. Lakin Bəni-Cuzeyməlilər bunu etmədilər. Xalid ibn Vəlid (r.ə) zöhr, əsr və məğrib namazı vaxtına qədər gözlədi, lakin onların yurdundan əzan səsi eşitmədiyi üçün yalan danışdıqlarını düşündü və Bəni-Cuzeymə yurduna hücum etdi. Bəni-Cuzeyməlilər şiddətlə

müdafiə olundular, lakin bəziləri öldürüldülər, digərləri isə qaçıb qurtuldular, bir qismi isə əsir edildilər. Bəni-Cuzeymə yurdu ələ keçiriləndə onların həqiqətən məscid inşa edib içində namaz qıldıqları görüldü. Geri, Məkkəyə qayıdanda baş verənləri Allah Rəsuluna (s.ə.v) danışdılar. Peyğəmbər (s.ə.v) bu hadisədən ötürü son dərəcə üzüldü. Ömər ibn Xəttab (r.ə), Əbdürrəhman ibn Əvf (r.ə), Osman ibn Əffan (r.ə) kimi səhabələrlə Xalid ibn Vəlid (r.ə) arasında bu məsələdən ötürü mübahisə yaranmış, onlar Xalid ibn Vəlidi (r.ə) qınayaraq tövbə və istiğfar etməyə dəvət etmişdilər. Allah Rəsulu (s.ə.v) Əli ibn Əbu Talibi (r.ə) Bəni-Cuzeymə yurduna göndərib öldürülənlərin qan diyətini tələb etdikləri miqdarda hesablataraq ödəmiş, onlardan alınan bütün qənimətlər və əsirlər geri qaytarılmışdı.

*Huneyn Döyüşü*

Huneyn Məkkədən 16-17 km cənub-şərqdə, Tihamə bölgəsində yerləşən, dar keçidləri olan dərəli-təpəli bir yerdir. Vaxtilə Qüreyş müşriklərinin müttəfiqi olmuş, yarımadanın ən böyük qəbilələrindən olan Həvazin və Səqif qəbilələri Məkkənin fəthi səbəbiylə təşvişə düşmüş, Allah Rəsulunun (s.ə.v) mütləq onların üzərinə silahlı qüvvə göndərəcəyini anlamışdılar. Səqif qəbiləsinin Bəni-Hənifə oymağı İslama və Allah Rəsuluna (s.ə.v) qarşı kinləri və düşmənlikləri ilə xüsusilə seçilirdilər. Buna görə də İslam ordusunun Məkkəyə yaxınlaşmasından xəbər tutduqları vaxtdan etibarən casuslar vasitəsi ilə ordunun hərəkətlərini izləməyə başlamışdılar. Səqif qəbiləsi əsasən Taif şəhərində məskunlaşmışdı. Burada onların möhkəm divarlara malik istehkamları və qalası var idi. Məkkənin fəthindən dərhal sonra onlar qalanın zəif yerlərini təmir etməyə başlamış və Həvazin qəbiləsilə bir neçə dəfə görüşüb danışaraq birgə hərəkət etmək barəsində razılaşmışdılar. Həvazin qəbiləsinin rəisi Malik ibn Əvf ən-Nasri də amansız İslam düşməni və təkəbbürlü bir insan idi. O, daim uzun ətəkli paltar geyərək paltarının ətəyini arxası ilə sürüyüb təkəbbürlə gəzirdi. Məkkənin fəthindən dərhal sonra Malik ibn Əvf rəislik etdiyi Həvazinə mənsub bütün oymaq və ailələrinin böyüklərini yanına çağırıb səfərbərlik təlimatı vermişdi. Onun bu əmrini Bəni-Kə’b və Bəni-Kilab oymaqları yerinə yetirməmiş, silahlı qüvvə göndərməmişdilər. Beləcə Həvazin və Səqif qəbilələri bütün oymaqlardan əli silah tutan döyüşçüləri və müttəfiq qəbilələrdən cəlb etdikləri süvariləri Əvtas adlanan yerdə topladılar. Onların ümumi sayı 14 min nəfərə yaxın idi. Bu xeyli böyük bir hərbi qüvvə idi. Bəni-Hilal oymağının başçısı, yaşı 100-ü haqlamış Dureyd ibn Simmə öz döyüşçüləri ilə Əvtasa çatanda orada həvazinlilərin qadın və uşaqlarını daşıyan köçü görmüşdü. O, Malik ibn Əvfdən hərbi səfərə

qadınlar və uşaqların da gətirilməsinin səbəbini soruşanda Malik ibn Əvf ona döyüşçülərin arxada öz qadın və uşaqlarının olduğunu bilərək döyüşdən qaçmayacaqları üçün belə bir iş tutduğunu bildirmişdi. Dureyd ibn Simmə yaşlı və təcrübəli döyüşçü idi. O, Malikin bu cavabına hirslənərək ona dedi:

- *Sən dana çobanından başqa bir şey deyilsən ey Malik. Vahiməyə qapılıb qaçmağa üz tutmuş əsgəri heç bir şey dayandıra bilməz. Döyüşçünü fərarilikdən sadəcə əlindəki qılınc və nizə qurtara bilər. Lakin indiki halda məğlub olsan ailən, malın-mülkün düşmənin əlinə qənimət kimi keçəcək, sən isə rəzil və rüsvay olacaqsan.*

Kə'b və Kilab qəbiləsindən də heç kimin orduya qatılmadığını görən Dureyd, Malik ibn Əvfi ordunu pis təşkilatlandırmaqda, qəbiləsinə rəislik edə bilməməkdə günahlandırdı və onu qınadı. Sonra isə Malik ibn Əvfə piyada döyüşçüləri köçün yanında qoyub süvarilərlə müsəlmanlara hücum etməyi təklif etdi. Əgər qələbə çalsalar piyada ordu arxadan onlara yetişəcəkdi, məğlub olsalar geri qayıdıb köçü müdafiə edəcəkdilər. Malik onun bu təklifini qəbul etmədi və onu qocalığı səbəbiylə səfehləməklə günahlandırdı. Dureyd bu təklifini ordudakı digər qəbilə və oymaq rəislərinə çatdıranda onun qınaqları və acı sözlərindən bezən Malik qəzəbləndi, qılıncını sıyıraraq oradakıları hədələməyə başladı. Qəbilə və oymaq rəisləri Malikə qulaq asmayacaqları təqdirdə ahıl və taqətsiz Dureydin ümidinə qalacaqlarından çəkinərək Dureydin təklifini rədd etdilər.

Bu vaxt Allah Rəsulu (s.ə.v) Həvazin və Səqif qəbilələrinin müharibə səfərbərliyində olduqları xəbərlərini almışdı. O, belə vəziyyətdə yeni fəth olunmuş Məkkəni müdafiəsiz qoyub Mədinəyə qayıda bilməzdi. Digər tərəfdən Məkkədə qalıb Həvazin və Səqifin müttəfiq ordusu ilə döyüşü burada qəbul etmək də istəmirdi. Çünki Məkkədə hələ də İslam düşmənləri var idi və zəif mövqedə də deyildilər. Buna görə də Allah Rəsulu (s.ə.v) müttəfiq müşrik ordusunun üstünə getməyi düşünürdü. Allah Rəsulu (s.ə.v) Abdullah ibn Əbi Hədrəd əl-Əsləmini (r.ə) casus olaraq göndərib düşmənin niyyətindən və hərbi təchizatından təfərrüatı ilə xəbərdar olmuşdu. Peyğəmbər (s.ə.v) dərhal səfərbərlik əmri verdi və əmirlərə öz dəstələrini döyüş nizamına gətirmələrini tapşırdı. Bundan başqa Allah Rəsulu (s.ə.v) hələ ki, İslamı qəbul edib müsəlman olmamış Səfvan ibn Uməyyəni yanına çağırdı və ondan 100 nəfər mücahidi təmin etmək üçün əmanət olaraq zireh və silah-sursat istədi. Səfvan, Peyğəmbərin (s.ə.v) bu istəyini yerinə yetirdi. Bundan başqa Peyğəmbər (s.ə.v) əmisi oğlu Novfəl ibn Harisdən də Məkkədən toplatdığı 3 min ədəd nizəni əmanət olaraq almışdı. Bununla Allah Rəsulu (s.ə.v) həm öz ordusunun silah

ehtiyacını təmin etmiş, həm də hər ehtimala qarşı Qureyşi əlindəki silah-sursatdan məhrum etmişdi.

Allah Rəsulu (s.ə.v) səfərə çıxmamışdan əvvəl İslamı yeni qəbul etmiş, iyirmi bir yaşlı gənc olan Əttab ibn Useydi (r.ə) Məkkə canişinliyinə, Muaz ibn Cəbəli (r.ə) isə dini işlərin icrası üçün təyin etmişdi. İslamı yeni qəbul etmiş 2 min qüreyşli də tam təchizatlı olaraq İslam ordusuna qatılmışdı. Beləcə Allah Rəsulunun (s.ə.v) əmrindəki ordunun ümumi sayı 12 min nəfəri keçmişdi. Hicri 8-ci il şəvval ayının 5-i (24 yanvar 630) İslam ordusu Məkkədən hərəkətə başlamışdı.

İki gün sonra, axşam vaxtı Huneyn vadisinə çatanda Allah Rəsulu (s.ə.v) gecənin qaranlığında ordunu dar vadidən keçirməyi münasib görməyib düşərgə qurmaq əmrini verdi. Burada mücahidlərə xitab edərək onlara nəsihət etdi. Gecəni keçirib səhərə az qalmış ordu Huneyn vadisinə girdi. Bu vaxt Həvazin qəbiləsinin casusları İslam ordusunun bütün hərəkətlərini müşahidə edirdilər. Malik ibn Əvf Huneyn vadisinin çıxışının hər iki tərəfinə oxçularını və piyada döyüşçülərini yerləşdirərək pusqu qurmuşdu. İslam ordusunun önündə yeni müsəlman olmuş məkkəli gənc döyüşçülər gedirdilər. Səhərin ala qaranlığında həvazinlilərin piyadaları önçü qüvvələrə qəfil hücum etdilər. Hücumun qəfil və gözlənilməz olmasına baxmayaraq önçü qüvvələr hücumun qarşısını aldılar və hücum edənləri geri oturtdular. Lakin bir qədər irəliləyəndən sonra geri çəkilən düşmən əsgərlərinin buraxıb getdikləri qənəmət mallarını toplamağa başları qarışdığı üçün pusqudakı oxçuların asan hədəfinə çevrildilər. Qəfil ox yağışı və geri çəkilənlərin əks hücumu vahiməyə və qaçışa səbəb oldu. Bu qaçış onların ardınca gələn, Xalid ibn Vəlidin (r.ə) əmrindəki Bəni-Suleym süvarilərinə də təsir etdi, onlar da nizamsız halda geri çəkilməyə başladılar. Tezliklə vahimə bütün İslam ordusuna sirayət etdi və nizamsız bir geri çəkilmə başladı. Bir çox əsgər dağılışıb ətrafa qaçmağa başlamışdı. Önçü dəstədəkilərin bəziləri şəhid olmuşdular. Allah Rəsulu (s.ə.v) yanındakı möminlərlə birlikdə vadinin sağ tərəfindəki yüksəkliyə doğru çəkildi. Yanında əmisi Abbas (r.ə), onun oğlu Fəzl (r.ə), əmisi Harisin oğulları Cəfər (r.ə), Rəbiə (r.ə), Əbu Süfyan ibn Haris (r.ə), Əli ibn Əbu Talib (r.ə), Əbu Bəkr (r.ə), Ömər ibn Xəttab (r.ə), Əymən ibn Ubeyd (r.ə), Osman ibn Əffan (r.ə), Usamə ibn Zeyd (r.ə) və başqaları var idi. Peyğəmbərin (s.ə.v) ətrafındakı adamların sayı təqribən yüz nəfərə yaxın idi. Nizamsız halda geri çəkilən ordudakı əsgərlərin bağırmaları, dəvələrin nəriltisi bir-birinə qarışmışdı. Abbas ibn Əbdülmüttəlibin (r.ə) səyi ilə ordunu yenidən intizama qaytarmaq mümkün olmuşdu. O, geri çəkilərək ətrafa dağılışmış əsgərlərə gur səsiylə səslənərək "*ey Əqəbədə beyət edənlər! Ey Ridvan ağacının altında and içənlər! Allahın Rəsulu (s.ə.v) bura-*

*dadır! Muhəmməd (s.ə.v) buradadır*" deyərək səslənirdi. Onun səsinə qulaq verən mücahidlər dəstə-dəstə Peyğəmbərin (s.ə.v) olduğu təpənin ətrafına toplaşmağa başladılar. Allah Rəsulu (s.ə.v) dərhal orduya döyüş nizamı verərək əks-hücuma keçmək əmrini verdi. Bu vaxt həvazinlilərin cəngavərlərindən biri dəvəsinin belində, müşriklərin önündə, əlində bayraq mücahidlərə hücum edir, həvazinliləri döyüşə təşviq edirdi. Əli ibn Əbu Taliblə (r.ə) Əbu Dücanə (r.ə) dərhal müşrik cəngavərin üstünə yeridilər. Əli (r.ə) onu vurub dəvənin üstündən yerə saldı. Əbu Dücanə (r.ə) qılıncı ilə vurub həvazinli cəngavərin bir ayağını qopardı. Daha sonra Əli (r.ə) və Əbu Dücanə (r.ə) həvazinli pəhləvanı qılıncları ilə doğrayaraq öldürdülər. Həvazinlilərin cəngavərlərindən bir digərini də təkbətək döyüşdə Əbu Qatədə (r.ə) öldürmüşdü. Allah Rəsulu (s.ə.v) "*müharibə təndirinin alovu hələ indi qızışdı*" deyərək İslam ordusuna ümumi hücum əmri verdi. İslam ordusunun ard-arda etdiyi bir neçə həmlədən sonra Həvazin və Səqif qəbilələrinin müttəfiq ordusunun sıraları yarıldı və onlar nizamsız halda geri qaçmağa başladılar. Bu vaxt onlardan yüzə yaxınının cəsədi döyüş meydanında qaldı. Yaşlı və təcrübəli sərkərdə Dureyd ibn Simmə dəvəsinin üstündəki kəcavədə döyüş meydanından qaçarkən Rəbiə ibn Rufey (r.ə) adlı yeniyetmə bir mücahidin əlinə keçmiş və öldürülmüşdü. Hüneyndə həvazinli müşriklərdən çox sayıda əsir də alınmışdı.

Müttəfiq müşrik ordusu bir neçə yerə ayrılaraq sürətlə qaçıb Huneyn vadisini tərk etmişdi. Səqiflilər qaçaraq Taif qalasının möhkəm divarları arxasına sığınmışdılar. Həvazin qəbiləsinin rəisi Malik ibn Əvf də Taif qalasına sığınmışdı. Həvazinlilərin bir qismi Nəxləyə, bir qismi isə Əvtas tərəfə qaçmış, oradakı mövqelərində möhkəmlənmişdilər. Allah Rəsulu (s.ə.v) süvari mücahidlərə düşməni təqib etmək əmri verdi. Peyğəmbər (s.ə.v) döyüş meydanında bir qadın cəsədi görmüşdü. Buna görə də düşməni təqib edən mücahidlərə qəti təlimat verdi: "*qadınları, uşaqları və kölələri əsla öldürməyin*". Bu vaxt Useyd ibn Hudeyr (r.ə) ondan "*ey Allahın Rəsulu (s.ə.v)! Onlar müşriklərin uşaqları deyillərmi?*" deyə soruşmuş və Allah Rəsulu (s.ə.v) ona belə cavab vermişdi:

- *Sizlərdən ən xeyrli möminlər də müşriklərin uşaqları deyillərmi? Hər uşaq İslam fitrəti ilə dünyaya gəlir, dili açılana qədər də belə qalır. Sonra ata və anası onu ya yəhdiləşdirir, ya da xristianlaşdırır.*

Bu vaxt Həvazin səfərində iştirak etmiş, fəqət döyüşdən qaçmış bəzi qüreyşli müşriklər özlərini Məkkəyə çatdıraraq şəhərdə "*Muhəmməd (s.ə.v) öldürüldü, əshabı da qaçıb dağılışdı, artıq öz ata-babanızın dininə qayıda bilərsiniz*" deyə xəbər yaymağa başlamışdılar. Əttab ibn Useyd (r.ə) "*Muhəmməd (s.ə.v) öldürübsə də gətirdiyi din diridir, onun ibadət etdiyi Allah ölümsüzdür*" deyərək

onları susdurmuşdu. Axşama yaxın gələn İslam ordusunun qələbə xəbəri ikiüzlülərin sevincini ürəyində qoymuşdu.

Allah Rəsulu (s.ə.v) Əvtasda mövqe tutmuş həvazinli müşriklərin üstünə Əbu Amir Abdullah ibn Qeys əl-Əş'əri (r.ə) ilə Əbu İyas Sələmə ibn əl-Əkva əl-Əsləminin (r.ə) əmrindəki mücahidləri göndərmişdi. Əbu Amir əl-Əş'əri (r.ə) dəstəsinin önündə düşmən mövqelərinə hücum etmiş, qəhrəmancasına vuruşmuş, ona hücum edən müşriklərlə vuruşaraq onlardan doqquzunu öldürmüşdü. Fəqət ürəyinə dəyən bir oxla şəhid olmuşdu. Əbu Amir (r.ə) Əbu Musa əl-Əş'ərinin (r.ə) əmisi idi və qardaşı oğlu həmin oxçunu yaxalayıb qətlə yetirmişdi. Əvtas döyüşü müsəlmanların qələbəsiylə nəticələnmişdi. Həvazinlilərdən qalan çox miqdarda qənimət və əsir mücahidlərin əlinə keçmişdi.

Huneyn yaxınlığında Xuzaə və Dəvs qəbilələrindən olan müşriklərin tez-tez ziyarət etdikləri "Zulkəffeyn" adlı bir büt və bütpərəst məbədi var idi. Tufeyl ibn Əmr əl-Xuzai (r.ə) Allah Rəsulunun (s.ə.v) izniləgedib Zulkəffeyn məbədini yandırmış və bütü yıxıb dağıltmışdı. Tufeyl ibn Əmr (r.ə) geri qayıdarkən öz qəbiləsindən İslamı qəbul etmək istəyən 400 nəfərlə birlikdə Allah Rəsulunun (s.ə.v) hüzuruna gəlmişdi.

Allah Rəsulu (s.ə.v) Xalid ibn Vəlidin (r.ə) əmrinə 1000 nəfər süvari mücahid verərək ordunun əsas hissəsindən öndə Taifə tərəf yola çıxardı. Xalid ibn Vəlid (r.ə) Huneyndə qolundan ağır yaralanmışdı. Allah Rəsulu (s.ə.v) öz əlilə Xalidin (r.ə) yarasını sarıyaraq yola çıxmasını əmr etmişdi. Daha sonra özü ordunun əsas hissəsilə yola çıxmışdı. Xalid ibn Vəlid (r.ə) "divarlarla əhatə olunmuş" mənasını ifadə edən Taifə çatanda Səqif qəbiləsinin istehkamlarda möhkəm mövqe tutduğunu gördü. Səqiflilər Xalid ibn Vəlidin (r.ə) açıq meydan döyüşü təklifini rədd etmişdilər. Allah Rəsulu (s.ə.v) Taifə gəlib çatanda qalanın mühasirəsi üçün göstəriş verdi. Mücahidlərin mövqeləri, o cümlədən Peyğəmbərin (s.ə.v) oturduğu çadır qala divarlarına çox yaxın olduğu üçün qaladakı müşriklərin atdıqları oxların asan hədəfinə çevrilmişdi. Buna görə də Allah Rəsulu (s.ə.v) həm də qərargah kimi istifadə etdiyi çadırını biraz daha uzaq bir yerdə qurdurdu. Mücahidlər müşriklərin qala divarlarının üzərindən atdıqları oxlardan qalxanlarla müdafiə olunmağa çalışır, fürsət düşdükcə qaladakıları oxa tuturdular. Lakin istehkamlardakı müşriklərin mövqeləri ox atışı üçün daha əlverişli idi. Mücahidlərin atdıqları oxlar isə çox vaxt hədəfdən yan keçirdi. Allah Rəsulu (s.ə.v) Salman əl-Farsinin (r.ə) təklifi ilə mancanaq düzəldilməsi üçün göstəriş verdi. Mancanaqlardan atılan daşlar, gözlənildiyinin əksinə, Taifin möhkəm qala divarlarlarının uçurulması üçün kifayət etmədi. Daha sonra Salman əl-Farsi (r.ə) qala divarlarının bünövrəsinin qazılaraq uçu-

rulmasını təklif etdi. Lakin müşriklərin atdıqları oxlar səbəbiylə divarlara yaxın düşmək mümkün deyildi. Salman əl-Farsi (r.ə) vətəni İranda, Sasani ordusunun belə məqsədlər üçün istifadə etdiyi qurğudan düzəldilməsini təklif etdi. Salman əl-Farsinin (r.ə) ağac gövdələrindən düzəltdiyi, üzərinə heyvan gönü çəkilmiş dəbbabə adlanan qurğunun altına sığınan mücahidlər oxlardan qorundular və qala divarının dibinə qədər yaxınlaşdılar. Lakin bürclərin bünövrəsini qazımaq mümkün olmadı. Belə ki, səqifli müşriklərin odda qızdırdıqları ucu iti dəmir çubuqlar heyvan gönlərini yandıraraq yırtmış və dəbbabənin altındakı mücahidləri yaralamağa başlamışdılar. Ərzaq və sursat ehtiyatının bol olduğu Taif qalasındakı müşriklərin mühasirəsi təqribən 21 gün davam etmişdi. Allah Rəsulu (s.ə.v) bu müddət başa çatandan sonra orduya mühasirəni ləğv edilib çəkilmək əmrini verdi. Ordudakı bəzi əmirlər buna istəksiz yanaşdılar. Onlar "*biz səqiflilərdən daha çətin və cəsur düşmənlərlə qarşılaşıb məğlub etdiyimiz halda indi heç bir nəticə əldə etmədən geri çəkilirik. Halbuki bu qala divarlarının arxasına sığınıb ox atanlar öz deşiyinə girib gizlənmiş tülküdən başqa bir şey deyillər*" deyirdilər. Lakin əshab Hudeybiyyə sülhündə də Peyğəmbərin (s.ə.v) verdiyi qərarın doğru və isabətli olduğunun sonradan anlaşıldığını xatırlayıb Allah Rəsulunun (s.ə.v) bu əmrini dərhal yerinə yetirdi. Mühasirə ləğv edilərkən əshabdan bəzilərinin "*ey Allahın Elçisi (s.ə.v)! Səqifə lənət oxu, onlara bəddua et*" deməsinə Allah Rəsulu (s.ə.v) bu dua ilə cavab vermişdi:

- *Ey Rəbbim! Səqiflilərə hidayət ver. Onlara doğru və haqq olan yolu göstər. Onları bizə (İslam camaatına) qovuşdur!*

Ordu Məkkə yaxınlığındakı Cu'ranə adlı yerə gəlib çatanda Allah Rəsulu (s.ə.v) mücahidlərə fasilə əmri verdi. Ordunun Cu'ranədə qaldığı üç gün ərzində bütün səfər zamanı alınan qənimət malları, əsirlər yenidən sayıldı və bölüşdürüldü. Həvazinlilərdən 6000-dən artıq əsir alınmışdı. 24 min dəvə, 40 min baş iri və xırda buynuzlu mal-qara və 4000 uqiyyə (514 kg) gümüş pul qənimət olaraq ələ keçirilmişdi. Bütün hərbi səfər boyu cəmi 18 mücahid şəhid olmuşdu. Bunlardan 13-ü Taif mühasirəsində aldıqları ox yaraları səbəbiylə şəhid olanlardı. Gigər 5 nəfər isə Huneyn və Əvtas döyüşlərində şəhid olmuşdular.

Allah Rəsulu (s.ə.v) Busr ibn Süfyan əl-Xuzaiyə (r.ə) qənimət mallarından pul verərək Məkkəyə göndərdi və Məkkə tacirlərindən əsirlər üçün, ələlxüsus qadın və uşaqlara çatacaq qədər paltar aldırdı. Beləcə əsirlərdən paltarsız və cır-cındır içində olanlara təzə paltar geyindirildi. Qənimətlərin bölüşdürülməsi mövzusunda bəzi çöl ərəbi, bədəvi müsəlmanlar Allah Rəsulunu (s.ə.v) çox sıxışdırmışdılar. Onlar bu haqda Allah Rəsuluna (s.ə.v) tez-tez müraciət edir, bu işdə çox ifrata varırdılar. Allah Rəsulu (s.ə.v) Zeyd ibn Sabitə (r.ə) qənimət mal-

larını və pay sahiblərini sayıb hesablatmağı əmr etdi. Bu iş başa çatandan sonra beytülmala aid olan beşdə bir hissə ayrıldı. Sonra isə Əbu Cəhm Huzeyfə əl-Ədəvi (r.ə) qənimət mallarını mücahidlər arasında payladı. Hər piyada əsgərə 4 dəvə və ya 40 qoyun, hər süvari əsgərə isə 12 dəvə və ya 120 qoyun düşmüşdü. Həmin dövrdə bir dəvənin qiyməti 400-480 dirhəm arası, bir qoyunun qiyməti isə 4-6 dirhəm arasında dəyişirdi. 1 dirhəm isə 2,975 gr gümüşə bərabər idi.

Məkkənin fəthindən sonra beytülmaldan "*müəllifəyi-qülub*" adlanan hissə ayrılmışdı. "Qəlblərin İslama isinməsi" mənasındakı bu hissə Məkkənin fəthindən sonra İslamı yeni qəbul etmiş və ya hələ ki, İslamı qəbul etməmiş Məkkəli əsilzadələrə ödənirdi. Əbu Süfyan ibn Hərb, Səfvan ibn Üməyyə, Nəzir ibn Haris, Əqra ibn Habis ət-Təmimi, Suheyl ibn Əmr, Xuveytib ibn Əbdüluzza, Uyeynə ibn Hısn əl-Fəzari, Abbas ibn Mirdas əs-Süləmi, Həkim ibn Hizam xəzinədən "*müəllifəyi-qülub*" alanlardan idilər. Beytülmaldan "*müəllifəyi-qülub*" alanlardan sadəcə Uyeynə ibn Hısn müşrik olaraq ölmüş, digər hamısı İslamı səmimiyyətlə qəbul etmişdilər.

Allah Rəsulu (s.ə.v) bundan başqa Huneyn və Taif hərbi səfərlərində iştirak etmiş qaynatası Əbu Süfyan Səxr ibn Hərb (r.ə), onun oğulları Yəzid[33] (r.ə) və Müaviyənin (r.ə) hər biri üçün qənimət mallarından 40 uqiyyə gümüş və 100 dəvə pay ayırmışdı. Taif mühasirəsi vaxtı gözünə dəyən bir oxun yaralaması nəticəsində Əbu Süfyan ibn Hərb (r.ə) bir gözünü itirmişdi.

Huneyn səfərində alınan qənimət malları paylanarkən Təmim qəbiləsinə mənsub Zülhuveyrisə adlı bir şəxs gəlib Peyğəmbərə (s.ə.v) "*ey Muhəmməd (s.ə.v)! Mən sənin bu gün etdiyin işi gördüm*" demişdi. Allah Rəsulu (s.ə.v):

- *Nəcə gördün?*

- *Sənin ədalətli davranmadığını gördüm. Ədalətli ol ey Allahın Elçisi (s.ə.v)!*

Onun bu sözü Peyğəmbərə (s.ə.v) pis təsir etmiş və onu hiddətləndirmişdi. Peyğəmbər (s.ə.v) ona belə cavab verdi:

- *Vay olsun sənin bu halına. Əgər mən də ədalətli deyilsəm, bəs kim ədalətlidir? Əgər mən adil olmasaydım niyyət etdiyimi əldə edə bilməzdim. Sən isə mənə tabe olduğun üçün ziyan içində olardın.*

Onların bu danışığını eşidən Ömər ibn Xəttab (r.ə) "*ey Allahın Rəsulu (s.ə.v)! İzn ver bunun boynunu vurum*" deyəndə Allah Rəsulu (s.ə.v) belə cavab vermişdi:

- *Xeyr! Sən onu burax getsin. Vaxt gələcək onun ətrafında toplaşanlar olacaq və onlar dində (ibadətdə) dərinləşəcəklər. Sizlər onların tutduğu oru-*

[33] Bu şəxs Əməvi sülaləsinin ikinci hökmdarı Yəzid (680-683) deyil, onun əmisidir.

*cun yanında öz orucunuzu, onların qıldığı namazın yanında öz namazınızı kiçik görəcəksiniz. Onlar Qur'anı oxuyacaqlar, fəqət oxuduqları körpücük sümüklərindən aşağı (boğazlarından qəlblərinə) enməyəcək. Onlar oxun yaydan uçub çıxdığı kimi İslamdan çıxacaqlar. Onlar müsəlmanlar öz aralarında ixtilafa düşdükləri vaxt peyda olacaqlar.*

Bu vaxt Allah Rəsuluna (r.ə) ənsardan bəzi gənclərin dünənə qədər İslamın və müsəlmanların azğın düşməni olan bəzi quyerşlilərə beytülmaldan hissə ayrılıb ödənməsindən narazı qaldıqları xəbəri çatdırıldı. Allah Rəsulu (s.ə.v) sadəcə ənsardan olan mücahidləri və mühacirlərin qabaqcıllarını ayrı bir çadırda topladaraq onlardan bu eşitdiklərinin doğru olub olmadığını soruşmuş, onlar da aralarından bəzi gənclərin bu kimi sözlər danışdıqlarını demişdilər. Daha sonra Allah Rəsulu (s.ə.v) onlara belə xitab etmişdi:

- *Ey Ənsar! Siz yolunu azmış müşriklər idiniz. Allah mənim vasitəmlə sizi hidayətə qovuşdurmadımı? Siz fəqir insanlar idiniz. Mən sizin aranıza gələndən sonra Allah sizi rifaha qovuşdurmadımı? Siz öz aranızda bir-birinizlə düşmən idiniz. Allah mənim vasitəçiliyimlə sizin qəlblərinizi birləşdirmədimi?*

Ənsar yekdilliklə "*bəli, doğrudur, bütün minnət Allaha və Rəsuluna (s.ə.v) aiddir*" deyə cavab verəndə, Peyğəmbər (s.ə.v) onlara xitabına belə davam etdi:

- *Ey ənsar! Əgər istəsəydiniz siz mənim suallarıma belə də cavab verə bilərdiniz:*

*"Öz qəbilən səni təkzib, inkar etdi. Bizim yanımıza hicrət etdin. Biz sənin peyğəmbərliyini təsdiq edib iman gətirdik. Öz qəbilədaşların səni tərk etdilər, biz sənə yardım etdik. Öz qövmün səni doğma yurdundan qovub çıxardı, biz səni bağrımıza basdıq. Sən bizim yanımıza gələndə qərib idin, biz səni himayə etdik".*

*Əgər siz mənim sizə verdiyim suallara belə cavab versəydiniz, mən də sizə "bəli, düz deyirsiniz" deyərdim.*

*Ey ənsar! Yoxsa siz bəzi adamlara qəlbləri bu dinə isinsin deyə dünya malından verdiyim üçün məndən incidiniz? Bəziləri dünyalıqla, dəvə və mal-qarayla evinə qayıdır. Siz isə Allahın Elçisi (s.ə.v) ilə birlikdə evinizə qayıdırsınız. Məgər razı qalmaq üçün bu kifayət etmirmi? Sizin yanınızda olan, onların yanında olan dünya malından çox daha xeyrlidir. Əgər hicrətin izzəti və şərəfi olmasaydı, mən ənsarın bir fərdi olmaq istəyərdim. Əgər bütün insanlar bir tərəfə, ənsar isə başqa bir tərəfə üzünü tutub getsə, mən ənsarın yolunu tutub gedərdim.*

Daha sonra Allah Rəsulu (s.ə.v) ənsar üçün xeyir-dua etdi. Peyğəmbərin (s.ə.v) bu sözləri ənsarın qəlbinə təsir etmiş, bir çoxu gözyaşlarını saxlaya bilməmişdi. Bu kimi sözləri dilə gətirən gənclər isə söylədiklərindən ötürü böyük peşmançılıq çəkmişdilər.

Hicri 8-ci il zilqədə ayının 17-si (7 mart 630) Allah Rəsulu (s.ə.v) Cu'ranədən ehrama girərək çıxmış və umrə etmək niyyətilə əshabı ilə birlikdə Məkkəyə üz tutmuşdu. Umrə ziyarətini başa vurandan sonra Allah Rəsulu (s.ə.v) Əttab ibn Useydi (r.ə) Məkkənin idari işləri üçün öz vəkili, canişini təyin etmişdi. Muaz ibn Cəbəl (r.ə) isə Məkkədə dini işlər, Qur'an müəllimliyi və fiqh məsələləri üzrə Peyğəmbərin (s.ə.v) vəkili olaraq təyin edilmişdi. Daha sonra əshabı ilə birlikdə yola çıxaraq Mədinəyə getmişdi və zilqədə ayının 23-ü (13 mart 630) Mədinəyə çatmışdı.

Allah Rəsulu (s.ə.v) Mədinəyə çatandan sonra əsirləri mücahidlərin arasında bölüşdürmədən 10 gün gözləmişdi. O, həvazinlilərin gəlib əsir qadın və uşaqları alıb aparmaları üçün bu qədər müddət gözləmişdi. Lakin 10 gün ərzində Həvazin qəbiləsindən heç kim Mədinəyə gəlməmişdi. On dörd gün keçəndən sonra başlarında Bəni-Sə'd oymağından Əbu Surəd Zuheyr olmaqla on nəfərdən artıq həvazinli elçi heyəti Mədinəyə gəlmişdilər. Onlar özlərinin artıq müsəlman olduqlarını və qövmlərindən də bir çoxunun İslama meylli olduqlarını bildirmişdilər. Daha sonra onlar Allah Rəsuluna (s.ə.v) öz süd anası Həlimənin də həvazinli olduğunu, həvazinlilərin ona yad insanlar olmadıqlarını bildirərək onlardan alınmış əsirləri və qənimət mallarını geri istəmişdilər. Peyğəmbər (s.ə.v) bunun üçün onları on gün gözlədiyini, lakin onlardan heç bir soraq çıxmadığını gördüyü üçün əsirləri mücahidlərə payladığını bildirəndən sonra belə demişdi: "*Bu gün zöhr namazı vaxtı məscidə gəlin. Namazdan sonra hamının yanında bu istəyinizi mənə deyin. Mən hamının yanında özümün və Əbdülmüttəlib övladının payına düşən əsirləri azad etdiyimi bildirəcəyəm. Digər insanlar isə bu işdə sərbəsdirlər, mən onları məcbur edə bimərəm. Lakin siz ya əsirlər ya da qənimət malları arasında bir seçim etməlisiniz*". Həvazin elçiləri qənimət mallarından əl çəkdiklərini, əsirlərin isə geri qaytarılmasını istədilər. Onlar məsciddə xahişlərini təkrar edəndə Peyğəmbər (s.ə.v) "*mən özümün və Əbdülmüttəlib övladının payına düşən bütün həvazinli əsirləri azad etdim*" demişdi. Onun bu sözündən sonra ənsar və mühacirdən olan bütün müsəlmanlar paylarına düşən əsir həvazinliləri Peyğəmbərə (s.ə.v) bağışladıqlarını bəyan etmişdilər. Yəni onların əlində olan əsirlər də beləcə azadlığa qovuşmuşdular. Həmçinin Mədinə ətrafındakı qəbilələrdən olan müsəlmanlara da bu haqda xəbər göndərilmiş, onlar da əllərində olan həvazinli əsirlərini əqrəbalarına geri qaytarmışdılar. Ailə üzvləri olan 6000 əsirin təmənnasız geri qaytarılması həvazinliləri xeyli sevindirmişdi. Həvazinlilərin əksəriyyəti qısa müddət ərzində İslamı qəbul etmişdilər.

Əvtas döyüşündə Həvazin qəbiləsinin rəisi Malik ibn Əvfin ailəsi və övladları da müsəlmanların əlinə əsir düşmüşdü. Allah Rəsulu (s.ə.v) onları

digərlərindən ayırıb əsirlər paylanarkən heç kimə verməmişdi. Həvazinli elçilərə əgər ailəsi və uşaqlarını aparmaq istəyirsə Malikin özünün gəlməsini tapşırmışdı. Bu xəbər Malik ibn Əvfə çatanda o, Mədinəyə getmək istəmişdi. Lakin müttəfiq olduğu səqiflilərin bundan ötürü onu ya həbs etmələrindən, ya da öldürmələrindən qorxduğu üçün gizlicə Taifi tərk edib Mədinəyə gəlmişdi. Allah Rəsulu (s.ə.v) hüzuruna gələn Malik ibn Əvfə ailəsindən olan əsirləri verdi. Bundan başqa ona 100 dəvə hədiyyə etdi. Bir müddət sonra Malik ibn Əvf səqiflilərin sözünə uyaraq tutduğu işlərdən ötürü peşman oldu və Allah Rəsuluna (s.ə.v) İslamı qəbul edib müsəlman olduğu xəbərini göndərdi. Malik ibn Əvf (r.ə) həqiqətən səmimiyyətlə İslamı qəbul etmiş, bundan sonrakı həyatını zöhd və ibadətlə keçirmişdi. O, müsəlman olandan sonra Həvazin qəbiləsinin rəisi olmaqla yanaşı həm də Allah Rəsulunun (s.ə.v) valisi olmuşdu. Peyğəmbər (s.ə.v) onu Sümamə, Səlimə və Fəhm qəbilələrinə də öz valisi təyin etmişdi.

*Təbükə Hərbi Yürüş*

Mədinədən Şam diyarına daim ticarət karvanları gedib-gəlirdi. Ticarət karvanlarının şimaldan gətirdiyi xəbərlər Mədinədə narahatlıqla qarşılanmaqda idi. Məkkənin fəthi ilə Qüreyş müşriklərinin müqaviməti qırılmış, müşrik ərəblərin anti-İslam fəaliyyətinin böyük ölçüdə qarşısı alınmışdı. Bu Mədinə İslam dövlətinin yarımadadakı mövqeyini, ərəb qəbilələri üzərindəki nüfuzunu gücləndirmişdi. Bu xəbərlər Şama hakim olan, Bizansın vassalı xristian ərəb Qəssani krallığını narahat edirdi. Başqa sözlə müsəlmanların bu fəaliyyətləri Bizansın Misir və Şamdakı nüfuzuna xələl gələcəyi əndişəsini meydana gətirmişdi. Buna görə də Bizans imperiyası Mədinə İslam dövlətinin güclənməsinin qarşısını almaq üçün Şamda yeni bir hərbi kampaniya hazırlıqlarına başlamışdı. Şam diyarından gələn ticarət karvanları vasitəsilə bu xəbərlər Mədinəyə çatmışdı. Bu xəbərlərin araşdırılıb doğrulanmasından sonra Allah Rəsulu (s.ə.v) dərhal hərbi hazırlıqlar üçün tədbirlər gördürməyə başladı. Mutə döyüşündən əvvəlki hərbi səfərbərlikdən fərqli olaraq bu dəfə hədəf açıq və aşkar olaraq elan edilmişdi. Allah Rəsulu (s.ə.v) Mədinə yaxınlığındakı Səniyyətü'l-Vəda adlı yerdə hərbi düşərgə qurulmasını və bütün hərbi hazırlıqların orada aparılmasını tapşırmışdı. Məkkəyə və yarımadadakı bütün müttəfiq qəbilələrə hərbi səfərbərlik elan edilmiş və Səniyyətü'l-Vədada toplanılması əmr edilmişdi. Mədinədəki münafiqlər bu səfər hazırlıqlarını da narahatlıqla qarşılayıb "*bu istidə də səfərə çıxmaq olar?*" kimi sözlərilə qəlblərindəki nifaqı izhar etmişdilər. Münafiqlərin başı Abdullah ibn Ubeyy ibn Səlul isə münafiq dostlarına "*deyəsən Muhəmməd (s.ə.v) Rum (Bizans) dövlətini oyun-oyuncaq hesab edir. Mən onun öz əshabı ilə*

*birlikdə əsir düşəcəyini sanki öz gözlərimlə görürəm*” demişdi. Münafiqlərdən 80-ə yaxını müxtəlif bəhanələrlə səfərbərlikdən yayınmışdılar. Bəziləri isə qənimətdən hissə alacaqlarını umaraq bu səfərdə iştirak etmiş, lakin bütün səfər boyu fəsad çıxarmaqdan çəkinməmişdilər. Allah Qur’anın Tövbə surəsi 49-cu ayəsində münafiqlərin bu fitnəkarlığını üzlərinə vurmuşdu:

**وَمِنْهُمْ مَنْ يَقُولُ ائْذَنْ لِي وَلَا تَفْتِنِّي أَلَا فِي الْفِتْنَةِ سَقَطُوا وَإِنَّ جَهَنَّمَ لَمُحِيطَةٌ بِالْكَافِرِينَ**

*“Onlardan (münafiqlərdən): “Mənə (döyüşə getməməyə) izin ver, məni fitnəyə salma!”- deyənlər də var. Bilin ki, onlar (özləri) fitnəyə düşmüşlər. Şübhəsiz ki, Cəhənnəm kafirləri bürüyəcəkdir!”*[34]

Allah Rəsulu (s.ə.v) Məscidu’n-Nəbəvidə möminlərə xitab edərək Allah yolunda hərbi səfərə çıxan İslam ordusuna malları və canları ilə yardım etmələri üçün onları təşviq etmişdi. Allah Rəsulu (s.ə.v) “*kim bu gün (Təbük səfəri üçün) sədəqə versə, verdiyi sədəqə qiyamət günü Allahın hüzurunda onun lehinə şahidlik edəcəkdir*” deyərək möminləri təşviq etmişdi. Ömər ibn Xəttab (r.ə) Təbük səfəri üçün dörd min dirhəm bağışlayanda Allah Rəsulu (s.ə.v) ondan “*evində nə qaldı?*” deyə soruşmuş, Ömər (r.ə) də bu infaq etdiyinin sahib olduğu mal-dövlətin yarısı olduğunu bildirmişdi. Əbu Bəkr (r.ə) də orduya dörd min dirhəm bağışlamışdı. Eyni sualı Peyğəmbər (s.ə.v) ona da vermiş və Əbu Bəkr (r.ə) “*evimdə Allah və Rəsulunun sevgisi qaldı*” deyə cavab vermişdi. Əbu Bəkr (r.ə) sahib olduğu bütün mal varlığını Təbük səfəri üçün bağışlamışdı. Əbdürrəhman ibn Əvf (r.ə) də Təbük səfəri üçün orduya dörd min dirhəm bağışlamışdı. Osman ibn Əffan (r.ə) min dinar qızıl pul, üçyüz dəvə və yüz minik atını orduya bağışlayanda Allah Rəsulu (s.ə.v) sevimli kürəkəni üçün belə dua etmişdi: “*ey Allahım! Mən Osmandan (r.ə) razıyam, sən də ondan razı ol!*”. Bundan başqa Osman (r.ə) ordunun səfər vaxtı su təchizatı üçün də lazım olan bütün xərcləri çəkmişdi. Maddi vəziyyəti əlverişli olmayan müsəlmanlar da hər kəs əlindən nə gəlirsə Allah yolunda cihad üçün yola çıxmağa hazırlaşan orduya kömək etməkdə idilər. Kimi başındakı əmmaməsini, kimi bir dəst paltarını, kimi ərzaq, kimi bir səbət xurma, kimi bir dəvə, kimi də bir qoyun orduya bağışlamışdı. Kasıb müsəlman olan Əbu Uqeyl (r.ə) orduya verməyə bir şey tapmadığı üçün hərbi düşərgədəki əsgərlər və minik heyvanları üçün gecə-gündüz quyudan su çəkmişdi. O, bu əməyinə qarşılıq ona bağışlanan iki səbət xurmanın birini evinə, ailəsi üçün göndərmiş, digərini isə mücahidlərə paylamışdı. Uqbə ibn Zeyd (r.ə) adlı başqa bir kasıb səhabə isə orduya bağışlaya biləcəyi heç bir şeyinin olmamasından çox kədərlənərək səhərə

[34] Təbük səfərində münafiqlərin tutduqları mövqe ilə bağlı həmçinin bax: Qur’an, Tövbə surəsi, 78-87-ci ayələr.

qədər dua etmiş və səhər evindən götürdüyü bir qab yeməklə utanaraq Allah Rəsulunun (s.ə.v) hüzuruna gəlmişdi. Peyğəmbər (s.ə.v) onun hüznlü halına baxıb: "*Muhəmmədin (s.ə.v) varlığı əlində olan Allaha and olsun ki, sən Allahın nəzdində sədəqəsi qəbul olanların arasına yazıldın*" demişdi. Müsəlman qadınlar da qızıl və gümüş ziynət əşyalarını, üzük, sırğa, bilərzik, boyunbağılarını İslam ordusuna bağışlamışdılar.

Nifaq səbəbiylə deyil, fəqət sırf yavaş davranmaları və hazırlıqlarını vaxtında görüb qurtarmamaları səbəbiylə Təbük səfərindən geri qalmış möminlər də olmuşdu. Bunlar əshabdan üç nəfər idilər. Kə'b ibn Malik (r.ə), Hilal ibn Uməyyə (r.ə) və Minar ibn Rəbi' (r.ə) Təbük səfərində iştirak etməmiş, səfərbərlikdən geri qalmışdılar. Bu hallarından ötürü çox sıxılmış, Mədinə onlara dar gəlmişdi. Allah peşmanlıqlarından ötürü sıxıntı və üzüntüyə məruz qalmış bu möminlərin düçar olduqları kədəri Tövbə surəsi 118-ci ayəsində belə təsvir etmişdi:

**وَعَلَى الثَّلَاثَةِ الَّذِينَ خُلِّفُوا حَتَّى إِذَا ضَاقَتْ عَلَيْهِمُ الْأَرْضُ بِمَا رَحُبَتْ وَضَاقَتْ عَلَيْهِمْ أَنفُسُهُمْ وَظَنُّوا أَن لَّا مَلْجَأَ مِنَ ا ـِ إِلَّا إِلَيْهِ ثُمَّ تَابَ عَلَيْهِمْ لِيَتُوبُوا إِنَّ ا ـَ هُوَ التَّوَّابُ الرَّحِيمُ**

*"Həmçinin (Təbuk döyüşündən) geri qalmış üç nəfərin də (tövbələrini qəbul etdi). Belə ki, dünya onlara dar olmuş, ürəkləri (qəm-qüssədən) təngə gəlib sıxılmışdı. Onlar Allahdan (Allahın əzabından) yalnız Onun Özünə sığınmağın mümkün olduğunu başa düşdülər. Şübhəsiz ki, Allah tövbələri qəbul edəndir, rəhmlidir!"*

Əshabın əlindən gələn bütün yardımlarına baxmayaraq Təbük səfərinə çıxan İslam ordusunu tam təchiz etmək mümkün olmamışdı. Belə ki, səfərdə iştirak etmək üçün Səniyyətü'l-Vədaya gələn Salim ibn Umeyr (r.ə), Uqbə ibn Zeyd (r.ə), Əbu Leyla əl-Mazini[35] (r.ə), Sələmə ibn Səxr (r.ə), İrbad ibn əs-Səriyyə (r.ə), Abdullah ibn Muğəffəl əl-Muzəni (r.ə), Mə'qul ibn Yəsar (r.ə) adlı möminlər onlara veriləcək dəvə, at və ya qatır kimi minik tapılmadığı üçün səfərdə iştirak edə bilməmişdilər. Bu möminlərin əlindən səfərə çıxmaq üçün hazırlaşan ordunu gözü yaşlı seyr etməkdən başqa bir şey gəlməmişdi. Allah Tövbə surəsi 92-ci ayədə onlar haqqında belə buyurmuşdu:

**وَلَا عَلَى الَّذِينَ إِذَا مَا أَتَوْكَ لِتَحْمِلَهُمْ قُلْتَ لَا أَجِدُ مَا أَحْمِلُكُمْ عَلَيْهِ تَوَلَّوا وَّأَعْيُنُهُمْ تَفِيضُ مِنَ الدَّمْعِ حَزَنًا أَلَّا يَجِدُوا مَا يُنفِقُونَ**

*"(Döyüşə getməyə minikdən ötürü) yanına gəldikdə: "Sizin minməyiniz üçün bir heyvan tapmıram",- deyərkən (cihad yolunda) sərf etməyə bir şey*

[35] Bu səhabə tabiundan olan məşhur alim, İbn Əbi Leyla (693-765) adı ilə tanınan Əbu Əbdurrəhman Muhəmməd ibn Əbdurrəhmanın babası idi.

*tapa bilmədikləri üçün kədərdən gözlərindən yaş axa-axa geri dönənlərdə heç bir günah yoxdur!"*

Onların bu halı mömin qardaşlarını mütəəssir etmişdi. Onlardan ikisini İbn Yəmin (r.ə), ikisini Abbas ibn Əbdülmüttəlib (r.ə), üçünün isə Osman ibn Əffan (r.ə) miniklə təmin etmişdi.

Beləcə səfərbərlik tamamlanıb ordu yola çıxmağa hazır olanda Allah Rəsulu (s.ə.v) hicri 9-cu ilin rəcəb ayının ilk cümə axşamı günü (18 oktyabr 630) orduya hərəkət əmrini verdi. Allah Rəsulu (s.ə.v) səfərə çıxmamışdan əvvəl Əli ibn Əbu Talibi (r.ə) Mədinədə öz yerinə həm idari, həm dini işlər üçün vəkil təyin etdi. Lakin səfərdə iştirak etməyən münafiqlər "*görəsən Əli (r.ə) Muhəmmədin (s.ə.v) xoşlamadığı hansı işi tutub?*" deyərək fitnəkarlıq etməyə başladılar. Onların bu sözləri Əlinin (r.ə) ürəyini sıxmış və o, silahlanaraq ordunun ardınca yollanmışdı. Curf adlı yerdə orduya çatan Əli (r.ə) Peyğəmbərin (s.ə.v) yanına gedərək "*ey Allahın Elçisi (s.ə.v)! Məni qadınlar və uşaqların arasında vəkil qoyub gedirsən?*" demiş, Allah Rəsulu (s.ə.v) ona belə cavab vermişdi:

- *Sənin haqqında bu sözləri danışanlar yalan danışıblar. Mən səni arxamda qoyub getdiklərimin üzərində vəkil qoymuşam. Dərhal geri qayıt, mənim ev əhlimin və öz ev əhlinin başında vəkil ol. Sən mənim üçün Harunun (ə.s) Musa (ə.s) üçün olduğu kimi olmaq istəməzsənmi? Fəqət gerçək budur ki, məndən sonra peyğəmbər gəlməyəcək.*

Peyğəmbərin (s.ə.v) bu sözlərindən sonra Əli ibn Əbu Talib (r.ə) "*Allahın Elçisi (s.ə.v) doğru söylədi*" deyərək geri, Mədinəyə qayıtmışdı.

Ordunun öncü qüvvələrinə Xalid ibn Vəlid (r.ə), sağ cinaha Təlhə ibn Ubeydullah (r.ə), sol cinaha isə Əbdürrəhman ibn Əvf (r.ə) komandanlıq edirdi. 30 min nəfəlik ordu yarımadanın şimal-qərb istiqamətində irəliləyərkən 18 yerdə fasilə vermişdi. Hicr adlanan yerə çatanda Allah Rəsulu (s.ə.v) orduya bu yerdən sürətlə keçməyi və buradakı quyulardan su götürməməyi tapşırdı. Hicr Saleh (ə.s) peyğəmbərin qövmü Səmudun yurdu idi. Allah Saleh peyğəmbəri (ə.s) inkar edən bu qövmü məhv etmişdi. Hicrdən uzaqlaşandan sonra Allah Rəsulu (s.ə.v) orduya gecələmək üçün düşərgə salmaq əmri verdi. Həmin gecə çox şiddətli qum fırtınası qopmuşdu. Səhər açılanda ordu susuzluqdan əziyyət çəkməyə başlamışdı. Ordudakı münafiqlər "*əgər həqiqətən Allahın Elçisidirsə niyə Allah onun üçün göydən su endirmir?*" kimi sözlər danışmağa başlamışdılar. Peyğəmbər (s.ə.v) Əbu Bəkrin (r.ə) yağış yağması üçün dua etməsini istədi və özü də bu duada iştirak etdi. Dua sona çatandan bir qədər sonra səmanı buludlar örtmüşdü. Yağış yağmağa başlamış, insanlar və ordudakı minik, yük

heyvanları su ehtiyaclarını təmin etmişdilər. Bu hadisə müvəqqəti də olsa münafiqlərin fitnəkar səslərinin kəsilməsinə səbəb oldu.

İslam ordusu Şam diyarı ilə yarımada arasındakı hüdud hesab olunan, indiki Səudiyyə Ərəbistanının şimal-qərbində yerləşən Təbük adlı yerə çatanda dayanma əmri verildi. Bizans ordusunun hərəkəti buradan izlənəcək və lazımi cavab veriləcəkdi. İslam ordusu Təbükdə 21 gün qalmışdı. Bu müddət ərzində Bizans imperatoru Heraklın (610-641) Şam diyarında olduğu, fəqət cənub istiqamətinə hər hansı bir hərbi səfər üçün hazırlıq görülmədiyi, imperatorun daha çox Şam diyarının işlərini nizamlamaqla məşğul olduğu xəbərləri gəlmişdi. Bundan başqa Şamda taun xəstəliyinin yayıldığına dair xəbərlər də alınmışdı. Yoluxucu xəstəliyin tüğyan etdiyi bir vaxta Bizans ordusunun hərbi səfərə çıxacağı da ağlabatan deyildi. Allah Rəsulu (s.ə.v) Təbükdə qaldığı müddət ərzində bölgədəki Bizans vassalı xristian ərəb qəbilələrini itaət altına almaq üçün bəzi tədbirlər görmüşdü. O, Qırmızı dənizin şimal sahillərindəki, Əqəbə körfəzi civarında yerləşən Əylə hakimi Yuhanna ibn Ru'bəni hüzuruna çağıraraq onunla danışıq aparmış və əhdnamə bağlanmışdı. Əhdnaməyə görə Yuhannanın hakimiyyəti altında olanlar Mədinə İslam dövlətinin hakimiyyəti altında olan ərazilərdə, istər quruda, istərsə də Qırmızı dənizdə sərbəst hərəkət edə biləcəkdilər. Əylə Mədinə İslam dövlətinin himayəsi altında olacaq, onların tacirləri Hicazda sərbəst ticarətlə məşğul ola biləcəkdilər. Əylələlilərin din xadimlərinə, rahiblərinə heç bir şəkildə toxunulmayacaqdı. Daha sonra Əzruh və Cəbranın hakimləri ilə də bənzər məzmunlu əhdnamələr bağlanmışdı.

Yuxarıdan məlumat verdiyimiz kimi Dumətü'l-Cəndəlin xristian hakimi Uqeydir ibn Əbdülməlik əl-Kindinin üzərinə hicri 5-ci ilin rəbiələvvəl ayında (avqust 626) səfər gerçəkləşdirilmiş, lakin istənilən nəticə alınmamışdı. Dumətü'l-Cəndəl Təbükdən şərqdə yerləşirdi. Bu dəfə Xalid ibn Vəlidin (r.ə) əmrindəki süvarilər Uqeydir ibn Əbdülməliki qardaşı ilə birlikdə qaban ovlayarkən yaxalayıb Allah Rəsulunun (s.ə.v) yanına gətirmişdilər. Peyğəmbər (s.ə.v) Uqeydirlə əsir kimi deyil, qonaq kimi rəftar etmiş, ona hörmət göstərmişdi. Uqeydir ibn Əbdülməlik əndişəsinin yersiz olduğunu görüb Allah Rəsulu (s.ə.v) ilə razılaşmış və onunla da bir əhdnamə bağlanmışdı. Allah Rəsulu (s.ə.v) Uqeydirə qiymətli hədiyyələr bağışlayaraq öz yurduna göndərmişdi. Təbükdəki bu hərbi-siyasi tədbirlərlə Mədinə İslam dövlətinin şimal sərhədlərinin təhlükəsizliyi təmin edilmiş və ordu geri qayıtmaq üçün yola çıxmışdı.

Ordu geri qayıdarkən Mədinə yaxınlığındakı, səfərbərlik üçün toplandığı yerdə, Səniyyətü'l-Vədada düşərgə salmışdı. Allah Rəsulunun (s.ə.v) izni ilə Mədinə xaricindən gələn mücahidlər tərxis olunaraq yurdlarına qayıtmışdılar.

Allah Rəsulu (s.ə.v) əshabı ilə Mədinəyə daxil olanda əvvəlcə Məscidu’n-Nəbəviyə gedib iki rəkat namaz qılmış, sonra məsciddə onun yanına gələnləri qəbul etmişdi.

Müsəlmanlar Təbük səfəri üçün hazırlıq görərkən Mədinə ətrafında məskun olan bəzi münafiqlər Quba məscidi onlara uzaq olduğu üçün oraya namaza getməkdə çətinlik çəkdiklərini bəhanə edərək Bəni-Salim ibn Əvf oymağının yurdunda bir məscid inşa etmişdilər. Onlar Allah Rəsulundan (s.ə.v) öz əshabı ilə bu məscidə gəlib buradakı camaata namaz qıldırmasını xahiş etmişdilər. Peyğəmbər (s.ə.v) səfərbərlik səbəbiylə bunu səfərdən sonra edə biləcəyini bildirmişdi. Əslində isə münafiqlər bu məscidi, yuxarıda haqqında məlumat verdiyimiz, azğın İslam düşməni Əbu Amir əl-Fasiq və onun dayısı oğlu, münafiqlərin lideri Abdullah ibn Ubeyy ibn Səlulun təşviqi ilə inşa etmişdilər. Əsl məqsədləri rahat toplaşa biləcəkləri bir məkana sahib olmaq, Quba məscidinin camaatını ikiyə bölmək, öz məscidlərinə cəlb edəcəkləri möminlərin zehninə şübhə salıb öz tərəflərinə çəkmək idi. Məkkənin fəthindən sonra qaçıb Şam diyarına getmiş Əbu Amir əl-Fasiq münafiqləri inandırmışdı ki, əgər onlar Muhəmmədi (s.ə.v) və əshabından ona ən çox yardım edənləri öldürə bilsələr o, Bizans ordularını gətirib Mədinə və Məkkədə İslamın varlığına birdəfəlik son qoyacaq. Bu məqsədlə münafiqlər inşa etdikləri məsciddə silah-sursat gizlətmişdilər. Allah Rəsulu (s.ə.v) əshabı ilə həmin məscidə gəlib namaz qılacağı vaxt münafiqlər gizlətdikləri silahlarla onlara hücum edib qətlə yetirməyi planlaşdırmışdılar. Allah Rəsulu (s.ə.v) Təbük səfərindən qayıdan kimi münafiqlər Bəni-Salim yurdunda inşa etdikləri məsciddə namaz qıldırması üçün onu yenidən dəvət etdilər. Allah Rəsulu (s.ə.v) onların dəvətini qəbul edib yola çıxmaq istəyərkən Allah Qur’anın Tövbə surəsi 107-108-ci ayələrini nazil edərək münafiqlərin əsl məqsədlərindən Peyğəmbəri (s.ə.v) xəbərdar etmişdi.

**وَالذِينَ اتخَذُواْ مَسْجِدًا ضِرَارًا وَكُفْرًا وَتَفْرِيقًا بَيْنَ ٱلْمُؤْمِنِ َ وَإِرْصَادًا لمَنْ حَارَبَ ا وَرَسُولَهُ مِن قَبْلُ وَلَيَحْلِفَن إِنْ أَرَدْنَا إِلا ٱلْحُسْنَى وَا يَشْهَدُ إِنهُمْ لَكَاذِبُون. لاَ تَقُمْ فِيهِ أَبَدًا لمَسْجِدٌ أُسسَ عَلَى التقْوَى مِنْ أَولِ يَوْمٍ أَحَق أَن تَقُومَ فِيهِ فِيهِ رِجَالٌ يُحِبونَ أَن يَتَطَهرُواْ وَا يُحِب ٱلْمُطهرِين.**

*“(Quba məscidinə və müsəlmanlara) zərər vurmaq, küfr etmək, möminlər arasına təfriqə salmaq məqsədilə, əvvəllər Allaha və Onun Peyğəmbərinə qarşı müharibə edən kimsədən göz-qulaq olmaq üçün məscid düzəldən və: “Biz bununla yaxşılıqdan başqa bir şey istəmədik”,- deyə and içən münafiqlərin həqiqətən, yalançı olmaları barədə Allah Özü şahidlik edəcəkdir! (Ey Rəsulum!) Orada heç vaxt namaz qılma. İlk gündən binası təqva üzərində qurulmuş məscid*

*namaz qılmağına daha layiqdir. Orada paklanmağı sevən insanlar vardır. Allah pak olanları sevər!*"

Allah münafiqlərin inşa etdikləri bu məscidi "*dirar*", yəni "zərər vuran" adlandırmışdı. Bu vəhyin bitməsindən sonra Allah Rəsulu (s.ə.v) Məscidu'd-Dirara getmək fikrindən daşındı. Əshabından Malik ibn əd-Duxşəm əl-Əvsi (r.ə) və Mə'ən ibn Ədiyy əl-Bələvini (r.ə) oraya göndərib Dirar məscidini yandırmağı və divarlarını uçurmağı əmr etdi. Malik (r.ə) və Mə'ən (r.ə) Dirar məscidini oda verib yandırmış, sonra da yıxmışdılar. Beləliklə münafiqlərin möminlərin məscidlərinə alternativ olaraq məscid inşa etmələrinin qarşısı alınmışdı.

Təbük səfərindən qayıdandan bir müddət sonra Allah Rəsulunun (s.ə.v) qızı, Osman ibn Əffanın (r.ə) xanımı Umm Kulsum (r.ə) vəfat etmişdi. Peyğəmbərin (s.ə.v) bibisi Safiyyə (r.ə), Umm Ətiyyə (r.ə) və Əsma bint Umeys (r.ə) cənazəni yuyub kəfənləmişdilər. Umm Kulsumun (r.ə) cənazəsini məzara Əli (r.ə), Fəzl ibn Abbas (r.ə), Usamə ibn Zeyd (r.ə) və Təlhə ibn Ubeydullah (r.ə) qoymuşdular. Xanımının vəfatına çox kədərlənən Osman (r.ə) onun məzarı başında göz yaşı axıtmışdı.

Bundan bir müddət sonra isə Allah Rəsulun (s.ə.v) oğlu İbrahim vəfat etmişdi. İbrahimi hicri 8-ci ilin zilhiccə ayında (mart-aprel 630) misirli cariyə Mariya dünyaya gətirmişdi. İbrahim vəfat edərkən 18 aylıq idi. Allah Rəsulu (s.ə.v) bu kiçik oğlunu çox sevirdi. O, dəfn edilərkən Peyğəmbər (s.ə.v) qəbrinin başında göz yaşı axıtmışdı. Allah Rəsulunun (s.ə.v) ölülər üçün yas tutarkən ifrata varmağı qadağan etdiyini bilən səhabə buna təccüblənəndə Peyğəmbər (s.ə.v) onalara "*mən sizə qışqırıb-bağıraraq, yaxa cıraraq ağlamağı qadağan etmişəm. Bu isə Allahın öz qullarının qəlbinə qoyduğu şəfqətdəndir. Ürək yanar, gözlər yaş axıdar. Biz Rəbbimizin rizasına zidd olan söz söyləmərik*" demişdi. İbrahim, Allah Rəsulunun (s.ə.v) yeddinci övladı idi. Digər altı övladının anası Xədicə (r.ə) idi. Bundan əvvəl də Qasım və Abdullah adlı iki oğlu olmuş, hər ikisi azyaşlı ikən vəfat etmişdilər.

## Məkkənin Fəthindən Sonrakı Dövrdə Baş Vermiş Hadisələr

*Bizansla Münasibətlər*

Hudeybiyyə sülh müqaviləsinin bağlanmasından bir müddət sonra Allah Rəsulu (s.ə.v) qonşu ölkələrin hökmdarlarına, eyni zamanda onların vassalı olan qəbilə rəisləri və hakimlərə məktublar göndərərək onları İslama dəvət etmişdi. Belə məktublardan biri də Bizans imperatoru Herakla (610-641) yaz-

dırmışdı. Allah Rəsulunun (s.ə.v) Bizans imperatoruna göndərdiyi məktubun mətni belə idi:

*"Rəhman və Rəhim olan Allahın adı ilə*

*Allahın qulu və elçisi Muhəmməddən (s.ə.v) Rum qeysəri Herakla!*

*Allahın salamı hidayət yolunda olanların üzərinə olsun. Bu səbəblə mən sənə tam bir İslami dəvətlə səslənirəm. İslamı qəbul et, nəticədə axirətdə əmin-amanlıq və salamatlıq içində olarsan və Allah sənə bunun əcrini iki dəfə verəcəkdir. Əgər sən İslamı qəbul etməkdən boyun qaçırsan təbəənin günahı da sənin boynuna olacaqdır.*

*- "Ey kitab əhli, sizinlə bizim aramızda eyni olan (fərqi olmayan) bir kəlməyə tərəf gəlin! (O kəlmə budur:) "Allahdan başqasına ibadət etməyək. Ona şərik qoşmayaq və Allahı qoyub bir-birimizi (özümüzə) Rəbb qəbul etməyək!" Əgər onlar yenə də üz döndərərlərsə, o zaman (onlara) deyin: "İndi şahid olun ki, biz, həqiqətən, müsəlmanlarıq (Allaha təslim olanlarıq)!* (Ali-İmran surəsi, 64)*".*

*Allahın Elçisi Muhəmməd (s.ə.v)*

Peyğəmbərin (s.ə.v) səfiri olaraq imperatorun hüzuruna gedən Dihyə ibn Xəlifə əl-Kəlbi (r.ə) bu məktubu Herakl Suriya torpaqlarında ikən ona çatdırmışdı.

Təbük səfəri vaxtı Allah Rəsulu (s.ə.v) Qüdsdə olan imperator Herakla ikinci dəfə məktub göndərmişdi. Bu məktubunda da Peyğəmbər (s.ə.v) imperatoru İslama dəvət etmiş və İslamı qəbul edənlərə, eyni zamanda öz torpaqlarına ticarət səfəri edən müsəlmanlara təzyiq göstərilməməsini tələb etmişdi. İmperator, Allah Rəsulunun (s.ə.v) elçisini qəbul edib onun dinini qəbul edənlərə qarşı heç bir düşmənçiliyinin olmadığını bildirmiş və hədiyyə olaraq Peyğəmbərə (s.ə.v) çatdırması üçün elçiyə 1000 dinar qızıl pul vermişdi. Allah Rəsulu (s.ə.v) bu min dinarı hədiyyə deyil, cizyə olaraq qəbul etdiyi üçün məbləğin mücahidlər arasında paylanmasını əmr etmişdi.

*Sasanilərlə Münasibətlər*

Sasani imperiyasının ərəb yarımadası üzərindəki təsiri Bizansa nisbətən daha böyük idi. Belə ki, yarımadanın şimal-şərqi, şərqi və cənubu Sasani orduları tərəfindən zəbt edilmişdi. Bu ərazilər uzun müddət iranlıların hakimiyyəti altında qalmışdı. Hudeybiyyə sülhündən sonra Allah Rəsulunun (s.ə.v) elçisi Abdullah ibn Huzafə əs-Səhmi (r.ə) Sasani hökmdarı II Xosrov Pərvizin (590-628) hüzuruna gedərək Peyğəmbərin (s.ə.v) ona göndərdiyi məktubu təqdim etmişdi. Məktubun mətni belə idi:

*“Rəhman və Rəhim olan Allahın adı ilə*

*Allahın Elçisi Muhəmməddən (s.ə.v) iranlıların başçısı Kəsraya.*

*Hidayət yoluna tabe olana, Allaha, onun qulu və elçisinə iman edənə, Allahdan başqa ilah olmadığını, onun tək və şəriksiz olduğunu, Muhəmmədin onun qulu və elçisi olduğunu qəbul və təsdiq edənə salam olsun. Bu səbəblə mən sənə tam bir İslami dəvətlə səslənirəm. Çünki mən kimliyindən aslı olmayaraq hər can sahibini xəbərdar etmək və inanmayanlar üzərində Allahın və'dini gerçəkləşdirmək üçün istisnasız bütün insanlara göndərilmiş Allahın Elçisiyəm. Elə isə sən də İslama gəl ki, axirətin əmin-amanlıq və salamatlıq içində olsun. Əgər sən bu dəvətdən boyun qaçırsan bil ki, şübhəsiz bütün məcusilərin günahı sənin boynunda olacaqdır*”.

Tərcüməçi məktubun müraciət qismini oxuyan kimi II Xosrov Pərviz ardını dinləmədən onu dayandırdı. Təkəbbürlü və özündən razı şah ona “*iranlıların başçısı Kəsra*” şəklindəki müraciəti bəyənməmiş, bunu öz “şanına” sığışdırmamışdı. Çünki o, özünü şahənşah, yəni şahların şahı adlandırırdı və məcusilər ona belə müraciət edirdilər. Buna görə də qəzəblə məktubu almış və yırtıb parçalayandan sonra isə Abdullah ibn Huzeyfəni (r.ə) hüzurundan qovmuşdu. Abdullah ibn Huzeyfə (r.ə) gördüklərini və eşitdiklərini olduğu kimi Allah Rəsuluna (s.ə.v) çatdıranda o, “*Allah da onun səltənətini parça-parça etsin*” demişdi. Bu hadisədən iki il sonra II Qubad (628-630) atası II Xosrovu xəncərlə doğrayaraq öldürmüş və Sasani taxtına oturmuşdu. Bir neçə il sonra isə Sasani imperiyası xilafət ordularının həmlələriylə parçalanıb dağılmışdı.

II Xosrov özünə belə məzmunda bir məktubun yazılmasına o qədər qəzəblənmişdi ki, Yəməndəki Sasani canişini Bazana məktub göndərərək Mədinəyə silahlı dəstə göndərib Muhəmmədi (s.ə.v) ölü və ya diri hüzuruna göndərməsini əmr etmişdi. Lakin Sasanilərin yəmən canişini Bazan (r.ə) bu vaxt Allah Rəsulunun (s.ə.v) İslama dəvətini qəbul edib müsəlman olmuşdu.

Allah Rəsulu (s.ə.v) eyni məzmunlu məktubla misirli Muqavqısı[36] da İslama dəvət etmişdi. Misir hökmdarı cavab məktubunda nəzakətli bir üslubla İslamı qəbul etmək istəmədiyini bildirmiş, lakin hörmət əlaməti olaraq Peyğəmbərə (s.ə.v) müxtəlif hədiyyələr göndərmişdi. Bu hədiyyələrin arasında Mariya və Şirin adlı iki cariyə də var idi.

---

[36] Müsəlman salnaməçilərin əsərlərində adı “Muqavqıs” olaraq qeyd edilən bu şəxs 630-631 və 642-644-cü illərdə İsgəndəriyyə və bütün Misirin patriarxı olmuş Kirdir (Cyrus of Alexandria). O, həm də Bizansın Misirdəki son canişini idi. Onun öldüyü il Misir xilafət orduları tərəfindən fəth olunmuşdu. Bizansa imperatorunun vassalı olsa da patriarx Kir Bizans kilsəsinin rəsmi məzhəbi olan pravoslavlığa deyil mofilitliyə sitayiş edirdi.

Bəhreyn IV əsrdən bəri Sasanilərin hakimiyyəti altında idi və burada zərdüştilik yayılmışdı. Bundan başqa Bəhreyndə bütpərəst ərəblər və yəhudilər də yaşayırdılar. Allah Rəsulu (s.ə.v) Ə'la ibn Hədrəmini (r.ə) məktubla Bəhreyn hakimi Munzir ibn Savə ət-Təmiminin yanına göndərmişdi. Munzir ibn Savə ət-Təmimi Allah Rəsulunun (s.ə.v) elçisini hörmətlə qəbul etmiş və Peyğəmbərə (s.ə.v) xoş sözlərlə dolu cavab məktubu yazmışdı. Allah Rəsulu (s.ə.v) ilə Munzir ibn Savə arasında yazışmalar davam etmiş və Munzir bir müddət sonra İslamı qəbul etmişdi.

*Yarımadadakı Ərəb Qəbilələri İlə Münasibətlər*

Həvazin qəbiləsinin rəisi Malik ibn Əvf (r.ə) İslamı qəbul edəndən sonra Allah Rəsulunun (s.ə.v) izni ilə daim Taif şəhərinə və səqiflilərə təzyiq göstərir, tez-tez onlara basqın edirdi. Malik ibn Əvf ən-Nasrinin (r.ə) basqınları, ətraf qəbilələrin böyük əksəriyyətinin İslamı qəbul etməsi, Allah Rəsulunun (s.ə.v) 30 minlik ordu toplaya biləcək gücü əldə etmiş olması Səqif qəbiləsinin liderlərini qorxutmuşdu. Onlar bir gün Taifin də Məkkə kimi fəth ediləcəyini bilirdilər. Buna görə də nüfuzlu şəxslərindən ibarət altı nəfərlik heyət təşkil edib hicri 9-cu ilin ramazan ayında (10 dekabr 630-09 yanvar 631) Mədinəyə, Allah Rəsulu (s.ə.v) ilə görüşməyə göndərmək qərarına gəlmişdilər. Səqifin elçi heyətinin Mədinə yaxınlığında olması xəbəri Allah Rəsulunu (s.ə.v) məmnun etmişdi. O, səqifli elçiləri hörmətlə qarşılayıb Mədinədə qonaq etdi və bir neçə gün onlarla görüşüb söhbət etdi. Bu söhbətləri vaxtı onlara İslamı anlatır, şirkdən və cəhalətdən çəkindirir, müsəlman olmağa çağırırdı. Səqifli elçilər İslamı qəbul etməkdən imtina etmədikləri bildirsələr də bəzi şərtlər irəli sürmüşdülər. Onlar səqiflilərin səfərbərliyə cəlb edilməməsi, ticarət mallarından uşr (1/10) vergisi ödəməməyi, səqifli olmayan birinin canişin təyin edilməməsi və namaz qılmalarının vacib olmaması şərtlərini irəli sürmüşdülər. Allah Rəsulu (s.ə.v) onlardan onda bir vergisinin alınmayacağı və səqifli olmayan birinin Taifə canişin təyin edilməyəcəyi şərtini qəbul etmişdi. Səqiflilərdən müsəlman olanların hərbi səfərbərlikdə iştirak edib etməməkdə sərbəst olduqlarını bildirmişdi. Lakin "*namaz qılmayanın İslamda payı yoxdur*" deyərək namazın vacib şərt olduğunu təkidlə vurğulamışdı. Daha sonra səqifli elçilərə zinanın, faizin və sərxoşluq verən içkilərin içilməsinin də qadağan olduğunu bildirmişdi. Səqiflilər zinanın yayğın olduğunu, sərvətlərinin mənbəyinin faiz olduğunu, içki içilməsinin qarşısının alınmasının isə çətin olduğunu bildirsələr də Allah Rəsulu (s.ə.v) İslamı qəbul edəndən sonra onların Allahın əmrlərinə itaət etməyə məcbur olduqlarını bəyan etmişdi. Səqifli elçilər bu haramları və qadağaları Səqif

qəbiləsindən İslamı mənimsəyənlərin sayı artıqca tətbiq etmənin daha asan olacağını bildirmişdilər. Lakin ən əsas bir məsələ ortaya çıxmışdı. Bütün yarımada müşriklərinin sitayişdə qüsur göstərmədikləri, səqiflilərin "Rəbbə" adlandırdıqları, məşhur Lat bütü və məbədi Səqif qəbiləsinin yurdunda idi. Elçi heyəti Lat bütünə toxunulmamasını xahiş etsə də Allah Rəsulu (s.ə.v) onların Latı dərhal yıxmalı olduqlarını bildirdi. Onlar bir neçə il Lata toxunulmamsını xahiş etsələr də Allah Rəsulu (s.ə.v) Lat məbədinin və bütünün hər hansı bir güzəştsiz dərhal yıxılmalı olduğunu təkidlə bəyan etmişdi. Səqifli elçilər Latın yıxılmasının səqifli müşrikləri qəzəbləndirəcəyini, bu işi onların görməsinin mümkün olmadığını bildirmişdilər. Onlar bütün dağıldılması işini Allah Rəsulunun (s.ə.v) öz üstünə götürməsini istəmişdilər. Allah Rəsulu (s.ə.v) bu işi Əbu Süfyan ibn Hərb (r.ə) və Muğirə ibn Şu'bəyə (r.ə) tapşırmışdı. Səqif elçiləri İslamı və Qur'anı öyrənmək üçün bir müddət Mədinədə qalmışdılar. Onlardan ən gənci Əbu Abdullah Osman ibn Əbül-As əs-Səqəfi (r.ə) Qur'anın mühüm bir hissəsini əzbərləmiş və İslam fiqhini dərindən öyrənmişdi. Səqifli elçilərin Taifə qayıtmasından 2-3 gün sonra Əbu Süfyan (r.ə), Muğirə ibn Şu'bə (r.ə) və Xalid ibn Vəlid (r.ə) də 20 nəfər müsəlmanla birlikdə Taifə gəlmişdilər. Onların gəliş məqsədi məlum idi, Lat bütün yıxmaq üçün gəlmişdilər. Muğirə (r.ə) onunla birlikdə gəlmiş müsəlmanlara "*vallahi, bu gün səqiflilərin üzünü güldürəcəm*" deyərək əlinə külüng alıb Latın təpəsinə çıxdı. Səqifli müşriklər, qadınlı kişili böyük bir kədərlə orada toplanmışdılar. Muğirə (r.ə) külüngü qaldırıb Lata ilk zərbəni vurandan sonra dayandı, onu bir titrəmə tutdu, sonra arxası üstə yıxılıb qaldı. Səqifli müşriklər sevinib şadlanmağa və Latın Muğirəni (r.ə) cəzalandıraraq məhv etdiyini söyləməyə başladılar. Lakin Muğirə ibn Şu'bənin (r.ə) gülümsəyərək ayağa qalxması ilə gülüşləri üzlərində donub qaldı. Muğirə (r.ə) onlara belə müraciət etdi:

- *Ey Səqiflilər! Deyirdilər ki, siz ərəblərin arasında ən ağıllı, ən zəkalı qövmsünüz. Məgər ki, ərəblər arasında sizdən daha axmaq qəbilə yoxmuş. Uzza, Mənat və Lat da digər daşlar, kərpiclər kimi daş və kərpicdirlər. Onlar kimin onlara sitayiş etdiyinin fərqində belə deyillər. Vay olsun sizin bu halınıza. Lat heç eşidirmi, görürmü? Onun kimə isə bir faydası və ya zərəri toxunurmu? Allahdan əvf diləyin və onun lütfünə pənah aparıb sadəcə ona ibadət edin.*

Sonra isə oradakı digər müsəlmanlarla birlikdə ağ rəngli qaya paçasından yonulmuş Lat bütünü külüng və baltalarla parça-parça etdilər, dibinə qədər yıxıb dağıltdılar. Lat bütünün dibində kəbkəb adlanan bir xəzinəyə rast gəldilər. Səqiflilər illər boyu Lata bağışladıqları qızıl və gümüş sədəqələri kəbkəbə atıb doldurmuşdular. Müsəlmanlar kəbkəbdəki qızıl və gümüş əşyaları toplayıb

Mədinəyə gətirmiş, Latın xəzinəsi burada ehtiyacı olan müsəlmanlara paylanmışdı. Peyğəmbər (s.ə.v) Osman ibn Əbül-Ası (r.ə) əvvəlcə Taifdəki müsəlman camaata imam, sonra isə Taif şəhərinə və Səqif qəbiləsinə vali təyin etmişdi.

Təbük səfərindən bir müddət sonra Fəzarə, Uqeyl, Murrə, Dar, Zur'a, Hədəs, Raşidə, Kəlb, Kilab, Ruas, Bəkkə, Tucib, Quşeyr, Hilal, Təğlib, Bəhrə, Zuheyr, Bəkr ibn Vail kimi ərəb yarımadasının müxtəlif yerlərində yaşayan qəbilə və oymaqlar öz təmsilçilərini Mədinəyə, Allah Rəsulunun (s.ə.v) yanına göndərək İslamı qəbul etdiklərini bildirmiş və əhdnamələr bağlamışdılar. Allah Rəsulu (s.ə.v) bu qəbilələrin hər birinə onlara İslamı öyrətmələri üçün dəvətçilər, müəllimlər və mübəlliğlər göndərmişdi.

Hicri 9-cu ilin şəvval ayında (09 yanvar 631-08 fevral 631) münafiqlərin lideri Abdullah ibn Ubeyy ibn Səlul ağır xəstəliyə tutulmuş və xəstəliyi üç həftə davam etmişdi. Allah Rəsulu (s.ə.v) onu xəstə yatağında ziyarət etmişdi. Nəhayət Abdullah ibn Ubeyy bu xəstəlikdən qurtuluş olmadığını anlayanda Allah Rəsuluna (s.ə.v) xəbər göndərərək çağırmış və Peyğəmbər (s.ə.v) onun yanına getmişdi. Allah Rəsulu (s.ə.v) onun üzünə ölümün kölgəsinin qonduğunu görəndə belə dedi:

- *Vallahi, ey İbn Ubeyy! Mən sənə dəfələrlə bu yəhudilərdən uzaq dur dedim. And olsun ki, yəhudilərə olan sevgin səni məhv etdi.*

- *Ya Rəsulallah! İndi qınama və danlama vaxtı deyil. İndi canın boğaza dirəndiyi vaxtdır. Səni məni qınaman üçün deyil, Allahdan mənimçün əvf diləyəsən deyə çağırdım. Mən öləndən sonra məni yusunlar, tapşır ki, məni sənin köynəyinlə kəfənləsinlər. Mənim cənazə namazımı qıldır və mənimçün Allaha dua et.*

Həmin gecə Abdullah ibn Ubeyy ölmüş və onun müsəlman olan oğlu Abdullah (r.ə) gəlib Peyğəmbərə (s.ə.v) atasının öldüyü xəbərini çatdırmışdı. Peyğəmbər (s.ə.v) onun istədiyi kimi öz köynəyini kəfənləmək üçün vermişdi. Abdullah ibn Ubeyyin cənazə namazını qılmaq istəyəndə isə Ömər ibn Xəttab (r.ə) Peyğəmbərə (s.ə.v) yaxınlaşıb münafiqlərin liderinin müsəlmanlara etdiyi düşmənçilik və pislikləri bir-bir, günü ilə saydı. O, bütün olanları bir-bir söyləyərkən Allah Rəsulu (s.ə.v) gülümsəyərək onu dinləyirdi. Sözünün sonunda Ömər (r.ə) "*ey Allahın Elçisi (s.ə.v) bütün bunlardan sonra sən Abdullah ibn Ubeyyin cənazəsinin üzərində namaz qılacaqsanmı? Bu sənin nəyinə lazımdır?*" deyə soruşmuşdu. Ömərin (r.ə) bu sualına Allah Rəsulu (s.ə.v) belə cavab vermişdi:

- *Ey Ömər! Allah mənə ikisindən birini seçməyim üçün ixtiyar verdi və buyurdu "(Ey Rəsulum!) Onlar (o münafiqlər) üçün istər bağışlanma dilə, istər*

*diləmə; onlar üçün yetmiş dəfə bağışlanma diləsən də, yenə Allah onları bağışlamayacaq. Bu onların Allahı və Onun Peyğəmbərini inkar etmələrinə görədir. Allah fasiq tayfanı doğru yola yönəltməz!* (Tövbə surəsi 90)*"*

Bir müddət sonra Allah Rəsulunun (s.ə.v) bu münafiqbaşının cənazə namazını qıldırması və onun vəsiyyətini yerinə yetirib öz köynəyilə kəfənlənməsinə izn verməsinin hikməti üzə çıxmışdı. Peyğəmbərin (s.ə.v) bu qədər açıq və gizli düşmənçiliyinə rəğmən Abdullah ibn Ubeyyin xahişini yerə salmaması onun mənsub olduğu Xəzrəc qəbiləsindən bir çox müşrikin səmimiyyətlə İslamı qəbul etməsinə səbəb olmuşdu.

*Yarımadadakı Xristian Qəbilələrlə Münasibətlər*

Ərəb yarımadasındakı ən böyük xristian icması Nəcranda idi. Nəcran Məkkə ilə Yəmən arasında, yarımadanın cənub-qərbində yerləşirdi. Buradakı xristian ərəblər Qəhtanilərdən idilər və  70-dən çox yaşayış məntəqələri var idi. Təbük səfərindən sonra Allah Rəsulu (s.ə.v) Nəcran xristianlarının başçısına məktub yazmışdı. Məktubda deyilirdi:

*"Bismillah!*

*Allahın Elçisi Muhəmməddən (s.ə.v) Nəcran usqufuna (yepiskopuna)! Sözümə İbrahimin (ə.s), İsmayılın (ə.s), İshaqın (ə.s) və Yaqubun (ə.s) Rəbbi olan Allahın adı ilə başlayıram. Mən sizi qullara (insanlara) qulluq etməkdən Allaha qulluq etməyə, qulların (insanların) dostluğundan Allahın dostluğuna dəvət edirəm. Əgər İslama dəvətimi qəbul etməsəniz cizyə ödəməyi qəbul edəcəksiniz. Əgər hər ikisini rədd etsəniz sizə hərb elan edəcəyimdən xəbəriniz olsun. Vəssalam!"*

Məktubu oxuyan yepiskopun canına qorxu düşmüş və o, nəcranlıların liderləri ilə məsləhətləşmək qərarına gəlmişdi. Onlar uzun müzakirədən sonra nümayəndə heyəti təşkil edib Mədinəyə göndərmək qərarına gəlmişdilər. Nərcanlıların Mədinəyə göndərdikləri heyət 60 nəfərdən ibarət olmuşdu. Onlar Mədinə yaxınlığına gəlib çatanda səfər paltarlarını çıxardılar. İpək parçadan tikilmiş, uzun ətəkli, rəngarəng paltarlarını geyib qızıl bəzək əşyalarını taxdılar və paltarlarının ətəyini yərdə sürüyərək əsr namazı vaxtı Məscidu'n-Nəbəviyə gəldilər. Peyğəmbərin (s.ə.v) qarşısında dayanıb ona salam verdilər. Lakin Allah Rəsulu (s.ə.v) onların salamını almadı və onlarla heç bir şey danışmadı. Onlar məsciddən çıxıb hələ İslamdan əvvəl Qüreyşin zəngin tacirlərindən olaraq tanıdıqları Osman ibn Əffan (r.ə) və Əbdürrəhman ibn Əvflə (r.ə) görüşdülər. Peyğəmbərin (s.ə.v) onlara göndərdiyi məktub haqqında danışdılar, bu səbəblə

Mədinəyə gəldiklərini və indi Peyğəmbərin (s.ə.v) onlarla danışmamasına, salamlarını almamasına bir məna verə bilmədikləri dedilər. Osman (r.ə) Əli ibn Əbu Talibdən (r.ə) "*ey Əbəl-Həsən! Sən bu haqda nə düşünürsən?*" deyə soruşanda Əli (r.ə) belə cavab vermişdi:

- *Məncə onlar bu dəbdəbəli paltarlarını dəyişsinlər. Səfərdə ikən geydikləri paltarları geyib sonra Allah Rəsulu (s.ə.v) ilə görüşsünlər!*

Nəcranlı elçilər səhəri gün Əlinin (r.ə) dediyi kimi səfər paltarlarını geyinərək Məscidu'n-Nəbəviyə gəldilər və Allah Rəsuluna (s.ə.v) salam verdilər. Bu dəfə Peyğəmbər (s.ə.v) onların salamını aldı və onlarla söhbətə başlayıb nəcranlıları İslama dəvət etdi. Onunla əsasən hey'ətdəki xristian din alimləri, Aqib və Zu-Rayhəm adlı iki rahib danışırdı. Allah Rəsulu (s.ə.v) ilə onlar arasında belə bir dialoq olmuşdu:

- *Allaha təslim (müsəlman) olun!*

- *Biz əvvəldən bəri Allaha təslim (müsəlman) olmaqdayıq!*

- *Siz yalan danşırsınız. Əgər istəyirsinizsə müsəlman olmağınıza mane olan şeyləri sizə deyə bilərəm.*

- *Buyur, de.*

- *Allahın oğlu olduğunu söyləməniz, donuz əti yeməniz və içki içməniz sizin İslamı qəbul etməyinizə mane olur.*

- *Xeyr, biz deyirik ki, Allah bütün etdiklərini tək etsəydi "yaratdıq, etdik, göndərdik, əzab etdik" deməzdi. Demək ki, Allah həqiqətən üçün üçüncüsüdür. İsa (ə.s) Allahın özündən qeyrisi deyildir. Çünki onun bilinən bir atası olmamışdır. Atasız isə uşağın dünyaya gəlməsi mümkün deyil. O, qeybdən xəbər verir, xəstələri sağaldır, ölmüş quşa nəfəsi ilə həyat verirdi. İsa (ə.s) beşikdə bir çağa ikən dil açıb danışmışdı, ondan əvvəl bunu heç kim etməmişdir. Müqəddəs Ruhla İsa (ə.s) Allahdan başqası da deyildirlər, onun eynisi də deyildirlər. Bu üçlü birlik birdir, bir bütündür.*

- *İsa (ə.s) sadəcə Allahın qulu və rəsuludur.*

- *Ey Muhəmməd (s.ə.v)! Sən İsaya "qul" deməklə onu təhqir edirsən.*

- *Bəli, İsa (ə.s) Allahın quludur, Məryəmin oğludur və Allah onu Məryəmə ilqa etmişdir.*

Allah Rəsulunun (s.ə.v) bu sözləri nəcranlı rahiblərin hiddətinə səbəb olmuşdu. Onlar təkidlə deyirdilər:

- *Sən bununla İsanı (ə.s) alçaldırsan. İsa (ə.s) Allahın özündən başqası deyildir.*

- *Siz bunu qəbul edirsinizmi ki, hər bir oğul az və ya çox dərəcədə sima olaraq öz atasına oxşayır?*

- *Bəli, qəbul edirik.*

- *Siz İsanın (ə.s) fani, Allahın isə baqi olduğunu qəbul edirsinizmi?*

- *Bəli, qəbul edirik.*

- *Siz Rəbbimizin öz zatı ilə qaim olduğunu, hər şeyi qoruduğunu və ruziləndirdiyini qəbul edirsinizmi?*

- *Bəli, qəbul edirik.*

- *İsa (ə.s) bu sadaladıqlarımdan hər hansı birinə sahib idimi?*

- *Xeyr, deyildi.*

- *Şübhəsiz ki, İsaya (ə.s) anasının bətnində dilədiyi kimi surət və şəkil verən Allahdır. Allah yeməkdən və içməkdən münəzzəhdir. Fəqət Məryəm (ə.s) bütün qadınlar kimi hamiləlik keçirdi, sonra bütün qadınların öz övladlarını dünyaya gətirdiyi kimi İsanı (ə.s) dünyaya gətirdi. Sonra bütün qadınların etdiyi kimi İsanı (ə.s) əmizdirdi. İsa (ə.s) bütün insanlar kimi yedi və içdi, bütün insanların etdiyi kimi təharət (təbii ehtiyaclarını görmək) üçün çıxdı. Siz bütün bunları qəbul edirsinizmi?*

- *Bəli, edirik.*

- *Elə isə bütün bunlardan münəzzəh olan Allah necə İsa (ə.s) ola bilər? Və ya İsa (ə.s) necə Allahın oğlu ola bilər?*

Bu sual qarşısında nəcranlı rahiblər susub qaldılar. Lakin Allah Rəsulunun (s.ə.v) sözlərini təsdiqləməyib öz dediklərindən də dönmədilər. Bunu görən Allah Rəsulu (s.ə.v) onlara "*əgər hələ də mənim yalan danışdığımı, özünüzün isə düz danışdığınızı iddia edirsinizsə, gəlin mülaənə edək, qarşılıqlı olaraq lənətləşək, qoy Allah yalan deyənə lənət etsin*" demişdi. Onun bu sözlərinə cavab olaraq nəcranlılar düşünüb məsləhətləşmək üçün möhlət istəmişdilər. Lakin onlar bu haqda yekdil qərara gələ bilməmişdilər. Bəziləri "*əgər o, həqiqətən peyğəmbərdirsə, bizə lənət etsə Allah bizim deyil onun duasını qəbul edər. Bir peyğəmbərin lənət etdiyi qövm isə əsla fəlah tapmaz, nəsli kəsilər, yurdu xaraba qalar*" deyərək rahiblərini lənətləşməkdən çəkindirmişdilər. Nəhayət nəcranlılar cizyə ödəmək şərtini qəbul etmişdilər. Allah Rəsulu (s.ə.v) onlarla yazılı əhdnamə tərtib edərək ödəyəcəkləri illik miqdarı və digər şərtləri qeyd etdirmişdi. Əbu Ubeydə Amir ibn Abdullah ibn Cərrahı (r.ə) isə Allah Rəsulu (s.ə.v) Nəcrana öz təmsilçisi olaraq göndərmişdi. Nəcrana qayıdandan bir müddət sonra rahiblərdən Aqib və Bişr ibn Muaviyyə geri, Mədinəyə qayıdıb Allah Rəsulunun (s.ə.v) hüzurunda İslamı qəbul etdiklərini bildirmişdilər.

Hicri 9-cu ilin zilhiccə ayında (mart 631) Allah Rəsulu (s.ə.v) həcc ziyarəti üçün möminlərin Mədinədən Məkkəyə yola düşmələrini əmr etmiş, Əbu Bəkri (r.ə) həcc əmiri təyin etmişdi. Zəvvarlar Məkkədə ikən Əli ibn Əbu Talib (r.ə)

Allah Rəsulunun (s.ə.v) göstərişilə onlara yetişib Tövbə surəsinin yeni nazil olmuş ayələrini oxumuşdu. Allahın əmrilə müşriklərin Kə'bəyə yaxınlaşmaları, onu təvaf etmələri, Məscidü'l-Həram və Kə'bədə bütpərəst ayinlərini icra etmələri qadağan olunmudu.

**Muhəmməd Peyğəmbərin (s.ə.v) Təlim və Tərbiyə Sahəsində Fəaliyyətləri**

*Qur'ani-Kərim*

Qur'an Allahın kəlamı olaraq 23 illik risalət müddətində ayə-ayə Rəsulallaha (s.ə.v) vəhy edilmişdi. Allah Rəsulu (s.ə.v) ona vəhy olunan hər ayəni vəhydən dərhal sonra əshabından əvvəlcə kişilərdən ibarət bir qrupa oxuyub təbliğ edir, əzbərlətdirirdi. Daha sonra müsəlman qadınlardan da bir qrup yeni vəhy olunmuş ayələri dinləyir, əzbərləyirdilər. Sonra isə vəhy katiblərindən birini və ya bir neçəsini çağıraraq Allahın kəlamını yazdırır, qeyd etdirirdi. Daha sonra katib və ya katiblər uca səslə Allah Rəsulunun (s.ə.v) hüzurunda yazdıqlarını oxuyur, Peyğəmbər (s.ə.v) ayə və ya ayələrin ona vəhy edildiyi kimi yazıldığından əmin olurdu. Vəhy katibi və Qur'an hafizi olan səhabələrdən Zeyd ibn Sabit (r.ə) Allah Rəsulunun (s.ə.v) ona yazdırdığı ayəni öz hüzurunda uca səslə özünə oxutdurduğunu, tam doğru yazldığından əmin olandan sonra insanların arasında oxumağı əmr etdiyini demişdir. Vəhy katibləri ayələri vəhy sırasına görə deyil, Allah Rəsulunun (s.ə.v) buyurduğu şəkildə hər birini lazımi ardıcıllıqla qeyd edirdilər. Allah Rəsulu (s.ə.v) nazil olan Qur'an ayələrini əshabdan bir çoxuna həm əzbərlətdirir, həm də öz vəhy katiblərinə yazdıqlarının üzünü köçürərək çoxaltmalarını əmr edirdi. Beləcə Qur'anın həm yazılı və əzbər olaraq saxlanılması, həm də namazlarda oxunması təmin edilirdi. Allah Rəsulu (s.ə.v) özünün yetişdirdiyi, Qur'anı şəxsən ondan öyrənib əzbərləyən hafizlərə yeniyetmə və gənc möminlərə də Qur'anı öyrədərək əzbərlətmələrini tapşırırdı. Ramazan ayında isə Allah Rəsulu (s.ə.v) gündüzlər həmin vaxta qədər nazil olmuş bütün Qur'an ayələrini uca səslə başdan sonra qədər oxuyurdu. Allah Rəsulu (s.ə.v) ömrünün son ramazan ayında mələk Cəbrayılın (ə.s) gələrək ona Qur'anı iki dəfə başdan sonra qədər oxutdurduğunu, bununla da öz vəfatının artıq yaxın olduğunu anladığını bildirmişdi. Allah Rəsulu (s.ə.v) əshabı ilə söhbətlərində Qur'anın bir çox ayəsinin izahı ilə bağlı danışır, ayələrin mənasını, orada haqqında danışılan şəxs, əşya, hadisə, hal, hərəkət, ibadət, əmr, qadağa kimi xüsuslara aydınlıq gətirirdi.

Yuxarıda qeyd etdiyimiz kimi Allah Rəsulu (s.ə.v) ona vəhy olunan Qur'an ayələrini dərhal əzbərlətdirir və yazdırırdı. Vəhy katibləri ayələri ya kağız, ya

da aşılanmış dəri üzərinə yazırdılar. Yeni nazil olmuş ayələri insanların hamısı dərhal əzbərləyə bilmirdi. Çünki insanları hamısının yaddaşı və əzbərləmə qabiliyyətləri eyni olmur. Bu səbəbdən idi ki, hafizlər xüsusi, fenomenal yaddaşa sahib insanlar arasından çıxırdı. Digər insanlar isə həm namazlarda, həm də ayrıca ibadət məqsədilə tilavət edə bilmək üçün vəhy katiblərinin əlindəki nüsxələrdəki ayələrin üzünü köçürürdülər. Həmin dövrdə kağız və aşılanmış dəri həm ucuz olmaması, həm də hazırlanması asan olmadığı üçün insanlar geniş səthi olan daşlar, dəvənin kürək sümüyü, iri saxsı parçası, xurma ağacının ortasındakı lif və. s bu kimi açıq rəngli və düz səthə malik şeylərin üzərinə öz istifadələri üçün Qur'an ayələrinin üzünü köçürürdülər.

Qur'ani-Kərim Allahın kəlamıdır. Qur'anın əvvəlki peyğəmbərlərə endirilmiş vəhylərdən ən əsas fərqi bu idi ki, Qur'an Allahın mühafizəsi altında idi. Yəni bu gün, müasir dövrdə əlimizdə olan Qur'an məhz Allahın öz kəlamını bəşərəyyətə çatrımaq istədiyi formadadır. Allah Rəsulunun (s.ə.v) vəfatından qısa müddət əvvəl mələk Cəbrayılın (ə.s) təsdiq etdiyi şəkildə möminlərə öyrətdiyi, yazdırdığı, əzbərlətdiyi şəkildədir. Ondan heç bir şey əskilməyib və heç bir şey əlavə edilməyib. Hicr surəsi 9-cu ayədə buyurulduğu kimi:

إِنا نَحْنُ نَزلْنَا الذكْرَ وَإِنا لَهُ لَحَافِظُونَ

*"Şübhəsiz ki, Qur'anı Biz nazil etdik və sözsüz ki, Biz də onu (hər cür təhrif və təbdildən; artırıb-əskiltmədən) qoruyub saxlayacağıq!"*

Məlum olduğu kimi Qur'an ayələri Məkki və Mədəni, yəni risalətin Məkkə dövrü və hicrətdən sonrakı, Mədinə dövründə nazil olmasına görə iki qismdir. Qur'an ayələrinin bəzisi insanlara nəsihət, bəzisi İslamın tövhid əqidəsini açıqlayan mahiyyətdəki ayələrdir. Bununla yanaşı əhkam, yəni şəriət hökmləri ilə bağlı ayələr də mövcuddur. 23 illik risalət dövründə Allah Qur'anın bəzi əhkam ayələrini yeniləmiş, hər hansı bir məsələ haqqındakı əvvəlki hökmü ləğv edərək bu barədəki hökmünü yenisi ilə əvəz etmişdi. Hökmü ləğv edilən ayələr "*mənsux*", yəni nəsx edilmiş ayələr adlanır. Qur'anın Bəqərə surəsi 106-cı ayəsində bu məsələyə belə aydınlıq gətirilir:

مَا نَنسَخْ مِنْ آيَةٍ أَوْ نُنسِهَا نَأْتِ بِخَيْرٍ مِنْهَا أَوْ مِثْلِهَا أَلَمْ تَعْلَمْ أَن ا عَلَى كُل شَيْءٍ قَدِيرٌ

*"Biz hər hansı bir ayəni ləğv edir və ya onu unutdururuqsa, ondan daha yaxşısını, yaxud ona bənzərini gətiririk. Allahın hər şeyə qadir olmasını bilmirsənmi?!"*

*Hədislər*

Allah, Qur’anın Nisa surəsi 113-cü ayəsində belə buyurmaqdadır:

أَنزَلَ ا عَلَيْكَ الْكِتَابَ وَالْحِكْمَةَ وَعَلَّمَكَ مَا لَمْ تَكُنْ تَعْلَمُ

*“(Ey Rəsulum!) Allah sənə Quranı və hikməti nazil edərək bilmədiklərini öyrətdi”*

Əhzab surəsinin 34-cü ayəsində isə belə buyurulur:

وَاذْكُرْنَ مَا يُتْلَى فِي بُيُوتِكُنَّ مِنْ آيَاتِ ا ـ وَالْحِكْمَةِ

*“(Ey Peyğəmbərin xanımları) Allahın evlərinizdə oxunan (Qur’an) ayələrini və hikməti xatırlayın”*

Allahın eynən öz kəlamı olan Qur’an ayələri kimi endirdiyini, vəhy edib öyrətdiyini bildirdiyi bu iki ayədəki *hikmət* sözü Allah Rəsulunun (s.ə.v) yaşadığı İslami həyatı, yəni sunnəni bildirilməkdədir. Allah Rəsulunun (s.ə.v) sözləri və davranışları ilə bəyan etdiyi, öyrətdiyi bu İslami həyat tərzi ona yaxın insanlar olan səhabələri və ev əhli, yəni xanımları tərəfindən dinlənilir, hifz və qeyd edilirdi. Bununla da ilk hədis mətnləri və bu mətnlərin toplandığı məcmuələr meydana çıxmışdır. Allah Rəsulunun (s.ə.v) sözləri, davranışları və şahidi olduğu hal və hadisələrə münasibətinin yazılaraq məcmuələr halında toplanmasına Peyğəmbər (s.ə.v) hələ həyatda ikən başlanılmışdı. Bir sonrakı nəsil isə səhabədən ayrı-ayrı şəxslərin yazıb saxladıqlarını birləşdirərək, toplayaraq bu Peyğəmbər (s.ə.v) hikmətini kitab halına gətirmişdilər. Səhabədən sonrakı ikinci nəslin müfəssəl olaraq topladığı, Peyğəmbər (s.ə.v) hikmətini bəyan edən hədis kitabları müasir dövrümüzə qədər gəlib çıxmış hədis kitablarıdır. Bu hədis külliyatlarının ən məşhurları və ən mötəbərləri “*Kutubi-Sittə*” olaraq tanınan altı hədis külliyatıdır.

İslam dininin meydana çıxdığı dövrdə Məkkə və Mədinədə yazıb oxumağı bacaran insanların sayı çox deyildi və bunu bacaran insanların çoxu varlı ailələrin övladları idilər. Yuxarıda bildirdiyimiz kimi Allah Rəsulu (s.ə.v) yeniyetmə və gənc müsəlmanların yazıb oxumağı öyrənmələrinə xüsusi diqqət yetirir, onları buna təşviq edirdi. Yazıb oxumağı bacaran, savadlı gənclərdən olan Ənəs ibn Malik (r.ə) yeniyetməlik yaşlarından etibarən Allah Rəsulunun (s.ə.v) vəfatına qədər onun yanında, xidmətində olmuşdu. Təsadüfi deyildir ki, Ənəs ibn Malik (r.ə) ən çox hədis nəql etmiş səhabələrdən biridir və o, həmçinin Allah Rəsulundan (s.ə.v) eşitdiklərini, onun davranışlarını müşahidə edərək qeyd etmiş səhabədir. Eyni zamanda Abdullah ibn Əmr ibnü’l-As (r.ə), Əmr ibn Həzm (r.ə), Cabir ibn Abdullah (r.ə), Səmurə ibn Cundəb (r.ə), Sə’d ibn Ubadə (r.ə), Əbu Hureyrə (r.ə), Abdullah ibn Abbas (r.ə) kimi səhabələr Allah

Rəsulundan (s.ə.v) eşitdikləri sözləri, onun davranışlarını, müxtəlif hadisələrə qarşı münasibətini müşahidə edərək qələmə almışdılar. Yəni ilk yazılı hədis əsərlərinin müəllifləri bu adı çəkilən səhabələrdir.

Əhzab surəsinin 34-cü ayəsində Allah, Peyğəmbərin (s.ə.v) xanımlarına Qur'anla yanaşı bu hikmətin, yəni sunnənin məhz onların evlərində Allah Rəsulu (s.ə.v) tərəfindən açıqlanıb oxunduğunu vurğulamaqdadır. Bu səbəbdəndir ki, Peyğəmbərin (s.ə.v) xanımları da ən çox hədis nəql edən şəxslərdir. Onların arasında Ayşə bint Əbu Bəkr (r.ə) ələlxüsus seçilməkdədir.

Allaha iman və onun əmrinə itaət etmiş bir cəmiyyət meydana gətirmək əzmində olan Allah Rəsulu (s.ə.v) elmə, təlim və tərbiyəyə xüsusi diqqət yetirmişdi. Onun fəaliyyətlərində və sözlərində bilik öyrənməyə, öyrədənə və öyrənənə verilən dəyərin nə qədər yüksək olduğu görülməkdədir. Hədis külliyatlarında təhsil, təlim və tərbiyəyə təşviq edən, elmsizliyi və savadsızlığı məzəmmət edən yüzlərlə hədis mövcuddur. Bu da təsadüfi deyildi. Çünki İslam, müqəddəs kitabı "*oxu*" əmri ilə vəhy edilməyə başlamış bir dindir. Yəni oxumaq və savadlanmaq İslam ümmətinə edilmiş ilk əmrdir. Allah Qur'anın Zumər surəsi 9-cu ayəsində **(هَلْ يَسْتَوِي الذينَ يَعْلَمُونَ وَالذينَ لاَ يَعْلَمُونَ)**"*Heç bilənlərlə bilməyənlər eyni ola bilərmi?!*" buyuraraq elmin bütün sahələrində bilənin bilməyənə üstün gələcəyini vurğulamış, müsəlmanları bütün elmlərə vaqif olmağa təşviq etmişdi. Allah Rəsulu (s.ə.v) (**وَإِنَمَا بُعِثْتُ مُعَلما**) "*mən bir müəllim olaraq göndərildim*"[37] deyərək oxumaq, bilmək və öyrənməkdə öz ümmətinə rəhbərlik etmişdi. Hələ Məkkədə ikən müsəlmanların hər cür təqib, tizyiq və məşəqqətlərə məruz qaldığı bir vaxtda Allah Rəsulu (s.ə.v) nazil olan ayələrin yazılaraq yayılmasını və öyrənilməsini təmin etmişdi. Məkkədə "*Daru'l-Ərqam*" olaraq tanınan Ərqam ibn Əbil-Ərqamın (r.ə) evi ilk öyrətmə və öyrənmə yeri, məktəb olaraq istifadə olunmuşdu. Peyğəmbər (s.ə.v) onun ilahi dəvətinə könül vermiş az sayıda insana bu evdə tövhidi, şirki, imanı və İslamı öyrətməyə başlamışdı. Allah Rəsulu (s.ə.v) öz əshabından Mus'ab ibn Umeyri (r.ə) İslamı yeni qəbul etmiş yəsriblilərlə müəllimlik etməsi, onlara İslamı öyrətməsi üçün hicrətdən əvvəl Mədinəyə göndərmişdi. Hicrətdən sonra isə Məscidu'n-Nəbəvi İslamın Mədinədəki məktəbi olmuşdu. Məscidin yaxınında Suffə adlanan yer inşa olunmuşdu. Suffədə Mədinəyə hicrət edən və bu şəhərdə kimsəsi, qalacaq yeri olmayan gənc müsəlmanlar yaşayırdılar. Bunların bir çoxu daha sonra evlənib ailə sahibi olur, Suffədən ayrılırdılar. Suffə məktəbindən gəlib keçmiş səhabələrin sayının 400-ə yaxın olduğu bildirilir. İslami elmlərdə dərinləşmiş,

[37] İbn Macə, "*Sünən*", Müqəddimə 16.

Qur’an hafizi, ən çox hədis nəql etmiş bir çox səhabə Suffə əshabından idi. Suffə əshabının baş müəllimi Allah Rəsulunun (s.ə.v) özü idi. Allah Rəsulu (s.ə.v) Suffə əshabının təlimi və tədrisi ilə məşğul olmaq üçün alim səhabələrdən Ubadə ibn Samiti (r.ə) təyin etmişdi. Peyğəmbər (s.ə.v) Bədrdə əsir düşmüş, yazıb oxumaq bilən bəzi müşrik əsirlərə azad edilmələri müqabilində onların hər birinin on müsəlman uşağa yazıb oxumağı öyrətmələrini şərt qoymuşdu. Bu əsirlər müsəlmanların uşaqlarına yazıb oxumağı öyrətmişdilər. Zeyd ibn Sabit (r.ə) bunun sayəsində yazıb oxumağı öyrənən səhabələrdən idi. Allah Rəsulu (s.ə.v) Zeyd ibn Sabiti (r.ə) həmçinin yəhudi və süryani dillərini öyrənməyə təşviq etmiş, Zeyd (r.ə) Peyğəmbərin (s.ə.v) istəyi ilə bu iki dili öyrənmişdi.

Allah Rəsulu (s.ə.v) peyğəmbərlərin yolunun dəvətçiləri olmaqla müjdələdiyi alimləri peyğəmbərlərin varisləri adlandırmış, elmi öyrənənlərin və öyrədənlərin heç bir şeylə müqayisə edilə bilməyəcək böyük bir mirasa sahib olduqlarını bildirmişdi. Səhabədən Əbu’d-Dərdanın (r.ə) nəql etdiyi bir hədisdə Allah Rəsulu (s.ə.v) belə buyurmaqdadır:

**عَنْ أَبِي الدَّرْدَاءِ قَالَ : فَإِني سَمِعْتُ رَسُولَ ا ـ صَلى ا ُ عَلَيْهِ وَسَلمَ , يَقُولُ : مَنْ سَلَكَ طَرِيقًا يَطْلُبُ فِيهِ عِلْمًا , سَلَكَ بِهِ طَرِيقًا مِنْ طُرُقِ الْجَنةِ ، وَإِن الْمَلائِكَةَ لَتَضَعُ أَجْنِحَتَهَا رِضًا لِطَالِبِ الْعِلْمِ ، وَإِن فَضْلَ الْعَالِمِ عَلَى الْعَابِدِ كَفَضْلِ الْقَمَرِ لَيْلَةَ الْبَدْرِ عَلَى سَائِرِ الْكَوَاكِبِ ، وَإِن الْعَالِمَ لَيَسْتَغْفِرُ لَهُ مَنْ فِي السمَوَاتِ وَمَنْ فِي الْأَرْضِ ، وَكُل شَيْءٍ حَتى الْحِيتَانِ فِي جَوْفِ الْمَاءِ ، إِن الْعُلَمَاءَ وَرَثَةُ الْأَنْبِيَاءِ ، إِن الْأَنْبِيَاءَ لَمْ يُوَرثُوا دِينَارًا ، وَلا دِرْهَمًا ، وَأَوْرَثُوا الْعِلْمَ , فَمَنْ أَخَذَهُ أَخَذَ بِحَظ وَافِرٍ**

*“Kim elm təhsil etmək məqsədiylə yola çıxsa Allah onu cənnətin yollarından birinə istiqamətləndirər. Şübhəsiz ki, mələklər elm tələbəsini o qədər xoşlayırlar ki, onun üçün qanadlarını açarlar. Şübhəsiz ki, alimin abidə olan üstünlüyü ondörd gecəlik ayın parlaqlığına görə digər ulduzlara olan üstünlüyü kimidir. Göylərdə, yerdə və sudakı məxluqat Allahdan alimin günahlarının bağışlanmasını diləyərlər. Alimlər peyğəmbərlərin varisləridirlər. Peyğəmbərlər miras olaraq dinar və dirhəm deyil, elm qoyub gedərlər. Kim o elmi əxz etsə çox böyük bir miras əldə edər”*[38].

Əbu Zərr əl-Ğifarinin (r.ə) nəql etdiyi hədisdə isə Rəsulullah (s.ə.v) müəllimlər, elm öyrədənlər haqqında belə buyurmaqdadır: ( **ا معلم**) “*müəllim (öyrədən) xeyir tapmışdır*”[39].

[38] Buxari, *Səhih*, Elm 10.
[39] Tirmizi, *Sünən,* Elm, 2681.

Daha sonrakı dövrdə Mədinədə Məscidu'n-Nəbəvidən başqa daha doqquz məscidin inşa edildiyi mənbələrdə qeyd edilməkdədir. Bu məscidlərin hər biri həm də məktəb idi. Öyrətmə və öyrənmədə Allah Rəsulu (s.ə.v) qadınlarla kişiləri ayırmamışdır. Belə ki, xanım səhabələrdən Umm Süleyman bint Heysəmə (r.ə) Peyğəmbərin (s.ə.v) xanımı Həfsa bint Ömərə (r.ə) yazıb oxumağı öyrətmişdi. Allah Rəsulunun (s.ə.v) xanımlarından Ayşə (r.ə) və Umm Sələmə (r.ə) öz evlərində gənc müsəlman qızlara yazıb oxumağı, Qur'anı və sunnəni öyrətmişdilər. Bu mövzuda azad insanlarla kölələr arasında da fərq qoyulmamışdır. Allah Rəsulu (s.ə.v) "*kim bir cariyəni gözəl bir şəkildə öyrədib, tərbiyə edib, sonra azad edib evləndirərsə onun üçün Allahın yanında iki qat mükafat vardır*" buyurmuşdur. Allah Rəsulu (s.ə.v) müsəlmanların öz uşaqlarına ox atmaq, üzmək, hesablamaq, müalicə, ənsab (nəsil şəcərəsi) və Qur'an oxumaq kimi həm dini, həm də dünyəvi bilikləri vermələri üçün təşviq etmişdir.

*Namaz, Oruç, Həcc, Zəkat*

Allah öz elçisi Muhəmməd (s.ə.v) vasitəsilə təbliğ etdiyi tövhid əqidəsinin insanlar arasında yayılması, möhkəmləndirilməsi və buna xələl gətirə biləcək hər cür söz, hərəkət və davranışlardan möminləri çəkindirməyi əmr buyurmuşdur. Həmçinin möminlərin özündən başqa heç kimə boyun əyməyib qulluq etmədikləri Allaha olan bağlılıqlarının daim diri və canlı saxlanması üçün bir sıra ibadətləri vacib buyurmuşdu. Bu ibadətlərin başında heç şübhəsiz namaz gəlməkdədir. Namaz ibadətinin vacibliyi, əvəzolunmazlığı Qur'anın yüzdən artıq yerində müxtəlif səbəblərlə vurğulanmaqdadır. Qur'anın Taha surəsi 130-cu ayəsində isə bu ibadətin günün beş vaxtında icra ediləcəyi bəyan edilmişdir. Həmçinin Qur'anın bir sıra ayələrində namazın rüku və səcdə kimi əsas rüknlərindən bəhs edilməkdədir. Allah Rəsulu (s.ə.v) öz şəxsi həyatında tətbiq edərək namazın hansı vaxtlarda, necə, nələrə diqqət yetirərək icra edilməsini ən incə təfərrüatına qədər möminlərə izah etmiş, bu mövzudakı bütün məqamlara aydınlıq gətirmişdir. Bununla bağlı hədis külliyatlarında yüzlərlə hədis nəql edilməkdədir. Namazla hər bir mömin Allaha bağlılığının bir dəlili olaraq, hər bir namazın aldığı cəmi 10-15 dəqiqəlik vaxt ərzində özünün bütün şəxsi qayğılarından, dünyəvi mənfəətlərindən sıyrılaraq uca yaradana ibadət, itaət etdiyini təsdiq etmiş olur. Üstəlik möminin bu ibadəti icra etməsi üçün, digər dinlərdən fərqil olaraq, daim bir məbədə ehtiyacı olmur. Çünki Allah Rəsulu (s.ə.v) "*yer üzü mənimçün məscid və təmiz qılındı*"[40] demiş və bunu özünün

[40] Hədis, Müslimin "*Səhih*", Tirmizinin "*Sünən*", İbn Macənin "*Sünən*" və Əhməd ibn Hənbəlin "*Müsnəd*" adlı hədis külliyatlarında qeyd edilməkdədir. (جُعِلَتْ لِيَ اَرْضُ مَسْجِداً وَطَهُوراً)

digər peyğəmbərlərdən fərqi olaraq bəyan etmişdi. Bununla yanaşı Peyğəmbər (s.ə.v) möminlərin gündəlik namaz ibadətlərini məscidlərdə camaat halında icra etmələrinin tək başına məscid xaricində namaz qılmalarından daha üstün və daha fəzilətli olduğunu da vurğulamışdı. Gündəlik beş vaxt namazla yanaşı Allah Qur'anın Cumə' surəsinin 9-cu ayəsində möminlərə hər həftə, cümə günü, məscidlərdə birlikdə camaat halında namaz qılmağı da fərz buyurmuşdur. Qur'anın İsra surəsi 44, Həcc surəsi 18 və Nur surəsi 41-ci ayələrində Allah sadəcə insanların deyil bütün məxluqatın, bütün yaratdıqlarının aləmlərin Rəbbi olan Allaha ibadət etdiklərini, ona səcdə edib təqdis etdiklərini bəyan etməkdədir. Buna görə də Allah Rəsulu (s.ə.v) namazın vacibliyini, namazı tərk etmənin isə müsəlmanın özü ilə Rəbbi arasına məsafə qoyması, ondan uzaqlaşması demək olduğunu təkidlə vurğulamışdı ki, bu haqda hədis kitablarında aşağıda qeyd etdiyimiz hədislər nəql olunmaqdadır. Allah Rəsulunun (s.ə.v) (**ان بـ الرجل و بـ الشرك و الكفر ترك الصلاة**) "*şübhəsiz insan ilə şirk və küfr arasında namazın tərki vardır*"[41], (**بـ العبد و بـ الكفر ترك الصلاة**) "*bəndə ilə küfr arasında namazın tərki vardır*"[42], (**ليس بـ العبد و الشرك الا ترك الصلاة فادا تركها فقد اشرك**) "*bəndə ilə şirk arasında namazın tərkindən başqa bir şey yoxdur, onu tərk etdiyi vaxt Allah şərik qoşmuş olur*"[43] kimi sözləri onun namaza necə əhəmiyyət verdiyini göstərməkdədir.

İslamdakı əsas ibadətlərdən biri də orucdur ki, Qur'anın Bəqərə surəsi 183-184-cü ayələrilə möminlərə fərz buyurulmuşdur. Bu fərz orucu hicri-qəməri aylardan ramazan ayında tutulan orucdur. Həmin ayələrdə Allah əvvəlki ümmətlərə də oruc ibadətinin vacib buyurulduğunu bəyan etməkdədir. Həqiqətən də xristianlıq, ibranilik və zərdüştilik kimi dinlərdə də oruc ibadəti mövcuddur. Fəqət İslam dinində vacib buyurulan oruc mahiyyəti baxımından tamamilə fərqlidir. Allah Rəsulu (s.ə.v) ildə bir ay tutulan ramazan orucundan başqa hər ayın müxtəlif günlərində də oruc tutardı ki, bunlar da sünnə orucları olaraq möminlərin yerinə yetirdikləri ibadətlər arasına daxil olmuşdur. Allah öz Elçisinə (s.ə.v) və möminlərə ramazan ayında oruc tutmağı hicrətin ikinci ilində, şaban ayında (26 yanvar-25 fevral 624), Bədr döyüşündən qısa müddət əvvəl fərz buyurmuşdur. Allah Rəsulu (s.ə.v) fərz buyurulmasından vəfatına qədər 9 dəfə ramazan orucunu tutmuşdu. Mədinə yəhudiləri hər məhərrəm ayının 9 və 10-cu günləri öz dinlərinə xas şəkildə oruc tuturdular. Allah Rəsulu (s.ə.v) da İslama xas qaydada məhərrəm ayının 9-10-cu günləri oruc tuturdu. Bundan başqa Allah Rəsulu (s.ə.v) hər qəməri ayın "*əyyami-bid*" adı ilə bilinən

---

[41] Müslim, *Səhih*, İman, 134
[42] Tirmizi, *Sünən*, İman, 24
[43] İbn Macə, *Sünən*, İqamə's-Səlah, 77

13, 14 və 15-ci günlərini oruclu keçirirdi. Ramazan orucunun fərz buyurulmasından sonra da Allah Rəsulu (s.ə.v) bu orucları tutmuşdur.

Beytullahın, yəni Allahın evi olan Kə'bənin İbrahim (ə.s) peyğəmbər tərəfindən, bəşər tarixində tövhid etiqadına xas inşa edilmiş ilk məbəd olduğuna inanılır. İbrahim (ə.s) peyğəmbər bu məbədi inşa etməklə yanaşı həcc kimi tövhid etiqadına xas bir ibadətin də əsasını qoymuşdu. İbrahim (ə.s) və oğlu İsmayıldan (ə.s) gələn həcc ibadəti bu ənənənin varisi olan İslam dininin beş əsasından biridir. Allah, buna maddi imkanı çatan hər möminə bütün ömrü boyu ən az bir dəfə Kə'bəni ziyarət edərək həcc ibadətini yerinə yetirməyi fərz buyurmuşdur. Allah Rəsulu (s.ə.v) ikisi hicrətdən əvvəl, biri isə hicrətdən sonrakı dövrdə olmaqla üç dəfə həcc etmişdi. O, Beytullahda həmçinin umrə ibadətlərini də yerinə yetirmişdir.

Allah, Qur'anın Nur surəsi 56-cı ayəsində (**وَأَقِيمُوا الصَّلَاةَ وَآتُوا الزَّكَاةَ وَأَطِيعُوا الرَّسُولَ لَعَلَّكُمْ تُرْحَمُونَ**) "*namazı qılın, zəkatı verin və Peyğəmbərə itaət edin ki, sizə rəhm olunsun!*" buyuraraq namazla yanaşı digər fərz ibadətlərin deyil, məhz zəkatın adını çəkməkdədir. Həmçinin Allah bu ayədə namaz və zəkatla yanaşı, Allah Rəsuluna (s.ə.v) itaət etməyi, onun göstərdiyi yoldan, onun sunnəsindən ayrılmamağı öz mərhəmətinə məzhər olmanın şərtləri kimi vurğulamaqdadır. Zəkat namaz, oruc, həcc və kəlimeyi-şəhadətlə birlikdə İslamın beş şərtindən birini təşkil etməkdədir. Zəkat Qur'anda otuz iki dəfə vacib ibadət kimi qeyd edilməkdədir. Zəkatın fərz buyurulması ilk ramazan orucunun tutulduğu ayda olmuşdur. Zəkat ildə bir dəfə ödənir. Hədislərdə Allah Rəsulunun (s.ə.v) hər 20 dinar (1dinar-4,25 gr qızıl pul) məbləğindəki mallar üçün üçün yarım dinar məbləğində zəkat təyin etdiyi bəyan edilir. Bu miqdardan daha az varidata sahib olan müsəlmanlar zəkat ödəmirdilər. Zəkatla mükəlləf olması üçün 20 dinar məbləğindəki həmin bu miqdar bir qəməri il müddətində sahibinin əlində qalmış olmalıdır. Ev, minik vasitəsi, torpaq sahəsi, bağ, tarla kimi daşınan və daşınmaz əmlak əgər gəlir gətirməyib şəxsin öz istifadəsində idisə bu mallardan zəkat alınmırdı. Heyvan sürüsünə sahib müsəlmanlar dəvələrinin sayı 5-i, iri buynuzluların 30-u, xırda buynuzluların sayı 40 başı keçirdisə bunun zəkatını ödəyirdi. Zəkat miqdarı hesablanarkən mükəlləfin borcunun olub olmaması nəzərə alınırdı. Zəkatın şərtləri və qaydaları ilə bağlı hökmlər fiqh məcmualarında geniş və ətraflı şəkildə mövcuddur.

## Muhəmməd (s.ə.v) Peyğəmbərin Dövründə Dövlət və İdarəçilik

*Siyasi Əxlaq*

Bütün icraatlarında Allahın kəlamı olan Qur'anın hökmlərinə istinad edən Allah Rəsulu (s.ə.v) formalaşdırdığı İslam cəmiyyətinin idarə edilməsi üçün müəyyən edilmiş əsasları şəxsən tətbiq etmiş və Mədinəyə hicrətin ardından qurduğu İslam dövlətinin ilk başçısı olmuşdu. İstər Mədinə əhdnaməsinin tərtibi, istərsə də ondan sonrakı hadisələrin inkişafında Allah Rəsulunun (s.ə.v) yüksək idarəçilik qabiliyyəti və bacarığına sahib olduğunu müşahidə etməkdəyik. Peyğəmbər (s.ə.v) ona iman gətirənləri qeydsiz və şərtsiz, sorğusuz və sualsız öz şəxsinə bağlayıb itaət altına almaq imkanına sahib olsa da o, tam əksinə bu cahiliyyə idarə üsulunu aradan qaldırmışdı. Bununla da idarəetmədə həmin dövr üçün inqilab sayıla biləcək bir addımı atmışdı. Allah Rəsulu (s.ə.v) dövlət idarəetməsində təməl əsas olaraq şuranı qəbul etmiş, Allahın qəti əmri olmayan xüsuslarda əshabı ilə müşavirə edərək həll edilməli məsələləri onların müzakirəsinə açmışdı. Haqq və ədalətin bərqərar olması onun idarəetmədəki təməl prinsipi idi. Əgər mövzu haqq və ədalətin öz yerini tapması idisə Allah Rəsulunun (s.ə.v) nəzərində əsil-nəcabət, vəzifə, zənginlik kimi amillərin qəti surətdə yeri və dəyəri olmazdı. Buna nümunə olaraq yuxarıda haqqında bəhs etdiyimiz, Məkkəli bir qadını etdiyi oğruluq səbəbiylə cəzalandırılması hadisəsini xatırlada bilərik. Nəcib və əsilzadə bir ailəyə mənsub Fatimə adlı bu qadın üçün vasitəçilik edib əvfinə nail olmaq istəyən Usaməyə (r.ə) qeyzlənərək bunu hətta öz doğma qızı Fatimə (r.ə) belə etsəydi nəticənin dəyəşməyəcəyi cavabını vermişdi.

Allah Rəsulu (s.ə.v) vəzifəyə təyin edərkən həmin şəxsin işin əhli və şəxsi keyfiyyətlərinə görə həmin vəzifəyə layiq olub olmamasını əsas götürərdi. Əhliyyət və ləyaqət Allah Rəsulunun (s.ə.v) dövlət vəzifəsinə təyin etdiyi şəxsdə axtardığı iki təməl keyfiyyət idi. Əsilzadə ailəyə, nüfuzlu nəslə mənsub olmayan, sıravi hətta keçmişdə kölə olub sonra azad edilmiş bir çox əhliyyətli və ləyaqətli mömini Allah Rəsulu (s.ə.v) mühüm və yüksək vəzifəyə təyin etmişdi. Peyğəmbər (s.ə.v) vəzifələndirdiyi məmurlardan bütün icraatlarında Qur'an və sunnəyə sıx bağlı olmalarını tələb edir, onların vəzifəcə öz üstlərində olan məmur və əmirlərə itaət etmələrini buyrurdu. Bununla belə masiyyətdə, yəni haqsızlıq, haram və zülmü ehtiva edən işlərdə əmri altına olduğu məmura itaətin vacib olmadığını bildirirdi. Peyğəmbər (s.ə.v) özünü vəzifəyə təyin etdiyi məmurların üstündə, fövqündə deyil onların arasında görürdü. Çünki bir çox Qur'an ayəsində

də ifadə edildiyi kimi İslam idarə sistemində hakimiyyət, hökmranlıq, qanun qoyma səlahiyyəti insanlara deyil Allaha aid idi.

Allah Rəsulu (s.ə.v) vəzifə sahiblərinin öz səlahiyyətlərindən sui-istifadə edərək rüşvət və qülul (korrupsiya) yolu ilə maddi mənfəət əldə etməsinə əsla göz yummaz, bu kimi halların qarşısını ciddi tədbirlərlə alırdı. Belə ki, Allah Qur’anın Bəqərə surəsi 188-ci ayəsində bu cür maddi mənfəət əldə etmənin haram olduğunu buyurmaqdadır: (**وَلَا تَأْكُلُوا أَمْوَالَكُمْ بَيْنَكُمْ بِالْبَاطِلِ وَتُدْلُوا بِهَا إِلَى الْحُكَّامِ لِتَأْكُلُوا فَرِيقًا مِنْ أَمْوَالِ النَّاسِ بِالْإِثْمِ وَأَنْتُمْ تَعْلَمُونَ**) “*Bir-birinizin mallarını haqqınız olmadığı halda yeməyin. Xalqın malının bir qismini (onun sizə haram olduğunu) bilə-bilə günah yolu ilə yeməyiniz üçün onu (malınızı) hakimlərə (rüşvət) verməyin!*”.

Əshab Allah Rəsulunun (s.ə.v) rüşvətə dair söylədiyi sözləri diqqətlə dinləyib hifz etmiş və sonrakı nəsillərə ötürmüşdür. Abdullah ibn Əmr ibnü’l-As (r.ə) Peyğəmbərin (s.ə.v) rüşvət və rüşvətxorlar haqqında belə dediyini eşitmişdi: (**لعنة ا على الراشي وا رتشي**) “*Allah rüşvəti alan da, verənə də lənət etsin*”[44], Abdullah ibn Ömər (r.ə) Peyğəmbərin (s.ə.v) belə buyurduğunu demişdir: (**لَعَنَ الراشِيَ وَالْمُرْتَشِيَ وَالرائِشَ الذي يَسْعَى بَيْنَهُمَا**) “*Rüşvət alana, verənə və onların arasında vasitəçilik edənə lənət olsun*”[45].

Əshab Allah Rəsulunun (s.ə.v) rüşvət və qülul barəsindəki əmrlərini daim diqqətdə saxlayır, bu kimi hallardan uzaq dururdular. Allah Rəsulunun (s.ə.v) bağ və tarla məhsullarından alınan illik vergini toplamaq üçün Xeybər yəhudilərinin yanına göndərdiyi Abdullah ibn Rəvahənin (r.ə) orada rastlaşdığı bir hadisəyə göstərdiyi reaksiya çox mənalıdır. Xeybər yəhudiləri ona bahalı bir qızıl ziynət əşyasını təklif edərək “*bu sənindir, bunu al və bizim yükümüzü biraz azalt, miqdarı hesablayarkən bizim üçün bəzi şeylərə göz yum*” deyəndə Abdullah ibn Rəvahə (r.ə) onlara belə cavab vermişdi: (**يَا مَعْشَرَ الْيَهُودِ إنكُمْ لَمِنْ أَبْغَضِ خَلْقِ ا تَعا إ . وَمَا ذَاكَ بِحَامِلِي على أَنْ أَحِيفَ عَلَيْكُمْ. وَأما مَا عَرَضْتُمْ على مِنَ الرشْوَة فإنهَا سُحْتٌ وَإنا نَأْكُلُهَا**) “*Sizlər mənim nəzərimdə Allahın yaratdıqlarının ən mənfuru olmağınıza baxmayaraq mənim sizə zülm edəcəyimdən əndişə etməyiniz. Bu təklif etdiyiniz isə rüşvətdir və Allah onu yeməyi bizə haram buyurmuşdur*”[46].

Əbu Humeyd əs-Səidinin (r.ə) nəql etdiyi hadisə də ibrətamizdir. Allah Rəsulu (s.ə.v) bir şəxsi zəkat vergisini toplamaq üçün Bəni-Suleym oymağına göndərmişdi. O, işi icra edib geri qayıdanda gətirdiyi malları Allah Rəsulunun (s.ə.v) önündə iki qismə ayıraraq “*bu sizə aid(zəkat)dır. Bu isə mənə hədiyyə edilmişdir*” demişdi. Bu vəziyyət Allah Rəsulunu (s.ə.v) qəzəbləndirmişdi.

---

[44] İbn Macə, “*Sunən*”, Əhkam 2313.
[45] Zəhəbi, “*Mövzuatu’l-Mustədrək*”, 28.
[46] Malik ibn Ənəs, “*Muvatta*’”, Müsaqat, 2; Əbu Davud, “*Sünən*”, Buyu‘, 36.

O, sadəcə bir nəfərə deyil hamıya nəsihət olsun deyə məscidin minbərindən möminlərə belə xitab etmişdi: (أما بَعْدُ فَإِنى أَسْتَعْمِلُ الرجُلَ مِنْكُمْ على الْعَمَلِ مما وَّلنى ا عز وَجُل فَيأتى فَيَقُولُ: هَذَا لَكُمْ وَهذا أُهْدِىَ ! أفَ جَلَسَ بَيْتِ أَبِيه أَوْ بَيْتِ أُمه حَتى تَأْتِيَهُ هَدِيتُهُ إِنْ كَانَ صَادِقًا ؟ وا َ يَأْخُذُ أَحدٌ مِنْكُمْ شَيْئًا بِغَيْرِ حَقهِ إلَقِىَ ا تَعا يَحْمِلُهُ على رَقَبتِهِ يَوْمَ القِيَامَة) “*Mən Allahın əmrini yerinə yetirməyi sizlərdən birinə həvalə edirəm. O, isə gəlib deyir: “Bu sizə aiddir. Bu isə mənə hədiyyə edilmişdir”. Bu adam düz danışırsa atasının və anasının evində otursaydı, görək hədiyyələr onun ayağına gələcəkdimi? Vallahi, haqsızlıq edərək alanlar qiyamət günü Allahın hüzuruna aldıqları şey boyunlarından asılmış vəziyyətdə gələcəklər*”[47].

*İctimai Nizam*

Allah Rəsulunun (s.ə.v) əsasını qoyduğu İslam cəmiyyəti müsəlmanlardan və qeyri-müsəlmanlardan meydana gəlməkdə idi. Müsəlmanların böyük əksəriyyəti ərəblərdən ibarət olmaqla yanaşı zənci, fars və yunan millətindən olan müsəlmanlar da var idi. Bundan başqa müxtəlif etnik mənsubiyyətə malik kölələr və köləlikdən azad edilmişlər də var idi. Allah öz Elçisi (s.ə.v) vasitəsilə dərisinin rəngindən, danışdığı dildən və mənsub olduğu irqdən aslı olmayaraq bütün insanlara xitab etməkdə idi. Daha əvvəl qeyd etdiyimiz kimi ərəb cəmiyyəti o dövrdə qəbilə-oymaq sisteminə sahib idi və bir ərəb üçün onun qəbiləsi hər şey demək idi. Bu cür bir ictimai təşəkkülün mövcud olduğu cəmiyyətdə fərd olmaq xeyli çətin idi. Cahiliyyə dövründə öz qəbiləsindən qopub ayrılmaq bir növ intihar, özü-özünü yox etmək demək idi. Belə bir cəmiyyətdə öz qəbiləsi, oymağı, nəsli və ailəsinə arxa çevirib, sadəcə bir fərd olaraq İslamı qəbul etmək böyük fədakarlıq və cəsarət tələb edən bir addım idi. Peyğəmbər (s.ə.v) ilahi dəvətə könül verərək Allaha itaət etmiş bu insanlar arasında həmrəylik quraraq yeni bir cəmiyyət meydana gətirmiş, möminləri qardaş elan etmişdi. Bu qardaşlıq hər cür sosial statusun, zümrə, sinif, qəbilə, nəsil, ailə mənsubiyyətinin fövqündə dayanan bir qardaşlıq idi. Allah Rəsulunun (s.ə.v) meydana gətirdiyi cəmiyyətdə insanlar Allah və hüquq qarşısında bərabər idilər. Bunanla birlikdə Allah Rəsulu (s.ə.v) qəbilə və soy mənsubiyyətini aradan qaldırmamış, bunun üçün cəhd göstərməmişdi. Tam əksinə insanları öz qohum və əqrəbaları, ailə üzvlərilə daim sıx münasibət saxlamaları üçün yaxşı və pis gündə onlara arxa və dayaq olmağa təşviq etmişdi.

Mədinə əhdnaməsi bağlanarkən də qəbilələr, oymaqlar və soylar arasındakı qarşılıqlı anlaşma və razılaşma yolu ilə bağlanmışdı. Lakin hansısa qəbiləyə,

---

[47] Buxari, “*Səhih*” Hibə 17, Zəkat 67; Müslim, “*Səhih*”, İmarət 26.

oymağa, soya mənsubiyyətin fərdə üstünlük qazandırması ənənəsinə son qoyulmuş, insanlar sadəcə təqva ilə üstünlük qazanmışdılar. İslam cəmiyyəti sinfi və nəsil mənsubiyyətinə görə zadəgan hesab edilən bir qrup insanın ağalıq etdiyi cəmiyyət deyil, insanların bacarıq, qabiliyyət, çalışqanlıqlarına görə varlana bildikləri bir cəmiyyəti idi. Bu cəmiyyətdə Əbu Bəkr (r.ə) və Ömər (r.ə) kimi keçmiş Daru'n-Nədvə[48] üzvləri ilə keçmiş kölə olan Bilal əl-Həbəşi (r.ə) arasında heç bir fərq yox idi.

Ərəblərin qədim ənənələrindən olan qan intiqamının, qisasın fərdi qaydada tətbiqi qəti qadağan edilmiş, cinayət törədənlərin mühakimə edilərək dövlət tərəfindən cəzalandırılması qaydası bərqərar edilmişdi. Müsəlmanlarla yanaşı İslam cəmiyyətində yəhudilər və xristianlar da yaşayırdılar. Kitab əhli və onlarla yanaşı az sayıdakı məcusilər də İslam cəmiyyətinin cizyə ödəyən zımmi statusu daşıyıcısı idilər. Allah Rəsulunun (s.ə.v) qurduğu cəmiyyətdə zımmilərin dini etiqad, can və mal təhlükəsizliyinin qorunması mövzusunda müsəlmanlardan heç bir fərqi yox idi. Yəhudilər Qureyş müşriklərilə aparılan müharibələr vaxtı İslam cəmiyyətinin əleyhinə düşmənlə əməkdaşlıq etdikləri üçün Mədinədən sürgün edilmişdilər. Vaxt keçdikcə bütün ərəb qəbilə və oymaqlarının İslamı qəbul etməsi ilə Mədinə sırf İslam şəhərinə çevrilmişdi. Bununla yanaşı İslam dövlətinin hakimiyyəti altındakı torpaqlardan Xeybər, Vadi əl-Qura, Fədək, Məkna və Teymada yəhudilər, Əylə, Əzruh, Dumətu'l-Cəndəl və Nəcranda xristianlar, Həcər və Bəhreyndə zərdüştilər[49] yaşayırdılar. Bu qeyri-müsəlman icmalarla İslam dövləti arasında əhdnamələr bağlanmış və onların bütün haqq və hüquqları bu əhdnamələrə əsasən qorunmuşdu.

*Şura*

İslam siyasi və idari işlər mövzusunda idarəedənləri məşvət etməyə təşviq edən bir dindir. Qur'an iki ayəsi ilə açıq və aydın şəkildə şuraya müraciət etmək

---

[48] "Daru'n-Nədvə" cahiliyyə dövründə Məkkəni idarə edən zadəganlar şurası idi.

[49] حدثني يحيى عن مالك عن ابن شهاب قال: بلغني أن رسول الله -صلى الله عليه وسلم- أخذ الجزية من مجوس البحرين، وأن عمر بن الخطاب -رضي الله تعالى عنه- أخذها من مجوس فارس، وأن عثمان بن عفان -رضي الله تعالى عنه- أخذها من البربر

İbn Şihab (r.ə) demişdir: Eşitdim ki, Allah Rəsulu (s.ə.v) Bəhreyn məcusilərindən cizyə almışdır. Ömər ibn Xəttab (r.ə) İran məcusilərindən, Osman ibn Əffan isə (r.ə) bərbərilərdən cizyə almışdır. (Tirmizi, "Sünən", Siyər, 31; Malik ibn Ənəs, "Muvatta'", Kitabu'z-Zəkat, 41)

وحدثني عن مالك عن جعفر بن محمد بن علي عن أبيه أن عمر بن الخطاب -رضي الله تعالى عنه- ذكر المجوس فقال: "ما أدري كيف أصنع في أمرهم؟ فقال عبد الرحمن بن عوف -رضي الله تعالى عنه-: أشهد لسمعت رسول الله -صلى الله عليه وسلم- يقول سنوا بهم سنة أهل الكتاب

Cəfər ibn Muhəmməd ibn Əli (r.ə) atasından belə eşitdiyini söyləmişdir: "Ömər ibn Xəttab (r.ə) məcusiləri nəzərdə tutaraq "onların işlərini necə edim bilmirəm" dedi. Əbdurrəhman ibn Əvf (r.ə) ona belə cavab verdi: "Mən Allah Rəsulunun (s.ə.v) "onlarla əhli-kitab kimi rəftar edin" dediyini şəxsən eşitmişəm". (Malik ibn Ənəs, "Muvatta'", Kitabu'z-Zəkat, 42).

və məşvərət etməyə təkidlə təşviq etməkdədir. Ali-İmran surəsinin 159-cu ayəsi Allah Rəsuluna (s.ə.v) məşvərət etməyi əmr edərkən Şura surəsinin 38-ci ayəsi ümuma aid işlərdə məşvərət edib şurada qərar verməyi möminlərin sifətlərindən biri olaraq bəyan etmiş, məşvərəti namaz və zəkat kimi fərz ibadətlərlə birlikdə zikr etmişdir. Bir idarəedən olaraq Peyğəmbərin (s.ə.v) siyasi və ictimai həyatında şura mühüm yer tutmaqda idi. Səhabələr onu insanlar arasında ən çox məşvərət edən bir şəxs kimi tanıtmışdırlar. Allah Rəsulu (s.ə.v) ümuma aid məsələlər barədə məşvərət etdiyi kimi xüsusi, şəxsi mövzularda da şuranın fikrinə müraciət edərdi. Bu səbəbdən də məşvərət şurası Allahın əmri olduğu kimi, Rəsulunun (s.ə.v) da müəkkəd sunnəsidir. Möminlər məşvərət şurasına müraciət edərkən həm sunnəyə əməl etmiş olurlar, həm də müsəlmanlara aid məsələlərin daha asan və doğru şəkildə həllinə nail olmuş olurlar. Bununla belə İslamda idarəedən şəxsin məşvərət şurasının qərarına mütləq surətdə əməl etməsi vacib sayılmır. Məşvərət idarəedən, son qərarı verən şəxsin müzakirəyə açdığı məsələ barəsindəki məlumatını, fikirlərini, qənaətlərini möhkəmləndirməsi baxımından mühümdür. Lakin İslamın istibdadı rədd etdiyini nəzərə alaraq deyə bilərik ki, idarəedən şəxsin məşvərət şurasının qənaəti istiqamətində hərəkət etməsinin ümumun mənafeyi baxımından böyük əhəmiyyəti vardır və bütün qərarların şuranın razılığı ilə alınmasının faydası böyükdür. Məşvərətin mühüm şərtlərindən biri də müşavirə edəlin şəxslərin müzakirəyə açılan mövzuda mütəxəssis, dərin bilik sahibi olmalarıdır. Qur'an və sunnədə müşavirə edilən şəxslərin sayı barədə heç bir şey bildirilməmişdir. Lakin məşvərət şurasına üzv olan şəxslərdə axtarılan keyfiyyətlər barəsində İslam fiqhində müəyyən kriteriyalar müəyyən edilmişdir. Bunlardan ilki həmin şəxsin müsəlman və əqli-baliğ, yəni yetkin olmasıdır. İkincisi şura üzvünün hürr, yəni azad olub kölə olmaması şərtidir ki, bu həmin şəxsin fikirlərini heç kimin müdaxiləsi olmadan, müstəqil şəkildə bəyan etməsinin təminatı hesab olunur. Digər bir şərt şura üzvünün kişi cinsinə mənsub olmasıdır. Başqa bir şərt şura üzvlərinin müzakirəyə açılan məsələyə dərindən bələd olmaları, bu sahədə ixtisas sahibi olmalarıdır. Şura üzvlərinin heç bir zaman kəbairlə, yəni İslamda böyük günah hesab edilən zina, oğurluq, faiz, qətl, əyyaşlıq kimi əməllərlə suçlanmamış olmaları, zülm etdiklərinə dair dəlilin olmaması, adillikləri ilə tanınmaları da əsas şərtlərdəndir. Allah Rəsulu (s.ə.v) Bədr, Uhud döyüşləri, Hudeybiyyə sülhü kimi mövzularda öz əshabı ilə məşvərət etmiş, aldığı qərarlarda onların fikir və qənaətlərini nəzərə almışdı.

*Hərbi Təşkilat*

Allah Rəsulu (s.ə.v) Mədinə əhdnaməsinin tərtib edilməsindən sonra istər müsəlmanların müdafiəsi məqsədiylə, istərsə də İslami dəvətin qarşısındakı maneələri aradan qaldırmaq üçün İslam ordusunun önündə döyüş meydanlarında vuruşmuşdu. Allah Rəsulun (s.ə.v) həyatda ikən xüsusi olaraq saxlanılan, daimi bir ordu mövcud deyildi. Əli silah tutan hər bir mömin İslamın və müsəlmanların müdafiəsi üçün hərbi mükəlləfiyyət daşıyırdı. Ümumi səfərbərliklər zaman bütün müsəlmanlar orduya cəlb olunurdular. Ayrı-ayrı səriyyələr, yəni kiçik çaplı hərbi yürüşlərdə isə Allah Rəsulu (s.ə.v) könüllülərin iştirak etməsinə üstünlük verirdi. İstər ümumi, istərsə də xüsusi səfərbərliklər zamanı Mədinə yaxınlığında ordugah qurulur və silahlı mücahidlər burada toplanırdı. Səfərdə iştirak edənlərin siyahısı tutulurdu. Eləcə də səfər üçün tədarük edilən silah-sursat, minik və yük hevyanları, azuqənin də qeydiyyatı aparılırdı. Hərbi səfər vaxtı səfərin təyinatını və əsgərlərin sayını Peyğəmbər (s.ə.v) özü müəyyən edirdi. Mücahidlər adətən silah-sursat, minik və azuqələrini özləri təmin edirdilər. Bunu təmin etməyə gücü çatmayanlara beytülmaldan vəsait ayrılırdı. Hər qəbilə başçısı eyni zamanda öz qəbiləsindəki döyüş qabiliyyətli kişilərin komandanı olduğu üçün səfərbərliyin məsuliyyətini də o, daşıyırdı. Səfərin təyinatı, məqsədi, hərbi dəstənin keçəcəyi yollara uyğun olaraq dəstəyə bir və ya bir neçə nəfər bələdçi təhkim edilirdi. Hərbi dəstənin əmirini, yəni komandanını Allah Rəsulu (s.ə.v) özü təyin edirdi. Özünün də iştirak etdiyi hərbi səfərlərdə komandan özü olurdu. Ümumi səfərbərliklər zamanı ordu beş əsas hissədən ibarət olurdu. Bu hissələr avanqard, yəni önçü qüvvələr, sağ cinah, sol cinah, mərkəzi və ardçı qüvvələr. Önçü və ardçı qüvvələrin əsas təyinatı orduya öndən və arxadan edilə biləcək qəfil hücumların qarşısını almaq və mərkəz qüvvələri düşmən hücumundan xəbərdar etmək idi. Ordugah, mərkəzi qərargah və yürüş vaxtı verilən fasilələrdə qurulan düşərgələrin gecə və gündüz keşiyinin çəkilməsi gözətçi-növbətçilərə həvalə edilirdi. Bütün hərbi səfərlərdən əvvəl kəşfiyyatçılar göndərilir, düşmənin vəziyyəti, sayı, təchizatı, mövqeyi barədə məlumat toplanır və İslam ordusunun keçəcəyi yollarda kəşfiyyat aparılırdı. Düşmənin hərəkətlərini izləyən, casusluq fəaliyyəti aparan və lazım gələndə pusqu quran hərbi dəstələr də təşkil edilirdi. Düşmən casuslarının zərərsizləşdirilməsi də bu dəstələrə həvalə edilmişdi. Bütün hallarda düşmənin qan tökülmədən təslim olması üçün lazımi tədbirlər görülürdü. Allah Rəsulu (s.ə.v) hərbi səfərlərin təyinatı, məqsədi və hədəfi ilə bağlı məlumatların gizliliyinin təmini üçün gərəkli bütün tədbirləri gördürürdü. Bunun üçün adətən səfərin təyinatı və hədəfi ilə bağlı yalan və şayiə xarakterli xəbərlər yaydırılırdı.

Ordunun hədəfi cənubda isə ordugahdan şimal istiqamətində ayrılır və xeyli uzaqlaşandan sonra əsl istiqamətə dönülürdü. Hərbi səfərlər vaxtı adətən karvanların və çobanların istifadə etmədikləri güzərgahlardan istifadə olunurdu. Təbük səfəri xaric digər bütün səfərlərdə mücahidlərin böyük əksəriyyəti hədəfə yaxınlaşana qədər səfərin məqsədindən və hədəfindən xəbərdar edilməmişdilər. Bununla Allah Rəsulu (s.ə.v) hərbi sirlərin yayılmasının qarşısını mümkün olan ən üst dərəcədə almağa çalışırdı. Allah Rəsulu (s.ə.v) bütün səfərlərdə orduya əsas döyüş barağı (liva) və hər bir bölüyə də onu digərlərindən fərqəndirən bayraq (rayə) verirdi. Bütün hallarda döyüşdən əvvəl düşmən İslama dəvət edilirdi. Qədim ərəb ənənələrinə uyğun olaraq döyüşlər adətən qarşılaşan ordulardakı igidliyi, cəsurluğu, çevikliyi və pəhləvanlığı ilə məşhur olan cəngavərlərin təkbətək döyüşü ilə başlayırdı. Allah Rəsulu (s.ə.v) düşmənlə qaşılaşıb orduya döyüş nizamı verərkən hava şəraitin mütləq nəzərə alardı. Mövqe tutarkən günəşin mücahidlərin arxasında olmasına diqqət yetirər, günəş şüalarının oxçuların və nizə atanların gözünə düşərək mane olmamasını nəzərə alardı. Döyüş mövqeyi seçərkən İslam ordusunun arxasında dağ və yüksək təpə kimi hündürlüyün olmasına da diqqət yetirirdi. Bu həm pusquya düşərək arxadan qəfil hücuma uğramanın qarşısını alır, həm də zəruri geri çəkilmələr vaxtı hündürlüyə qalxaraq düşmənə yuxarıdan aşağıya doğru əks-hücuma keçmək imkanı verirdi. Bu taktika Uhud döyüşündə tətbiq edilmiş, xeyli müsbət nəticə verərək mücahidləri daha ağır itgilərdən qorumuşdu. Döyüşdən dərhal əvvəl mücahidlərə İslam ordusunun parolu bildirilirdi. Bu yanlışlıqla döyüşün qızığın anında müsəlmanların bir-birlərini yaralayıb öldüməlørinin qarşısını almaq üçün zəruri idi. Uzaq səfələr vaxtı minik olaraq atlar və dəvələrdən istifadə edilirdi. Allah Rəsulu (s.ə.v) İslamın ən qatı düşmənləri ilə belə döyüş meydanında qarşılaşanda mücahidlərə insan ləyaqətini alçaldan hərəkətlərə yol verilməsini qəti qadağan etmişdi. Əsirlərin döyülməsi, işgəncə verilməsi, düşmən cəsədlərinin bədən üzvlərinin kəsilməsi və cəsədlərin təhqir edilməsi qəti surətdə qadağan edilmişdi. İslama və müsəlmanlara düşmənliyi ilə tanınmış bəzi şəxslərin döyüş meydanında qalmış cəsədlərinə qarşı muslə[50] tətbiq edilməsi tələb ediləndə belə Allah Rəsulu (s.ə.v) "*Mən əsla muslə etmərəm, etdirmərəm. Rəsulu belə olsam bu səbəbdən Allahın məni cəzalandıracağından qorxuram*" deyə cavab

[50] عن عبدِاللّٰه بن زيد الانصارى رَضِيَ اُللّٰه عَنْه قال: نَهَى رَسولُ اِللّٰه صل الله عليه وسلم عَنِ النُّهْبَى وَالْمُثْلَى.
Abdullah ibn Zeyd əl-Ənsari (r.ə) dedi: "Peyğəmbər (s.ə.v) yağmalamanı və musləni qadağan etdi". (Buxari, "Səhir", Məzalim 30; Zəbaih 25). Muslə-bədən üzvlərinin kəsilərək cəsədin eybəcər hala salınması. Əbu Səid əl-Xudridən (r.ə) nəql olunan başqa bir hədisdə Peyğəmbərin (s.ə.v) sadəcə insanlarla deyil heyvanlarla da bu şəkildə rəftar etməyi qadağan etdiyi bildirilir.

vermişdi. Allah Rəsulu (s.ə.v) səfərdən əvvəl mücahidlərə xitab edib onları təlimatlandırırdı. O, əli silahlı düşmən əsgərləri xaric düşmən ordusunda rast gəlinən qadınlar, uşaqlar, qocalar, kitab əhlindən olan din xadimləri, kölələr, şikəstlərə toxunmamağı dönə-dönə tapşırırdı. Allah Rəsulu (s.ə.v) İslama və müsəlmanlara xüsusi düşmənliyi ilə seçilmiş, onlara qarşı fiziki zorakılığı ilə ad çıxarmışların edamı xaric əsirlərin öldürülməsini qadağan etmişdi. Əsirlər fidyə əvəzində, müsəlman əsirlə dəyişdirilmək surətilə və ya heç bir şey tələb olunmadan azad edilə bilir yaxud payına düşdüyü mücahid tərəfindən kölə olaraq satıla bilirdi. Əsirlərin döyülməsi və işgəncə edilməsi Peyğəmbər (s.ə.v) tərəfindən qadağan edilmişdi ki, bununla bağlı bir sıra hədislər nəql olunmaqdadır.

Allah və Rəsulu Muhəmməd (s.ə.v) yer üzündə ədalətin bərqərar olmasının, insanların dünya və axirət səadətinə qovuşmasının yeganə yolu olan ilahi ismarıcın, Allahın hökmünün bütün bəşəriyyətə çatdırılması üçün ümməti təşviq etmişdirlər. Lakin bunun necə çətin və məşəqqətli bir iş olduğu, bunun əngəllənməsi üçün şeytanın ləpirlərini təqib edən insanların heç bir əməldən, günahdan və cinayətdən çəkinməyəcəkləri məlum idi. Belə ki, İsa (ə.s), Yəhya (ə.s), Zəkəriyya (ə.s) kimi peyğəmbərlər bu xislətli insanların iblisanə əməllərinin qurbanı olmuş, kimisi öldürülmüş, kimisinin canına qəsd edilmişdi. Allah və Rəsulu (s.ə.v) ilayi-kəlimətullah, yəni Allahın kəlamı olan Qur'anın hökmünün ucaldılaraq bəşəriyyətə çatdırılması uğrunda möminləri mallarını və canlarını əsirgəməməyə təşviq etmişdir. Bu yolda canından keçənlərin Allah nəzdindəki mükafatların ən alisinə layiq olacaqları bildirilmişdi. Bununla da İslamın şəhidlik məfkurəsi ayələr və hədislərlə sarsılmaz təməllər üzərinə bina edilmişdi.

**عَنْ أَبا مُوسَى ، قَالَ : جَاءَ رَجُلٌ إِلَى رَسُولِ اللَّهِ صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : إِنَّ مِنَ النَّاسِ مَنْ يُقَاتِلُ رِيَاءً ، وَمِنْهُمْ مَنْ يُقَاتِلُ حَمِيَّةً ، وَمِنْهُمْ مَنْ يُقَاتِلُ مُحْتَسِبًا ، فَأَيُّ هَؤُلَاءِ الشَّهِيدُ ؟ فَقَالَ رَسُولُ اللَّهِ صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ : " مَنْ قَاتَلَ لِتَكُونَ كَلِمَةُ اللَّهِ هِيَ الْعُلْيَا فَهُوَ شَهِيدٌ »**

Əbu Musa əl-Əş'əri (r.ə) deyir ki: "*Bir gün bir adam Allah Rəsulundan (s.ə.v) soruşdu: "Ey Allahın Elçisi (s.ə.v)! Kimi şücaətini göstərmək, qəhrəmanlıq üçün, bir başqası həmiyyət, öz qövmünün təəssübü səbəbiylə, bir başqası da riyakarlıqla vuruşub öldürülür. Bunların hansı Allah yolundadır?" Peyğəmbər (s.ə.v) ona belə cavab verdi: "Kim Allahın Kəlamını (Qur'anı) ucaltmaq yolunda öldürübsə şəhid olan odur*"[51].

[51] Əbu Davud, *Sünən*, Cihad, 5344

Bu uğurda canından keçənlərin Allah nəzdində necə bir dərəcəyə sahib olduqlarını isə Ənəs ibn Malikdən (r.ə) nəql olunan bir hədisdən öyrənirik. Ənəs ibn Malik (r.ə) Allah Rəsuludan (s.ə.v) belə eşitdiyini demişdir:

النبي صلى ا ُ عَلَيهِ وَسَلمَ قَالَ مَا أَحَدٌ يَدْخُلُ ٱلْجَنَةَ يُحب أَنْ يَرْجِعَ إِلى الدنْيَا وَلَهُ مَا عَلَى ٱلْأَرْضِ مِنْ شَيْءٍ إِلا الشهيدُ يَتَمنى أَنْ يَرْجِعَ إِلى الدنْيَا فَيُقْتَلَ عَشْرَ مَراتٍ لِمَا يَرَى مِنْ ٱلْكَرَامَةِ

"*Cənnətə daxil olmuş heç bir kəs, dünyanın bütün nemətləri ona və'd edilsə belə, dünyaya qayıtmaq istəməz. Yalnız şəhid istisna. Cənnətdə gördüyü ikram və təşrif səbəbiylə (şəhid olaraq ölmək ona elə sevdirilir ki) on dəfə daha dünyaya qayıdıb şəhid olmaq istəyər*"[52].

Bu gözəl kəlamın sahibinə Allahın səlat və səlamı olsun, onu sonrakı nəsillərə çatdıranlardan biri olduğu üçün məşhur azərbaycanlı mühəddis Əbu Bəkr Əhməd Bərdicini (vəfatı 914) rəhmətlə yad edirik.

Allah Qur'anın Ali-İmran surəsi 169-cu ayəsində bu yolda canını vermiş möminləri belə müjdələməkdədir:

وَلاَ تَحْسَبَن الذِينَ قُتِلُواْ فِي سَبِيلِ ا أَمْوَاتًا بَلْ أَحْيَاء عِندَ رَبهِمْ يُرْزَقُونَ

"*Allah yolunda öldürülənləri (şəhid olanları) heç də ölü zənn etmə! Əsl həqiqətdə onlar diridirlər. Onlara Rəbbi yanında ruzi (cənnət ruzisi) əta olunur*".

إِن ا اشْتَرَى مِنَ ٱلْمُؤْمِن أَنفُسَهُمْ وَأَمْوَالَهُم بِأَن لَهُمُ ا نَةَ يُقَاتِلُونَ فِي سَبِيلِ ا فَيَقْتُلُونَ وَيُقْتَلُونَ وَعْدًا عَلَيْهِ حَقًّا فِي التوْرَاةِ وَالإِ يلِ وَٱلْقُرْآنِ وَمَنْ أَوْفَى بِعَهْدِهِ مِنَ ا فَاسْتَبْشِرُواْ بِبَيْعِكُمُ الذِي بَايَعْتُم بِهِ وَذَلِكَ هُوَ ٱلْفَوْزُ ٱلْعَظِيمُ

"*Allah, şübhəsiz ki, Allah yolunda vuruşub öldürən və öldürülən möminlərin canlarını və mallarını Tövratda, İncildə və Qur'anda haqq olaraq vəd edilmiş Cənnət müqabilində satın almışdır. Allahdan daha çox əhdə vəfa edən kimdir? Etdiyiniz sövdəyə görə sevinin. Bu, böyük qurtuluşdur (uğurdur)!*". (Qur'an, Tövbə surəsi, 111).

*Ədli Təşkilat və Məhkəmə-Hüquq Sistemi*

Mədinə əhdnaməsinin bir sıra maddələri bu əhdnaməyə daxil olmuş qrupların siyasi, hərbi və maliyyə mövzularında görəcəkləri tədbirləri, atacaqları addımları tənzim və təsbit etməkdə idi. Əhdnamə həmçinin hüquq və ədliyyə kimi sahələrə dair hökmləri də ehtiva edirdi. Bu hökmlərlə fərdlərin və qəbilələrin öz haqlarını özlərinin qoruması ənənəsini aradan qaldırmışdı.

[52] Tirmizi, *Sünən,* Fəzailu'l-Cihad, 1643.

Hüquqi və ədli mövzularda alınmış qərarların yerinə yetirilməsi səlahiyyəti mərkəzi hakimiyyətə verilmişdi. Mədinə əhdnaməsilə Mədinə İslam dövlətinin hüdudları daxilində yaşayan və bu əhdnaməyə qoşulan hər kəs üçün Allah və Rəsulu (s.ə.v), başqa sözlə desək Qur'an və sunnə ali qanunverici və mühakiməedici mərci', müraciət məqamı kimi təsbit olunmuşdu. Mədinə İslam dövlətinin qurulduğu ilk gündən etibarən hər növ mübahisələr və ixtilaflar Allah Rəsulu (s.ə.v) tərəfindən həll edilirdi. O, bütün ixtilaflı, çəkişməli mövzularda Qur'anın hökmlərinə müraciət edir, Qur'anda bəyan edilməyən xüsuslarda isə öz ictihadı ilə hökm verirdi. Allah Rəsulu (s.ə.v) oğurluq, zina, əyyaşlıq, yaralama, qətl, qarət və bənzər mahiyyətdəki cinayətləri törətmiş cinayətkarlara Qur'anın müəyyən etdiyi cəzaları tətbiq edirdi. Allah Rəsuluna (s.ə.v) sadəcə cinayətlərlə bağlı şikayətlər edilmirdi. Miras ixtilafları, ev, mülk, torpaq, su quyusu, su kanalı kimi əmlak məsələri, nəsil mənsubiyyəti, borclar və s. bu kimi mülki çəkişmələr və ixtilaflarla bağlı olaraq da insanlar Peyğəmbərə (s.ə.v) müraciət edirdilər. Allah Rəsulu (s.ə.v) ilk dövrlərdə ayrı-ayrı qəbilə və bölgələrə vali təyin etdiyi səhabələrə həmçinin orada meydana gələn hüquqi və ədli məsələləri həll etmək tapşırığı da vermişdi. Yəni valilər eyni zamanda qazı idilər. Lakin Mədinə İslam dövlətinin hüdudları genişlədikcə istər müsəlman, istərsə də qeyri-müsəlman əhalinin sayı artdıqca valilərin işləri xeyli çoxalmış və onların ədliyyə işlərinə baxmaları çətinləşmişdi. Buna görə də Allah Rəsulu (s.ə.v) valilərin sadəcə idari işlərlə məşğul olmasını, maliyyə işləri ilə amillərin, ədliyyə işləri ilə isə qazılarin məşğul olmasını əmr etmiş və bu vəzifələrin hər birinə ayrı şəxsi təyin etmişdi. Hətta Mədinə şəhərinin özündə ədli və hüquqi məsələlərlə bağlı müraciətlərin çoxalması Mədinədə bu işi bir neçə nəfərə həvalə etmək, yəni qazılığa təyin etmək zərurətini meydana çıxarmışdı. Bununla yanaşı qazıların verdiyi hökmdən narazı qalanlar Allah Rəsuluna (s.ə.v) müraciət edə bilirdilər ki, bu da bir növ appelyasiya şikayəti xarakterini daşıyırdı. Bəzən də onun təyin etdiyi qazı ixtilaflı məsələ ilə bağlı hökm verir, Allah Rəsulunun (s.ə.v) təsdiqilə bu hökm icra olunurdu. Məsələn iki qardaşın mübahisəli ərazi üzərində inşa edilmiş evin kimə məxsus olması ilə bağlı etdikləri şikaləyti Allah Rəsulu (s.ə.v) Huzeyfə ibnü'l-Yəmana (r.ə) həvalə etmiş, Huzeyfə (r.ə) Mədinə yaxınlığındakı həmin evin olduğu yerə gedib baxmış, şahidləri dinləyərək məsələni araşdırmış və verdiyi qərarı Peyğəmbərə (s.ə.v) bildirmişdi. Allah Rəsulu (s.ə.v) Huzeyfənin (r.ə) verdiyi qərarı təsdiq etmişdi. Allah Rəsulu (s.ə.v) qazılığa, yəni hakimliyə Qur'anı və sunnəni yaxşı bilən, fiqhi məsələlərə dərindən bələd olan, çəkişən tərəflərin təqdim edəcəkləri dəlilləri və əl atacaqları hilələri qavraya biləcək kəskin zəka sahibi, fəhmi açıq

olan səhabələri təyin edirdi. Bu iş üçün adam seçərkən yaşının çox olmasını nəzərə almazdı. Məsələn Əli ibn Əbu Talib (r.ə) və Muaz ibn Cəbəl (r.ə) Peyğəmbər (s.ə.v) tərəfindən qazı təyin edərkən 24-25 yaşında idilər. Zeyd ibn Sabit (r.ə) qazı təyin edilərkən yaşı bundan da kiçik idi. Allah Rəsulunun (s.ə.v) tez-tez qazı olaraq vəzifələndirdiyi səhabələrdən Ömər ibn Xəttab (r.ə), Əli ibn Əbu Talib (r.ə), Muaz ibn Cəbəl (r.ə), Abdullah ibn Məs’ud (r.ə), Ubeyy ibn Kə’b (r.ə), Zeyd ibn Sabit (r.ə), Əbu Musa əl-Əş’əri (r.ə), Uqbə ibn Amir (r.ə), Huzeyfə ibnü’l-Yəmanın (r.ə) adlarını sadalaya bilərik. Allah Rəsulu (s.ə.v) və təyin etdikləri qazılar ixtilaflı məsələlərə adətən məsciddə və ya öz evlərində baxırdılar, yəni ayrıca bir məhkəmə binası yox idi. Allah Rəsulu (s.ə.v) yəhudi və xristianların ixtilaflı məsələrini öz hakimlərinə müraciət edərək həll etmələrinə izn vermişdi. Bununla yanaşı kitab əhlindən ona müraciət edənlərin ixtilaflarını İslam hüququna əsaslanaraq həll edirdi. Əgər çəkişən tərəfin biri müsəlman digər kitab əhli idisə bu ixtilafı Allah Rəsulunun (s.ə.v) özü və ya müsəlman bir qazı həll edirdi. Allah Rəsulu (s.ə.v) müsəlmanların mübahisəli məsələləri öz aralarında razılaşaraq barışıq yolu ilə həll edilməsini tərəfdarı olmuşdur. Səfvan ibn Muəttəl səhabələrdən şair təbiətli Həssan ibn Sabitin (r.ə) söylədiyi bir şeer xətrinə dəydiyi üçün onunla mübahisə etmiş və qılıncı ilə Həssanı (r.ə) yaralamışdı. Peyğəmbər (r.ə) onların hər ikisini çağırıb dindirmiş və məsələdən təfərrüatı ilə xəbərdar olmuşdu. Söylədiyi şeerdə təhqiramiz ifadə olduğu üçün Həssan ibn Sabiti (r.ə) qınayan Allah Rəsulu (r.ə) cinayət törətdiyi üçün Səfvanı həbs etdirmiş və Həssanın (r.ə) aldığı yara səbəbiylə öləcəyi təqdirdə Səfvan ibn Muəttələ qisas tətbiq edilərək edam ediləcəyinə dair hökm vermişdi. Bu hadisə səbəbiylə Sə’d ibn Ubadə (r.ə) Həssan ibn Sabit (r.ə) və ailəsi ilə danışaraq onların Allah Rəsuluna (s.ə.v) müraciət etmələrini və Səfvanla halallaşıb barışdıqlarını, şikayəti geri götürdüklərini bildirmələrini xahiş etmişdi. Həssan ibn Sabit (r.ə) bu xahişi qəbul edərək Allah Rəsuluna (s.ə.v) şikayətini geri götürməsi ilə bağlı müraciət etmişdi. Həssanın (r.ə) bu müraciətindən sonra Peyğəmbər (s.ə.v) Səfvan ibn Muəttəlin azad edilməsini əmr etmişdi. Allah Rəsulu (s.ə.v) Həssanın (r.ə) bu hərəkətindən məmnun qalmış, ona mülk və Misir hökmdarının özünə göndərdiyi Şirin adlı kənizi hədiyyə etmişdi. Sə’d ibn Ubadəyə (r.ə) isə etdiyi vasitəçilik səbəbiyə Mədinədə bir bağça bağışlanmışdı. Allah Rəsuluna (s.ə.v) hüquqi məsələrlə bağlı edilən müraciətlər, Peyğəmbərin (s.ə.v) məhkəmə işlərinə baxma və mühakimə üsulu, verdiyi məhkəmə qərarlarını ehtiva edən əsərlər də qələmə alınmışdır. Bunların mövzunu ən geniş əhatə edəni və ən məşhurlarından biri Əbu Abdullah Muhəmməd ibn Fərəc ət-Təlla əl-Qurtubinin (1014-1104) “*Kitabu Əqziyyətu’r-Rəsulullah*” adlı əsədiridir.

*İqtisadi Sistem*

Öz iradəsinə və rizasına uyğun bir cəmiyyətin, İslam cəmiyyətinin formalaşmasını diləyən Allah insan həyatının bütün sahələrinə, o cümlədən iqtisadi-ticari həyata dair ayələr nazil etmişdi. Peyğəmbər (s.ə.v) Qur'anın iqtisadi-ticari mövzulardakı ayələrini, hökmlərini açıqlayır bu sahədə ciddi islahatlar həyata keçirirdi. Allah Rəsulu (s.ə.v) özü gənclik illərindən bəri ticarətlə məşğul olmuş, istər ərəblərin, istərsə də qonşu ölkələrin bazarlarına və ticarət ənənələrinə yaxşı bələd olan təcrübəli və bacarıqlı bir tacir idi. Hicrətdən əvvəl və hicrətin ilk illərində Mədinənin iqtisadi-ticari həyatına yəhudi tacirlər hakim idilər. Bazarlar onların əlində idi. Bu bazarlarda ticarətlə məşğul olan müşrik və yəhudi tacirlər qədim ənənələrə, cahiliyyə adətlərinə uyğun hərəkət edirdilər. Allah Rəsulu (s.ə.v) Mədinənin bazarlarını gəzib bu bazarların müsəlmanların ticarətlə məşğul olmaları üçün əlverişli olmadığı qənaətinə gəlmişdi. İslamın iqtisadi mövzulardakı hökmlərinin tətbiq edilə bilməsi üçün müsəlmanların öz bazarının qurulmasına ehtiyac duyulmaqda idi. Bunun üçün Mədinənin Bəni-Saidə məhəlləsindəki bir ərazi münasib görülərək seçilmiş və bazar nizamnaməsi tərtib edilmişdi. Bu bazarda hər tacirin daim ticarətlə məşğul olduğu yerlərin müəyyən edilməsi, yəni ayrı-ayrı şəxslərə aid dükanların olması və dükan vergisi alınması qadağan edilmişdi. Ticarət sahəsində böyük təcrübəyə malik olan Allah Rəsulu (s.ə.v) bazardakı yerlərin daimi şəxslərlər tərəfindən məşğul edilməməsi və bazar vergisinin alınmamasının istər əcnəbi, istərsə də yerli tacirləri özünə cəlb edəcəyini bilirdi. Bu həm əmtəə bolluğunun, həm də sərbəst rəqabət şəraitinin yaranmasını təmin edəcəkdi. Mədinə bazarları əsasən yəhudi Bəni-Qaynuqa qəbiləsinə mənsub tacirlərin nəzarətində idi. Onlar bu bazarları qismlərə bölərək icarəyə vermişdilər və tacirlərdən vergi almaqda idilər. Allah Rəsulunun (s.ə.v) Bəni-Saidə məhəlləsində qurdurduğu bazar tezliklə Bəni-Qaynbuqa bazarının kasadlaşmasına səbəb olmuşdu. Allah Rəsulu (s.ə.v) Bəni-Saidə bazarına nəzarət işini Ömər ibn Xəttaba (r.ə) həvalə etmişdi. Məkkənin fəthindən sonra bu şəhərin iqtisadi-ticari işlərinə nəzarəti isə Səid ibn əl-Asa (r.ə) tapşırmışdı.

İslam ticarəti halal qılıb təşviq etmiş, faiz və sələmçiliyi isə mərhələ-mərhələ haram buyurub qadağan etmişdi. Ticarətin hər növü və bütün borclar sələmçiliyin ağır yükündən xilas edilmişdi. Məkkə və Taifin ticarət həyatını müşrik ərəb zadəganları faizlə zəhərləməkdə idilər. Mədinədə isə bu işi yəhudi tacirlər görürdülər. Hicri 5-ci ilin ilk aylarında (iyun-iyul 626) Ali-İmran surəsinin 130-cu ayəsi ilə sələmçilik haram buyurulmuşdu. Daha sonra nazil olan Bəqərə surəsinin 275-279-cu ayələri ilə faiz və sələmçiliyin hər növü qəti qadağan edilmişdi. Allah Rəsulu (s.ə.v) vəfatından əvvəl yarımadanın hər tərəfinə,

bütün qəbilə və oymaqlara mübəlliğlər göndərərək faiz və sələmçiliyini qəti qadağan olunduğunu bəyan etmişdi.

Allah Rəsulu (s.ə.v) möhtəkirliyi qəti qadağan etmişdi. Möhtəkirlər əmtəəni bazardan toplayıb malın təklifini gecikdirir, beləcə süni qıtlıq yaradaraq bahalaşmaya səbəb olurdular. Ələlxüsus təməl ehtiyac maddələrinin möhtəkirliyi ilə məşğul olanlar cəmiyyətin bundan əziyyət çəkməsinə səbəb olurdular. Allah Rəsulu (s.ə.v) bəzi hədislərində möhtəkiri pisləmiş, lənətləmişdi.

Allah Rəsulunun (s.ə.v) iqtisadi-ticari sahədə qadağan etdiyi fəaliyyətlərdən biri də inhisar idi. Məlum olduğu kimi Mədinə də Məkkə kimi şimal-cənub ticarət yolunun üzərində yerləşirdi. Şam diyarından Yəmənə və əks istiqamətə hərəkət edən ticarət karvanları, eyni zamanda yarımadanın müxtəlif yerlərindən gələn tacirlər Mədinə bazarında bir müddət dayanırdılar. Bəzi yerli tacirlər karvanların şəhərə yaxınlaşdığı xəbərini alan kimi dərhal yola çıxır, karvan şəhərə daxil olmadan bəzi malların hamısını səyahət edən tacirlərdən ucuz qiymətə alır, sonra Mədinə bazarlarına gətirərək istədikləri qiymətə satırdılar. İstehsalçının və istehlakçının bu kimi möhtəkirlik və inhisarçılıqdan qorunması məqsədiylə Allah Rəsulu (s.ə.v) karvanların, həm də kənd təsərrüfatı mallarını şəhərə gətirən ayrı-ayrı şəxslərin Mədinə bazarına daxil olmadan mal satmasını qadağan etmişdi. Bu cür satışların qarşısını almaq və qadağanı təsirli şəkildə tətbiq edə bilmək üçün Mədinəyə gələn yollara xüsusi adamlar təyin edilmişdi. Beləcə tacirlər Mədinə bazarına daxil olur, oradakı qiymətləri öyrənir və mallarını bazarın müəyyən etdiyi qiymətə sata bilirdilər. Bu tədbir iri sərmayə sahiblərinin müxtəlif əmtəələri öz inhisarları altına almalarının qarşısını almışdı. Həm də daha az sərmayəyə sahib olan tacirlərin də eyni əmtəəni bazara çıxarmasına imkan yaradaraq sərbəst rəqabət şəraiti yaratmışdı. Allah Rəsulu (s.ə.v) heç vaxt narx tətbiq etməmiş, sərbəst rəqabətə, tələb və təklifə uyğun olaraq qiymətləri bazarın müəyyənləşdirməsinə üstünlük vermişdi. Bununla belə qiymət müəyyən edərkən tacirin əxlaqi normalara əməl etməsini tövsiyə etmişdi. Fahiş, yəni ifrat baha qiymətə mal satan tacirlərə xəbərdarlıq edilir, xəbərdarlıqdan nəticə çıxarmayanlar cəzalandırılırdılar.

Allah Rəsulu (s.ə.v) hiylənin insanı dünyada və axirətdə ağır məsuliyyət altında qoyan haram, pis və yanlış bir davranış olduğunu bildirmişdir. Ticari fəaliyyətlərdə hiyləyə əl atanlar üçün (مَنْ غَشَنَا فلَيْسَ مِنا) "*bizi (müsəlmanları) aldadan bizdən (müsəlman) deyildir*"[53] buyurmuşdur. Allah Rəsulu (s.ə.v) bu sözü bir buğda tacirinin satdığı buğdanın içinə əlini salaraq alt qatlardakı buğ-

---

[53] Muslim, "*Səhih*", İman, 164.

danın nəm olduğunu gördüyü vaxt demişdi. O, tacirdən bunun səbəbini soruşanda tacir yağışın buğdanı islatdığını demiş, Allah Rəsulu (s.ə.v) da ona müştərilərin də bilməsi üçün buğdanın alt hissəsini üstə çıxarmasını tapşırmışdı. Peyğəmbər (s.ə.v) alış-veriş vaxtı malını sata bilmək üçün and içməkdən insanları çəkindirmişdi. Allah Rəsulundan (s.ə.v) nəql olunan bir hədisdə o, Allahın nifrət etdiyi üç növ adamdan bəhs edərək bunların etdiyi yaxşılığı başa qaxanc edən, geydiyi paltarlara təkəbbürlülük edən və yalandan and içərək malının dəyərini artırıb satışını asanlaşdırmaq istəyən tacir olduğunu bildirmişdi[54].

Peyğəmbər (s.ə.v) ehtisabı, yəni bazarların və ticarət yerlərinin yoxlanılmasını tez-tez özü həyata keçirirdi. Ümumiyyətlə bu işi üçün möhtəsiblər təyin olunurdu. Yuxarıda Ömər ibn Xəttabın (r.ə) Mədinə, Səid ibn əl-Asın (r.ə) isə Məkkə möhtəsibliyinə təyin edildiyini qeyd etmişdik. Ömər ibn Xəttab (r.ə) istər xəlifə olana qədər, istərsə də xəlifə olduqdan sonra bu işi ciddi nəzarət altında saxlamışdı. İslam dövlətinin ərazisində ticarətlə məşğul olan istər müsəlman, istərsə də qeyri-müsəlman tacirlərin İslamın bu mövzudakı əmr və qadağalarını, qanunlarını yaxşı bilməsi tələb olunurdu. Bu səbəbdəndir ki, Ömər ibn Xəttab (r.ə) belə demişdir: (**يَبعْ سُوقَنا إِ مَنْ قَدْ تَفَقَهَ الدين**) "*bazarlarımızda dinimizi anlayıb qavrayanlar satışla məşğul olsunlar*"[55]. Qur'anın haram buyurduğu xəmr (sərxoşluq verən hər cür maddə), donuz əti və ondan hazırlanan məmulatlar, leş (ölü heyvan əti), Allahdan başqasının adına kəsilmiş heyvanın əti, büt, istər vəhşi, istərsə də əhilləşdirilmiş yırtıcı (pişik, it və s.) heyvan ətinin satılması da qadağan edilmişdi. Sadəcə satışla deyil bir sıra haram yollarla qazanc əldə edilməsini də İslamın hökmləri qadağan etməkdə idi. Bunlardan sehrbazlıq, falçılıq, rəqqasəlik, nəğmə oxuyaraq gəlir əldə etmək, müğənni kənizlərdən gəlir əldə etmək, fühuşdan (fahişəlikdən) və ya buna vasitəçilik edərək gəlir əldə etmək, qumar oynamaq və oynatmaq, faiz almaq, vermək və vasitəçi olaraq faizdən gəlir əldə etmək, müsəlmanlarla müharibə vəziyyətində olanlara silah-sursat sataraq gəlir əldə etməyi sadalaya bilərik.

Peyğəmbər (s.ə.v) ticarətdə düzgünlüyə təşviq etmiş, dürüst davranan tacirlərin axirətdə peyğəmbərlər və şəhidlərlə birlikdə olacağını bildirmişdir. (**التَاجِرُ ا ُ الصدُوقُ مَعَ النِبيينَ والصدِ والشهَداءِ والصالحِ**) "*Etibarlı və dürüstlüyü tərk etməyən tacirlər peyğəmbərlər, sıddıqlar, şəhidlər və saleh insanlarla birlikdə*

---

[54] عن أبي ذر رَضِيَ أُللهُ عَنه قال: قَالَ رَسُولُ اللّه صل الله عليه وسلم: ثَلَاثَةٌ لَا يُكَلِّمُهُمُ اللّهُ وَ لَا يَنْظُرُ إِلَيْهِمْ يَوْمَ الْقِيَامَةَ وَ لَا يُزَكِّيهِمْ وَلَهُمْ عَذَابٌ أَلِيمٌ قَالَهَا ثَلَاثاً، قُلْتُ: خَابُوا وَخَسِرُوا يَا رَسُولَ اللّهِ، مَنْ هُمْ؟ قَالَ: الْمُسْبِلُ، وَالْمَنَّانُ، وَالْمُنْفِقُ سِلْعَتَهُ بِالْحَلِفِ الْكَاذِبِ. (Müslim, *Səhih*, İman, 171; Əbu Davud, *Sünən*, Libas 28; Tirmizi, *Sünən*, Buyu', 5)

[55] Tirmizi, *Sünən*, Vitr, 21.

*olacaqlar*"[56]. Öz alıcısı və borclusu üçün şərtləri əlverişli hala gətirənlər üçün isə Peyğəmbər (s.ə.v) xeyir-dua etmişdir. Hüzeyfə ibnü'l-Yəmanın (r.ə) bununla bağlı nəql etdiyi hədisdə Allah Rəsulu (s.ə.v) belə buyurmuşdur:

أَن رَجُلا مَاتَ فَدَخَلَ الْجنةَ ، فَقِيلَ لَهُ : مَا كُنتَ تَعْمَلُ ؟ فَإما ذَكَرَ وَإما ذُكِرَ ، فَقَالَ : إِني كُنتُ أُبَايِعُ الناسَ ، فَكُنتُ أُنظِرُ الْمُعْسِرَ ، وَأَتَجَوزُ فِي السكةِ أَوْ فِي النقْدِ ، فَغُفِرَ لَه

*"Ölüb cənnətə daxil olan bir şəxsdən soruşacaqlar "cənnətə girmək üçün dünyada hansı əməli işlədin?" O, belə cavab verəcək "mən insanlara ticarət malı satardım, maddi darlıqda olanlara möhlət verər, vəziyyətləri düzələnə qədər borclarını ödəmələri üçün onları gözləyərdim, nəğd satarkən də alacağımın bir qismini bağışlayardım". Bundan ötürüdür ki, uca Allah onu bağışlamışdı*"[57].

Ölçü alətlərində hiyləyə əl atanlar həm Qur'anda, həm də hədislərdə ağır ifadələrlə pislənmişdirlər. (وَيْلٌ لِّلْمُطَفِّفِينَ) "*vay halına çəkidə və ölçüdə aldadanların*!"[58]. Allah Rəsulu (s.ə.v) keyfiyyətsiz, çürük və xarab malın bazara çıxarılmasını qadağan etmiş, bu cür malın keyfiyyətli mala qarışdırılaraq satılmasının qarşısını almaq üçün tədbirlər görmüşdü. Malının qüsurunu bilə-bilə gizlədən satıcı hədislərdə qınanmaqdadır. Qiymət endirmək və ya qaldırmaq üçün bəhs qızışdırmaq da qadağan olunan əməllərdən idi. Peyğəmbər (s.ə.v) uzunluq, çəki kimi ölçü vahidlərini sabitləmiş və bunların daim nəzarətdə saxlanılmasını təmin etmişdi.

## Muhəmməd Peyğəmbərin (s.ə.v) Vəfatı

### *Vida Həcci*

Allah Rəsulu (s.ə.v) hicri 10-cu ilin zilqədə ayında (fevral 632) həcc ziyarəti üçün hazırlıqlar görməyə başlamış, Mədinədə və Mədinə xaricində yaşayan bütün müsəlmanlara həcc ziyarəti üçün hazırlaşmaları xəbərini göndərmişdi. Bu xəbərin yayılmasından sonra minlərlə müsəlman minikli və piyada olaraq Mədinəyə gəlmiş, kimisi şəhərdə, böyük əksəriyyəti isə Mədinə yaxınlığında düşərgə salaraq qalmışdılar. Yola çıxmamışdan əvvəl Allah Rəsulu (s.ə.v) namazlardan sonra, ələlxüsus cümə xütbələrində möminlərə həcc haqqında danışmış, həccin rüknlərini izah etmişdi. Yola çıxmamışdan əvvəl Peyğəmbər (s.ə.v) Əbu Dücanə Simak ibn Əvs əl-Ənsarini (r.ə) öz yerinə Mədinədə vəkil təyin etmişdi. Bu həcc vaxtı qurban kəsmək üçün Allah Rəsulu (s.ə.v) 100-ə yaxın dəvə tədarük

[56] Muslim, *Səhih*, Buyu', 194.
[57] Müslim, *Səhih*, Kitabu'l-Musaqat, 2927.
[58] Qur'an, Mutəffifin surəsi 1-ci ayə.

etmişdi. Hicri 10-cu il zilqədə ayının 24-ü (20 fevral 632) Allah Rəsulu (s.ə.v) əshabı ilə birlikdə Mədinədən Məkkəyə doğru yola çıxmışdı. Qadınlar dəvələrin üstünə qurulmuş kəcavələrdə yola çıxmışdılar. Mədinədən 11-12 km cənub-şərqdə yerləşən Zülhuleyfəyə çatandan sonra Peyğəmbər (s.ə.v) dörd rəkat olan fərz namazlarını iki rəkat olaraq qılmağa başlamış və həcc üçün ehrama girmişdi. Allah Rəsulu (s.ə.v) Zülhuleyfədə həcc üçün yola çıxmış bütün müsəlmanların gəlib çatmasını gözləmişdi. Əshabından əksəriyyətinin Zülhuleyfəyə çatmasından sonra Allah Rəsulu (s.ə.v) ehramlı olaraq təlbiyyələrlə yola rəvan olmuşdu. Allah Rəsulu (s.ə.v) Məkkəyə çatandan sonra onunla birlikdə həcc üçün yola çıxmış möminlərlə birlikdə həcc ziyarətinin rüknlərini yerinə yetirməyə başlamışdı. Peyğmbər (s.ə.v) həcc üçün yola çıxmamışdan çox daha əvvəl Əli ibn Əbu Talibin (r.ə) əmrinə bir dəstə əsgər verərək Yəmənə göndərmişdi. Bu hərbi səfər deyildi, Əli ibn Əbu Talib (r.ə) Yəmənə illik zəkat vergisini toplamaq üçün göndərilmişdi. Həcc ziyarəti davam edərkən Əli ibn Əbu Talib (r.ə) gəlib Məkkəyə çatmışdı. O, da ehramlı idi və həcc üçün niyyət etmişdi. Həcci Allah Rəsulu (s.ə.v) ilə birlikdə edə bilmək üçün yanındakı əsgərlərin əmirliyini yoldaşlarından birinə həvalə edərək özü Məkkəyə tələsmişdi.

Allah Rəsulu (s.ə.v) Minadan Ərəfata gəlib bir müddət burada qaldıqdan sonra günorta vaxtı Ərəfatda toplanmış, sayı 100 mini aşan insan kütləsinə xitab etmişdi. Bu xütbədən bir qədər əvvəl Allah Qur'anın Maidə surəsi 3-cü ayəsini nazil etmişdi, bu Allahın öz Rəsuluna (s.ə.v) etdiyi son vəhy idi. (ٱلْيَوْمَ أَكْمَلْتُ لَكُمْ دِينَكُمْ وَأَتْمَمْتُ عَلَيْكُمْ نِعْمَتِي وَرَضِيتُ لَكُمُ ٱلْإِسْلَامَ دِينًا) "*Bu gün dininizi sizin üçün kamil etdim, sizə olan nemətimi tamamladım və sizin üçün din olaraq İslamı bəyənib seçdim*". İzdihamın arasında müəyyən məsafələrdə dayanmış gur səsli bir neçə nəfər Allah Rəsulunun (s.ə.v) sözlərini uca səslə hamının eşitməsi üçün təkrar edirdilər. Vida xütbəsi kimi tanınan bu xütbənin mənti aşağıdakı kimidir:

*"Həmd ancaq Allaha məxsusdur. Biz ona həmd edir, ondan yardım diləyir, əvfimizi ondan istəyirik. Nəfslərimizin şərrindən və əməllərimizin pisliyindən Allaha sığınırıq. Allahın doğru yola, hidayətə gətirdiyini heç kim bu yoldan azdıra bilməz, Allahın yolundan sapdırdığını isə artıq heç kim doğru yola gətirə bilməz. Şahidlik edirəm ki, Allahdan başqa ilah yoxdur, O, təkdir və heç bir şəriki yoxdur. Və şahidlik edirəm ki, Muhəmməd (s.ə.v) onun qulu və elçisidir.*

*Ey Allahın qulları! Sizə Allahdan qorxub çəkinməyinizi tövsiyə edirəm və sizi Allaha itaətə təşviq edirəm. Beləcə sözlərimə sözün ən xeyrlisi ilə başlayıram. Ey insanlar! Sözlərimi diqqətlə dinləyin. Çünki bimirəm, bu ildən sonra olduğum bu yerdə bəlkə də artıq sizinlə görüşməyəcəyəm.*

*Ey insanlar! Qanlarınız, mallarınız, heysiyyət və şərəfiniz Rəbbinizə qovuşacağınız günə qədər bu yerin, bu ayın və bu günün müqəddəs və toxunulmaz olduğu kimi toxunulmazdır. Diqqət edin, təbliğ etdimmi? Ey Allahım sən şahid ol.*

*Əmanət olaraq hər hansı bir şey əlində olan şəxs onu əmanət sahibinə qaytarmalıdır. Şübhəsiz ki, cahiliyyə dövründəki faiz və sələmin hər növü haram buyurulmuş, ləğv və qadağan edilmişdir. Lakin verdiyiniz borc olduğu kimi borc verənindir, bu haqda nə zülmə uğrayacaqsınız, nə də zülm edəcəksiniz. Allah faizin, sələmin mövcud olmamasını əmr buyurdu. Ləğv etdiyim ilk sələm əmim Abbas ibn Əbdülmüttəlibin (r.ə) alacağı olan sələmdir.*

*Şübhəsiz ki, cahiliyyə dövründəki qan düşmənçiliyi, qisas ləğv və qadağan edilmişdir. Ləğv etdiyim ilk qan düşmənliyi, qisas əmim oğlu Amir ibn Rəbiə ibn Haris ibn Əbdülmüttəlibin qanının qisasıdır.*

*Cahiliyyə dövründə Məkkədə mövcud olmuş bütün idari vəzifələr ləğv və qadağan edilmişdir. Kə'bə mühafizliyi və hacılara su paylanması işi bundan istisnadır...".*

Allah Rəsulunun (s.ə.v) vida xütbəsinə davam edərkən qadınların öz ərlərinin yanında Allahın əmanəti olduqlarını, ərin arvadı üzərindəki, arvadın da ərinin üzərindəki haqq və hüquqlarını sadalamışdı. Kölə sahiblərinin əlləri altındakı kölələrə zülm etməyib insan kimi rəftar etmələrini öyüd etmişdi. Müsəlmanların bir-biri ilə din qardaşı olduqlarını bəyan etmişdi. Bütün insanların Adəmin (ə.s) nəslindən törədiklərini, heç kimin heç kim üzərində üstünlüyünün olmadığını, Allahın nəzərində üstünlüyün sadəcə təqva ilə olduğunu vurğulamışdı. Burada dediklərinin eşitməyənlərə çatdırılmasını nəsihət etmişdi. Allah Rəsulu (s.ə.v) vida xütbəsində bu dörd günahdan xüsusilə, şiddətlə uzaq durulmasını əmr etmişdi: tövhidi tərk edərək Allaha şərik qoşmaq, qəstən adam öldürərək nahaq qan tökmək, zinakarlıq və oğurluq etmək.

Əli ibn Əbu Talib (r.ə) həcc ziyarətini başa vurandan sonra onun Yəməndən Məkkəyə gələrkən geridə qoyduğu əsgərlərin şəhərə yaxınlaşdığı xəbərini almış və onları qarşılamağa çıxmışdı. Əsgərlər Məkkəyə səfər paltarlarında deyil, təmiz və təzə paltarda daxil olmaq istəmiş və zəkat mallarından olan paltarlardan seçib geymişdilər. Onların bu halını görən Əli ibn Əbu Talib (r.ə) qəzəblənərək öz yerinə vəkil təyin etdiyi şəxsdən bunun səbəbini soruşmuşdu. Həmin şəxs adamlarının Məkkəyə daxil olarkən daha yaxşı görkəmdə olmasını arzu etdiyi üçün buna icazə verdiyini bildirəndə Əli (r.ə) onlara "*vay olsun sizin halınıza, Allah Rəsulunun (s.ə.v) yanına getməmişdən əvvəl dərhal bunları çıxarıb yerinə qoyun*" deyə əmr etmişdi. Əli (r.ə) ilə birlikdə Yəmənə səfər edənlər onun bütün səfər boyu onlara qarşı sərt davranmasından, nəhayət bu so-

nuncu davranışından narazı qalaraq Peyğəmbərə (s.ə.v) şikayət etmişdilər. Allah Rəsulu (s.ə.v) onların şikayətinin yersiz olduğunu, Əlinin (r.ə) Allahın rizasından başqa hər hansı bir şey üçün qəzəblənməyəcəyini bildirmişdi. Buna baxmayaraq şikayətçilərin narazılığı kəsilməmiş, onlar Əli ibn Əbu Talibi (r.ə) sərt davranışları ilə ifrata varmaqda və xəsislikdə təqsirləndirməyə çalışmışdılar. Həcc ziyarətindən sonra Mədinəyə yola çıxarkən də bu mübahisə və şikayətlər kəsilməmişdi. Məkkə ilə Mədinə arasındakı Cuhfə adlı yerin yaxınlığındakı, Qədri-Xumm kimi tanınan yerə çatanda Allah Rəsulu (s.ə.v) fasilə verilməsini əmr etmişdi. Burada camaatla namaz qılınandan sonra Allah Rəsulu (s.ə.v) bu mövzu ilə bağlı bütün möminlərə xitab etmək məcburiyyəti hiss etmişdi. Məqsədi Yəmən səfərində ona yoldaşlıq etmiş şəxslərin Əli ibn Əbu Talib (r.ə) haqqındakı narazılıq və şikayətlənmələrinə son qoymaq idi. O, bu xütbəsində "*Ey insanlar! Əli (r.ə) haqqında şikayət etməkdən əl çəkin. Allaha and olsun ki, Əli (r.ə) Allah yolundan başqa bir şey üçün sərt davranmamışdır. Mənə Allahdan dəvət gəldi. Mən də bu dəvəti qəbul etdim. Sizin aranızda iki əmanət qoyub gedəcəyəm, Allahın kitabı Qur'anı və ev əhlimi*[59]*. Allah mənim mövlamdır, mən də hər bir möminin mövlasıyam*" demiş, daha sonra Əli ibn Əbu Talibin (r.ə) əlini tutub qaldıraraq sözünə belə davam etmişdi "*mən kimin mövlasıyamsa bu da onun vəlisidir (dostudur)*". Allah Rəsulunun (s.ə.v) bu xitabından sonra yuxarıda qeyd edilən mövzu ilə bağlı Əli (r.ə) haqqındakı şikayət və narazılıqlara son qoyulmuşdu[60].

Allah Rəsulunun (s.ə.v) Mədinəyə qayıtmasından qısa müddət sonra Yəməndə bir şəxsin peyğəmbərlik iddiası ilə ortaya çıxdığı xəbəri gəlmişdi. Bu saxtakar Əns qəbiləsindən Kə'b ibn Əbhələ idi. Kə'b ibn Əbhələ "Əsvəd əl-Ənsi" və "Zül-Himar" ləqəbləri ilə məşhur olmuş kahin və sehrbaz idi. O, aldadaraq ətrafına topladığı 500-600 nəfər bədəvi ilə Yəmənin bir sıra bölgələrinə hücum etmiş, müsəlman və qeyri-müsəlman əhalidən çox adamı öldürüb qan

---

[59] Bu sözü ilə Allah Rəsulu (s.ə.v) özü həyatda olmayacağı vaxt xanımlarının haqlarına riayət edilməsini müsəlmanlara vəsiyyət etməkdə idi. Çünki Allahın da muradı bu idi. Bu səbəbdəndir ki, uca Allah Qur'anda Peyğəmbərin (s.ə.v) xanımlarını "*möminlərin anaları*" adı ilə müşərrəf edərək bununla möminlərə onlara qarşı öz anaları kimi münasibət bəsləməyi əmr etmişdir. Peyğəmbərdən (s.ə.v) nəql olunan bu xütbənin son qisminin iki müxtəlif rəvayət şəkli vardır. Bəzisində Peyğəmbər (s.ə.v) müsəlmanlar üçün Qur'anla birlikdə ev əhlini, bəzisində isə sünnəsini əmanət olaraq qoyduğunu söyləməkdədir.

[60] İzzəddin Əli ibn əl-Əsir, *əl-Kamil fi't-Tarix*, C. II, s. 278; İmadəddin İsmayıl ibn Kəsir, *əl-Bidayə və'n-Nihayə*, C. V, s. 369-370.

Peyğəmbərin (s.ə.v) Qədri-Xummda insanlara bu xitabı özündən sonra kimi isə öz yerinə təyin etmək üçün deyil, bəsit bir anlaşmazlığı və mübahisəni aradan qaldırmaq üçün idi. Əgər məqsədi özündən sonra yerinə qaim təyin etmək olsaydı bunu Qədri-Xummda bir neçə yüz insanın arasında deyil, Məkkədə vida xütbəsində on minlərlə insana xitab edərkən edərdi.

tökmüşdü. Allah Rəsulunun (s.ə.v) Yəməndəki əslən iranlı olan canişini Şərh ibn Bazan (r.ə) Əsvəd əl-Ənsinin adamlarına müqavimət göstərsə də döyüşdə şəhid olmuşdu. Allah Rəsulu (s.ə.v) Yəməndəki müsəlmanlara xəbər göndərərək Əsvəd əl-Ənsi və ətrafına topladığı qaragüruhun zərərsizləşdirilməsini əmr etmişdi. Tezliklə öz yaxın adamlarının əyyaşlıq və sehrbazıqla məşğul olan Əsvəd əl-Ənsiyə xəyanət etmələri nəticəsində bir neçə nəfər müsəlmanın əlbir olub tərtib etdikləri sui-qəsd nəticəsində Əsvəd əl-Ənsi öldürülmüş, ətrafındakılar isə qaçıb dağılmışdılar. Əsvəd əl-Ənsini Yəməndəki İran mənşəli müsəlmanlardan Feyruz əd-Deyləmi (r.ə) öldürmüşdü.

Hicri 11-ci il səfər ayının 25-i (20 may 632) Allah Rəsulu (s.ə.v) ümumi səfərbərlik elan etdi. Curf adlı yerdə ordugah quruldu, Mədinə və ətraf qəbilələrdə yaşayan müsəlmanların tam təchizatlı olaraq Curfdakı ordugaha gəlmələri əmr olunmuşdu. Bir gün sonra Allah Rəsulu (s.ə.v) Usamə ibn Zeydi (r.ə) yanına çağırıb onu İslam ordusunun əmirliyinə təyin etdiyini bildirdi və onu belə təlimatlandırdı: "*Ey Usamə! Şam diyarına, Bəlqa hüduduna, Fələstindəki Daruma, atanın şəhid olduğu yerə Allahın adı və bərəkətiylə get. Səni bu orduya komandan təyin etdim. Oradakı kafirlərin başının üstünü qəfil al, şimşək kimi üstlərinə şığı. Gedərkən sürətli hərəkət et ki, xəbərindən əvvəl hədəfinə çatasan. Yanında bələdçilər, casuslar və gözətçiləri də apar. Özündən əvvəl dəstə yola sal. Allah səni zəfər nəsib etsə orada çox qalma. Ey Usamə! Allah yolunda, Allahın adı ilə döyüşmək üçün çıx. Allahı inkar edənlərə qarşı vuruş. Vuruşun, lakin əhdə vəfasızlıq etməyin, uşaqları və qadınları öldürməyin. Düşmənlə qarşılaşdığınız vaxt səbr və səbatla vüqarınızı qoruyun, öz aranızda çəkişməyin. Bilin ki, cənnət qılıncların parıltısı altındadır*". Sonra isə Usamə (r.ə) və ordusu üçün dua etdi. Səfər ayının 27-si (22 may 632) şiddətli baş ağrısı və qızdırmaya tutulan Allah Rəsulu (s.ə.v) qəflətən xəstələndi. Usamə (r.ə) Allah Rəsulunun (s.ə.v) onun üçün bağladığı döyüş bayrağını Bureydə ibn Huseybə (r.ə) verdi və onu bayraqdar təyin etdi. Ənsar və mühacir silahlanaraq hamısı bir nəfər kimi Curfdakı ordugaha gəlmişdi. Usamənin (r.ə) əmirlik etdiyi orduya Əbu Bəkr (r.ə), Ömər ibn Xəttab (r.ə), Əbu Ubeydə ibn Cərrah (r.ə), Sə'd ibn Əbu Vəqqas (r.ə), Əbu'l-Avər Səid ibn Zeyd (r.ə), Qatadə ibn Ne'man (r.ə), Sələmə ibn Əsləm ibn Hureys (r.ə) kimi məşhur səhabələr sıravi əsgər kimi gəlmişdilər. Lakin mühacirlərdən bəzi şəxslər komandanlıq mövzusunda şikayətlənməyə və danışmağa başlamışdılar. Onlar 18-19 yaşlarında gənc olan Usamə ibn Zeydin (r.ə) ümumi səfərbərliyə çağırılan İslam ordusuna komanlıq etməsindən əndişəli idilər. Bu mövzudakı tərəddüdlər Allah Rəsulunun (s.ə.v) xoşuna gəlməmiş və xəstəliyinin şiddətinə baxmayaraq rəbiələvvəl ayının 10-

da (03 iyun) məsciddə minbərə çıxaraq möminlərə xitab etmək zərurətini hiss etmişdi. Allah Rəsulu (s.ə.v) adəti üzrə həmd və sənadan sonra sözə başlayaraq belə demişdi: "*Ey insanlar! Usamənin (r.ə) komandanlığı haqqında mənə gəlib çatan bu sözlər nədir belə? Vallahi, siz bunun kimi onun atasının komandan təyin edilməsi haqqında da danışmışdınız. Allaha and olsun ki, onun atası əmirliyə necə layiq idisə, mənim nəzərimdə necə insanların ən sevimlisi idisə, ondan sonra oğlu da əmirliyə eləcə layiqdir. Usamə (r.ə) də mənin nəzərimdə insanların ən sevimlisidir. O, sizin aranızda bu iş üçün ən xeyrli, ən yararlı olanlardan biridir".* Bu sözlərindən sonra Allah Rəsulu (s.ə.v) minbərdən enib evinə getmişdi. Səfərbərliyə yollanan Mədinədəki möminlər gəlib Allah Rəsulu (s.ə.v) ilə evində vidalaşmışdılar. İki gün sonra Peyğəmbərin (s.ə.v) halının pisləşdiyini eşidən Usamə (r.ə) ordugahdan Mədinəyə qayıtmış, ağlayaraq Rəsulullahın (s.ə.v) otağına daxil olmuşdu. Rəsulullahın (s.ə.v) yanında əmisi Abbas (r.ə) və xanımları var idi. O, əyilib Peyğəmbəri (s.ə.v) öpəndə Allah Rəsulu (s.ə.v) əllərini qaldırdı, lakin danışa bilmirdi. Usamə (r.ə) Peyğəmbərin (s.ə.v) onun üçün dua etdiyini anladı. Rəbiələvvəl ayının 12-si (05 iyun) Usamə (r.ə) yenidən Peyğəmbərin (s.ə.v) yanına gəldi. Allah Rəsulunun (s.ə.v) halı əvvəlkinə nisbətən yaxşılaşmışdı. O, Usaməyə (r.ə) yubanmadan həmin gün günortadan sonra yola çıxmağı tapşırdı. Usamə bin Zeyd (r.ə) Peyğəmbərlə (s.ə.v) vidalaşıb Curfdakı ordugaha qayıtmışdı.

Allah Rəsulu (s.ə.v) Nəsr surəsinin nazil edilməsindən sonra artıq Rəbbinə qovuşma vaxtının yaxınlaşdığını anlamışdı. Allah Rəsulunun (s.ə.v) son vaxtlar (سُبْحَانَ اَ وَبِحَمْدِه , أَسْتَغْفِرُ اَ وَأَتُوبُ إِلَيْه) "*Sübhanallahi və bihəmdihi, əstəğfirullahə və ətubu ileyh*" (*Allahı hər cür nöqsandan uzaq tutur, sadəcə ona məxsus olan həmdlə həmd edirəm, Allahdan bağışlanma diləyir və ona tövbə edirəm*) duasını tez-tez təkrar etdiyini eşidən xanımı Ayşə (r.ə) bunun səbəbini soruşanda Peyğəmbər (s.ə.v) "*Uca Rəbbim mənə ümmətimdə bir əlaməti görəcəyimi bildirmişdi. Həmin əlaməti görəndə ona daha çox təsbih, həmd və istiğfar etməliyəm, həmin əlaməti gördüm*" deyə cavab vermiş sonra isə Nəsr surəsini oxumuşdu. Sevgili qızı Fatiməyə (r.ə) isə vəfatından əvvəl "*Cəbrayıl (ə.s) hər il bir dəfə mənimlə Qur'an müqabiləsi edərdi, bu il isə iki də məqabilə etdi. Düşünürəm ki, əcəlim yaxınlaşmışdır*" demişdi. Bu iki dəfə müqabilə Allah Rəsulunun (s.ə.v) yaşadığı son ramazan ayında baş vermişdi. Vida xütbəsində də insanlara xitab edərkən bir sonrakı həccdə bəlkə də onlarla birlikdə olmayacağını bildirmişdi. Vəfatından bir qədər əvvəl Allah Rəsulu (s.ə.v) Bəqi qəbristanına gedib özündən əvvəl vəfat etmiş və şəhid olmuş möminlərin qəbirlərini ziyarət etmiş, onlar üçün dua etmişdi. Daha sonra Uhud dağının ətəklərinə gedib Uhud

döyüşündə şəhid olanların məzarlarını ziyarət etmiş, onların cənazə namazını qılmışdı. Uhud döyüşü günü və döyüşdən sonrakı ağır vəziyyət səbəbiylə şəhidlərin cənazə namazının qılınması üçün fürsət tapılmamışdı.

Bütün həyatı boyu Allah Rəsulu (s.ə.v) heç bir ciddi xəstəlikdən əziyyət çəkməmişdi. Lakin yaxarıda qeyd etdiyimiz kimi səfər ayının 27-si (22 may 632) şiddətli baş ağrısı və qızdırmaya tutulmış, bu qızdırma bəzən epilepsiya növbəsinə (*humma*) çevrilmişdi. Bu səbəbdən xəstəliyi şiddətləndiyi vaxt bəzən Allah Rəsulu (s.ə.v) huşunu itirmişdi. O, ömrünün son günlərini xanımlarından Ayşənin (r.ə) yanında keçirmişdi. Xəstəliyi şiddətləndiyi vaxt xanımına "*ey Ayşə! Xeybərdə qursağıma gedən o zəhərli ətin ağır-acısını vaxtaşırı hiss edirdim. İndi isə qəlbimin damarlarının parçalandığnı hiss edirəm*" demişdi. Xeybər səfəri vaxtı yəhudi liderlərdən Harisin qızı Zeynəbin qoyun kəsdirərək ətini qızardıb Peyğəmbəri (s.ə.v) qonaq etdiyini yuxarıda qeyd etmişdik. Allah Rəsulu (s.ə.v) ilk loxmanı ağzına qoyan kimi ətin zəhərli olduğunu anlamışdı. Lakin mücahidlərdən Bişr (r.ə) adlı biri qızardılmış ətdən yediyi üçün qurtula bilməyib ölmüşdü. Peyğəmbər (s.ə.v) atası, qardaşı və əri döyüşdə öldürülmüş Zeynəbi əvf etsə də Bişrin (r.ə) qohumları qisas tələb etmişdilər.

Allah Rəsulu (s.ə.v) xəstə yatağında ikən xanımlarından Umm Həbibə (r.ə) Umm Sələməyə (r.ə) Həbəşistana hicrət vaxtı orada içində peyğəmbərlər və saleh insanların təsvirləri olan kilsə gördüyü haqqında danışırdı. Bunu eşidən Allah Rəsulu (s.ə.v) belə demişdi: "*Həqiqətən onların arasında saleh əməlli bir insan öləndə, onun qəbrinin üstündə məbəd tikirlər, onun təsvirlərini də həmin mədədin içində asırlar. Onlar qiyamət günü Allahın hüzuruna məxluqatın ən pisi olaraq gələcəklər. Buna diqqət edin, sizdən əvvəlki ümmətlər peyğəmbərlərin və saleh insanların qəbrlərini ibadətxanaya çevirmişdilər. Sizlər əsla qəbirləri məscidə çevirməyin. Mən bunu sizə qadağan edirəm. Allah yəhudi və xristianlara lənət etsin ki, onlar peyğəmbərlərin qəbrlərini ibadət yerinə çevirmişdirlər. Allahım, mənim qəbrimi ibadət edilən bir bütə çevirmə. Öz peyğəmbərlərinin qəbirlərini məscidlərə çevirən bir qövmə Allahın qəzəbinin şiddəti artmışdır*".[61]

Peyğəmbərin (s.ə.v) sevgili qızı Fatimə (r.ə) hər gün gəlib atasına baş çəkir, onun xidmətində dururdu. Atasının xəstəliyi Fatiməni (r.ə) çox üzürdü.

---

[61] وعن أبى هريرة رَضِيَ اُللهِ عَنْه قال: قال رسولُ اَلله لَعَنَ اُللهِ الْيَهُودَ والنَّصَارى اتَّخَذُوا قُبُورَ أَنْبِيَائِهِمْ مَسَاجِدَ
وعن عطاء بن يسار رَضِيَ اللهُ عَنْه قال: قال رَسولُ اللهِ: اللَّهُمَّ لاَ تَجْعَلْ قَبْرِى وَثَناً يُعْبَدُ، اشْتَدَّ غَضَبُ اللهِ عَلى قَوْمٍ اتَّخَذُوا قُبُورَ أَنْبِيَائِهِمْ مَسَاجِدَ.
Bax: Buxari, *Səhih*, Səlat, 54; Müslim, *Səhih*, Məsacid, 20 (530); Əbu Davud, *Sunən*, Cənaiz, 76; Nəsayi, *Sunən*, Cənaiz 106; İmam Malik ibn Ənəs, *Muvatta'*, Qəsr-us-Səlat, 85).
Əbu Davudun "*Sünən*"indəki hədisdə Ayşə (r.ə) belə demişdi: *"Əgər bu əndişə (yəni qəbrinin məscidə çevrilməsi) olmasaydı, Rəsulullahın (s.ə.v) məzarı açıqlıqda olacaqdı. Fəqət buranın (ibadət edilən) məscidə çevrilməsindən qorxuldu"*.

Vəfatından əvvəlki gün Peyğəmbərin (s.ə.v) yanında olarkən “*atacan, kim bilir bu xəstəlik sənə necə əziyyət çəkdirir*” deyən Fatiməyə (r.ə) Allah Rəsulu (s.ə.v) “*atan bu gündən sonra artıq əziyyət çəkməyəcək qızım*” deyə cavab vermişdi.

Allah Rəsulu (s.ə.v) xəstəliyi ağırlaşdığı vaxt artıq məscidə gedib müsəlmanlara namaz qıldıra bilməmişdi. Bunda görə də Əbu Bəkrin (r.ə) camaata namaz qıldırmasını söyləmişdi. Ayşə (r.ə) atası Əbu Bəkrin (r.ə) yumuşaq qəlbli bir insan olduğunu, Allah Rəsulunun (s.ə.v) yerində dayanıb Qur’an oxuyarkən özünü saxlaya bilməyib ağlayacağını bildirsə də Peyğəmbər (s.ə.v) Əbu Bəkrin (r.ə) camaata namaz qıldırması əmrini təkidlə təkrarlamışdı. Bundan sonrakı üç gün ərzində Məscidu’n-Nəbəvidə Allah Rəsulunun (s.ə.v) yerinə Əbu Bəkr (r.ə) əshaba namaz qıldırmışdı. Üç gün sonra sübh namazı vaxtı Allah Rəsulu (s.ə.v) Əli ibn Əbu Talib (r.ə) və Fəzl ibn Abbasın (r.ə) köməyi ilə məscidə gəlmişdi. Onun gəldiyini görən əshab sağaldığını düşünərək sevinmişdi. Əbu Bəkr (r.ə) geri çəkilərək Allah Rəsulunun (s.ə.v) namaz qıldırmasını istəmiş, lakin Peyğəmbər (s.ə.v) ona yerində qalmasını işarə etmişdi. Özü isə Əbu Bəkrin (r.ə) sol tərəfində yerə oturaraq, onun imamlığında namazını qılmışdı. Bu Allah Rəsulunun (s.ə.v) məsciddə qıldığı son namazı idi. Bu namazdan sonra Əbu Bəkr (r.ə) Peyğəmbərdən (s.ə.v) Mədinədən bir qədər kənarda, Sunh adlanan yerdəki evinə getmək üçün izn istəmişdi. Allah Rəsulu (s.ə.v) xanımı Ayşənin (r.ə) məcidin yanında yerləşən evinə getmişdi. Həmin gün günorta saatlarında Allah Rəsulu (s.ə.v) vəfat[62] etmişdi.

Usamə ibn Zeyd (r.ə) Curfa qayıdandan sonra orduya hərəkət əmri verimiş və özü də atına minmək istəyərkən Mədinədən gələn bir şəxs özünü yetirib Allah Rəsulunun (s.ə.v) vəfat etdiyi xəbərini gətirmişdi. Xəbəri alan kimi Usamə (r.ə), Ömər ibn Xəttab (r.ə) və Əbu Ubeydə ibn Cərrahla (r.ə) birlikdə dərhal Mədinəyə qayıtmışdı. Əbu Bəkr (r.ə) Peyğəmbərin (s.ə.v) izni ilə Mədinə yaxınlığındakı Sunha getmişdi. Oradan Curfa gəlib orduya qoşulacaqdı. Curf ordugahındakı müsəlmanların böyük əksəriyyəti Mədinəyə gəlmişdilər. Bureydə

[62] Allah Rəsulu Muhəmməd (s.ə.v) hicri-qəməri 11-ci il rəbiələvvəl ayının 13-də (8 iyun 632) vəfat etmiş, səhəri gün dəfn edilmişdir. Vəfat edərkən miladi tarixlə 61, hicri-qəməri tarixlə 63 yaşında idi. Bu fərqin meydana gəlməsinə səbəb qəməri, yəni ay təqviminin miladi təqvimlə müqayisədə hər il on gün geri getməsidir. Digər bir səbəb isə Ömər ibn Xəttabın (r.ə) xəlifəliyi dövründə qəməri tarix dövlətin rəsmi tarixi olaraq qəbul edilərkən təqribən iki ay yarım kimi bir müddətin araya girməsidir. Məlum olduğu kimi Peyğəmbər (s.ə.v) miladi 622-ci ildə, rəbiələvvəl ayının 12-si hicrət etmişdir. Xəlifə Ömərin (r.ə) dövründə qəməri tarix qəbul edilərkən hicrətin baş verdiyi ay və gün deyil, həmin ilin məhərrəm ayının 1-i başlanğıc götürülmüşdür. Çünki məhərrəm ayı qəməri ayların ilkidir. Bu təfərrüatlar nəzərə alındığında tarixlərdəki fərqin səbəbi aydın olur. Peyğəmbərin (s.ə.v) təvəllüd tarixi olan 20 aprel 571-ci (hicrətdən 52 il əvvəl, rəbiələvvəl ayının 12-si) ildən 40 il bir neçə ay sonra risalət başlamış, 61 yaşında isə Peyğəmbər (s.ə.v) vəfat etmişdir.

ibn Huseyb (r.ə) döyüş bayrağını gətirib Peyğəmbərin (s.ə.v) evinin qabağında yerə sancmışdı.

Rəsulullahın (s.ə.v) vəfatı əshabını sarsıtmış və ağır kədərə qərq etmişdi. İnsanlar onun vəfat etdiyinə inanmaq istəmirdilər. Ömər ibn Xəttab (r.ə) qılıncını sıyıraraq evin ətrafına toplaşmış insanlara "*Xeyr! Muhəmməd (s.ə.v) ölməmişdir, huşunu itirmişdir, çox keçməz özünə gələr. Kim öldüyünü desə boynunu varacağam*" demişdi. Xəbəri alan kimi Sunhdan Mədinəyə qayıdan Əbu Bəkr (r.ə) qızının evinə daxil olaraq Allah Rəsulunun (s.ə.v) üzündəki örtünü götürmüş, ağlayıb iki qaşının arasından öpərkən "*atam, anam sənə fəda olsun ey Allahın Elçisi (s.ə.v). Allahın təqdir etdiyi ölümü dadmısan. Sən həyatda ikən də gözəl idin, ölümündə də gözəlsən*" demişdi. Əbu Bəkr (r.ə) qızı Ayşənin (r.ə) evindən çıxıb məscidə gəlmiş və minbərə çıxmışdı. Orada toplanan insanlara "*ey insanlar! Əgər aranızda Muhəmmədə (s.ə.v) sitayiş edənlər varsa bilsinlər ki, o, artıq ölmüşdür. Allaha ibadət edənlər isə bilsinlər ki, Allah baqidir və ölümsüzdür*" deyərək xitab etdikdən sonra Qur'anın Ali-İmran surəsi 144-cü ayəsini oxumuşdu.

**وَمَا مُحَمَّدٌ إِلا رَسُولٌ قَدْ خَلَتْ مِنْ قَبْلِهِ الرُّسُلُ أَفَإِين مَاتَ أَوْ قُتِلَ انْقَلَبْتُمْ عَلَى أَعْقَابِكُمْ وَمَنْ يَنْقَلِبْ عَلَى عَقِبَيْهِ فَلَنْ**
**يَضُرَّ ا َ شَيْئًا وَسَيَجْزِي ا ُ الشَّاكِرِينَ**

"*Muhəmməd (s.ə.v) ancaq bir peyğəmbərdir. Ondan əvvəl də peyğəmbərlər gəlib-getmişlər. Əgər o, ölsə və ya öldürülsə, siz gerimi dönəcəksiniz? (Dininizdən dönəcəsiniz?) Halbuki geri dönən şəxs Allaha heç bir zərər yetirməz. Lakin Allah şükür edənlərə mükafat verər*".

Əbu Bəkrin (r.ə) bu xitabından sonra insanlar arasında səbr və sükut hakim oluşdu. Allah Rəsulunun (s.ə.v) cənazəsini Əli ibn Əbu Talib (r.ə), Abbas (r.ə), Fəzl ibn Abbas (r.ə), Qusəm ibn Abbas (r.ə), Usamə ibn Zeyd (r.ə) və Əvs ibn Həvli (r.ə) yumuş və kəfənləmişdilər. Möminlər dəstə-dəstə Ayşənin (r.ə) evinə girərək Allah Rəsulunun (s.ə.v) cənazə namazını qılmışdılar. Peyğəmbər (s.ə.v) ruhunu Allaha təslim etdiyi yerdə, xanımı Ayşənin (r.ə) otağında dəfn edilmişdi. Peyğəmbərin (s.ə.v) məzarını Əbu Ubeydə ibn Cərrah (r.ə) ilə Əbu Təlhə Zeyd ibn Səhl ən-Ənsari (r.ə) qazımışdılar. Cənazəni məzara Əli ibn Əbu Talib (r.ə), Fəzl ibn Abbas (r.ə), Usamə ibn Zeyd (r.ə) və Allah Rəsulunun (s.ə.v) qulluqçusu Şükran (r.ə) qoymuşdular. Allah Rəsulunun (s.ə.v) vəfatından sonra Bilal (r.ə) məsciddə bir dəfə azan verdi. Bu Peyğəmbərin (s.ə.v) vəfatından sonra onun oxuduğu son əzan idi və Allah Rəsulundan (s.ə.v) sonra Bilal (r.ə) uzun illər bir daha əzan oxumamışdı. Ömər ibn Xəttabın (r.ə) xəlifəliyi dövründə Bilal əl-Həbəşi

(r.ə) Şam diyarına gedib Qüdsdə yaşamışdı. Bir gün Mədinəyə qayıdan Bilal (r.ə) Peyğəmbərin (s.ə.v) nəvələri Həsən (r.ə) ilə Hüseynin (r.ə) xahişini yerə salmayıb Məscidu'n-Nəbəvidə (r.ə) sübh əzanını oxumuşdu. Bu səsi uzun müddətdir eşitməyən Mədinə əhalisi evlərindən çıxaraq məscidə axın etmişdilər. Əzan oxuyanın həqiqətən Bilal (r.ə) olduğunu görəndə Allah Rəsulunun (s.ə.v) dövrünü xatırlayan insanlar göz yaşlarını saxlaya bilməmişdilər.

Allah Rəsulunun (s.ə.v) Mədinədə az sayıda müsəlmanla birlikdə qurduğu İslam dövləti on il ərzində böyüyüb genişləmiş, onun vəfatı vaxtı artıq 1,5 milyon $km^2$ ərazini əhatə etməkdə idi. Bu Mədinə İslam dövlətinin ərazisinin on il ərzində hər gün təqribən 440 $km^2$ artması demək idi. Bu müddət ərzində aparılan döyüşlərdə cəmi 150 nəfər şəhid olmuşdu. Allah Rəsulunun (s.ə.v) vəfatından sonra bu dəyərli mirası onun şərəf və izzət sahibi əshabı daha da genişlətəcək, Allahın kəlamının dünyanın dörd bir tərəfinə, bütün bəşəriyyətə çatdırılması üçün çalışacaqdılar.

*Bəni-Saidə Şurası və Əbu Bəkrin (r.ə) Xəlifə Seçilməsi*

Allah Rəsulunun (s.ə.v) vəfatından sonra əshab arasında ciddi bir məsələ ortaya çıxmışdı. Müsəlmanların dini və siyasi liderliyi vəzifəsini kim icra edəcəkdi? Mədinənin yerlisi olan ənsar İslama böyük xidmətləri ilə şərəfli bir keçmişə sahib olduqlarını bildirirdilər. Hicrətdən sonra Allah Rəsulu (s.ə.v), onun ev əhli və mühacirlərin qorunması, himayə edilməsi, Allah yolunda malları və canları ilə mübarizə apararaq Allahın kəlamının ucaldılması, İslamın bütün ərəb yarımadasına yayılmasında ən böyük əmək onlara müyəssər olmuşdu. Elə isə İslam dövlətini idarə edəcək şəxsin də ənsardan olmasının vacibliyini düşünürdülər. Bu barədə həmfikir olan Əvs və Xəzrəc qəbilələrinə mənsub ənsar məsələni müzakirəyə açıb həll etmək üçün Bəni-Saidə məhəlləsindəki bir kölgəlikdə toplaşmışdlar. Lakin bu mövzuda ortaq məxrəcə gəlib müştərək bir qərar çıxarmaq xeyli müşkül olmuşdu. Çünki əvslilər Useyd ibn Hudeyrin (r.ə), xəzrəclilər isə öz rəisləri Sə'd ibn Ubadənin (r.ə) bu iş üçün daha münasib olduğunu düşünürdülər. Sə'd ibn Ubadənin (r.ə) tərəfdarları sayca çoxluq təşkil edirdilər. Muğirə ibn Şu'bə (r.ə) Bəni-Saidə məhəlləsindəki bu yığıncaqdan Əbu Bəkr (r.ə) və Ömər ibn Xəttabı (r.ə) xəbərdar etmişdi. Əbu Bəkrlə (r.ə) Ömər (r.ə) Əbu Ubeydə ibn Cərrahla (r.ə) birlikdə dərhal ənsarın toplandığı yerə getmişdilər. Onlar yığıncaq yerinə gələndə orada artıq fikirlər haçalanmış, mübahisə qızışmışdı. Onların mühacirlərin nümayəndəsi olaraq bu toplantıda iştirak etməyə başlamasından sonra ənsardan olan səhabələr ənsarın üstün xidmətləri ilə bu işdə ən çox haqq sahibi olduğuna dair dəlillərini sadalayaraq

öz fikir və niyyətlərini açıqlamışdılar. Bu vaxt digər mühacir səhabələr də oraya gəlməyə başlamışdılar. Əbu Bəkr (r.ə) orada toplananlara belə xitab etmişdi:

*"Ey Ənsar! Şübhəsiz ki, bu irəli sürdüyünüz, dediyiniz bütün fəzilət və keyfiyyətlərin hamısı sizdə mövcuddur. Sizin Allahın dini qarşısındakı ali xidmətləriniz inkarolunmazdır. Allah öz dininə və Elçisinə (s.ə.v) kömək etmək üçün sizi seçmişdir. Rəsulullahın (s.ə.v) sizin yurdunuza köçüb gəlməsini nəsib etmişdir. Allah Rəsulu (s.ə.v) ilə birlikdə öz yurd-yuvasını tərk edib hicrət edənlərdən sonra fəzilətinə görə sizdən daha üstün olan heç kim yoxdur. Rəsulullaha (s.ə.v) kömək etdiniz, bu yolda vuruşdunuz, siz izzət və şərəf sahibi insanlarsınız. Lakin ərəblərə liderlik haqqı Qureyşindir. Ərəblər Qureyşdən olmayanın idarəsinə boyun əyməzlər. Hər kəsə məlumdur ki, Qureyş nəsəb baxımından ərəblərin seçilmişidir. Biz əmirlər, siz isə vəzirlərsiniz. Heç bir iş sizin məsləhətiniz xaricində görülə bilməz".*

Əbu Bəkr (r.ə) bu sözlərinə dəstək olaraq Peyğəmbərdən (s.ə.v) hər kəsin eşitdiyi sözləri xatırladandan sonra Ömər ibn Xəttabla (r.ə) Əbu Ubeydə Amir ibn Cərrahı (r.ə) göstərib "*sizə bu iki nəfərdən birini seçmənizi tövsiyə edirəm*" dedi. Əbu Bəkrin (r.ə) üstün fəzilətini, təqvasını, xanımı Xədicədən (r.ə) sonra Rəsulullaha (s.ə.v) iman etmiş ikinci insan olduğunu, bütün malını və canını Allahın dini olan İslamdan və onun Rəsulundan (s.ə.v) əsirgəmədiyini, hələ İslamdan əvvəl Peyğəmbərin (s.ə.v) dostu olduğunu, müdrikliyi, uzaqgörənliyi və idarəetmədəki təcrübəsi kimi dərəcələrini bilən Ömər ibn Xəttab (r.ə) onun bu təklifini eşidən kimi dərhal yerindən qalxmış və Əbu Bəkrə (r.ə) əlini uzadaraq "*əlini ver, mən sənə bey'ət edirəm*" demişdi. Əbu Bəkri (r.ə) hidayət yoluna gətirməklə Allah öz Rəsulunun (s.ə.v) mövqeyini xeyli gücləndirmişdi. Əbu Bəkr (r.ə) Qureyşin və bütün ərəblərin ən varlı zadəganlarından, tacirlərindən biri idi. O, cahiliyyə dövründə Daru'n-Nədvə üzvü kimi Məkkənin idarə olunmasında söz sahibi olmuşdu. Həqiqətən Əbu Bəkr (r.ə) hələ cahiliyyə dövündə sadəcə Məkkədə deyil bütün ərəb qəbilələri arasında ən nüfuzlu şəxslərdən biri idi. Ömər ibn Xəttabın (r.ə) Əbu Bəkrə (r.ə) bey'ət etməsindən sonra Əbu Ubeydə (r.ə), Əbdürrəhman ibn Əvf (r.ə) , Osman ibn Əffan (r.ə) daha sonra isə mühacir və ənsardan olan digər səhabələr Əbu Bəkrə (r.ə) bey'ət etmişdilər. Beləcə İslam tarixində Raşid Xəlifələr dövrü başlamışdı. Sadəcə bir neçə nəfər səhabə ki, bunların arasında Əli ibn Əbu Talib (r.ə) də var idi, Allah Rəsulunun (s.ə.v) ilk xəlifəsi olan Əbu Bəkrə (r.ə) bir neçə ay sonra bey'ət etimşdilər. Musa ibn Uqbənin (VIII əsr) "*Məğazi*" adlı əsərində və "*əl-Biday və'n-Nihayə*" müəllifi İmadəddin İsmayıl ibn Kəsirin (XIV əsr) verdiyi məlumata görə isə həmin vaxt ənsar və mühacirin hamısı, o cümlədən Əli ibn Əbu Talib (r.ə) də Əbu Bəkrə (r.ə) bey'ət etmişdi. Lakin Rəsulullahın (s.ə.v) qızı, Əlinin (r.ə) xa-

nımı Fatimənin (r.ə) Fədəkdəki bir bağı atasının mirası olaraq tələb etməsi[63] və Əbu Bəkrin (r.ə) isə bu bağın dövlətin xəzinəsinə aid olmasını bildirməsi səbəbiylə yaranmış soyuqluq səbəbiylə Əli ibn Əbu Talib (r.ə) xanımı Fatimənin (r.ə) vəfatından sonra yenidən Əbu Bəkrə (r.ə) bey'ət etmişdi. Fatimə (r.ə) Allah Rəsulundan (s.ə.v) altı ay sonra vəfat etmişdi.

[63] Bu haqda yuxarıda məlumat vermişdik.

# II. FƏSİL

# ƏBU BƏKRİN (R.Ə) HAKİMİYYƏTİ DÖVRÜ (632-634)

*İrtidad Hadisələri və Saxta Peyğəmbərlərin Meydana Çıxması*

Adı Abdullah ibn Osman ibn Əbu Quhafə olan, Əbu Bəkr (r.ə) künyəsi ilə tanınan dörd raşid xəlifənin ilki Qureyş qəbiləsinin Bəni-Teym oymağına mənsub idi. İslamdan əvvəl Məkkənin nüfuzlu və zəngin tacirlərindən biri olan Əbu Bəkr (r.ə) gözəl əxlaqı, dürüstlüyü, yumuşaq qəlbliliyi və yardımsevərliyi ilə tanınmışdı. Bir çox müsəlman köləni müşrik sahiblərinən satın alıb azad etdiyi üçün "*Atiq*" ləqəbilə məşhur olmuşdu. Əbu Bəkr (r.ə) kişilərdən İslamı ilk qəbul edən şəxsdir. Allah Rəsulu (s.ə.v) bu haqda belə demişdi: "*kimi İslama dəvət etdimsə ilk anda tərəddüd göstərmişdir. Fəqət Əbu Bəkr (r.ə) əsla tərəddüdə qapılmamış, dərhal təsdiq etmişdi*". Merac vaxtı bu hadisəni eşidəndə "*mən Allah Rəsulunun (s.ə.v) söylədiyi hər sözün doğruluğuna şahidlik edirəm*" deyə cavab vermişdi. Bu səbəbdən də o, həmçinin doğru sözlü olan, yalan söyləməyən mənasındakı "*Sıddiq*" ləqəbi ilə də tanınmışdı.

Əbu Bəkr (r.ə) orta boylu, arıq bədən quruluşlu, çəhrayıla çalan ağ bənizli, qara gözlü və qara saçlı bir insan idi. O, cahiliyyə dövründə Məkkədə Quteylə bint Əbdüluzza ilə evlənmiş, bu nikahından Abdullah adlı oğlu və Əsma adlı qızı dünyaya gəlmişdi. Yenə cahiliyyə dövründə Amir ibn Uveymir əl-Kinaninin qızı Umm Ruman adlı qadınla evlənmiş, bu nikahdan Əbdürrəhman və Ayşə adlı övladları dünyaya gəlmişdi. Hicrətdən sonra Mədinədə ikən Mutə döyüşündə şəhid olmuş Cə'fər ibn Əbu Talibin (r.ə) dul xanımı Əsma bint Umeys (r.ə) ilə evlənmiş və nikahdan Muhəmməd adlı oğlu dünyaya gəlmişdi. Yenə hicrətdən sonra ənsardan Xaricə ibn Zeydin (r.ə) qızı Həbibə ilə evlənmişdi. Həbibə xəlifənin vəfatından bir neçə ay sonra onların Umm Kulsum adlı qızlarını dünyaya gətirmişdi.

Əbu Bəkrin (r.ə) iki illik xilafəti dövrünün əvvəli mənbələrdə daha çox yarımadanın müxtəlif yerlərində bəzi bədəvi ərəb qəbilələri arasında müşahidə edilən irtidad, dindən dönmə hadisələrilə təsvir olunmaqdadır. İslam əleyhdarı mövqeyi və fəaliyyəti ilə Qüreyş müşrikləri bir çox müşrik ərəb qəbiləsi üçün həm ümid yeri, həm də ətrafında birləşdikləri güc mərkəzi idi. Məkkənin fəthi ilə özlərinin dayaq və güvən nöqtəsini itirmiş bəzi bədəvi ərəb qəbilələrinin müşrik liderləri çarəsizlikdən və məcburiyyət qarşısında İslamı qəbul etdiklərini

bəyan etmişdilər. Allah Rəsulunun (s.ə.v) vəfat xəbəri yayılanda sözügedən qəbilə liderləri bunu fürsət bilmiş və baş qaldırmışdılar. Bəziləri isə saxta peyğəmbərlərin ətrafında birləşərək fəaliyyətə başlamışdılar. Mürtədlərlə, yəni irtidad edənlərlə yanaşı irticaya əl atan qəbilə liderləri də var idi. Bunların əsas istəyi Mədinə İslam dövlətinə bağlılıqlarını davam etdirmək, fəqət beytülmala zəkat ödəməmək idi. Bütün bu kimi halların qarşısı Əbu Bəkrin (r.ə) bəsirətli və qətiyyətli tədbirləri nəticəsində alınmışdı.

Əbu Bəkrin (r.ə) ilk icraatlarından biri Allah Rəsulunun (s.ə.v) əmri ilə şimal istiqamətinə hərbi yürüş üçün hazırlanmış və Usamə ibn Zeydin (r.ə) əmir təyin edildiyi ordunu yola çıxarmaq olmuşdu. Xəlifə bunu etməmişdən əvvəl əshabın qabaqcıllarını şurada toplayaraq onlarla məşvərət etmişdi. Rəsulullahın (s.ə.v) vəfatından sonra Curfda toplanmış ordunun şimala, Şam diyarındakı xristian ərəb qəbilələrinin yaxud yarımadada irtidad edən qəbilələrin üzərinə göndərilməsi mövzusunda tərəddüd yaranmışdı. Əshabdan bəziləri yarımadanın müxtəlif yerlərində irtidad və irtica hərəkətləri olduğu bir vaxtda İslam ordusunun Şam diyarına göndərilməsinin Mədinəni hücuma açıq hala gətirəcəyini söyəmişdilər. Bəziləri isə Usamənin (r.ə) belə böyük bir orduya əmirlik etmək üçün çox gənc olduğu söyləməkdə idilər. Lakin Əbu Bəkr (r.ə) Rəsulullah (s.ə.v) bu ordunu hansı məqsəd üçün hazırlamışdısa o istiqamətdə hərəkət edəcəyini bildirərək belə demişdi: "*Qurdların və köpəklərin məni parçalayacaqlarını bilsəm belə bu qərarımdan geri addım atmayacam. Çünki Allah Rəsulunun (s.ə.v) əmri belə idi. Bu işdə tək başına qalsam belə Usamənin ordusunu yola çıxaracağam. Məndən Allah Rəsulunun (s.ə.v) təyin etdiyi əmiri bu işdən azad etməyimi istəyirsiniz?*". Beləcə Əbu Bəkr (s.ə.v) bütün hazırlıqlar tamamlanandan sonra Curfdakı ordugaha gəlib İslam ordusunun yola çıxması əmrini vermişdi. O, ordunu bir qədər müşayət etmişdi. Bu vaxt Usamə (r.ə) atının belində xəlifə isə piyada idi. Usamə (r.ə) bundan narahatlıq duyaraq atından enib Əbu Bəkrlə (r.ə) yanaşı piyada getmək istəmişdi. Lakin böyüklənməkdən daim uzaq olan xəlifə onun atından enməsinə izin verməyərək "*Qoy mənim ayaqlarım da Allah yolunda toza batsın. Allah yolunda atılan hər addım insanı yeddi yüz dəfə ucaldar və yeddi yüz xətasını silər*" demişdi. Əbu Bəkr (r.ə) Usamə ibn Zeydə (r.ə) Ömər ibn Xəttaba (r.ə) Mədinədə ehtiyacı olduğunu bildirərək komandanın Ömərі (r.ə) bu səfərdən azad etməsini istədi. Usamə (r.ə) bunu çaşqınlıqla qarşılasa da Əbu Bəkr (r.ə) Ömərin (r.ə) onun əmri altındakı əsgərlərdən biri olduğunu və buna izn verib verməməyə Usamənin (r.ə) haqqı olduğunu bildirmişdi. Usamənin (r.ə) izni ilə Ömər ibn Xəttab (r.ə) ordudan ayrılıb xəlifə ilə birlikdə Mədinəyə qayıtmışdı. Xəlifə ordunu bir müddət müşayət edərkən mücahidlərə xitab edərək belə demiş-

di: “*Ey insanlar! Xəyanət, zülm, əhdə vəfasızlıq etməyin və həddi aşmayın. İnsanların bədən üzvlərini kəsməyin, qoparmayın. Uşaqları, qadınları və qocaları öldürməyin. İsinmək üçün meyvə ağaclarını kəsib yandırmayın. Qoyun, inək və dəvələri ancaq ehtiyacınız olan qədər yemək üçün kəsin. Siz bu dünyadan əl çəkib inzivaya çəkilmiş insanlara, rahiblərə rast gələcəksiniz, onlara toxunmayın. Sizə təklif onunanı yemədən əvvəl üzərində Allahın adını anın. Haydı, Allahın adını ucaldaraq irəliləyin, Allah sizi qorusun*”.

Əbu Bəkr (r.ə) daha sonra Usamə ibn Zeydlə (r.ə) birlikdə ordudakı əmirlərə lazımi əmr və təlimatları vermişdi. Usamə ibn Zeyd (r.ə) xəlifənin ona verdiyi vəzifəni layiqincə yerinə yetirmişdi. İslam ordusu ilk əvvəl Xuzaə qəbiləsinin yurduna girərək buradakı mürtədləri və mürtəceləri cəzalandırmış, daha sonra Dumətü’l-Cəndələ yürüş etmişdi. Bu səfər iki ay yarım davam etmişdi.

Təyy, Qətəfan, Əsəd, Əbs qəbilələri ilə Kinanə qəbiləsinin bəzi oymaqları öz elçilərini Mədinəyə göndərərək xəlifə ilə onları zəkat vergisindən azad etməsi barərədə danışıq aparmışdılar. Onlar namaz qılmaqla kifayətlənib beytülmala zəkat ödəmək istəmədiklərini bildirmişdilər. Lakin Əbu Bəkrin (r.ə) onların bu tələbinə “*zəkat olaraq verməli olduğunuz heyvanların iplərini belə əsirgəsəniz sizinlə cihad edəcəyəm*” deyərək verdiyi sərt cavabı sakitliklə qarşılayaraq bir müddət daha Mədinədə qalıb öz yurdlarına qayıtmışdılar. Sərt cavabının sakitliklə qarşılanması və elçilərin heç bir səbəb olmadan Mədinədə yubanmaları xəlifəni şübhələndirmişdi.

Yuxarıda haqqında danışdığımız şurada ortaya çıxan bir başqa məsələ də bu idi ki, saxta peyğəmbərlərə və irtidad edənlərə qarşı silahlı qüvvə göndərilməsində hamı həmfikir ikən, irtica edənlərə, yəni sadəcə zəkat verməktən imtina edənlərə qarşı hərbi gücün tətbiq edilməsinə şura üzvlərinin əksəriyyəti tərəfdar olmamışdılar. Ömər ibn Xəttab (r.ə) şurada çıxış edərkən: “*Lə iləhə illəllah” deyənlərin üstünə qılınc çəkə bilmərik. Çünki Allah Rəsulu (s.ə.v) kəlimeyi-şəhadəti söyləyənə qədər insanlarla vuruşmağa mükəlləf olduğunu, bundan sonrasının isə Allaha aid olduğunu söyləmişdir*” demişdi. Onun bu çıxışını Əli ibn Əbu Talib (r.ə), Osman ibn Əffan (r.ə) kimi şura üzvləri də dəstəkləmişdilər. Lakin xəlifə onlarla həmfikir deyildi. Çünki zəkat ödəməkdən imtina edənlərə qarşı yumuşaq rəftar edilməsi digər qəbilələrin də eyni yolu tutmasına səbəb olacaqdı. Bununla da əvvəla İslamın bərqərar etdiyi zəkat müəssisəsi, sonra isə dövlətin nüfuzu sarsılacaqdı. Bundan başqa beytülmal mühüm bir gəlir qaynağından məhrum qalacaqdı. Buna görə də Əbu Bəkr (r.ə) bununla qəti razılaşmadı, Ömər ibn Xəttabın (r.ə) söylədiyi hədisin ardını “*Rəsulullah (s.ə.v) “malının hıqqını vermək şərtilə” demişdir*” deyərək bəyan etdi və şuradakılara Tövbə surəsinin 5-ci ayəsini xatır-

latdı (فَإِنْ تَابُوا وَأَقَامُوا الصَّلَاةَ وَآتَوُا الزَّكَاةَ فَخَلُّوا سَبِيلَهُمْ) "*Lakin əgər tövbə etsələr, namaz qılıb zəkat versələr, onları sərbəst buraxın (işiniz olmasın)*". Xəlifə şuradakı çıxışını bu sözlərlə bitirmişdi: "*Allaha and olsun ki, mən namazı qılıb zəkatı ödəmək istəməyənlərə qarşı vuruşaram. Rəsulullahın (s.ə.v) yolundan başqa bir yol tanımaram. Hətta insanların əlində beytülmala məxsus bir oğlaq belə qalsa ya onu verəcəklər, ya da onlarla vuruşacağam*". Bu sözlərdən sonra şura yekdilliklə xəlifənin qərarını dəstəkləmişdi.

Yuxarıda haqqında bəhs etdiyimiz mürtəce qəbilələrin elçiləri xəlifə ilə görüşüb danışandan, onun fikrini öyrənəndən sonra Mədinədə qalaraq ümumi vəziyyəti müşahidə etmişdilər. Onlar əli silah tutan ənsar və mühacirin böyük əksəriyyətinin Usamə ibn Zeydin (r.ə) komandanlığındakı hərbi səfərdə iştirak etdiklərini görmüşdülər. Bu onlarda Mədinənin müdafiəsiz və asanlıqla ələ keçirilə biləcək vəziyyətdə olduğu fikrini oyandırmışdı. Bunun fərqinə varan xəlifə dərhal şura üzvlərilə müşavirə edərək mürtəce və mürtəd qəbilələrin Mədinəyə hücum edəcəklərindən əndişələndiyini bildirmişdi. Bundan sonra Məscidu'n-Nəbəvidə toplanmış möminlərə belə xitab etmişdi: "*İmandan sonra küfrə dönənlər bizə təklif etdilər, təkliflərini qəbul etmədiyimiz üçün aramızdakı əhdnamə hökmünü itirmişdir. Göndərdikləri elçilər sayımızın az olduğunu gördülər. Bizə gecə yoxsa gündüz hücum edəcəklərini bilmirəm. Buna görə də siz silahlanın və hazır olun*". Daha sonra xəlifə Əli ibn Əbu Talib (r.ə), Zubeyr ibn Əvvam (r.ə), Təlhə ibn Ubeydullah (r.ə) və Abdullah ibn Məs'uda (r.ə) Mədinəyə gələn bütün yolları gecə-gündüz nəzarət və müşahidə altında saxlamaq barədə göstəriş verdi. Üç gün sonra gözətçilər silahlı dəstələrin Mədinəyə yaxınlaşdığı barədə xəbər gətirdilər. Mürtədlər ehtiyat qüvvələrini Zi-Hüsa adlı yerdə saxlamışdılar. Xəlifə hicri 11-cu ilin cəmaziyəlaxir ayında (avqust-sentyabr 632) Mədinədə hazır vəziyyətdə gözləyən mücahidlərin başında dərhal mürtədlərə qarşı hücuma keçdi. Mürtədlər mücahidlərin qəfil hücumundan sonra əks-hücuma keçsələrdə uzun müddət davam gətirə bilməyib geri qaçmağa başladılar. Əbu Bəkr (r.ə) az saydakı ordusu ilə onları təqib etdi. Lakin az qüvvə ilə Mədinədən çox uzaqlaşmamaq üçün təqibi dayandırıb geri çəkildi. Bu geri çəkilmə və saxta peyğəmbər Tuleyhanın öz oğlu Hiballa göndərdiyi köməkçi qüvvələr mürtədləri cəsarətləndirmişdi. Lakin Əbu Bəkr (r.ə) ilk döyüşdə qazanılan qələbə ilə arxayınlaşmayaraq həmin gecə yatmadı və ordunun da yatmasına izn vermədi. O, gecə vaxtı mücahidləri yenidən döyüş üçün təşviq edərək ətraf qəbilələrdən az da olsa yeni gələn əsgərlərlə sıralarını möhkəmləndirdi. Ordusunu üç əsas qismə ayıraraq onlara şücaətləri ilə tanı-

nan mücahid qardaşlar Ne'man ibn Muqərrin (r.ə), Abdullah ibn Muqərrin (r.ə) və Suveyd ibn Muqərrini (r.ə) əmir təyin etdi. İslam ordusu sübh namazından sonra, səhərin alaqaranlığında səssizcə düşmən ordugahına yaxınlaşdı. Belə ki, mürtədlər bir ox atışı məsafəsinə qədər onlara yaxınlaşmış mücahidlərin fərqinə varmamışdılar. Günəşin doğuşu vaxtı İslam ordusu mürtədlərə basqın etdi. Mürtədlərin az bir qismi qaçıb qurtula bilmiş, əksəriyyəti qılıncdan keçirilmişdi. Öldürülənlərin arasında Hibal da vardı. Əbu Bəkr (r.ə) qaçanları təqib əmri vermişdi. İslam ordusu qaçan mürtədlərin ardınca Zil-Qissə adlanan yerə qədər irəliləmişdi. Bu yarımadadakı mürtəd və mürtəcelərin planlarını altüst edən parlaq bir qələbə idi. Bu məğlubiyyətin qisasını almaq məqsədiylə Əbs və Zibyan qəbiləsindən olan mürtədlər öz qəbilədaşları, əqrəbaları olmalarına baxmayaraq bu qəbilələrə mənsub müsəlmanları qətlə yetirmişdilər. Əbu Bəkr (r.ə) ordusu ilə Zil-Qissədən geri, Mədinəyə qayıtmışdı. Bundan bir neçə gün sonra da Usamə ibn Zeyd (r.ə) uğurla başa vurduğu Şam səfərindən əmrindəki İslam ordusu ilə Mədinəyə qayıtmışdı. Əbu Bəkr (r.ə) Usaməni (r.ə) Mədinədə öz yerinə vəkil qoyaraq əli müsəlmanların qanına batmış mürtədləri cəzalandırmaq üçün İslam ordusunun başında Əbs və Zibyan yurduna istiqamət götürmüşdü. Xəlifəyə özünün Mədinədə qalması, orduya Usamənin (r.ə) başçılıq etməsi təklif olunsa da o, bununla razılaşmayaraq bu hərbi yürüşə şəxsən əmirlik etmişdi. Əbs, Zibyan, Bəni-Bəkr qəbilələrinə mənsub mürtədlər ağır şəkildə cəzalandırılmışdılar. Onlardan qaçıb qurtulanlar saxta peyğəmbər Tuleyhanın yanına gedərək onun dəstəsinə qoşulmuşdular.

Xəlifə Mədinəyə qayıdandan sonra artıq dincəlib Şam səfərinin yorğunluğunu atmış İslam ordusunu yenidən səfərbər etdi. Ordunu on bir qola ayıraraq hər birinə sərkərdəlikləri və şücaətləri ilə tanınmış şəxsləri əmir təyin etdi. Əbu Süleyman Xalid ibn Vəlid (r.ə), İkrimə ibn Əbu Cəhl (r.ə), Əmr ibnü'l-As (r.ə), Şurahbil ibn Abdullah ibn Həsənə (r.ə), Əbu Uməyyə (r.ə), Xalid ibn Səid (r.ə), Huzeyfə ibn Muhsin (r.ə), Ə'la ibn Hədrəmi (r.ə), Suveyd ibn Muqərrin (r.ə) onun irtica və irtidadın kökünü kəsmək üçün təyin etdiyi əmirlərdən idilər. Xəlifənin özü də bu hərbi səfərdə iştirak etmək niyyətində idi. Lakin Ömər (r.ə) və Əlinin (r.ə) xəlifənin hərbi səfərdə iştirak edib uzun müddət Mədinədən kənarda qalmasının məqsədəuyğun olmadığı barədəki təkidlərindən sonra bu fikrindən daşınmışdı. Ordu Zil-Qissəyə qədər birlikdə irəliləyib buradan hər əmir öz dəstəsi ilə təlimat üzrə hərəkətə keçmişdi.

Xalid ibn Vəlid (r.ə) Tuleyha ibn Xuveylidin üstünə getmişdi. Tuleyha hələ Rəsulullah (s.ə.v) həyatda ikən, onun ömrünün son günlərində irtidad etmiş, lakin Peyğəmbərin (r.ə) əmri ilə onun qiyamını yatırmaq üçün getmiş Dirar

ibn Əzvərin (r.ə) hücumuna müqavimət göstərə bilməyərək qaçıb gizlənmişdi. Əbu Bəkrin (r.ə) xilafətinin ilk günlərindən Tuleyha yenidən peyda olaraq özünü peyğəmbər elan etmişdi. Qətəfan, Təyy, Əsəd, Fəzarə, Əbs, Zibyan, Bəni-Bəkr, Həvazin, Qəvs və Cədilə qəbilələrindən olan mürtədlərin əksəriyyəti Tuleyhanın ətrafında toplaşaraq silahlı qüvvə meyadan gətirmişdilər. Əbu Bəkr (r.ə) Xalid ibn Vəliddən (r.ə) əvvəl Ədiyy ibn Hatimi (r.ə) Təyy qəbiləsinin yanına göndərmişdi. Ədiyy ibn Hatim (r.ə) özü bu qəbiləyə mənsub idi. O, öz qəbilədaşları ilə danışaraq onları irtidaddan çəkindirmiş, onlar Əbu Bəkrə (r.ə) bey'ət edərək İslama dönmüşdülər. Cədilə və Qəvs qəbilələri də xəlifənin elçilərinin nəsihətlərini dinləyərək tövbə etmiş, irtidaddan əl çəkmişdilər. Xəlifənin Əsəd qəbiləsinə elçi olaraq göndərdiyi Sabit ibn Əqrəm əl-Bələvi (r.ə) və Ukaşə ibn Mihsan əl-Əsədi (r.ə) Tuleyhanın mürtədləri tərəfindən qətlə yetirilmişdilər. Bu hadisədən sonra Buzaxə adlı yerdə Tuleyha ibn Xuveylid əl-Əsədinin silahlı mürtədləri ilə qarşılaşan Xalid ibn Vəlid (r.ə) onları ağır məğlubiyyətə uğratmışdı. Tuleyha yenindən qaçaraq canını qurtarmağı bacarmışdı. Onun qaragüruhu isə Havab adlı yerdə toqlanıb yenidən Xalid ibn Vəlidin (r.ə) ordusu ilə döyüşə girişmiş lakin məğlub olaraq çoxu öldürülmüşdü. Bununla da Tuleyhaya qoşularaq irtidad edən qəbilələr yenidən itaət altına alınmışdılar. Tuleyhanın özü isə Ömər ibn Xəttabın (r.ə) xiləfəti dövrünə qədər çöllərdə dərbədər gəzərək gizlənmişdi. Nəhayət o, Ömərə (r.ə) xəbər göndərərək tövbə edib İslamı qəbul etdiyini və ona bey'ət etmək istədiyini bildirmişdi. Ömər ibn Xəttab (r.ə) onun bu istəyini qəbul etmiş, lakin onu yarımadada qoymayaraq İraq cəbhəsinə, Sasani ordusu ilə vuruşmağa göndərmişdi.

Tuleyha və ətrafındakıların qiyamını yatıran Xalid ibn Vəlid (r.ə) ordusu ilə Bəni-Təmim qəbiləsinin üstünə getmişdi. Təmim qəbiləsinin bir qismi Səcah bint Haris adlı xristiyan bir rahibənin ətrafında birləşərək irtidad etmişdi. Səcah ərəb yarımadasına İraqdan gəlmişdi. Xalidin (r.ə) ordusu Təmim qəbiləsinin yurduna hücum edərək oradakı mürtədlərin silahlı müqavimətini qırmışdı. Səcah isə qaçaraq digər bir saxtakara, Yəmamə bölgəsində "*kəzzab*", yəni yalançı ləqəbi ilə məşhur olmuş Museyləməyə pənah aparmışdı. Səcah insanları irtidada və özünə itaət etməyə dəvət edərkən təmimli müsəlmanlardan ona qarşı çıxanlar olmuşdu. Təmimli müsəlmanların müqavimətini qırmaq üçün Səcah Təmim qəbiləsinin əsilzadələrindən olan Malik ibn Nuveyrənin nüfuzundan istifadə etmişdi. Malik ibn Nuveyrə Bəni-Təmim qəbiləsinin Bəni-Hənzələ oymağının rəisi idi. İslamı qəbul etmişdi və Allah Rəsulu (s.ə.v) ona Bəni-Təmim qəbiləsinə zəkat məmuru təyin etmişdi. Səcah ortaya çıxdığı vaxt Maliki də öz dininə dəvət etmişdi. Malik ibn Nuveyrə onun dinini qəbul etməkdə tərəddüd

göstərib bunun üçün Səcahdan vaxt istəsə də ona yardım etməkdən geri durmamışdı. Malik ibn Nuverya Səcahın göstərişinə əməl edərək öz dəstəsi ilə təmimli müsəlmanlarla vuruşmuş, onları məğlub edərək bir çoxunu öldürmüşdü. Nəticədə Səcah qüvvətlənmiş və tərəfdarlarının sayı artmışdı. Bu vəziyyət Xalid ibn Vəlidin (r.ə) öz ordusu ilə Bəni-Təmim yurduna gəlməsinə qədər davam etmişdi. Əbu Bəkr (r.ə) Xalid ibn Vəlidi (r.ə), eləcə də digər əmirləri, mürtədlərin və mürtəcelərin üzərinə göndərərkən onları belə təlimatlandırmışdı ki, mücahidlərin əzan səsi eşidilən yurdlara hücum etməsini əmr etməsinlər. Malik ibn Nuverya Xalidin (r.ə) Bəni-Təmim yurduna yaxınlaşdığını eşidən kimi qorxuya düşərək yanındakı zəkat mallarını ona göndərmişdi və Xalid ibn Vəlid (r.ə) də bu malları Mədinəyə yollamışdı. Xalidin (r.ə) ordusundakı bir qrup mücahid "*biz müşahidə edib dinləsək də onların yurdundan namaz vaxtlarında əzan səsi gəldiyini eşitmədik*" deyərək Bəni-Hənzələ oymağına hücum etmiş və Malik ibn Nuveyrəni yaxalayıb Xalidin (r.ə) yanına gətirmişdilər. Lakin bu dəstədə olanlardan Əbu Qatədə Haris ibn Rəbi' (r.ə) "*mən onların yurdundan əzan səsi gəldiyini eşitdim*" demişdi. Xalid (r.ə) Malik ibn Nuveyrəni sorğu-sual edərkən "*sən niyə Səcaha itaət etdin?*" sualına Malik "*mən onun dinini qəbul etmədim, sadəcə onunla sülh bağladım*" deyə cavab vermiş, Allah Rəsulu (s.ə.v) haqqında danışarkən isə "*sizin sahibiniz*" ifadəsini işlətmişdi. Malik Səcaha qarşı çıxan təmimli müsəlmanların qətlində iştirak etmişdi. Buna görə də Xalid ibn Vəlid (r.ə) tutduğu işlərdən ötürü Malikə qəzəbli idi. Onun Peyğəmbər (s.ə.v) haqqında "*sizin sahibiniz*" ifadəsini işlətməsi Xalidin (r.ə) qəzəbinin alovlanmasına səbəb olmuşdu. O, Malikə "*Ey köpək! Bizim peyğəmbərimizidir, bəs sənin peyğəmbərin deyilmi? Sən münafiqsən. Səcaha itaət etdin, onun əmri ilə müsəlmanların qanını tökdün*" deyə bağırmış və boynunun vurulmasını əmr etmişdi. Əbu Qatədə (r.ə) Mədinəyə qayıdanda şahidi olduğu bu hadisəni Ömər ibn Xəttaba (r.ə) danışmışdı. Ömər ibn Xəttab (r.ə) bundan ötürü Xalidə (r.ə) qəzəblənmiş və onu xəlifəyə şikayət etmişdi. Bir müddət sonra Malik ibn Nuveyrənin qardaşı da gəlib qardaşının müsəlman olduğu halda Xalidin (r.ə) əmrilə edam etdirildiyi barədə şikayət etmişdi. Xəlifə Xalid ibn Vəlidi (r.ə) Mədinəyə çağırmışdı. Ömər ibn Xəttab (r.ə) Xalidi (r.ə) görən kimi sadağındakı oxları alıb sındırmış və "*Sən heç Allahdan qorxmursanmı? Bir müsəlmanın boynunu vurdurtmusan*" demişdi. Xalid (r.ə) ona "*Sən Allah Rəsulunun (s.ə.v) "Xalid Allahın qılıncıdır" dediyini eşitməmisənmi? Allahın qılıncı ancaq kafirlərlə münafiqlərin boynuna enər*" deyə cavab vermişdi. Əbu Bəkr (r.ə) baş verənləri Xalid ibn Vəliddən (r.ə) dinləyəndən sonra onu haqlı bildi və vəzifəsini icra etməyə göndərdi. Lakin Xalidin (r.ə) Malik ibn

Nuveyrənin arvadını cariyə kimi götürməsini xoş qarşılamadı və qadını sərbəst buraxmasını tapşırdı.

Kəzzab, yəni yalançı adı ilə məşhur olmuş Museyləmə ibn Həbib hələ Allah Rəsulu (s.ə.v) həyatda ikən öz peyğəmbərliyini elan etmişdi. Bəni-Hənifə qəbiləsinin dəstəyinə arxalanan Museyləmə həyasızlıqda həddini o qədər aşmışdı ki, hətta Allah Rəsuluna (s.ə.v) məktub yazaraq özünün də peyğməbər olaraq qəbul edilməsini və yarımadanın ikisi arasında bölünməsini təklif etmişdi. Allah Rəsulu (r.ə) vəfatından bir müddət əvvəl Rəccal ibn Unfuvə əl-Hənəfini Yəmaməyə, Museyləmənin qiyamını yatırmaq üçün göndərmişdi. Peyğəmbərin (s.ə.v) vəfatından sonra, Əbu Bəkrin (r.ə) xilafəti dövründə Rəccal xəyanət edərək Museyləmənin yağlı və'dlərinə aldanmış və mürtədlərə qoşulmuşdu. Rəccalın bu hərəkəti Bəni-Hənifəli mürtədləri tamamilə azğınlaşdırmışdı. Museyləmə Yəmamədə Məkkə ətrafında olduğu kimi həram bölgə təyin etmiş, öz adını əzana daxil etdirərək oxutmuşdu. Əbu Bəkr (r.ə) Bəni-Hənifə qəbiləsinin gücünə və imkanlarına bələd olduğu üçün İkrimə ibn Əbu Cəhllə (r.ə), Şurahbil ibn Həsənəni (r.ə) Yəmaməyə çatmadan qüvvələrini birləşdirib birlikdə hərəkət etmək barədə təlimatlandırmışdı. Müseyləmə təqribən 40 minə yaxın silahlı mürtədi öz ətrafına toplaya bilmişdi. Lakin İkrimə ibn Əbu Cəhl (r.ə) cahiliyyə dövründəki qüsurlarının izini silmək üçün tək başına şücaət göstərmək niyyətinə düşmüş və Şurahbilin (r.ə) qüvvələrini gözləmədən hücuma keçmişdi. Xəlifənin təlimatına əməl etməməsi mürtədlər qarşısında məğlub olub geri çəkilməsinə səbəb olmuşdu. Şurahbil (r.ə) də İkrimənin (r.ə) səhvini təkrarlayaraq Yəmamə mürtədlərinə qarşı tək başına döyüşə girişmiş və İkrimənin (r.ə) aqibətinə uğramışdı. Xəlifənin qəti təlimatı ilə bu dəfə hər ikisi Xalid ibn Vəlidin (r.ə) köməyə gələn qüvvələri ilə birləşib hərəkətə keçməli idilər. Xalidin (r.ə) əmri altına girən üç hərbi birləşmə Yəmaməyə hücum etmişdi. Qanlı döyüşlərdən sonra Bəni-Hənifəli mürtədlər ağır məğlubiyyətə uğramışdılar. Museyləmə qaçaraq bir istehkamda gizlənmiş, lakin Vəhşi ibn Hərb (r.ə) ilə ənsarlı bir mücahid onu burada yaxalamışdılar. Vəhşinin (r.ə) nizəsi ilə sinəsindən ağır yaralanan Museyləmənin başını bədənindən ənsarlı mücahidin qılıncı ayırmışdı. Vəhşi ibn Hərb (r.ə) vaxtilə Bədr döyüşündə Həmzəni (r.ə) şəhid etmiş, lakin daha sonra əməlindən peşman olaraq İslamı qəbul etmişdi. Museyləməyə pənah aparmış Səcah isə yenidən qaçıb səhradakı bədəvilərin arasında izini itirmişdi. Hicri 11-ci ilin (632) yayında baş vermiş Yəmamə döyüşündə 14000 mürtəd öldürülmüş, 1200-ə yaxın mücahid şəhid olmuşdu. Şəhidlərin arasında Suffə əshabından olan 70 nəfər Qur'an hafizi də var idi. Yəmamədə mürtədlərə qarşı döyüşdə şəhid olanlar arasında Zeyd ibn

Xəttab[64] (r.ə), Əbu Dücanə (r.ə), Tufeyl ibn Əmr (r.ə), Abdullah ibn Suheyl ibn Əmr (r.ə), Sabit ibn Qeys əl-Ənsari (r.ə), Əbu Huzeyfə ibn Utbə (r.ə), Salim (r.ə) kimi tanınmış səhabələr də var idilər.

Allah Rəsulunun (s.ə.v) dəvəti ilə İslamı qəbul etmiş Bəhreyn hakimi Munzir ibn Savə ət-Təmimi (r.ə) Peyğəmbərin (s.ə.v) vəfatından bir neçə ay sonra dünyasını dəyişmişdi. Munzirin (r.ə) ölümündən sonra əmri altındakı qəbilə və oymaqlarda irtidad baş qaldırmış, bəziləri İslamı tərk etmişdilər. Ə'la ibn Hədrəmi (r.ə) əmri altındakı əsgərlərlə xəlifənin göstərişiylə Bəhreynə gəlmişdi. Burada ona Bəhreynli müsəlmanlar da qoşulmuşdular. Mürtədləri darmadağın edən Ə'la (r.ə) onlardan qaçıb Dareyn adasına sığınanları da orada yaxalayıb məhv etmişdi.

Umman mürtədləri Luqeyt ibn Malik adlı bir şəxsin ətrafında birləşmişdilər. Huzeyfə ibn Muhsin (r.ə) köməyə gələn İkrimə ibn Əbu Cəhl (r.ə) və Əfrəcə ibn Hərsəmənin (r.ə) qüvvələri ilə birləşərək Dəba adlı yerdə Luqeytin mürtədləri ilə şiddətli bir döyüşə girişmiş və onları ağır məğlubiyyətə uğratmışdı. Döyüş meydanında 10 minə yaxın mürtədin cəsədi qalmış və xeyli sayıda əsir alınmışdı. Daha sonra İkrimə (r.ə) Məhrədə irtidad etmiş Bəni-Şəqrət, Bəni-Şihrit və Bəni-Muharib qəbilələrinin üzərinə gedərək onları məğlub etmişdi.

Əns qəbiləsindən Əsvəd əl-Ənsi adı ilə məşhur olan saxtakar Kə'b ibn Əbhələnin qiyamının yatırılması haqqında yuxarıda məlumat vermişdik. Əbu Bəkrin (r.ə) xilafəti dövründə Yəməndə Əsvəd əl-Ənsinin tərəfdarları yenidən baş qaldırmışdılar. Üstəlik vaxtilə Əsvədə qarşı vuruşmuş Qeys ibn Əbdiyəğus əl-Məkşuh mürtədlərə qoşulmuşdu. Lakin yəmənli müsəlmanlar qüvvələrini səfərbər edərək mürtədlərin öhdəsindən gəlmiş və onları məğlub etmişdilər. Qeys ibn əl-Məkşuh qaçarkən Əbu Bəkrin (r.ə) yəmənli müsəlmanlara köməyə göndərdiyi Mühacir ibn Uməyyənin (r.ə) ordusundakı mücahidlərin əlinə keçmişdi. İkrimənin (r.ə) əmri altındakı ordu ilə Məhrədən Yəmənə gəlməsilə buradakı irtidad hərəkətinin kökü tamamilə kəsilmişdi. Qeys ibn əl-Məkşuh əsir kimi Mədinəyə göndərilmişdi. Xəlifə onun keçmişdəki xidmətlərini və tutduğu əməldən peşmanlığını nəzərə alaraq əvf etmişdi. Beləcə yarımadadakı irtica və irtidad çıxışlarının kökü kəsilmiş, İslamın gətirdiyi sülh və əminamanlıq bərqərar edilmişdi.

---

[64] Ömər ibn Xəttabın (r.ə) qardaşı Zeyd ibn Xəttab (r.ə) Allah Rəsulunun (s.ə.v) dəvətinə ilk iman gətirənlərdən biri idi. Hicrət etmiş və Peyğəmbərlə (s.ə.v) birlikdə demək olar ki, bütün döyüşlərdə iştirak etmişdi. Yəmamə döyüşündə qəhrəmanlıqla vuruşmuş, bir çox mürtəd onun qılıncı ilə məhv olmuşdu. Bu döyüşdə Museyləmənin əsgərlərinə komandanlıq edən Rəccal ibn Unfuvəni də Zeyd ibn Xəttab (r.ə) öldürmüşdü.

*İraqdakı Hərbi Əməliyyatlar*

Allahın yer üzərindəki son elçisi Muhəmməd (s.ə.v) vəhy olunmuş tövhid dininin gətirdiyi yeni sistem və nizam, ərəb millətinin həyatını hər cəhətdən dəyişdirdiyi kimi hərbi və siyasi həyatına da geniş surətdə nüfuz etmiş, mükəmməl şəkildə təşkilatlandırmışdı. Cahiliyyə dövrü adı ilə tanınan İslamdan əvvəlki dövrdə ərəb qəbilələri arasında illər boyu davam edən müharibələr, hər bir ərəbi özünü bir əsgər, döyüşçü kimi yetişdirməyə məcbur edirdi. Allah Rəsulunun (s.ə.v) vəfatından sonra baş vermiş fəthlər və qazanılan parlaq zəfərlər sayəsində onun qurduğu Mədinə şəhər dövləti qısa müddət ərzində xeyli genişləmiş və əzəmətli bir gücə çevrilmişdi. Bunun paralelində İslam dini bu torpaqlarda yayılaraq vaxt keçdikcə çox böyük bir coğrafiyada yaşayan bir çox millətin və xalqın yeganə, müştərək dininə və ümumi mədəniyyətinə çevrilmişdi. Peyğəmbərin (s.ə.v) arzu və məqsədi Allahın iradəsinə və təqdirinə insanların riza və təslimiyyət göstərmələri olmuşdur. Allah Rəsulu (s.ə.v) üçün bunun xaricindəki hər şey bu məqsədə çata bilməkdən ötürü sadəcə bir vasitə idi. Siyasi iqtidar və ya hər hansı başqa bir əməl və hərəkət bu məqsədə doğru gedən yolda irəliləmək üçün ehtiyac duyulan vasitədən başqa bir şey deyildi. Rəsulullahın (s.ə.v) vəfatından sonra isə onun ətrafındakı insanlar, onun səhabələri ona Allah tərəfindən endirilmiş ilahi müjdəni yəni Qurani-Kərimi bəşəriyyətə çatdırmaq məqsədilə onun getdiyi yolda əzmlə irəliləmişdilər. İslam dininin ən ümdə əmrlərindən biri olan cihad əmri insanları hərəkətə gətirmiş, onların fitrətindəki qüvvət və istedadın üzə çıxmasına səbəb olmuşdu. Uca Allah müsəlmanlara nüsrət və müvəffəqiyyəti təqdir buyurmuş, onların ilk nəsli şəxsən Allah Rəsulu Muhəmmədin (s.ə.v) tərbiyəsi ilə yetişdirmişdi. Onların arasından siyasət, hərb, elm, zəka və dühada bəşəriyyətin ən böyük və nadir şəxsləri çıxmışdı. Əbu Bəkr (r.ə), Ömər ibn Xəttab (r.ə), Osman ibn Əffan (r.ə), Əli ibn Əbu Talib (r.ə) təqva, fəzilət, salehlik və dühada dövrün nadir və əvəzsiz şəxsiyyətləri idilər. Xalid ibn Vəlid (r.ə), Usamə ibn Zeyd (r.ə), Xalid ibn Səid (r.ə), Əbu Ubeydə ibn Cərrah (r.ə), Sə'd ibn Sufyan (r.ə), Muğirə ibn Şubə (r.ə), Sə'd ibn Əbu Vəqqas (r.ə) ordulara komandanlıq, zəka, strategiya və taktikada hər biri bir dahi idilər. İlk dövrlərdə bu kimi şəxslərin yetişməsi İslamın sürətlə müvəffəqiyyət qazanmasına xidmət edən səbəblərdəndir.

Ərəb yarımadasından dünyanın dörd bir tərəfinə yayılmaq ərəfəsində olan İslamın qarşısında iki böyük rəqib var idi; xristian şərqi Roma İmperiyası (Bizans) və məcusi İran Sasani imperiyası. Şam diyarında yaşayan xristian və bütpərəst ərəb qəbilələri Bizansın müttəfiqi idilər. İraqın Fərat çayı ilə ərəb yarımadası arasındakı hissəsində yaşayan ərəb qəbilələri isə Sasanilərin təsiri

altında idilər. Buradakı Hirə şəhəri və ətrafındakı torpaqlar Sasani şahlarının təyin etdiyi canişinlərin idarəçiliyi altında idi.

Əbu Bəkr (r.ə) İslamın buradakı ərəb qəbilələri arasında yayılmasını üçün əlverişli şərait yaratmaq niyyətində idi. Artıq Qəssanilər arasında İslam yayılmaqda idi. İraqla həmsərhəd ərazilərdə məskun olan Bəkr ibn Vail qəbiləsinin Bəni-Şeyban oymağından Müsənna ibn Harisə (r.ə) Hirə əyalətinə öz süvariləri ilə hücumlar təşkil etməkdə idi. O, xəlifəyə məktub yazaraq bu iş üçün maddi dəstək və əlavə qüvvə istəmişdi. Əbu Bəkr (r.ə) əvvəlcə Bəni-Şeyban oymağına qonşu olan ərəb qəbilələrinin rəislərinə məktub göndərərək Müsənnaya (r.ə) kömək etmələrini tövsiyə etmişdi. Daha sonra isə Xalid ibn Vəlidi (r.ə) əmrindəki 10 min nəfərlik qüvvə ilə İraqa göndərmişdi. Xalid (r.ə) İraq hüdudlarına yaxınlaşanda Müsənna (r.ə) 8 min nəfərlik döyüşçüsü ilə ona qoşulmuşdu. Xalid ibn Vəlid (r.ə) 18 minlik ordusuna üç əsas istiqamətdə hücum əmri vermişdi. Plana görə hər biri 6 min nəfərdən ibarət bu üç qrup hərbi tapşırıqları başa vurub Hufeyr adlı yerdə yenidən birləşəcəkdi. Xalid ibn Vəlid (r.ə) Hirə şəhərinə yaxınlaşdığı vaxt burada Sasanilərin təyin etdiyi ərəb canişin onunla görüşərək illik 90 min dinar cizyə müqabilində əhdnamə bağlamışdı. Lakin canişinin bu hərəkəti Sasani sarayının qəzəbinə səbəb olmuş, əhdnamə bağlayan canişin işindən uzaqlaşdırılaraq yerinə başqası təyin edilmişdi. Bundan başqa Hörmüzd adlı sərkərdənin əmrindəki Sasani ordusu Hufeyrdə döyüşə hazır vəziyyətə gətirilmişdi. Xalid ibn Vəlid (r.ə) Hufeyrin iranlılar tərəfindən zəbt edildiyi xəbərini alan kimi hərbi dəstələrə indiki Küveyt ərazisində yerləşən və Kazımiyyə (və ya Kazımə) adlanan yerdə cəmləşməyi əmr etdi. Lakin Hörmüzd daha cəld tərpənərək xilafət ordularından əvvəl Kazımiyyəyə gələrək buranı zəbt etmişdi. Kazımiyyədə ordunun su təchizatını təmin edə biləcək su quyuları var idi ki, Sasani əsgərləri buranı artıq ələ keçirmişdilər. Xalid ibn Vəlid (r.ə) Sasani ordusu ilə döyüşün qaçınılmaz olduğunu anlamışdı. O, Hörmüzdə məktub göndərərək onu İslama dəvət etdi. İslamı qəbul etmək istəmirsə cizyə ödəyərək itaət edə biləcəyini, əks təqdirdə bunun ağır nəticələrini qəbul etmək məcburiyyətində qalacağını bildirdi. Xalid ibn Vəlidin (r.ə) bu məktubuna cavab olaraq Hörmüzd əmrindəki Sasani ordusunu döyüş nizamına gətirdi. Xalid ibn Vəlid (r.ə) əmirlərə hər şeydən əvvəl su quyularını ələ keçirməyi əmr etmişdi. Çünki ordu susuz idi və bu əlverişsiz şəraiti aradan qaldırmaq lazım idi. Lakin döyüşdən əvvəl yağan yağış ordudakı əsgərlərin və minik heyvanlarının su ehtiyacını aradan qaldırmışdı. Beləliklə Hörmüzdün su quyularını ələ keçirərək əldə etdiyi üstünlük də əhəmiyyətini itirmişdi. İki ordu döyüşə girməmişdən əvvəl Hörmüzd Xalidə (r.ə) təkbətək döyüş təklif etmişdi. Xalid ibn Vəlid (r.ə)

bu təklifi qəbul edərək irəli çıxmışdı. Təkbətək döyüş Xalidin (r.ə) qələbəsi ilə bitmişdi. Cəsədi döyüş meydanında qalan Hörmüzdün adamları Xalidə (r.ə) hücum etmək istəsələr də xəlifənin göndərdiyi köməkçi qüvvələrin əmiri Qə'qa ibn Əmr ət-Təmimi (r.ə) onların qarşısını kəsmişdi. Xalid ibn Vəlid (r.ə) öldürdüyü iranlı sərkərdənin silahlarını və başındakı yaqut və zümrüd daşlarla bəzədilmiş 100 min dirhəm dəyərindəki dəbilqəsini qənimət olaraq götürmüşdü. Bu təkbətək döyüşün nəticəsindən ruh düşkünlüyünə qapılmış Sasani ordusu ərəblərin hücumlarına daha çox davam gətirə bilməyərək məğlubiyyətə uğramışdı. Kazımiyyə[65] qələbəsindən sonra mücahidlər yaxınlıqdakı İlyə və Mər'ə qalalarını fəth etmişdilər.

Ordusunun Kazımiyyədəki aqibətindən xəbərsiz olan Sasani şahı III Yəzdigərd (632-651) ərəblərin İraqa hücumunun qarşısını almaq üçün Kureyn adlı sərkərdəsini böyük bir ordu ilə yola çıxarmışdı. Kazımiyyədən sağ qurtulmuş sərkərdələr Qubad və Ənuşcan əsgərləri ilə birlikdə Kureynin ordusuna qatılmışdılar. Xalid ibn Vəlid (r.ə) hicri 12-ci ilin səfər ayında (aprel-may 633) Mizar adlı yerdə, Səna çayı sahilində Kureynin ordusuna hücum etmişdi. Buradakı şiddətli döyüş Sasani ordusunun məğlubiyyəti ilə nəticələnmişdi. İranlı sərkərdələr Kureyn, Qubad və Ənuşcan da Mizar döyüşündə öldürülmüşdülər. Sasani əsgərlərinin bir çoxu qaçarkən Səna çayında boğulmuşdular. Mizar döyüşündə 30 minə yaxın Sasani əsgəri öldürülmüşdü. Bunların arasında Sasanilərin müttəfiqi olan çox sayıda xristian ərəb qəbiləsindən döyüşçü də var idi. Bu döyüşdə çox sayıda əsir və qənimət də alınmışdı. Xalid (r.ə) qənimətlərin beşdə birini əsirlərlə birlikdə Mədinəyə göndərmiş, beşdə dördünü isə mücahidlərin arasında bölmüşdü. Xalidin (r.ə) əmri ilə kəndlərdə və qəsəbələrdə yaşayan dinc əhalinin canlarına və mallarına toxunulmamışdı. Əsirlər və qənimətlər sadəcə döyüş meydanında qarşılaşılan düşmən əsgərlərindən alınmışdı. Müsəlmanların dinc əhaliyə toxunmaması illər boyu Bizans-Sasani müharibələrində soyğun və talana məruz qalan İraq əhalisini məmnun etmiş və onlar mücahidlərə heç bir əngəl törətməmişdilər.

Xalid ibn Vəlid (r.ə) ətrafa göndərdiyi kiçik kəşfiyyatçı dəstələri vasitəsi ilə daim düşmənin vəziyyəti və hərəkətləri barədə məlumatlar alırdı. O, Əndərzəgar adlı iranlı sərkərdənin İraqdakı Hirə, Kəskər və Mənazirə şəhərlərindəki, əsasən

---

[65] Mənlələrdə Kazımiyyə döyüşü həmçinin "Zatu's-Səlasil" (zəncirlər) döyüşü kimi də qeyd olunur. Buna səbəb iranlı əsgərlərin döyüşdən qaçmalarını əngəlləmək üçün ayaqlarından bir-birinə zəncirlənmiş olmalarıdır. Bu adla, yəni Zatu's-Səlasil adı ilə tanınan bir başqa döyüş də Əmr ibn əl-Asın komandanlığı altındakı İslam ordusu ilə Şamdakı xristina ərəb qəbilələri arasında hicri 8-ci ilin cəmadiəlaxir ayında (sentyabr-oktyabr 629) baş vermişdi. Bu haqda yuxarıda məlumat vermişdik.

Bəkr ibn Vail qəbilələr birliyinə mənsub xristian və müşrik ərəblərdən topladığı ordu ilə Vəlcə adlı yerdə ordugah qurduğunu öyrənən kimi dərhal hərəkətə keçdi. Mücahidlərin bir qismini pusquya yatıraraq gözləmələrini əmr etdi. Özü isə ordusunun əsas hissəsi ilə Vəlcədəki düşmən ordugahına hücum etdi. Döyüşün ən şiddətli vaxtında pusqudakı mücahidlər düşmən ordusunun arxasına keçib hücum etdilər. Bu hal Sasani ordusunda çaşqınlıq yaratdı, onlar nə baş verdiyini anlaya bilməmişdilər. Buna görə də xeyli itgi verərək ağır məğlubiyyətə uğramışdılar. Öldürülənlərin arasında Əndərzəgar da var idi.

Hicri 12-ci ilin rəbiələvvəl ayında (may-iyun 633) Xalid ibn Vəlid (r.ə) Ulleys adlı yerdə iranlı sərkərdə Cabanın əmrindəki başqa bir Sasani ordusunu da məğlubiyyətə uğratmışdı. Xalid ibn Vəlid Ulleysdəki iranlıların hərbi düşərgəsinə qəfil basqın etmişdi. Sasani ordusu döyüş nizamını ala bilmədən süvari mücahidlərin hücumuna uğrayaraq darmadağın edilmişidi. Ulleys zəfərindən sonra Əmgişiyyə qalası fəth olunmuşdu. Əmgişiyyədə xeyli miqdarda qənimət İslam ordusunun əlinə keçmişdi. Burada ələ keçirilən qənimətlərin beşdə dördü mücahidlər arasında bölünərkən hər birinin payına 1500 dirhəm düşmüşdü. Əmgişiyyədə çox qalmayan Xalid ibn Vəlid (r.ə) ordularını İraqın indiki Nəcəf şəhəri ətrafındakı ərazilərinə istiqamətləndirmiş, buradakı bəzi qala və istehkamları ələ keçirmişdi.

Xalid ibn Vəlid (r.ə) İraqdakı Sasani qüvvələrinə ağır zərbələr vurub iranlıların silahlı gücünü xeyli zəiflədəndən sonra əsas hədəfi olan Hirə şəhərinə üz tutmuşdu. O, hədəfə daha tez çatmaq üçün Əmgişiyyədə hərbi təchizatı və piyada əsgərləri iranlılardan qənimət olaraq ələ keçirilmiş gəmilərə yüklədərək Fərat çayı boyu üzməyi əmr etmişdi. Özü isə süvari qüvvələrlə gəmilərin paralelində Fərat çayı boyunca irəliləmişdi. Gəmilər Hirəyə yaxınlaşarkən iranlıların bənd quraraq çayın məcrasını dəyişdikləri görüldü. Bu səbəbdən də gəmilərin bir çoxu dayaz sularda palçığa batıb qalmışdı. Xalid ibn Vəlid (r.ə) çayın məcrasını dəyişən bəndləri dağıldaraq gəmilərin hərəkətini təmin etmək məqsədiylə hərəkətə keçmişdi. Bu vaxt ona mane olmağa çalışan Sasani süvarilərini məğlub etmiş və bəndləri yıxdıraraq Fərat çayını öz məcrasına qaytarmışdı. Beləcə hərbi təchizatın yükləndiyi gəmiləri lazımi yerə qədər üzdürmək mümkün olmuşdu. Xalid ibn Vəlid (r.ə) ordusunun bütün təchizatını təmin etdikdən sonra Hirə şəhərini mühasirəyə almışdı. O, şəhər əhalisinə ya İslamı qəbul etməyi ya da cizyə ödmək şərti ilə təslim olmağı təklif etmişdi. İranlı canişin mühasirədən əvvəl şəhərdən qaçsa da əsasən xristian ərəblərdən ibarət əhali bir müddət müqavimət göstərmişdi. Heç bir yerdən kömək ümidləri qalmayan hirəlilər müsəlmanların gec-tez hərbi yolla şəhəri ələ keçirəcəklərini bildikləri üçün cizyə ödəmək şərti

ilə əhdnamə bağlamağa razılıq vermişdilər. Xalid ibn Vəlidlə (r.ə) hirəlilərin elçiləri arasında əhdnamə tərtib edilərək təsdiqlənmiş, beləcə Hirə xilafət orduları tərəfindən fəth olunmuşdu. Xalidin (r.ə) hirəlilərə verdiyi əhdnamənin mətninin məzmunu aşağıdakı kimidir:

*Bu, Xalid ibn Vəlidin (r.ə) Hirə əhalisinin təmsilçiləri olan Ədiyy ibn Ədiyy, Əmr ibn Əbdulməsih, İlyas ibn Qabisə və Cubeyr ibn Əqqala verdiyi əhdnamədir. Adları çəkilənlər Hirəlilərin səlahiyyətli nümayəndələri və etimad göstərdikləri şəxslərdir. Hirəlilər müsəlmanlarla sülh sazişi bağlamağı onlara həvalə etmişdilər. Bu dünya həyatında bir cəza olaraq hər il ödəyəcəkləri 190 min dirhəm cizyə müqabilində onlarla sülh sazişi bağlanmışdır. Monastırlarda tərkidünya yaşayan rahiblər istisna olmaqla onların rahibləri və keşişləri də cizyə ödəyəcəkdirlər. Müsəlmanlar Hirə şəhəri əhalisinin təhlükəsizliyinin təminatını öz üzərlərinə götürürlər. Onların təhlükəsizliyini təmin edə bilməyəcəkləri təqdirdə cizyə alınmayacaq. Hirəlilərin söz və davranışları ilə müsəlmanları aldatmaları əhdnamənin hökmünə son qoyacaqdır. Həmin bu sənəd on ikinci ilin rəbiələvvəl ayında (14 may-13 iyun 633) yazılaraq Hirəlilərin təmsilçilərinə verilmişdir".*

Əbu Bəkrin (r.ə) vəfatından sonra Hirəlilər əhdnamənin şərtlərinə əməl etməyərək qiyam qaldırmış və şəhəri Sasanilərə təslim etmişdilər. Lakin qısa müddət sonra Ömər ibn Xəttabın (r.ə) xilafəti dövründə Müsənna ibn Harisə (r.ə) Hirəni ikinci dəfə fəth edərək əhali ilə daha ağır şərtlərlə yeni əhdnamə bağlamışdı.

Hirəni fəth edən Xalidin (r.ə) növbəti hədəfi indiki İraqın mərkəzində yerləşən Ənbar şəhəri idi. Ənbar Şirzad adlı bir Sasani canişini tərəfindən idarə olunmaqda idi. Şirzad qala divarlarının möhkəmliyinə və şəhərin ətratındakı dərin və enli xəndəyə güvənərək şəhərdəki qarnizona müdafiə əmri vermişdi. İslam ordusu Ənbara çatanda xəndəyin bayır tərəfində Ənbar ətrafında yaşayan bütpərəst ərəb qəbiləsi olan Bəni-İyadın süvariləri ilə qarşılaşmışdı. Bəni-İyad qəbiləsi Sasani canişinin müttəfiqi idi. Xalid (r.ə) mücahidlər arasındakı ən sərrast oxçuları seçərək onlara Bəni-İyad süvarilərini gözlərindən hədəf alaraq vurmalarını əmr etmişdi. Mücahidlərin sərrast ox atışları bütpərəst bədəvi döyüşçülərdən bir çoxunun kor olmasına səbəb olmuşdu. Gözlərini itirən bədəvilərin ah-naləsi digərlərində qorxu və təlaş yaratmışdı. Bu səbəbdən də bu döyüşə həm də *Zatü'l-Uyun* döyüşü deyilmişdi. Bədəvilərdən bir fayda hasil edə bilməyəcəyini görən Şirzad Xalidə (r.ə) sülh təklif etmişdi, lakin Xalid (r.ə) onun irəli sürdüyü şərtləri rədd etmişdi. Xalid ibn Vəlid (r.ə) əsgərlərinə yanlarındakı lazımsız əşyaları və dəvələrini xəndəyin yaxınlığına gətirib on-

lara bu əşyaları və dəvələri kəsərək xəndəyi doldurmağı əmr etmişdi. Beləcə xəndəyi addayıb qala divarlarına yaxınlaşmaq mümkün olmuşdu. Şirzad İslam ordusunun Ənbarı qılınc gücü ilə alacağını anladığı üçün Xalidə (r.ə) onun irəli sürəcəyi şərtlərlə sülh müqaviləsi bağlamağa razı olduğunu bildirmişdi. Özünün isə bir şərti vardı, istədiyi yerə gətmək üçün şərait yaradılması. Xalid ibn Vəlid (r.ə) Şirzadın bu təklifini qəbul etmişdi. Xalid (r.ə) Şirzadı öz ordugahına gətirdib onunla əsir və ya məğlub tərəf kimi yox qonaq kimi davranmışdı. Beləcə Ənbar cizyə müqabilində əhdnamə bağlanaraq müsəlmanlara təslim edilmişdi. Xalid (r.ə) bir müddət Ənbarda qalaraq ətraf vilayətlərin başçılarına cizyə ödəyərək barışıq təklifləri göndərmişdı. Onlar Xalidin (r.ə) bu çağırışına əməl etsələr də daha sonra Bankiya və Bəvazic qəsəbələrinin əhalisi xaric heç biri, İslam ordusunun yurdlarını ikinci dəfə fəth etməsinə qədər, bu əhdnamə şərtlərinə əməl etməmişdilər.

Xalid ibn Vəlid (r.ə) Ənbar qalasında Zibrikan ibn Bədri kiçik bir mühafizə dəstəsi ilə qoyaraq ordunun əsas hissəsi ilə Əynu't-Təmr qalasına yürüşə çıxmışdı. Əynu't-Təmri mühafizə edən Sasani qarnizonuna Bəhram Çubin oğlu Mehran adlı iranlı sərkərdə başçılıq edirdi. Onun əmrində həmçinin xristian ərəb olan Təmr, Təğlib və İyad qəbilələrindən olan döyüşçülər də var idi ki, bunlara Əkkə ibn Əbi Əkkə adlı bir şəxs başçılıq edirdi. Mehran "*bunlar ərəbdirlər, onlarla vuruşmağı biz daha yaxşı bacararıq*" deyən Əkkənin təklifini qəbul etmişdi. Əkkənin niyyətindən xəbərdar olan Xalid (r.ə) ona öz əsgərlərini döyüş nizamına gətirmə fürsətini vermədən qəfil hücum etdi. Ətrafındakı döyüşçülərin bəziləri öldürülən, bəziləri isə qaçan Əkkə əsir alınaraq ordugaha gətirildi. Əkkənin başçılıq etdiyi bədəvi xristian əsgərlər mücahidlərin inadlı həmlələri qarşısında çox davam gətirə bilməyərək qaçıb Əynü't-Təmr qalasına pənah aparmışdılar. Bədəvi xristianların İslam ordusu qarşısında davam gətirə bilmədiyini görən Mehran qala divarları arxasında müqavimətin mənasız olacağı qənaətinə gələrək əmrindəki Sasani qarnizonu ilə birlikdə Əynu't-Təmri tərk edib getmişdi. Qalanı mühasirəyə alan İslam ordusu müdafiə olunmağa çalışan bədəvi xristianlara güclü həmlələr edərək onları qaladan çıxıb təslim olmağa məcbur etmişdi. Qalanı təslim alan Xalidin (r.ə) əmri ilə Əkkə ibn Əbi Əkkə boynu vurularaq edam edilmişdi. Qalada olan bütün hərbi təchizat, silah-sursat və qiymətli əşyalar qənimət alınmışdı. Xalid ibn Vəlid (r.ə) öz adamları ilə qalanı gəzərkən burada bir kilsəyə rast gəlmişdi. Bu kilsədə keşişlərlə birlikdə 40 yeniyetmə oğlan var idi. Xalid (r.ə) onları da hərbi əsirlərlə birlikdə Mədinəyə, xəlifənin hüzuruna göndərmişdi. Bu əsirlərin arasında Sirin adlı bir gənc də vardı. Qənimətlər və əsirlər bölünərkən o, Ənəs ibn Malikin (r.ə)

payına düşmüşdü. Tabiundan olan məşhur İslam alimi Muhəmməd ibn Sirin (r.ə) əsir alınmış həmin bu xristian yeniyetmənin oğlu idi. Sirin sonralar İslamı qəbul etmiş, oğlu Muhəmməd isə əshabın alimlərindən sayılan Ənəs ibn Malikin (r.ə) təlim və tərbiyəsi ilə böyümüşdü.

Yuxarıda daha əvvəl Dumətü'l-Cəndələ iki dəfə hərbi yürüş edildiyi barədə məlumat vermişdik. Bunlardan sonuncusu Təbük hərbi səfəri vaxtı baş vermişdi. Təbük səfəri vaxtı Xalid ibn Vəlidin (r.ə) əmrindəki süvarilər Dumətü'l-Cəndəl hakimi Uqeydir ibn Əbdülməliki yaxalayaraq Allah Rəsulunun (s.ə.v) yanına gətirmişdilər. Peyğəmbər (s.ə.v) Uqeydirlə əsir kimi deyil, qonaq kimi rəftar etmiş, ona hörmət göstərmişdi. Uqeydir ibn Əbdülməlik Allah Rəsulu (s.ə.v) ilə əhdnamə bağlanmışdı. Allah Rəsulunun (s.ə.v) vəfatından sonra baş qaldıran Uqeydir əhdnamənin şərtlərini pozmuşdu. Əynu't-Təmri mühasirədə saxlayarkən Xalid ibn Vəlid (r.ə) Dumətü'l-Cəndəl ətrafında hərbi əməliyyatlara girişmiş, lakin xristian bədəvilərin əhatəsində qalıb çətin vəziyyətə düşmüş İyaz ibn Qənəmdən (r.ə) məktub almışdı. İyaz (r.ə) Xalidi (r.ə) köməyə çağırırdı. Xalid (r.ə) ona cavab məktubu yazaraq biraz daha səbr etməsini, qısa vaxt ərzində ən cəsur döyüşçüləri ilə birlikdə onun imdadına yetişəcəyini bildirmişdi. Əynu't-Təmri fəth edib Uveymir ibn Kahin əl-Əsləmini (r.ə) qaladakı mühafizə dəstəsinə başçı təyin edən Xalid (r.ə) öz döyüşçüləri ilə birlikdə sürətlə Dumətü'l-Cəndələ tərəf hərəkət etmişdi. Dumətü'l-Cəndəllilər Xalid ibn Vəlidin (r.ə) onların üstünə ordu ilə gəldiyini eşidən kimi dəhal Bəhrə, Tənux, Təcaim, Kəlb və Qəssan qəbilələrinə kömək göndərmələri üçün xəbər göndərmişdilər.

Şam və İraqın xristian ərəb qəbilələri Dumətü'l-Cəndəllilərin imdadına yetişsələr də Uqeydir ibn Əbdülməlik onlara "*Siz Xalidi mənim qədər yaxşı tanımırsınız, əgər o buraya gəlirsə müsəlmanlarla müharibəni davam etdirmək faydasızdır, onunla döyüşə girib məğlub olmayan birini mən tanımıram*" demişdi. Lakin onlar Uqeydirin nəsihətlərini dinləməyərək qəti və həlledici döyüşə hazırlaşmışdılar. Uqeydir ibn Əbdülməlik bu müharibədə iştirak etmək istəməyərək bir dəstə əsgərlə Dumətü'l-Cəndəli tərk etmişdi. Xalid (r.ə) Uqeydirin Dumətü'l-Cəndəli tərk etdiyini öyrənən kimi Asim ibn Əmr ət-Təmimiyə[66] (r.ə) onu yaxalamaq tapşırığını verdi. Asim ibn Əmr (r.ə) öz süvariləri ilə Uqeydirə yetişib onun dəstəsi ilə döyüşə girişdi, onları məğlub edərək Uqeydiri yaxalayıb Xalidin (r.ə) yanına gətirdi. Xalid ibn Vəlid (r.ə) verdiyi sözə xəyanət etdiyi və əhdnamənin şərtlərini pozduğu üçün Uqeydir ibn Əbdülməlikin boynunu vurduraraq edam etdirdi. Xalid ibn Vəlid (r.ə) öz ordusu ilə Dumətü'l-

[66] Asim ibn Əmr ət-Təmimi (r.ə) igidliyi və şücaəti ilə tanınmış sərkərdə Qə'qa ibn Əmrin (r.ə) qardaşı idi.

Cəndələ çatanda buradakı silahlı qüvvələrə artıq Cudi ibn Rəbiə başçılıq edirdi. Xalid (r.ə) Dumətü'l-Cəndəl qalası onunla İyaz ibn Qənəmin (r.ə) qüvvələri arasında qalacaq şəkildə mövqe tutdu. Dumətü'l-Cəndəldəki bədəvi döyüşçülər yarıya bölünərək bir qismi İyazın (r.ə) digər qismi isə Xalidin (r.ə) ordusuna qarşı cəbhə aldılar. Baş verən döyüşdə Dumətü'l-Cəndəl müdafiəçiləri ağır itki vermişdilər. Cudi ibn Rəbiə əsir edilərək Xalidin (r.ə) əlinə keçmişdi. Xristian bədəvilər mücahidlərin qarşısında daha artıq müqavimət göstərə bilməyərək hər tərəfdən qaçıb qalaya doluşmağa başladılar. Dumətü'l-Cəndəl qalası ətrafdan qaçıb gələn insanlarla dolub daşmaqda idi. Buna baxmayaraq onlar divarların arxasında inadla müdafiə olunmağa davam edirdilər. Xalid ibn Vəlid (r.ə) qalanın mühasirəsini gücləndirdi. O, qalanın ən zəif yeri olan qapılarının sökülməsi üçün döyüşçülərini çox çalışdırdı və nəhayət buna nail oldu. Dumətü'l-Cəndəl qalasının qapısı yıxılıb dağılan kimi mücahidlər buradan həmlələr edərək qalanın içinə girdilər. Qala içində gedən qanlı küçə döyüşlərində çox sayıda düşmən əsgəri məhv edilmişdi. Əsir alınan əsgərlərdən bir qismi də Xalid ibn Vəlidin (r.ə) əmri ilə edam edilmişdilər. Xalid (r.ə) sadəcə düşmən əsgərlərinin deyil, onların ailə və uşaqlarının da əsir edilməsini əmr etmişdi. Cudi ibn Rəbiənin gözəlliyi ilə məşhur qızı da əsirlərin arasında idi. Xalid (r.ə) onu payına düşdüyü mücahiddən pulla satın almışdı.

Xalid ibn Vəlid (r.ə) Dumətü'l-Cəndəldə ikən Sasani qüvvələrinin Ənbarı geri almaq üçün girişdikləri döyüş məğlubiyyətlə nəticələnmişdi. Dumətü'l-Cəndəlin fəthinin xəbəri Xalidin (r.ə) özündən əvvəl Hirəyə çatmışdı. Buna görə də o, Hirəyə qayıdıb gələndə bu şəhərin əsilzadələri onu qarşılamaq üçün yola çıxıb ehtiram göstərməkdə o qədər ifrata varmışdılar ki, az qalmışdı ona səcdə etsinlər.

Xalid ibn Vəlid (r.ə) Dumətü'l-Cəndəldən Hirəyə qayıdıb gələndən sonra Sasanilərin paytaxtı Mədainə hücum etmək niyyətində idi. Lakin xəlifənin izni olmadan bunu etmək istəmədi. O, bu vaxt İraqda yenidən fəallaşan Sasani hərbi gücü və onlarla ittifaqda olan xristian bədəvilərlə bir neçə dəfə ağır döyüşə girişmək məcburiyyətində qalmışdı. Xalid (r.ə) Qə'qa ibn Əmri (r.ə) Ruzbeh və Zərmehr adlı sərkərdələrin başçılıq etdikləri Sasani ordusu ilə döyüşmək üçün göndərmişdi. Döyüş müsəlmanların qələbəsi ilə bitmişdi. İranlılar bu döyüşdə çox itki vermişdilər. Ruzbeh və Zərmehr də döyüşdə öldürülmüşdülər. Ruzbehi Qə'qa (r.ə), Zərmehri isə İsmət ibn Abdullah əd-Dəbbi (r.ə) öldürmüşdü.

Xalid ibn Vəlid (r.ə) ordusunu üç qismə ayırıb Mudəyyəh adlı yerdə iranlılarla xristian ərəblərin birləşmiş qüvvələrinə hücum edərək onları ağır məğlubiyyətə uğratmışdı. Mudəyyəhdən sonra Səna və Zumeyh adlı yərlərdə

də iranlıların xristian ərəblərlə birləşmiş qüvvələri ilə müsəlmanlar arasında şiddətli döyüşlər baş vermişdi. Hər iki döyüş də müsəlmanların qələbəsi ilə nəticələnmişdi. Bu döyüşlərdə müsəlmanların əlinə bol qənimət və əsir keçmişdi. Xalid (r.ə) qənimətlərin beşdə birini və əsirləri Mədinəyə, xəlifəyə göndərmişdi. Əli ibn Əbu Talib (r.ə) bu əsirlərdən Rəbiə ibn Buceyr ət-Təğlibinin qızını satın alaraq onunla evlənmişdi. Rəbiə ibn Buceyr Bəni-Təğlib qəbiləsinin əsilzadələrindən biri idi. Əli ibn Əbu Talibin (r.ə) bu qadın ilə nikahından Ömər (r.ə) və Ruqəyyə (r.ə) adlı övladları dünyaya gəlmişdi. Bundan bir il sonra Əli ibn Əbu Talib (r.ə) Allah Rəsulunun (s.ə.v) nəvəsi Umamə (r.ə) ilə evlənmişdi. Umamə (r.ə) Peyğəmbərin (s.ə.v) qızı Zeynəbin (r.ə) qızı idi və atası Əbü'l-As ibn Rəbiə ibn Əbduşşəms əl-Kinani idi.

Xalid ibn Vəlid (r.ə) hicri 12-ci ilin ramazan ayında (noyabr 633) Mesopotamyanın şimalına, İraq, Anadolu və Şam diyarı hüdudlarının kəsişdiyi yerə getmiş, burada bəzi hərbi əməliyyatlar keçirmişdi. Onun bu cürətkar davranışı Bizans sarayını hiddətləndirmişdi. Şamdakı Bizans silahlı qüvvələri səfərbər olaraq döyüşə hazır vəziyyətə gətirilmişdi. Onlar bölgədəki müttəfiqləri olan xristian bədəvi ərəb qəbilələrini də köməyə çağırmışdılar. İranlılar da bizanslılara silahlı qüvvə ilə kömək edəcəklərini bildirmişdilər. Maraqlıdır ki, bu vaxta qədər düşmən olan Bizans və Sasani dövlətləri İslam qarşısında dost və müttəfiq ola bilmişdilər. Hicri 12-ci ilin zilqədə ayında (yanvar 634) Bizans, İran və xristian ərəblərin birləşmiş qüvvələri Firaz adlı yerdə düşərgə salmış Xalidin (r.ə) ordugahına yaxınlaşdılar. Xalid ibn Vəlid (r.ə) onların hərəkətlərindən kəşfiyyatçıları vasitəsi ilə xəbərdar idi, lakin narahat deyildi. Çünki düşmənlə onun arasında Fərat çayı var idi. Xalid ibn Vəlid (r.ə) tutduğu mövqenin strateji baxımdan xeyli əlverişli olduğunu nəzərə alaraq çayı keçib düşmənə hücum etməmiş, düşmən ordusunun çayı keçib İslam ordusu üçün əlverişli olan yerdə döyüşə girməsini gözləmişdi. Nəhayət səbri tükənən Bizans hərbi qüvvələri öz say çoxluğuna arxayın olaraq Fərat çayını keçib İslam ordusuna hücum etdi. Firazda baş verən ağır və qanlı döyüş İslam ordusunun qələbəsi ilə bitmişdi. Qaçan düşmən əsgərləri təqib edilərək qılıncdan keçirilmiş, çayı üzərək keçmək istəyənlərin bir qismi boğularaq ölmüşdü. Düşmən ordusundan çox sayıda əsir alınmışdı. Bizans, İran və xristian ərəblərin müttəfiq ordusu Firazda 100 mindən çox döyüşçüsünü itirmişdi. Xalid ibn Vəlid (r.ə) bir müddət daha Firazda qalıb zilqədə ayının 24-ü (29 yanvar 634) orduya Hirəyə qayıtmaq üçün yola çıxmaq əmri vermişdi. Xalid ibn Vəlid (r.ə) ordunun əsas hissəsinin əmirliyini Asim ibn Əmr ət-Təmimiyə (r.ə) həvalə edib özü ardçı qüvvələrlə birlikdə yola çıxacağını bildirmişdi. Niyyəti isə gizlicə Məkkəyə gedib həcc etmək idi, çünki zilhiccə

ayı yaxınlaşmaqda idi. Xalid (r.ə) ordusu Hirə yolunda ikən özü at belində günlərlə çaparaq heç kimin keçmədiyi yollardan istifadə edib İraqın şimalından Məkkəyə gəlmişdi. O, həcc ziyarətini başa vurub gəldiyi kimi çaparaq İraqa qayıtmış, Firazdan yola çıxan ordusu Hirəyə çatmadan o, öz ordusuna yetişmişdi. Xalidin (r.ə) həcc ziyarətində olduğu xəbəri Əbu Bəkrə (r.ə) çatanda o, bundan son dərəcə narahat olmuş və Xalidə (r.ə) qəzəblənmişdi. Çünki, Xalid ibn Vəlid (r.ə) xəlifədən iznsiz vəzifəsini icra etdiyi yeri tərk etmişdi. Bununla da əmri altındakı İslam ordusunu faktiki başsız qoyaraq təhlükəyə atmışdı. Əbu Bəkr (r.ə) ona məktub yazaraq bütün bunları sadalamış və onun bu hərəkətindən ötürü qınamışdı. Cəza olaraq İraq cəbhəsindəki İslam ordusunun baş komandanlığı vəzifəsindən azad edərək, Şam diyarındakı ordulara göndərmişdi.

*Şam Diyarındakı Hərbi Əməliyyatlar*

Hicri 12-ci ilin həcc (fevral 634) ziyarətindən sonra Əbu Bəkr (r.ə) əshabdan şura üzvü olanları toplayaraq onlarla məşvərət etmişdi. Məşvərət mövzusu İraq cəbhəsindəki və Şam diyarında yaranmış vəziyyət idi. İslam ordularının Fərat çayının sol sahilindəki ərazilərdə keçirdikləri hərbi əməliyyatların uğurla nəticələnməsi bu bölgədəki Sasani nüfuzunun əhəmiyyətli dərəcədə qırılmasına səbəb olmuşdu. Beləcə buradakı ərəb qəbilələri İslam dövlətinin nüfuz dairəsinə daxil edilmiş və İslam dininin onların arasında yayılması üçün əlverişli şərait yaradılmışdı. Belə görünürdü ki, Sasani dövləti daxilindəki qeyri-sabit vəziyyət, taxt-tac uğrunda gedən saray çəkişmələri sayəsində müsəlmanları bu tərəfdən ciddi təhlükə gözləmirdi. Lakin İslam ordularının ərəb İraqında uğur qazanmaları, Dumətü’l-Cəndəlin fəthi və Firaz zəfəri Bizans imperiyasını dərindən narahat etmişdi. Bizans dövləti xilafətin Şam diyarındakı ərəb qəbilələrini də öz nüfuzu altına ala biləcəyindən əndişələnməkdə idi və bunun qarşısını almaq üçün tədbirlər görməkdə idi. Şam diyarındakı Bizans hərbi və inzibati məmurları buradakı xristian ərəb qəbilələrini səfərbər edərək hərbi hazırlıqlar keçir, onları ehtimal olunan hücumlara qarşı hazır vəziyyətə gətirir, silah-sursat və canlı qüvvə ilə dəstəkləyirdilər. Bütün bu mövzular şurada müzakirə edilmiş və qərara gəlinmişdi ki, Şam diyarındakı hərbi əməliyyatları intensivləşdirmək və gücləndirmək üçün yeni bir ordu hazırlansın.

Şam diyarına göndərilmək üçün Mədinədə ordu hazırlandı, lakin hərbi işdə təcrübəsi olan səhabələrin əksəriyyəti bu ordunu say və təchizat baxımından qənaətbəxş hesab etməmişdilər. Buna görə də Əbu Bəkr (r.ə) Yəmənə və yarımadanın müxtəlif yerlərindəki qəbilələrə qasid göndərərək yeni səfərbərlik elan etdi. Qısa müddət ərzində Yəməndən və yarımadanın müxtəlif yerlərindən

gələn süvari və piyada əsgərlər Mədinə yaxınlığındakı ordugahda toplaşmışdılar. beytülmaldan ayrılan vəsait hesabına yeni toplanmış ordunun çatışmamazlıqları aradan qaldırılmış, hərbi ləvazımat, silah-sursat və minik heyvanları ilə təmin edilmişdi. Əbu Bəkr (r.ə) Şam diyarına göndəriləcək ordunun baş komandanlığına Xalid ibn Səid ibn əl-As əl-Əməvini (r.ə) təyin etmək istəyirdi. Lakin Ömər ibn Xəttabın (r.ə) məsləhəti ilə bu fikrindən daşındı və bir neçə namizədən arasından yenə Əməvi ailəsinə mənsub Əbu Süfyan ibn Hərbin (r.ə) oğlu Yəzidi seçdi. Məkkənin fəthindən sonra İslamı qəbul etmiş Yəzid ibn Əbu Süfyan (r.ə) bacarıqlı və cəsur döyüşçü kimi tanınmaqda idi. Lakin belə böyük bir orduya əmirlik etmək kimi bir təcrübəyə malik deyildi. Buna görə də Əbu Bəkr (r.ə) onu yanına çağırıb ona həm nəsihət etdi, həm də hərbi vəzifəsi barədə təlimatlandırdı. Xəlifə (r.ə) Şam cəbhəsi ordusuna əmir təyin etdiyi Yəzidə (r.ə) belə xitab etmişdi:

*“Mən səni sınamaq, hərbin məşəqqətlərinə qarşı dözümlülüyünü yoxlamaq, bu kimi işlər üçün təcrübə qazanman üçün əmir təyin etdim. Əgər bu işi layiqincə başa vursan, sənə bundan daha böyük işlər üçün etimad göstəriləcəkdir. Əgər vəzifə borcunu yerinə yetirməkdə çətinlik çəkdiyini görsəm səni bu işdən azad edəcəyəm. Elə isə sən sadəcə Allahdan qorx. Çünki biz sənin zahirini necə açıq aşkar görürüksə Allah da sənin batinini, qəlbini eləcə açıq və aşkar görür. Bil ki, Allaha yaxın olmağa ən layiqli insan o kəsdir ki, Allahla dost olmağa hər kəsdən daha çox can atır. Allaha yaxınlıq saleh əməllərin çoxluğu ilə olur. Mən sənə Xalid ibn Səidə (r.ə) tapşırmaq istədiyim işi tapşırıram. Əsla və əsla cahiliyyə dövrünün quru təəssübkeşliyinə qapılmayasan. Bil ki, Allah həm cahiliyyə dövrünə, həm də cahiliyyə insanlarına buğz (nifrət) etmişdir.*

*Əmrin altındakı əsgərlərlə daim ünsiyətdə ol, onlarla xoş söhbət et. Onlara cihadın xeyrini başa sal və onlara xeyir və’d et. Onlara öyüd-nəsihət verdiyin zaman sözü çox uzatma, çünki çox sözün bir qismi digər bir qismini yaddan çıxarar. Sən özünü daim islah et ki, əmrin altındakıları da islah edə biləsən. Namazlarını vaxtı-vaxtında, rükusunu, səcdəsini tamamlayaraq, xüşu ilə qıl. Düşmənin elçiləri sənin yanına gələndə onları xoş qarşıla, mülayim rəftar et, lakin öz qərargahında qısa müddət saxla ki, ordunun vəziyyəti haqqında çox şey öyrənə bilməsinlər. Çalış ki, ordugahını, hərbi təchizatını görməsinlər. Əks təqdirdə ordunun zəif cəhətləri haqqında məlumatlı olarlar. Onları ordunun güclü və zəngin hissəsində qonaq et. Özündən başqa heç kimlə danışmalarına imkan vermə. Gizli, sirr olan mövzularda əsla söhbət açma.*

*Gecələr əmirlərin və dostlarınla işlərin barədə söhbət et. Kəşfiyyatçıların sənə müxtəlif xəbərlər gətirəcəklər, önündəki pərdələr qalxacaq, görə*

*bilmədiklərindən xəbərdar olacaqsan. Gecələr ordugahdakı növbətçilik və gözətçilik işini daha möhkəm tut. Gözətçilərin sayını atrtır və ordunun bütün hissələrinə payla. Gecələr növbətçilər və gözətçilərdən xəbərsiz qərargahından çıx və onları vəzifə başında yoxla. Növbə başında qəflətə dalanları cəzalandır, lakin bu işdə ifrata varma. Gecə yarısı növbətçiləri və gözətçiləri dəyişdir. Gecə növbəsini ilk tutanların müddətini uzun, ikincisini isə qısa et. Çünki gecənin birinci yarısında keşik çəkmək daha asandır, ikinci yarısında yorğunluq və yuxusuzluq daha çox olur.*

*Cəza vermək məsələsində tələskənlik göstərmə, lakin çox yumuşaq da davranıb sonraya buraxma. Əmrin altındakı insanların gizilnlərini araşdırma, bu onların yoldaşları arasında biabır və hörmətsiz olmasına səbəb olar. Ailəsi yanında olan əsgərlərin ailə işləri ilə maraqlan ki, onlar öz işlərinə daha çox vaxt ayıra bilsinlər. Boşboğaz insanlardan uzaq dur, onlarla oturub durma. Doğru sözlü, dürüst və vəfakar insanları özünə yaxın et. Onlara qarşı səmimi ol. Əsla qorxma. Çünki səndə qorxu əlaməti görünsə bu əmirlərin və əsgərlərinə də sirayət edər. Qənimət mallarına qarşı dürüst ol. Əsla haqqın olmayan mala əl uzatma. Bu ordudakıları kasıblığa sövq edər, nəticədə zəfər səndən uzaqlaşar. Dünya həyatından əl çəkmiş rahiblərə toxunma, onları rahat burax".*

Bu vaxt Xalid ibn Vəlid (r.ə) Şam diyarında bəzi uğurlu hərbi əməliyyatlar keçirmiş və nəticələri haqqında xəlifəyə məktubla məlumat vermişdi. O, müdəmadi olaraq Şam diyarındakı ümumi vəziyyət və Bizans ordularının hərəkətləri haqqında Mədinəyə məlumat yollamaqda idi. Xəlifə təlimatlandırdığı Yəzid ibn Əbu Süfyanın (r.ə) əmrindəki İslam ordusunun əsas hissəsini şimal istiqamətində yola çıxardı. Onlar Təbükə çatanda isə Əbu Ubeydə Amir ibn Abdullah ibn Cərrah (r.ə), Əmr ibn əl-As və Şurahbil ibn Həsənənin (r.ə) əmrindəki əlavə qüvvələri də eyni istiqamətə göndərmişdi. Əbu Ubeydə ibn Cərrah (r.ə) indiki İordaniyanın Bəlqa şəhərinə yaxınlaşaraq şəhər müdafiəçiləri ilə şiddətli döyüşə girmiş və onları məğlub etmişdi. Şəhərin silah zoru ilə fəth ediləcəyini bilən bəlqalılar Əbu Ubeydə (r.ə) ilə cizyə müqabilində əhdnamə bağlamışdılar.

Yəzid ibn Əbu Süfyan (r.ə) Əbu Umaməni (r.ə) əmrindəki əsgərlərlə Ərabə adlı yerdə toplanmış Bizans silahlı qüvvəsinin üstünə göndərmişdi. Əbu Umamə (r.ə) buradakı Bizans qüvvələrini əzdikdən sonra Mərcu's-Suffardakı Bizans qarnizonuna da basqın edərək onları darmadağın etmişdi. Peyğəmbərin (s.ə.v) əmisinin gənc oğlu Fəzl ibn Abbas ibn Əbdulmuttəlib (r.ə) Mərcu's-Suffar döyüşündə şəhid olmuşdu. Bu vaxt Mədinəyə yarımadanın müxtəlif yerlərindən Şam diyarına getmək üçün könüllü mücahidlər toplanmışdı. Əbu Bəkr (r.ə) onların başına Müaviyə ibn Əbu Süfyanı (r.ə) əmir təyin edərək Şama

göndərdi və Müaviyəyə (r.ə) qardaşı Yəzidin (r.ə) əmrindəki əsas İslam ordusuna qoşulmağı tapşırdı. Yəzid ibn Əbu Sufyan (r.ə) Ölüdənizin cənubunda, Fələstindəki Bizans canişini Sergiusla vuruşaraq zəfər əldə etmişdi. Sergiusin məğlub olmuş ordusundan qaçan 1500-2000 nəfər Bizans əsgəri isə Dasin adlı yerdə hicri 12-ci ilin zilqədə ayında (yanvar-fevral 634) Əbu Umamənin (r.ə) əsgərləri tərəfindən mühasirəyə alınaraq məhv edilmişdi. Sərkərdələri Sergius da öldürülənlər arasında idi.

Xalid ibn Vəlid (r.ə) Bizansın Şam diyarındakı əsas qala şəhərlərindən biri olan Busranı fəth etmək məqsədiylə ordusu ilə hərəkətə keçmişdi. Xaliddən (r.ə) əvvəl Şurahbil ibn Həsənə (r.ə) öz ordusu ilə Busraya hücum etmiş, lakin müsbət nəticə ala bilməmişdi. İki əmirin ordusu Busranı fəth etmək üçün birlikdə hərəkət edəcəkdilər. Busradakı Bizans qarnizonunun komandanı Romanus ordusu ilə qaladan çıxıb İslam ordusu ilə üz-üzə gəldi. Romanus meydana çıxaraq təkbətək döyüş üçün cəngavər tələb edəndə onun qarşısına xəlifənin oğlu, Əbdürrəhman ibn Əbu Bəkr (r.ə) çıxmışdı. Əbdürrəhmanın (r.ə) qarşısında duruş gətirə bilməyən Romanus yaralı halda qaçıb canını qurtarmışdı. Bu vaxt Xalid (r.ə) İslam ordusuna ümumi hücum əmri verdi. Romanusun ordusu mücahidlərin həmlələri qarşısında davam gətirə bilməyib geri, qalaya çəkilmiş və müdafiə olunmağa başlamışdılar. Xalid ibn Vəlid (r.ə) Busranı mühasirəyə almışdı. Bir gecə kəşfiyyatçılar Busra qalası ətrafında bir adamı ələ keçirərək ordugaha gətirmişdilər. Xalid ibn Vəlid (r.ə) sorğu sual etdiyi bu adamın Romanus olduğunu anlamışdı. Romanus qaladakılara müsəlmanlarla əhdnamə bağlamağı təklif etdiyi üçün onların qəzəbinə gələrək qaladan qovulduğunu söyləmidi. Buna görə də o, buradakı bizanslılardan qisas almaq istədiyini bildirmişdi. Əbdürrəhman ibn Əbu Bəkr (r.ə) əmrindəki 100 könüllü ilə Romanusun göstərdiyi zəif yerdən bir gecə vaxtı lağım atıb qalaya daxil oldu. Onlar sakitcə keşikçiləri aradan götürərək qala qapılarını açmış və İslam ordusuna işarə vermişdilər. Mücahidlər ildırım sürəti ilə açıq qala qapılarından şəhərə daxil olaraq Bizans ordusuna basqın etmişdilər. Beləcə hicri 13-cü il rəbiələvvəl ayının 25-i (29 may 634) Busra fəth olunmuşdu.

Əmr ibn əl-As əmrindəki 3000 nəfərlik ordu ilə Mədinədən çıxıb Qırmızı dəniz sahili boyunca şimala irəliləyərək Sina yarımadasındakı Əyləni fəth etmişdi. Daha sonra şimala doğru gedərək Fələstin torpaqlarına daxil olmuşdu. O, Fələstinin cənubunu ələ keçirmişdi, lakin Bizans imperatoru Heraklın (610-641) qardaşı Feodorun (Theodoros) 80 minlik Bizans ordusu ilə Fələstinin şimalında peyda olduğu xəbərini alan kimi bunu dərhal Mədinəyə çapar göndərərək xəlifəyə bildirmişdi. Əbu Bəkr (r.ə) Xalid ibn Vəlidi (r.ə) Şam cəbhəsindəki

digər əmirlərin başçısı təyin edərək buradakı hərbi əməliyyatlara bir mərkəzdən idarə etməsini tapşırmışdı.

Xalid ibn Vəlid (r.a.) əmrindəki 700 süvari ilə özünün məşhur İldırım hərəkatını gerçəkləşdirmişdi. İranın Hirə şəhərindən başlayaraq İraqla Suriya arasındakı keçilməz səhranı Dumətu'l-Cəndəl adlı yerdən keçib 18 günlük çətin yürüşdən sonra öz hərbi dəstəsi ilə Dəməşq şəhəri ətrafına gəlmişdi. Bu yürüşün 5-6 günü səhranın ən çətin, keçilməz hissəsində olmuşdu. Səhradakı bu çətin yürüş vaxtı əsgərlərin və atların su ehtiyacını dəvələrin öz bədənlərində topladıqları su ilə təmin etmişdilər. Belə ki, dəvələri əvvəlcədən bir neçə gün susuz qoymuş, sonra onlara su içirmişdilər. Susamış dəvələr bir neçə günlük su ehtiyaclarını qursaqlarında toplamışdılar. Səhrada yürüş vaxtı bu dəvələrdən bir neçəsini kəsmiş, qursaqlarındakı su ilə süvarilərin atlarını suvarmışdılar. Kəsilmiş dəvələrin əti isə qida olaraq istifadə edilmişdi. Beləcə Xalid ibn Vəlid (r.ə) süvariləri ilə özünü vaxtında lazım olan yerə çatdıraraq İslam ordusu ilə üzbəüz dayanmış Bizans ordusunun arxasına keçmişdi. Döyüş mövqeyinə irəliləyərkən Xalid ibn Vəlidin (r.ə) dəstəsi Bizans ordusuna köməyə gedən xristian ərəblərdən ibarət Qəssani ordusu ilə rastlaşmış və onları məğlub etmişdi. Fələstinin Busra qəsəbəsinə gələrək burada onu gözləyən digər müsəlman əsgərlərlə öz qüvvələrini birləşdirmişdi. Xalid ibn Vəlid (r.ə) əmri altındakı İslam ordusunu dörd əsas hissəyə ayırmış, Əbu Ubeydə ibn Cərrahı (r.ə) mərkəzi qüvvələr, Muaz ibn Cəbəli (r.ə) sağ cinah, Səid ibn Əmri (r.ə) sol cinah və Səid ibn Zeydi (r.ə) süvari qüvvələrinə əmir təyin etmişdi. Digər tərəfdən isə Əmr ibn əl-As Bizans ordusuna hücum edəcəkdi. İki tərəfdən sıxışdırılan Bizans ordusu hicri 13-cü ilin cəmaziyələvvəl ayının 28-ci günü (30 iyul 634) Qürdsün qərbində, indiki Rəmlə ilə Beytulcibrin şəhərləri arasındakı Əcnadeyn adlı yerdə darmadağın edildi. Bu parlaq qələbə İslam tarixində Əcnadeyn zəfəri kim qeyd olunur. Beləcə Fələstin müsəlmanların üzünə açılmışdı.

İslam ordularının Şam diyarının cənubuna yayılaraq buralardakı Bizans qala və istehkamlarını ələ keçirdiklərinə dair xəbərlər bu vaxt Qüdsdə olan Bizans imperatoru Herakla (610-641) çatdırılmışdı. Heraklı onu müharibəyə təşviq edənlərin fikirlərinə qarşı çışaraq müsəlmanlara sülh təklif etməyin daha məqsədəuyğun olacağını bildirmişdi. O, Şam diyarından alınan vergilərin bir qismi müqabilində sülh sazişi əldə etmək mümkün olacağını düşünürdü. Lakin canişinlər və generallarının təzyiqləri qarşısında bu fikrindən daşınaraq Şam diyarındakı Bizans hərbi qüvvələrini səfərbər edərək Humsa gəldi. Heraklı ayrı-ayrı əmirlərin idarə etdikləri xilafət orduları ilə vuruşmağın daha əlverişli olacağını düşünürdü. Çünki Bizans hərbi qüvvələri sayca daha çox idi. On-

lar müsəlmanların ayrı-ayrı ordularını daha asan məğlub edə biləcəkdilər. O, qardaşı Feodoru Əmr ibn əl-Asın, onun oğlu Georgini Yəzid ibn Əbu Süfyanın (r.ə), general Qaykarı 60 minlik ordu ilə Əbu Ubeydənin (r.ə), Draqosu isə Şurahbilin (r.ə) ordusu ilə vuruşmaq üçün göndərmişdi. Bundan xəbər tutan əmirlər aralarında hərbi işdə daha çox təcrübəsi olan Əmr ibn əl-Asa məktub yazaraq nə etməli olduqları barədə onun fikrini öyrənmək istədilər. Əmr ibn əl-As düşmən qüvvələrinin say çoxluğu səbəbiylə ayrı-ayrılıqda vuruşmağın onlar üçün əlverişsiz olduğunu, özləri üçün strateji baxımdan əlverişli bir yerdə birləşib Bizans ordusu ilə döyüşü orada qəbul etmənin daha münasib olacağını bildirdi. Əmirlər yaranmış vəziyyətdən Əbu Bəkri (r.ə) xəbərdar edəndə xəlifə Əmr ibn əl-Asın fikrinin isabətli olduğunu bildirmişdi. Buna görə də Şam diyarındakı bütün müsəlman orduları indiki İsrail-Suriya sərhəddində, Qolan təpələrindəki Yərmuk adlanan yerdə toplanmağa başladılar. Burada toplanmış İslam ordusunun ümumi sayı 21 min idi. Bundan başqa İkrimə ibn Əbu Cəhlin (r.ə) əmrindəki 6 min nəfərlik köməkçi qüvvə də pusquda saxlanmışdı. Müsəlman əmirlərin bu şəkildə bir taktika seçməsi Heraklı ordularını birləşdirib Yərmuka tərəf göndərməyə məcbur etdi. O, Yərmuka gedən təqribən 200 minlik Bizans ordusuna qardaşı Feodoru baş komandan təyin etmişdi. Feodor öz ordusu ilə Yərmuka gəlib çatandan sonra İkrimə ibn Əbu Cəhl (r.ə) öz ordusu ilə şimaldan Yərmuka gələn bütün yolları nəzarət altına aldı və beləcə Bizans ordusuna ərzaq, silah-sursat, hərbi ləvazımat, əlavə qüvvə kimi kömək göndərilməsinin qarşısı alınmış oldu. İslamı qəbul etmiş Bizanslı general Georgi döyüşdən əvvəl İslam ordusu tərəfinə keçmişdi. Bizans ordusu sayca çox olsa da İslam ordusunun Yərmukda daha əlverişli mövqe tutması səbəbiylə üstünlük qazana bilmədi. İslam ordusu Yərmuk çayının cənub sahilində mövqe tutmuşdu. Bizans ordusu isə İslam ordusu ilə üzbəüz mövqe tutmuşdu və aralarında Yərmuk çayı axmaqda idi. Bizans ordusunun kəşfiyyat xarakterli, kiçik çaplı ilk hücumlar uğursuzluqla nəticələndi. Beləcə Bizans ordusu hicri 13-cü ilin cəmaziyələvvəl və cəzayilaxir aylarını (iyul-avqust 634) yerində sayaraq keçirdi. Lakin müsəlmanlar da Bizans ordusu qarşısında ciddi uğur qazana bilməmişdilər. Bu hal xəlifəni narahat etdiyi üçün o, Xalid ibn Vəlidə (r.ə) məktub yazaraq dərhal Yərmuka gedərək buradakı İslam ordusunun baş komandanlığını üzərinə almasını əmr etdi. Xalid (r.ə) dərhal xəlifənin əmini yerinə yetirərək öz ordusu ilə Yərmuka gəldi. Onun gətirdiyi qüvvələrlə birlikdə Yərmukdakı İslam ordusunun sayı 46 minə çatmışdı. Xalid ibn Vəlid (r.ə) Yərmukdakı İslam ordusuna yeni döyüş nizamı verdi. O, öz planını əmirlərə izah edəndən sonra ordunu hər birində min nəfər olmaqla 40

bölüyə ayırdı və hər birinə əmir təyin etdi. Ordunun bütünü isə 4 qismə ayırdı. Mərkəzi qüvvələrə Əbu Ubeydəni (r.ə), sağ cinaha Əmr ibn əl-As ilə Şurahbili (r.ə), sol cinaha Yəzid ibn Əbu Süfyanı (r.ə) komandan təyin etdi. Dördüncü qismə, əsas süvari bölüyünə isə özü başçılıq edəcəkdi. Artıq xeyli yaşılı olmasına baxmayaraq Əbu Süfyan ibn Hərb (r.ə) Yərmuk döyüşündə oğulları Müaviyə (r.ə) və Yəzidlə (r.ə) birlikdə iştirak etmişdi. Xalid (r.ə) hicri 13-cü il cəmaziyəlaxir ayının 16-cı günü (15 avqust 634), səhərin alaqaranlığında öz süvari bölüyü ilə Bizans ordusunun mərkəzinə qəfil hücuma keçdi. Hücum o qədər güclü və sarsıdıcı olmuşdu ki, Bizans ordusunun mərkəzi cəmi bir neçə saat davam gətirə bilmişdi. Bizans ordusunun mərkəzindəki əsgərlər dağınıq şəkildə cinahlara tərəf geri çəkilməyə başlamışdılar. Mərkəzdə başlayan təşviş, vahimə tezliklə bütün orduya sirayət etmişdi. Cinahlardakı əsgərlərin də döyüş nizamı pozulmuşdu. Bundan sonra Xalidin (r.ə) əmr ilə İslam ordusunun sağ və sol cinahları Bizans ordusuna ard-arda ağır həmlələr edərək geri çəkilməyə məcbur etmişdi. Bizans ordusu dar Ruqaəd vadisinə tərəf nizamsız halda geri çəkilməyə başlamışdı. İslam ordusunun 4 gün davam edən hücumları qarşısında Bizans ordusunun müqaviməti tamamilə qırılmışdı. İslam ordusu bütün istiqamətlərdə düşməni təqib etmişdi. Döyüş vaxtı sərt və isti küləyin qaldırdığı toz və qum buludu döyüş meydanını bürümüşdü. Belə hava şəraitinə vərdiş edən ərəblər Bizans ordusuna güclü həmlələr edir və şiddətli zərbələr endirirdilər. Nə komandirlərin canfəşanlığı, nə də ordudakı keşişlərin xorla dua oxumaları Bizans ordusunun imdadına yetişmədi. Mücahidlərin qılıncından canını qurtara bilənlər özlərini bir giriş və bir çıxışı olan dar Ruqaəd vadisinə çatdıraraq qaçmağa başladılar. Amma vadinin çıxışında Şuahbilin (r.ə) əmrindəki ərəb süvarilərinin onları gözlədiyindən xəbərsiz idilər. Burada Bizans ordusunun tör-töküntüləri də müsəlman süvariləri tərəfindən məhv edildi. Döyüş meydanında 120 min Bizans əsgərinin cəsədi qalmışdı. İmperatorun qardaşı, Bizans ordusunun baş komandanı Feodor da bunların arasında idi. Yərmuk döyüşündə 3 min mücahid şəhid olmuşdu. Çox sayda yaralı da vardı. Bizans ordusunun və qardaşı Feodorun Yərmukda uğradığı fəlakətin xəbərini Humsda alan Herakl yanındakı ordusu ilə sürətlə Qüdsə tərəf geri çəkilmişdi.

*Qur'ani-Kərimin Cild Halına Gətirilməsi*

Əbu Bəkr (r.ə) xilafətinin ilk aylarında irtidad və irtica hərəkətlərinin yatırılması ilə məşğul olmuşdu. Buna görə də müsəlmanlar bir çox cəbhələrdə vuruşmaq məcburiyyətində qalmışdılar. Bunların əksəriyyəti Allah Rəsulunun (s.ə.v) əshabından olan şəxslər idi ki, bəziləri bu döyüşlərdə şəhid olmuşdu-

lar. Şəhid olanların arasında qurralar, yəni Qur'ani-Kərimi başdan sona əzbər bilən hafizlər də var idi. Yəmamə döyüşündə 70 Qur'an hafizinin bir gündə şəhid olması Qur'anın sonrakı nəsillərə ötürülməsi məsələsində çətinliyin yarana biləcəyi təhlükəsini meydana gətirmişdi. Buna görə də Ömər ibn Xəttab (r.ə) xəlifəyə müraciət edərək dağınıq halda olan Qur'an səhifələrinin bir cild halında toplanmasının və kitab halına gətirilməsi zərurətinin meydana çıxdığını bildirmişdi. Lakin Əbu Bəkr (r.ə) Peyğəmbərin (s.ə.v) etmədiyi bir işi etməkdə tərəddüd göstərdiyini bildirmişdi. Ömərin (r.ə) bu təklifi təkidlə təkrar etməsi xəlifədə bu işi görmənin zəruri olduğu qənaətini hasil etmişdi. Əbu Bəkr (r.ə) bu işin təşkili üçün Allah Rəsulunun (s.ə.v) vəhy katiblərindən biri, eyni zamanda hafiz olan Zeyd ibn Sabiti (r.ə) münasib görmüşdü. Zeyd ibn Sabit (r.ə) də Allah Rəsulu (s.ə.v) belə bir işi əmr etmədiyi üçün tərəddüd göstərmişdi, lakin həm xəlifənin, həm də Ömər (r.ə), Sə'd ibn Əbu Vəqqas (r.ə), Osman (r.ə), Abdullah ibn Zubeyr (r.ə) kimi səhabələrin də bu mövzuda həmfikir olduqlarını görəndən sonra razılıq vermişdi. Zeyd ibn Sabit (r.ə) əksəriyyəti Peyğəmbərin (r.ə) vəhy katiblərindən ibarət 30 nəfərlik bir hafiz heyəti təşkil etmişdi. O, kağız, aşılanmış dəri, geniş səthi olan daşlar, dəvənin kürək sümüyü, iri saxsı parçası, xurma ağacının ortasındakı lif kimi üzərində Qur'an surələrinin yazılı olduğu nüsxələri toplamağa başlamışdı. Əllərdəki bu kimi yazılı sənədlər iki şərtlə qəbul edilirdi; 1. Birbaşa Allah Rəsulunun (s.ə.v) hüzurunda yazılmış olması və bunun iki şahid tərəfindən təsdiq olunması, 2. Yazıdakı ayə və surələrin hafizlər tərəfindən əzbər bilinir olması. Rəsulullahın (s.ə.v) vəfatından altı ay sonra başlanılan bu iş bir neçə ayda tamamlanmış və Qur'ani-Kərim bir cild halında toplanıb kitab halına gətirilmişdi. Bu nüsxə daim xəlifənin yanında qalmaqda idi. Ömər ibn Xəttab (r.ə) xəlifə olandan sonra bu nüsxə onun yanıda olmuşdu. Ömərin (r.ə) şəhadətindən sonra isə bu ilk Qur'an nüsxəsi onun qızı və Allah Rəsulunun (s.ə.v) xanımı Həfsanın (r.ə) yanında olmuşdu. Osman ibn Əffanın (r.ə) xəlifəliyi dövründə isə Ərməniyyə və Azərbaycanın fəthində iştirak edən iraqlı və suriyalı əsgərlər Qur'an ayələrindəki bəzi kəlmələrin tələffüzündə ixtilaf etmişdilər. Bunun səbəbi İraq və Suriya ərəbləri arasındakı ləhcə fərqi idi. Özü də Qur'an hafizi olan, Allah Rəsulunun (s.ə.v) əshabından Huzeyfə ibnu'l-Yəman (r.ə) bu mübahisələri eşidəndə son dərəcə qəzəblənmişdi. O, xəlifəyə bir məktub yazaraq vəziyyəti təfərrüatı ilə izah etmiş və müsəlmanların da əvvəlki ümmətlər kimi öz kitabları barədə ixtilafa düşmələrinin qarşısının alınması üçün tədbir görülməsini tələb etmişdi. Bundan sonra xəlifə Osman ibn Əffan (r.ə) Ömər ibn Xəttabın (r.ə) qızı, Allah Rəsulunun (s.ə.v) xanımı Həfsadan (r.ə) üzü köçürülmək üçün ilk Qur'an nüsxəsini istəmişdi. Xəlifə Osman (r.ə) Zeyd

ibn Sabiti (r.ə) bir neçə nəfərdən ibarət yeni bir heyətə başçı təyin edərək ilk Qur'an nüsxəsinin üzünün köçürülərək yeddi yeni nüsxə yazılmasını istəmişdi. O, tələffüzündə ixtilaf edilmiş kəlmələrin ərəb dilinin ən fəsahətli və bəlağətli ləhcəsi olan Qureyş ləhcəsinə uyğun formada yazılmasını əmr etmişdi. Belə ki, Allah Rəsulu (s.ə.v) də qureyşli idi və Allah öz kəlamını ona bu şəkildə vəhy etmişdi. Beləcə ilk Qur'an nüsxəsinini üzü köçürülərək yeddi yeni nüsxə hazırlanmıdı. Bunlardan biri xəlifə Osman ibn Əffanın (r.ə) evində, Mədinədə qalmışdı. Digər altı nüsxə isə Məkkə, Şam diyarı, Yəmən, Bəhreyn, Bəsrə və Kufədəki canişinlərə göndərilmiş və yanlarında saxlamaları əmr edilmişdi.

# III. FƏSİL

# ÖMƏR İBN XƏTTABIN (R.Ə) HAKİMİYYƏTİ DÖVRÜ (634-644)

Allah Rəsulunun (s.ə.v) ilk xəlifəsi Əbu Bəkr (r.ə) hicri 13-cü ilin cəmaziyəlaxir ayının 23-cü günü (22 avqust 634) vəfat etmişdi. Vəfatından on beş gün əvvəl soyuq bir gündə yuyunaraq soyuqlamış və bu soyuqlaması sətəlcəmə çevrilmidi. Həmin gündən vəfatına qədər qızdırması bəzən şiddətlənərək davam etmişdi. Həmin vaxt Məscidu'n-Nəbəvidə camaata onun yerinə Ömər ibn Xəttab (r.ə) namaz qıldırmışdı. Ümumiyyətlə onun Mədinədə olmadığı vaxtlarda camaata namazı Ömər (r.ə) qıldırırdı. Xəstəliyinin şiddətləndiyini görən xəlifə dövlət işlərini nizama salmaq üçün bəzi tədbirlər görmüşdü. O, şura üzvlərindən əvvəlcə Əbdürrəhman ibn Əvfi (r.ə) yanına çağıraraq Ömər ibn Xəttab (r.ə) haqqında fikrini soruşmuşdu. Əbdürrəhman ibn Əvf (r.ə) "*Onun bizim gözümüzdəki dəyəri sənin gözündə olduğundan daha az deyil, lakin Ömər (r.ə) biraz sərt məzaclıdır*" deyə cavab vermişdi. Əbu Bəkr (r.ə) ona "*O, mənim xasiyyətimin yumuşaq olduğunu deyərək sərtlik göstərməkdədir*" demiş və daha sonra şura üzvlərindən Osman ibn Əffanı (r.ə) yanına çağıraraq Ömər (r.ə) haqqındakı fikrini soruşmuşdu. Osman ibn Əffan (r.ə) ona "*Bizim aramızda onun kimisi yoxdur*" deyə cavab vermişdi. Ömər ibn Xəttab (r.ə) sərt təbiətli bir insan idi, lakin onun qəzəbi əsla Allah rizasından başqa bir şey üçün olmamışdı. Onun bəzən sərt davranışları və kəskin sözləri insanları qorxudurdu. Buna görə də bəzi insanlar onun xəlifə olmasından çəkinmişdilər. Şura üzvlərindən Təlhə ibn Ubeydullah (r.ə) evində ağır xəstə olaraq yatan xəlifəni ziyarət edərkən "*Sən insanlara Öməri (r.ə) xəlifə təyin edirsən? Halbuki insanların ondan necə çəkindiklərini bilirsən, Rəbbinə qovuşacaqsan, bu qərarın barədə ona nə deyəcəksən?*" demişdi. Bunu eşidən Əbu Bəkr (r.ə) yerindən dikələrək ona belə cavab vermişdi: "*Müsəlmanlar üçün onların arasında ən xeyirli olanı xəlifə seçdim deyəcəyəm*". Daha sonra Əbu Bəkr (r.ə) Osman ibn Əffanla (r.ə) tək qalaraq ona Ömər ibn Xəttabı (r.ə) xəlifə olaraq öz yerinə təyin etdiyi barədə vəsiyyətnamə yazdırmışdı.

Xəlifə olana qədər Əbu Bəkr istər cahiliyyə, istərsə də İslami dövrdə ticarətlə məşğul olmuşdu. O, Məkkədə ikən Qureyşin ən zəngin tacirlərindən biri idi. Xəlifə olandan sonrakı altı ay müddətində həm dövlət işləri ilə, həm də

ticarətlə məşğul olmuşdu. Lakin bunun xeyli çətin olduğunu və iki işi eyna anda görmənin çətinliyini gördüyü üçün ticari fəaliyyətindən əl çəkmişdi. Buna görə də şura xəlifəyə illik altı min dirhəm maaş təyin etmişdi. Bu məbləğ Əbu Bəkrin (r.ə) özü və ailə üzvlərinin illik məişət ehtiyaclarına ancaq yetməkdə idi. Buna görə də xəlifə vəfat edərkən miras olaraq bir dinar qızıl pul, bir dəvə, qiyməti 5 dirhəm olan parça və paltarları, bir də gündəlik məişət işlərində ona yardım edən köləsi qalmışdı. O, xəlifə seçilərkən Mədinənin kənar məhəllələrindən olan Sunhdakı evində xanımı Həbibə ilə yaşayırdı. Buradan hər gün sübh namazı vaxtı piyada və ya miniklə Məscidu'n-Nəbəviyə gəlir, müsəlmanların işlərini buradan idarə edirdi. Vəfatından bir müddət əvvəl isə Sunhdakı evindən Mədinənin mərkəzinə köçüb gəlmişdi.

Vəfat edəndən sonra xəlifənin cənazəsini oğlu Əbdürrəhman (r.ə) yuyub kəfənləmişdi. Daha sonra cənazəni məscidə gətirmişdilər və Ömər ibn Xəttab (r.ə) Əbu Bəkrin (r.ə) cənazə namazını qıldırmışdı. Əbu Bəkri (r.ə) Rəsulullahın (s.ə.v) məzarının sağ tərəfində, başı Peyğəmbərin (s.ə.v) çiyinləri səviyyəsinə çatacaq vəziyyətdə dəfn etmişdilər. Cənazəni məzara oğlu Əbdürrəhman (r.ə), Ömər (r.ə), Osman (r.ə) və Təlhə (r.ə) endirib dəfn etmişdilər.

Xəlifə seçiləndən sonra məsciddə minbərə çıxan Ömər ibn Xəttab (r.ə) söylədiyi xütbəni bu sözlərlə bitirmişdi: "*Ərəblərin vəziyyəti burnuna yüyən taxılmış və sürücüsünün arxasınca gedən dəvənin vəziyyəti kimidir. Onu yedəyinə alan hara apardığına diqqət etməlidir. Mənə gəldikdə, isə Kə'bənin Rəbbinə and olsun ki, mən onları doğru yolda aparacağam*".

Ömər ibn Xəttab (r.ə) uzun boya və iri vücuda sahib bir insan idi. Boyu o qədər uzun idi ki, bir dəstə insanın arasında yeriyrəkən, hərkəs piyada, o, isə at belindəymiş kimi görünürdü. Açıq çəhrayıya çalan ağ dərili olan Ömər ibn Xəttab (r.ə) tünd qumral saçlı idi və saçının orta qismi tökülmüşdü. Qureyş qəbiləsinin Bəni-Ədiyy oymağına mənsub idi. İslamdan əvvəl Məkkənin idarəçiliyində söz sahibi olan nüfuzlu əsilzadələrdən biri idi. İslamı qəbul edərkən 27 yaşında idi. Bəziləri İslamdan əvvəl, bəziləri isə İslamı qəbul etdikdən sonra olmaqla bir neçə qadınla evlənmişdi. Abdullah, Ubeydullah, böyük Əbdürrəhman, ortancıl Əbdürrəhman, kiçik Əbdürrəhman, böyük Zeyd, kiçik Zeyd, Asim, İ'yaz adlı oğulları və Həfsa, Ruməyyə, Zeynəb, Fatimə adlı qızları olmuşdu. Xanımlarından biri də Əli ibn Əbu Talibin (r.ə) qızı Umm Kulsüm (r.ə) idi. Umm Kulsüm (r.ə) Ömərin (r.ə) evləndiyi ən son xanım idi. Onunla xəlifəliyi dövründə, 40 min dirhəm mehr ödəyərək evlənmişdi. Kiçik Zeydlə Ruməyyənin anası Umm Kulsüm (r.ə) idi. Qızlarından Həfsa (r.ə) Allah Rəsulunun (s.ə.v) xanımı idi.

*Dəməşqin Fəthi*

Ömər ibn Xəttab (r.ə) xəlifə olduqdan sonra Əbu Bəkrin (r.ə) xilafəti dövründə İraq və Şam cəbhələrində başladılmış fəth hərəkatını davam etdirmişdi. O, ilk olaraq Xalid ibn Vəlidi (r.ə) Şam diyarındakı İslam ordusunun baş komandanlığı vəzifəsindən azad etdiyini və onun yerinə Əbu Ubeydə ibn Cərrahı (r.ə) təyin etdiyini bildirən əmrnamə yazdıraraq göndərmişdi. Əbu Bəkrin (r.ə) vəfat edib yerinə Ömər ibn Xəttabın (r.ə) xəlifə olduğu ilə bağlı xəbər bu əmrnamə ilə birlikdə Yərmuk müharibəsinin son günlərində Şam diyarındakı İslam ordusuna çatdırılmışdı. Ömər ibn Xəttabın (r.ə) Xalid ibn Vəlidi (r.ə) vəzifəsindən azad etməsinin səbəbi kimi mənbələrdə Malik ibn Nuveyrə hadisəsində aralarında yaranmış anlaşmazlıqla yanaşı insanların qələbələri Xalid ibn Vəlidin (r.ə) adına bağlamaları da göstərilməkdədir. İnsanlar həmin dövrdə dünyanın ən qüdrətli orduları hesab olunan Bizans və Sasani imperiyalarının hərbi gücünün İslam orduları qarşısında duruş gətirə bilməməsinin Xalid ibn Vəlidin (r.ə) sayəsində baş verdiyi haqqında danışmağa başlamışdılar. Bu Ömər ibn Xəttabı (r.ə) narahat etməkdə idi. Belə ki, müsəlmanların qələbələrin sadəcə Allahın lütfü və nüsrəti sayəsində qazandıqlarını dərk edərək bunu heç kimin sayəsində baş vermədiyini anlamalarını təmin etmək zəruri idi. Buna görə də Ömər ibn Xəttab (r.ə) Xalid ibn Vəlidin (r.ə) yerinə Əbu Ubeydə ibn Cərrahı təyin etmişdi. Əbu Ubeydə ibn Cərrah (r.ə) Bəşir ibn Kə’b əl-Himyərini (r.ə) kiçik bir dəstə ilə Yərmukda qoyub özü ordunun əsas hissəsi ilə Mərcu’s-Suffara gəlmişdi. O, burada ətrafa casuslar göndərərək onlara Bizans hərbi qüvvələrinin vəziyyəti və hərəkətləri ilə bağlı məlumatlar gətirməyi tapşırmışdı. Əbu Ubeydə ibn Cərrah (r.ə) Yərmukda canını sağ qurtara bilmiş Bizans əsgərlərinin Fihl adlanan yerdə toplandıqlarını, imperatorun buraya əlavə qüvvələr cəlb etdiyini və onların müsəlmanlarla yeni bir müharibə üçün hazırlaşdıqları barədə kəşfiyyatçıların gətirdikləri xəbərləri məktubla xəlifəyə bildirmişdi. O, Fihldəki Bizans ordusu ilə döyüşəmi çıxmalı, yoxsa Dəməşqimi mühasirə altına almalı olduğu barədə Ömər ibn Xəttabın (r.ə) fikrini soruşmuşdu. Ömər ibn Xəttab (r.ə) ona yazdığı cavab məktubunda Bizansın Şam diyarındakı qərargahının Dəməşqdə yerləşdiyi, bütün vilayətə köməkçi qüvvələr və silah-sursatın buradan göndərildiyini, Dəməşq alınmadığı müddətcə Şam vilayətindəki hərbi əməliyyatların uzanacağını bildirərək Dəməşqi fəth etməsini əmr etmişdi. Xəlifə Fihldə toplanmış Bizans ordusunu məşğul etmək üçün kiçik bir ordu hissəsini oraya gömdərməsini, fəth olunmuş yerlərin mühafizəsi üçün müəyyən sayıda silahlı dəstənin Fələstində qalmasını əmr etmişdi. Əbu Ubeydənin (r.ə) Fihldəki Bizans ordusuna qarşı göndərdiyi hərbi birlik oraya yaxınlaşanda bu

yerin geniş çaplı hərbi əməliyyat üçün əlverişsiz hala gətirildiyi görülmüşdü. Belə ki, bizanslılar İslam ordusunun üzərlərinə gəldiyini öyrənən kimi çayların məcralarını dəyişərək düzənliklərə axıtmışdılar. Beləcə ərazi əsgərlərin, yük və minik heyvanlarının hərəkəti üçün əlverişsiz hala gəlmişdi. Buraya göndərilən İslam ordusu da iri hərbi əməliyyat üçün təlimatlandırılmamışdı. Onlara verilən əsas tapşırıq ondan ibarət idi ki, kiçik və qısa müddətli hücumlarla Fihldəki Bizans ordusunu məşğul etsinlər. Beləcə buradakı Bizans ordusu yerindən tərpənə bilməyərək İslam ordusunun əsas hərbi əməliyyatlarına mane törətmək imkanından məhrum olacaqdı. Əbu Ubeydə ibn Cərrah (r.ə) İslam ordusunun əsas hissəsi ilə Dəməşqə yaxınlaşanda hərbi dəstələr göndərərək şəhərə üç istiqamətdən gələn əsas yolları bağlatdırmışdı. Bu vaxt imperator Herakl Hums şəhərində idi və o, İslam ordusunun əsas hissəsinin Dəməşq ətrafında olduğu xəbərini alan kimi oraya kömək göndərmək istəmişdi. Lakin Bizans ordusu Əbu Ubeydənin (r.ə) göndərdiyi dəstənin pusqusuna düşərək irəliləyə bilməmişdi. O cümlədən Fələstindən və şimal istiqamətindən Dəməşqə gələn yollar da bağlanmışdı. Beləcə həm Dəməşqə əlavə qüvvənin gəlməsinin qarşısı alınmış, həm də arxadan qəfil zərbə almadan mühasirənin rahat davam etdirilməsi təmin edilmişdi. Əbu Ubeydə ibn Cərrah (r.ə) Dəməşqin qala divarlarının xeyli uzun və möhkəm olduğunu nəzərə alaraq Şam diyarındakı bütün hərbi qüvvələri buraya cəlb etmişdi. O, şəhərə üç istiqamətdən hücum etmişdi. Birinci istiqamətə özü, ikincisinə Xalid ibn Vəlid (r.ə), üçüncüsünə isə Əmr ibn əl-As başçılıq etmişdi. İslam ordusundakı süvari qüvvələrə İyaz ibn Qənəm (r.ə), piyada əsgərlərə isə Şurahbil ibn Həsənə (r.ə) əmirlik etməkdə idi. Dəməşqdəki Bizans qüvvələrinin komandanı general Anastas idi. Yetmiş gün davam edən mühasirə vaxtı çox şiddətli döyüşlər olmuşdu. İslam ordusu, xüsusilə də İraq cəbhəsindən köməyə gəlmiş qüvvələr ağır itgi vermişdilər. Dəməşqin möhkəm qala divarları şəhər müdafiəçilərinin işini xeyli asanlaşdırmaqda idi. Mühasirənin davam etdiyi günlərdə general Anastasın oğlu dünyaya gəlmişdi. Bizans ordusuna başçılıq edənlərin əksəriyyəti bu münasibətlə verilən ziyafətdə yeyib içəndən sonra sərxoş olmuş və ağır yuxuya dalmışdılar. Lakin Xalid ibn Vəlid (r.ə) və kəşfiyyatçıları həmin gecə yatmayaraq bütün baş verənlərdən xəbərdar olmaqda idilər. Onlar divarların üzərindəki Bizans qüvvələrinin seyrəldiyini və müdafiənin zəiflədiyini görmüşdülər. Xalidin (r.ə) cəsarət və şücaətləri ilə tanınmış könüllülərdən meydana gətirdiyi kiçik bir dəstə bunu fürsət bilib qalanın ətrafındakı su ilə doldurulmuş dərin xəndəyi üzüb keçərək divarlara yaxınlaşmışdılar. Qə’qa ibn Əmr ət-Təmimi (r.ə) və Məz’ur ibn Ədiyy əl-İcli (r.ə) adlı iki mücahid kəmənd ataraq qala divarları-

nın üzərinə dırmanmışdılar. Onların bağladıqları ipdən hörülmüş nərdivanlarla Xalid ibn Vəlidin (r.ə) başçılığındakı digər mücahidlər divarların üzərinə dırmanaraq içəri girmişdilər. Yuxuda ikən yaxaladıqları mühafizləri öldürüb qala qapılarına yaxınlaşmışdılar. Xalid ibn Vəlid (r.ə) və yoldaşları qala qapılarını qoruyan gözətçiləri də səssizcə zərərsizləşdirərək qapıları açmış və əvvəlcədən şərtləşdikləri kimi təkbir səsləri ilə bayırdakı mücahidləri xəbərdar etmişdilər. Xalidin (r.ə) ordusu açılmış qapıdan dəstə-dəstə keçərək şəhərə girmişdi. Beləcə Dəmşqin bir tərəfində küçə döyüşləri başlamışdı. Əməliyyat gizli aparıldığı üçün Əbu Ubeydə (r.ə) ilə Əmr ibn əl-Asın ordusu bundan xəbər tutmamışdı. Bizanslılar müsəlmanların qılınc gücü ilə şəhəri fəth edəcəyini anlayınca Əbu Ubeydənin (r.ə) yanına öz elçilərini göndərərək ona təklif etdiyi şərtlərlə əhdnamə bağlamağa razı olduqlarını bildirmişdilər. Əbu Ubeydə ibn Cərrah (r.ə) bundan əvvəl Dəməşq əhalisi üçün əlverişli şərtlərlə sülh təklif edib əhdnamı bağlamaq isəmişdi. Lakin bizanslılar mühasirənin ilk günlərində bunu qəbul etməmişdilər. İndi isə çarəsiz vəziyyətdə özləri buna can atmaqda idilər. Əbu Ubeydə (r.ə) onlarla razılaşaraq ordusunu şəhərə yeridərkən Xalid ibn Vəlidin (r.ə) keçirdiyi əməliyyatdan xəbərdar olmuşdu. Buna görə də Dəməşqin sülh yolu ilə yoxsa döyüşlə fəth edildiyi barədə müştərək fikir bəyan olunmamışdı. Xalid ibn Vəlid (r.ə) şəhərin döyüşlə alındığını bildirərək dəməşqlilərə müsəlmanların müəyyən etdikləri şərtlərlə əhdnamə veriləcəyini bildirmiş və bu barədə yazılı sənəd hazırlamışdı. Beləcə hicri 14-cü ilin rəcəb ayında (sentyabr 635) Dəməşq şəhəri fəth olunmuşdu. Xalid ibn Vəlidin (r.ə) Dəməşq əhalisi üçün yazdırdığı əhdnamənin mətni aşağıdakı kimidir:

"*Rəhman və rəhim olan Allahın adı ilə*

*Bu əhdnamə Xalid ibn Vəlidin şəhərə girəcəyi təqdirdə Dəməşq əhalisi üçün öz təminatı altına alacağı mövzuları sadalayır. Onların həyatları, mal-mülkləri və kilsələri təminat altındadır. Şəhərin qala divarları dağıldılmayacaq. Heç bir müsəlman əsgər yerli əhalinin evinə girməyəcək. Allahın, Rəsulunun və möminlərin himayəsi onlara verilmişdir. Onlar cizyə ödədikləri müddətcə başlarına müsəlmanlar tərəfindən yaxşılıqdan başqa bir şey gəlməyəcəkdir*".

Əbu Ubeydə ibn Cərrah (r.ə) Mədinəyə, xəlifəyə yazdığı məktubla Dəməşqin fəth olunduğunu bildirmişdi. O, Şam diyarındakı hərbi əməliyyatlarda iştirak etmiş və xeyli şəhid vermiş İraq cəbhəsi əsgərlərinin sıralarını əlavə qüvvələrlə möhkəmləndirərək İraqa göndərmişdi. Dəməşqin fəthindən sonra Əbu Ubeydə ibn Cərrah (r.ə) ordusu ilə Fihldəki Bizans qüvvələrinin üzərinə getmişdi. O, Fihlə doğru yola çıxmamışdan əvvəl Dəməşqin fəthindən sonra şəhərin mühafizəsi üçün ayırdığı əsgərlərə Yəzid ibn Əbu Süfyanı (r.ə) əmir təyin et-

mişdi. Allah Rəsulunun (s.ə.v) əshabından olub onunla birlikdə Bədr və sonrakı döyüşlərdə iştirak etmiş Muaz ibn Cəbəl əl-Xəzrəci əl-Ənsari (r.ə) hicri 18-ci ildə (639) Dəməşq yaxınlığında, Qurinsan adlı yerdə xəstələnərək 38 yaşında ikən vəfat etmişdi.

*Fihl Döyüşü*

Fihl yürüşündə ordunun avanqard qüvvələrinə Xalid ibn Vəlid (r.ə) başçılıq etməkdə idi. Ordunun əsas, mərkəz qüvvələrinin başında Şurahbil ibn Həsənə (r.ə) vardı. Sağ cinaha Əbu Ubeydənin (r.ə) özü, sol cinaha isə Əmr ibn əl-As başçılıq etməkdə idi. Süvari qüvvələr Dirar ibn əl-Əzvər əl-Əsədinin (r.ə), piyada qüvvələr isə Əbu Sə'd İyaz ibn Qənəm əl-Fıhrinin (r.ə) əmri altında idi. İslam ordusu Fihlə gəlib çatanda bizanslıların çayların məcralarını dəyişərək düzənlik əraziyə axıtdıqlarını, buna görə də ərazinin tamamilə palçıqla dolu bataqlığa döndüyünü görmüşdülər. İslam ordusunun buradakı hissələri Bizans ordusuna qarşı ciddi həmlə edə bilməmişdi. İslam ordusunun əsas hissəsinin də palçıq dəryasının içində batıb qalma təhlükəsi var idi. Buna görə də Əbu Ubeydə ibn Cərrah (r.ə) Mədinəyə məktub yazaraq Ömər ibn Xəttabı (r.ə) yaranmış vəziyyətdən xəbərdar etmiş və onun təlamatını gözləməyə başlamışdı. İslam ordusu gözləyərkən Şurahbil ibn Həsənə (r.ə) ordunu daim döyüş nizamında, hazır vəziyyətdə saxlayıb əsgərlərin rahatçılığına izn verməmişdi. Şurahbilin (r.ə) bu tədbiri işə yaramışdı. Belə ki, bir neçə gün sonra general Nestor gecə vaxtı Bizans ordusuna qəfil hücum əmri vermişdi. Əraziyə yaxşı bələd olan Bizans ordusu quru yerlərdən keçərək hücum etmişdi. Hicri 14-cü ilin şəvval ayında (oktyabr-noyabr 635) Fihl adlanan yerdə ərəblərin Zatü'r-Rədaqa adlandırdıqları bu döyüş bir sonrakı günün axşamına qədər davam etmişdi. Gecənin qaranlığında ərəb süvarilərinin sağdan və soldan sıxışdırdıqları Bizans ordusunun döyüş nizamı pozulmuş və ordu nizamsız halda geri çəkilməyə başlamışdı. Tezliklə bu geri çəkilmə süvari mücahidlərin təqibi səbəbiylə vahiməyə düşmüş əsgərlərin geri qaçışına çevrilmişdi. Süvari mücahidlər düşmən əsgərlərini amansızca təqib edərək özlərinin düzəltdikləri palçıq dəryasına tərəf sıxışdırmışdılar. Palçıq və bataqlığa ilişib qalan Bizans ordusundan 80 mini qılıncdan keçirilmiş, çox azı qaçıb qurtula bilmişdi. Bir çox bizanslı sərkərdə, o cümlədən general Nestor Fihldə öldürülmüşdü.

Fihl döyüşündən sonra Xalid ibn Vəlid (r.ə) öz süvariləri ilə Bəqa' vadisinə daxil olmuşdu. Xalidin (r.ə) ordusunun öncü qüvvələri Zəhru'l-Beydar adlı yerdə rastlaşdıqları Bizans qüvvələri ilə qeyri-bərabər döyüşə girmiş və bu qrupdakı mücahidlərin əksəriyyəti burada şəhid olmuşdular. Xalid ibn Vəlid (r.ə) ordusunun əsas hissəsi ilə Bə'əlbək şəhərinə yaxınlaşaraq şəhəri fəth etmişdi.

*Humsun Fəthi*

Fihld döyüşündən sonra Əbu Ubeydə ibn Cərrah (r.ə) növbəti hədəf olaraq Hums şəhərini seçmişdi. Humsda əhəmiyyətli sayda Bizans hərbi qüvvəsi mövcud idi. Əbu Ubeydənin (r.ə) ordusu Humsa yaxınlaşarkən Əqəbətu'sSəlmiyyə adlı yerdə Bizans hərbi qüvvələri ilə rastlaşdılar. Burada baş verən döyüş mücahidlərin qələbəsi ilə başa çatmışdı. Əqəbətu's-Səlmiyyədən qaçan Bizans əsgərlərini təqib edən İslam orudusu Humsa çatıb hicri 14-cü ilin zilqədə ayında (noyabr-dekabr 635) şəhəri mühasirə altına aldılar. Hums əhalisi şəhərdəki qüvvələrin uzun müddət mühasirəyə davam gətirə bilməyəcəyini anladıqları üçün Dəməşq şəhəri ilə bağlanmış əhdnamənin şərtlərilə şəhəri Əbu Ubeydəyə (r.ə) təslim edəcəklərini bildirmişdilər. Beləcə Hums sülh yolu ilə fəth edilmişdi. Humsun müsəlmanların əlinə keçməsindən qısa müddət sonra Laziqiyyə və Həma şəhərləri də fəth edilmişdi.

*Aralıq Dənizinin Şərq Sahillərindəki Hərbi Əməliyyatlar*

Humsun fəthindən sonra Əbu Ubeydənin (r.ə) əmri ilə Dəməşdən öz ordusu ilə hərəkətə keçən Yəzid ibn Əbu Süfyan (r.ə) qardaşı Müaviyə (r.ə) ilə birlikdə indiki Livan və İsrail dövlətlərinin Aralıq dənizi sahillərində yerləşən ərazilərinin fəthinə başlamışdılar. Onlar buradakı Səyda, İrqa, Cubeyl və Beyrut şəhərlərini fəth etmişdilər. İrqa qalası Ömər ibn Xəttabın (r.ə) hakimiyyətinin son dövrlərində yenidən Bizans ordusu tərəfindən ələ keçirilmişdi. Lakin Müaviyə ibn Əbu Süfyan (r.ə) Bizans ordusunu məğlub edərək ikinci dəfə İrqanı ələ keçirmiş və buraya çox sayda müsəlman ailəni köçürərək məskunlaşdırmışdı. Muaviyənin (r.ə) əmirlərindən Süfyan ibn Mucib əl-Əzdi (r.ə) Trablus adlanan yerdəki qalaların fəthi ilə məşğul olmuşdu. Bir tərəfi Aralıq dənizinə açılan, möhkəm qala divarları ilə əhatə olunmuş Trablusun fəthi xeyli çətin olmuşdu. Süfyan ibn Mucib əl-Əzdi (r.ə) Trablusdan bir qədər aralıda, Murc adlanan yerdə Hısnu's-Süfyan adı ilə tanınan qala inşa etdirmişdi. O, öz əsgərlərini Hısnü's-Süfyanda saxlayır, vaxtaşırı Trablusa hücumlar təşkil edirdi. Trablusdakı Bizans qüvvələri Süfyan ibn Mucibin (r.ə) aramsız hücumları nəticəsində bir gecə qalanı boşaltmış, gəmilərə minərək Trablusu tərk etmişdilər. Növbəti hücum vaxtı Trablusun boş olduğunu görən Süfyan ibn Mucib (r.ə) öz əsgərləri ilə qalaya daxil olaraq buranı fəth etmiş və məktub yazaraq bu xəbəri Müaviyə ibn Əbu Süfyana (r.ə) bildirmişdi.

Əbu Ubeydə ibn Cərrahın (r.ə) əmri ilə Şurahbil ibn Həsənə (r.ə) öz ordusu ilə Beysan qalasını mühasirəyə almış, buradakı Bizans və xristian ərəblərin silahlı qüvvələri ilə uzun müddət döyüşmüşdü. Bu vaxt Əbü'l-Avər əs-Suləmi

(r.ə) də Təbəriyyədəki bizanslılar və xristian ərəblərlə vuruşmaqda idi. Beysan və Təbəriyyə şəhərləri hicri 14-cü ilin zilqədə-zilhiccə aylarında (dekabr 635-yanvar 636) İslam orduları tərəfindən fəth edilmiş və buranın əhalisi ilə dəməşqlilərlə bağlanmış əhdnamənin şərtlərinə uyğun olaraq sülh bağlanmışdı.

*Nəmariq Döyüşü*

Ömər ibn Xəttabın (r.ə) xilafətinin ilk aylarında Mədinəyə İraq cəbhəsindən həyəcanlı xəbərlər gəlməkdə idi. Sasani sarayındakı taxt-tac çəkişmələri müvəqqəti də olsa bitmiş və iranlılar İraqda itirdikləri əraziləri geri almaq üçün aparacaqları hərbi əməliyyatların hazırlıqlarına başlamışdılar. Rüstəm Fərruxzadə adlı sərkərdə Sasani ordularının baş komandanlığına təyin edilmişdi. O, itirilmiş ərazilərin geri alınması üçün Sasani ordularının başında İraqa gəlmişdi. Müsənna ibn Harisə (r.ə) İraqda baş verən hadisələr haqqında Mədinəyə, Ömər ibn Xəttaba (r.ə) mütəmadi olaraq məlumat verirdi. Ömər ibn Xəttab (r.ə) hər şeydən əvvəl Əbu Ubeydə ibn Cərraha (r.ə) Şam diyarındakı hərbi əməliyyatlarda iştirak etməkdə olan İraq cəbhəsi əsgərlərini əlavə qüvvələrlə dəstəkləyərək İraqa göndərməsini əmr etmişdi. Daha sonra xəlifə İraqa göndərmək üçün Mədinədə yeni bir ordunun hazırlanması əmrini vermişdi. O, yarımadadakı qəbilələrə könüllülərin toplanması üçün xəbər göndərmişdi. Qısa müddət ərzində Mədinədə 7 min nəfərlik ordu toplanmışdı. Ömər ibn Xəttab (r.ə) bu orduya Əbu Ubeyd ibn Məs’ud Əs-Səqəfini (r.ə) əmir təyin etmişdi. Abdullah ibn Ömər ibn Xəttabın (r.ə) qaynatası olan Əbu Ubeyd ibn Məs’ud (r.ə) Allah Rəsulunun (s.ə.v) əshabından deyildi. İslamı Peyğəmbərin (s.ə.v) vəfatından sonra qəbul etmişdi. Lakin Ömər ibn Xəttabın (r.ə) İraq cəbhəsinə könüllülərin cəlb edilməsilə bağlı çağırışına ilk gələnlərdən biri idi. Xəlifə hərbi işdə təcrübəsi və sərkərdəlik qabiliyyəti olan Əbu Ubeyd ibn Məs’udu (r.ə) yola çıxmamışdan əvvəl yanına çağıraraq nəsihət etmiş, ibadətlərin vaxtı vaxtında yerinə yetirməsinə xüsusi diqqət yetirməsini, əsgərlərlə sərt və kobud davranmamağı tövsiyə etmişdi. Ömər ibn Xəttab (r.ə) Allah Rəsulunun (s.ə.v) əshabından Səlit ibn Qeys əl-Ənsarini (r.ə) Əbu Ubeyd ibn Məs’uda (r.ə) köməkçi təyin edərək bütün işlərində Səlitlə (r.ə) məsləhətləşməyi tapşırmışdı.

Əbu Ubeyd ibn Məs’udun (r.ə) öz ordusu ilə yola çıxmasından sonra xəlifə İraq cəbhəsinə göndərilmək üçün yeni silahlı qüvvələrin hazırlanması işini davam etdirmişdi. Qədisiyyədə toplanmış Rüstəmin əmrindəki Sasani ordusunun Hirəyə tərəf hərəkət etdikləri xəbəri alınmışdı. Əbu Ubeyd ibn Məs’ud (r.ə) İraqa gələrək öz qüvvələrini Müsənna ibn Harisə əş-Şeybaninin (r.ə) qüvvələrilə birləşdirmişdi. Əbu Ubeyd ibn Məs’ud (r.ə) süvari qüvvələrin başına Müsənna

ibn Harisəni (r.ə), piyadaların başçılığına isə Əmr ibn Heysəmi (r.ə) təyin edərək Hirədən yola çıxmışdı. İki ordu Hirə ilə Qədisiyyə arasındakı Nəmariq adlı yerdə qaşılaşmışdı. Sasani ordularına Caban və Mərdanşah adlı sərkərdələr başçılıq edirdilər. Hicri 13-cü il şaban ayının 8-də (6 oktyabr 634) bir neçə saat davam etmiş Nəmariq döyüşü İslam ordusunun qələbəsi ilə nəticələnmişdi. Caban və Mərdanşah əsir düşmüşdülər. Mərdanşahı əsir götürən Əqtəl ibn Şəmmax əl-Uqeyli adlı mücahid deyəsən onun kim olduğunu bilmədən Mərdanşahı öldürmüşdü. Caban isə onu yaxalayan Matar ibn Fiddə ət-Teymi adlı mücahidin əlindən qaçmışdı. Lakin tezliklə yenidən yaxalanaraq Əbu Ubeyd ibn Məs'udun (r.ə) yanına gətirmişdi. Əmirlər Cabanın edam edilməsində təkid etsələr də Əbu Ubeyd (r.ə) onun öldürülməsinə izn verməmişdi. Əbu Ubeydə (r.ə) süvarilərə Nəmariqdə məğlub olub qaçan Sasani əsgərlərini təqib edərək məhv etmək əmrini vermişdi. Nəmariqdən qaçan iranlı əsgərlər yaxınlıqdakı Kəskər qalasına sığınmışdılar. Mücahidlər onları Kəskərə qədər təqib etmişdi. Kəskərdəki Sasani qarnizonunun başçısı Nerseh Nəmariqdən qaçanları yenidən səfərbər edərək öz qarnizonu ilə birlikdə qalaya yaxınlaşan İslam ordusu ilə vuruşmaq üçün hərəkətə keçmişdi. Bu vaxt Qalen (Calinus) adlı iranlı sərkərdə də Rüstəmin göndərdiyi əlavə qüvvələrlə Kəskərə Nersehin köməyinə gəlməkdə idi. Müsənna ibn Harisənin (r.ə) süvarilərinin ardınca Əbu Ubeyd (r.ə) də ordunun əsas hissəsi ilə Kəskərə yaxınlaşmışdı. Səqatiyyə adlı yerdə baş verən ağır döyüş İslam ordusunun qələbəsi ilə nəticələnmiş, Nersehin ordusu məğlub edilmiş, Kəskər qalası müsəlmanların əlinə keçmişdi. Əbu Ubeyd ibn Məs'ud (r.ə) Kəskərdə qalmayaraq Rüstəm Fərruxzadənin Qalenin komandanlığında göndərdiyi ordu ilə vuruşmaq üçün hərəkətə keçmişdi. O, hicri 13-cü il şabanın 17-si (15 oktyabr 634) Baqusyas adlı yerdə Qalenin ordusu ilə qarşılaşaraq döyüşə girmişdi. Baqusyasdakı döyüş Sasani ordusunun məğlubiyyəti ilə nəticələnmişdi. Əbu Ubeyd (r.ə) daha sonra süvarilərini ətraf ərazilərə göndərərək Barusma, Zəvabi, Nəhrcəbər, Zəndəvərd və Fəravəndad adlı şəhər və qəsəbələri fəth etmişdi. O, hərbi əməliyyatları uğurla başa vurandan sonra Hirəyə qayıdaraq buradan Mədinəyə məktub göndərmiş və Ömər ibn Xəttabı (r.ə) baş verənlər barədə təfərrüatı ilə məlumatlandırmışdı. Ömər ibn Xəttab (r.ə) İraqda olan Əbu Ubeyd ibn Məs'uda (r.ə) yazdığı cavab məktubunda belə demişdi: "*Sən hilə, kələk, xəyanət və cəbriliyin ölkəsinə getmisən. O ölkədə elə bir qövm yaşayır ki, bilə-bilə şərrə meyl edir, yaxşı əməllərə qarşı göz yumur, ondan üz çevririlər. Buna görə də hərəkətlərində diqqətli və ehtiyatlı ol. Dilini saxla və əsla sirrini açıqlama. Çünki sirrini saxlaya bilən kəsi heç kim ələ keçirə bilməz və o, xoşlamayacağı vəziyyətə düşməz. Sirrini qoruya bilməyən isə məhv olub gedər*".

*Cisr Döyüşü*

Sasani ordusunun əsas hissəsi Bəhmən Cazuyə[67] adlı sərkərdənin başçılığı altında Fərat çayı hövzəsinə gələrək çayın sağ sahilində Məhurə adlı yerdə düşərgə qurmuşdu. Daha əvvəl məğlub edilmiş İran hərbi birləşmələrindən sağ qalan əsgərləri də Qalen toplayıb Məhurəyə gətirmişdi. Bir müddət sonra Əbu Ubeyd ibn Məs'ud (r.ə) da İslam ordusu ilə həmin yerə gəldi və Fəratın sol sahilində düşərgə qurdurdu. İki ordunu bir-birindən Fərat çayı ayırırdı. Həmin yerdə hicri 13-cü ilin şaban ayının 23-də (21 oktyabr 634) ərəblər və iranlılar arasında şiddətli döyüş baş vermişdi. Çayın üstündəki taxta körpüdən keçib İran ordusuna hücum edən mücahidlər, düşmən ordusundakı fillərlə qarşılaşmışdılar. İranlılar ordunun ön cərgəsinə düzdükləri fillərin boynundan iri zınqırovlar asmışdılar. Bu zınqırovların və fillərin çıxardığı səslər atları ürkütməkdə idi. Atları ürkmüş süvarilərin döyüş nizamının pozulması nəticəsində İslam ordusu çətin vəziyyətdə qalmışdı. Əbu Ubeydə (r.ə) piyadaların fillərə hücum etməsini əmr etmiş və özü ön cərgələrdə fillərə hücum etmişdi. Əbu Ubeydə (r.ə) iri bir filin xortumunu qılıncı ilə kəsmişdi. Yaralanan filin ayaqları altında qalan Əbu Ubeyd ibn Məs'ud (r.ə) şəhid olmuşdu. Eləcə də piyada qüvvələrdəki yeddi əmir də döyüşçülərinin önündə qılınc və nizələri ilə fillərə hücum edərkən şəhid olmuşdular. Döyüş nizamı pozulan süvari və piyada mücahidlər Fərat çayı üzərindəki taxta körpüyə tərəf geri çəkilməyə məcbur olmuşdular. Körpünün üzərində yaranan sıxlıq və ağırlıq körpünün çökməsinə səbəb olmuşdu. Buna görə də ordunun bir hissəsi Fərat çayının sağ sahilində düşmən əhatəsində qalmışdı. Mücahidlərdən çayı üzüb keçməyə çalışanların bir çoxu boğulmuşdu. Bir qismi isə onları mühasirəyə almış Sasani əsgərləri ilə sona qədər vuruşaraq şəhid olmuşdular. Əbu Ubeydin (r.ə) şəhadətindən sonra İslam ordusunun komandanlığı onun tapşırığına əsasən Müsənna ibn Harisəyə (r.ə) keçmişdi. Müsənna (r.ə) yıxımış körpünü qismən bərpa etdirərək mücahidlərin bir qismini sol sahilə keçirə bilmişdi. O, sona qədər sağ sahildə qalmış, körpünü keçən son döyüşçü olmuşdu. İslam tarixində Cisr (körpü) döyüşü adı ilə qeyd olunan bu döyüşdə müsəlmanlar məğlub olmuş və 10 min nəfərlik İslam ordusundan 4 minə yaxın mücahid şəhid olmuşdu. Bununla belə müsəlmanlar Sasani ordusuna ağır itgi verdirə bilmişdilər. Döyüş meydanında 6 min iranlının cəsədi qalmışdı. Əbu Ubeyd ibn Məs'udun (r.ə) ordusundan sağ qalan mücahidlərin bir qismi Mədinəyə qayıtmış, bir qismi İraqda, Cərir ibn Abdullah əl-Bəcəlinin (r.ə) əmrində qalmışdılar. Körpü müharibəsindən sonrakı bir il müddətində

---

[67] Cazuyə və ya Cazəveyh (بهمن جاذويه).

Mədinədən İraqa yeni bir ordu göndərilməmişdi. Lakin Müsənna (r.ə) öz dəstəsi ilə kiçik çaplı əməliyyatlar aparmışdı. Körpü döyüşündə iştirak etmiş mücahidlərin bir qismi Mədinəyə qayıdanda Ömər ibn Xəttab (r.ə) onları qınamamış, əksinə təsəlli və təqdir etmişdi. Əbu Ubeyd ibn Məs'udun (r.ə) ardınca köməkçi qüvvə olaraq İraqa göndərilən ordu Haşim ibn Utbə əz-Zuhri[68] (r.ə) ilə Cərir ibn Abdullah əl-Bəcəlinin (r.ə) əmri altında idi.

*Buveyb Döyüşü*

Cərir ibn Abdullah (r.ə) ilə Müsənna ibn Harisənin (r.ə) qüvvələri birləşəndən sonra Rüstəm Fərruxzadənin Mehran adlı sərkərdənin başçılığı altında onların üzərinə göndərdiyi Sasani ordusu ilə vuruşmaq üçün hazırlıqlarını tamamlayaraq indiki Kufə şəhərinin olduğu yerdən birlikdə hərəkətə keçmişdilər. Fərat çayının sol sahilindəki Buveyb adlı yerdə iki ordu qarşılaşmışdı. Sasani ordusunun sayı İslam ordusundan dəfələrlə çox idi. Hicri 13-cü ilin son ayında (yanvar-fevral 635) Buveyb adlanan yerdə İslam ordusu ilə Sasani ordusu arasında şiddətli döyüş baş vermişdi. Döyüşdə İslam ordusuna Müsənna (r.ə) komandanlıq etmişdi. Döyüşün ilk saatlarında iranlılar İslam ordusunu cinahlardan sıxışdırmışdılar. Hətta bəzi yerlərdə iranlılar mücahidlərin sıralarını yararaq irəliləmişdilər. Müsənna ibn Harisənin (r.ə) çevikliyi və tədbirliliyi sayəsində İslam ordusunun döyüş nizamını qorumaq mümkün olmuşdu. Döyüşün ən qızğın anlarında Munzir ibn Həsən ibn Dirar əd-Dəmri adlı süvari mücahidin Sasani ordusuna komandanlıq edən Mehranı nizə ilə vurub atından yerə salması və Cərir ibn Abdullah əl-Bəcəlinin (r.ə) qılıncı ilə ayağa qalxmağa cəhd edən Mehranın kəlləsini uçurması vəziyyəti İslam ordusunun lehinə dəyişmişdi. Komandanlarının öldürüldüyünü görən Sasani ordusunda təşviş başlamışdı. İslam ordusunun ard-arda etdiyi həmlələr iranlıları nizamsız halda geri, Fərat üzərindəki körpüyə tərəf çəkilməyə məcbur etmişdi. Müsənnanın (r.ə) göndərdiyi bir qrup əsgər körpünü əvvəlcədən tutduğu üçün qaçan iranlı əsgərlər İslam ordusu ilə Fərat çayı arasında sıxışıb qalmışdılar. Onların bir qismi üzüb çayı keçməyə çalışarkən boğulmuş, bir qismi isə mücahidlərin qılınc və nizə zərbələri altında can vermişdilər. Buveybdə 60 mindən artıq Sasani əsgərinin cəsədi qalmışdı. Bu döyüşdə 4 min mücahid şəhid olmuşdu. Mücahidlər Sasani ordusunun böyük silah-sursat və ərzaq ehtiyatını qənimət olaraq ələ keçirmişdilər. Buveyb qələbəsindən sonra Müsənna ibn Harisənin (r.ə) əmri ilə süvari mücahidlər şərq və şimal istiqamətlərində hücumlarını davam etdirərək daha əvvəl itirilmiş bəzi yerləri də yenidən ələ keçirmişdilər. Buveyb döyüşündə

[68] Bu komandan Sə'd ibn Əbu Vəqqasın (r.ə) qardaşı Utbə ibn Əbu Vəqqasın (r.ə) oğlu idi.

ələ keçirilmiş qənimətlərin beşdə biri Mədinəyə, xəlifə Ömər ibn Xəttaba (r.ə) göndərilmiş, geri qalanı isə mücahidlər arasında paylaşdırılmışdı.

Hicri 14-ci ilin əvvəlində (fevral-mart 635) Ömər ibn Xəttab (r.ə) Sə'd ibn Əbu Vəqqası (r.ə) İraq cəbhəsi baş komandanlığına təyin etmiş və 24 min nəfərlik ordu ilə Mədinədən İraqa yola çıxarmışdı. O, Cərir (r.ə) ilə Müsənnaya (r.ə) məktub yazaraq Sə'di (r.ə) hər ikisinin üzərinə əmir təyin etdiyini, onların öz qüvvələrilə Sə'd ibn Əbu Vəqqasa (r.ə) itaət etməli olduqlarını bildirmişdi. Müsənna ibn Harisə (r.ə) Körpü və Buveyb döyüşlərində bir çox dəfə yaralanmışdı. Bu yaralarından bəziləri ağırlaşdığı üçün yatağa düşmüş və vəfat etmişdi.

*Qadisiyyə Döyüşü*

Sə'd ibn Əbu Vəqqas (r.ə) Təmim, Bəni-Əsəd, Quzaə, Bəcilə, Bəni-Bəkr, Təyy və digər ərəb qəbilələrindən toplanmış 24 min nəfərlik ordusu ilə İraqa gəlmişdi. İraq cəbhəsindəki orduların gəlib onlara birləşməsi ilə Sə'din (r.ə) əmri altındakı ordunun sayı 36 min nəfərə çatmışdı. Bu orduda Allah Rəsulunun (r.ə) 360-dan çox səhabəsi vardı ki, bunlardan təqribən 70-i Bədr döyüşündə iştirak etmiş mücahidlər idilər. Sə'd (r.ə) öz ordusu ilə Qadisiyyə adlı yerə gəlib burada ordugah qurmuşdu. Qadisiyyədəki ordugahdan mütəmadi olaraq kiçik çaplı səfərlərə çıxan mücahidlər Sasani ordusuna aid qarnizonlara, qala və istehkamlara hücum edir, onlara məxsus silah-sursat, ərzaq və digər təchizatı ələ keçirirdilər. Bu vəziyyət bölgədəki Sasani qarnizonlarının başçılarını narahat edir və onlar bu barədə Sasani şahı III Yəzdigərdə (632-651) yazdıqları məktublarla şikayət edirdilər. Bir aya yaxın müddətdə Qadisiyyədəki ordugahında qalan Sə'd ibn Əbu Vəqqas (r.ə) Sasani şahına öz elçilərini göndərmişdi. Nu'man ibn Muqərrin (r.ə), Asim ibn Əmr (r.ə), Muğirə ibn Şu'bə (r.ə), Ədiyy ibn Suheyl (r.ə), Əş'əs ibn Qeysdən (r.ə) ibarət elçi heyəti Mədainə gələrək III Yəzdigərdin hüzuruna çıxmışdılar. Nu'man ibn Muqərrin (r.ə) şaha xitab edərək belə demişdi: "*Uca Allah, mərhəmət edərək bizə yaxşılığı əmr edib pislikdən çəkindirən Peyğəmbərini (s.ə.v) göndərmişdir. O, bizə onun dəvətini qəbul edəcəyimiz təqdirdə dünya və axirətdə xeyir və'd etdi. O, həmçinin bizə iman edəndən sonra ətrafımızdakı millətləri də ədalətə və insafa çağırmağımızı əmr etmişdir. Biz də sizi dünya və axirət səadətinə qovuşmağınız üçün İslama dəvət edirik. Əgər qəbul etsəniz Qur'anın hakimiyyəti altında yaşamağınız üçün sizə kömək edəcəyik. Əgər qəbul etməsəniz sizə başqalarından qorumaq üçün himayəmizə daxil olub cizyə ödəməyi təklif edirik. Əgər bunu da rədd edirsinizsə artıq dillər susacaq və qılınclar danışacaq...*". Onun bu çıxışı Sasani şahını son dərəcə qəzəbləndirmişdi. Elçilərin öldürülməməsi adəti olma-

saydı onları edam etdirəcəyini bildirən şah bir torba torpaq gətirilməsini əmr etmişdi. Daha sonra nəsil-nəcabət baxımından onların üstün olanını soruşmuş və torpaqla dolu torbanı qabağa çıxan Asim ibn Əmrin (r.ə) çiyninə yüklədərək hüzurundan qovmuşdu. Torbanı çiyninə götürən Asim (r.ə) yoldaşlarına "*bu əslində bir müjdədir. And olsun ki, Allah bizi onların mülk və səltənətlərinə mirasçı qılacaqdır*" deyib şahın hüzurundan çıxmışdı.

III Yəzdigərd Rüstəm Fərruxzadəyə əmrindəki bütün orduları səfərbər edib Qadisiyyəyə getməyi əmr etmişdi. Lakin Rüstəm ərəblərlə Qadisiyyədə döyüşmənin müsbət nəticə verməyəcəyini, onları burada uzun müddət ətrafla əlaqəsi kəsilmiş vəziyyətdə saxlamanın daha məqsədəuyğun olacağını bildirmişdi. Şah onun bu məsləhətlərini dinləməyərək dərhal Sə'd ibn Əbu Vəqqasın (r.ə) ordusu ilə döyüşə girməyi əmr etmişdi. Təqribən 120 minlik ordusu ilə Qadisiyyəyə tərəf irəliləyən Rüstəm Sabat adlı yerdə ordugah quraraq ordusunu təftiş etmişdi. O, ordusunu önçü, ardçı, mərkəz, sağ və sol cinahlara ayıraraq Bəhram, Qalen, Bəndəran, Hürmüzan kimi tanınmış sərkərdələri bunlara komandan təyin etmişdi. Rüstəm Qadisiyyə döyüşündən əvvəl İslam ordusuna komandanlıq edən Sə'd ibn Əbu Vəqqasa (r.ə) xəbər göndərərək elçi heyəti göndərməsini tələb etmişdi. Buna görə də Sə'd ibn Əbu Vəqqas (r.ə) Muğirə ibn Şu'bəni (r.ə) iranlıların hərbi düşərgəsinə göndərmişdi. Muğirə (r.ə) onların ehtişamına əhəmiyyət vermədiyini göstərmək üçün qiymətli daşlarla bəzədilmiş qızıl taxtında təkəbbürlə oturan Rüstəmə yaxınlaşıb onun yanında taxta oturmuşdu. Onun bu cürətkar hərəkəti iranlıların qəzəbinə səbəb olmuş və onlar Muğirəni (r.ə) tutub taxtdan aşağı endirmişdilər. Rüstəm Muğirəyə (r.ə) xitab edərək bir xeyli danışdıqdan sonra "*Mənə məlum olduğuna görə sizi bu işə (müharibəyə) vadar edən, başqa bir şey deyil, sadəcə fəqirlik, kasıblıq və iqtisadi darlıq içində olmanızdır, qayıdın öz yurdunuza gedin, biz sizin buralara karvanlarla gəlib ticarətlə məşğul olmanıza maneə törətməyəcəyik*" demişdi. Muğirə ibn Şu'bə (r.ə) isə ona belə cavab vermişdi: "*Biz dünya malı axtarmağa gəlməmişik. Bizim istəyimiz və məqsədimiz axirətdir. Allah bizə öz Rəsulunu (s.ə.v) göndərmişdir. Biz onun dəvətini qəbul edərək ona tabe olduq. Bunun sayəsində xoşbəxt və bəxtiyarıq. Allah İslama zidd hərəkət edənlərlə, onlar boyun əyib öz əlləri ilə cizyə verənə qədər vuruşmağı əmr edir. Biz sizdən yalnız bir olan Allaha sitayiş edib, onun elçisini təsdiq etmənizi istəyirik. İslamı qəbul etsəniz nə əla, din qardaşımız olarsınız. Etməyəcəyiniz təqdirdə cizyə ödəyəcəksiniz. Ya da aramızda qılınc hakim olacaqdır*".

Hicri 15-ci il şaban ayının 13-ü (18 sentyabr 636) ordusuna zöhr namazını qıldıran Sə'd ibn Əbu Vəqqas (r.ə) namazdan sonra xütbə söyləyərək

mücahidlərə müraciət etmişdi. O, xütbəsində əsgərlərinə Allah yolunda cihadın, ilayi-kəlimətullahın (Allahın kəlamı olan Qur’anın hakim qılınması) fəzilətini və ümdəliyini xatırlatmış, bu yolda onları fədakarlıq etməkdən çəkinməməyə çağırmışdı. Daha sonra Sə’d ibn Əbu Vəqqas (r.ə) ordusuna hücum əmri vermişdi. İranlıların ön sıralara düzdükləri 40-a yaxın fil bu dəfə işə yaramamışdı. Belə ki, Sə’d ibn Əbu Vəqqas (r.ə) əvvəlcədən hazırladığı sərrast atıcılara fillərin gözlərini nişan alaraq ox və nizələrlə vurmalarını əmr etmişdi. Gözündən yaralanan və zəncirlərlə bir-birinə bağlı olan fillər aldıqları yaraların verdiyi şiddətli ağrı ilə geri dönüb arxalarındakı iranlı əsgərləri əzərək qaçmışdılar. İslamın ilk dövrlərindəki ən ağır və şiddətli döyüşlərdən biri olan Qadisiyyə döyüşü İslam ordusunun qələbəsi ilə bitmişdi. Bir neçə gün çəkən döyüşdə İslam ordusundan 6000 mücahid şəhid olmuşdu. Sasanilər isə bu müharibədə 10 mindən çox canlı qüvvə itirmişdilər. Bəzi mənbələr iranlıların 40 minə yaxın itgi verdiyini qeyd eidrlər. Öldürülənlər arasında Sasani ordusunun tanınmış sərkərdələri də var idilər. İranlı sərkərdə Rüstəm də döyüşdə öldürülmüşdü. Rüstəmi Hilal ibn Əlfə adlı mücahid öldürmüşdü. Döyüş vaxtı Sasani ordusunun tərkibində vuruşan erməni əsgərlər gözlənilmədən fərariliyə başlamışdılar. Qaçanları təqib edən mücahidlər onlardan xeylisini qılıncdan keçirmişdilər. Erməni əsgərlərin başçıları Muşeq Mamikonyan və Qriqori də Qadisiyyədə öldürülmüşdülər. Alban knyazı Varaz Qriqor da III Yəzdigərdin tələbi ilə İran ordusunda ərəblərə qarşı vuruşmaq üçün İraqa kiçik bir alban hərbi dəstəsi göndərmişdi. Bu dəstənin başçılığına 20-25 yaşında gənc olan ikinci oğlu Cavanşiri təyin etmişdi. Döyüşdə üç dəfə yaralanan Cavanşir Fərat çayını keçib canını qurtula bilmişdi.

Sasani ordusunun Qadisiyyədə qoyub qaçdığı saysız hesabsız və çeşidli qənimətlər mücahidlərin əlinə keçmişdi. Ələ keçən qənimətlər arasında Sasani ordusunun pələng dərisindən olan, qiymətli daşlarla bəzədilib qızıl saplarla tikilmiş “Derəfş-Kaviyan” adlanan iri döyüş bayrağı da var idi. Bayrağı Dirar ibn Xəttab adlı mücahid ələ keçirmişdi. İbn Cərir ət-Təbəri Dirarın payına düşən bu dəyərli qəniməti otuz min dirhəm gümüş pula satdığını, halbuki bayrağın dəyərinin bundan dəfələrlə çox olduğunu qeyd etmişdir. Sə’d ibn Əbu Vəqqasın (r.ə) əmri ilə süvari mücahidlər qaçan Sasani ordusunu təqib etmişdi. Bu süvari dəstələrindən biri Sasanilərin paytaxtı Mədainə qədər gedib çıxmışdı.

*Qinnəsreyn Döyüşü*

Əbu Ubeydə ibn Cərrah (r.ə) Humsun fəthindən sonra (noyabr-dekabr 635) Xalid ibn Vəlidi (r.ə) əmrindəki ordu ilə şimala göndərmişdi. Xalid ibn

Vəlid (r.ə) Humsla Hələb arasındakı Qinnəsreynə yaxın yerdə qarşılaşdığı Bizans ordusu ilə hicri 14-cü ilin zilhiccə ayında (yanvar 636) döyüşə girmişdi. General Mitasın başçılığı altındakı Bizans hərbi qüvvələri Qinnəsreyn şəhəri yaxınlığında mühasirəyə alınaraq məhv edilmişdi. Mitasın ordusunun məğlub edilməsindən sonra Xalid (r.ə) Qinnəsreyn şəhərinə yaxınlaşmışdı. Şəhərdəki Bizans qarnizonu şəhərin xristian ərəb əhalisi ilə birlikdə Xalidin (r.ə) ordusuna bir müddət müqavimət göstərmiş, lakin İslam ordusunun həmlələri qarşısında uzun müddət davam gətirə bilməyərək təslim olmuşdular. Xalid ibn Vəlid (r.ə) xəlifəyə məktub yazaraq Qinnəsreynin fəthi xəbərini ona bildirmiş, qənimətlərin beşdə birini də Mədinəyə göndərmişdi. Qinnəsreynin fəthi barədə ətraflı məlumat alan Ömər ibn Xəttab (r.ə): "*Allah Əbu Bəkrə (r.ə) mərhəmət etsin, o igidləri məndən daha yaxşı tanıyırmış. Mən Xalidlə (r.ə) Müsənnanı (r.ə) onlar haqqında şübhəyə düşdüyüm üçün vəzifələrindən azad etməmişdim. Fəqət müsəlmanlar onları gözlərində o dərəcədə böyütmüşdülər ki, mən insanların zəfərlərin Allahın lütfü ilə deyil, onlar sayəsində qazanıldığını düşünmələrindən ehtiyat etmişdim*" demişdi.

*Qeysəriyyə Döyüşü*

Xalid ibn Vəlid (r.ə) Qinnəsreynin fəthi ilə məşğul ikən Əbu Ubeydə ibn Cərrah (r.ə) xəlifədən aldığı təlimata əsasən Əmr ibn əl-Ası Rəmlə şəhəri və ətraf ərazilərin, Müaviyə ibn Əbu Süfyanı (r.ə) isə Qeysəriyyə şəhərinin fəthi üçün göndərmişdi. Əmr ibn əl-As Rəmlə yaxınlığında qarşılaşdığı Bizans ordusunu məğlubiyyətə uğratmışdı. Müaviyə (r.ə) isə Qeysəriyyə şəhərini mühasirəyə almışdı. Qeysəriyyənin mühasirəsi xeyli davam etmişdi. Lakin Müaviyə (r.ə) ruhdan düşmədən inadla şəhəri mühasirə altında saxlamış, qala divarlarını mancanaq və dəbbabələrlə vurmuşdu. Piyada döyüşçülər də vaxtaşırı qala müdafiəçilərinin üzərinə hücuma keçmişdilər. Nəhayət bu inadlı mühasirə öz nəticəsini vermişdi. Mücahidlər qala divarlarını aşaraq şəhərə girmiş və Qeysəriyyədə gedən küçə döyüşlərində 80 minə yaxın Bizans əsgəri öldürülmüşdü. Çox sayda əsir və qənimət alınmışdı. Müaviyə ibn Əbu Süfyan (r.ə) alınan qənimətlərin və əsirlərin beşdə birini xəlifəyə göndərmişdi. Qeysəriyyə fəth olunduğu vaxt Əlqamə ibn Mücəzziz əl-Mudlici (r.ə) öz ordusu ilə Qəzzəyə daxil olmuş və buradakı Bizans qüvvələrini məğlub edərək Qəzzəni fəth etmişdi.

*Hələb və Antioxiyanın Fəthi*

Hicri 15-ci ilin (636) yayın əvvəllərində Əbu Ubeydə ibn Cərrah (r.ə) Qinnəsreyndən ordusu ilə hərəkətə keçərək Hələbi fəth etmək üçün yola çıxmışdı. Lakin onun şəhəri tərk etməsini fürsət bilən Qinnəsreyn əhalisi əhdnamənin şərtlərini pozaraq qiyam qaldırmışdılar. Buna görə də Əbu Ubeydə (r.ə) Simt əl-Kindinin başçılığı altındakı ordunu Qinnəsreynə göndərmişdi. Simt əl-Kindi öz ordusu ilə ikinci dəfə Qinnəsreynə hücum edərək şəhəri zəbt etmiş və qiyamçıları cəzalandırmışdı. Bu vaxt Hələbə yaxınlaşıb şəhəri mühasirəyə alan Əbu Ubeydə (r.ə) əhalinin şəhəri tərk edərək Antioxiya tərəfə getdiyini öyrənmişdi. Şəhərlərini tərk edən hələblilər Əbu Ubeydəylə (r.ə) əhdnamə bağlayaraq öz şəhərlərinə qayıtmaq istədiklərini bildirmişdilər. Əbu Ubeydə (r.ə) onların təklifini qəbul etmiş, cizyə müqabilində hələblilərlə əhdnamə bağlanmışdı. Lakin Əbu Ubeydə (r.ə) şəhərin yarısında əvvəlki sakinlərin məskunlaşmasına izn vermişdi. Digər yarısına isə müsəlman ailələrin köçürülüb gətirilməsini və burada məskunlaşdırılmasını əmr etmişdi. Hələbin fəthindən sonra Əbu Ubeydə (r.ə) Antioxiyaya tərəf yönəlmişdi. Ömər ibn Xəttab (r.ə) Əbu Ubeydəyə (r.ə) məktub yazaraq Antioxiyanı fəth etməsini, qala divarları ilə əhatə olunmuş qismini boşaldaraq burada müsəlman əsgərləri öz ailələri ilə birlikdə məskunlaşdırmağı, ailələri ilə burada məskunlaşmış və sərhəddi qoruyan mücahidlər üçün maaş miqdarı müəyyən edib ödəməyi əmr etmişdi. Antioxiya Şam diyarının fəthindən sonra öz yurdlarını tərk etmiş insanlarla dolmuşdu. Əbu Ubeydənin (r.ə) əmri ilə hərəkətə keçən İslam ordusu Antioxiya ətrafındakı qəsəbə və kəndləri ələ keçrimişdi. İyaz ibn Qənəmin (r.ə) süvariləri Antioxiyaya hücum edərək şəhəri müdafiə etməyə çalışan Bizans qarnizonunu əzmişdi. O, şəhər əşrafından bəzi adamları və şəhərin baş yepiskopunu da yaxalayaraq Əbu Ubeydənin (r.ə) qərargahına gətirmişdi. Əbu Ubeydə (r.ə) baş yepiskop və yanındakılarla Antioxiyanın fəthinə dair cizyə müqabilində müqavilə bağlamış və onları sərbəst buraxmışdı. Antioxiyada möhkəmlənmiş İslam ordusu ətraf bölglərə hücumlar təşkil etmişdi. Həbib ibn Məsləmənin (r.ə) süvariləri indiki Suriyanın şimalındakı Hədəs qalasını, İyaz ibn Qənəmin (r.ə) süvariləri Mənbic qalasını fəth etmişdilər. Meysərə ibn Məsruq əl-Əbsinin (r.ə) süvariləri isə Aralıq dənizi sahilindəki düzənlik ərazilərdən keçərək Anadolu torpaqlarına girmiş, aldıqları qənimət və əsirlərlə Antioxiyaya geri qayıtmışdılar. Bu İslam ordusunun Kiçik Asiyaya ilk hərbi yürüşü olmuşdu.

*Qüdsün Fəthi*

Şam diyarındakı fəthlər nəticəsində buradakı ən böyük şəhər olan Qüds faktiki mühasirə vəziyyətinə düşmüşdü. Çünki dörd bir tərəfindəki şəhər və qəsəbələr İslam orduları tərəfindən fəth edilmişdi. Qüds həm yəhudilər, həm xristianlar, həm də müsəlmanlar üçün müqəddəs məkan sayılırdı. Bu şəhər uzun illər, əsrlər boyu Bizansın əlində olmuşdu. Qüdsdə şəhərin mühafizəsi ilə məşğul olan böyük bir Bizans qarnizonu var idi. Bununla belə şəhəri Bizanslı hərbi məmurlar deyil xristian din xadimləri idarə edirdilər. Hicri 15-ci ilin məhərrəm ayında (fevral-mart 636) Əbu Ubeydə ibn Cərrah (r.ə) Dəməşdən Qüdsə məktub yazaraq buradakı xristian din xadimlərinə müraciət etmişdi. Əbu Ubeydə (r.ə) onları İslama dəvət etmişdi. Əgər İslamı qəbul etmək istəmirlərsə cizyə ödəməyi qəbul etməliydilər. Əks təqdirdə ordusu ilə Qüdsün ələ keçirilməsi üçün hərəkətə keçəcəyini bildirmişdi. Bu təkliflərin rədd edilməsindən sonra Əbu Ubeydə (r.ə) Dəməşqin mühafizəsini Səid ibn Zeydə (r.ə) tapşıraraq ordusu ilə Qüdsə doğru getmişdi. Şəhərə yaxınlaşan Əbu Ubeydə (r.ə) mancanaq və dəbbabələri yerləşdirmiş, Qüdsü mühasirəyə almışdı. Şəhər əhalisi İslam ordusu ilə vuruşmaq niyyətində deyildi, buna görə də Qüdsdəki xristian din xadimləri münasib şərtlər müəyyənləşdirərək şəhəri Əbu Ubeydəyə (r.ə) təslim etmək qərarına gəlmişdilər. Onlar Əbu Ubeydədən (r.ə) hərbi əməliyyatları dayandırmağı və əhdnamə bağlamaq üçün şərtləri müəyyənləşdirməyi tələb etmişdilər. Əbu Ubeydə (r.ə) bu barədə danışmağa hazır olduğunu bildimişdi. Lakin Qüds baş yepiskopu Sofranos, Əbu Ubeydənin (r.ə) sadəcə sərkərdə olduğunu, onların bu əhdnaməni sadəcə xəlifənin özü ilə bağlayacaqlarını bildirməsindən sonra Əbu Ubeydə ibn Cərrah (r.ə) Mədinəyə məktub göndərərək xəlifəni məsələdən təfərrüatı ilə xəbərdar etmişdi. Ömər ibn Xəttab (r.ə) məsələni şurada müzakirə etdikdən sonra Qüdsə getmək qərarına gəlmişdi. O, Mədinədə öz yerinə Əli ibn Əbu Talibi (r.ə) vəkil qayaraq yola çıxmışdı. Xəlifə yola çıxmamışdan əvvəl məktubla Şam diyarındakı bütün ordu komandanlarını bu səfərdən agah etmiş və onlara öz yerlərində köməkçilərindən birini vəkil qoyaraq Cabiyə adlanan yerdə toplanmalarını əmr etmişdi. Xəlifə yola çıxmamışdan bir qədər əvvəl Abbas ibn Əbdülmüttəlibi (r.ə) öncü qüvvələrə əmir təyin edərək yola çıxarmıdı. Özü isə kiçik bir qrupla yola çıxmışdı. Yanında səhabədən bəzi şəxslər də var idi. Cabiyəyə çatanda əmirlər xəlifəni qarşılamaq üçün yola çıxmışdılar. Orada sadəcə Əmr ibn əl-As və Şurahbil ibn Həsənə (r.ə) yox idilər. Çünki bu iki əmir Qəzzədə Bizans generalı Artabonun ordusu ilə vuruşmaqda idilər. Ömər ibn Xəttab (r.ə) onu qarşılamağa gələn əmirlərin üzərində bahalı və bəzəkli paltarları görəndə qəzəblənmiş, onlara "*kasıblıqdan qurtulduğunuz iki il oldu, silah-*

*larınız, zirehləriniz hanı? Vallahi, iki il deyil iki yüz il də keçsəydi yenə sizin bu geyiminizi xoşlamazdım*” demişdi. Əmirlər bu paltarları sadəcə mərasim üçün geydiklərini, zireh və silahlarının isə paltarlarının altında olduğunu bildirəndən sonra özü bir neçə dirhəmlik paltarda olan Ömər ibn Xəttab (r.ə) onlara heç bir şey deməmişdi.

Cabiyədə Ömər ibn Xəttab (r.ə) Qüds əhalisi üçün əhdnamə yazdırdı. Bu əhdnaməni Müaviyə ibn Əbu Süfyan (r.ə) yazmış, Xalid ibn Vəlid (r.ə), Əbdürrəhman ibn Əvf (r.ə) və Yəzid ibn Əbu Süfyanın (r.ə) adı şahid olaraq əhdnaməyə qeyd edilmişdi. Əhdnamənin mətni aşağıdakı kimi idi:

*Rəhman və rəhim olan Allahın adı ilə*

*“Bu, Allahın qulu və möminlərin əmiri Ömər ibn Xəttab (r.ə) tərəfindən Qüds əhalisinə verilən bəraətdir. Bu bəraətin təmin etdiyi əmin-amanlıq onların canlarına, mallarına, kilsələrinə, ibadət yerlərinə, xəstələrə, sağlamlara, eləcə də onlarla birlikdə olan dindaşlarına və digər həmvətənlərinə şamil edilməklə aşağıdakı şərtləri ehtiva etməkdədir. Kilsələr məskunlaşma və yaşayış yeri olmayacaqdır. Kilsələr və onlara əlavə binalar dağıldılmayacaq, içindəki əşyalar müsadirə olunmayacaqdır. Xristianlar dini məsələrdə sərbəst olub heç bir təzyiqə məruz qalmayacaqlar. Yəhudilərin onlarla birlikdə yaşamalarına izn verilməyəcəkdir. Qüds əhalisi digər şəhərlərin əhalisi kimi cizyə ödəyəcək. Qüds əhalisi şəhərdəki Bizans əsgərlərini və məmurlarını oradan çıxaracaq və Bizans üsuli-idarəsindən imtina edəcəklər. Bizanslılardan Qüdsdə qalmaq istəyənlər şəhər əhalisi kimi cizyə ödəyərək yaşaya biləcəklər. Getmək istəyənlərin canlarına və əmlaklarına toxunulmaqacaqdır. Şəhəri tərk edən bizanslılarla birlikdə getmək istəyən qüdslülərə izn veriləcək, onların canlarına və mallarına toxunulmayacaq, İslam hakimiyyətinin bərqərar olduğu ərazini tərk edənə qədər himayə olunacaqlar. Cizyə ödəməyə davam etdikləri müddətcə müəyyən edilmiş şərtlərə əməl olunacağına Allah və müsəlmanlar zəmanətçidirlər”.*

Ömər ibn Xəttab (r.ə) Peyğəmbərin (s.ə.v) möhrü ilə təsdiq etdiyi əhdnamə ilə birlikdə Qüdsə gəldi. O, əhdnamənin bir nüsxəsini baş yepiskop Sofranosa vermişdi. Üç gün ərzində bizanslıları şəhərdən çıxaran qüdslülər şəhəri Ömər ibn Xəttaba (r.ə) təslim etmişdilər. Şəhərə daxil olan xəlifə ilk əvvəl əl-Əqsanı ziyarət etmişdi. Davud peyğəmbərin (ə.s) mehrabına gəlib çatanda Ömər (r.ə) Davud peyğəmbərin (ə.s) əhvalatının anlatıldığı Qur’anın Sə’d surəsini oxumağa başlamış, 24-cü ayənin sonuna çatanda mehrabın önündə tilavət səcdəsi etmişdi. Ömər ibn Xəttab (r.ə) yepiskop Sofranosun müşayəti ilə Qüdsün ən böyük kilsəsi olan Qiyamə kilsəsinə daxil oluşdu. Zöhr namazının vaxtı çatanda

o, yepiskopdan harada ibadət edə biləcəyini soruşmuş, yepiskop kilsənin içində namaz qıla biləcəyini söyləmişdi. Lakin xəlifə "*məndən sonra gələnlər kilsədə namaz qılmağı adət halına gətirərlər*" deyərək kilsədən çıxmış və bir qədər aralıdakı boş ərazidə müsəlmanlarla birlikdə namaz qılmışdı. Həmin yerdə daha sonra xəlifənin adı ilə tanınan Məscidi-Ömər inşa edilmişdi. Qüds möminlərin əmiri Ömər ibn Xəttab (r.ə) tərəfindən hicri 15-ci il rəbiyələvvəl ayında (aprel-may 636) fəth edilmişdi. Bu tarix bəzi mənbələrdə fərqli qeyd olunmaqdadır. Mənbələdə Ömər ibn Xəttabın (r.ə) ikinci dəfə də Qüdsə səfər etdiyi barədə məlumatlar mövcuddur.

*Mədainin Fəthi*

Sə'd ibn Əbu Vəqqas (r.ə) Qadisiyyə zəfərindən bir müddət sonra Sasani imperiyasının paytaxtı olan Mədaini fəth etmək məqsədiylə tədbirlər görmüşdü. O, əmri altındakı İraq cəbhəsi ordularını yenidən səfərbər edərək Dəclə çayının sol sahili boyunca şimala doğru hərəkət edərək Mədain şəhərinə yaxınlaşmışdı. Mədain şəhərinin əsas hissəsi Dəclə çayının sağ sahilində yerləşirdi. Sasani şahlarının Bəyaz Sarayı da şəhərin bu qismində idi. Sol sahildə isə şəhərin möhkəm qala divarları ilə əhatə olunmuş Bəhurəsir adlanan hissəsi mövcud idi. Sə'd ibn Əbu Vəqqas (r.ə) ordusunun bütün hərbi təchizatından, 20-dən çox mancanaq və xeyli dəbbabədən Bəhurəsirin möhkəm qala divarlarının mühasirəsi üçün istifadə etmişdi. İki ay davam edən mühasirə qanlı döyüşlərlə müşayət olunmuşdu. Sasani əsgərləri vaxtaşırı qaladan çıxıb şəhəri mühasirəyə almış İslam ordusuna hücum edirdilər. Bu hücumların hamısında Sasani ordusu məğlub edilərək geri oturdulmuşdu. Uzun çəkən mühasirə nəticəsində Bəhurəsirdə aclıq başlamışdı. İnsanlar hətta şəhərdəki itləri və pişikləri belə yeməyə başlamışdılar. Şah Dəclə çayının sağ sahilindəki İraq torpaqların müsəlmanlarda qalması müqabilində hərbi əməliyyatların dayadırılıb sülh sazişi bağlamağı təklif etmişdi. Lakin Sə'd ibn Vəqqas (r.ə) əmirləri ilə məşvərət etdikdən sonra bu təklifi rədd etmişdi. Belə ki, casuslar qala müdafiəçilərinin əzminin artıq qırıldığı barədə xəbərlər gətirməkdə idilər. Şahın bu cür təklifinin özü də Sasani ordusunun paytaxtı uzun müddət müdafiə edə bilməyəcək vəziyyətdə olduğundan xəbər verirdi. Buna görə də Sə'd (r.ə) hücumları fasilə vermədən davam etdirmişdi. İki aylıq mühasirədən və şiddətli döyüşlərdən sonra İslam ordusu hicri 16-cı ilin səfər ayında (mart 637) Bəhurəsir qalasını fəth etmişdi. İndi növbəti hədəf çayın sağ sahili, şahın əfsanəvi sarayının olduğu Mədain şəhərinin əsas hissəsi idi. Sə'd ibn Əbu Vəqqas (r.ə) ordusunu kiçik gəmilərlə qarşı sahilə keçirmək təklifini qəbul etməmişdi. Çünki düşmən bəndlər vasitəsi ilə axına

yön verib gəmilərin istiqamətini dəyişdirə və ya onları batıra bilərdi. Bu isə həm hədəfdən yayınmağa, həm də çoxsaylı tələfata gətirib çıxara bilərdi. Ona görə də qərara gəlindi ki, əvvəlcə bir neçə yüz nəfərlik cəsur, könüllü döyüşçü üzərək Dəclənin sağ sahilinə çıxsın. Onların təmin edəcəkləri çıxarma yerinə isə ordunun digər, əsas qismi çıxarılsın. Asim ibn Əmr (r.ə) topladığı 600 nəfər könüllü ilə özünü Dəclənin azğın sularına vurmuş və üzərək sağ sahilə çıxa bilmişdi. O, burada onlara hücum edən Sasani hərbi dəstələrini geri oturtmuşdu. Asim ibn Əmrin (r.ə) əsas çıxarma üçün hazırladığı yerə İslam ordusu çıxmalı idi. Sə’d ibn Əbu Vəqqas (r.ə) Salman Farsi (r.ə) ilə birlikdə ordunun önündə Dəcləyə girdi və qarşı tərəfə üzməyə başladılar. Onların ardınca 12 min nəfərlik süvari və piyada mücahid Dəclə çayını üzərək qarşı tərəfə keçməyə başlamışdılar. Beləcə İslam ordusu Mədanin yaxınlığında Dəclənin sağ sahilinə keçə bilmişdi. Bu keçiş vaxtı sadəcə bir mücahid Dəclə çayında boğularaq şəhid olmuşdu. Bəhurəsirin fəthindən sonra şah III Yəzdigərd öz yaxın adamları ilə Mədaini tərk edərək şərqə doğru üz tutmuşdu. Eləcə də müsəlmanların tezliklə Mədainə hücum edəcəklərini bilən şəhər zadəganları da şahın ardınca dövrün ən ehtişamlı şəhərlərində biri olan Mədaini tərk etmişdilər. Onlar gedərkən özləri ilə apara bildikləri qədər qiymətli əşyalarını aparmışdılar. Dəclə çayını keçib Sasanilərin paytaxtı Mədain şəhərini mühasirəyə alan Sə’d ibn Əbu Vəqqasın (r.ə) ordusu müqavimətlə rastlaşmamışdılar. Belə ki, şəhərdə kiçik bir hərbi dəstədən başqa heç kim qalmamışdı. Mücahidlər hicri 16-cı ilin səfər ayında (mart 637) şəhəri demək olar ki, müqavimətə rast gəlmədən almışdılar. Sasani şahının Bəyaz Sarayına gələn Sə’d ibn Əbu Vəqqas (r.ə) Qur’ani-Kərimin Duxan surəsi 25-28-ci ayələrini oxuyaraq saraya daxil olmuşdu:

كَمْ تَرَكُوا مِن جَنَّاتٍ وَعُيُونٍ. وَزُرُوعٍ وَمَقَامٍ كَرِيمٍ . وَنَعْمَةٍ كَانُوا فِيهَا فَاكِهِينَ . كَذَلِكَ وَأَوْرَثْنَاهَا قَوْمًا آخَرِين

“*Onlar neçə-neçə bağlar, çeşmələr qoyub getdilər. Neçə-neçə əkinlər, gözəl yerlər. Və zövq aldıqları neçə-neçə nemətləri tərk etdilər. Bu belədir və onlara başqa bir milləti varis etdik*”.

Şəhər bütün ehtişamı ilə mücahidlərin ixtiyarına keçmişdi. Mədaini fəth edən mücahidlər bol qənimət ələ keçirmişdilər. Sadəcə Sasani şahlarının sarayındakı xəzinədən mücahidlərin əlinə 1,5 trilyon dirhəm[69] keçmişdi. Mədainin fəthində iştirak etmiş mücahidlərin hər birinə qənimət payı olaraq 12 min dinar[70] düşmüşdü. Şah III Yəzdigərdin (632-651) qiymətli daşlarla bəzədilmiş taxtı və tacı da müsəlmanların əlinə keçmişdi. Xəlifə Ömər ibn Xəttab (r.ə) şahın

[69] 1 dirhəm=2,975 gr gümüş pul.
[70] 1 dinar=4,25 gr qızıl pul.

qızıl və gümüş iplərlə tikilmiş, qiymətli daşlarla bəzədilmiş mərasim geyimini Mədinədə bir qorxuluğa geydirərək xalqa nümayiş etdirmişdi. Sarayda qənimət kimi müsəlmanların əlinə keçən digər bir qiymətli əşya isə Sasani şahlarının "Bahar"[71] adlandırdıqları təqribən 136,6 $m^2$-lik nəhəng xalça idi. Bu xalça qızıl və ipək saplardan toxunmuşdu. Xalçada Sasani şahlarının təsvirləri, Sasani imperiyasının xəritəsi, ölkədəki dağlar, çaylar, ağaclar və.s təsvirlər həkk olunmuşdu. Üzərindəki güllər qızıl və gümüşdən, ağacların meyvələri mirvari, yaqut kimi qiymətli daşlardan idi. Sasani şahları taxta bu xalçanın üzərində otururdular. "Bahar" Mədinəyə, xəlifə Ömər ibn Xəttaba (r.ə) göndərilmişdi. Xəlifə ərəblər üçün heç bir estetik və incəsənət dəyəri olmayan bu xalçanı, Əli ibn Əbu Talibin (r.ə) məsləhəti ilə, döyüş qəniməti kimi bir neçə şəxsin arasında böldürmüşdü. Hissələrdən biri Əli ibn Əbu Talibin (r.ə) payına düşmüş, o, da bu hissəni 20 min dinara satmışdı. Maddi sərvətlərin sel kimi xilafət mərkəzinə axması qısa müddətdə rifah partlamasına səbəb olmuşdu.

*Kufə və Bəsrə Şəhərlərinin Salınması*

Sə'd ibn Əbu Vəqqasın (r.ə) başçılığı altındakı İslam ordusunun Qədisiyyə zəfərindən və Mədainin fəthindən sonra müsəlman ərəblər axın-axın köçüb gələrək Mədaində məskunlaşmışdılar. Amma bir müddət sonra onlar şəhərin havasından və suyundan şikayət etməyə başladılar. Çölün, səhranın iqlim şərtlərinə vərdiş olan ərəblər o dövrün ən müasir və dəbdəbəli şəhərində yaşaya bilməmişdilər. Bunun həqiqətən belə olduğunu, aşağıda nəql edəcəyimiz, Ömər ibn Xəttabın (r.ə) sözləri də təsdiq edir. Sə'd ibn Əbu Vəqqas (r.ə) ərəblərin Mədain haqqındakı fikirlərini məktubla xəlifəyə bildirmişdi. Ömər ibn Xəttab (r.ə) cavab məktubunda Sə'də (r.ə) öz əsgərlərini və onların ailələrini qərbə tərəf aparmasını əmr etmişdi. Bundan sonra Sə'd (r.ə) öz adamları ilə birlikdə Kuvayfə adlanan yerə gəlmişdi. Amma müsəlmanlar Kuvayfənin rütubətli və həşəratların bol olduğundan şikayətlənərək Sə'ddən (r.ə) xəlifəyə yenidən bu haqda məktub yazmasını istəmişdilər. Sə'd (r.ə) məktub yazaraq xəlifəyə insanların şikayətlərini ərz etmişdi. Xəlifə Ömər ibn Xəttab (r.ə) Sə'də (r.ə) məktubunda belə yazmışdı: "*Ərəb qövmü dəvə kimidir. Ərəblərə ancaq dəvəyə yarayan yerlər yarayar. Sən onlar üçün şoranlıq və acı otların bitdiyi bir yer tap, amma elə et ki, sizinlə bizim (xilafətin paytaxtı Mədinə) aramızda böyük çay və ya dəniz olmasın*". Ömər ibn Xəttab (r.ə) yeni qurulacaq şəhərin yerini müəyyənləşdirmək üçün Əbü'l-Həyyac Əmr ibn Malik əl-Əsədini (r.ə) İraqa

71 [القطيف...- وهو بهار كسرى]

göndərmişdi. Əbü'l-Həyyac (r.ə) orada ikən iraqlı xristian ərəb Əbdulməsih ibn Bukayə adlı bir şəxs Sə'd ibn Əbu Vəqqasın (r.ə) yanına gələrək ona kömək etmək istədiyini bildirmiş və indiki Kufə şəhərinin yerini ona göstərmişdi. O vaxt bu yer Savristan adlanırdı. Bu yer Sə'din (r.ə) xoşuna gəlmiş və yanındakı ərəbləri burada məskunlaşdırmışdı. Sə'd ibn Əbu Vəqqas (r.ə) əvvəlcə ərazidəki ən hündür yerdə məscid və hökumət binası tikdirmişdi. Bu məscid daha sonra iki dəfə, Muğirə ibn Şu'bə (r.ə) və Ziyad ibn Hənzələnin (r.ə) Kufə canişini olduqları dövrlərdə, yenidən inşa edilmişdi. Məskunlaşma məsələsinə gəldikdə isə şəhərin şərqində yəmənlilərdən 12 min, qərbində isə 8 min nəfər məskunlaşmışdı. Döyüş qabiliyyəti olan kişi əhali qəbilə-qəbilə siyahıya alınmışdı.

Ömər ibn Xəttab (r.ə) Əmmar ibn Yasiri (r.ə) Kufə valiliyinə təyin etmişdi. Əmmar (r.ə) Kufənin ilk valisi idi. Xəlifə bu barədə kufəlilərə aşağıdakı məzmunda məktub yazmışdı:

*"Sizə Əmmar ibn Yasiri (r.ə) əmir, Abdullah ibn Məs'udu (r.ə) müəllim olaraq təyin edirəm. Onların hər ikisi Bədr əshabındandır. Onları dinləyin və itaət edin. Abdullah ibn Məs'ud mənimçün çox qiymətli bir insandır. O, mənə burada lazım idi. Lakin mən sizi özümə tərcih etdim və onu sizin yanınıza göndərdim. Osman ibn Huneyfi (r.ə) də (onlara köməkçi olaraq) İraqa göndərirəm".*

Abdullah ibn Məs'ud (r.ə) Kufədə həm dini işlərlə, Qur'an və sünnənin təlimilə, həm də amil olaraq maliyyə işlərilə məşğul olurdu. Əmmar ibn Yasir (r.ə) bir il 9 ay Kufə valisi olmuşdu. Kufəlilər Əmmarın (r.ə) siyasi və idari işlərdə yetərsiz olduğunu, bu işi apara biləcək qüdrətə sahib olmadığını bildirərək dəfələrlə xəlifədən Kufə valisini dəyişməsini istəmişdilər. Nəhayət Ömər ibn Xəttab (r.ə) Kufədən bu barədə gələn tələblərin ardı-arası kəsilmədiyini görərək Əmmar ibn Yasiri (r.ə) Kufə valiliyindən azad etmək qərarına gəlmişdi. Vəzifədən azad etməmişdən əvvəl xəlifə Əmmarı (r.ə) Mədinəyə çağıraraq məsələdən tam agah olmaq üçün onunla söhbət etmişdi. Bundan xəbər tutan bir dəstə kufəli də Əmmarın (r.ə) ardınca Mədinəyə gələrək xəlifə ilə görüşmüş və Əmmar ibn Yasirin (r.ə) tədbirsiz, idarəçilikdən və siyasətdən anlayışı olmayan bir insan olduğunu bildirmişdilər. Şikayətlərin kəsilmədiyini görən Ömər ibn Xəttab (r.ə) Əmmar ibn Yasiri (r.ə) Kufə valiliyindən azad etsə də onun könlünü almaq istəmiş, bu qərarından ötürü inciyib incimədiyini soruşmuşdu. Əmmar ibn Yasir (r.ə) "*bu vəzifəyə təyin olunarkən sevinməmişdim, amma (şikayətlər ucbatından) azad olunmağım mənə toxundu*" deyə cavab vermişdi. Kufəlilərin Əmmar ibn Yasirdən (r.ə) narazı olmalarına səbəb fəth olunmuş ərazilərdən əldə olunan gəlirlərin bölüşdürülməsi səbəbilə idi. Bəsrəlilər öz valilərinə müraciət

edib xəlifəyə məktub yazdıraraq onlara fə'ydən ayrılan gəlirlərin kifayət etmədiyini, kufəlilərə məxsus bəzi fə'y ərazilərinin alınaraq onlara verilməsini istəmişdilər. Bu xəbər kufəlilərə çatanda onlar da Əmmardan (r.ə) xəlifəyə eyni məzmunda məktub yazmasını tələb etmişdilər. Lakin Əmmar (r.ə) onların bu istəklərinə müsbət cavab verməmişdi. Bu səbəbdən də bəzi kufəlilər Əmmar ibn Yasirdən (r.ə) narazı qalaraq şikayətlənmiş, hətta Utarid adlı bir kufəli Əmmara (r.ə) "*burnu kəsik ac kölə*" deyərək təhqir etməkdən belə çəkinməmişdi. Əmmar ibn Yasirdən (r.ə) sonla xəlifə Kufə valiliyini kufəlilərin öz istəyi ilə bu vaxt həm də Bəsrə valisi olan Əbu Musa əl-Əş'əriyə həvalə etmişdi. Lakin bir il keçmədən kufəlilər Əbu Musadan (r.ə) şikayətlənməyə başlamışdılar. Ömər ibn Xəttab (r.ə) bu dəfə Kufə valiliyinə Muğirə ibn Şu'bəni (r.ə) təyin etmişdi. Xəlifə fə'y ərazilərindən əldə edilən gəlirlərin kufəlilərə məxsus hissəsinin bir qisminin alınıb bəsrəlilərə verilməsi istəyini qəbul etməmişdi. Lakin bəsrəlilərin də məişət sıxıntısı səbəbiylə meydana gəlmiş bu istəklərinə cavab olaraq onların hər birinə bir dəfə ödənmək şərtilə beytülmaldan 100 dinar ayırmışdı.

Şəhərin əsası qoyulandan sonra Bəsrə valiliyinə Əbu Musa əl-Əş'əri (r.ə) təyin edilmişdi. Əbu Musa əl-Əş'əri (r.ə) Bəsrə valisi olduğu dövrdə İran, cənubi Qafqaz və Xorasanın fəthi üçün mühüm işlər görmüşdü. Bəsrənin kənar məhəllələrində məşkunlaşmış "əsavira" adlanan camaat mənşə etibarı ilə sindli idilər. Sasani ordusunda əslən Sind (indiki Pakistanda) vilayətindən olan çox sayıda muzdlu əsgər döyüşməkdə idi. Ömər ibn Xəttabın (r.ə) xilafəti dövründə baş vermiş döyüşlərdə "səyabicə" adlanan bu muzdlu əskərlərin böyük əksəriyyəti əsir alınmış və Bəni-Təmim qəbiləsinin ərazisində məskunlaşdırılmışdılar. Bunların tamamına yaxını qısa müddət sonra İslamı qəbul etmişdi. Əbu Musa əl-Əş'əri (r.ə) İraq valiliyinə təyin ediləndən sonra səyabicə adlanan bu müsəlman sindliləri İslam ordusunda yardımçı qüvvə kimi istifadə etmiş və Bəsrənin kənar məhəllərində onları kompakt şəkildə məskunlaşdırmışdı.

*Cəlula Döyüşü*

Paytaxt Mədaini tərk edən III Yəzdigərd öz yaxın adamları ilə birlikdə şərqə tərəf getmişdi. Cəlula adlanan yerdə toplanmasını əmr etdiyi Sasani ordusuna komandan olaraq Mehran Razi adlı sərkərdəni təyin edən şahın özü Hulvan şəhərinə getmişdi. Cəluladakı Sasani ordusu imperiyanın müxtəlif yerlərindən gəlmiş hərbi birləşmələrdən ibarət idi. Orada Arran, Azərbaycan və cənubi Qafqazın digər bölgələrindən cəlb edilmiş əsgərlər də var idi. Azərbaycan və Arranlı əsgərlərin başçıları Cəlulada qalmayaraq öz ölkələrinə qayıtmaq və orada müdafiə olunmaq niyyətini açıqlamışdılar. Lakin Mehran Razi bununla razı-

laşmayıb “*əgər indi burada ayrılsaq bir daha əsla birlikdə ola bilməyəcəyik”* deyərək onları birlikdə müdafiə olunmağın daha məqsədəuyğun olduğuna inandırmışdı. Sasani əsgərləri Cəluladakı ordugahlarının ətrafına dərin və enli bir xəndək qazımış, özləri üçün hazırladıqları çıxış və girişlərə isə tikanlı dəmir tellər döşəmişdilər. Lazım gələndə bu tikanlı dəmir telləri kənara çəkib müdafiə xəttinin bayır tərəfinə çıxa bilirdilər. Onlar bu tikanlı dəmir telləri İslam ordusundakı süvarilərin xəndəyin içəri tərəfinə keçməsinin qarşısını almaq üçün döşəmişdilər. Sə’d ibn Əbu Vəqqas (r.ə) Mədaində ikən kəşfiyyatçılar vasitəsilə Sasani ordusunun Cəlulada toplanması və müdafiə tədbirləri haqqında ətraflı məlumat almışdı. O, bu məlumatları məktubla xəlifəyə çatdırmış və onun təlimatını gözləmişdi. Ömər ibn Xəttab (r.ə) ona Qə’qa ibn Əmri (r.ə) öncü qüvvələrlə Cəlulaya göndərməsini, onun arxasında Haşim ibn Utbəni (r.ə) 12 minlik orduya əmir təyin edərək düşmənin üzərinə göndərməsini əmr etmişdi. Xəlifə Sə’də (r.ə) Cəlulada qələbə qazanacaqları təqdirdə İraqın şimalındakı dağlıq ərazi ilə Səvad adlanan cənubdakı düzənlik ərazi arasında müdafiə xətti qurmağı və Qə’qa ibn Əmri (r.ə) bu xətti müdafiə edən əsgərlər komandan təyin etməyi tapşırmışdı. Sə’d ibn Əbu Vəqqas (r.ə) xəlifənin əmrini dərhal yerinə yetirərək 12 min nəfərlik ordunu Mədaindən Cəlulaya tərəf göndərmişdi. Haşim ibn Utbə (r.ə) ordusu ilə Cəluladakı Sasani ordugahına çatıb ordusunu xəndəyin ətrafında yerləşdirdi və onları mühasirəyə aldı. Bu mühasirə 80 gün davam etmişdi. Sasani əsgərləri bu 80 günlük mühasirə vaxtı hər gün xəndəyin digər tərəfinə keçərək İslam ordusu ilə döyüşə girişmişdi. Lakin döyüşlərin hamısı müsəlmanların qələməsi ilə bitmiş, mühasirəni yarmaq mümkün olmamışdı. Sasani ordusu Cəluladakı döyüşlər zamanı çox sayda itgi vermişdi. Nisbi sakitlik olan zamanlarda isə hər iki tərəfin döyüşçüləri xəndəyin qarşı tərəfinə ox yağdırmışılar. Bu vaxt da tərəflər xeyli itgi vermişdi. Hər iki tərəf əlavə yardımçı qüvvələrlə öz səflərini möhkəmləndirməyə çalışmışdı. 80 günlük mühasirənin sonunda Sasani ordusu bütün döyüş xətti boyu piyada və süvari qüvvələrlə hücuma keçmişdi. Hücumun başlamasından bir neçə saat sonra qalxan qum fırtınası havada toz buludu yaratmışdı. Belə ki, göz-gözü görməyəcək dərəcədə hər tərəfi toz dumanı bürümüşdü. Sasani hərbi birləşmələri arasındakı əlaqə pozulduğu üçün hücumun mütəşəkkilliyini qoruyub saxlamaq mümkün olmamışdı. Ərəblər isə əksinə bu cür hava şəraitinə vərdiş olduqları üçün hücumun qarşısını alıb əks hücuma keçmişdilər. Geri çəkilərkən böyük əksəriyyəti özlərinin döşədikləri tikanlı dəmir tellərə ilişərək yaralanan Sasani süvariləri Qə’qa ibn Əmrin (r.ə) süvarilərinin ağır zərbələrinə məruz qalmışdılar. Buna görə də iranlılar məcburiyyət qarşısında xəndəyin bir

neçə yerini torpaqla doldurmalı olmuşdular. Həmin bu yerlərdən xəndəyin içəri tərəfində keçən mücahidlərlə Sasani ordusu arasında şiddətli döyüş baş vermişdi. Hicri 16-cı ilin zilqədə ayında (dekabr 637) baş verən son döyüş həlledici olmuş və Sasani ordusu Cəlulada xəndəklə əhatə olunmuş ordugahda 100 minə yaxın tələfat verərək ağır məğlubiyyətə uğramışdı. Cəluladakı ordusunun məğlubiyyət xəbərini alan III Yəzdigərd (632-651) Hulvanı tərk edərək Rey şəhərinə getmişdi.

*Hulvan, Tikrit və Mosulun Fəthi*

Cəlulada Sasani ordusunun ağır məğlubiyyətə uğramasından sonra Qə’qa ibn Əmr (r.ə) öz qüvvələri ilə Hulvana hücum etmişdi. Şah Hulvanı tərk edərkən şəhərin idarəsini və müdafiəsini Xosrov Şünum adlı sərkərdəyə həvalə etmişdi. Lakin Xosrov Şünum əmri altındakı ordunun Qə’qanın (r.ə) süvariləri qarşısında duruş gətirə bilmədiyi görüb Hulvanı tərk edərək Həmədana qaçmışdı. Beləcə Hulvan müsəlmanların əlinə keçmişdi. Bir qədər sonra Sə’d ibn Əbu Vəqqas (r.ə) da ordunun əsas hissəsi ilə Hulvana gəlmişdi. O, Ömər ibn Xəttaba (r.ə) məktub yazaraq Cəlulada qazandıqları qələbəni xəbər vermiş və əmirlərin Sasani ordularını təqib etmək istədiklərini bildirmişdi. Lakin xəlifə İranın mərkəzi əyalətlərinə girməyin İslam ordusunu təhlükə altında qoya biləcəyi düşüncəsiylə bu fikri qəbul etməmiş və əvvəlki əmrini təkrarlamışdı. Qə’qa ibn Əmr (r.ə) Səvadla İraqın şimalındakı dağlıq bölgə arasındakı xətti müdafiə edəcəkdi. Bununla belə Qə’qa ibn Əmr (r.ə) Cəlulada sağ qurtulmuş Sasani əsgərlərini bir qədər təqib edərək onları haqlamış və bu döyüşdə Mehran Razi öldürülmüşdü. Xəlifənin məktubunu alandan sonra Qə’qa (r.ə) Hulvanın idarəsini Xorasanlı müsəlman olan Qubada tapşırıb özü ordusu ilə əmr edilən yerə getmişdi.

Cəlulada və Hulvanda İslam ordusunun əlinə xeyli qənimət və əsir keçmişdi. Qənimətlərin arasında qızıl və gümüş olaraq nəğd pulla yanaşı, qiymətli əşyalar, silah-sursat, hərbi ləvazımat, yük və minik heyvanları və ərzaq malları var idi. Sə’d ibn Əbu Vəqqas (r.ə) qənimətin beşdə birini Mədinəyə göndərəndən sonra geri qalanını mücahidlər arasında bölmüş və hər mücahidin payına 9 min dirhəm və 9 minik heyvanı düşmüşdü. Qənimət mallarının hesablanması və bölünməsi işi Salman ibn Rəbiə əl-Bahiliyə (r.ə) tapşırılmıdı.

Mədain, Cəlula və Hulvanın qənimət mallarını Mədinəyə Ziyad ibn Əbih (r.ə) gətirmişdi. Ömər ibn Xəttab (r.ə) ondan məsciddə insanlara xitab edərək İraq cəbhəsində baş verənləri danışmasını istəmişdi. Ziyad ibn Əbih (r.ə) döyüşləri təfərrüatı ilə nəql etmiş və insanlar baş verənlərdən agah olmuşdular. Qənimət malları həmin gecə Məscidu’n-Nəbəvidə saxlanılmış, Əbdürəhman

ibn Əvf (r.ə) və Abdullah ibn Ərqam (r.ə) həmin gecə məsciddə qalaraq keşik çəkmişdilər. Sübh namazından sonra xəlifə qənimət mallarının üzərindəki örtükləri açdırmışdı. Ömər ibn Xəttab (r.ə) oradakı qızıl, gümüş, yaqut, zümrüd kimi mücəvhəratı görəndə ağlamışdı. Əbdürrəhman ibn Əvf (r.ə) ona "*Səni ağladan nədir ey möminlərin əmiri? Vallahi ağlamaq yox Allaha şükr etmək lazımdır*" deyəndə Ömər ibn Xəttab (r.ə) sanki sonralar baş verəcək fitnələri görürmüş kimi belə cavab vermişdi: "*Allaha and olsun ki, ağlamağım şükr etməyimə mane deyil. Lakin Allahın bunları verdiyi insanlar daim bir-birlərinə həsəd ediblər, sonra bu həsəd kinə çevrilib. Kin bəsləyənləri isə Allah gec-tez bir-birinin canına müsəllət edir*".

İraqın əkinə yararlı ən münbit ərazisi olan Səvad bölgəsi də müsəlmanların əlinə keçmişdi. Bu yerlərdəki iranlı dehqanların, iri torpaq sahiblərinin bir çoxu könüllü olaraq cizyə müqabilində müsəlmanlarla əhdnamə bağlamışdılar. Səvaddakı münbit ərazilərin mühüm bir qismi də Sasani dövlətinin divan torpaqları, yəni şah və onun ailə üzvlərinə məxsus ərazilər idi. Xəlifəyə Səvad torpaqlarının da qənimət olaraqa mücahidlər arasında bölünməsi ilə bağlı tələblər çatdırılmaqda idi. Lakin xəlifə bu mövzudakı tələb və təklifləri qəbul etməyərək Səvad torpaqlarının satılması və ya hər hansı bir formada mənimsənməsini qadağan etmişdi. O, Həşr surəsinin 6-7-ci ayələrinə istinad edərək Allah Rəsulu (s.ə.v) və Əbu Bəkrin (r.ə) Fədək və Teymə əraziləri üçün tətbiq etdiyi hökmü Səvad ərazisinə də şamil edib bu yerlərin fə'y hökmündə olduğunu bəyan etmişdi. Fə'y qeyri-mənqul, yəni daşınmaz əmlak qəbilindən olan qənimətlərə deyilirdi. Torpaq, mülk, ev, imarət və.s bu kimi şeylər fə'y sayılırdı. Fə'y isə mücahidlər arasında bölünmür, ondan əldə olunan gəlirlər birbaşa dövlət xəzinəsinə, beytülmala keçirilirdi. Buradan isə ehtiyacı olanlara aylıq maaş şəklində ödənirdi. Bunun əsas məqsədi inhisarçılığın və möhtəkirliyin qarşısını almaq idi. Ömər ibn Xəttab (r.ə) bunu döyüşçülərin fəth edilmiş ərazilərdə iri torpaq sahibinə çevrilib feodallaşmasının qarşısını almaq məqsədilə etmişdi. Bundan başqa, mücahidlər sahib olduqları torpaqların işlədilməsi ilə məşğul olub cihada laqeyd yanaşa bilərdilər. Güman ki, Ömər ibn Xəttab (r.ə) aşağıda nəql etdiyimiz hədisi Allah Rəsulundan (s.ə.v) eşitdiyi üçün Səvaddakı torpaqların müsəlmanlar arasında qənimət olaraq bölünməsinə izn verməmiş, bu torpaqları əvvəlki sahiblərinin məcusi və xristianların mülkiyətində qalmasına hökm etmişdir. Xəlifənin oğlu Abdullah ibn Ömər (r.ə) Allah Rəsulu Muhəmmədin (s.ə.v) belə buyurduğunu nəql etməkdədir:

**عن ابن عمر قال عت رسول ا صلى ا عليه وسلم يقول إذا تبايعتم بالعينة وأخذ أذناب البقر ورضيتم بالزرع**
**وتركتم ا هاد سلط ا عليكم ذلا لا ي عه ح ترجعوا إ دينكم**

"*Sizlər iyanə*[72] *üsulu ilə təcarətə başladığınız, inək-buzov ardınca düşdüyünüz (maldarlıqla məşğul olduğunuz), ziraətlə (torpaq əkib biçməklə) kifayətləndiyiniz və cihadı tərk etdiyiniz vaxt Allah sizə zilləti müsəllət edər. Siz bu zillətdən dininizə dönüb cihad edənə qədər qurtula bilməzsiniz*"[73].

Həmçinin torpaqların əvvəlki sahiblərinin əlindən alınması əkinə yararlı torpaqların əkilməməsinə, beləcə iqtisadiyyatın zəifləməsinə yol aça bilərdi. Buna görə də xəlifə Ömər (r.ə) daşınmaz qənimətləri dövlət xəzinəsinə aid etmiş, torpaqlar əvvəlki sahiblərinə verilmiş, məhsuldan alınan vergi isə xəzinəyə keçirilərək buradan daha çox ehtiyacı olan və qənimət əldə edə bilməyən insanlara maaş şəklində ödənmişdi.

Sə'd ibn Əbu Vəqqas (r.ə) Tikrit şəhərində İraqdakı bəzi xristian ərəb qəbilələrin silahlanaraq toplandıqları və Şam diyarındakı Bizans hərbi birləşmələrindən də onlara yardım gəldiyi barədə aldığı xəbərləri xəlifəyə çatdırmışdı. Ömər ibn Xəttab (r.ə) Sə'də (r.ə) Abdullah ibn Mu'təmi əmrindəki orduları oraya göndərməyi, Rəbi' əl-Əfkəlini öncü birliklərə, Əfrəcə ibn Hərsəməni isə süvari qüvvələrin başına təyin etməsini əmr etmişdi. Abdullah ibn Mu'təm ordusu ilə Tikritə gələndə buradakı silahlıların şəhərin qala divarlarının arxasına sığınıb müdafiə olunmaq əzmində olduqlarını görmüş və onları mühasirəyə almışdı. Qırx gün davam edən döyüş nəticəsində Tikrit şəhəri hicri 17-ci ilin cəmadiyələvvəl ayında (may-iyun 638) fəth edilmişdi. Qaladan çıxıb Dəclə çayına tərəf qaçan düşmən burada sıxışdırılmış və aman diləyərək təslim olmuşdu. Təslim olan xristian ərəblərlə Abdullah ibn Mu'təm arasında sülh bağlanmışdı. Qısa müddət sonra Tikrit və ətrafında yaşayan Təğlib, İyad və Nəmir adlı xristian ərəb qəbilələrin bir sıra oymaqları İslamı qəbul etmişdilər.

Tikritin fəthindən bir müddət sonra Rəbi' əl-Əfkəli əmri altındakı ordu ilə şimal istiqamətində gedərək Mosul şəhərinə yaxınlaşmışdı. Onun ordusunda İslamı yeni qəbul etmiş iraqlı ərəb qəbilələrindən olan əsgərlər də var idi. Rəbi'nin ordusu Mosul müdafiəçilərinə qarşı uğurlu əməliyyatlar keçirərək şəhəri fəth etmişdi. Bundan başqa Mosul ətrafında kürdlərin yaşadıqları bir sıra qəsəbə və kəndlər də zəbt edilmişdi. Bu səfər vaxtı düşməndən xeyli qənimət alınmışdı. Hər bir süvari mücahidin payına 3 min, piyada əsgərlərin hər birinə

---

[72] İyanə üsulu ilə alver etmək-əmtəəni müşrətiyə nisyə olaraq baha qiymətə satıb nəğd olaraq ucuz qiymətə geri almaq.

[73] Əbu Davud, *Sünən*, Buyu', 56.

isə min dirhəm dəyərində qənimət düşmüşdü. Lakin Mosul bir müddət sonra əldən çıxmış, hicri 20-ci ildə (19 dekabr 640-09 dekabr 641) Ömər ibn Xəttabın (r.ə) əmri ilə Utbə ibn Fərqəd əs-Suləminin (r.ə) ordusu tərəfindən ikinci dəfə fəth edilmişdi. Utbə ibn Fərqəd (r.ə) kufəli əsgərlərin başında Fərat çayı boyunca şimal istiqamətində irəliləyərək çayın qərb və şərq sahillərini və Mosul şəhərini fəth etmişdi.

*Masəbzan, Əhvaz və Tustərin Fəthi*

Cəlula və Hulvan döyüşlərində iştirak etmiş İraq cəbhəsindəki İslam ordusunun əsas hissələrinin Mədainə qayıtmasından sonra bölgədəki Sasani qüvvələri fəallaşmışdı. Sasani imperiyasının qərb vilayətlərinin mərzbanı və hakim sülaləyə mənsub olan Hürmüzanın oğlu Azin topladığı böyük bir ordu ilə Masəbəzana tərəf yola çıxmışdı. O, buradan cəlb edəcəyi yeni qüvvələrlə Hulvana hücum etmək fikrində idi. Sə'd ibn Əbu Vəqqas (r.ə) Hürmüzanın planlarından və Azinin hərəkətlərindən xəbər tutan kimi dərhal Dirar ibn Xəttab əl-Fıhrini (r.ə) süvari qüvvələrinin başında Masəbəzana göndərmişdi. Dirarın (r.ə) ordusunun qəfil basqınına məruz qalan Azin əsir düşmüş, ordusu dağılmışdı. Dirar ibn Xəttab (r.ə) məğlub olaraq qaçan Sasani qüvvələrini bir qədər təqib etdikdən sonra Masəbəzana geri qayıtmışdı. O, bura əsir aldığı Azini edam etdirmişdi. Baş verənlər haqqında Sə'd ibn Əbu Vəqqası (r.ə) məlumatlandıran Dirara (r.ə) Masəbəzanda gözləməsi əmr edilmişdi. Sə'd ibn Əbu Vəqqas (r.ə) Mədaindən Kufəyə gedəndən sonra Dirarın (r.ə) da Kufəyə gəlməsini əmr etmişdi. Dirar ibn Xəttab (r.ə) Masəbəzandakı qarnizona İbn Xuzeyl əl-Əsədini (r.ə) əmir təyin edib özü ordusu ilə Kufəyə yollanmışdı.

Masəbəzanda edam edilən Azinin atası Hürmüzan Əhvaz şəhəri və ətraf bölgələrin, Xuzistanın hakimi idi. O, Tir çayı hövzəsini ələ keçirərək buradan İslam ordusu ilə əhdnamə bağlayaraq cizyə ödəyən Mənazir, Meysan, Dəstmizanda yaşayan məcusi iranlılarla xristian ərəblərə basqınlar edirdi. Bu bölgənin mühafizəsi ilə mükəlləf olan ordunun əmiri Əbu Abdullah Utbə ibn Qəzvan (r.ə) baş verənlərlə bağlı Sə'd ibn Əbu Vəqqasa (r.ə) məktub yazaraq ətraflı məlumat vermiş və yardım istəmişdi. Sə'd ibn Əbu Vəqqas (r.ə) Nueym ibn Muqərrin (r.ə) və Nueym ibn Məs'udun (r.ə) əmrinə ordu verərək Utbə ibn Qəzvanın (r.ə) köməyinə göndərmişdi. Daha sonra Sulmə ibn əl-Qeyn (r.ə) və Hərmələ ibn Mureyti (r.ə) də öz hərbi dəstələri ilə onlara köməyə göndərmişdi. Onlar Tir çayı hövzəsinə gəlib çatanda buradakı xristian ərəb qəbilələrinin təmsilçilərindən Qalib əl-Vaili və Kuleyb əl-Vaili ilə görüşüb danışmış, Hürmüzana qarşı birlikdə hərəkət etmək barədə razılaşmışdılar. Bundan başqa Xu-

zistanda yaşayan Bəni-Əmr ibn Malik oymağı da onlara kömək etməyi və'd etmişdi. İslam ordusu Hürmüzanın ordusu ilə Tir çayı və Dulus qəsəbəsi arasındakı düzənlik ərazidə qarşılaşmışdı. Döyüşün qızğın vaxtında zimmi ərəblərdən təşkil olunmuş köməkçi qüvvələr Tir çayını keçərək arxadan Hürmüzanın ordusuna hücum etmişdilər. İki qüvvə arasında sıxışan Sasani ordusu məğlubiyyətə uğrayaraq çox sayda itgi vermişdi. Hürmüzan sağ qalan əsgərləri ilə birlikdə Əhvaza tərəf çəkilərək Duceyl çayını keçmiş və orada düşərgə salmışdı. Utbə ibn Qəzvanın (r.ə) əmri altındakı İslam ordusu onu təqib edərək Duceyl sahilinə qədər gəlmişdi. Hürmüzan Utbəyə (r.ə) sülh təklif edərək əhdnamə şərtlərinin müəyyən edilməsini istəmişdi. Utbə (r.ə) onun sülh təklifini qəbul edərək Hürmüzana sadəcə Canqazaq şəhəri və ətraf əraziləri verib Əhvaz da daxil olmaqla idarəsi altındakı bütün torpaqların İslam dövlətinə ilhaq edilməsi şərtini irəli sürmüşdü. Hürmüzan bu şərti qəbul etmişdi. Əhdnamə şərtlərini əvvəlcə qəbul edən Hürmüzan daha sonra bəzi ərazilərlə bağlı iddia irəli sürməyə başlamışdı. Hürmüzan müsəlmanlarla yeni bir müharibənin qaçınılmaz olduğunu anlayaraq İraqın şimalındakı kürd qəbilələrindən yardımçı qüvvə istəmişdi. Lakin kürdlər onun bu istəyini yerinə yetirməmişdilər. Ömər ibn Xəttab (r.ə) baş verənlər haqqında məlumatlandırılandan sonra Hurqus ibn Zuheyr əs-Sə'dini yardımçı qüvvələrlə Utbə ibn Qəzvanın (r.ə) yanına göndərmişdi. İslam ordusu Duceyl çayını keçərək Hürmüzanın ordusuna hücum etmişdi. Məğlub olan Hürmüzan ordusunun qalıqları ilə Ramhürmüzə tərəf geri çəkilmişdi. Utbə ibn Qəzvan (r.ə) isə hicri 17-ci ilin (638) yayında beynəlxalq ticarət yeri kimi tanınan Suqi-Əhvazı ələ keçirmişdi. Lakin III Yəzdigərd Əhvaz vilayətini asanlıqla müsəlmanlara təslim etmək niyyətində deyildi. Sasani imperiyasının kədərli aqibəti talesiz gənc şahı İranın qərbindəki şəhərlərdə dərbədər gəzməyə məcbur etmişdi. O, ətraf əyalətlərin canişinlərinə fərman göndərərək dağılmış imperiya ordusunu birləşdirməyə çalışırdı. III Yəzdigərd hicri 17-ci (638) ilin yay aylarında Əhvaz və Fars əyalətlərinin əhalisinə müraciət edərək, onları ərəblərlə müharibədə lazımi kimi iştirak etmədikləri üçün qınamışdı. Bundan sonra həmin əyalətlər müharibə üçün ciddi hazırlıqlar görməyə başlamışdılar. Xəlifə Ömər ibn Xəttab (r.ə) bundan xəbərdar olan kimi Sə'd ibn Əbu Vəqqasa (r.ə) aşağıdakı məzmunda məktub yazmışdı: "*Nu'man ibn Muqərrinin (r.ə) əmrinə böyük ordu ver və Əhvaza Hürmüzanla döyüşmək üçün göndər. Əmri dərhal yerinə yetir*". Sə'd (r.ə) Nu'manı (r.ə) böyük bir ordu ilə yola salmışdı. Bundan başqa Ömər ibn Xəttab (r.ə) Bəsrədə olan Əbu Musa əl-Əş'əriyə (r.ə) də məktub yazaraq yanındakı mücahidlərlə Əhvaza, Nu'man ibn Muqərrinə (r.ə) köməyə getməsini əmr etmişdi. Hürmüzanın sərkərdəlik etdiyi ordunu

Nu'man ibn Muqərrin (r.ə) Əhvaz ətrafında məğlubiyyətə uğratmışdı. Hürmüzan qaçıb Tustər qalasına sığınmış və qalanın müdafiəsini möhkəmləndirmişdi. Müsəlmanlar Tustər qalasını mühasirəyə almışdılar. Bir müddət sonra qaladakılardan biri Əbu Musa (r.ə) ilə əlaqə quraraq şəhərin gizli girişini ona bildirmişdi. Mücahidlər bir gün sübh namazı vaxtı gizlicə şəhərə girdilər və qapıları açaraq İslam ordusunun şəhərə girməsini təmin etdilər. Beləcə Tustər fəth olunmuşdu. Çox sayda Sasani əsgəri, o cümlədən Hürmüzan da əsir alınmışdı. Yuxarıda qeyd etdiyimiz kimi Hürmüzan Sasani ailəsinin yaxın qohumu idi. O, əsirlikdə ikən İslam dinini qəbul etmişdi. Ömər ibn Xəttab (r.ə) onu azad edərək özünün müşaviri vəzifəsinə təyin etmişdi. Hürmüzanın əsir alınması, Ömər ibn Xəttabla (r.ə) görüşməsi və İslamı qəbul etməsində həqiqətən ibrətamiz təfərrüatlar mövcuddur. Tustər qalasının fəthi vaxtı Hürmüzan təslim olmayaraq sona qədər vuruşmuş, nəhayət mücahidlər onu qalanın bürclərindən birində sıxışdırmışdılar. Sərrast atıcı olan Hürmüzan əlindək yay və oxlarla müqavimət göstərmişdi. Hürmüzan sığındığı yerdən mücahidlərə belə səslənmişdi:

- *Əlimdə yüz ədəd ox var. Bu yüz oxdan sonuncusu qalana qədər siz mənə yaxınlaşa bilməyəcəksiniz. O vaxta qədər də mən sizdən yüz nəfəri ya öldürəcəm, ya da yaralayacağam.*

- *Nə istədiyini de.*

- *Məni hökmdarınızın yanına aparın, mənə nə edəcəksə qoy o etsin.*

Mücahidlər onun təklifini qəbul edib aman verəndən sonra Hürmüzan silahlarını yerə qoyub onlara təslim olmuşdu. Tustərin fəthində işitirak edən Muğirə ibn Şu'bə (r.ə), Ənəs ibn Malik (r.ə) və Əhnəf ibn Qeys ət-Təmimi (r.ə) bir dəstə mücahidlə birlikdə Hürmüzanı və alınan qənimətlərin beşdə bir hissəsini Mədinəyə aparmışdılar. Mədinəyə çatanda onlar Hürmüzanın mərasim paltarlarını geyməsini istədilər. Hürmüzan da özünün qızıl və gümüş iplərlə tikilmiş dəbdəbəli paltarlarını əyninə geyib, mirvari və yaqutlarla bəzədilmiş qızıl tacını başına qoyub, qiymətli daşlarla bəzədilmiş əsasını əlinə almışdı. Mədinəyə doğru gedərkən yol boyu insanlar bu ehtişamı əsirini tamaşasına çıxmışdılar. Onlar Mədinəyə çatanda xəlifənin namazdan sonra məscidin bir küncündə yatdığı xəbərini alaraq Məscidu'n-Nəbəviyə yollanmışdılar. Ömər ibn Xəttab (r.ə) gecələr az yatıb ibadət edir, gündüzlər də dövlət işəlir ilə məşğul olur və camaata məsciddə namaz qıldırırdı. Həmin gün sübh namazından sonra bir ərəb qəbiləsinin elçi heyətini qəbul etmiş, sonra da əbasının başının altına qoyaraq yuxuya getmişdi. Muğirə (r.ə), Ənəs (r.ə) və Əhnəf (r.ə) bir neçə nəfərlə birlikdə məscidə girərək Ömər ibn Xəttaba (r.ə) yaxın yerdə oturmuş və xəlifənin oyanmasını gözləmişdilər. Hürmüzan ərəbcə başa düşmədiyi üçün bu yatan şəxsin

Ömər (r.ə) olduğunu anlamamışdı. O, Ömər ibn Xəttabın (r.ə) sadə bir həyat tərzi yaşadığı haqqında eşitmişdi. Lakin bir hökmdarın məscidin bir küncündə, tək başına, yanında mühafizləri, qulluqçuları olmadan yata biləcəyi ağlına belə gəlməmişdi. Buna görə də sakit bir şəkildə oturan müsəlmanların xəlifənin gəlməsini gözlədiklərini zənn etmidi. Əhnəf ibn Qeys ət-Təmiminin (r.ə) yatan şəxsi oyatmamaq üçün uca səslə danışanlara susmalarını işarə etdiyini görəndə Hürmüzan farsca bilən Muğirə ibn Şu'bədən (r.ə) bu yatan adamın kim olduğunu soruşmuşdu. Muğirə (r.ə) ona "*Bu möminlərin əmiri Ömərdir (r.ə)*" deyəndə Hürmüzan heyrət və çaşqınlıqa demişdi:

- *Ömərdir? Bəs mühafizləri və qulluqçuları hardadırlar?*

- *Onun mühafizəçiləri və qulluqçuları yoxdur.*

- *Elə isə o, bir peyğəmbər olmalıdır.*

- *Xeyr, Muhəmməddən (s.ə.v) sonra peyğəmbər yoxdur. Lakin o, Peyğəmbərin (s.ə.v) dostu və yoldaşı idi. Ona görə də onun kimi yaşayır.*

Hürmüzan haqqında eşidən hər kəs məscidə toplaşmağa başlamışdı. Nəhayət Ömər ibn Xəttab (r.ə) artan səs-küydən oyanmışdı. Yatdığı yerdən dikələn xəlifə qarşısında ayaq üstə durmuş, paltarı, tacı və əsası parıldayan adam görmüşdü. Əhvalatdan xəbəri olan xəlifə "*Yoxsa bu Hürmüzandır*?" deyə soruşmuş, Əhnəf (r.ə) də ona "*Bəli, ey möminlərin əmiri, Hürmüzandır"* deyə cavab vermişdi. Xəlifə qarşısındakı adamın dəbdəbəsini diqqətlə süzdükdən sonra üzünü ondan çevirib "*Cəhənnəm odundan Allaha pənah aparıram. Dünaya qarşı Allahdan yardım diləyirəm. Bunu və tərəfdarlarını İslama boyun əydirən Allaha həmd olsun*" demişdi. Sonra isə üzünü məsciddək camaata tutaraq belə söyləmişdi:

- *Ey müsəlmanlar! Bu dinə möhkəmcə sarılın, Peyğəmbərinizin (r.ə) yolunda gedin. Dünya sizi bu yoldan azdırmasın, çünki dünya aldadıcıdır.*

Xəlifə sözünü bitirəndən sonra Əhnəf ibn Qeys (r.ə) "*Ey möminlərin əmiri! Hürmüzan onun haqqında sənin hökm vermən şərti ilə bizə təslim olmuşdur. İstəyirsənsə onunla danış*" dedi. Xəlifənin "*əynindəki bu qudurğanlıq və azğınlıq əlamətləri olduğu müddətcə mən onunla danışmayacağam*" deməsindən sonra Hürmüzanın tacını, əsasını aldılar və ona bəsit bir paltar geyindirdilər. Xəlifə Hürmüzana Əhvazın fəthindən əvvəl onun özünün sülh təklif etdiyini, sonra sözünün üstündə durmayaraq yenidən vuruşmaq üçün təşəbbüs göstərdiyin xatırlatdı və ona dedi:

- *Necədir indi Hürmüzan? Verdiyin sözə xəyanət etməyi və Allahın təqdirinin gerçəkləşməsini bəyənirsənmi?*

Bu sözlərdən mütəəssir olan Hürmüzan başını aşağı saldı, sonra isə belə dedi:

- *Ey Ömər! Bizlər və sizlər cahiliyyədə olarkən Allah nə sizin, nə də bizim tərəfimizdə deyildi. Lakin biz sizə qalib gəlirdik. Sonra siz İslamı qəbul etdiniz, Allah sizin tərəfinizdə oldu və siz bizi məğlub etdiniz.*

Ömər ibn Xəttab ona "*Doğrudur, siz bizə həm bu, həm də başqa səbəblərdən qalib gəlirdiniz. Bunlardan biri də bu idi ki, siz birlikdə, biz isə dağınıq idik*" deyə cavab verən xəlifə ona sərt şəkildə səslənərək sözünə belə davam etmişdi:

- *Ey Hürmüzan! Dəfələrlə verdiyin sözün üstündə durmanan üçün uydurduğun bir bəhanə varmı?*

- *Məni öldürtəcəyindən qorxuram.*

- *Sən son sözünü deyənə qədər sənə heç kim toxunmayacaq.*

- *Mən çox susamışam.*

Xəlifə ona su verilməsini söylədi və Hürmüzana adi, ağacdan oyulmuş bir qabda su verdilər. Hürmüzan su dolu qaba baxıb "*susuzluqdan öləcəyimi bilsəm belə bu qabdan su içmərəm*" deyəndə Ömər ibn Xəttab (r.ə) onun üçün bəyənəcəyi bir qabda su gətirilməsini əmr etmişdi. Hürmüzan onun üçün gətirilən başqa bir su qabını əlinə aldı. Lakin birdən onu titrəmə tuttu və su qabını ağzına apara bilmədi. Xəlifə ondan nə baş verdiyini soruşanda Hürmüzan "*Mən bu suyu içərkən öldürüləcəyimdən qorxuram*" deyə cavab vermişdi. Xəlifənin "*Qorxma, o suyu içənə qədər sənə heç kim toxunmayacaq*" sözündən sonra Hürmüzan əlindək qabı yerə atıb suyu dağıltdı. Əli əsdiyi üçün qabın yerə düşdüyünü düşünən Ömər ibn Xəttab (r.ə) "*Ona yenə su gətirin, suyunu içənə qədər heç kim ona toxunmasın*" dedi. Lakin Hürmüzan belə dedi:

- *Suya ehtiyacım yoxdur. Mən susuzluğu bəhanə edərək səndən mənim barəmdə ölüm hökmü verməyəcəyinə dair söz aldım.*

Ömər ibn Xəttab (r.ə) "*O suyu içənə qədər sənə toxunulmayacaq*" demişdi, zəki və hiyləgər bir insan olan Hürmüzan da həmin suyu içməyib yerə dağıltmışdı. Yerə dağılmış həmin suyu içməsi isə artıq mümkün deyildi. Onun suyu bəhanə edərək hiyləyə əl atdığını anlayan xəlifə belə dedi:

- *Xeyr, səni mütləq edam etdirəcəyəm.*

- *Lakin sən mənə aman verdin.*

- *Xeyr, sən mənə yalan dedin və hiyləgərlik etdin.*

Ənəs ibn Malik (r.ə) sözə qarışıb "*Ey möminlərin əmiri! O doğru deyir, sən ona təminat verdin*" dedi. Hürmüzanın döyüşdə Bəra ibn Malik (r.ə) və Məczə ibn Səvri (r.ə) öldürdüyünü bilən xəlifə Ənəs ibn Malikə (r.ə) səslənərək "*Vay olsun sənə Ənəs. Mən qardaşlarımın qatilinə aman verərəmmi heç?*" dedi. Bəra (r.ə) ilə Məczə (r.ə) Allah Rəsulunun (s.ə.v) əshabından və Ömər ibn Xəttabın (r.ə) dostları idilər. Ənəs ibn Malik (r.ə): "*Lakin sən ona əvvəlcə son sözünü*

*deyənə qədər, sonra isə o suyu içənə qədər sənə toxunulmayacaq dedin. Bu isə öldürülməyəcəyinə dair təminatdır*" deyəndə Əhnəf ibn Qeys (r.ə) də Ənəsin (r.ə) sözünü dəstəklədi. Oradakılardan da bunu təsdiqləyən mahiyyətdə sözlər eşidəndə Ömər ibn Xəttab (r.ə) qeyzləndi və üzünü Hürmüzana tutub:

- *Sən hiyləgərlik edib məni aldatdın. Mən bir kafirin sözünə əsla aldanmaram.*

"*Elə isə mən də müsəlman oluram*" deyən Hürmüzan xəlifənin hüzurunda İslamı qəbul etmişdi. Daha sonra Ömər ibn Xəttab (r.ə) Hürmüzanı gətirən hey'ətdəkilərlə ayrıca görüşərək söhbət etmişdi. Xəlifə İraqda müsəlmanlarla əhdnamə bağlayan əhalinin əhdnamə şərtələrini tez-tez pozmalarından narahat idi və bunun səbəbini aydınlaşdırmaq istəyirdi. O, hey'ətdəkilərə bununla bağlı suallar vermiş və hər kəs öz fikrini söyləmişdi. Lakin eşitdiyi fikirlər xəlifəni qane etməmişdi. Ən sonda Əhnəf ibn Qeys (r.ə) bu barədə fikirlərini Ömər ibn Xəttaba (r.ə) açıqlamışdı. O, belə demişdi:

- *Ey möminlərin əmiri! Cəlula döyüşündən sonra sən bizim İran torpaqlarında irəliləməmizə izn vermədin və fəth olunan yerlərlə kifayətlənməyimizi istədin. Şübhəsiz onların başlarında səltənət sürən hökmdarları və onları idarə edən dövlətləri olduğu müddətcə torpaqlarını əllərindən almağımızdan məmnun olmadıqları üçün fürsət tapdıqca bizə hücum edəcəklər. Əhdnamə bağladıqlarımız da onlar tərəfdən birinin silahlı qüvvə ilə gəldiyini görəndə onun tərəfinə keçəcəklər. Bir torpaqda iki hökmdar olmaz. Biri digərini mütləq oradan çıxaracaqdır. Əgər sən izn versən biz onların torpaqlarının içlərinə qədər irəliləyərik, hökmdarlarını yaxalayıb məhv edərik, ümid bəslədikləri dövlətlərini də yıxarıq. Beləcə iradələri və cəsarətləri qırılmış olar.*

Onu dinləyəndən sonra bir qədər fikrə gedən xəlifə "*ən doğrusunu Əhnəf söylədi*" demişdi. Əhnəf ibn Qeysin (r.ə) bu sözləri tarixin axarını dəyişmişdi. Çünki Ömər ibn Xəttab (r.ə) bu hadisədən sonra Sasani imperiyası və onun silahlı qüvvələrinin tamamilə dağıldılması istiqamətində hərəkət etmişdi. Tustər şəhərinin fəthindən sonra Əbu Sabrə (r.ə) və Əbu Musa əl-Əş'ərinin (r.ə) əmrindəki ordular Fars vilayətindəki Sus və Cündi-Şapur şəhərlərini də ələ keçirmişdilər.

*Nəhavənd Döyüşü*

Ömər bin Xəttabın (r.ə) xəlifəliyinin ilk illərində aparılan hərbi əməliyyatların əsas məqsədi İraqı fəth etmək idi. Xəlifə İslam ordularının İranın mərkəzi əyalətlərinə girmələrinə izn vermirdi. O, bu məsələdə diqqətli və ehtiyatlı davranırdı. İslam dövlətini və müsəlmanları təhlükəyə atmaqdan ehtiyat edirdi.

Lakin Əhnəf ibn Qeys (r.ə) və digər sərkərdələrin məlumatlarını dinlədikdən sonra xəlifə III Yəzdigərd və ətarfındakıların tamamən aradan qaldırılmasına qərar vermişdi. Bununla yanaşı, müharibələrdə alınan saysız-hesabsız qənimət bədəvi ərəb qəbilələrindən gələn könüllüləri müharibəni İranın mərkəzi və şimali əyalətlərində davam etdirməyə təşviq edirdi. Sasani orduları üzərində ard-arda qazanılan qələbələr bu imperiyanın əslində zənn edildiyi qədər qüdrətli olmadığını üzə çıxarmışdı. Bundan sonra hərbi yürüşlər nizamlı və planlı fəth hərəkatına dönməyə başlamışdı.

Cərir ibn Abdullah əl-Bəcəlinin (r.ə) komandanlığında böyük bir ordunun Cəluladan Hulvana doğru yola çıxdığından xəbər tutan III Yəzdigərd Hulvandan İsfahana getmişdi. Cərir ibn Abdullah (r.ə) da Hulvanı zəbt etmişdi. Şəhər əhalisi ilə canları və mallarının toxunulmazlığına zəmanət verərək əhdnamə bağlanmışdı. İslam orduları irəlilədikcə geri çəkilən III Yəzdigərd İsfahandan imperiyanın dörd tərəfinə fərmanlar göndərərək öz təbəələrini həlledici döyüş üçün ümumi səfərbərliyə çağırmışdı. O, hətta vassal dövlətlərdən də öz qüvvələrini köməyə göndərməyi tələb etmişdi. Kufə valisi Əmmar ibn Yasir (r.ə) Mədinəyə məktub yazaraq Sasani şahının fəaliyyətləri haqqında xəlifəyə məlumat vermişdi. Ömər ibn Xəttab (r.ə) məktubu oxuyandan sonra özünün məşvərət məclisini toplamışdı. Xəlifə Sasanilərlə vuruşmaq üçün böyük bir ordu toplanmasını və bu ordunu baş komandanlığına Nu’man ibn Muqərrinin (r.ə) təyin edilməsini qərara almışdı. Xəlifə Bəsrə, Şam diyarı və Omandakı ordu komandanlarına da əmrnamə göndərərək qısa müddətdə öz əsgərləri ilə İraqa gedib Nu’man ibn Muqərrinin (r.ə) ordusu ilə birləşməyi əmr etmişdi. Beləcə bu nəhəng ordunun baş komandanlığına Nu’man ibn Muqərrin (r.ə), avanqard qüvvələrin başına onun qardaşı Nueym ibn Muqərrin (r.ə), digər qardaşı Suveyd ibn Muqərrin (r.ə) sağ cinah qüvvələrinin başına, Huzeyfə ibn əl-Yəman (r.ə) sol cinah qüvvələrinin başına, ordunu arxadan qoruyan dəstənin komandirliyinə Mucaşi ibn Məs’ud (r.ə) təyin edilmişdilər. Bu orduda Muğirə ibn Şu’bə (r.ə), Cərir ibn Abdullah (r.ə), xəlifənin oğulları Abdullah ibn Ömər (r.ə) və Ubeydullah ibn Ömər (r.ə), Əmr ibn Madikərib (r.ə) və digər bir çox səhabələr də vardılar. Sasanilərin birləşmiş ordusuna isə məşhur sərkərdə Mərdanşah Hörmüzd başçılıq edirdi. Hicri 21-ci (642) ilin yayında 30 minlik İslam ordusu ilə 150 minlik Sasani ordusu Həmədanla İsfahan arasında yerləşən Nəhavənd adlı dağlıq yerdə qarşı-qarşıya gəlmişdilər. Çərşəmbə günü başlayan müharibə üç gün davam etmişdi. Bu misli görülməmiş döyüşdə qan su yerinə axmışdı. O dərəcədə qanlı döyüş olmuşdu ki, insanlar və atlar döyüş meydanını örtmüş qanın üzərində ayaq üstə dayana bilmir, sürüşüb yıxılırdılar.

Cümə günü gecəsi döyüş müsəlmanların parlaq qələbəsi ilə bitmişdi. Döyüş meydanında 30 min Sasani əsgərinin cəsədi qalmışdı. Mücahidlərdən də çox sayda şəhid olan vardı. Daim ön cərgələrdə vuruşan İslam ordusunun baş komandanı Nu'man ibn Muqərrin (r.ə) də Nəhavənd döyüşündə şəhid olmuşdu. Xəlifə Ömər ibn Xəttab (r.ə) dostu Nu'man ibn Muqərrinin (r.ə) şəhid olduğu xəbərini eşidəndə çox kədərlənmiş və göz yaşlarını saxlaya bilməmişdi.

Nəhavənddəki məğlubiyyətdən sonra Sasani ordusu bir daha özünə gələ bilməmiş və nəhəng imperiya sürətlə yıxılmağa başlamışdı. İranlılar qalalara qapanaraq fərdi qaydada müqavimət göstərməyə başlamışdılar. İslam tarixi mənbələrində Nəhavənddə qazanılmış zəfər "*fəthu'l-fütuh*" (fəthlər fəthi), zəfərlər zəfəri adlandırılmışdır. Belə ki, bu qələbədən sonra ərəblər Sasani imperiyasını başdan-başa, demək olar ki, ciddi bir müqavimətə rast gəlmədən fəth etmişdilər. Ömər ibn Xəttab (r.ə) III Yəzdigərdin müqavimət göstərmək üçün yenidən əsgər toplamasının qarşısını almaq məqsədilə İslam ordusunun hərbi birləşmələrinə İranın müxtəlif əyalətlərinə yürüşlər təşkil edərək əhalini itaət altına almaq və III Yəzdigərdə kömək etməkdən çəkindirməyi əmr etmişdi.

*İsfəhanın Fəthi*

Nəhavənd zəfərindən sonra Ömər ibn Xəttab (r.ə) bir gün özünün müşaviri vəzifəsinə təyin etdiyi Hürmüzana belə bir sual vermişdi: "*Yeni fəthlərə Fars əyalətindən, Azərbaycandan, yoxsa İsfahandan başlayaq?*". Hürmüzan xəlifənin sualına belə cavab vermişdi: "*Fars və Azərbaycanın hər biri qanaddır, İsfahan isə başdır. Qanadlardan birini kəssən digəri öz işini görər. Başı kəssən hər iki qanad da yerə düşər*". Nəhavənd zəfərindən qısa müddət sonra xəlifə Ömər (r.ə) Kufə valisi Əmmar bin Yasirə (r.ə) məktub yazaraq əmirlərdən Abdullah ibn Abdullah ibn Utban əl-Ənsarini (r.ə) təlimatlandırmağı əmr etmişdi. Əmrnamədə Abdullah ibn Abdullaha (r.ə) xitabən belə deyilirdi: "*Əmrin altındakı əsgərlə birlikdə İsfahana doğru hərəkət et. Ziyad ibn Hənzələ (r.ə) sənin yerinə Kufədə qalıb şəhərin mühafizəsi ilə məşğul olsun. Abdullah ibn Vərqa' ər-Riyahini (r.ə) öncü qüvvələrə əmir təyin et. Abdullah ibn Haris ibn Vərqa' əl-Əsədini (r.ə) və İsmət ibn Abdullah ibn Übeydəni (r.ə) də sağ və sol cinah komandanlığına təyin et*". Abdullah ibn Abdullah əl-Ənsari (r.ə) dərhal xəlifənin əmrini yerinə yetirməyə başlamış və ordusu ilə İsfahana yaxınlaşmışdı. İsfahan civarında Şəhriyar Cazuyə adlı yaşlı iranlı sərkərdə öz ordusu ilə Abdullah ibn Abdullah əl-Ənsarinin (r.ə) ordusuna hücum etmiş və burada şiddətli döyüş baş vermişdi. Yaşlı və təcrübəli sərkərdə Şəriyar Cazuyənin  döyüşdə Abdul-

lah ibn Vərqa' ər-Riyahi (r.ə) tərəfindən öldürülməsindən sonra Sasani ordusu məğlubiyyətə uğramışdı. Şəhriyar Cazuyənin öldürülməsi və ordusunun məğlub olmasından sonra İsfahan hakimi Fəzusfan müqavimət göstərəcəkləri təqdirdə belə şəhərin gec-tez zəbt olunmasının qaçınılmaz olduğu qənaətinə gəlmişdi. Bu isə həm artıq itgi, həm də şəhərin dağıntıya məruz qalmasına səbəb olacaqdı. Buna görə də İsfahan hakimi Fəzusfan qaladan çıxıb Abdullah ibn Abdullah əl-Ənsarinin (r.ə) düşərgəsinə gəlmiş və onunla əhdnamə bağlayaraq İsfahanı İslam ordusuna təslim etmişdi. Əhdnaməyə görə şəhər əhalisindən kim istəsə köçüb gedəcək, istəyən isə şəhərdə qalacaqdı. Qalanların canları və mallarının toxunulmazlığına cizyə ödəmələri şərtilə zəmanət verilmişdi. Köçüb gedənlərin daşınmaz əmlakı isə müsəlmanlara veriləcəkdi. Beləcə 642-ci ilin yayında İsfahan döyüşsüz, sülh yolu ilə fəth edilmişdi.

*Həmədanın Fəthi*

Nəhavənd döyüşündən sonra Əbu Musa əl-Əş'əri (r.ə) ona göndərilən köməkçi qüvvələri də Bəsrədə öz ordusuna birləşdirərək Dinəvər şəhərini ələ keçirmək üçün yola çıxmışdı. İslam ordusunun beş günlük mühasirəsindən sonra Dənəvər əhalisi Əbu Musaya (r.ə) cizyə müqabilində əhdnamə bağlamaq üçün sülh təklif etmişdilər. Əbu Musa (r.ə) bu təklifi qəbul etmiş və Dinəvər sülh yolu ilə fəth edilmişdi. Bu vaxt Saib ibn əl-Əqra əs-Əs-Səqəfi də Dinəvər yaxınlığındakı Mehriganqazaq şəhərini döyüşsüz, sülh yolu ilə ələ keçirmiş və şəhər əhalisi ilə əhdnamə bağlanmışdı.

Dinəvər və Mehriganqazaqın fəthi vaxtı Nueym ibn Muqərrin (r.ə) və Qə'qa ibn Əmrin (r.ə) orduları Nəhavənddə məğlub olaraq qaçan Sasani əsgərlərini təqib edərək hicri 21-ci ildə (09 dekabr 641-28 noyabr 642) Həmədan şəhərinə yaxınlaşmışdı. Qaçanlar Həmədan qalasına sığındıqları üçün Nueym (r.ə) ilə Qə'qa (r.ə) şəhəri mühasirəyə almışdılar. Bu vaxt Həmədanın hakimi Xosrov Şünum adlı şəxs idi. O, daha əvvəl Hulvan hakimi olmuş, lakin Hulvanın fəthindən sonra Həmədana gəlmişdi. Xosrov Şünum müqavimət göstəriləcəyi təqdirdə İslam ordusunun gec-tez şəhəri ələ keçirəcəyini bildiyi üçün müsəlmanlarla cizyə qarşılığında əhdnamə bağlayaraq şəhəri qətl və dağıntıdan xilas etmək istəmişdi. Buna görə də o, cizyə şərtlərinin müəyyənləşdirilməsi və əhdnamə bağlanması üçün Nueym ibn Muqərrinə (r.ə) müraciət etmişdi. Nueym (r.ə) və Qə'qa (r.ə) cizyə əvəzində əhdnamə bağlamağa razılıq vermiş və şərtləri müəyyən etmişdilər. Şəhərdəki Sasani silahlı qüvvələrinin tam tərki-silah edilməsi üçün də tədbirlər görülmüşdü. Nueym ibn Muqərrin (r.ə) İslam ordusunun Həmədana daxil olmasından sonra Xosrov Şünumu özlərinə itaət etmək şərti ilə əvvəlki vəzifəsində,

Həmədan valiliyində qoymuşdu. Həmədanın fəthi vaxtı Huzeyfə ibn əl-Yəman (r.ə) da öz ordusu ilə 642-ci ilin yayında Mahan qalasını ələ keçirmişdi. O, cizyə müqabilində şəhər əhalisi ilə əhdnamə bağlamışdı.

Nueym ibn Muqərrin (r.ə) və Qə'qa ibn Əmrin (r.ə) Həmədanı tərk edib getməsindən bir müddət sonra Həmədanlılar əhdnamə şərtələrini pozaraq cizyə ödəməkdən və itaət etməkdən boyun qaçırmış, üsyan etmişdilər. Kufə valisi olan Muğirə ibn Şu'bə (r.ə) Cərir ibn Abdullah əl-Bəcəlini (r.ə) 12 min nəfərlik ordu ilə Həmədana göndərmişdi. Cəririn (r.ə) ordusu Həmədanı mühasirəyə almış və şiddətli döyüşlərdən sonra İslam ordusu şəhəri ələ keçirmişdi. Həmədandakı silahlı üsyançıların əksəriyyəti döyüşdə məhv edilmişdi. Döyüş vaxtı Cərir ibn Abdullah (r.ə) gözünə dəyən bir oxla yaralanmışdı.

*İranın Mərkəzi və Şərq Vilayətlərindəki Hərbi Əməliyyatlar*

Ömər ibn Xəttab (r.ə) Nəhavənd qələbəsindən sonra Bəsrə canişini Əbu Musa əl-Əş'əriyə (r.ə) yazdığı məktubda əmri altındakı Sasani ordularının nəzarətində İran torpaqlarına qədər gedib orada növbəti əmri gözləməyi tapşırmışdı. Bu vaxt Mədinədə meydana gətirilən yeni hərbi birləşmələr Kufə və Bəsrəyə göndərilirdi. Bu hərbi birləşmələr Sasani imperiyasının vilayətlərinin fəthi üçün hazırlanmışdı. Xəlifə hər bir hərbi birləşməyə döyüş təcrübəsi, sərkərdəlik qabiliyyəti olan, şücaəti və igidliyi ilə fərqlənmiş şəxsləri əmir təyin etmişdi. Xorasan vilayətinin fəthi Əhnəf ibn Qeysin (r.ə), Ərdəşiri-Hurrə və Şapur vilayəti Mücaşi ibn Məs'ud əs-Suləminin (r.ə), İstəxr Osman ibn Əbü'l-As (r.ə), Fəsa və Darabgərd Sariyyə ibn Zuneym əl-Kinani (r.ə), Kirman Suheyl ibn Ədiyy (r.ə), Sicistan Asim ibn Əmr (r.ə), Muqran vilayətinin fəthi isə Həkəm ibn Umeyr ət-Təğlibinin (r.ə) əmrindəki ordular tərəfinən həyata keçiriləcəkdi. Bundan başqa xəlifə, Abdullah ibn Abdullah ibn Utban, Əlaqamə ibnu'n-Nəzir, Abdullah ibn Əbu Aqil, Ribi' ibn Amir, İbn Umeyr əl-Əşcai, Şihab ibnü'l-Mühariki ehtiyat qüvvələrə komandan təyin edərək İran cəbhəsinə göndərmişdi. Beləliklə İran cəbhəsindəki İslam orduları hicri 22-ci (28 noyabr 642-18 noyabr 643) ildə təyinatları üzrə hərəkətə keçmişdilər.

Cərir ibn Abdullah (r.ə) Həmədanı ələ keçirəndən sonra Bəra ibn Azibin (r.ə) əmrinə verdiyi ordunu Qəzvin üzərinə göndərmişdi. Cərih (r.ə) Bəraya (r.ə) Qəzvini ələ keçirəndən sonra Deyləm vilayətinə yürüş etməyi də tapşırmışdı. Bəra ibn Azib (r.ə) Cibal vilayətinin hüdudlarını keçərək Azərbaycanın cənubundakı Əbhər şəhərinə yaxınlaşmışdı. O, qala qapılarını bağlayaraq müqavimət göstərməkdə olan əbhərliləri mühasirəyə almışdı. Bir neçə günlük döyüşdən sonra şəhər əhalisi cizyə müqabilində əhdnamə bağlayıb şə-

hərin qapılarını İslam ordusuna açmağa razı olmuşdu. Beləcə Əbhər fəth edilmişdi. Qəzvinlilər İslam ordusunun növbəti hədəfinin öz şəhərləri olduğunu bildiklərindən ötürü şəhərin müdafiəsi üçün tədbir görmüş, həmçinin Deyləm dağlılarından yardım istəmişdilər. Bəra ibn Azibin (r.ə) ordusu Qəzvini mühasirədə saxlayakən Deyləmlilər şəhərin köməyinə gəlmiş, lakin ərəblərə hücum etməyərək ətrafdakı dağlıq ərazidə mövqe tutub şəhərin mühasirəsini müşahidə etmişdilər. Deyləmlilərin hərəkətsiz gözlədiyini görüb onların köməyindən ümidlərini üzən qəzvinlilər Əbhər əhalisi ilə bağlanmış əhdnamənin şərtləri ilə cizyə ödəməyə və şəhəri təslim etməyə razı olmuşdular. Qəzvinin fəthindən sonra ordusu ilə Xəzər dənizi sahillərinə üz tutan Bəra ibn Azib (r.ə) deyləmlilərlə vuruşub onları məğlub etmişdi. Daha sonra Gilan vilayətinə yürüş edib Talış dağlarının ətəklərinə qədər irəliləmiş və geri qayıtmışdı. Güman ki, Bəranın (r.ə) Gilan və Talışa hərbi yürüşü sonrakı fəthlər üçün yolların, keçidlərin öyrənilməsi məqsədiylə, kəşfiyyat xarakterli yürüş olmuşdu.

İrəlidə haqqında ətraflı məlumat verəcəyimiz Vaci-Ruz döyüşündən sonra Nueym ibn Muqərrin əl-Muzni (r.ə) Həmədana qayıtmışdı. Həmədanda ikən o, Ömər ibn Xəttabın (r.ə) ona Rey (Tehran) şəhərinə yürüş etməsiylə bağlı tapşırıq verdiyi məktubunu almışdı. Həmədanın mühafizəsini Yəzid ibn Qeys əl-Həmdaniyə həvalə edən Nueym xəlifənin əmrini yerinə yetirmək üçün yola çıxmışdı. Daha əvvəl İraq cəbhəsində İslam orduları ilə döyüşlərdə iştirak etmiş Sasani sərkərdələrindən Əbü'l-Fərruxan əz-Zeynəbi bu vaxt Rey şəhərində idi. O, Rey hakimi Səyavuş Mehranzadəyə əlverişli şərtlər müəyyən edərək əhdnamə bağlamağı və şəhəri Nueymə (r.ə) təslim etməyi təklif etmişdi. Səyavuş bu təklifi rədd etmiş, bu səbəbdən Əbü'l-Fərruxanla Səyavuş arasında ədavət meydana gəlmişdi. Buna görə də Əbü'l-Fərruxan kiçik bir qrupdan ibarət adamları ilə Reyi tərk edib Nueymin (r.ə) yanına getmişdi. Səyavuş Mehranzadə ətraf vilayətlərin hakimlərinə məktub yazaraq Dəmavənd, Təbəristan, Cürcan və Qum əhalisindən yardım istəmişdi. Lakin həmin vilayətlərin hakimləri öz torpaqlarının qorunmasına çalışdıqları üçün Səyavuşun yardım tələbinə müsbət cavab verməmişdilər. Səyavuş öz əmrindəki Sasani qüvvələri ilə Rey şəhərindən çıxıb Nueymin (r.ə) əmrindəki İslam ordusu ilə döyüşə girmişdi. Reyin dağlıq bölgəsində cərəyan edən bu şiddətli döyüşlərdə hər iki tərəf çox sayda itgi vermişdi. Əbü'l-Fərruxan əz-Zeynəbi Nueym ibn Muqərrinə (r.ə) düşmən qüvvələrinin mücahidlərdən sayca bir neçə dəfə çox olduğunu, bu döyüşlərin müsbət nəticə verməsinin müşkül olduğunu söyləyib onun əmrinə süvari dəstəsi verməsini təklif et-

mişdi. Əbü'l-Fərruxan əz-Zeynəbinin planına görə Nueym (r.ə) Reydən xeyli kənarda Səyavuşun ordusunu məşğul edərkən o, bir gecə vaxtı gizli yollarla Rey qalasına yaxınlaşıb müdafiəsiz qalmış qalanı zəbt edəcək, beləcə Səyavuşun müqavimət əzmi qırılmış olacaqdı. Nueym (r.ə) onun bu təklifini qəbul edib könüllü mücahidlərdən ibarət süvari dəstəni qardaşı oğlu Munzir ibn Əmrin (r.ə) başçılığı altında əz-Zeynəbilə birlikdə göndərmişdi. Munzirin (r.ə) süvariləri gecə vaxtı Əbü'l-Fərruxan əz-Zeynəbilə birlikdə, onun göstərdiyi yollardan keçərək Rey qalasına yaxınlışmışdı. Gözlənilməz hücum qarşısında çaşqın qalmış az saydakı qala mühafizini məhv edən mücahidlər Rey qalasını fəth etmişdilər. Səhər açılanda Reydən təkbir səslərini eşidən Səyavuş və ordusunda ruh düşkünlüyü yaranmış, Nueymin (r.ə) həmlələrinə qarşı dayanacaq gücləri və iradələri qalmamışdı. Beləcə həm Rey şəhəri fəth edilmiş, həm də Səyavuş Mehranzadənin ordusu məğlub edilmişdi. Qaçıb dağılan Sasani qüvvələrini təqib edən mücahidlər bol qənimət ələ keçirmişdilər. Mənbələr Reyin fəthi vaxtı ələ keçirilən qənimətlərin çoxluğunu Mədaində alınan qənimətlərlə müqayisə etmişdilər. Əbü'l-Fərruxan əz-Zeynəbinin təklif etdiyi şərtlərlə Rey əhalisilə xilafət arasında cizyə müqabilində əhdnamə bağlanmışdı. Nueym ibn Muqərrin (r.ə) Reyin idarəsini Əbü'l-Fərruxan əz-Zeynəbiyə vermiş və şəhərin mühafizəsi üçün burada mücahidlərdən ibarət qarnizon yerləşdirmişdi. Əbü'l-Fərruxan əz-Zeynəbi bir müddət sonra İslamı qəbul etmişdi. Mənbələrin verdiyi məlumata görə Rey şəhəri bu fəthdən sonra uzun əsrlər boyu Əbü'l-Fərruxan əz-Zeynəbinin nəslindən olanların idarəsində qalmışdı. Reyin fəthindən bir müddət sonra Dəmavənd vilayəti də döyüşsüz, sülh yolu ilə əhdnamə bağlanaraq fəth edilmişdi. Nueym ibn Muqərrin (r.ə) qənimətlərin beşdə birini Mədinəyə göndərmiş və məktubla baş vermiş hadisələr haqqında xəlifəyə təfsilatlı məlumat vermişdi. III Yəzdigərdi təqib edən mücahidlər onun sığınacaq tapdığı hər şəhəri və hər qalanı fəth etməyə çalışırdılar. Həmədan və Reyin fəthindən sonra Sasani şahının şimala gedərək Xəzər xaqanının yanında sığınacaq tapma ehtimalı da aradan qaldırılmışdı.

Həmədanın fəthindən sonra Deyləm, Rey və Azərbaycan əhalisi ərəblərlə vuruşmaq üçün öz qüvvələrini birləşdirmiş və müharibəyə hazırlaşmışdılar. Azərbaycanlı əsgərlərə Qadisiyyədə öldürülən iranlı sərkərdə Rüstəmin qardaşı İsfəndiyar Fərruxzadə komandanlıq edirdi. Bu müttəfiq orduya bizanslılar da köməyə gəlmişdilər. Hicri 22-ci ilin (28 noyabr 642-18 noyabr 643) ortalarında iki ordu Vaci-Ruz adlı yerdə qarşılaşmışdılar. Burada Nəhavənd döyüşü ilə müqayisə edilə biləcək dərəcədə şiddətli döyüş baş vermiş və döyüş İslam ordusunun qələbəsi ilə bitmişdi.

Reyin fəthindən sonra Suveyd ibn Muqərrin əl-Muzni (r.ə) və Hind ibn Əmr əl-Cəməli (r.ə) xəlifənin göndərdiyi əmrnamyəyə əsasən Quməs şəhərinin fəthi üçün hərəkətə keçmişdilər. Quməs əhalisi İslam ordusunun yaxınlaşdığını öyrənib şəhəri tərk etmiş və Təbəristana getmək üçün yola çıxmışdlar. Suveyd (r.ə) öz ordusu ilə demək olar ki, tamamilə boşaldılmış Quməs şəhəri yaxınlığında ordugah qurmuşdu. Bir müddət sonra Təbəristan dağlarına sığınmaq üçün yola çıxmış quməslilər Suveydə (r.ə) öz elçilərini göndərərək cizyə müqabilində əhdnamə bağlamaq istədiklərini bildirmişdilər. Suveyd (r.ə) onların bu təklifini qəbul edərək əhdnamə şərtlərini müəyyən etmişdi. Əhdnamənin bağlanmasından sonra şəhər əhalisi qayıdıb Quməsə gəlmişid. Quməsdən sonra Suveyd ibn Muqərrin (r.ə) ordusu ilə Cürcana getmişdi. Cürcan hakimi Saman Sul Suveydin (r.ə) ordugahına gələrək onunla cizyə müqabilində əhdnamə bağlamışdı. Əhdnamənin bağlanmasından sonra Suveyd (r.ə) Saman Sul ilə birlikdə Cürcan şəhərinə gəlmiş və şəhəri təslim almışdı. O, şəhərin köçəri qəbilələrin hücumlarına məruz qaldığını öyrənəndən sonra qala divarlarının möhkəmləndirilməsi üçün tədbirlər görmüşdü. Təbəristan hakimi Sipahbud da Cürcanda Suveydin (r.ə) yanına gələrək öz vilayətindəki əhalinin cizyə ödəməsi müqabilində onunla əhdnamə bağlamışdı. Beləcə Qum, Təbəristan və Cürcan döyüşsüz, sülh yolu ilə fəth edilmişdi.

III Yəzdigərd Reyin fəthindən sonra Kirmana getmiş, lakin orada çox qalmayaraq Xorasana gedərək və indiki Türkmənistan ərazisindəki Mərv şəhərində qərar tutmuşdu. Əhnəf ibn Qeys (r.ə) Mərvdən İranın dörd bir tərəfinə məktublar göndərərək öz təbəələrini İslam ordularına qarşı mübarizəyə təşviq edən III Yəzdigərdin öz torpaqlarında sığındığı son yerə, Xorasana hərbi yürüş etmişdi. İranın şimal-şərq bölgəsinə gələn Əhnəf (r.ə) Mütərrif ibn Abdullahı (r.ə) ordusu ilə Nişapurun, Haris ibn Həsəni (r.ə) isə Sərəxsin fəthi üçün təlimatlandırmış, özü isə ordusu ilə Mərv şəhərinə yaxınlaşmışdı. III Yəzdigərd Əhnəf ibn Qeysin (r.ə) Mərvə yaxınlaşdığı xəbərini alın kimi şəhəri tərk edərək möhkəm qala divarları ilə əhatə olunmuş Mərvərruda getmiş, buradan qərbi Göktürk xaqanına, Soqdiana hökmdarına və Çin imperatoruna məktub yazaraq yardım istəmişdi. Mərvdən bir qədər aralıda düşərgə salan Əhnəf (r.ə) Kufədən yola çıxmış yardımçı qüvvələri gözləmişdi. Yardımçı qüvvələrin gəlməsindən sonra Əhnəf (r.ə) şiddətli döyüşlədən sonra Mərv şəhərini fəth etmişdi. III Yəzdigərd Mərvərruddan çıxıb Əfqanıstanın Bəlx şəhərinə getmişdi. Onun qalanı tərk etməsindən sonra Əhnəf (r.ə) Mərvərrudu ələ keçirmişdi. O, Mərvin mühafizəsini Harisə ibn Nu’man əl-Bahilinin (r.ə) qarnizonuna həvalə edərək ordusu ilə Bəlxə yollanmışdı. Bəlx şəhəri yaxınlığında III

Yəzdigərdin əsgərləri ilə Əhnəfin (r.ə) ordusu arasında şiddətli döyüş baş vermişdi. İslam ordusu qələbə çalaraq Bəlxi zəbt etmişdi. Beləcə hicri 22-ci (643) ilin payızında Xorasanın mühüm bir hissəsi fəth edilmişdi. III Yəzdigərd Bəlx döyüşü baş verdiyi vaxt şimala, Türküstana getmişdi. Onu təqib edən süvari mücahidlər Toxaristan vilayətinə qədər getmişdilər. Toxaristanın fəth edilmiş bölgələrinin mühafizəsini Rəbi' ibn Əmrə (r.ə) həvalə edən Əhnəf (r.ə) Mərvə qayıtmış və buradan baş verənləri təfərrüatı ilə yazıb Ömər ibn Xəttabı (r.ə) məlumatlandırmışdı. III Yəzdigərd Soqdianaya gedərək Fərqanə bölgəsində sığınacaq tapmışdı. Ömər ibn Xəttab (r.ə) Əhnəf ibn Qeysə (r.ə) yazdığı məktubda onu əmrindəki orduları Əmudərya (Ceyhun) çayının sağ sahilinə keçirməmək barədə təlimatlandırımşdı. III Yəzdigərd Fərqanədə ikən Soqdiana hakimi və qərbi Göktürk hökmdarı İşbara-Yabgu xaqanın (640-642) göndərdiyi ordularla yenidən Əmudərya çayının sol sahilinə keçərək Mərvə hücum etmişdi. Düşmən ordularının çoxluğu səbəbiylə Mərvi mühafizə edə bilməyəcəyini anlayan Əhnəf ibn Qeys (r.ə) şəhəri boşaldaraq ordusu ilə dağlıq bölgəyə çəkilmişdi. Beləcə III Yəzdigər türklərin köməyi ilə yenidən Mərvi ələ keçirmişdi. Əhnəfin (r.ə) əmrindəki 20 minlik İslam ordusu arxası dağlıq bölgəyə tərəf mövqe tutmuşdu. Onunla türk ordusu arasında çay axmaqda idi. Əhnəf (r.ə) burada türklərin bir neçə həmləsinin qarşısını almışdı. İtgi verən Göytürk ordusu geri çəkilmişdi. Göytürk ordusu ilə ərəblər arasında döyüş davam edərkən III Yəzdigər Mərv qalasına gələrək buradakı xəzinəsini gizlətdiyi yerdən çıxarmış və daşınmasını əmr etmişdi. Bir neçə ildən bəri dərbədər gəzməkdə olan III Yəzdigərdin yanında daim bəzi iranlı zadəganlar və yüksək rütbəli Sasani dövlət adamları var idi. Onlar III Yəzdigərdin Çinə getmək fikrində olduğunu öyrənəndə onu bu fikrindən daşındırmağa çalışmışdılar. Lakin onu fikrindən döndərə bilməyəndə onu tərk edərək ailəsi və bir neçə yaxın adamı ilə birlikdə tək qoymuşdular. III Yəzdigərdi tərk edənlər İrana qayıdaraq ölkələrini zəbt etmiş ərəblərlə sülh bağlayıb vətənlərində yaşamaq niyyətində olduqlarını bildirimşdilər. Köməksiz və tək qalan III Yəzdigərd yenidən Əmudərya çayını keçərək Fərqanə vilayətinə pənah aparmışdı. Göytürk ordusu da yaranmış vəziyyət səbəbiylə Əhnəf ibn Qeysin (r.ə) ordusu ilə üz-üzə durmaqdan çəkinib Türküstana qayıtmışdı. Göytürk ordusunun Türküstana qayıtmasından sonra Əhnəf ibn Qeys (r.ə) yenidən Mərv şəhərini zəbt etmiş və Ömər ibn Xəttaba (r.ə) məktub yazaraq baş verənləri təfərrüatı ilə anlatmışdı. Əhnəf ibn Qeysin (r.ə) məktubunu alıb yaranmış vəziyyətdən agah olan Ömər ibn Xəttab (r.ə) Məscidu'n-Nəbəvidə söylədiyi xütbədə müsəlmanlara belə xitab etmişdi: "*Məlumunuz olsun ki, məcusi (atəşpərəst) dövləti təməlindən dağılmış və*

*məhv olmuşdur. Artıq onlar öz ölkələrində müsəlanlara zərər verə biləcək bir qarış torpağa belə sahib deyillər. Xəbəriniz olsun ki, Allah onların mülklərini, torpaqlarını, şəhərlərini, mallarını və canlarını sizin əmriniz altına vermişdir. Artıq bundan sonra Haqq olan Allah sizi davranışlarınızla, həyatınızla sınağa çəkəcəkdir. Mən bu ümmətə kənardan bir zərərin asanlıqla gələcəyindən qorxmuram, lakin sizə öz tərəfinizdən gələ biləcək zərərdən qorxuram*".

Hulvanın fəth edilməsindən sonra Ömər ibn Xəttab (r.ə) Əzra ibn Qeysi (r.ə) Hulvan canişinliyinə təyin etmişdi. Əzra ibn Qeys (r.ə) Hulvandan hərəkətə keçərək Şəhrəzuru fəth etmək istəmiş, fəqət buna nail ola bilməmişdi. Mənbələrin verdiyi məlumata görə Şəhrəzur ətrafındakı ərazi zəhərli əqrəblərlə dolu olduğu üçün Əzranın (r.ə) ordusu burada rahat hərəkət edə bilməmiş və əsgərlərdən bir çoxu əqrəb sancması səbəbiylə ölmüş və yaralanmışdılar. Utbə ibn Fərqəd (r.ə) öz ordusu ilə Şəhrəzuru mühasirəyə almış və şiddətli döyüşdən sonra buranı fəth etmişdi. Utbə ibn Fərqəd (r.ə) Şəhrəzurdan sonra Darabad və Saməğan qalalarını da fəth etmişdi. Bu fəthlərdən sonra xəlifə Utbə ibn Fərqədi (r.ə) Mosul həvalisinə göndərərək burada Azərbaycanın fəthi üçün hazırlıqlar görməyi tapşırmışdı.

Hicri 22-ci (643) ilin yay aylarının sonunda bəzi iranlı zadəganlar qüvvələrini birləşdirərək Təvvac adlı yerdə toplaşmış və ərəblərlə döyüşə hazırlaşmışdılar. Sariyyə ibn Zuleym əl-Kinani (r.ə) və Mücaşi ibn Məs'ud (r.ə) orduları ilə Təvvaca gələrək burada toplanmış iranlılarla vuruşmuş və onlara qalib gəlmişdilər. Təvvac döyüşündə ərəblərin əlinə xeyli qənimət və əsir keçmişdi.

Xəlifənin əmri ilə İstəxri fəth etməsi tapşırılmış Osman ibn Əbü'l-As (r.ə) əmri altındakı ordularla İstəxr vilayətinə girmişdi. O, Gur qalasında Sasani qarnizonunun ciddi müqaviməti ilə üzləşmiş və burada şiddətli döyüşlər baş vermişdi. Gur qalasının fəthindən sonra Osman ibn Əbü'l-As (r.ə) İstəxri mühasirəyə almışdı. Bir neçə gün davam edən qanlı döyüşlərdən sonra İstəxr şəhəri fəth edilmiş və şəhər əhalisilə cizyə müqabilində əhdnamə bağlanmışdı. İstərxrin mühasirəsi vaxtı Əbu Musa əl-Əş'əri (r.ə) Şiraz şəhəri ələ keçirmişdi. İstəxrin fəthindən sonra Osman ibn Əbü'l-As (r.ə) bu vilayətdəki Kazerun, Nubəndgan və Cannəban şəhərlərini də fəth etmişdi. Osman ibn Əbü'l-As (r.ə) İstəxr vilayətindəki döyüşlər vaxtı alınmış qənimətlərin beşdə birini Mədinəyə göndərmiş, geri qalanını öz mücahidləri arasında bölmüşdü.

Hicri 22-ci ilin zilqədə ayında (oktyabr-noyabr 643) Fəsa və Darabgərdin fəthi üçün yola çıxan Sariyyə ibn Zuneym əl-Kinani (r.ə) Fəsa şəhəri mühasirəyə almışdı. Fəsanı inadla müdafiə edən iranlılara ətraf vilayətlərdən çox sayda

köməkçi qüvvə gəlmiş və beləliklə iki ordu arasında böyük bir say fərqi yaranmıdı. Bundan başqa ətraf vilayətlərdən gələn köməkçi qüvvələrlə Fəsa müdafiəçiləri arasında qalan İslam ordusu mühasirəyə düşməkdən son anda qurtula bilmişdi. Bacarıqlı sərkərdə olan Sariyyə ibn Zuneym (r.ə) ordusunu nizamlı şəkildə yaxınlıqdakı dağlıq bölgəyə tərəf çəkmiş və geri çəkilərkən mücahidlərdən bir neçə qrupu pusquda qoymuşdu. İranlılar ərəbləri dar və sıldırımlı dağ keçidinə sıxışdırdığı vaxt Sariyyə (r.ə) pusqudakılarla birlikdə əks hücuma keçmişdi. Pusquya düşən iranlıların əksəriyyəti dağlıq ərazidə məhv edilmişdi. Bu məğlubiyyətdən sonra Sariyyə ibn Zuneym (r.ə) Fəsa və Darabgərdi fəth etmiş və onları cizyə müqabilində əhdnamə bağlamağa məcbur etmişdi.

Hicri 22-ci (643) ilin payızında Abdullah ibn Abdullah əl-Ənsarini (r.ə), Suheyl ibn Əmr əl-İclinin (r.ə) və Abdullah ibn Budeyl əl-Xuzainin (r.ə) əmrindəki ordular Kirman vilayətinə girmişdi. III Yəzdigərd Xorasana getməmişdən əvvəl Kirmanın müdafiəsini təşkil etmidi. Buna görə İslam ordusu Kirmanda ciddi müqavimətə rast gəlmiş, lakin buradakı döyüş mücahidlərin qələbəsi ilə bitmişdi. Kirman şəhərini fəth edən İslam ordusu vilayətin digər şəhər və qəsəbələrini də ələ keçirmidi. Həmin bu vaxt Asim ibn Əmr (r.ə) və Abdullah ibn Umeyrin (r.ə) orduları da Sicistan vilayətinin fəthi ilə məşğul olmaqda idilər. Sicistandakı Sasani qüvvələri alınmaz qala kimi tanınan, dağlıq bölgədəki Zərənc qalasına toplaşaraq burada müdafiə olunmuşdular. Zərənc yaxınlığındakı qanlı döyüşlər İslam ordusunun qələbəsi ilə nəticələnmiş və alınmaz hasab olunan Zərənc fəth olunmuşdu. Hicri 22-ci ilin son günlərində (noyabr 643) Həkəm ibn Umeyr ət-Təğlibi (r.ə) Muqran vilayətinin fəth etmişdi. Ömər ibn Xəttabın (r.ə) İranın fəthinə məmur etdiyi komandanların hər biri verilən tapşırıq və əmrləri uğurla yerinə yetirmişdilər. Sasani ordularının qalıqlarının və müqavimət əzmində olan bəzi iri feodalların iradəsinin qırılaraq aradan qaldırılması sonrakı iki il ərzində də davam etmişdi. Hicri 21-23-cü (642-644) illərdə İsfahan, Təbəristan, Fars, Kirman, Sistan və Xorasan əyalətlərinin fəth edilməsi ilə İran demək olar ki, tamamilə müsəlmanların əlinə keçmiş, beləcə qoca Sasani imperiyası tarix səhnəsindən silinib getmişdi.

*Cəzirənin Fəthi və Şərqi Anadoludakı Hərbi Əməliyyatlar*

Hicri 17-ci (638) ilin ortalarında Bizans imperatoru Herakl itirdiyi torpaqları geri almıq üçün son bir cəhd etmişdi. Cəzirədəki bəzi xristian ərəb və kürd qəbilələrinin dəstəyinə arxalanan Herakl ordusunu Şam diyarına yeridərək Hums şəhərini zəbt etmək istəmişdi. İslam ordularının Şam diyarındakı baş komandanı Əbu Ubeydə ibn Cərrah (r.ə) bu vaxt Humsda idi. Əbu Ubeydə (r.ə)

Qınnəsreyndəki Xalid ibn Vəlidə (r.ə), eləcə də digər vilayətlərdəki əmirlərə orduları ilə birlikdə Humsa gəlmək göstərişi vermişdi. Əbu Ubeydə (r.ə) Humsdan çıxaraq şəhərin yaxınlığında ordugah qurmuş, burada əmirlərlə məşvərət etmişdi. Xalid ibn Vəlid (r.ə) Bizans ordusu ilə döyüş meydanında üzləşməyi təklif etmişdi. Lakin digər əmirlər bunun təhlükəli ola biləcəyini bildirərək Hums qalasında müdafiə olunmağa üstünlük vermişdilər. Əbu Ubeydə (r.ə) ordugahdakı bütün hərbi birləşmələri Hums qalasında müdafiəyə cəlb edərək xəlifəyə məktub yazıb vəziyyəti bildirmişdi. Ömər ibn Xəttab (r.ə) yarana biləcək bu kimi halları nəzərə alaraq ehtiyat qüvvələr hazırlamışdı. Bunların 4 mini Kufədə hazır vəziyyətdə idi. Eləcə də digər şəhərlərdə də ehtiyat qüvvələr mövcud idi. Xəlifə Sə'd ibn Əbu Vəqqasa (r.ə) məktub yazaraq Qə'qa ibn Əmri (r.ə) Kufədəki ehtiyat qüvvələrlə Humsa göndərməyi əmr etmişdi. Xəlifə Bizans imperatorunun Cəzirə əhalisinin köməyinə arxalanaraq bu işə girişdiyini və yanında Cəzirə əhalisindən toplanmış xeyli sayda əsgər olduğunu bilirdi. Buna görə də Bizans imperatoruna kömək etmək əzmində olan yerli muzdu əsgərlərin imperatorun ordusunu tərk etmələri üçün tədbir görmüş və xəlifənin bu planı tezliklə bəhrəsini vermişdi. Möminlərin əmiri Ömər ibn Xəttab (r.ə) Suheyl ibn Əmrə (r.ə) Rəqqə şəhərinə, Abdullah ibn Utbana (r.ə) Nuseybinə, Vəlid ibn Uqbəyə Cəzirədəki Bəni-Tənux və Bəni-Rəbiə qəbilələrinə mənsub xristian bədəvilərin üzərinə, Həbib ibn Məsləmə (r.ə) ilə İyaz ibn Qənəmin (r.ə) isə Hərran və Urfa şəhərlərinə yürüş etməsini əmr etmişdi. Ömər ibn Xəttab (r.ə) özü də Mədinədən yola çıxaraq Şam diyarına gəlmiş və yanındakı qüvvələlə Cabiyədə mövqe tutmuşdu. Bizans ordusundakı Cəzirə vilayətindən olan muzdu əsgərlər İraq cəbhəsindəki İslam ordularının onların yurdlarını ələ keçirməkdə olduğunu öyrənən kimi Heraklın ordusunu tərk edərək öz yurdlarını qorumaq üçün geri qayıtmışdılar. Beləcə Bizans ordusu mühüm bir hərbi qüvvədən məhrum qalmışdı. Əbu Ubeydə (r.ə) yaranmış vəziyyətdən faydalanaraq hicri 18-ci ilin rəcəb ayında (iyul 639) yayında ordusu ilə Hums qalasından çıxıb Heraklın ordusu ilə döyüşə girimiş və Bizans ordusunu məğlubiyyətə uğratmışdı. Vəziyyətin birdən-birə əksinə döndüyünü görən və Şam diyarını müsəlmanlardan geri almaq ümidini itirən Herakl geri çəkilmişdi. O, Kiçik Asiyaya geri çəkilərkən Cəzirədəki bəzi xristian ərəb qəbilələi də onunla birlikdə yurdlarını tərk edərək Anadoluya getmişdilər. Ömər ibn Xəttab (r.ə) bununla bağlı Herakla məktub yazaraq yurdlarını tərk edib Anadoluya getmiş xristian ərəb qəbilələrini dərhal geri öz yurdlarına göndərməyi tələb etmiş, əks təqdirdə Şam diyarındakı bütün xristian əhalini sürgün edərək Anadoluya qovacağı ilə hədələmişdi. Herakl məcburən Anadolu torpaqlarına girmiş xristi-

an ərəb qəbilələrini Cəzirəyə geri yollamışdı. Bu hadisədən sonra Cəzirədəki xristian ərəb və kürd qəbilələri üzərindəki nəzarət gücləndirilmidi. Onların İslamı qəbul etmək istəyən övladlarına mane olmaları qəti qadağan edilmişdi. Hicri 18-ci ilin şaban ayında (avqust 639) Şam diyarında hazırlanmış böyük bir ordu Cəzirənin geri qalan ərazilərinə və Anadolunun şərqinə hərbi yürüş üçün yola çıxmışdı. Bu ordunun baş komandanı Əbu Sə'd İyaz ibn Qənəm əl-Fıhri (r.ə) idi. Sol cinaha Əbu Əmr Səfvan ibn Müəttəl əs-Süləmi (r.ə) ilə Əbu Əbdurrəhman Həbib ibn Məsləmə əl-Fıhri (r.ə), sağ cinaha Səid ibn Əmr əl-Cumahi (r.ə), öncü qüvvələrin əmirliyinə isə Hubeyrə ibn Məsruq (r.ə) təyin olunmuşdular. Bu ordu Anadolunun cənub-şərqini fəth etmişdi. Bu hərbi əməliyyatlar nəticəsində Cəzirənin Urfa, Malatya, Harran, Mardin, Nuseybin, Hısn-Keyfə, Səruc, Ərzu'l-Beyda, Rasu'l-Əyn, Cisri-Mənbic, Sumeysat, Təll-Məvzən, Məyyafariqin, Amid (Diyarbəkir), Kəfərsud kimi şəhər və qalaları fəth olunmuşdu. Meysərə ibn Məsruq əl-Əbsinin (r.ə) başçılığı altındakı bir neçə minlik süvari mücahiddən ibarət ordu Ərzuruma qədər yürüş etmişdi.

Hicri 18-ci ilin ramazan ayında (sentyabr 639) Osman ibn Əbü'l-Asın (r.ə) ordusu isə şimal istiqamətində irəliləyərək Van gölü civarına gəlmiş və burada ermənilərin hərbi qüvvələri ilə döyüşə girmişdi. Bu döyüş İslam ordusunun qələbəsi ilə nəticələnmişdi. Ərməniyyə əhalisi ilə cizyə müqabilində əhdnamə bağlanmışdı. Osman ibn Əbü'l-Asın (r.ə) ordusu Van gölü hövzəsini ələ keçirmiş və Əxlat şəhəri fəth olunmuşdu.

Hicri 18-ci (639) ilin payızında Şam diyarında vəba xəstəliyi yayılmışdı. Bu xəstəlik müsəlmanlardan da bir çox insanın ölümünə səbəb olmuşdu. O cümlədən Allah Rəsulunun (s.ə.v) "*İslam ümmətinin əmini (etibarlı adamı)*" deyə adlandırdığı Əbu Ubeydə Amir ibn Abdullah ibn Cərrah əl-Fıhri əl-Qureyşi (r.ə) da vəbaya yoluxmuş və vəfat edərək Beysan şəhəri yaxınlığında dəfn edilmişdi. O, vəfatından əvvəl İyaz ibn Qənəm əl-Fıhrini (r.ə) yanına çağırıb xəlifənin təlimatına uyğun olaraq onu öz yerinə Şam və Cəzirə canişinliyinə təyin etmişdi. Həmin vaxt Dəməşq valisi olan Yəzid ibn Əbu Süfyan (r.ə) da vəbaya yoluxaraq vəfat etmişdi. O, xəstə yatağında ikən kiçik qardaşı Müaviyəyə (r.ə) vəkalətən Dəməşqin idarəçiliyin tapşırmışdı. Ömər ibn Xəttab (r.ə) Yəzidin (r.ə) ölüm xəbərini alandan sonra Müaviyəni (r.ə) qardaşının yerinə təyin etmişdi. Bu vəba epidimeyası vaxtı Şam diyarında əshabdan bəzi tanınmış şəxslər vəfat etmişdilər. Bunlardan biri də Əbu Cəndəl ibn Suheyl ibn Əmr (r.ə) idi.

*Azərbaycanın Fəthi*

Azərbaycana təşkil olunmuş ilk səfər haqqında orta əsrlərdə yaşamış tarixçi Əbu Abdullah Muhəmməd ibn Ömər əl-Vaqidi öz əsərində məlumat vermişdir. Osman ibn Əbü'l-As (r.ə), İyaz ibn Qənəm (r.ə), Əbu Musa əl-Əş'əri (r.ə), Sə'd ibn Əbu Vəqqasın (r.ə) əmri altındakı mücahidlər Cəzirə və Ərməniyyəni fəth edilmiş və cizyə vermələri şərtiylə yerli əhali ilə əhdnamələr bağlamışdılar. Əbu Ubeydə ibn Cərrahın (r.ə) vəfatından sonra Ömər ibn Xəttabın (r.ə) əmri ilə əl-Cəzirə qəsəbəsi (indiki Cizrə) əyalət mərkəzi və İyaz ibn Qənəm (r.ə) də bu əyalətə canişin təyin edilmişdi. Malatya şəhərindən şimali Afrikaya qədər olan məmləkətlər bu əyalətə daxil edilmişdi. İyaz ibn Qənəm (r.ə) Yərmuk müharibəsi qəhrəmanlarından idi. O, canişinliyə başlayandan sonra müxtəlif istiqamətlərdə fəth hərəkatını davam etdirmiş, Diyarbəkir, Urfa, Hərran kimi şimali Mesopatamiyanın  bir sıra şəhərlərini fəth olunmuşdu. İyaz ibn Qənəmin (r.ə) əmri ilə müsəlman əsgərlər Bidlisin dağ keçidlərindən keçərək Van gölünün şimalından Azərbaycan torpaqlarına girmişdilər.

İyaz ibn Qənəm (r.ə) Van gölünün şimalında yerləşən Əxlat qalasından hərbi baza kimi istifadə etmiş və Ərməniyyə vilayətindəki bir çox qala və şəhərləri fəth etmişdi. Hicri 18-ci ildə (11 yanvar 639-31 dekabr 639) aparılmış bu hərbi əməliyyatlar vaxtı onun əmri altındakı əsgərlər Azərbaycanın cənub-qərbindəki üç böyük şəhəri Xoy, Səlmas, Urmiya və ətraf əraziləri fəth etmişdilər. Bu xilafət ordularının Azərbaycana ilk dəfə daxil olduğu tarixdir. Salnaməçi Əbu Abdullah Muhəmməd ibn Ömər əl-Vaqidinin qeyd etdiyinə görə bu üç şəhərin əhalisi çox azı istisna olmaqla İslam dinini qəbul etmişdi. İyaz ibn Qənəm (r.ə) oraya insanlara Qur'anı və İslam dinini öyrətmək üçün müəllimlər təyin etmiş, özü isə əsgərləri ilə birlikdə əl-Cəzirəyə qayıtmışdı.

Ərəblər Azərbaycana təşkil etdikləri hərbi səfərlərdə bir daha bu yoldan istifadə etməmişdilər. Belə ehtimal etmək mümkündür ki, yüksək dağ silsilələri arasından keçən bu yollar səhra milləti olan ərəblər və onların əsas nəqliyyat vasitələri olan dəvələrin hərəkəti üçün əlverişli deyildi. Həmədan, Rey, Zəncan kimi şəhərlər fəth edildikdən sonra Azərbaycana gedən cənub yolu açılmış və yuxarıda haqqında danışdığımız yol öz əhəmiyyətini itirmişdi. Xoy, Səlmas və Urmiya əhalisinin İslam dininə meyilli olduğuna baxmayaraq, bu fəth hərəkatı müvəqqəti olmuş və bir neçə il sonra Utbə ibn Fərqəd (r.ə) həmin şəhərləri ikinci dəfə fəth etmişdi.

Utbə ibn Fərqəd əs-Suləmi (r.ə) hicri 18-ci ilin sonlarında (payız-qış 639) xəlifə Ömər ibn Xəttabın (r.ə) əmri ilə kufəli əsgərlərin başında Fərat çayı boyunca şimal istiqamətində hərəkətə keçərək çayın qərb və şərq sahillərini və Mosul

şəhərini fəth etmişdi. Mosuldan şimal-şərqə istiqamət alan Utbə ibn Fərqəd (r.ə) Azərbaycan torpaqlarına daxil olmuş və Urmiya şəhərini zəbt etmişdi. Urmiya gölünün qərb sahili ilə şimala irəliləyən İslam ordusu Səlmas və Xoy şəhərlərini də fəth etmişdi. Utbə ibn Fərqədin (r.ə) əsgərləri burada məğlubiyyətə uğratdıqları Sasani ordusundan külli miqdarda qənimət almışdılar.

Nəhavənd döyüşündən (h. 21/m. 642) bir müddət əvvəl Əmmar ibn Yasirin (r.ə) yerinə Kufə canişinliyinə təyin olunmuş Muğirə ibn Şu'bə (r.ə) vəzifəsini icraya başladıqdan sonra xəlifənin məktubunu Huzeyfə ibn əl-Yəmana (r.ə) çatdırmışdı. Bu vaxt artıq Nəhavənd döyüşü bitmiş və Huzeyfə ibn əl-Yəman (r.ə) öz əsgərləri ilə birlikdə Nəhavənd yaxınlığındakı hərbi düşərgədə qərar tutmuşdu. Ömər ibn Xəttab (r.ə) məktubda Huzeyfə ibn əl-Yəmana (r.ə) Azərbaycana hərbi səfərə çıxmağı əmr etmiş və onu Azərbaycan canişinliyinə təyin etdiyini yazmışdı. Nəhavənddən hərbi yürüşə başlayan Huzeyfə ibn əl-Yəman (r.ə) Azərbaycanın cənub-şərqində yerləşən Ərdəbil şəhəri ətrafına çatmışdı. O dövrdə Ərdəbil Azərbaycanın cənubundakı ən böyük şəhər və paytaxt idi. Sasani canişini bu şəhərdə yaşayırdı. Canişin Bacərvan, Şiz, Miyanəc və digər şəhərlərdən topladığı ordu ilə Huzeyfə ibn əl-Yəmanın (r.ə) ordusunun qarşısına çıxmışdı. Ərdəbil yaxınlığında baş vermiş döyüş müsəlmanların zəfəri ilə bitmişdi. Salnaməçi Əhməd Bəlazurinin bildirdiyinə görə döyüşdən sonra Huzeyfə ibn əl-Yəman (r.ə) ərdəbillilərlə əhdnamə bağlamışdı. Əhdnaməyə görə şəhər əhalisindən heç kim öldürülməyəcək, əsir alınmayacaq və məbədlər dağıdılmayacaqdı. Əhali illik 800 min dirhəm cizyə ödəməyi qəbul etmişdi. Huzeyfə ibn əl-Yəman (r.ə) öz əsgərləri ilə Ərdəbildən Xəzər dənizi sahili boyunca şimala doğru hərəkət edərək Muğana gəlmiş, burada müqavimət göstərənlər məğlubiyyətə uğradılmış və yerli əhali ilə əhdnamə bağlanmışdı. Ərdəbil Nəhavənd zəfərindən sonra fəth edilmişdi. 643-cü ildə isə Utbə ibn Fərqəd (r.ə) Huzeyfənin (r.ə) yerinə Azərbaycana canişin təyin edilmişdi. Buna görə də ehtimal ki, Ərdəbil 642-ci ilin sonu, 643-cü ilin əvvəlində fəth edilmişdi.

642-ci ildə Həmədanı ikinci dəfə fəth edən Nueym ibn Muqərrin əl-Muzni (r.ə) buradan Reyə getmişdi. Reyə getməmişdən əvvəl o, Vaci-Ruz döyüşündə iştirak etmiş ordudakı əmirlərdən biri olan Bukeyr ibn Abdullah əl-Leysiyə (r.ə) öz dəstəsi ilə Hulvanda qalmağı əmr etmişdi. Bir müddət sonra xəlifə Ömər (r.ə) Bukeyr ibn Abdullah (r.ə) və Utbə ibn Fərqədə (r.ə) Azərbaycana gedərək buradakı Sasani ordusunun qalıqlarını təmizləmək əmrini vermişdi. Əmrə görə Bukeyr ibn Abdullah (r.ə) Hulvandan şimal istiqamətinə hərəkət edəcəkdi. Öz ordusu ilə Mosulda olan Utbə ibn Fərqəd (r.ə) isə şəmal-şərqə

doğru gedəcək, beləcə iki ordu Azərbaycanın mərkəzinə doğru irəliləyərkən yolda birləşəcəkdilər.

Sasanilərin sərkərdələrindən biri olan İsfəndiyar Fərruxzadə Azərbaycanın müxtəlif şəhərlərindən əsgər toplamağa və ərəblərlə vuruşmaq üçün müharibə hazırlıqlarına başlamışdı. İsfəndiyar Qadisiyyə döyüşündə öldürülən iranlı sərkərdə Rüstəm Fərruxzadənin qardaşı idi. Kəşfiyyatın bu xəbəri gətirməsindən sonra Bukeyr (r.ə) yürüşü dayandıraraq Mədinəyə, Ömər ibn Xəttaba (r.ə) ətraflı məlumat vermiş və əlavə qüvvə istəmişdi. Ömər ibn Xəttab (r.ə) Nueym ibn Muqərrinə (r.ə) məktub yazaraq Simak ibn Xarəşə əl-Ənsarini (r.ə) öz əsgərləri ilə Bukeyrə köməyə göndərməsini əmr etmişdi. Bu vaxt Reyin mühasirəsi ilə məşğul olan Nueym (r.ə) öz qüvvələrini bölməmək üçün xəlifənin əmrini dərhal yerinə yetirə bilməmişdi. Bu səbəbdən də Bukeyr ibn Abdullah (r.ə) İsfəndiyarın ordusuna qarşıköməkçi qüvvələri gözləmədən vuruşmağa məcbur olmuşdu. Gərmizan dağ silsiləsi yaxınlığında baş vermiş şiddətli döyüş ərəblərin qələbəsi ilə nəticələnmişdi. İsfəndiyar Fərruxzadə əsir alınaraq Bukeyr ibn Abdullahın (r.ə) yanına gətirilmişdi. Bukeyr (r.ə) İsfəndiyarla söhbət edərkən İsfəndiyar ondan soruşmuşdu: "*sən müharibəni çox sevirsən, yoxsa sülhü?*" Bukeyr "*sülhü daha çox sevirəm*" deyə cavab verəndən sonra İsfəndiyar ona "*elə isə məni öldürtmə, əgər sən məni öldürtsən azərbaycanlılar səninlə əhdnamə bağlamayacaqlar, dağlara qalxıb müqaviməti davam etdirəcəklə*r". Bukeyr ibn Abdullah (r.ə) onun bu təklifini qəbul etmişdi.

Döyüş bitəndən bir neçə gün sonra Simak ibn Xarəşə əl-Ənsari (r.ə) öz əsgərləri ilə birlikdə Bukeyr ibn Abdullahın (r.ə) olduğu yerə gəlib çatmışdı. Utbə ibn Fərqədin (r.ə) də gəlib çatmasından sonra bu üç sərkərdənin əmrindəki ordular bir neçə qala istisna olmaqla cənubi Azərbaycanı tamamən ələ keçirmişdilər. Cənubi Azərbaycanın fəth edilməsindən sonra Bukeyr ibn Abdullah (r.ə) xəlifə Ömərə (r.ə) məktub yazaraq bütün baş vermiş hadisələr haqqında ona təfərrüatlı məlumat vermişdi. Ömər ibn Xəttab (r.ə) Bukeyrə (r.ə) yazdığı cavabda fəth olunmuş ərazilərin idarə olunması işini Utbə ibn Fərqədə (r.ə) tapşırmasını və Simak ibn Xarəşənin (r.ə) də öz əsgərləri ilə Utbənin (r.ə) əmrinə tabe olmasını, Bukeyr ibn Abdullahın (r.ə) isə öz ordusu ilə Babü'l-Əbvaba (Dərbənd) doğru irəliləməsini əmr etmişdi. Xəlifənin cavab məktubun alan Bukeyr (r.ə) İsfəndiyarı Utbənin yanında qoyaraq şimala doğru yürüşə başlamışdı.

Xəlifə Ömər ibn Xəttab (r.ə) hicri 22-ci (643) ilin əvvəlində Ərdəbil və Muğan fatehi Huzeyfə ibn əl-Yəmanın (r.ə) yerinə Utbə ibn Fərqədi (r.ə) Azərbaycan canişinliyinə təyin etmişdi. Həmin il Şəhrəzurdan Ərdəbilə gələn

Utbə ibn Fərqəd (r.ə) yerli əhalinin Huzeyfə (r.ə) ilə bağladıqları əhdnamənin şərtlərinə əməl etmədiklərinə, şəhər ətrafı ərazilərdə yaşayanların isə üsyan edərək məmurları qovduqlarına şahid olmuşdu. Bu səbəbdən də Utbə ibn Fərqəd (r.ə), Əmr ibn Utbənin (r.ə) başçılığı altındakı əsgərlərlə birlikdə həmin ərazilərə yürüşə çıxmışdı. Üsyan yatırılandan sonra ərdəbillilərlə bağlanmış əhdnamə yenilənmiş və yerli əhali əvvəlki şərtlərlə cizyə ödəməyi qəbul etmişdi.

Ordusu Gərmizanda məğlubiyyətə uğrayıb, özü də əsir olaraq ərəblərin əlinə keçən İsfəndiyar, Gərmizan döyüşündə iştirak edib sağ qalmış qardaşı Bəhrama ümid bəsləyirdi. Bəhram döyüşdən sağ qurtulandan sonra parçalanıb ətrafa dağılmış əsgərlərini toplamağa başlamışdı. O, eyni zamanda yerli əhaliyə müraciət edərək könüllülər toplayırdı. Yeni ordusunu hazırlayıb başa çatdıran Bəhram dərhal Utbə ibn Fərqədin (r.ə) ordusu ilə qarşılaşmaq üçün hərəkətə keçmişdi. Cənubi Azərbaycanın mərkəzi vilayətlərindən birində baş verən döyüşdə ərəblər qalib gəlmişdilər. Bəhramın ordu topladığı xəbərini eşidəndən sonra Bukeyr ibn Abdullah (r.ə) Dərbənd yürüşünü təxirə salıb Muğanda gözləməyə başlamışdı. Müsəlmanların döyüşü zəfərlə bitirdikləri xəbərini alandan sonra o, Dərbənd istiqamətində hərəkətə keçmişdi. Qardaşının məğlub olduğunu eşidəndən sonra İsfəndiyar əsirlikdən xilas olmaq ümidini itirərək Utbə ibn Fərqədə (r.ə) müqavilə bağlamağı təklif etmişdi. Utbə (r.ə) onun bu istəyini Mədinəyə, xəlifə Ömər ibn Xəttaba (r.ə) məktub yazaraq bildirmişdi. Xəlifənin bu təklifi məmnuniyyətlə qarşılamasından sonra Cənubi Azərbaycan hakimi İsfəndiyar Fərruxzadə ilə Mədinə İslam dövlətinin Azərbaycandakı canişini Utbə ibn Fərqəd (r.ə) arasında əhdnamə imzalanmışdı. Əhməd Bəlazuri və İbn Cərir ət-Təbəri kimi müəlliflər bu müqavilənin mətnini öz əsərlərində qeyd etmişdilər.

*Rəhman və rəhim olan Allahın adı ilə*

*Bu, əmirəlmöminin Ömər ibn Xəttabın canişini Utbə ibn Fərqəd tərəfindən, Azərbaycanın çöl və dağlıq bölgələrində, ətraf və ucqarlarında yaşayan əhaliyə verilən əhdnamədir. Onlar maddi vəziyyətlərinə müvafiq olaraq cizyə ödəmək şərti ilə əmniyyət içindədirlər. Bu vergidən uşaqlar, qadınlar, xəstələr, əllərində heç bir varidatı olmayan fəqirlər və özlərini ibadətə vermiş, dünya malından heç bir nəsibi olmayan, inzivaya çəkilmiş rahiblər azaddırlar. Onlar (əhali) öz yurdlarından keçib gedən müsəlman əsgərləri bir gecə və bir gündüz qonaq saxlayıb, onlara bələdçilik edib yol göstərməlidirlər. Onların (əhalinin) arasından müsəlmanlarla birlikdə əsgəri xidmətə gedənlər həmin ilin vergisindən azaddırlar. Xidmətləri bitib öz evlərinə qayıdandan sonra, səfərlərdə iştirak*

*etməyənlər kimi vergilərini ödəməlidirlər. Öz yurdlarını tərk edib gedənlər, əmin olacaqları yerdə məskunlaşana qədər əmin-əmanlıq içində olacaqlar.*

*Əhdnaməni Cündəb yazdı.*

*Bukeyr ibn Abdullah əl-Leysi və Simak ibn Xarəşə əl-Ənsari şahid oldular.*

İsfəndiyarla əhdnamə bağlanıb Azərbaycanın fəthi tamamlandıqdan sonra xəlifə Ömər ibn Xəttab (r.ə) Bukeyr ibn Abdullaha (r.ə) şimala, Dərbəndə doğru yürüşünü davam etdirmək əmrini vermişdi. Bu əmri dərhal yerinə yetirmək üçün hərəkətə başlayan Bukeyr (r.ə) şimal istiqamətində irəliləyərək Muğana gəlmiş, muğanlılarla vuruşaraq onları məğlubiyyətə uğratmışdı. Muğan bölgəsinə tamamən sahib olan Bukeyr (r.ə) yerli əhali ilə əhdnamə bağlamışdı. Əhdnamə aşağıdakı məzmunda idi.

*Rəhman və rəhim olan Allahın adı ilə*

*Bu, Bukeyr ibn Abdullah tərəfindən Qıbç dağlarından sayılan Muğan əhalisinə verilmiş əhdnamədir. Onların malları, canları, dini etiqadları və qanunları əmniyyətdədir. Bunun əvəzi olaraq hər həddi-büluğa çatmış kişi başına bir dirhəm və ya bunun bədəlini ödəyəcəklər. Hər bir müsəlmanla yaxşı rəftar edəcək, ona yol göstərəcək, bir gecə və bir gündüz qonaq saxlayacaqlar. Belə olsa xeyirxah olub, əmniyyətdə olarlar. Bu bizim vədimizdir və vəkil olaraq Allah yetər. Onlar bu şərtlərə xələl gətirsələr, əhdnamə hökmünü itirəcəkdir. Üsyançıları tutub təslim etməyə məcburdurlar. Əks təqdirdə onlar da üsyançılarla birlikdə sayılacaqlar.*

*Buna Şəmmax ibn Dirar, Rəsaris ibn Cənadib və Həmələ ibn Cəviyyə şahid oldular.*

Muğan Xəzər dənizilə Araz və Kür çaylarının arasında və Dərbənd yolu üzərində yerləşən strateji əhəmiyyətə malik bir yerdi. Muğanın fəthi ilə Dərbənd yolu müsəlmanların üzünə açılmışdı. Salnaməçi Muhəmməd ibn Cərir ət-Təbəri ərəblərin Azərbaycandakı fütuhat hərəkatını sıralayarkən Suraqə ibn Əmrin (r.ə) Şirvan və Dərbənd səfərini Bukeyr ibn Abdullahın (r.ə) Muğan səfərindən əvvəl qeyd edib, Suraqə ibn Əmrin (r.ə) ancaq Şirvan və Dərbəndi fəth etdikdən sonra Bukeyrə (r.ə) Muğana hərbi yürüş təşkil etməyi əmr etdiyini yazır. Halbuki Muğan Dərbənd və Şirvan yolu üzərində əhəmiyyətli bir maneə idi və bu bölgəni keçib şimala doğru hərəkət etmək hərbi və taktiki baxımdan qətiyyən məntiqə uyğun iş olmazdı.

Xəlifə Ömər ibn Xəttab (r.ə) Azərbaycanın fəthinə böyük əhəmiyyət verirdi. Xüsusilə də bu ölkənin şimal-şərqində yerləşən Şirvan məmləkətini və Babü'l-Əbvabın (Dərbəndin) İslam dövlətinə qazandırılması üçün çox çalışırdı.

Muğanın fəth olunmasından qısa müddət sonra Bukeyr ibn Abdullaha (r.ə) şimal istiqamətində irəliləməsini əmr edən xəlifə digər tərəfdən də Kufədə Şirvana yürüş üçün təchizatlı bir ordu hazırlanması barədə göstəriş vermişdi. Xəlifə bu ordunun sağ və sol cinah komandanlığına Huzeyfə ibn Useyd əs-Səqəfi (r.ə) və Bukeyr ibn Abdullahı (r.ə), avanqard qüvvələrin başçılığına Əbdürrəhman ibn Rəbiə əl-Bahilini (r.ə) təyin etmişdi. Qənimətlər, ərzaq, silah-sursat və maddi təchizat işlərilə Salman ibn Rəbiə əl-Bahili (r.ə) məşğul olacaqdı. Bu əzəmətli ordunun baş komandanlığına isə o dövrün məşhur sərkərdələrindən və bahadırlarından biri, Allah Rəsulunun (s.ə.v) əshabından Suraqə ibn Əmr (r.ə) təyin edilmişdi. Ordu xəlifənin əmri ilə döyüş nizamını pozmadan Kufədən yola çıxmışdı. Bəzi mənbələrdə Suraqə ibn Əmr (r.ə) ilə birlikdə Əbu Musa əl-Əş'ərinin (r.ə) də bu yürüşdə iştirak etdiyi və bu səfərin 640-cı ildə baş verdiyini qeyd edilir. Xəlifə İyaz ibn Qənəmin (r.ə) vəfatından (640) sonra əl-Cəzirə valiliyinə təyin etdiyi Həbib ibn Məsləməyə (r.ə) də məktub yazaraq Suraqə ibn Əmrın (r.ə) ordusunun ardınca Şirvana getməyi əmr etmişdi.

Əbdürrəhman ibn Rəbiənin (r.ə) əmri altındakı avanqard qüvvələr Dərbənd ətrafına gəlib çatdığı vaxt Albaniya hökmdarı Şəhribəraz (Varaz-Qriqor) ərəbləri səmimiyyətlə qarşılamışdı. Şəhribəraz Əbdürrəhman ibn Rəbiənin (r.ə) yanına öz adamlarını göndərərək onunla görüşmək istədiyini bildirmişdi. Əbdürrəhman (r.ə) onun bu istəyini rədd etməmiş və Şəhribəraz İslam ordusunun düşərgəsinə gələrək idarə etdiyi insanların müxtəlif millətlərdən olduğunu, bu insanlardan özünün çox da məmnun olmadığını və müsəlmanlarla əməkdaşlıq etmək istədiyini Əbdürrəhmana (r.ə) bildirmişdi. Bunun əvəzində Şəhribəraz idarəsi altındakı insanların cizyə vergisindən azad olunmasını istəmişdi. Bu mövzuda səlahiyyətli olmadığını bildirən Əbdürrəhman (r.ə) Şəhribərazı Suraqə ibn Əmrin (r.ə) yanına göndərmişdi. Suraqə ibn Əmr (r.ə) ona yalnız müsəlmanlarla birlikdə hərbi səfərlərdə iştirak edənləri cizyədən azad edə biləcəyini söyləmişdi. Suraqə ibn Əmr (r.ə) Mədinəyə məktub yazaraq xəlifəyə yaranmış vəziyyət və Şəhribərazın istəyi haqqında məlumat vermişdi. Ömər ibn Xəttab (r.ə) Suraqənin (r.ə) fikrini bəyənmiş və bu şərtlərlə əhdnamə bağlanmasını tapşırmışdı. Şirvan və Arran əhalisilə bu şərtlərlə əhdnamə bağlanması təsadüfi deyildi. Şəhribəraz və adamları bu yerləri, yəni Qafqaz dağlarındakı keçidləri və yolları yaxşı tanıyırdılar. Eyni zamanda xəzərilərin döyüş taktikasına və üsuluna bələd idilər. Muhəmməd ibn Cərir ət-Təbərinin öz əsərində qeyd etdiyi Şəhribərazla bağlanan əhdnamənin mətni aşağıdakı kimidir:

*Rəhman və rəhim olan Allahın adı ilə*

*Bu, əmirəlmöminin Ömər ibn Xəttabın canişini Suraqə ibn Əmr tərəfindən Şəhribəraza, albanlara və Albaniyada yaşayanlara verilən əhdnamədir. Hər hansı bir hadisə baş verib-verməməsindən asılı olmayaraq, hər hərbi səfərdə iştirak etmək, canişinin uyğun gördüyü hər yürüşdə iştirak etmək şərtilə onların canları və malları qorunacaq, dinləri və məzhəblərinə, dini ayinlərinin icrasına toxunulmayacaq və mane olunmayacaqdır. Zərər və ziyana uğramayacaqlar, heç bir şeyləri əskilməyəcəkdir. Bu əhdnamə Albaniya əhalisinə, əl-Bab (Dərbənd) bölgəsindəki dağlarda, dağ kənarlarında, məskunlaşanlara, onlarla qonşu ərazilərdə yaşayanlara və şərtləri qəbul edən hər kəsə şamil edilir. Onların arasından bu şərtləri qəbul edənlər cizyədən azaddırlar. Səfərbərlikdə iştirak etmək cizyə yerinə keçərlidir. Səfərbərlikdə iştirak etmək istəməyənlər (cənubi) Azərbaycan əhalisinin ödədiyi miqdarda cizyə ödəməlidirlər. Eyni zamanda onlar bələdçilik etməli və hər biri bir müsəlmanı bir gecə və gündüz qonaq saxlamalıdırlar. Səfərbərlikdə olanlar bundan azaddırlar. Səfərbərlik bitib öz yurdlarına qayıdandan sonra yenə bu şərtlərə əməl etməlidirlər.*

*Əhdnaməni Mərazə ibn Muqərrin yazdı. Əbdürrəhman ibn Rəbiə əl-Bahili, Salman ibn Rəbiə əl-Bahili, Bukeyr ibn Abdullah əl-Leysi şahid oldular.*

Suraqə ibn Əmr (r.ə) Şəhribərazla əhdnamə bağlayandan sonra əmri altındakı ordunu bir neçə hissəyə böldü və ətraf məmləkətlərə yürüş etmələrini əmr etdi. Həbib ibn Məsləmə (r.ə) Tiflisə, Huzeyfə ibn Useyd (r.ə) isə Gürcüstanın digər yerlərinə yürüş etmişdi. Xəlifə Ömər (r.ə) Suraqənin (r.ə) bu işini bəyənməmiş və hərbi dəstələri dərhal geri, Şirvana çağırmasını əmr etmişdi. Bu ordu üçün çox təhlükəli bir hərəkət idi. Kiçik dəstələrə bölünmüş ordu bir-birlərindən çox uzaq məsafələrə səfərə çıxmışdılar. Bundan başqa, onlara ərzaq və əlavə qüvvə göndərilməsi də çətinləşmişdi. Yeni fəth edilmiş İran və digər ölkələrin əhalisi müsəlmanların hər hərəkətini diqqətlə müşahidə edirdilər. Xəzərilərin qəfil hücumu əldə edilmiş bütün uğurları alt-üst edə bilərdi. Bu kiçik hərbi dəstələr heç bir müvəffəqiyyət əldə edə bilmədən geri, Şirvana qayıtmışdılar. Bir müddət sonra Suraqə ibn Əmr (r.ə) Şirvanda vəfat etmiş və onun yerinə Şimali Azərbaycan canişinliyinə Əbdürrəhman ibn Rəbiə əl-Bahili (r.ə) təyin edilmişdi.

Suraqə ibn Əmrin (r.ə) Dərbəndi fəth edib-etməməsi məsələsinə gəldikdə, hər şeydən əvvəl orta əsr İslam salnaməçilərinin bu haqda verdikləri məlumatları nəzərdən keçirək. İbn Cərir ət-Təbəri və İbn əl-Əsir Azərbaycanın fəthi haqqında "hicri 22-ci (643) il hadisələri" başlığı altında məlumat verib "*əl-Babın (Dərbənd) fəthi də bu ildə olmuşdur*" deyə qeyd edərək Dərbəndin Suraqə ibn Əmr (r.ə) tərəfindən fəth edildiyini yazırlar. Məsələni diqqətlə araşdırsaq bu

məlumatın doğru olmadığı qənaətinə gəlmək mümkündür. Hər şeydən əvvəl Şəhribərazla bağlanan əhdnamə sayəsində Şirvan sülhlə ərəblərin əlinə keçmişdi. Bu əhdnamənin ehtivasına isə "*əl-Bab (Dərbənd) bölgəsindəki dağlarda, dağ kənarlarında məskunlaşanlar*" daxil edilmişdir və heç bir halda Dərbənd şəhəri, qalası və səddindən söhbət getmir. Bundan başqa Əhməd əl-Bəlazuri və Musa Kalankaytuklu ərəblərin hərbi yürüşü vaxtı Gürcüstan və Arranın şimalının xəzərilərin nəzarətində olduğunu qeyd edirlər. Üstəlik orta əsr müsəlman salnaməçilər Suraqə ibn Əmrin (r.ə) ordusunun Dərbəndi mühasirəyə almasından, xəzərilərlə vuruşmasından bəhs etmirlər. Daha sonrakı illərdə Əbdürrəhman ibn Rəbiənin (r.ə) Bələncər qalasını mühasirəyə almasından, Salman ibn Rəbiənin (r.ə) Dərbənd qalasını xəzərilərdən alıb şəhəri fəth etməsindən bəhs edən mənbələri burada susmağa məcbur edən nədir? Əlbəttə ki, xəzərilərin Dərbənd kimi o dövrün ehtişamlı və möhkəm qalasını ərəblərə döyüşsüz təslim etdiklərini təsəvvür etmək mümkün deyil. Necə ki, irəlidə görəcəyimiz kimi Dərbənddən daha zəif və kiçik qala olan Bələncəri mühasirəyə alan ərəblərə xəzərilər şiddətlə müqavimət göstərərək qalanı öz əllərində saxlaya bilmişdilər. Nəticə etibarilə belə bir qənaətə gəlmək olar ki, Suraqə ibn Əmrin (r.ə) ordusu Dərbəndi deyil, onun cənubundakı dağlıq bölgələri sülh yolu ilə fəth etmişdir.

Hicri 23-cü ilin əvvəlində (643-cü ilin sonu) möminlərin əmiri Ömər ibn Xəttab (r.ə) Əş'əs ibn Qeys əl-Kindini Azərbaycan canişinliyinə təyin etmişdi. Bu vaxt Huzeyfə ibn əl-Yəmanla (r.ə) bağladıqları əhdnamənin şərtlərinə əməl etməyən şərqi Azərbaycan əhalisi üsyan etmişdi. Əş'əs ibn Qeys (r.ə) bu bölgəni yenidən zəbt edərək sabitliyi təmin etmiş və yerli əhalinin öz istəyilə onlarla Huzeyfə ibn əl-Yəmanla (r.ə) bağladıqları əhdnamənin şərtlərinə uyğun olaraq yeni əhdnamə bağlamışdı. Daha sonra Əş'əs (r.ə) Azərbaycan əhalisinə İslam dinini öyrətmək üçün fəth etdiyi yerlərə dövlət xəzinəsindən maaş alan müəllimlər təyin etmişdi. Xəlifə Ömər ibn Xəttab (r.ə) Suraqə ibn Əmrin (r.ə) vəfatından sonra Əbdürrəhman ibn Rəbiəni (r.ə) əl-Bab (Dərbənd) hüdudlarına, Şirvana canişin təyin etmişdi. Əbdürrəhman ibn Rəbiə (r.ə) xəzərilərin ölkəsinə bir neçə uğurlu yürüş gerçəkləşdirmişdi. Xəzərilər onun ordusu ilə qarşılaşmağa cəsarət etməyib qalalara çəkilərək müqavimət göstərmişdilər. Bu yürüşlərin birində Əbdürrəhman ibn Rəbiə (r.ə) xəzərilərin ölkəsinin içlərinə doğru 200 fərsəx (təqribən 400 km) irəliləmiş və ordusu heç bir itki vermədən çox miqdarda qənimət və əsirlə geri dönmüşdü.

*Misirin Fəthi*

Fələstin və Qəzzədəki Bizans ordularına qarşı uğurlu hərbi əməliyyatlar keçirən Əmr ibn əl-As hicri 20-ci (641) ildə 4 min nəfərlik ordusu ilə Ömər ibn Xəttabın (r.ə) əmrinə müvafiq olaraq Misirin fəthi üçün yola çıxmışdı. Ömər ibn Xəttab (r.ə) 4 min nəfərlik ehtiyat qüvvələrin komandanlığına Zubeyr ibn Əvvamı (r.ə) təyin edərək Misirə, Əmr ibn əl-Asın köməyinə göndərmişdi. Misir qıbtilərinin hökmdarı Bisans imperatorunun vassalı idi. Əmr ibn əl-Asın Qəzzədə məğlub etdiyi bizanslı general Artabon qaçıb Misirə getmişdi. Əmr ibn əl-As Misir torpaqlarına daxil olub Əynu'ş-Şəms adlı yerdə düşərgə salmışdı. Misir qıbtiləri Əbu Məryəm adı ilə tanınan öz baş yepiskoplarını elçi olaraq Əmrin (r.ə) ordugahına göndərmişdilər. Əmr ibn əl-As Əbu Məryəmə qıbtilərin ya İslamı qəbul etməli, ya da cizyə ödəməli olduqlarını bildirmişdi. O, Əbu Məryəmə belə xitab etmişdi: "*Məni diqqətlə dinlə. Həqiqət budur ki, Allah Muhəmmədi (s.ə.v) haqq dinlə öz elçisi olaraq bizim aramıza göndərmişdir. O, bizə bu dinə sıx bağlı olmağı əmr etmişdir. Allahın əmri ilə Muhəmməd (s.ə.v) bizim çiyinlərimizə belə bir yük qoydu; Allahın kəlamını başqa qövmlərə təbliğ etmək. Sonra o, bu dünyadan köçüb getdi və bizi bu dinlə baş-başa buraxdı. O, bizə ortada heç bir bəhanə qalmayacaq şəkildə Allahın dinini insanlara təbliğ etməyi əmr etmişdi. Biz sizi Allahın dininə dəvət edirik, müsəlman olun. Bu dəvəti qəbul edənlər bizimlə eyni məsabəyə, səviyyəyə yüksələr, etməyənlərə cizyə ödəməyi təklif edərik. Cizyə ödəyənlər bizim qorumamız və himayəmiz altında olarlar. Muhəmməd (s.ə.v) bizə ölkələri fəth edəcəyimizi müjdələmişdi. O, həmçinin bizə demişdi ki, qıbtilərlə aramızda olan əqrəbalıq səbəbiylə sizinlə xoş rəftar edək*". Əbu Məryəm bu haqda tək başıına qərar verə bilməyəcəyini söyləyib vaxt istəmiş, Əmr (r.ə) onlara dörd gün möhlət vermişdi. Misir qıptiləri müsəlmanların Şam diyarındakı qələbələrindən xəbərdar olduqları üçün bəziləri döyüşmədən cizyə müqabilində əhdnamə bağlamaq arzusunda olduqlarını bildirmişdilər. Lakin Artabon onları sayca özlərindən az olan düşmənə döyüşsüz təslim olmaq istəmələrindən ötürü qınamışdı. Artabonun təşviqi ilə Misir qıbtiləri Əmr ibn əl-Asın ordusu ilə döyüşmək qərarına gəlmişdilər. Onlar 4 günlük möhlət bitmədən Əynu'ş-Şəmsdəki İslam ordusuna gecə vaxtı hücum etmişdilər. Əmr ibn əl-As bu möhlət müddətinin hərbi hiylə ola biləcəyini nəzərə alaraq əsgərlərini sərbəst buraxmamış, döyüş nizamında saxlamışdı. Buna görə də misirlilərin hücumu qəfil və gözlənilməz olmamışdı. Hicri 20-ci ilin rəbiələvvəl ayında (aprel-may 641) baş verən döyüşün ilk günündə ordunun sağ cinahındakı yəmənli əsgərlər düşmənin ardıcıl həmlələri qarşısında geri çəkilmişdilər. Əmr ibn əl-As bu səbəbdən yəmənli əsgərlərin

əmirlərini ağır sözlərlə qınamışdı. Onlar Əmr ibn əl-Asa "*canımız dəmirdən deyil, üstəlik biz döyüşdən qaçmamışıq, sadəcə geri çəkilmişik*" deyəndə Əmr ibn əl-As onlara "*səsinizi kəsin, siz köpəkdən başqa bir şey deyilsiniz*" demişdi. Onlar da baş komandanın bu sözünə "*elə isə sən də köpəklərin əmirisən*" deyə cavab vermişdilər. Əmr ibn əl-As əmri altındakı ordudan Allah Rəsulunun (s.ə.v) səhabələrini seçərək sağ cinahdakı ordunun ön cərgələrinə göndərmişdi. Bunların arasında Əbu Burdə əl-Ənsrai (r.ə), Əbu Bərzə Nəzlə əl-Əsləmi (r.ə), Umeyr ibn Vəhb (r.ə) və digərləri vardı. Əynu'ş-Şəms döyüşü müsəlmanların qələbəsi ilə bitmişdi. Mücahidlər qaçan qıbti ordusunu təqib edərək bir çoxunu qılıncdan keçirmiş, əksəriyyətini də əsir götürmüşdülər. General Artabon da Əynu'ş-Şəms döyüşündə öldürülmüşdü. Döyüşdən sonra İslam ordusu yaxınlıqdakı qalanı zəbt etmişdi. Döyüşdə sağ qalan bizanslı və qıbtilər qaçıb İsgəndəriyyə şəhərinə sığınmıdılar. Əynu'ş-Şəms zəfərindən sonra qıbtilərin xristian din xadimlərindən bir qrup Əmr ibn əl-Asın yanına gələrək hərbi əməliyyatları dayandırmasını, cizyə müqabilində əhdnamə bağlamağı xahiş etmişdilər. Əmr ibn əl-As illik 50 milyon dirhəm müqabilində Misir qıbtiləri ilə əhdnamə bağlamışdı. Daha sonra İslam ordusu İsgəndəriyyənin fəthi üçün hərəkətə keçmiş və üç aylıq mühasirədən sonra İsgəndəriyyə fəth olunmuşdu.

Əhdanmə bağlanarkən qıbtilərin elçi hey'əti Əmr ibn əl-Asdan əsirlərin sərbəst buraxılmasını da istəmişdilər. Lakin Əmr ibn əl-As onlara "*siz əvvəlcə möhlət istədiniz, sonra özünüz bizə hücum etdiniz, indi də əsirlərin azad edilməsini istəyirsiniz?*" deyərək onların bu xahişini rədd etmişdi. Əmr ibn əl-As Misirin fəthi vaxtı alınan qənimətlərin beşdə birini, əsirlərlə birlikdə Mədinəyə göndərmiş və xəlifəyə yazdığı məktubda baş verənlər haqqında məlumat vermişdi. Ömər ibn Xəttab (r.ə) Əynu'ş-Şəms döyüşü vaxtı alınan hərbi əsirlər istisna olmaqla digər qıbti əsirləri azad edərək geri qayıtmalarına izn vermişdi.

Hicri 20-ci ildə (641) Əlqamə ibn Mucəzziz əl-Mudlici (r.ə) xəlifənin əmri ilə Həbəşistana yürüş etmişdi. O, Yəməndə gəmilərə mindirdiyi ordusunu Qırmızı dənizdən keçirərək Həbəşistana daxil olmuş və həbəşlərlə vuruşmuşdu. Lakin Əlqamə (r.ə) uğur qazana bilməyərək geri qayıtmışdı.

Həmin ildə bir sıra mühüm hadisələr də baş vermişdi. Peyğəmbərin (r.ə) səhabələrindən olan Muzəhhər ibn Rabi' əl-Ənsari (r.ə) Şam diyarından Mədinəyə gələrkən bir qrup xeybərli yəhudi onun tək olmasını fürsət bilərək pusqu qurmuş və Muzəhhəri (r.ə) qətlə yetirmişdilər. Ömər ibn Xəttab (r.ə) Muzəhhərin (r.ə) qatillərini aşkara çıxardaraq edam etdirmiş, Xeybər, Vadi əl-Qura, Nəcrandakı bütün yəhudilərin bir qismini Şam diyarına, bir qismini isə İraqa sürgün etdirmişdi. Şama sürgün edilənlər əsasən Əriha şəhərində, İra-

qa sürgün edilənlər isə Kufə şəhərində məskunlaşdırılmışdılar. Kufəyə sürgün olunmuş Hicaz yəhudilərinin bir qismi təməli müsəlmanlar tərəfindən qoyulmuş və əhalisinin tamamı müsəlmanlardan ibarət olan Kufənin iqtisadi və ictimai həyatında mövqe sahibi ola bilmək üçün zahirən İslamı qəbul etmiş kimi görünməyə başlamışdılar. Hələ Rəsulullah (s.ə.v) həyatda ikən İslama düşmən kəsilən, lakin indi sürgün olunmuş, zahirən müsəlman kimi görünməkdən başqa çarələri qalmayan bu yəhudi camaatın ələlxüsus Əli ibn Əbu Talibin (r.ə) xəlifəliyi və bundan sonrakı illərdə Kufənin siyasi və dini həyatındakı dəyişikliklərə ciddi təsirləri olacaqdır ki, bu haqda irəlidə söhbət açacağıq. Ömər ibn Xəttab (r.ə) Kufədə həmçinin Əbu Bəkrin (r.ə) xilafəti dövründə irtidad hərəkətləri ilə baş qaldırmış bədəvi ərəb qəbilələrinin mühüm bir qismini məskunlaşdırmışdı. O, əsasən Mudar qəbiləsinə mənsub bədəvi çöl ərəblərini İraqa köçürərək onları Kufə şəhəri və ətrafın bölgələrə yerləşdirmişdi.

Hicri 20-ci ildə (641) Allah Rəsulunun (r.ə) xalası qızı və xanımı Zeynəb bint Cəhş (r.ə), bibisi Safiyyə bint Əbdulmuttəlib (r.ə), əmisi Əbu Süfyan ibn Haris (r.ə) Mədinədə, əshabdan Bilal ibn Rəbah əl-Həbəşi (r.ə) Hələbdə, İyaz ibn Qənəm (r.ə) Cəzirədə vəfat etmişdilər.

*Xristian Məzhəbləri Arasındakı İxtilaflarının Fəthlərə Təsiri*

Misir, Şam diyarı, cənubi Qafqaz, cənubi və şərqi Anadolu kimi Bizans imperiyasının tərkibinə daxil olan və ya ondan vassal asılılığı olan ərazilərin qısa maddət ərzində fəth edilərək xilafətə birləşdirilməsinə bu torpaqlarda yaşayan insanların fəth hərəkatı qarşısında tutduqları mövqenin heç şübhəsiz böyük təsiri olmuşdur. Belə ki, bir çox hallarda bu ərazilərdəki Bizans hərbi birləşmələri İslam orduları ilə vuruşsalar da yerli xristian əhali müsəlmanlarla vuruşmamış, cizyə ödəmək müqabilində əhdnamə bağlayaraq öz şəhərlərini müsəlmanlara təslim etmişdilər. Bunun əsas səbəbi İslam fəthlərinin başlanmasından 3-4 əsr əvvəl başlayıb həmin dövrə qədər davam edən xristian teoloji mübahisələri nəticəsində yaranmış məzhəb ixtilafları və ayrılıqları idi. Bizans imperatorları tərəfindən rəsmi himayə görən diofizit-pravoslav kilsəsi ilə "şərq xristianlığı" adlanan monofizitlik arasında dərin və bərpası mümkünsüz olan parçalanma mövcud idi. Məsələnin bütün təfərrüatı ilə aydınlaşması üçün xeyli keçmişə, xristianlığın yaranma tarixinə qısaca nəzər salmalı olacağıq. Məlum olduğu kimi ilk isəvilər üç əsrə yaxın müddət ərzində bütpərəst romalıların təzyiq, zülm və işgəncələrinə məruz qalmışdılar. Onlar öz dini etiqadlarını açıqlaya bilmir, ibadətlərini gizli edir, dinlərini sərbəst yaşaya bilmirdilər. Bu dövrdə xristianlıq bütpərəst cəmiyyətlərdə və gizli şəkildə yayıldığı üçün köhnə

inamları özünə uyğunlaşdıra bilmir, tam əksinə, gizli də olsa yaşaya bilmək üçün, özü köhnə etiqadlara uyğunlaşmağa çalışırdı. Xristianlığı qəbul edən hər hansı bir romalı və ya yunan köhnə dini etiqadını tam tərk etməyərək iman edirdi. İlk dövr nəsraniləri isə buna ciddi etiraz edə bilmirdilər. Çünki zəif və təzyiq altında idilər. Mövcudluğunu qoruya bilmək üçün ilk isəvilərin tərəfdar kütləsinə ehtiyacı var idi. Dini mətnlər müxtəlif dillərə, o cümlədən yunan dilinə tərcümə olunmuşdu. Bu tərcümələrə nəzarət edə biləcək bir mərkəz mövcud deyildi, safı çürükdən ayıra bilmək üçün hər hansı bir meyar, etalon dini mətn də yox idi. Məlum olduğu kimi İsa peyğəmbər (ə.s) sadəcə 2,5 il peyğəmbərlik edə bilmişdi. İsa peyğəmbərdən (ə.s) bir müddət sonra isəvilik ilahi mənşədən uzaqlaşmış, qədim Roma və yunan bütpərəstliyinin təsiri altında formalaşmış yeni bir dinə çevrilmişdi. Məsələn qədim dövrlərdə politeist yunanların etiqadına görə baş tanrı Zevsin arvadı və oğlu var idi. Bu paqan etiqad müasir xristianlaqdakı ata tanrı, oğul tanrı, tanrı doğan bakirə (yəni Məryəm ə.s) kimi dini inancların meydana çıxmasında mühüm rol oynamışdı. Roma imperatoru I Konstantin (306-337) xristianlığı qəbul edəndən sonra 313-cü ildə Milan şəhərində xristianlığın sərbəst din olduğunu elan etmişdi. Lakin xristianlığın gizlilik, qadağan dövrünün sona çatması ilə bir çox problemlər də üzə çıxmışdı. Məlum olmuşdu ki, bir çox "müqəddəs yazı" mətnləri var və insanlar da bu mətnlərə əsasən formalaşmış müxtəlif etiqadlara inanırlar. Etiqaddakı bu ixtilaflar əksər hallarda xristian teoloqların bir-birlərini təkfir, yəni kafirlikdə ittiham etmələri ilə nəticələnirdi. Belə ixtilaflı fikirlərdən birinin müəllifi də İsgəndəriyyəli teoloq Arius idi. Xristianlar İsanın (ə.s) həm ilahi, həm də bəşəri xüsusiyyətlərə sahib olduğununu iddia edirdilər. Yəni onlara görə İsa (ə.s) həm insan idi həm də tanrı. Arius isə İsanın (ə.s) sadəcə insan olduğunu, Kəlam olduqdan, yəni Tanrının (ata tanrının) lütfünə məzhər olandan sonra tanrılıq xüsusiyyətinə büründüyünü iddia etmişdi. Yəni onun tanrılığı müstəqil deyil ata tanrıdan aslı bir tanrılıq idi. Bu iddia xristianlar arasında ciddi ixtilafa səbəb olmuşdu. Bütün bu ixtilaflara son qoymaq və dini mətnlərin hansının kanonik (həqiqi) hansının isə apokrif (saxta) olduğunu müəyyənləşdirmək üçün Roma imperatorlarının ciddi müdaxilələri ilə müşayət olunan bir çox kilsə qurultayı keçirilmişdi. Bu qurultaylarda alınan qərarlar problemi həll etməmiş əksinə, dərinləşdirmişdi. Xristian kilsəsinin bir neçə yerə bölünməsi, şərq xristianlığı anlayışının ortaya çıxması ilə nəticələnən 451-ci ildə keçirilmiş Xalkedon[74] qurultayında, belə demək mümkündürsə, kilsələr

[74] Xalkedon-indiki İstanbulun Kadıköy səmti.

arasındakı körpülər yandırılmışdı. Monofizit və diofizit adlanan etiqadi xristian məzhəbləri rəsmən bərqərar olmuşdu. İsanın (ə.s) həm ilahi, həm də bəşəri xüsusiyyətlərə sahib olduğuna inanan diofizitlər şərqi Roma imperatorlarının dəstəyinə arxalanaraq İsanın (ə.s) sadəcə ilahi xüsusiyyətlərə sahib olduğuna inanan monofizitlərə qarşı əsrlər boyu davam edən dözümsüzlük nümayiş etdirmişdilər. Şərq xristianları, hansı ki, bura Misir, Suriya, Ərməniyyə daxil idi, bəzən qətliamlarla müşayət olunan bu ağır təzyiqlər səbəbilə Bizans imperiyasına nifrət etməyə başlamışdılar. Buna görə də İslam orduları bir çox hallarda monofizit şərq xristianları üçün xilaskara çevrilirdilər. Bu səbəbdən də bu bölgələrin əhalisi İslam ordularına qarşı ciddi müqavimət göstərməmiş, müsəlmanlara qarşı Bizans imperiyasını dəstəkləməmişdilər. Buna görə də müsəlman idarəçilər xilafət ərazisindəki kilsələrin monofizit şərq xristianlığına mənsub olmasını arzu etmişdilər. Zaman ötdükcə bu müsəlman dövlətlərin kilsə siyasətinə çevrilmişdi. İslamın meydana çıxmasından qısa müddət sonra əsasən şərq xristianlarının yaşadıqları bölgələr xilafətin tərkibində daxil edilmişdi. Bizansla daimi müharibə vəziyyətində olan xilafət pravoslav-diofizit Bizans xristianlığına qarşı monofizit şərq xristianlığını dəstəkləmişdi. Monofizitliyin bütün xilafət ərazisindəki xristianlar arasında yayılması xilafətin mənafeyinə uyğun idi. Bununla Bizans xilafət torpaqlarında yaşayan xristianlar arasındakı tərəfdar kütləsini itirmiş olacaqdı. Müsəlman idarəçilər isə, cənubi Qafqaz da daxil olmaqla, öz ərazilərindəki monofizit xristianları daha rahat idarə edə biləcəkdilər. Bu səbəbdən də Əməvilərdən etibarən bütün müsəlman hökmdarlar monofizit şərq xristianlığını, o cümlədən qriqoryan erməni kilsəsini dəstəkləmiş, cənubi Qafqaz və şərqi Anadoludakı bütün kilsələrin qriqoryan erməni kilsəsinə bağlı olaraq fəaliyyət göstərməsi məcburiyyətini bərqərar etmişdilər. Bu əslində Sasanilərin kilsə siyasətinin davamı idi. Bizans başda ermənilər olmaqla monofizit şərq xristianlarına qarşı amansız tədbirlər görməkdən çəkinməmişdi. Bizansın və pravoslav yunan kilsəsinin dözümsüzlüyü qarşısında şərq xristianları Sasani imperiyasının simasında özünə sığınacaq tapmışdılar. Sasani şahları da şərq xristianlarını daim özlərinə ən təhlükəli düşmən hesab etdikləri Bizansa qarşı dəstəkləmişdilər. Xilafət isə bu siyasəti davam etdirərkən daha ciddi və qətiyyətli olmuşdu. Alban katolikosu Nersesin Bizansa meyl edərək Xalkedon qurultayının qəbul etdiyi prinsipləri yaymağa cəhd etməsini erməni katolikosu İlya Əməvi hökmdarı Əbdülməlik ibn Mərvana (685-705) məktubla bildirmişdi. Əbdülməlik ibn Mərvanın göndərdiyi bir dəstə müsəlman əsgərlə Albaniyanın paytaxtı Bərdəyə gələn İlya alban katolikosu Nersesi və tərəfdarlarını mühakimə edərkən müxtəlif işkəncələr vermişdi. Son-

ra onu zəncirlədərək acından ölməyə məhkum etmiş, yazdığı kitabların isə Tərtər çayına atılmasını əmr etmişdi. Qriqoryan erməni kilsəsinin pravoslav gürcü kilsəsinə qarşı da eyni tərz davranışları tarixi mənbələrdəki qeydlərlə öz təsdiqini tapmaqdadır. Erməni katolikosu Abraham Xalkedon kilsə qurultayının qərarlarını qəbul etdiyi üçün gürcü patriarx Küronu lənətləyərək gürcülərlə heç bir təmamsda olmamaq, nə ibadətdə, nə yeməkdə, nə içməkdə, nə dostluqda, nə uşaqların tərbiyəsində, nə onların xaçlarına ibadətdə, gürcüləri öz kilsələrinə buraxmamaq, onlarla qohum olmamaq, gürcülərlə yəhudilərlə olduğu kimi sadəcə ticari təmasda olmaq barədə qərarlar qəbul etmişdi. Ermənilərin orta əsrlərdə gürücülərə aid kilsələri mənimsəyərək onları sıxışdırdıqları bilinən bir tarixi həqiqətdir. Monofizit-qriqoryan erməni kilsəsinin Albaniya xristianları üzərində əsrlər boyu davam edən təsiri albanların bir qisminin əvvəlcə qriqoryanlaşmasına, sonra isə erməniləşməsinə səbəb olmuşdur. Əvvəlcə xilafətin, sonra isə müsəlman türk dövlətlərinin idarəsi altında olan şərqi Anadolunun pravoslav yunan əhalisi qriqoryan erməni kilsəsinin nüfuz dairəsinə daxil edilərək zamanla qriqoryanlaşmağa və erməniləşməyə məruz qalmışdılar. O cümlədən Gürcüstan ərazisində yaşayan indiki ermənilər də qriqoryanlaşmış və erməniləşmiş alban və gürcülərin törəmələridir. Ermənilər bir millət kimi öz varlıqlarını qoruyub saxlaya bilmələrini əvvəlcə xilafətə, sonra isə Böyük Səlcuqlu imperatorluğu, Anadolu Səlcuqlu dövləti kimi türk dövlətlərinin davam etdirdikləri kilsə siyasətinə borcludurlar. Orta əsr erməni salnaməçiləri bunun fərqində idilər və öz əsərlərində müsəlman və türk hökmdarlarını daim ehtiramla yad edirdilər. Ertməni salnaməçi Urfalı Matvey (Matthieu d'Édesse) Böyük Səlcuqlu sultanı Məlikşahın (1072-1092) qəlbinin xristianlara qarşı şəfqət və xeyirxahlıqla dolu olduğunu, onun İsanın övladları ilə çox yaxşı rəftar etdiyini, erməni xalqına rifah, sülh və xoşbəxtlik gətirdiyini qeyd etmişdi. Erməni patriarxı Vasiliy 1091-ci ildə Məlikşahın hüzuruna gedərək ondan erməni kilsəsinin, keşiş və rahiblərin vergilərdən azad edilməsi barədə xahiş etmiş, sultan Məlikşah da onun bu xahişini qəbul edərək erməni din xadimlərinin, rahiblərin və ümumiyyətlə erməni kilsəsinin bütün vergilərdən azad edilməsi barədə fərman vermişdi. Şübhəsiz ki, bu fərman müəyyən siyasi məqsədlərlə verilmişdi. Xristian din xadimləri, ermənilər də daxil olmaqla, bütün şərq xristianları üzərində böyük nüfuza malik idilər. Din xadimlərini vergidən azad etməklə Böyük Səlcuqlu sultanı ermənilərin, ümumiyyətlə bütün şərq xristianlarının Bizansa deyil, İslamın hakimiyyətinə meyl etmələrini təmin etmişdi.

*Dövlət İdarəçiliyinin Təkmilləşdirilməsi*

Allah Rəsulunun (s.ə.v) hicrətdən sonra Mədinədə qurduğu dövlət özünün həm forması, həm də mahiyyəti baxımından o dövrə qədər mövcud olmuş dövlət anlayışından kəskin fərqlənməkdə idi. Bu tamamilə yeni bir dövlət və idarəçilik anlayışı idi. İslam və onun müqəddəs kitabı olan Qur'an səltənəti, krallığı, hakimiyyətin irsi olaraq ötürülməsini rədd etmir. Qur'an Firon, Nəmrud kimi zalım krallardan bəhs etməklə yanaşı Zülqərneyn kimi ədalətli və Davud (ə.s), Süleyman (ə.s) kimi peyğəmbər-krallar haqqında da söz açılmaqdadır. Lakin buna baxmayaraq hər şeydən əvvəl onu qeyd edək ki, Allahın elçisi Muhəmməd (s.ə.v) kral, sultan deyildi. O, qonşu dövlətlərin başçılarına göndərdiyi məktublarda qeyd etdirdiyi kimi Allahın qulu və elçisi olan bir dövlət başçısı idi. Allah Rəsulunun (s.ə.v) təməlini qoyub meydana gətirdiyi dövlət onun şəxsinə, ailəsinə və soyuna aid bir mülk deyildi. Bu dövlət onun qoyduğu qanunlarla deyil, elçisi olduğu Allahın qoyduğu qanunlarla idarə olunmaqda idi və bu mövzuda Allah Rəsulu (s.ə.v) dövlət başçısı olaraq sadəcə həmin qanunları icra edirdi. Qanunları icra etməklə yanaşı həm də həmin qanunlara istinadən mühakimə haqqına sahib idi. Allah Rəsulu (s.ə.v) bir qəbilənin, millətin, xalqın, zümrənin, sinifin, soyun deyil ümmətin başçısı idi. Onun qurduğu dövlət İslam ümmətinin dövləti idi. Bu dövlətin sahibi İslam ümməti idi. Buna görə də Allah Rəsulunun (s.ə.v) vəfatından sonra ümmət, daha dəqiq desək ümmətin seçgin zümrəsi sahib olduğu dövlətin idarəçiliyini onun xəlifəsinə əmanət etmişdi. Əbu Bəkrin (r.ə) iki illik xilafəti dövrü daha çox yarımadadakı irtica və irtidad hərəkətlərinin qarşısının alınması ilə yadda qalmışdı. Bununla yanaşı Allahın kəlamının, Qur'anın bütün bəşəriyyətə çatdırılması yolunda ərəb yarımadasının xaricindəki ilk addımlar da Əbu Bəkrin (r.ə) hakimiyyəti dövründə atılmışdı. Ömər ibn Xəttabın (r.ə) təqribən on illik xilafəti dövründə isə Allah Rəsulunun (s.ə.v) qurduğu dövlətin hüdudları fəthlər nəticəsində xeyli genişlənmişdi. Bu genişlənmə əlbəttə özü ilə bir sıra yeni məsələləri də meydana gətirmişdi. Nil çayından Əmudərya çayına, Qafqaz dağlarından Hind okeanına qədər geniş bir əraziyə sahib bir dövləti idarə etmək üçün dövlət idarəetmə aparatının həm təkmilləşdirilməsi, həm də möhkəm təməllər üzərinə inşa edilməsi vacib idi.

Müsəlmanlar Əbu Bəkrə (r.ə) "Rəsulullahın xəlifəsi" deyə müraciət edirdilər və bu dövlət başçısı olaraq onun tituluna çevrilmişdi. O, Peyğəmbərin (s.ə.v) dövlət başçısı olaraq icra etdiyi işi davam etdirdiyi üçün onun xələfi, yəni yerinə keçən şəxs kimi tanınmışdı. Ömər ibn Xəttab (r.ə) isə Əbu Bəkrin (r.ə) xələfi olduğu üçün ona "*Rəsulullahın xəlifəsinin xəlifəsi*" kimi uzun və tələffüzü çətin

bir ləqəblə xitab edilmişdi. Lakin Muğirə ibn Şu'bənin (r.ə) ilk dəfə Ömərə (r.ə) iman edənlərin komandanı, başçısı mənasındakı "*əmiru'l-mu'minin*" ləqəbi ilə xitab etməsindən sonra Ömər ibn Xəttab (r.ə) və ondan sonrakı dövlət başçılarına müsəlmanlar "möminlərin əmiri" deyə xitab etmişdilər. Əməvi və Abbasi xəlifələri də möminlərin əmiri tutulunu daşımışdılar.

Hicri-qəməri təqvimin təsis olunması da Ömər ibn Xəttabın (r.ə) dövründə olmuşdur. Valilərdən gələn məktublarda sadəcə qəməri ayların yazılması, bundan başqa maliyyə, vergi dəftərləri kimi dövlət sənədlərində ayın tarixinin yazılmamasından irəli gələn bəzi anlaşılmazlıqlar sənədlərə gün, ay və ilin yazılması zərurətini meydana çıxarmışdı. Cahiliyyə dövründə ərəblərin istifadə etdikləri müəyyən bir təqvim yox idi, sadəcə indi də mövcud olan qəməri aylardan istifadə edirdilər. İlləri isə Fil hadisəsinin baş verdiyi tarix kimi mühüm hadisələrdən ötən aylara görə hesablayırdılar. Bu cür bir zərurətin meydana çıxmasından sonra xəlifə Ömər ibn Xəttab (r.ə) müşavirələrdən birində bu məsələni şura üzvlərinin müzakirəsinə açmışdı. Kimi bizanslıların, kimi iranlıların təqvimindən istifadə etməyi təklif etmişdi. Lakin xəlifə Əli ibn Əbu Talibin (r.ə) fikrini daha məqbul saymış və Allah Rəsulunun (s.ə.v) Məkkədən Mədinəyə hicrət etdiyi vaxt (sentyabr 622) başlanğıc götürülüb qəməri aylarla hesablanan təqvim qəbul edilmişdi. Məlum olduğu kimi Allah Rəsulunun (s.ə.v) hicrəti rəbiələvvəl ayında baş vermişdi. Bu isə qəməri təqvimin üçüncü ayı idi. Buna görə də belə qərara gəlinmişdi ki, həmin ilin birici ayının birinci günü, yəni məhərrəm ayının biri yeni təqvimin başlanğıcı kimi qəbul edilsin, bu da miladi təqvimlə 15 iyul 622-ci ilə təqabül edirdi. Beləcə hicri-qəməri təqvim meydana çıxmışdı. Hicri 16-cı ildən (02 fevral 637-22 yanvar 638) etibarən bu yeni təqvim istifadə olunmağa başlanmışdı. Qəməri, yəni ay təqvimindən qədim babillilər və digər millətlər də istifadə etmişdilər. Lakin İslamın qəməri təqvimi hicrəti başlanğıc olaraq götürməkdə idi.

Ömər ibn Xəttab (r.ə) Allah Rəsuluna (s.ə.v) yaxın olan səhabələri, ələlxüsus mühacirləri adətən valilik vəzifəsinə təyin etmirdi. O, səhabələri ordu komandanlığına, əmirliyə təyin edirdi, lakin valilik vəzifəsinə nadir hallarda təyin edirdi. Bunun bir sıra səbəbləri var. Hər şeydən əvvəl Allah Rəsuluna (r.ə) yaxın olan səhabələr ki, bunların qabaqcılları cənnətlə müjdələnmiş on nəfər (əşərətu'l-mubəşşərə) idi, həm də Qur'anı və sunnəni, yəni İslam hüququnu dərindən bilən insanlar idilər. Peyğəmərin (s.ə.v) hələ həyatda ikən cənnətlə müjdələdiyi bu on nəfərə Ömər ibn Xəttabın (r.ə) özü də daxil idi. Bunlardan Əbu Bəkr (r.ə) vəfat etmişdi. Osman ibn Əffan (r.ə), Əli ibn Əbu Talib (r.ə), Əbdürrəhman ibn Əvf (r.ə), Əbu Ubeydə bin Cərrah (r.ə), Sə'd ibn Əbu Vəqqas

(r.ə), Səid ibn Zeyd (r.ə), Təlhə ibn Ubeydullah (r.ə), Zubeyr ibn Əvvam (r.ə) isə həyatda idilər. Ömərin (r.ə) onlara öz yanında, Mədinədə ehtiyacı var idi. Bu insanlar onun məşvərət məclisinə, şuraya daxil idilər və xəlifə onlarla gördüyü bütün işləri müzakirə edirdi. Bundan başqa Ömər ibn Xəttab (r.ə) "*mən sevdiyim təmiz insanların vəzifə ilə bulaşmalarını arzulamıram*" deyərək onları vilayətlərin, şəhərlərin idarəçiliyinə təyin etmirdi. Bilindiyi kimi valilər öz işləri, icraatları ilə idarə etdikləri insanların heç də hamısını həmişə məmnun edə bilmirdilər. Bir çox hallarda valilərdən haqlı və ya haqsız şikayətlər edilirdi. Sərt məzacı ilə tanınan Ömər ibn Xəttab (r.ə) isə haqqında şikayət olan insanları, bu hətta öz doğma övladı belə olsa, ağır şəkildə cəzalandırmaqdan çəkinmirdi. Buna görə də Ömər ibn Xəttab (r.ə) İslamın ən çətin günlərində Peyğəmbərlə (s.ə.v) çiyin-çiyinə durmuş insanları incidə biləcəyi əndişəsi ilə valiliyə təyin etmirdi.

Onun valiliyə təyin etdiyi şəxslərdən müəyyən tələbləri var idi ki, bunlara ciddi şəkildə nəzarət olunurdu. Hər şeydən əvvəl valilər xüsusi yetişdirilmiş, bahalı cins ərəb atlarına minməməliydilər. Bahalı cins ərəb atına minmək qürur və təşəxxüs doğura bilərdi. Ömər ibn Xəttab (r.ə) xəlifə olduğu müddətdə etdiyi səyahətlərdə özü cins ərəb atı minməz, dəvə, qatır və ya ulaq minərək səfərə çıxardı. Vali bahalı və bəzəkli paltar geyməməli idi. Özü üçün xüsusi yemək hazırlatmamalı, yeməyini öz ailəsi ilə birlikdə yeməli idi. İdarəsi altında olan insanlardan kənar və uzaq yaşamamalı, evi xalqın evlərinin arasında olmalı və qapısı daim onu görmək istəyənlərin üzünə açıq olmalı idi. Kufə şəhəri salındığı vaxt insanlar orada qamış və möhrədən tikdikləri kiçik evlərdə yaşamaqda idilər. Lakin yanğın baş vermiş və qamış evlərin əksəriyyəti yanıb kül olmuşdu. Bu hadisədən sonra Sə'd ibn Əbu Vəqqas (r.ə) kufəlilərə kərpicdən ev tikməyə icazə vermişdi. Sə'd ibn Əbu Vəqqas (r.ə) şəhərin mərkəzində böyük bir məscid və onun yanında da böyük bir iqamətgah tikdirmişdi. O, Sasani şahının köşkünün qapısını sökdürərək Mədaindən Kufəyə gətirtmiş və həmin bu iqamətgaha qoydurmuşdu. Ömər ibn Xəttab (r.ə) bundan xəbər tutanda Sə'də (r.ə) yazdığı məktubu ona çatdırmaq üçün Muhəmməd ibn Məsləməyə (r.ə) vermiş və ona belə demişdi "*Kufəyə get. Sə'din (r.ə) tikdirdiyi igamətgahın qapısına odun yığdır və oda verib yandır. İgamətgahdan geri nə qalsa yıx. Bu məktubu da Sə'də ver və ona başqa heç bir söz söyləmə*". Kufəyə gələn Muhəmməd ibn Məsləmə (r.ə) xəlifənin əmr etdiyi kimi igamətgahı oda verib yandırmış, sonra divarlarını yıxdırmışdı. Sə'd ibn Əbu Vəqqas (r.ə) xəlifənin bu sətirlərini oxuyanda utandığı üçün çox kədərlənmişdi; "*Kəsranın igamətgahına bənzəyən bir igamətgah inşa etdirdiyinə dair xəbər aldım. Kəsranın sarayının qapısını da*

*gətirib oraya qoydurmusanmış. Yanına gələnlərin qarşısını kəsib geri qaytaran mühafizəçiləri qapına qoymaq niyyətində deyilsən ki? Bu Allah Rəsulunun (s.ə.v) yolunu buraxıb İran Kəsrasının yolunu tutmaq deyilmi? Unutma ki, Kəsranı taxtından alıb yerə atdılar. Və bunu sən etdin. Sən bunu edərkən sarayı Kəsranı qoruya bilmədi. Muhəmməd ibn Məsləməni (r.ə) o igamətgahı yandırmaq üçün göndərdim. O, səndən çəkinmədən bunu edəcək. Ey Sə'd! Bu dünyada sənə iki torpaq (çiy kərpicdən tikilmiş) ev yetər. Birində özün yaşa, digərində isə müsəlmanların ortaq malını, beytülmalı saxla*". Bu hadisədən sonra Sə'd ibn Əbu Vəqqas (r.ə) çiy kərpicdən sadə bir ev tikdirmiş və vəfat edənə qədər orada yaşamışdı.

Sə'd ibn Əbu Vəqqasa (r.ə) yazdığı başqa bir məktubunda isə xəlifə belə deyirdi: "*Müsəlmanlardan xəstə olanları ziyarət et. Ölənlərin cənazə mərasimində iştirak et. Qapın yanına gələnlərin üzünə daim açıq olsun. Sən sadəcə onlardan birisən. Aranızda bu fərq var ki, Allah sənə onlara yüklədiyindən daha ağır bir yük yükləmişdir və sən onların yükünü daşıyırsan. Mənə deyirlər ki, sənin ailə fərdlərin kasıb müsəlmanların minmədiyinə minir, geymədiyini geyir, yemədiyini yeyirlər. Unutma ki, iqtidar sahibinin Allahın nəzdində hər kəsdən fərqi bir vəziyyəti vardır. İqtidar sahibi yolunu azanda təbəəsi də yolunu azar. İnsanların ən bədbəxti isə idarəçiliyi altında olanları bədbəxt edəndir. Vəssəlam*".

Ömər ibn Xəttab (r.ə) Misir valiliyinə təyin etdiyi Əmr ibn əl-Asa yazdığı məktubunda belə deyirdi: "*Əmri altında olduğun şəxsin səninlə necə rəftar etməyini istəyirsənsə əmrin altında olanlarla elə rəftar et. Sənin haqqında mənə gələn xəbərlərə görə yanına gələn insanlarla danışarkən nəyə isə dirsəklənərək oturursan. Yanına gələnlər necə otururlarsa sən də eləcə dik otur. Hər hansı bir şeyə söykənməyə ehtiyacın yoxdur*".

Şam diyarındakı İslam ordusunun baş komandanı Əbu Ubeyd ibn Cərraha (r.ə) yazdığı məktubda xəlifə belə deyirdi: "*Allahın əmrlərini ancaq qəflətdən uzaq olan, sağlam düşüncəli və ağıl sahibi insanlar yerinə yetirə bilərlər. Beləcə insanlar haqqında danışa biləcəkləri hər hansı bir qüsurunu görüb o şəxs barədə danışmazlar. O, da bundan ötürü təbəəsinə qarşı kin və nifrət bəsləməz, olmayan şeylərin özü barəsində danışılmasından da qorxmaz*".

Bütün vilayətlərdə, şəhərlərdə, ordularda Ömər ibn Xəttabın (r.ə) gizlicə vəzifələndirdiyi şəxslər var idi. Bu şəxslər müntəzəm olaraq orada baş verənlər, ələlxüsus ixtiyar sahiblərinin hərəkət və davranışları barədə xəlifəyə yazılı xəbər çatdırırdılar. Mənbələrdə qeyd edildiyinə görə xəlifə bu şəxslərin varlığını gizləmiş, sadəcə vəfat edərkən belə bir istixbarat şəbəkəsi qurduğunu söyləmişdi. Bununla yanaşı o, həmin şəxslərin kimliyini açıqlamamışdı.

Ömər ibn Xəttab (r.ə) tez-tez Mədinəni və ətraf kəndləini gəzərək insanların vəziyyətindən şəxsən xəbərdar olurdu. O, tanınmamaq üçün bunu adətən gecələr edirdi. Mədinənin ətrafına qulluqçusu Əsləmlə birlikdə etdiyi belə səyahətlərindən birində soyuq bir gecə vaxtı uzaqdan içində ocaq yanan bir çadır görmüş və "*bu gecə vaxtı bunları oyaq qalmağa vadar edən nədir*" deyərək Əsləmlə birlikdə çadıra tərəf getmişdi. Xəlifə çadıra yaxınlaşanda uca səslə "*ocağın sahibinə Allahın salamı olsun*" deyərək salamlamışdı. Onun salamını çadırın içindən bir qadın almışdı. Xəlifə izn istəyərək çadıra girmiş və içəridə ağlayan bir neçə uşağı sakitləşdirməyə çalışan ananın ocağın üstündə qazan qaynatdığını görmüşdü. Xəlifə qadından "*bu uşaqları niyə belə ağlayır?*" deyə soruşanda qarşısındakının xəlifənin özü olduğunu bilməyən qadın "*acdırlar, ona görə ağlayırlar, qazanda su qaynadıb gözləri yuxuya gedənə qədər onları ovuduram. Allah əlbəttə Ömərdən bizim bu halımızın hesabını soruşacaq*" deyə cavab vermişdi. Ömər ibn Xəttabın (r.ə) "*Ömər sizin bu halınızı haradan bilsin" sözünə qadının "madam halımızdan xəbərsizdir niyə başda oturur*" deyə cavab verməsindən mütəəssir olan xəlifə dərhal Mədinəyə qayıdaraq ərzaq anbarına getmiş və bir çuvalın içini ərzaqla doldurmuşdu. Əsləm (r.ə) çuvalı daşımaq istəyəndə xəlifə ona *"qiyamət günü də məsuliyyətimi daşıyacaqsanmı Əsləm? Burax öz yükümü özüm daşıyım*" deyərək çuvalı çiyninə götürmüş və qadının çadırına yollanmışdı. Mənbələrin Əsləmin (r.ə) dilindən nəql etdiklərinə görə xəlifə gətiriyi ərzaqla uşaqlar üçün özü yemək hazırlamışdı. Əsləm (r.ə) deyirdi ki, "*ocağı alışdırmaq üçün üfürərkən tüstünün onun saqqalından necə qalxdığını görürdüm*". Qadın tanımadığı bu insanın qayğısından məmnun qalaraq "*sən xəlifəliyə Ömərdən daha layiqsən*" deyəndə xəlifə ona "*sən Ömər üçün Allaha dua et. Əgər bir gün onu görmək üçün Mədinəyə getsən, mən də orada olacağam"* deyə cavab vermişdi.

Ömər ibn Xəttab (r.ə) dövlət işlərini ən çox güvəndiyi, etibar etdiyi insanlara həvalə etsə də daim bütün işləri özü nəzarətdə saxlayır, ən kiçik təfərrüatla da maraqlanırdı. Barmağında daşıdığı gümüş üzüyünün üstündə "*nəsihət olaraq ölüm yetər*" yazısı həkk olunmuş xəlifənin həsaslığını göstərən bu sözü məşhur idi: "*əgər Fərat çayının sahilində bir keçi tələf olsa, qorxuram ki, Allah bunun da hesabını Ömərdən soruşar*".

Ömər ibn Xəttab (r.ə) hər bir vəzifə sahibinin səlahiyytinin hüdudunu dəqiqliklə müəyyənləşdirmişdi. Vilayətlərdəki əmirlər sadəcə orduya, hərbiyə aid işlərlə məşğul olmaqda idilər. Valilər mülki, inzibati işlər, qazılar ədliyyə işləri, amillər isə maliyyə və vergi işləri ilə məşğul olurdular. Onun ən mühüm icraatlarından biri də hər bir orduya hərbiçilərin ədli işləri ilə məşğul olan qazılar təyin etməsi olmuşdu.

Bu qazı-əsgərlər vilayətlərdəki mülki işlərə baxan qazılardan ayrı idilər. Bundan başqa vilayətlərdəki ədliyyə işlərinə valilərin hər hansı bir şəkildə müdaxilə etməsi qadağan edilmişdi. Vilayətlərdəki qazılar valiyə deyil birbaşa xəlifəyə tabe idilər.

Hicri 15-ci (636) ildə Ömər ibn Xəttab (r.ə) müsəlmanlara beytülmaldan illik maaş ödənməsi üçün hesablama aparmağı əmr etmişdi. Maaşların miqdarı müəyyən kateqoriyalara görə müəyyənləşdirilmişdi. Bu kateqoriyalar insanların İslamı qəbul etdikləri dövrlərə və Allah Rəsuluna (s.ə.v) yaxınlıqlarına görə tənzimlənmişdi. İlk olaraq Peyğəmbərin (s.ə.v) əmisi Abbas ibn Əbdulmuttəlib (r.ə) üçün illik 20 min dirhəm maaş təyin edilmişdi. Sonra Bədr döyüşündə iştirak edən səhabələr üçün illik 5 min dirhəm, sonra Bədrdən Hudeybiyyə gününə qədər olan dövrdə İslamı qəbul edənlər üçün illik 4 min dirhəm, Hudeybiyyədən Allah Rəsulunun (s.ə.v) vəfatına qədər İslamı qəbul edənlər üçün illik 3 min dirhəm maaş təyin edilmişdi. Əbu Bəkrin (r.ə) xilafətindən Qadisiyyə döyüşünə qədər olan döyüşlərdə iştirak etmiş qazilər üçün illik 3 min dirhəm təyin olunmuşdu. Qadisiyyə döyüşü ilə Şam diyarındakı döyüşlərdə iştirak etmiş mücahidlərə illik 2000 dirhəm, bu döyüşlərdə fərqlənənlərə 2500 dirhəm, Qadisiyyə və Yərmukdan sonrakı döyüşlərdə iştirak etmiş mücahidlərə illik min dirhəm illik maaş təxsis edilmişdi. Bundan başqa Bədr döyüşündə iştirak etməmələrinə baxmayaraq dörd şəxsə Bədr qazilərinə ayrılan qədər, yəni illik 5 min dirhəm maaş ayrılmışdı. Bunlar Həsən ibn Əli ibn Əbu Talib (r.ə), Hüseyn ibn Əli ibn Əbu Talib (r.ə), Əbu Zərr əl-Ğifari (r.ə) və Salman əl-Farisi (r.ə) idilər. Peyğəmbərin (s.ə.v) həyatda olan xanımları üçün illik 10 min dirhəm maaş ayrılmışdı. Xəlifə (r.ə) onlardan ən gənci olan Ayşəyə (r.ə) 12 min dirhəm təxsis etmişdi, lakin Ayşə bint Əbu Bəkr (r.ə) digərləri kimi 10 min dirhəmi qəbul edərək, geri qalan 2 min dirhəmdən imtina etmişdi.

Hər bir döyüşdə alınmış qənimətlərin beşdə dördü mücahidlər arasında bölünərkən həmin döyüşdə şəhid olanların hissəsi varislərinə ödənmişdi. Bundan başqa xəlifə yuxarıda sadalanan döyüşlərdə şəhid olmuş müsəlmanların dul və yetimlərinə 200-dən 500 dirhəmə qədər illik maaş ayırmışdı. Heç bir döyüşdə iştirak etməmiş müsəlmanlara isə hər il xəzinədən 50-dən 150 dirhəmə qədər maaş ödənməkdə idi.

İllik maaşlar təyin edərkən Ömər ibn Xəttab (r.ə) Allah Rəsulunun (s.ə.v) ev əhlinə, əshabına, onların İslam qarşısındakı xidmətlərinə görə üstünlük vermişdi. Xəlifə Allahın nəzərində üstün olan insanları, yəni Allah Rəsulunun (s.ə.v) mühacir və ənsardan olan səhabələrini digərlərindən fərqləndirmişdi. Hansı ki, Allah bu insanların əməyini heç vaxt zay etməyəcəyinə dair (Tövbə 120; Hud 115) söz vermişdir.

*"(İslamı) ilk əvvəl qəbul edib (bu işdə başqalarından) irəli düşən mühacirlərə və ənsara, həmçinin yaxşı işlər görməkdə onların ardınca gedən kimsələrə gəldikdə, Allah onlardan, onlar da Allahdan razıdırlar"* (Tövbə 100)

*"İman gətirib (Məkkədən Mədinəyə) hicrət edənlər, Allah yolunda cihad edənlər (mühacirlər) və (Peyğəmbərlə mühacirlərə) sığınacaq verib kömək edənlər (ənsar)-məhz onlar həqiqi möminlərdir. Onları (axirətdə) bağışlanma və tükənməz (gözəl, minnətsiz) ruzi gözləyir!"* (Ənfal 74)

"*Muhəmməd Allahın Elçisidir. Onunla birlikdə olanlar kafirlərə qarşı sərt, öz aralarında isə mərhəmətlidirlər. Sən onları rüku edən, səcdəyə qapanan, Allahdan lütf və razılıq diləyən görərsən. Əlamətləri isə üzlərində olan səcdə izidir*" (Fəth 29)

Ömər ibn Xəttab (r.ə) illik maaşlar təyin edərkən ərəb və qeyri-ərəb səhabələri ayırmamışdı. Bilindiyi kimi Allah Rəsulu Muhəmmədin (s.ə.v) səhabələri arasında kifayət qədər qeyri-ərəblər də var idilər. Məsələn Bilal ibn Rəbah əl-Həbəşi və qardaşı Xalid ibn Rəbah, Dureyd ər-Rahib, Əbrəhə əl-Həbəşi, Asim əl-Həbəşi, Xalid ibn Hüvərra, Nafi' əl-Həbəşi, Əbu Nizar afrikalı, Abdullah ibn Səlam əl-İsraili, Əli ibn Rifa'ə, Sə'ləbə ibn Qeys, Əsəd ibn Ubeyd əl-Qurəzi, Əmmar ibn Sə'd yəhudi, Əzdad ibn Fəsaə, Firuz əd-Deyləmi, Maqsəm əl-Farsi, Qeys ibn Vəhriz, Salman əl-Farsi, Yəzid ibn Xosrov iranlı, Abbas ən-Nəvəvi, Bəğum ər-Rumi, Bəl'əm ər-Rumi, Əzraq ibn Uqbə, Cəbr ər-Rumi yunan, Cəbr ibn Abdullah, Mə'bur əl-Qıbti, Yaqub əl-Qıbti, Əbu Rafi' əl-Qıbti isə Misirin yerli xalqı olan qıbtilərə mənsub səhabələr idilər. Allah onlardan razı olsun. Bunların bəziləri bir vaxtlar kölə olaraq İslamı qəbul etmiş, daha sonra azadlığa qovuşmuşdular.

Məkkənin fəthindən sonra İslamı qəbul etmiş Səfvan ibn Uməyyə, Suheyl ibn Əmr, Haris ibn Hişam kimi bəzi Qureyş zadəganları və əsilzadələri xəlifə Ömər ibn Xəttabın (r.ə) onlar üçün təyin etdikləri maaşları bəyənməmiş "*keçmiş kölələrə belə bizdən daha çox verdin, halbuki ehtirama bizdən daha layiq olanı yoxdur*" deyərək bu maaşları almaqdan imtina etmişdilər. Ömər ibn Xəttabın (r.ə) onlara "*mən bu maaşları qəbilə və nəsil mənsubiyyətinə görə deyil insanların İslamı qəbuluna və Allahın dininə xidmətlərinə görə təyin etdim*" deməsindən sonra adı çəkilən şəxslər bununla razılaşmış və xəlifənin onlar üçün aydığı miqdara qane olmuşdular.

Bəzi insanlar xəlifəyə zəkat, cizyə, uşr və qənimət mallarından beytülmala toplanan gəlirin bir hissəsini ehtiyat olaraq ayırmağı tövsiyə etmişdələr. Lakin xəlifə bunu qəbul etməyərək belə demişdi: "*bu şeytanın sizin dilinizə gətirdiyi sözdür. Bundan Allaha sığınıram. Mən insanlar üçün sadəcə Allaha və Rəsuluna (s.ə.v) itaəti saxlayıram. Dünya malı sizinlə dininiz arasına*

*girməyə başladığı vaxt məhv olmusunuz deməkdir*". Ömər ibn Xəttab (r.ə) maddi nemətlərin bir yerdə yığılıb qalmaması, insanlar arasında dövr etməsi üçün beytülmala il ərzində toplanan bütün məbləği həmin il ərzində sərf edirdi. Hamıya haqqı olan illik maaşını ayırandan sonra məşvərət məclisindəkilərə xitab edərək belə demişdi: "*mən ticarətlə məşğul olan bir insan idim. Allah bu ticarətimlə ailəmin və övladlarımın ruzisini təmin edirdi. İndi siz məni öz işlərinizlə məşğul etməkdəsiniz. Sizin fikrinizcə beytülmalda mənim nə qədər haqqım var, hansı məbləğ mənə halal olar?*". Şura üzvlərinin hər biri öz fikrini söyləyərkən sadəcə Əli ibn Əbu Talib (r.ə) susaraq onları dinləmişdi. Ömər ibn Xəttab (r.ə) hər kəsi dinləyəndən sonra üzünü özü kimi zahid həyatı sürən Əliyə (r.ə) tutaraq "*sən bu haqda nə deyəcəksən ey Əli?*" deyə soruşmuş və Əli ibn Əbu Talib (r.ə) "*sadəcə sənin və ailənin dolanışığı üçün kifayət edən qədər, bundan artığına haqqın yoxdur*" deyə cavab vermişdi. Xəlifə "*doğru söz Əlinin dediyidir*" deyərək onunla razılaşmış, özünün və ailəsinin illik məişət xərclərini hesablatdıraraq həmin məbləğdə özünə maaş ayırmışdı. Lakin bu məbləğ çox az idi və bunu hər kəs bilirdi. Bunu xəlifənin özünün, ailəsi və övladlarının həyat tərzindən, yeyib içdiklərindən, geydikləri geyimlərdən də görmək mümkün idi. Ömər ibn Xəttab (r.ə) paltarının təmizliyinə ciddi fikir versə də əynində nimdaş, bəzən isə yamaqlı paltar olurdu. Əli (r.ə), Osman (r.ə), Təlhə (r.ə) və Zubeyr (r.ə) bunu öz aralarında müzakirə edərək xəlifənin illik ətiyyəsini artırmaq üçün özünə müraciət etmək istəmiş, lakin qəbul etməməklə yanaşı həm də onlara qəzəblənəcəyini bildikləri üçün bu fikirdən daşınmışdılar. Bunu özünə qarşı xəlifənin qəlbində şəfqət hissi olan biri etməli idi ki, bu da onun qızı, Peyğəmbərin (s.ə.v) xanımı Həfsa (r.ə) idi. Buna görə də onlar bu haqda Həfsa (r.ə) ilə danışmış və bunu atasından xahiş etməsini istəmişdilər. Ömər ibn Xəttab (r.ə) qızından bunu eşidəndə bu fikrin Həfsaya (r.ə) aid olmadığını anlamış və bunu ona kimin təlqin etdiyini soruşmuşdu. Lakin Həfsa (r.ə) bunun kimlərin təşəbbüsü olduğunu atasına deməmişdi. Sonra xəlifə, özü çox yaxşı bilsə də qızından Allah Rəsulu (s.ə.v) haqqında "*Rəsulullahın (s.ə.v) sənin evindəki paltarları nə idi?*" deyə soruşanda Həfsa (r.ə) belə cavab vermişdi:

- *Gələn qonaqlarla görüşəndə və cümə günləri geydiyi iki dəst pambıq paltarı vardı.*

- *Bəs sənin gördüyün ən yaxşı hansı yeməyi yemişdi?*

- *İsidilmiş arpa çörəyinin üstünə tökərək yediyi zeytun yağı.*

- *Yatdığı ən rahat yataq necə idi?*

- *Qaba yundan toxunmuş örtüyümüz vardı. Yayda qatlayıb üstündə yatar, qışda isə açıb yarısını üstümüzə atardıq.*

- *Qızım, o fikri sənə təlqin edənlərə de ki, Allah Rəsulu (s.ə.v) qıt-qənaət dolanardı. Süfrəsində iki cür yemək olmazdı. Olanda birini özü yeyər digərini kasıblara sədəqə verərdi. Sabaha ehtiyat saxlamazdı, artıq qalanı həmin gün ehtiyacı olanlara verərdi. De ki, qənaətlə keçinməkdə ondan daha diqqətli olan yox idi. Mənə gəldikdə isə mən ehtiyacım olandan artığını heç vaxt arzulamayacağam, artıq qalanı saxlamayıb sədəqə verəcəyəm. Mənim halım özündən əvvəl iki dostunun çatdığı yerə tərəf yol gedən adamın halı kimidir. Bunlardan ilki yol azuqəsini hazırlayıb yola düşdü və mənzil başına çatdı. İkincisi də onun izini təqib edərək ona yetişdi. Üçüncü əgər bu ikisinin addımladığı yoldan kənara addım atsa əsla mənzil başına çatıb dostlarına qovuşa bilməz".*

Həfs ibn Əbu'l-As (r.ə) dövlət işlərində Ömər ibn Xəttabın (r.ə) köməkçisi idi. İşlərinin çoxluğu səbəbiylə xəlifə evinə gedə bilməyəndə o, Ömərin (r.ə) evindən yeməyini gətirdi. Lakin özü xəlifə ilə birlikdə yeməyə oturmur, evinə gedirdi. Bir gün xəlifə Həfsdən (r.ə) soruşdu:

- *Sənə mənimlə yeməyə oturmağa nə mane olur?*

- *Sənin yeməyin qatı və sərtdir. Evimdə mənim üçün iştahımı çəkən yemək hazırlanır. Ona görə də evə gedib orada yeyirəm.*

Bu cavab xəlifəyə toxunmuşdu. O, səsini qaldıraraq Həfs ibn Əbu'l-Asa (r.ə) belə səslənmişdi:

- *Sən zənn edirsən ki, mən özüm üçün oğlaq kəsdirib ətini qızartdırmaqdan, buğda unundan incə fətir bişirtdirməkdən, kişmiş əzdirib su ilə şərbətini hazırlatdırmaqdan və bunları yeyib-içməkdən acizəm?*

- *Demək möminlərin əmiri həyatın gözəlliklərindən agah imiş.*

- *Allaha and olsun ki, yaxşı əməllərimin savabının azalmasına səbəb olmasaydı sizin bu rahat həyatınızda mən də iştirak edərdim. Amma mən istəyirəm ki, saleh əməllər mənimlə qalsın. Çünki mən Allahın bəzi qövmlər haqqında belə dediyini bilirəm: "Siz dünya həyatınızda bütün nemətləri görüb daddınız və onlardan ləzzət aldınız, dünyada sizin üçün gözəl olan hər şeyi xərclədiniz, axirətə bir şey qalmadı"* (Qur'an, Əhqaf surəsi, 20).

Əbu Musa əl-Əş'əri (r.ə) demişdi ki, "*bir müddət elə oldu ki, hər gün Ömər ibn Xəttabla (r.ə) görüşməli olduq. Onun yanında üç parça çörəyi olurdu. Yemək yeyəndə bu çörəyi zeytun yağı, kərə yağı və ya südlə qarışdırıb yeyirdi və yeməyi bundan ibarət idi*".

Qüdsün fəthi vaxtı Şam diyarına getmiş xəlifə üçün oradakı müsəlmanlar süfrə hazırlamışdılar. Süfrədə cürbəcür, növbənöv yeməkləri görən Ömər ibn Xəttab (r.ə) "*bu bizim yeməyimiz. Bəs arpa çörəyini doyunca yeyə bilmədən ölən müsəlmanların yeməyi haradadır?*" demişdi. O, Allah Rəsulu (s.ə.v) ilə birlikdə

İslamın ən çətin və məşəqqətli günlərində yaşayıb ölmüş möminləri nəzərdə tuturdu. Xalid ibn Vəlid (r.ə) xəlifənin bu sözünə "*onları Allah cənnətində ruziləndirir*" deyə cavab verəndə Ömər ibn Xəttabın (r.ə) gözləri yaşarmış və "*onlar əgər bu yeməkləri dadmağı bizə öyüd verib cənnətə gediblərsə bizimlə onların arasında çox böyük məsafə var*" deyə cavab vermişdi. Xütbələrinin birində isə insanlara belə xitab etməkdə idi: "*Mədənizin şərrindən özünüzü qoruyun. Mədə insanı tənbəlləşdirərək namazdan uzaqlaşdırar. Bədəni fəsada uğradaraq çürüdər. Mədə xəstəliklərin çıxdığı yerdir*". Ömər ibn Xəttab (r.ə) onun hakimiyyəti dövründə vəzifə sahibi olmuş şəxslər üçün nümunə idi. Valilər həyat tərzləri ilə özlərini ona bənzətməyə çalışırdılar. Bunda onun vəzifə üçün seçdiyi insanların təqva sahibi olması nə qədər mühüm rol oynamışdısa, Ömər ibn Xəttabın (r.ə) dövlət başçısı olaraq qətiyyəti və dürüstlüyünün də əhəmiyyəti olmuşdu.

*Ömər ibn Xəttabın (r.ə) Hakimiyyəti Dövründə İqtisadi- Ticari Həyat*

Ərəb yarımadasındakı iqtisadi-ticari həyat haqqında əvvəlki bölümlərdə məlumat vermişdik. Ticarət cahiliyyə dövrü ərəblərinin əsas gəlir mənbələrindən biri idi və yarımadanın müxtəlif yerlərində mövsümlük ticarət yarmarkaları qurulurdu. Qüreyşli tacirlər yarımadanın ticari həyatında mühüm yerə sahib idilər və Məkkə yarımadanın ticarət mərkəzi idi. Hicrətdən sonra İslamın ərəblər arasında yayılması nəticəsində Mədinəyə yarımadanın dörd bir tərəfindən axın olmuş və bu axın raşid xəlifələr dövründə də davam etmişdi. Bu da istər demoqrafik baxımdan, istərsə də iqtisadi-ticari baxımdan Mədinəni ön plana çıxarmışdı. Bununla bərabər raşid xəlifələr dövründə fəth hərəkatının əhəmiyyət qazanması yarımadanın iqtisadi həyatına da təsir etmişi. Fəthlər nəticəsində qənimət malları, cizyə və uşr kimi vergilərin gətirdiyi rifah ticarəti arxa plana keçirmiş, bu da əvvəlki mövsümlük yarmarkaların öz əhəmiyyətini itirməsinə səbəb olmuşdu. Bununla birlikdə həcc mövsümü vaxtı Məkkənin iqtisadi-ticari həyatında böyük canlanma müşahidə olunmaqda idi. Cahiliyyə dövründə ərəb tacirlər dəniz ticarətinə deyil, karvanlarla edilən quru yolu ticarətinə üstünlük verirdilər. Xilafət dövründə Qırmızı dəniz, Ərəbistan dənizi və Bəsrə körfəzinin, o cümlədən Aralıq dənizinin cənub-şərq və şərq sahillərindəki limanların müsəlmanların nəzarətinə keçməsilə dəniz ticarətində canlanma baş vermişdi. İranlı tacirlər tərəfindən qurulan Ciddə limanı regional və beynəlxalq ticarətin mühüm mərkəzlərindən birinə çevrilmişdi. Ciddə limanını ön plana çıxarıb əhəmiyyət qazandıran digər bir amil də Afrikadakı müsəlmanların həcc ziyarəti üçün dinəz yoluna üstünlük vermələri idi.

Allah Rəsulunun (s.ə.v) özü, Əbu Bəkr (r.ə), Osman ibn Əffan (r.ə), Əbdurrəhman ibn Əvf (r.ə), Ömər ibn Xəttab (r.ə) kimi daha bir çox səhabə İslamdan əvvəlki və sonrakı dövrün bacarıqlı və mahir tacirləri idilər. Yəni malı, pulu və zənginliyi görmüşdülər, nə olduğunu bilirdilər. İslamın zühurundan hicrətə qədərki dövrdə Allah yolunda qarşılaşdıqları sıxıntı və məşəqqətlər onları kasıblığa düçar etmişdisə də sonrakı dövrdə səhabənin bir çoxu yenidən maddi zənginliyə qovuşmuşdu. Lakin maddi varlığa sahib olmaları onların həyat tərzini dəyişməmişdi. Çünki maddi zənginliyin əbədi səadəti qazanmaq yolunda məqsəd deyil, sadəcə vasitələrdən biri ola biləcəyinin fərqinə varmışdılar. Səhabə çalışmış, qazanmış və hətta aralarında böyük sərvət sahibi olanlar da olmuşdu. Əbu Zərr əl-Ğifari kimi zahid həyat tərzinə düşkün olan səhabələr belə özləri və ailələrini təmin edəcək qədər maddi varlığa sahib olub əsla başqalarına əl açıb başqasının hesabına dolanan insanlar olmamışdılar. Fəthlər sayəsində maddi zənginliklərin axıb gəldiyi dövrdə insanlar qənimətlərdən paylarına düşənlə, beytülmaldan aldıqları illik maaşla, iqta olaraq aldıqları tarlalar, bağlar, mal-qara sürüləri ilə varlanmışdılar. Lakin səhabə sahib olduqları maddi zənginliyi digər müsəlmanların əməyini istismar edərək qazanmamaqla yanaşı bu zənginliyi digər insanlar üzərində ağalıq, hegemonluq etmək üçün də istifadə etməmişdir. Əksinə sahib olduqları maddi zənginliyi cəmiyyətin xeyrinə xərcləmişdilər. Süfyan əs-Səvrinin dediyi kimi: "*dünya malı onların əllərində idi, qəlblərində deyildi*". Onlar karvansaralar, hamamlar, bazarlar, məscidlər, yollar, körpülər salmaqla, su quyuları qazdırmaqla, suvarma kanalları çəkdirməklə insanlara təmənnasız olaraq bir çox xidmətlər etmişdilər. İslam inancına görə yerüzündəki hər şey Allah tərəfindən insan övladının xidmətinə verilmək üçün yaradılmışdır. Bütün məxluqat Allahın insana əmanətidir. İnsan bu əmanət üzərində ancaq Allahın əmr etdiyi şəkildə təsərrüf haqqına sahibdir, mülkün tək və gerçək sahibi isə Allahdır. Buna görə də əsri-səadət, yəni xoşbəxtlək, səadət dövrü adlanan raşid xəlifələr dövrü özünün iqtisadi həyatı ilə də bəşər tarixinin bütün digər dövrlərindən fərqlənmişdi. Ələlxüsus Ömər ibn Xəttabın (r.ə) xilafət müddəti bu dövrün zirvəsi hesab olunmaqdadır.

Ömər ibn Xəttab (r.ə) əsla haqsız qazanc əldə edilməsinə göz yummazdı. Bu cür qazanc əldə etmiş insanların sahib olduqları maddi zənginliklərin ya hamısı, ya da bir qismi müsadirə olunurdu. İstər Allah Rəsulu (s.ə.v) istərsə də raşid xəlifələr dövlət məmurlarının maddi vəziyyətini daim nəzarətdə saxlamışdılar. Dövlət vəzifəsi icra edərkən sərvəti qeyri-adi şəkildə artan insanların dövlət başçısının "*haradan və necə qazandın?*" sualı ilə qarşılaşması qaçınılmaz idi. Xəlifə vəzifəyə təyin etdiyi məmurlardan, ələlxüsus maliyyə-vergi

işləri ilə məşğul olan amillərdən yazılı şəkildə mal-mülk, əmlak bəyannaməsi alırdı. Ömər ibn Xəttab (r.ə) əmri ilə hər il həcc ziyarətindən sonra vilayətlərdən gələn valilər Mədinəyədə toplanır və xəlifə şəxsən onların işlərini təftiş edirdi. Vəzifəyə təyin olunan şəxslərdən mal bəyanı tələb olunur, onlardan sahib olduqları nəğd pul, daşınan və daşınmaz əmlakları haqqında yazılı iltizam alınırdı. Təyin olunduqları gündən etibarən hər il sahib olduqları mal varlığı müfəttişlər tərəfindən hesablanır, əmlakı və nəğd pulunda təxmin olunanın üstündə artış olanlar vəzifələrindən azad edilirdilər. Təxmin olunanın üzərindəki artıq isə müsadirə olunaraq beytülmalın hesabına keçirilirdi. Ömər ibn Xəttab (r.ə) vilayətlərdəki vəzifə sahiblərinin Mədinəyə gecə vaxtı daxil olmalarını qadağan etmişdi. Çünki gündüzlər şəhərə girən hər bir şəxsin Mədinəyə gətirdiyi daşınan əmlaka nəzarət edilirdi. Bu işə nəzarəti xəlifə Muhəmməd ibn Məsləməyə (r.ə) tapşırmışdı. Qinnəsreyn valisi Xalid ibn Vəlidin (r.ə) bir şəxsə on min dirhəm borc verdiyini eşidən xəlifə onu Mədinəyə çağıraraq şəxsən sorğu-sual etmişdi. Xalid ibn Vəlid (r.ə) bu pulun beytülmala aid olmayıb şəxsi vəsaiti olduğunu bildirmiş, özünün cəmi 60 min dirhəm nəğd pulu olduğunu, əgər bundan artıq çıxsa beytülmala təhvil verəcəyini bildirmişdi. Müfəttişlərin hesablamasında Xalidin (r.ə) 62 min dirhəm nəğd pulu çıxmışdı. Xəlifə 2 min dirhəmi müsadirə etdirərək Xalid ibn Vəlidi (r.ə) Qinnəsreyn valiliyindən azad etmişdi. Buna baxmayaraq o, Xalidə (r.ə) "*sən mənim qardaşımsan, səni nə qədər sevdiyimi bilirsən*" deyərək könlünü almışdı. Xəlifənin bu kimi məsələrdə öz doğma övladlarına belə güzəşt etmədiyini bilən insanlar buna görə ondan incimirdilər.

Ömər ibn Xəttab (r.ə) Mədinə bazarını gəzərkən bir dəllalın yaxşı bəslənmiş, gümrah bir dəvənin xüsusiyyətlərini mədh edərək satmağa çalışdığını görəndə ondan bu dəvənin sahibinin kim olduğunu soruşur və dəllal "*sənin oğlun Abdullahındır*" deyə cavab verir. Xəlifə oğlu Abdullahı (r.ə) yanına çağıraraq bu dəvə haqqında sorğu-sual edir və Abdullah ibn Ömər (r.ə) bu dəvəni kiçik, arıq və çəlimsiz ikən ucuz qiymətə aldığını, sonra Mədinə yaxınlığındakı otlaqlarda bəsləyərək böyüdüb səmirtdiyini söyləyir. Xəlifə həmin otlaqların beytülmala aid heyvanlar üçün olduğunu söyləyib bunu necə olduğunu öyrənmək istəyəndə Abdullah (r.ə) oradakı çobanların buna etiraz etmədiyini söyləyir. Xəlifə oğluna "*sən xəlifənin oğlu olduğun üçün etiraz etməyiblər*" deyib həmin dəvəni satdırmış, Abdullaha (r.ə) onu aldığı məbləği qaytarıb qazanc olaraq qalan məbləği isə xəzinəyə təhvil verdirmişdi.

Xəlifənin oğulları Abdullah (r.ə) və Ubeydullah (r.ə) İraq cəbhəsində iştirak etdikləri döyüşlərdən sonra Mədinəyə qayıdarkən Bəsrəyə gəlmişdilər. Bəsrə valisi olan Əbu Musa əl-Əş'əri (r.ə) onları görəndə çox sevinmiş və qo-

naq etmişdi. Vali "*qardaşımın oğullarına yaxşılıq etmək istəyirəm. Yanımda Mədinəyə göndərəcəyim beytülmala aid nəğd pul var. Gəlin bundan sizə borc olaraq verim. Buradan Mədinədə sata biləcəyiniz mallardan alın, aparıb orada satın. Sizə verdiyimi beytülmala təhvil verin, qazancı sizin olsun*" demiş və qardaşlar bu təklifi qəbul etmişdilər. Əbu Musa (r.ə) onlarla xəlifəyə yazdığı məktubu da göndərmiş və məsələ haqqında məlumat vermişdi. Məktubu oxuyan Ömər ibn Xəttab (r.ə) Əbu Musanın (r.ə) xəzinəyə aid puldan öz oğullarına borc verdiyini öyrənmişdi. Qardaşlar atalarının "*sizə verdiyi kimi Mədinəyə qayıdan bütün əsgərlərə borc verdimi?*" sualına "*xeyr*" deyə cavab vermişdilər. Ömər (r.ə) "*deməli siz xəlifənin oğulları olduğunuz üçün sizə verilib, satışdan əldə etdiyiniz qazancı dərhal beytülmala təhvil verin*" demişdi. İnsanlar Abdullahı (r.ə) təqva və davranışda atası Ömərə (r.ə) bənzətməkdəydilər. Abdullah (r.ə) atasının bu tələbi qarşısında susmuş, qardaşı Ubeydullah (r.ə) isə belə demişdi: "*ey möminlərin əmiri! Əgər İraqdan aldığımız mal yolda məhv olsaydı və ya biz bunu satarkən ziyan etsəydik Əbu Musanın (r.ə) bizə verdiyini yenə də ödəyəcəkdik. Lakin qazanc əldə etmişik, demək bu bizim haqqımızdır. Zərəri üzərimizə götürmüşüksə, qazancı da götürə bilərik*". Lakin xəlifə sözündə təkid edərək demişdi: "*aldığınız borcu da, əldə etdiyiniz qazancı da beytülmala təhvil verin*". Ubeydullah ibn Ömər (r.ə) qazancın onların haqqı olduğunu təkrar edəndə onların söhbətinə şahid olan müsəlmanlardan biri "*ey möminlərin əmiri! Müdaribə etsən daha yaxşı olmazmı?*" demişdi. Ömər ibn Xəttab (r.ə) bunun daha münasib olacağı düşüncəsiylə qazancın yarısını alaraq beytülmala təhvil vermişdi. Bu hadisə həm də insanların dövlətlə şərikli ticarət edə biləcəyi ənənəsinin təməlini qoymuşdu.

Ömər ibn Xəttab (r.ə) başçı olaraq Muhəmməd ibn Məsləməni (r.ə) təyin etdiyi müfəttişlər vasitəsilə vəzifə sahibi olub olmamasından aslı olmayaraq hər bir şəxsin gəliri, nəğd pulu, daşınan və daşınmaz əmlakı haqqında dəqiq məlumata sahib idi. Bununla həm vəzifədən sui-istifadələrin qarşısı alınır, həm də hər il beytülmala ödənməli olan zəkatın miqdarı dəqiq hesablanırdı.

Ömər ibn Xəttab (r.ə) tacirlərin və sərmayə sahiblərinin haqsız qazanc əldə etmələrinə də əsla izn vermirdi. Hicri 21-ci ildə (642) ərəb yarımadasında o vaxta qədər görülməmiş bir quraqlıq baş vermişdi. Bu quraqlıq qıtlığa səbəb olmuşdu. Belə ki, əkinlər və bağlar qurumuş, heyvanlar susuzluqdan tələf olmuşdu. Yarımadanın dörd bir yanından bədəvilər Mədinəyə axın etmişdilər. Mənbələrdə 60 minə yaxın bədəvinin quraqlıq və qıtlıq səbəbilə Mədinə və ətrafına köçərək burada məskunlaşdığını qeyd edilməkdədir. Bu köç Mədinədə də qıtlıq və çatışmamazlığa səbəb olmuşdu. Buna görə də xəlifə İraq, Şam və

Misirdəki valilərə məktub yazaraq Mədinəyə ərzaq və geyim göndərməyi əmr etmişdi. Misir valisi Əmr ibn əl-As paytaxtı təcili və ardıcıl olaraq buğda və arpa ilə təmin etmək məqsədiylə Qırmızı dənizlə Nil çayı arasında kanal qazdırmışdı. Nil çayı boyunca üzən taxıl dolu gəmilər Qırmızı dənizin Mədinəyə iki günlük məsafəsində olan Car limanına yanaşaraq yüklərini boşaltmışdılar. Xəlifə Zeyd ibn Sabitə (r.ə) insanların taxıl ehtiyacını dövlət hesabına təmin etmək üçün siyahı tərtib etdirmiş və bu siyahıya əsasın möhürlü istihqaq sənədləri paylanmışdı. Bu möhürlü istihqaq sənədlərini alanlar Car limanındakı ambarlardan öz taxıl paylarını ala biləcəkdirlər. Xəlifənin bu tədbirindən dərhal sonra Mədinədə istihqaq sənədi bazarı yaranmışdı. Sərmayə sahibləri insanların əlindəki istihqaqları pulla alaraq Car limanındakı ambarlara gedir, buradan sənədlərlə aldıqları buğdanı Mədinəyə və digər yerlərə daşıyaraq satır, qazanc əldə edirdilər. Vəzziyəti yerində təftiş etmək üçün Cara gələn xəlifə burada Hakim ibn Hizam adlı tacirin istihqaq sənədi ticarət etdiyini görmüşdü. O, amillərdən Ə'la ibn Əsvədə (r.ə) Hakimin bu işdən nə qədər qazanc əldə etdiyini araşdırmasını tapşırmışdı. Ə'la ibn Əsvəd (r.ə) tacirin bu işə 100 min dirhəm pul qoyduğunu və artıq 100 min dirhəm qazandığını müəyyən etmişdi. Ömər ibn Xəttab (r.ə) Hakim ibn Hizamı çağırıb soruşanda o, bunu təsdiq etmişdi. Ömər ibn Xəttab (r.ə) Hakimdən dərhal istihqaq sənədlərini aldığı adamlara geri verməsini əmr etmişdi. Hakim ibn Hizam sənədlərini satın aldığı insanların çoxunu şəxsən tanımadığını bildirib bunun mümkün olmadığını bildirsə də xəlifənin əlindən yaxasını qurtara bilməmişdi. Xəlifə, Hakim ibn Hizamı Mədinə və ətraf kəndlərindəki kasıb insanlara 100 min dirhəm sədəqə paylamağa məcbur etmişdi.

Məlum olduğu kimi fəthlər nəticəsində xilafətin sahib olduğu ərazilər sürətlə genişləmişdi. Bu da torpaq mülkiyəti mövzusunda bəzi yeni qərarların alınması və tətbiq edilməsi ilə nəticələnmişdi. Bəzən yeni fəth olunmuş ərazilərdəki əhali kütləvi şəkildə İslam dinini qəbul edirdi. Xilafətin ilk dövrlərində İslamı bu şəkildə kütləvi qəbul edənlər əsasən bütpərəst və ya xristian ərəblər idilər. Belə halda onların üzərində yaşadıqları torpaqlar uşr ərazisi hesab olunur və beytülmala bu şəkildə qeyd olunurdu. Uşr ərazilərində yaşayanlar məhsullarının sadəcə onda birini illik vergi olaraq ödəyirdilər. Bu cür ərazilərdə yaşayan əhalidən onda birdən, uşrdan başqa bir vergi alınmırdı. Əlbəttə zəkat ödəyə biləcək qədər sərvət sahibləri xaric. Bu cür sərvət sahibləri zəkat vergisini də ödəyirdilər. İkinci qism ərazilər isə döyüşsüz, sülh yolu ilə əhdnamə bağlanaraq fəth edilən ərazilər idi. Bu cür ərazilərdə yaşayan əhali əhdnamə şərtləri ilə müyyən olunmuş cizyə vergisini ödəyirdilər və bundan

başqa heç bir mükəlləfiyyət daşımırdılar. Cizyə vergisi sadəcə kişi əhalidən alınırdı. Müsəlman olmayan din xadimlərindən cizyə vergisi alınmırdı. Eləcə də qadınlar, uşaqlar, qocalar, əmək qabiliyyəti olmayanlar da cizyədən azad idilər. Cizyə vergisi ildə bir dəfə, mükəlləfin maddi vəziyyətinə uyğun olaraq alınırdı. Cizyə mükəlləfləri maddi vəziyyətlərinə görə üç qismə ayrılmaqda idilər. Varlılar 48 dirhəm, ordabablar 24 dirhəm, kasıblar isə 12 dirhəm ödəyirdilər. Döyüşlə, silahlı mübarizə yolu ilə fəth edilən ərazilər haqqında isə əsasən iki cür qərar verilirdi və bu qərarı vermək xəlifənin səlahiyyətində idi. Bu cür ərazilərdə yaşayanların daşınan və daşınmaz əmlakı ya qənimət malı hesab edilərək beşdə biri beytülmala, beşdə dördü isə həmin döyüşdə iştirak etmiş əsgərlər arasında paylaşdırılırdı. Və ya döyüş vaxtı alınmış qənimətlər xaric heç bir əmlak əllərindən alınmır, sahib olduqları daşınmaz əmlak öz mülkiyyətlərində saxlanılır, xəlifənin müəyyən etdiyi vergi miqdarını illik olaraq beytülmala ödəyirdilər.

Ömər ibn Xəttab (r.ə) ticari işləri, ələlxüsus bazarların fəaliyyətini ciddi nəzarətdə saxlayırdı. Süleyman ibn Əbi Hərsəmə (r.ə), Abdullah ibn Utbə (r.ə) Mədinə bazarlarındakı ticari fəaliyyətə nəzarət edirdilər. Səmurə ibn Cundəb əl-Fəzari (r.ə) xəlifə tərəfindən Suqu-Əhvaza möhtəsib təyin olunmuşdu. Suqu-Əhvaz Sasanilər dövründə beynəlxalq ticarətin dövr etdiyi bazarlardan biri idi.

Ölçülər, ağılıq və uzunluq vahidləri, eləcə də dinar, dirhəm kimi qızıl və gümüş pul vahidlərinin miqdarı müəyyənləşdirilmiş və sabitlənmişdi. Bunlardan bəziləri belə idi: bərid (22,176 km), zira’ (50 sm), cərib (1266 $m^2$), qıst (1,37 litr), kafiz (26 kg), misqal (4,25 gr), müdd (542,86 gr), sa (2,17 kg), uqiyyə (119 gr), dinar (4,25 gr qızıl pul), dirhəm (2,975 gr gümüş pul). Mənbələrdə həmçinin Allah Rəsulu (s.ə.v) və raşid xəlifələr dövründəki bəzi əmtəənin qiymətləri haqqında da məlumat verilmişdir. Bunlardan da bəzilərini burada qeyd etmək yerinə düşəcəkdir: zireh, qılınc və dəbilqədən ibarət bir dəst döyüş ləvazımatı=100 dirhəm, bir dəst paltar=8-60 dihəm, ayaqqabı =0,5-1 dirhəm, 1 cins ərəb atı=20-100 min dirhəm, 1 erkək dəvə=400-1000 dirhəm, 1 dişi dəvə=300 dinar, 3 ədəd çörək=0,5 dirhəm, 1 qoyun=5 dirhəm, 1 inək=200-500 dirhəm, bir yeməklik ət=1 dirhəm, 1 kafiz (26 kg) buğda=3 dirhəm, 1 ədəd yağ motalı=1 dirhəm.

Ömər ibn Xəttab (r.ə) özünün xarakteri, şəxsiyyəti, nüfuzu, idarəçilik və təşkilatçılıq qabiliyyəti, həmçinin imanı, təqvası, salehliyilə müstəsna bir insan idi. Onun xilafəti dövründə İslam Mesopatomiya, İran, cənubi Qafqaz, Azərbaycan, cənub-şərqi Anadolu, Suriya, şimal-şərqi Afrika ərazilərinə qədəm qoymuşdu. Sui-qəsd nəticəsində şəhid olan ilk müsəlman dövlət başçısı Ömər ibn Xəttabdır (r.ə). Fəth hərəkatı vaxtı çox sayıda əsir alınırdı. Bu

əsirlərin əksəriyyəti kölə bazarlarında satılırdı. Mədinəyə də bu cür müharibə əsirliyindən köləyə çevrilmiş çox sayda insan gətirilmişdi. Əsasən sənət, peşə sahibi kölələrə yiyələnmək arzu olunan idi. Mədinəli müsəlmanlar bu cür kölələrə sahib olmağa rəğbət göstərirdilər. Mədinəli müsəlmanlar bu cür kölələrə sahib olandan sonra bəzən onlarla özü özünü satınalma barədə razılaşırdılar. Yəni kölə ilə kölə sahibi arasında müəyyən bir məbləğ müəyyən edilir, həmin məbləğ müəyyən olunmuş müddət ərzində kölə tərəfindən öz ağasına ödənilir və kölə azad olurdu. Sənət, peşə sahibi kölələrin bir çoxu öz azadlıqlarını bu cür əldə edə bilirdilər. Ömər ibn Xəttab (r.ə) xəlifəliyi dövründə bu cür əsir-kölələrin Mədinədə mümkün qədər az məskunlaşmasına çalışmışdı. Lakin onların sayı kifayət qədər çox idi. Bunlardan biri də iranlı bir atəşpərəst, Əbu Lü'lu ləqəbi ilə tanınan atəşpərəst Firuz əl-Məcusi idi. Xarratlıq, dəmirçilik və nəqqaşlıq kimi sənətlərdə mahir olan məcusi Firuz, Muğirə ibn Şu'bənin (r.ə) köləsi idi. Muğirə ibn Şu'bənin (r.ə) bu iranlı köləsi Mədinə bazarlarından birində ustalıq edir və ağasına hər gün 2 dirhəm ödəyirdi. Məbləğin çox olmasından narazı olan Firuz tez-tez şəhərin ticari həyatına nəzarət etmək üçün gəzən xəlifənin qarşısına çıxaraq şikayətini bildirirdi. Bir gün yenə Ömər ibn Xəttabın (r.ə) qarşısına çıxaraq gündəlik iki dirhəmin çox olduğunu bildirmişdi. Ömər ibn Xəttab (r.ə) ondan peşəsini soruşub öyrənəndə bu məbləğin çox olmadığını, bundan başqa bu cür razılaşmanın kölə ilə ağası arasında olduğunu, buna heç kimin müdaxilə etmək səlahiyyətinin olmadığını bildirmişdi. Onun bu cavabı iranlı köləni qəzəbləndirmişdi. Firuz bu söhbət vaxtı Ömər ibn Xəttabın (r.ə) "*eşitdim ki, sən çox gözəl yel dəyirmanı düzəldə bilmənlə öyünürmüşsən. Mənimçün də belə bir dəyirman düzəldərsənmi?*" sualına belə cavab vermişdi "*əgər sağ qalsam səninçün elə bir dəyirman düzəldəcəm ki, sorağı şərqdən qərbə qədər yayılacaq*". Firuz əl-Məcusidən yanından uzaqlaşdıqdan sonra Ömər ibn Xəttab (r.ə) onun bu eyhamlı cavabından şübhələnərək yanındakılara "*bu kölənin məni necə hədələdiyini eşitdinizmi?*" demişdi. Hicri 23-cü il zilhiccə ayının 26-sı (01 noyabr 644) günü Əbu Lü'lu Firuz əl-Məcusi özünün düzəltdiyi, dəstəyi ortasında olan iki tərəfi kəskin bir xəncəri qoynunda gizlədərək sübh namazı vaxtı Məscidu'n-Nəbəviyə gəlib minbərə yaxın yerdə oturmuşdu. Sübh vaxtının ala-qaranlığında məscidə gəlib ön cərgədə dayanan bu məcusini heç kim görüb fərqinə varmamışdı. Ömər ibn Xəttab (r.ə) adəti üzrə sübh namazının fərzini camaata qıldırmaq üçün gəlib önə keçmiş və namaza dayanmışdı. Namaza başlayan xəlifəyə əlindəki xəncərlə hücum edən Firuz ona altı zərbə vurmuşdu. Zərbələrdən biri, Ömər ibn Xəttabın (r.ə) göbəyi ilə qasığı arasına dəyən zərbə ölümcül olmuşdu. Yerə çökən xəlifə camaatın

namazının pozulmasını istəməmiş, səsini çıxarmayaraq sadəcə "*bu it məni daladı*" demişdi. Xəlifə arxasındakı səfdə dayanan Əbdürrəhman ibn Əvfi (r.ə) öz yerinə keçirərək camaata namazı tamamlamasını əmr etmişdi. Əbdürrəhman ibn Əvf (r.ə) uzatmadan namazı tez qıldırmış və yerdə uzanan xəlifəni qaldıraraq evinə gətirmişdilər. Firuz qaçıb məsciddən çıxandan bir müddət sonra yenidən məscidə qayıdıb əlindəki xəncərlə namaz qılmaqda olan insanlara hücum etmiş və 13 nəfəri yaralamışdı. Bunlardan 6-sı aldıqları yaralardan ölmüşdülər. Namaz vaxtı və məsciddə olduqları üçün müsəlmanlar silahsız idilər. Buna görə də Firuz əlindəki xəncərlə qarşısına kim çıxmışdısa vura bilmişdi. Nəhayət Əbdürrəhman ibn Əvf (r.ə) əbasını onun üstünə tullamış və qəfil başına keçən əbadan ötürü çaşqın qalan Firuzu yaxalamışdı. Lakin Firuz sağ ələ keçmək istəməyib əlindəki xəncərlə sinəsinə və qarnına vuraraq özünü yaralamış və bu yaralardan ölmüşdü.

Yarasının ağırlığı və ağrıları səbəbiylə huşunu itirən xəlifə evində özünə gələndə "*insanlar namazlarını qıla bildilərmi?*" deyə soruşmuş, sonra özü yaralarından qan axdığı halda, uzandığı yerdə namazını qılmış və "*namazı olmayanın İslamda payı yoxdur*" demişdi. Xəlifə Abdullah ibn Abbasdan (r.ə) onu kimin vurduğunu dəqiqləşdirməsini istəmişdi. Abdullah ibn Abbas (r.ə) çıxıb araşdırmış və öyrəndiklərin xəlifəyə çatdırmışdı. Onu vuranın bir atəşpərəst olduğunu öyrənən Ömər (r.ə) "*Allaha həmd olsun ki, qiyamət günü alnı səcdə görmüş biri (bir müsəlman) bundan ötürü mənimlə qarşı-qarşıya gəlməyəcək*". Xəlifə öz canına qəsd edənin bir müsəlman olmamasından ötürü Allaha şükür etməkdə idi. Bəlkə bir faydası toxunar deyə xəlifə üçün təbib çağırdılar. Lakin içdiyi südün yarasından axdığını görəndə xəlifə sağalmasının mümkünsüz olduğunu anlamışdı. Buna görə də Ömər ibn Xəttab (r.ə) vəsiyyətini etmək qərarına gəlmişdi. Onu ziyarət üçün evinə dolan insanların ağladığını görəndə "*ağlamağı kəsin. İstəyən çıxsın bayırda ağlasın. Siz Peyğəmbərin (s.ə.v) "cənazə, yaxınlarının ah-fəryadlarından ötürü əzab görər" dediyini eşitmədinizmi?*" deyə xəbərdarlıq etmişdi. Xəlifə əvvəlcə oğlu Abdullahı (r.ə) yanına çağıraraq ona şəxsi işləri ilə bağlı vəsiyyətini etmişdi. O, oğlu Abdullaha (r.ə) borclarını hesablamasını, sahib olduğu əmlakdan satıb borclarını ödəməsini, əgər kifayət etməsə mənsub olduğu Bəni-Ədiyy qəbiləsindən yardım istəməsini tapşırmış, sonra isə onu Ayşənin (r.ə) yanına göndərmişdi. Xəlifə oğluna "*möminlərin anası Ayşənin (r.ə) yanına get, de ki, Xəttabın oğlu Ömər (r.ə) sənə salam deyir və iki dostunun yanında dəfn edilməsi üçün izn istəyir*". Abdullah ibn Ömər (r.ə) xəlifənin uğradığı müsibətə göz yaşı tökən Ayşənin (r.ə) yanına gedib atasının sözünü çatdırmışdı. Möminlərin anası Ayşə

(r.ə) "*mən o yeri özüm üçün saxlamışdım, lakin bu gün Öməri (r.ə) özümdən üstün tutacam*" deyə cavab vermişdi.

Ətrafındakılar Ömər ibn Xəttabdan (r.ə) özündən sonra yerinə birini tövsiyə etməsi üçün təkid etmişdilər. Ömər ibn Xəttab (r.ə) bunu etmək istəmirdi. Lakin təkidlərin kəsilməməsi səbəbiylə bu iş üçün də vəsiyyətini etmişdi. O, "*əgər Əbu Ubeydə ibn Cərrah (r.ə) sağ olsaydı bu iş üçün onu tövsiyə edəcəkdim, çünki o, bu ümmətin əmini idi*" demişdi. Muğirə ibn Şu'bənin (r.ə) xəlifəyə öz oğlu Abdullahı (r.ə) tövsiyə etməsini söyləməsi Ömər ibn Xəttabı (r.ə) hiddətləndirmiş və o, bu təklifi qəti surətdə rədd etmişdi. Daha sonra o, Allah Rəsulunun (s.ə.v) vəfatından əvvəl razı olub cənnətlə müjdələdiyi insanlardan həyatda qalmış altı nəfərin toplanmasını və öz aralarından birini xəlifə seçmələrini istəmişdi. Əşərətu'l-mubəşşərədən bu vaxt Əli ibn Əbu Talib (r.ə), Osman ibn Əffan (r.ə), Əbdurrəhman ibn Əvf (r.ə), Təlhə ibn Ubeydullah (r.ə), Zubeyr ibn Əvvam (r.ə) Səid ibn Zeyd (r.ə) və Sə'd ibn Əbu Vəqqas (r.ə) həyatda idilər. Ömər ibn Xəttab (r.ə) Səid ibn Zeydin (r.ə) yeni xəlifəni seçəcək şurada iştirak etməsini istəməmişdi. Səid ibn Zeyd (r.ə) Ömər ibn Xəttabın (r.ə) əmisi oğlu idi. O, yeni xəlifənin öz nəslindən, ailəsindən biri olmasını istəməmişdi. Digər altı nəfərin öz seçimlərində tən yarıya bölünə biləcəyini düşünərək oğlu Abdullahı (r.ə) da bir səs haqqıyla xəlifənin seçiləcəyi şurada təmsil olunmasını istəmişdi. Abdullah ibn Ömər (r.ə) əşərətu'l-mübəşşərədən olmadığı üçün seçilmə haqqına deyil, sadəcə seçmə haqqına sahib idi. Ömər ibn Xəttab (r.ə) şura üzvlərinin Əli (r.ə), Osman (r.ə) və ya Əbdurrəhman ibn Əvfi (r.ə) seçəcəyini təxmin etməkdə idi. Lakin Əbdurrəhman ibn Əvfin (r.ə) xəlifə olmaq üçün həvəsli və istəkli olmadığını bilirdi. Buna görə də Əliyə (r.ə) "*əgər bu iş sənin üstünə qalsa əsla soyun olan Bəni-Haşimi (vəzifələrə təyin edərək) insanların üstünə müsəllət etmə*" demişdi. Sonra üzünü Osmana (r.ə) tutaraq "*yox əgər bu iş üçün səni tərcih etsələr sən də əsla soyun olan Bəni-Uməyyəni (vəzifələrə təyin edərək) insanların üstünə müsəllət etmə*" demişdi. Daha sonra Suheyb ibn Sənan ər-Rumiyə (r.ə) yeni xəlifə seçilənə qədər üç gün müddətində məsciddə namazları qıldırmağı tapşırmışdı. Yanındakılar yeni xəlifəni seçmək üçün çıxandan sonra oğlu Abdullaha (r.ə) "*seçərkən Əbdurrəhman (r.ə) kimin tərəfində olsa, sən də onun tərəfində ol, bu dazı seçsələr nə yaxşı olardı, insanların işlərini idarə etməyi bacarardı*". Həmin vaxt Əli ibn Əbu Talib (r.ə) saçını dibindən qırxdırmışdı. Ömər ibn Xəttab (r.ə) da "*bu dazı seçsəydilər nə yaxşı olardı*" deyərkən həm də qayınatası olan Əlini (r.ə) nəzərdə tutmuşdu. Oğlu Abdullahın (r.ə) "*elə isə niyə onu insanlara tövsiyə etmədin?*" sualına xəlifə "*oğlum, mən sağ ikən bu yükü kifayət qədər çəkdim, öləndən sonra da çəkmək istəmirəm*" deyə cavab

vermişdi. Xəlifə bununla təyin edilən insanın mə’suliyyətinin də Allahın qarşısında təyin edən tərəfindən daşındığını bildirməkdə idi.

Səhabədən bəziləri Ömər ibn Xəttaba (r.ə) edilən sui-qəsdin müəmmalı olduğunu düşünərək bu məsələni araşdırmışdılar. Əbdurrəhman ibn Əbu Bəkr (r.ə) Firuzun sui-qəsddə istifadə etdiyi xəncəri görəndə bu xəncəri daha əvvəl də gördüyünü söyləyib belə demişdi: “*bundan qısa müddət əvvəl Firuzun Hürmüzan və Cufeynə ilə birlikdə tələsik addımlarla hara isə getdikləri və öz aralarında nə haqdasa danışdıqlarını gördüm. Onları səslədim. Dönüb məni görəndə ürküb çaşdılar və bu xəncərin yerə düşdüyünü gördüm. Lakin hansının üzərindən düşdüyünü anlamadım*”. Ömər ibn Xəttabın (r.ə) oğlu Ubeydullah (r.ə) bunu eşidən kimi dərhal Hürmüzanın evinə yollanmış və evindən bayıra çağırıb bir qədər gedəndən sonra qılıncı ilə vurub öldürmüşdü. Hürmüzan qılınc zərbəsinə məruz qalarkən “*lə iləhə illallah*” deyərək fəryad etmişdi. Ubeydullah (r.ə) sonra Cufeynəni yaxalayaraq öldürmüşdü. Cufeynə xristian ərəb kölə idi və Mədinədə müsəlmanların uşaqlarına yazıb oxumaq öyrədirdi. Ubeydullah (r.ə) qəzəbini cilovlaya bilməyərək yolda rast gəldiyi Firuzun qızı Lü’lunu da vurub öldürmüşdü. Əmmar ibn Yasir (r.ə) evində ağır yaralı halda yatan Ömər ibn Xəttabın (r.ə) yanına gələrək oğlu Ubeydullahın (r.ə) etdiyini ona xəbər vermişdi. Ömər ibn Xəttab (r.ə) qazı tərəfindən araşdırılıb mühakimə edilmədən özbaşına insan öldürdüyü üçün oğlu Ubeydullah (r.ə) həbs etdirmiş və yeni xəlifənin onu mühakimə etməsi istəmişdi.

# IV. FƏSİL

# OSMAN İBN ƏFFANIN (R.Ə) HAKİMİYYƏTİ DÖVRÜ (644-656)

Hicri 23-cü il zilhiccə ayının 29-u (04 noyabr 644) şəhid olan Ömər ibn Xəttab (r.ə) 55 yaşında dünyasını dəyişmişdi. Onun cənazəsini oğlu Abdullah (r.ə) yuyub kəfənləmiş, cənazə namazını Suheyb ər-Rumi (r.ə) qıldırmışdı. Cənazəni məzara Abdullah ibn Ömər (r.ə), Əli ibn Əbu Talib (r.ə), Osman ibn Əffan (r.ə) və Əbdurrəhman ibn Əvf (r.ə) qoymuş və Allah Rəsulu (s.ə.v) ilə Əbu Bəkrin (r.ə) yanında dəfn etmişdilər. Şura məclisi öz aralarında Osman ibn Əffanı (r.ə) xəlifə seçmiş və şura üzvlərinin hamısı ona bey'ət etmişdilər. Daha sonra bütün Mədinə əhalisi Osman ibn Əffana (r.ə) beyət etmişdi.

Əli ibn Əbu Talib (r.ə) başda olmaqla bəzi səhabələr Ubeydullah ibn Ömərin (r.ə) mühakimə olunmağını xəlifə Osman ibn Əffandan (r.ə) tələb etmişdilər. İslam fiqhinə görə bir müsəlmanı haqsız yerə qəsdən qətlə yetirmiş insanın cəzası edamdır. Öldürülmüş şəxsin varisləri qatili bağışlaya və ya qisas tələb edə bilərlər. Hürmüzan İslamı qəbul etmişdi. Lakin o, Mədinədə kimsəsiz idi, yəni ailəsi və soyundan heç bir vəlisi yox idi. Qanuna görə müsəlmanların əmiri olan şəxs vəlisi və varisi olmayanın vəlisi hesab olunurdu. Buna görə də Osman ibn Əffan (r.ə) Hürmüzanın vəlisi hesab olunmuşdu. Xəlifə Osman (r.ə) "*Hürmüzanın məndən başqa vəlisi yoxdur. Mən onun vəlisi olaraq Ubeydullahı (r.ə) bağışlayıram və qisas tələb etmirəm*" demişdi. Lakin əshabdan bəziləri müsəlman olmasalar belə Firuzun qızı Lü'lu və Cufeynəni qətlə yetirdiyi üçün Ubeydullahın (r.ə) mühakimə və qisasa cəlb olunmalı olduğunu bildirmişdilər. Bu tələb Osmanı (r.ə) hiddətləndirmiş və Ubeydullah ibn Ömərin (r.ə) atasının uğradığı müsibət səbəbiylə qeyri-ixtiyari bu işi gördüyünü bildirərək "*dünən Ubeydullahın atasını öldürdülər, bu gün mən onun özünü edam etdirə bilmərəm*" demişdi. Ubeydullah ibn Ömər (r.ə) xəlifənin əmri ilə həbs edildiyi hücrədən çıxarılıb sərbəst buraxılmışdı.

*Cənubi və Şərqi Anadoludakı Hərbi Əməliyyatlar*

Osman ibn Əffan (r.ə) xilafətin idarəsinə başlayandan bir müddət sonra Muğirə ibn Şu'bəni (r.ə) Kufə valiliyi vəzifəsindən azad etmişdi. O, bunu Ömər ibn Xəttabın (r.ə) vəsiyyətinə əməl edərək etmişdi. Belə görünür ki,

xəlifə Ömər (r.ə) özü Muğirəni (r.ə) Kufə canişinliyindən azad etmək fikrində imiş, lakin uğradığı sui-qəsd səbəbiylə bunu edə bilməmiş və özündən sonra seçiləcək xəlifənin bunu etməsini vəsiyyət etmişdi. O, vəsiyyətində bu vəzifəyə Əbu İshaq Sə'd ibn Əbu Vəqqası (r.ə) təyin etməsini də bildirmişdi. Buna görə də Osman ibn Əffan (r.ə) Kufə valiliyənə Əbu İshaq Sə'di (r.ə) təyin etmişdi. Sə'd ibn Əbu Vəqqas (r.ə) bu vəzifəni bir ildən artıq müddətdə icra etmiş, hicri 25-ci ilin (646) payızında xəlifənin əmrilə Kufə valiliyindən azad edilmişdi. Xəlifə Kufə valiliyinə öz ögey qardaşı Vəlid ibn Uqbə ibn Əbi Muaytı təyin etmişdi. Vəlid ibn Uqbə ilə Osman ibn Əffan (r.ə) ana bir qardaş idilər[75], anaları Ərva bint Kureyz idi. Ömər ibn Xəttab (r.ə) Vəlid ibn Uqbə ibn Əbi Muaytı əl-Cəzirə canişini təyin etmiş və o, bir müddət bu vəzifəni icra etmişdi. Sə'd ibn Əbu Vəqqas (r.ə) və Kufə beytülmalına nəzarətin həvalə edildiyi Abdullah ibn Məs'ud (r.ə) Vəlid ibn Uqbənin bu vəzifəyə təyin edilməsindən məmnun olmasalar[76] da xəlifənin əmrinə itaət edərək etiraz etməmişdilər.

Osman ibn Əffan (r.ə) Şam valisi Müaviyə ibn Əbu Süfyana (r.ə) Həbib ibn Məsləməni (r.ə) Anadolunun şərq və cənub-şərq vilayətlərini fəth etmək üçün göndərməsini əmr etmişdi. Müaviyə (r.ə) Həbib ibn Məsləmənin (r.ə) əmrinə verdiyi 6 min nəfərlik hərbi qüvvəni Bizans imperiyasının hakimiyyəti altındakı şərqi Anadoluya göndərmişdi. Həbib ibn Məsləmə (r.ə) öz ordusu ilə hicri 26-cı ildə (15 oktyabr 646-05 oktyabr 647) Anadoluya daxil olaraq Malatiya, Adata

---

[75] Onlar ana bir, ata ayrı qardaş idilər. Anaları Ərva bint Kureyz əl-Kinani idi. Osmanın (r.ə) atası Əffan ibn Əbü'l-As əl-Əməvinin vəfatından sonra Ərva bint Kureyzlə Vəlidin atası Utbə ibn Əbi Muəyt əl-Əməvi evlənmişdi. Vəlid və qardaş-bacıları bu nikahdan dünyaya gəlmişdilər.

[76] Vəlidin atası Uqbə ibn Əbi Muəyt Məkkədə İslama düşmən münasibət bəsləyərək Allah Rəsulu (s.ə.v) və müsəlmanlara əziyyət verənlərin öndə gedənlərindən idi. Uqbə ibn Əbi Muəyt Bədr döyüşündə öldürülmüşdü. Vəlid ibn Uqbə isə Məkkənin fəthindən sonra İslamı qəbul etmişdi. Vəlidin Məkkənin fəthi vaxtı azyaşlı uşaq olması barədə məlumatlar həqiqəti əks etdirmir. Belə ki, buna zidd olan tarixi və hədis rəvayətləri mövcuddur. İslamı qəbul edəndən sonra Allah Rəsulu (s.ə.v) hicri 9-cu (19 aprel 630-08 aprel 631) ildə Vəlid ibn Uqbəyə Bəni-Müstəliq qəbiləsinin illik zəkat vergisini alıb Mədinəyə gətirməsini tapşırmışdı. Vəlid isə onu qarşılamağa çıxmış Müstəliqoğullarının onu öldürmək üçün təşəbbüs etdiklərini düşünüb geri, Mədinəyə qayıtmış və Bəni-Müstəliqin vergi verməkdən imtina edərək irtidada üz tutduqlarını bildirmişdi. Bəzi məlumatlara görə isə Vəlid ibn Uqbə ümumiyyətlə Bəni-Müstəliq yurduna getməmiş, öldürüləcəyindən qorxaraq yarı yoldan qayıtmışdı. Bu xəbəri eşidəndən sonra Peyğəmbər (s.ə.v) Bəni-Müstəliq yurduna silahlı dəstə göndərmək istəmişdi. Lakin Allah Rəsulu (s.ə.v) bu məsələni araşdırandan sonra bunun səhv məlumat olduğu aydın olmuşdu. Zəkat vergisini toplamış məmur Haris ibn Dirar əl-Xuzai Peyğəmbərin (s.ə.v) yanına gələrək Vəlid ibn Uqbənin onların yanına gəlmədiyinə dair and içmişdi. İbn Cərir ət-Təbəri öz təfsirində Əhməd ibn Hənbələ istinadən "*Ey iman gətirənlər! Əgər bir fəsadçı sizə bir xəbər gətirsə, (onu) araşdırın. Yoxsa bilmədən bir qövmə pislik edər, sonra da bunun peşmançılığını çəkərsiniz*." (Hücurat 6) ayəsinin bu hadisəyə binaən nazil olduğunu bildirməkdədir. Güman ki, Sə'd ibn Əbu Vəqqas (r.ə) və Abdullah ibn Məs'udun (r.ə) Vəlid ibn Uqbənin Kufə valiliyinə təyin olunmasından məmnuniyyətsizliyi bu kimi səbəblərdən ötürü idi. Ömər ibn Xəttabın (r.ə) xəlifəliyi dövründə Vəlid ibn Uqbə Bəni-Təğlib qəbiləsində vergi məmuru olmuşdu.

və Zibatra şəhərlərini fəth edərək Qaliqalaya (Ərzurum) yaxınlaşmışdı. Həbib (r.ə) Ərzurumdakı Bizans qarnizonunu mühasirəyə almışdı. Şəhərin qriqoryan məzhəbində olan erməni əhalisi qalanın qapılarını müsəlmanların üzünə açmış və cizyə ödəməyi qəbul etmişdilər. Bunun müqabilində ermənilər Həbib ibn Məsləmədən (r.ə) bəzi insanların Ərzurumdan sürgün etməsini xahiş etmişdilər. Güman ki, bunlar şəhərin pravoslav yunan əhalisi və din xadimləri idilər. Çünki diofizit Bizans kilsəsinin monofizit şərq xristianlarına daim təzyiq göstərdikləri məlumdur. Həbib (r.ə) onların bu istəklərini qəbul edərək Ərzurumdan əhalinin bir qismini çıxarmışdı. O, bir neçə ay öz ordusu ilə Ərzurum şəhəri yaxınlığında düşərgə quraraq qalmışdı. Daha sonra Həbib ibn Məsləmə əl-Fıhri (r.ə) öz ordusu ilə Van gölü sahilindəki Əxlat qalasına yürüş etmişdi. İslam ordusunun şəhərə yaxınlaşdığını görən Əxlatın erməni yepiskopu daha əvvəl İyaz ibn Qənəmlə (r.ə) bağladıqları əhdnaməni götürərək Həbibin (r.ə) yanına gəlmiş və bu əhdnamənin şərtlərinə sadiq olduqlarını bildirmişdi. Həbib ibn Məsləmə (r.ə) yepiskopun gətirdiyi hədiyyələri qəbul edərək onunla xoş rəftar etmiş və beləcə Əxlat şəhəri ikinci dəfə sülh yolu ilə fəth olunmuş idi. Bununla yanaşı Həbib ibn Məsləmə (r.ə) kəşfiyyatçılarının gətirdikləri həyəcanlı xəbərləri dərhal Müaviyəyə (r.ə), o da öz növbəsində xəlifə Osman ibn Əffana (r.ə) bildirmişdi. Həbib ibn Məsləmə (r.ə) İslam ordularının fəaliyyətinin qarşısını almaq üçün general Mavrianın əmrindəki 80 minlik Bizans ordusunun Anadolunun şərqinə doğru yürüş etdiyi xəbərini almışdı. Xəlifə bu təhlükənin qarşısını almaq üçün dərhal tədbir görmüşdü. O, Kufə canişini Vəlid ibn Uqbənin Müaviyəyə (r.ə) lazımi köməyi göstərməsini əmr etmişdi. Osman ibn Əffanın (r.ə) Ömər ibn Xəttabın (r.ə) Azərbaycana vali təyin etdiyi Utbə ibn Fərqəd əs-Suləmini (r.ə) də tutduğu vəzifədən azad etməsindən qısa müddət sonra Azərbaycan əhalisi Utbə ibn Fərqədlə (r.ə) bağladıqları əhdnamənənin xilafına müqavilə şərtlərini yerinə yetirməkdən imtina etmişdilər. Bu üsyanı yatıraraq geri, Kufəyə qayıdan Vəlid ibn Uqbə İraqın əl-Hadisa qəsəbəsinə çatanda xəlifə Osman ibn Əffanın (r.ə) yeni əmr və təlimatlarının yazıldığı məktubu almışdı. Xəlifə Kufə valisinə belə yazırdı: “*Müaviyə ibn Əbu Süfyandan aldığım xəbərə görə bizanslılar müsəlmanların üzərinə böyük ordularla gəlməkdədirlər. Məktubumun sənə çatdığı yerdə dərhal kufəli döyüşçülərdən 8 və ya 9 min nəfərlik ordu təşkil et və dirayətli bir nəfəri onlara əmir təyin edərək Şam diyarındakı qardaşlarının yardımına göndər*”. Vəlid ibn Uqbə, Salman ibn Rəbiə əl-Bahilini (r.ə) 8 min mücahidə əmir təyin edərək Anadolunun şərqinə göndərmişdi. Həbib ibn Məsləmə (r.ə) öz qüvvələrini Salman (r.ə) və Səid ibn əl-Asın (r.ə) əmrindəki köməkçi qüvvələrlə birləşdirəndən sonra general Mavrianın ordusu ilə döyüşə girərək qələbə qazanmışdı. Bizans

ordusunun böyük bir qismi xeyli miqdarda silah-sursat və hərbi ləvazımatı döyüş meydanında qoyaraq qaçmış, bütün bunlar, o cümlədən general Mavrianın taxtı Həbib ibn Məsləmənin (r.ə) mücahidlərinin əlinə qənimət olaraq keçmişdi.

Hicri 26-cı ilin ortalarında (647-ci ilin baharı) Müaviyə ibn Əbu Süfyan (r.ə) başçılıq etdiyi ordu ilə Anadolunun cənubundan Bizans torpaqlarına daxil olmuş və Kappadokiyaya yürüş etmişdi. 10 gün Kayseri şəhərini mühasirədə saxlayan Müaviyə (r.ə) qaladakı Bizans qarnizonunun inadla müdafiə olunduğunu görüb bəzi hərbi dəstələrə Kayseri ətrafındakı kənd və qəsəbələrə hücum etmək əmrini vermişdi. Müaviyənin (r.ə) şəhəri zəbt etmədəki əzmini görən Kayseri əhalisi cizyə müqabilində əhdnamə bağlayıb şəhəri təslim etməyə razı olmuşdular. Kayseridən Anadolunun qərbinə doğru hərbi səfərini davam etdirən Müaviyə (r.ə) indiki Afyon şəhəri ətrafına qədər irəliləmiş və Amorium[77] şəhərinə hücum etmişdi. O, bu uğurlu hərbi səfərdən geri qayıdarkən Tarsus ətrafındakı Bizansa məxsus bəzi hərbi istehkamları və qalaları da ələ keçirmişdi. Həmin ilin sonlarına doğru (647-ci ilin yayı) Yəzid ibn Hürr əl-Əbsi (r.ə) Müaviyənin (r.ə) əmri ilə Anadolunun cənubuna hərbi yürüş etmiş, bol qənimətlə geri qayıtmışdı. Müaviyənin (r.ə) əsas hədəfi Bizansın paytaxtı Konstantinopol (İstanbul) idi. Buna görə də Kiçik Asiyaya kəşfiyyat xarakterli yürüşlər edərək bu ölkənin coğrafiyası və ordunun hərəkəti üçün əlverişli yollar haqqında ətraflı məlumata sahib olmaq istəyirdi. İrəlidə haqqında ətraflı bəhs edəcəyimiz kimi Müaviyə ibn Əbu Süfyan (r.ə) Konstantinopola hərbi səfərə çıxmışdı.

*Qafqaza Hərbi Yürüşlər*

Ömər ibn Xəttabın (r.ə) vəfatından qısa müddət sonra Azərbaycanda üsyan baş vermiş, əhali əhdnaməni pozaraq, müqavilə şərtlərini yerinə yetirməkdən imtina etmişdi. Albaniyada da vəziyyət gərginləşmişdi. Osman ibn Əffan (r.ə) Kufə canişinliyinə təyin etdiyi Vəlid ibn Uqbəyə Azərbaycana gedərək şəxsən vəziyyəti nəzarət altına almağı əmr etmişdi. Hicri 25-ci (646) ildə Salman ibn Rəbiəni (r.ə) avanqard qüvvələrlə yola salan Vəlid ibn Uqbə bir neçə gün sonra onun ardınca öz ordusu ilə Kufədən Azərbaycana doğru yola çıxmışdı. Sərkərdələrdən Abdullah ibn Şibl əl-Əhməs (r.ə) öz əsgərlərilə əvvəl Muğana, sonra isə Talış bölgəsinə gələrək üsyançılarla döyüşə girmiş və onları məğlubiyyətə uğratmışdı. Üsyançılardan bir hissəsi əsir alınmışdı. Muğan əhalisi Vəlid ibn Uqbədən, Huzeyfə ibn əl-Yəmanla (r.ə) bağladıqları əhdnamənin yenilənməsini xahiş etmişdilər. Vəlid

[77] Amorium Ön Asiyada, indiki Türkiyə Respublikasının Afyon vilayətinin Əmirdağ rayon mərkəzindək 13 km uzaqlıqda yerləşirdi. Xarabalıqları indiki Hisarköy kəndi yaxınlığındadır. Amorium orta əsrlərdə Anadolunun ən böyük şəhərlərindən biri idi.

(r.ə) onların bu istəyini qəbul edərək həmin şərtlərlə yeni əhdnamə bağlamışdı. Salman ibn Rəbiə (r.ə) isə əmrindəki 12 minlik qoşunla Albaniyaya gələrək o vaxta qədər fəth olunmamış ərazilərdə bəzi hərbi əməliyyatlar apararaq bol miqdarda qənimət və əsirlə Vəlid ibn Uqbənin yanına qayıtmışdı. Həbib ibn Məsləmə (r.ə) general Mavrianın başçılığındakı Bizans ordusunu məğlub etdikdən sonra Salman ibn Rəbiə (r.ə) ilə birlikdə Van gölü ətrafına gəlmiş, daha sonra isə onlar birlikdə Azərbaycanın şimal-qərb torpaqlarına daxil olmuşdular. Bu iki sərkərdə öz əsgərləri ilə Arran torpaqlarına girərək Azərbaycanın qərbində, Ərməniyyə ilə sərhəddə yerləşən Düveyn (Dvin) şəhərini mühasirəyə almışdılar. Qala divarlarını mancanaqlarla vuran mücahidlərin şiddətli hücumlarına şəhər əhalisi çox müqavimət göstərə bilməmişdilər. Bir müddət sonra onlar ərəblərdən hücumu dayandırmağı və aman verilməsini istəmişdilər. Düveynlilər müsəlmanlarla əhdnamə bağlayaraq şəhəri onlara təslim etmişdilər. Düveynin fəthindən sonra cənub-şərq istiqamətində irəliləyən xilafət ordusu Naxçıvan şəhərinə yaxınlaşmışdılar. Naxçıvandan bir qrup ağsaqqal ərəblərin ordugahına gələrək əhdnamə bağlamaq istədiklərini bildirmişdilər. İbn Cərir ət-Təbərinin bildirdiyinə görə bu əhdnamənin şərtləri Düveyn əhalisi ilə bağlanan əhdnamənin şərtləri ilə eyni idi. Bu səbəbdən də Düveynlilərlə bağlanan əhdnamənin mətninin tərcüməsini aşağıda qeyd edirik:

*Rəhman və Rəhim olan Allahın adı ilə*

*Bu sənəd Həbib ibn Məsləmə tərəfindən Düveyn şəhərinin xristianlarına, yəhudilərinə və məcusilərinə verilmişdir. Mən onların hüzurda olanlarına və olmayanlarına əman verirəm. Onların canlarına, mallarına, mülklərinə, kilsələrinə, sineqoqlarına, məbədlərinə və qala divarlarına toxunulmayacaqdır. Əhdinizə vəfa etdiyiniz, cizyə və xəracı ödədiyiniz müddətcə, əhdimizə vəfa etmək bizim üzərimizə yüklənmiş vəzifədir. Bu sənədin doğruluğuna Allah şahiddir. Vəkil olaraq Allah yetər. Həbib ibn Məsləmə əl-Fıhri bu vəsiqəni öz möhürü ilə təsdiq etdi.*

Naxçıvanın sülhlə fəthindən sonra əhalinin bir qismi əhdnamənin şərtlərindən narazı olduqlarını bildirmişdilər. Ərəblər şərtlərə əməl etməyərək üsyan edə biləcəklərindən ehtiyat etdikləri üçün onları Araz çayının cənubuna köçürüb burada məskunlaşdırmışdılar. Salman ibn Rəbiə (r.ə) və Həbib ibn Məsləmə (r.ə) öz əsgərləri ilə Naxçıvandakı dağ keçidindən keçib Sisyan ərazisinə daxil olmuşdular. Sisyan əhalisi öz qüvvələrini toplayıb ərəblərə qarşı müharibəyə girişmiş və məğlub olub geri çəkilmişdilər. Onlar ətrafdakı qalalara sığınıb müdafiə olunmuşdular. Xilafət ordusunun Sisyan vilayətinin ən

möhkəm qalalarından biri olan Veys qalasını zəbt etmələrindən sonra qüvvələr müharibəni dayandırıb təslim olmuşdular. Onlar ərəblərə cizyə ödəmək qarşılığında əhdnamə bağlamağı təklif etmişdilər. Salman (r.ə) və Həbib ibn Məsləmə (r.ə) onların bu təklifini qəbul etmişdilər. Bu iki sərkərdə daha sonra ayrı-ayrı istiqamətlərə hərəkət etmişdilər. Həbib ibn Məsləmə (r.ə) Sisyandan şimal istiqamətində, dağ yolları ilə Gürcüstana getmişdi. Salman ibn Rəbiə (r.ə) isə Araz çayı boyunca düzənlik ərazidə şərqə doğru irəliləyərək Arranın (Albaniya) cənubuna gəlmişdi. Salman ibn Rəbiə (r.ə) öz əsgərləri ilə bu ölkənin cənub-şərqində yerləşən ən böyük şəhəri, o dövrün ən məşhur mədəniyyət və ticarət mərkəzlərindən biri olan Beyləqana yaxınlaşmışdı. Salman ibn Rəbiə (r.ə) Beyləqan və ətraf bölgələrdə yaşayan əhalilə onların canlarına, mallarına, mülklərinə toxunmamaq, şəhərin qala divarlarını yıxmamaq, bunun əvəzində isə əhalinin cizyə ödəmələri şərtilə əhdnamə bağlamışdı. Beyləqanı sülhlə fəth edən Salman ibn Rəbiə (r.ə) buradan şimala doğru irəliləyərək Bərdə şəhərinə yaxınlaşmışdı. Salman ibn Rəbiə (r.ə) öz ordusuna şəhərdən bir qədər uzaqda düşərgə qurmağı əmr etdi. Bərdə əhalisi qala qapılarını bağlayıb müqavimət üçün hazırlaşmışdılar. Ərəblər Bərdəni mühasirəyə almışdılar. Bərdəlilər inadla müdafiə olunduqları üçün mühasirə bir qədər uzun çəkmişdi. Şəhərin mühasirəsi biçin vaxtına təsadüf etmişdi. Salman ibn Rəbiə (r.ə) əsgərlərinə ətraf kəndlərə hücum etmək əmrini vermişdi. Biçin vaxtı olduğu üçün ehtimal ki, Bərdənin mühasirəsi 647-ci ilin yay mövsümünün əvvəlinə təsadüf etmişdi. Salman ibn Rəbiənin (r.ə) ətraf kəndlərə basqın etməyi əmr etməsinin səbəbi öz əsgərləri üçün ərzaq təmin etmək ola bilər. Eyni zamanda bərdəliləri qışlıq ərzaqdan məhrum edərək təslim olmağa məcbur etmək məqsədi də daşımış ola bilər. Mühasirə uzun çəksə də nəhayət Bərdə əhalisi Salman ibn Rəbiənin (r.ə) yanına elçi heyəti göndərib sülh istəmiş və beyləqanlılarla bağlanmış müqavilənin şərtlərinə uyğun olaraq özlərilə də müqavilə bağlamağı təklif etmişdilər. Salman ibn Rəbiə (r.ə) bu təklifə müsbət yanaşmışdı. Beləcə Bərdə müsəlmanların əlinə keçmişdi. Salman ibn Rəbiə (r.ə) Bərdəni öz ordusu üçün istinad mərkəzi olaraq seçmişdi. Buradan hücuma keçən ərəblər Qarabağı bütünlüklə zəbt etmişdilər. Bərdənin və Qarabağın fəthindən sonra Salman ibn Rəbiə (r.ə) öz qüvvələrini Arranın şimal-qərbində yerləşən ən böyük şəhərlərindən biri olan Şəmkirə yönəltmişdi. Qısa müddət ərzində Şəmkiri ələ keçirən mücahidlər, daha sonra Kür çayı boyunca cənubi şərqə doğru irəliləyərək bu çay üzərindəki mühüm liman şəhəri olan Bərdici də zəbt etmişdilər.

Salman ibn Rəbiənin (r.ə) qardaşı Əbdürrəhman ibn Rəbiə (r.ə) öz ordusu ilə Arranın şimalına doğru irəliləmiş və xəzərilərə qarşı uğurlu hərbi əməliyyatlar

aparmışdı. Xəlifə Osman ibn Əffan (r.ə) Salman ibn Rəbiəyə (r.ə) öz ordusu ilə Dərbəndə, qardaşı Əbdürrəhman ibn Rəbiəyə (r.ə) köməyə getməsini əmr etmişdi. Dərbəndin yaxınlığındakı Bələncər qalasını fəth etməyə qərar vermiş Əbdürrəhman (r.ə) Şirvandan şimal istiqamətinə hərəkətə keçərək Bələncər qalasını mühasirəyə almışdı. Mücahidlər özləri ilə gətirdikləri mancanaqlarla qala divarlarını vurmağa başlamışdılar. Qaladakı xəzərilərin bir çoxu başlarına yağan daşlardan yaranaraq ölmüşdülər. Bu mühasirə vaxtı mücahidlər də çox itki vermişdilər. Yəzid ibn Müaviyə ən-Nəxəi (r.ə), Əlqamə ibn Qeys (r.ə), Miqdad əş-Şeybani (r.ə), Əmr ibn Utbə (r.ə) kimi sərkərdələr də Bələncər döyüşündə şəhid olmuşdular. Bu vaxt şimaldan qaladakıların köməyinə gələn xəzərilər müsəlmanlara arxadan hücum etmişdilər. Qalada müdafiə olunan xəzərilər də qaladan çıxaraq hücuma keçmişdilər. İki tərəfdən sıxışdırılan müsəlman əsgərlərin sıralarında nizamsızlıq yaranmışdı. Bələncərin mühasirəsi xəzərilərin qələbəsi ilə bitmişdi. Mücahidlərdən çox sayda şəhid olan vardı. Əbdürrəhman ibn Rəbiə (r.ə) də bu döyüşdə şəhid olmuşdu. Bu döyüşdə məşhur hədis ravisi və səhabə Əbu Hureyrə əd-Dəvsi (r.ə) və Salman Farsi (r.ə) də iştirak etmişdilər. Salman ibn Rəbiə (r.ə) ətrafa dağılışmış əsgərləri toplayaraq intizamı bərpa etmiş və ordusu ilə əvvəlcə İranın Gilan şəhərinə çəkilmiş, oradan da Gürgana getmişdi. Xəzərilər Əbdürrəhmanın (r.ə) cəsədi olan yerə bir neçə gün qorxudan yaxınlaşmadılar. Sonra isə bu cəsur mücahidin cəsədini götürüb hörmətlə dəfn etmişdilər. Mənbələrdə bu döyüşün hicri 32-ci (11 avqust 652-31 iyul 653) ildə baş verdiyi qeyd edilir.

Bərdicin fəthindən sonra bu şəhərin yaxınlığında Kür çayı üzərindəki körpünü təmir etdirən Salman ibn Rəbiə (r.ə) öz əsgərləri ilə Qəbələ şəhərinə yaxınlaşmışdı. Qısa çəkən döyüşdən qalib çıxan ərəblər əvvəlcə Qəbələ sonra da Şəki şəhərlərini ələ keçirmişdilər. Salman ibn Rəbiə (r.ə) Qəbələ, Şəki şəhərlərinin hakimləri və Şirvan məliki ilə cizyə vermələri şərtilə əhdnamə bağlamışdı. Şirvanda Huzeyfə ibn əl-Yəmanın (r.ə) ordusu ilə Salman ibn Rəbiənin (r.ə) ordusu birləşmiş və birlikdə Şabran şəhərinə doğru irəliləyib qalanı mühasirəyə almışdılar. Qısa müddətdə Şabran qalasını fəth edən Salman ibn Rəbiə (r.ə) Azərbaycanın Qafqaz dağlarında yaşayan əhalisi ilə də vuruşaraq özünə tabe olmağa məcbur etmişdi. Müşkür (Xaçmaz), Gilgilçay (Siyəzən), Ləkz, Filan, Təbərsəran (Dağıstanın cənubu) əhalisinin hakimləri ilə ərəblər arasında cizyə ödəmək şərtilə razılaşma əldə edilmişdi. Bir müddət Şabranda qalan Salman ibn Rəbiə (r.ə) buradan şimal istiqamətində irəliləyərək Dərbəndə yürüşə çıxmışdı. Salman ibn Rəbiənin (r.ə) əmri altındakı əsgərlərlə Samur çayını keçib sürətlə Dərbəndə yaxınlaşdığından xəbər tutan Xəzər xaqanı şimala doğru geri çəkilmişdi. Xəzər xaqanının Dərbənddən çəkilməsindən

sonra şəhərə girən mücahidlər heç bir müqavimətlə qarşılaşmadılar. Salman ibn Rəbiə (r.ə) Dərbənddə üç gün qalandan sonra xəzəriləri təqib etmək məqsədilə şimal istiqamətində hərəkət etmişdi. Yarqu şəhərini ələ keçirən mücahidlər xəzərilərin ordugahı yaxınlığında düşərgə salmışdılar. Bir müddət sonra xaqan digər millətlərdən də topladığı 300 min nəfərlik ordusu ilə müsəlmanlara hücum etmişdi. Ərəblərlə xəzərilər arasındakı bu misli görünməmiş müharibə 6 gün davam etmişdi. Xilafət ordusu ağır itgi vermişdi. Bu döyüşdə şəhid olmuş əsgərlərin məzarları Dərbəndin şimalında "*Qubur-uş-Şühəda*" (şəhidlərin qəbirləri) adlanan yerdədir. Xəzərilər ərəblərdən daha çox itki vermişdilər. Döyüşün altıncı günündə Salman ibn Rəbiə (r.ə) öz əsgərlərinə müraciət edərək 40 nəfər könüllü istəmişdi. Bu 40 nəfər süvari ilə xəzərilərin cərgələrini yarıb keçən Salman ibn Rəbiə (r.ə) xaqanın çadırına basqın edərək çadırın iplərini kəsmişdi. Fəqət dağıdılmış çadırda xaqanı ələ keçirə bilməmişdilər, çünki o, çadırda yox idi. Bu qırx igid əsgər, başçıları Salman ibn Rəbiə (r.ə) ilə birlikdə, mühasirəyə düşərək son nəfəslərinə qədər vuruşmuş və şəhid olmuşdular. Bu qırx şəhidin məzarı Dərbənd qalasının şimal divarının yaxınlığında bu gün də mövcuddur və "*Qırxlar qəbirstanlığı*" adı ilə tanınır.

Mənbələrin həm hadisələrin cərəyan etdiyi tarix, həm də şəxslər haqqında verdikləri məlumatlar qarışıq və ziddiyyətlidir. Təbəri və İbn-ul-Əsir bu hadisənin Hicri 32-ci (652-653) ildə baş verdiyini, bu döyüşdə Əbdürrəhman ibn Rəbiənin (r.ə) şəhid olduğunu qeyd etdikləri halda, Bəlazuri və İbn-ul-Ə'səm Salman ibn Rəbiənin (r.ə) bu döyüşdə xəzərilərlə vuruşduğunu və şəhid olduğunu yazırlar. İbn-ul-Ə'səmin "*Kitab-ul-Fütuh*" əsərini tərcümə etmiş akademik Z. Bünyadov açıqlamalar bölməsində bu hadisənin 646-cı ildə gerçəkləşdiyini qeyd edir. Bəlazuri də Salman ibn Rəbiənin (r.ə) bu məmləkətin fəthi üçün 646-cı ildə göndərildiyini nəql edir. İbn Kəsir isə Əbdürrəhman ibn Rəbiənin (r.ə) Hicri 32-ci (652-653) ildə Bələncər qalası yaxınlığında xəzərilərə qarşı girişdiyi döyüşdə şəhid olduğunu yazır. O, Salman ibn Rəbiə (r.ə) haqqında isə belə deyir: "*Salman ibn Rəbiə əl-Bahilinin Rəsulullahın (s.ə.v) əshabından olduğunu deyirlər. Salman ibn Rəbiə adlı-sanlı igid və məşhur qəhrəman idi. Xəlifə Ömər (634-644) onu Kufə qazılığına təyin etmişdi. Xəlifə Osmanın (644-656) dövründə o, türklərlə (xəzərilərlə) vuruşmaq üçün göndərilən orduya komandan təyin olunmuşdu. O, Bələncər yaxınlığında şəhid olmuşdur və məzarı da oradadır*". İbn Kəsir onun vəfat tarixinin bilinmədiyini yazır. Salman (r.ə) və Həbibin (r.ə) Düveyn və Naxçıvanı fəth etdikləri vaxt əhdnamə şərtlərindən narazı olan əhalinin bir hissəsini Araz çayının cənubuna köçürdüklərini qeyd etmişdik. Musa Kalankaytuklu öz salnaməsində Bizans imperatoru II Konstansın (641-668)

hakimiyyətinin 6-cı ilində ərəblərin Düveyni ələ keçirərək 35 min insanı əsir aldıqlarını qeyd edir. Bəlazuri, Həbib ibn Məsləmənin (r.ə) Arranı fəth etməsi haqqındakı məktubu ilə Salman ibn Rəbiənin (r.ə) şəhadət xəbərinin eyni vaxtda, onunla birlikdə döyüşlərdə iştirak etmiş Qərza ibn Kə'b əl-Ənsari (r.ə) adlı şəxs tərəfindən xəlifəyə çatdırıldığını yazır. II Konstansın hakimiyyətinin 6-cı ili 647-ci ilə təsadüf edir. Xəlifə Osman ibn Əffan (644-656) mücahidlərin və Salman ibn Rəbiənin (r.ə) şəhadət xəbərini eşitdiyi vaxt çox hüzünlənmişdi. Hətta xəlifə kədərindən ötürü yuxusuzluğa düçar olmuşdu. Daha sonra o, Huzeyfə ibn əl-Yəman əl-Əbsiyə (r.ə) məktub yazaraq onu şəhid olmuş Salman ibn Rəbiənin (r.ə) yerinə Arrandakı İslam ordusunun əmirliyinə təyin etmişdi.

*Misirdəki Üsyan Hərəkətləri*

Ömər ibn Xəttab (r.ə) şəhid edilib Ösman ibn Əffan (r.ə) xəlifə seçilərkən Misir fatehi və canişini Əmr ibn əl-As Mədinədə idi. O, yeni xəlifənin vəzifəsini icraya başlamasından sonra Misirə qayıtmış və həmin ilin cizyə və xəracını toplayıb Mədinəyə gömdərmişdi. Lakin xəlifə bu məbləğin əvvəlki illərə nəzərən daha az olmasının səbəbini soruşub izahat istəmişdi. Əmr ibn əl-As Misirdəki əkilən ərazilərin məhsuldarlığının Nil çayının səviyyəsinin qalxıb enməsindən asılı olduğunu bildirmişdi. Həmin il məhsuldarlığın əvvəlki illərə nəzərən az olmasının səbəbini suyun səviyyəsində yüksəlmə olmadığı şəklində izah etmişdi. Məhsuldarlıq az olduğu üçün də kənd təsərrüfatından alınan verginin miqdarında azalma olduğunu bildirmişdi. Lakin bu izahat xəlifəni qane etmədiyi üçün o, Əmr ibn əl-Ası Misir valiliyindən azad edərək bu vəzifəyə öz süd qardaşı olan Abdullah ibn Sə'd ibn Əbi Sərhi (r.ə) təyin etmişdi. Abdullah ibn Sə'd (r.ə) Əmr ibn əl-As canişin ikən Misirdə amil, yəni vergi işləri üzrə məmur idi. Belə bir səbəbdən ötürü vəzifəsindən azad edilməsi Əmr ibn əl-Ası incitmiş və Mədinəyə gedərək orada yaşamağa başlamışdı.

İmperator Heraklın ölümündən sonra Bizans taxtına oturmuş II Konstans (641-668) öz hakimiyyətini möhkəmlədəndən sonra imperiyasının xilafət qarşısında itirdiyi əraziləri geri almaq üçün bir sıra tədbirlər görmüşdü. Bizans xəzinəsinin əsas gəlir mənbələrindən biri olan Misirin yenidən ələ keçirilməsi məqsədiylə general Manuelin komandanlığındakı Bizans donanması Aralıq dənizinin Misir sahillərinə yaxınlaşmış və İsgəndəriyyə şəhərindəki az saydakı müsəlman əsgərlərə hücum etmək üçün münasib vaxtı gözləmişdilər. Hicri 25-ci (646) ilin bahar aylarında general Manuelin əmriylə İsgəndəriyyə limanında quruya çıxan Bizans ordusu şəhərdəki ərəb mühafizə dəstəsinə hücum etmiş və onları məğlub edərək İsgəndəriyyəni ələ keçirmişdi. İsgəndəriyyə əhalisini

bağladıqları əhdnamədən imtina etməyə məcbur edən Manuel şəhər ətrafındakı kənd və qəsəbələrin əhalisinə də bu məqsədlə müraciət etmişdi. Lakin İsgəndəriyyə ətrafındakı qıbtilər qiyamdan imtina edərək əhdnamə şərtlərinə sadiq qalacaqlarını bildirmişdilər. Buna görə də Manuel onları cəzalandırmaq məqsədiylə İsgəndəriyyə ətrafındakı yaşayış məntəqələrinə hücum etmiş və buradakı xristian əhalini qarət etmişdi. Abdullah ibn Sə'd ibn Əbi Sərh (r.ə) İsgəndəriyyə və ətraf ərazilərin müdafiəsini təşkil edə bilməmiş, bu isə bütün Misiri təhlükə altına qoymuşdu. Buna görə də Osman ibn Əffan (r.ə) dərhal Əmr ibn əl-Ası əvvəlki vəzifəsinə, Misir canişinliyinə təyin edərək yenidən Misirə göndərmişdi. Qısa müddətdə özünü Misirə yetirən Əmr ibn əl-As əmri altındakı mücahidlərlə İsgəndəriyyəyə hücum etmişdi. Manuel öz ordusu ilə İsgəndəriyyədən çıxıb Nikiu adlı yerdə Əmrin ordusu ilə qarşılaşmışdı. Nikiudakı şiddətli döyüş Bizans ordusunun darmadağın edilməsi ilə nəticələnmişdi. General Manuel limandakı Bizans hərbi gəmilərindən birinə minərək qaçmaqla canını qurtara bilmişdi. Hicri 25-ci (646) ilin yayında yenidən İsgəndəriyyəni fəth edən Əmr ibn əl-As şəhəri Bizans ordusunun qalıqlarından təmizləmişdi. İsgəndəriyyənin qıbti patriarxı Benyamin (622-661) Əmr ibn əl-Asla İsgəndəriyyə xristianları adına yeni bir əhdnamə bağlamışdı. Bu vaxt Manuelin əmri ilə soyulub talanmış kənd və qəsəbələrin xristian əhalisi Əmrin yanına gələrək bağladıqları əhdnaməyə sadiq qaldıqları üçün zümlə uğradıqlarını bildirmiş və mallarını geri istəmişdilər. Əmr ibn əl-As onların hər birinin uğradıqları ziyanı hesablatdıraraq bizanslılardan alınmış qənimətlədən bu ziyanın ödənməsini təmin etmişdi. Əmr ibn əl-As İsgəndəriyyəni tərk etməmişdən əvvəl yeni üsyan hərəkətlərinə qarşı bəzi tədbirlər görmüş, şəhərdəki bəzi hərbi istehkamları uçurdulmasını əmr etmişdi.

*Şimali Afrikadakı Hərbi Əməliyyatlar*

İsgəndəriyyə üsyanının yatırılması və şəhərin bizanslılardan təmizlənməsindən sonra, hicri 27-ci ildə (oktyabr 647-sentyabr 648) Osman ibn Əffan (r.ə) Abdullah ibn Sə'd ibn Əbi Sərhin (r.ə) əmrinə ordu verərək Afrikanın şimalına, Aralıq dənizi sahili boyunca qərb istiqamətinə getməsini əmr etmişdi. Misirin fəthindən sonra Abdullah ibn Nafi' ibn Qeys (r.ə), Abdullah ibn Nafi' ibn Hüseyn (r.ə) və Utbə ibn Nafi'nin (r.ə) əmri altındakı mücahidlər Afrikanın şimalındakı Bizans kaloniyaları və bərbəri tayfalarına qarşı mütəmadi olaraq kiçik çaplı hərbi yürüşlər təşkil etməkdə idilər. Abdullah ibn Sə'd ibn Əbi Sərhin (r.ə) əmrindəki ordu Misirdən qərbə doğru yola çıxıb Bərqa şəhərində Utbə ibn Nafi'nin (r.ə) qüvvələri ilə birləşmişdi. Bir müddət sonra Abdullah ibn Zübey-

rin (r.ə) əmrindəki əlavə qüvvələr də xəlifənin əmri ilə Mədinədən yolu çıxıb indiki Liviya ərazisində əsas orduya qoşulmuşdu. Bu orduda Həsən ibn Əli ibn Əbu Talib (r.ə) və qardaşı Hüseyn ibn Əli (r.ə), Abdullah ibn Cə’fər ibn Əbu Talib (r.ə), Abdullah ibn Əmr ibn əl-As (r.ə), Abdullah ibn Abbas (r.ə) kimi əshabından və Allah Rəsuluna (s.ə.v) yaxınlığı ilə tanınan bir çox şəxs var idi. Əlavə qüvvələrin qoşulması ilə Abdullah ibn Sə’d ibn Əbi Sərhin (r.ə) ordusunun ümumi sayı 40 minə çatmışdı. İndiki Liviyanın Aralıq dənizi sahili boyu qərbə tərəf irəliləyən İslam ordusu Tripoli yaxınlarındakı Subeytila qalası yaxınlığında düşərgə salmışdı. Bu qaladan qərbdə Aralıq dənizi sahillərinə qədər olan ərazi Qriqori adlı Bizans vassalı olan xristian generalın idarəsi altında idi. Onun ölkəsindəki şəhərlərin sakinlərinin böyük əksəriyyəti yunan və finikiyalı kaloniyaçıların törəmələri idi. Qriqorinin sayı 120 mini keçən böyük və qüvvətli ordusu var idi. Subeytilanı ələ keçirib Tripoliyə yaxınlaşan İslam ordusu burada şiddətli müqavimətə rast gəlmişdi. Digər tərəfdən Qriqorinin böyük bir ordu ilə Tripolinin köməyinə yetişmək üçün yola çıxdığı xəbəri alınmışdı. Abdullah ibn Sə’d (r.ə) əmirlərini toplayaraq məsələni şurada müzakirə etmiş və belə qərara gəlinmişdi ki, Qriqorinin ordusu ilə qarşılaşmaq qalanı mühasirədə saxlamaqdan daha məqsədəuyğundur. İndiki Liviya ərazisində iki ordu qarşı-qarşıya gəlmişdi. Abdullah ibn Sə’d (r.ə) İslamın hərb ənənəsinə uyğun olaraq Qiqoriyə məktub göndərərək onu İslamı və ya cizyə ödəməyi qəbul etməyə dəvət etmişdi. Qriqori bunu qəti surətdə rədd etməklə kifayətlənməyib İslam ordusunun komandanı olan Abdullah ibn Sə’di (r.ə) öldürənə 100 min dinar qızıl pul mükafatı və öz qızı ilə evləndirməyi və’d etmişdi. Bir neçə gün davam edən şiddətli döyüşlər hər iki tərəfin itgi verməsi və heç bir tərəfin ciddi uğur qazana bilməməsi ilə nəticələnmişdi. Abdullah ibn Sə’d (r.ə) Qriqorinin onun başına pul qoyması səbəbiylə döyüş meydanında xeyli ehtiyatlı davranmaqda idi. Bu onun öz ordusunu daha keyfiyyətli idarə edib istiqamətləndirməsinə mane olurdu. Bunu görən Abdullah ibn Zubeyr (r.ə) də eyni və’di Qriqori üçün elan etmişdi. O, Qriqorini öldürən mücahidə 100 min dinar və Qriqorinin qızını verməyi və’d etmişdi. Hər iki tərəf günün birinci yarısında bir-birinə hücum edərək döyüşür, günün ikinci yarısında isə kölgəliklərdə dincəlirdilər. Çünki döyüş səhrada və ilini isti aylarında aparılmaqda idi. Bu cür döyüş taktikası seçilməsi səbəbiylə bu müharibə mövqe döyüşünə çevrilmiş, heç bir tərəf digərinə üstün gələ bilməmişdi. Abdullah ibn Zübeyrin (r.ə) təşəbbüsü ilə Qriqoinin ordusuna qarşı aparılan müharibənin taktikasında dəyişiklik edilmişdi. Abdullah ibn Zubeyr (r.ə) bir gün hücum vaxtı İslam ordusundakı süvari mücahidlərin mühüm bir qismini atları ilə birlikdə düşərgədəki çadırlarda gizlətmişdi. İslam

ordusu Qriqorinin ordusuna hücum edərək bir müddət döyüşmüş, lakin şiddətli müqavimət səbəbiylə güya geri dönüb qaçmağa başlamışdı. Düşmən ordusu İslam ordusunun bu saxta qaçışını gerçək zənn edərək onları təqib etməyə başlamışdı. İslam ordusu öz ordugahındakı çadırları da keçərək xeyli uzaqlaşmış və düşmən ordusu da onları təqib etməklə məşğul olmuşdu. Beləcə çadırlarda gizlədilmiş süvari mücahidlər Qriqorinin ordusunun arxasında qalmışdı. İşarə edilən kimi İslam ordusunun əsas qismi saxta qaçışı dayandıraraq geri qayıdıb hücum etmiş, pusqudakı süvari mücahidlər də Qriqorinin ordusuna arxadan qəfil basqın etmişdi. Məngənədə qalan düşmən qüvvələri arasında çaxnaşma və intizamsızlıq başlamış, bu da general Qriqorinin ordusunun məğlubiyyəti ilə nəticələnmişdi. Abdullah ibn Zübeyr (r.ə) şəxsən general Qriqorinin yaxalayaraq öldürmüşdü. O, əsirlərin arasından Qriqorinin qızını da müəyyənləşdirib ayırmışdı. Beləcə Abdullah ibn Zubeyr (r.ə) və'd olunmuş 100 dinar mükafata və Qriqorinin qızına sahib olmuşdu. Bu məğlubiyyətdən qısa müddət sonra Tripoli, daha sonra isə indiki Tunis ərazisindəki Karfagen şəhərləri İslam ordusu tərəfindən fəth edilmişdi. Abdullah ibn Zubeyrin (r.ə) başçılığı altındakı süvari mücahidlər indiki Mərakeş torpaqlarına, Atlantik okeanı sahillərinə qədər irəliləyib geri qayıtmışdı. İslam ordusunun bir qismi isə cənub istiqamətində hərəkət edərək indiki Sudan torpaqlarına daxil olmuşdu. Yeni fəth olunmuş torpaqların inzitabi-idari işləri Abdullah ibn Nafi' ibn Qeysə (r.ə) tapşırılmışdı. Şimali Afrikanın fəthi ilə İspaniyanın və Avropanın fəthi yolu açılmışdı.

*İspaniyadakı (Əndəlus) Hərbi Əməliyyatlar. Kiprin Fəthi*

Karfagenin ələ keçirilərək indiki Tunis və Əlcəzair torpaqlarının bütünlüklə fəth edilməsindən sonra Osman ibn Əffan (r.ə) şimali Afrikadakı İslam ordularının komandanı Abdullah ibn Nafi' ibn Qeysə (r.ə) öz qüvvələri ilə Abdullah ibn Nafi' ibn Hüseynin (r.ə) əmrindəki qüvvələrdən döyüş təcrübəsi daha çox olan ən cəsur əsgərlərdən seçmə bir ordu təşkil edərək dəniz yolu ilə İspaniya torpaqlarına keçməyi əmr etmişdi. Məqsəd gələcəkdə fəth ediləcək yerlərə kəşfiyyat xarakterli hərbi yürüş etmək idi. Osman ibn Əffan (r.ə) Abdullah ibn Nafi' ibn Qeysə (r.ə) bu barədə yazdığı məktubda İspaniyanın fəthinin Konstantinopolun fəthi yolunda atılacaq mühüm bir addım olduğunu bildirmişdi. Hicri 27-ci ilin sonlarında (avqust-sentyabr 648) öz ordusunu dəniz yolu ilə Əndəlüsə (Andalusia) keçirən Abdullah ibn Nafi' ibn Qeys (r.ə) xəlifənin bu əmrini uğurla yerinə yetirmiş və geri, Şimali Afrikaya qayıtmışdı.

Ömər ibn Xəttabın (r.ə) xəlifəliyi dövründə Müaviyə ibn Əbu Süfyan (r.ə) sadəcə Dəməşq şəhəri, ətrafı və indiki İordaniyanın şimalının valisi idi. Şam di-

yarının ilk ümum-valisi buranı fəth etmiş ordunun baş komandanı Əbu Ubeydə ibn Cərrah (r.ə) olmuşdu. Əbu Ubeydənin (r.ə) vəfatından sonra Ömər ibn Xəttab (r.ə) onun dayısı oğlu İyaz ibn Qənəmi (r.ə) Şam valisi təyin etmişdi. İyazın (r.ə) vəfatından sonra Ömər ibn Xəttab (r.ə) onun yerinə Səid ibn Xuzeym əl-Cumahini (r.ə) təyin etmiş, ondan sonra da Hums və Qinnəsreyn hakimi Umeyr ibn Sə'd əl-Ənsari (r.ə) Şam diyarı ümum-valisi olmuşdu. Umeyr ibn Sə'd (r.ə) düçar oludğu xəstəlik səbəbiylə Osman ibn Əffandan (r.ə) vəzifəsindən azad olunmasını xahiş etmiş və Mədinəyə ailəsinin yanına qayıtmışdı. Osman ibn Əffan (r.ə) Hums və Qinnəsreyn hakimliyini də Müaviyəyə (r.ə) həvalə etmişdi. Bir müddət sonra Osman ibn Əffan (r.ə) Müaviyə ibn Əbu Süfyana (r.ə) vəfat etmiş Fələstin hakimi Abdullah ibn Əlqamənin (r.ə) işlərini də həvalə etmişdi. Beləcə Müaviyə ibn Əbu Süfyan (r.ə) bütün Şam diyarının, indiki Suriya, Fələstin, İsrail, İordaniya, Livan dövlətlərini əhatə edən ərazinin valisi olmuşdu.

Aralıq dənizinin şərq sahillərinin təhlükəsizliyinə cavabdeh olan Müaviyə (r.ə) buradakı tərsanələrdə gəmi inşa etdirərək donanma qurmaq və bu donanma ilə Aralıq dənizində Bizans imperiyasının hərbi dəniz qüvvələrinə qarşı mübarizəyə girişmək fikrində idi. Bu fikir hələ Ömər ibn Xəttabın (r.ə) dövründə mövcud idi. Bu məqsədlə dəfələrlə Ömərə (r.ə) müraciət etmişdi. Ömər ibn Xəttab (r.ə) donanma və dəniz döyüşləri barədə Əmr ibn əl-Asdan təfsilatlı məlumat alandan sonra bunu izn verməyəcəyi barədə qəti qərara gəlmişdi. Belə ki, xəlifə Ömər (r.ə) səhra qövmü olan ərəblərin gəmilərə minərək dəniz döyüşlərinə girişmələrini müsəlmanları təhlükəyə atmaq kimi qiymətləndirmişdi. Dənizçilik işində ərəblərin heç bir təcrübəsi yox idi. Osman ibn Əffan (r.ə) xəlifə olduqdan sonra Müaviyə (r.ə) yenidən bu məsələni qaldırmış və hərbi donanma qurulması üçün dəfələrlə xəlifəyə müraciət etmişdi. O, bu fikrini belə əsaslandırmışdı ki, əgər müsəlmanlar hərbi dəniz qüvvəsinə malik olsalar Aralıq dənizi sahillərindəki xilafət torpaqlarını qorumaq daha asan olar. Bundan başqa Aralıq dənizi sahillərindəki bəzi liman-qalaları sadəcə qurudan mühasirə etməklə fəth etmək mümkün deyildi. Çünki Bizans donanması dəniz yolu ilə bu qala-şəhərləri daim təchiz edirdilər. Bundan başqa Müaviyə (r.ə) Aralıq dənizindəki Kipr adasının fəthinin zəruri olduğunu düşünürdü. Belə ki, bu ada Şam diyarına çox yaxın idi. Hətta vali xəlifəyə yazmışdı ki, sahil qəsəbələrində yaşayan müsəlmanlar gecənin sakitliyində bu ada sakinlərinin itlərinin hürüşməsini və xoruzlarının banlamasın belə eşidə bilirlər. Yəni ada kifayət qədər sahilə yaxındır və fəth olunması üçün uzun yol qət etməyə ehtiyac olmayacaq. Bu adanın fəth edilməsilə Konstantinopola gedən dəniz yolu üzərindəki mühüm bir maneə aradan qaldırılmış olacaqdı. Osman ibn Əffan

(r.ə) irəli sürülən bütün zərurətləri nəzərə alaraq Müaviyənin (r.ə) hərbi donanma qurma işinə razılıq vermişdi. Lakin dəniz döyüşlərində işitirak üçün heç kim sərfərbər edilməyəcəkdi. Dəniz səfərlərində sadəcə könüllü mücahidlər iştirak edəcəkdilər. Xəlifənin razılığını rəsmi surətdə əldə edən Müaviyə ibn Əbu Süfyan (r.ə) dərhal tərsanələrdə hərbi gəmilərin inşa edilməsi əmrini vermişdi. Qısa müddət ərzində xeyli gəmi inşa edilmişdi. Şam valisi Müaviyə (r.ə) müsəlmanlar arasından Bizansa qarşı hərbi dəniz sərfərinə çıxmaq üçün könüllülərin toplanmasını təmin etmişdi. Qısa müddət ərzində bu iş üçün könüllü olan xeyli mücahid toplanmışdı. Bunların arasında Allah Rəsulunun (s.ə.v) əshabından Əbu Zərr əl-Ğifari (r.ə), Əbu'd-Dərda (r.ə), Ubadə ibn Samit (r.ə) də var idilər. Digər tərəfdən Misir valisi Abdullah ibn Sə'd ibn Əbi Sərh (r.ə) də Misirdə hazırladığı hərbi donanmanı yola çıxarmışdı. Beləcə hicri 28-ci ilin (sentyabr 648-sentyabr 649) ortalarında İslam donanması Kipr adasına doğru yola çıxmışdı. Şam diyarı sahillərindən hərəkətə keçən dənizçi mücahidlərə öz cəsurluğu ilə tanınmış Abdullah ibn Qeys əl-Cisi (r.ə) başçılıq etməkdə idi. Bu donanma Kipr yaxınlığında Misir donanması ilə birləşərək adaya əsgər çıxarmışdı. Kiprdə dənizçi mücahidlərlə Kiprin yerli və bizanslı əsgərləri arasındakı döyüş elə də uzun çəkməmiş və müsəlmanların qələbəsi ilə bitmişdi. Kipr adası qısa müddət ərzində fəth olunmuş və kiprlilərlə əhdnamə bağlanmışdı. Əhdnaməyə görə Kipr əhalisi hər il xilafət xəzinəsinə 7 min dinar cizyə ödəyəcək və lazım gəldikdə müsəlmanların bu adanı hərbi baza və istinadgah kimi istifadə etmələrinə mane olmayacaqdılar. Misir və Şam diyarından qısa müddət sonra Kiprin də itirməsi Bizans imperiyasında şok təsiri yaratmışdı. Abdullah ibn Qeys (r.ə) öz donanması ilə bir il ərzində 50-yə yaxın hərbi dəniz səfəri gerçəkləşdirmiş və hamısını uğurla başa çatdırmışdı. Beləcə Aralıq dənizinin şərqi müsəlmanların nəzarətinə keçmişdi. Onun vəfatından sonra Şaban ibn Əvf (r.ə) İslam donanmasının komandanı olmuşudu.

Kiprin müsəlmanlar tərəfindən fəth edilməsi Bizans sarayına ağır təsir etmişdi. İmperiyanın Aralıq dənizindəki hərbi varlığı sual altına düşmüşdü. Hicri 31-ci (avqust 651-iyul 652) ildə Bizans imperatoru II Konstans (641-668) həm Kipri geri almaq, həm də yeni qurulmuş İslam hərbi dəniz qüvvələrini məhv etmək üçün 500 gəmidən ibarət donanma ilə Aralıq dənizinin şərqinə doğru üz tutmuşdu. Dənizçilik işində əsrlərlə müqayisə edilməyəcək qədər təcrübəyə malik Bizans donanması Kipr yaxınlığında yeni yaradılmış, hərbi təchicat və say baxımından özündən daha aşağı səviyyədə olan İslam donanması ilə döyüşə girişmişdi. İslam donanması cəmi 200 gəmidən ibarət idi. Zatu's-Səvari adlanan bu dəniz döyüşü müsəlmanların parlaq qələbəsi ilə başa çatmışdı. 500

gəmidən ibarət Bizans donanması Zatu's-Səvari döyüşündə darmadağın edilmişdi. İmperator içində olduğu gəmi ilə canını çətinliklə qurtarmış və Siciliya adasına sığınana qədər dənizçi mücahidlər tərəfindən təqib olunmuşdu. Kipr yaxınlığındakı dəniz döyüşündə qazanılan zəfərdən sonra müsəlmanlar daha da cəsarətlənərək Aralıq dənizində irəliləmiş, Krit və Malta adalarına hərbi dəniz səfəri təşkil etmişdilər. Bir müddət sonra Müaviyənin (r.ə) əmri ilə İslam donanması Rodos adasını fəth etmişdi. Burada olan və dünyanın yeddi möcüzəsindən biri hesab olunan nəhəng heykəl qənimət malı hesab edilərək ələ keçirilmiş və bir yəhudi tacir tərəfindən satın alınaraq aparılmışdı. Rodosun fəthi ilə Egey və Mərmərə dənizləri İslam donanmasının üzünə açılmışdı. Müaviyə ibn Əbu Süfyan (r.ə) hicri 32-ci (avqust 652-iyul 653) ilin sonlarında Bizansın paytaxtı olan Konstantinopola hərbi dəniz səfəri təşkil etmişdi. İslam donanması Egey və Mərmərə dənizlərini keçərək Konstantinopola (İstanbul) yaxınlaşmış, bir müddət burada qalıb kiçik çaplı hərbi əməliyyatlardan sonra geri qayıtmışdı.

*İrandakı Üsyan Hərəkətləri*

Osman ibn Əffan (r.ə) İranın yeni fəth edilmiş ərazilərindəki ordu komandanları və canişinlər arasında bəzi dəyişikliklər etmiş, bəzilərinin yerini dəyişmiş, bəzi yerlərə isə yenilərini təyin etmişdi. Bəsrəlilərin nümayəndə heyəti Mədinəyə gəlib xəlifə ilə görüşmüş və Bəsrə valisi Əbu Musa əl-Əş'ərinin (r.ə) bu vəzifədən azad edilərək yerinə başqa birini təyin edilməsini xahiş etmişdilər. Osman ibn Əffan (r.ə) onların hansı səbəbdən ötürü validən narazı olduqlarını soruşanda isə nümayəndə heyəti bu barədə danışmaq istəmədiklərini bildirmişdilər. Əslində isə bəsrəlilərin validən narazı olmasının elə də ciddi bir səbəbi yox idi. İraqın şimalındakı dağlıq ərazilərdə məskunlaşmış bəzi kürd qəbilələri müsəlmanlarla bağladıqları əhdnaməni pozmuş və qiyam qaldırmışdılar. Əbu Musa əl-Əş'əri bəsrəlilərə müraciət edərək onları qiyamçılara qarşı cihada təşviq etmiş, bu əməlin fəzilətini anlatmış, piyada olaraq cihadda iştirak etməyin savabının süvari olaraq iştirak etməkdən daha üstün olduğunu söyləmişdi. Hərbi səfər üçün hazırlıqlar tamamlanıb ordu yola çıxanda isə valinin özünün silah-sursat və ərzaq kimi ehtiyaclarını bir neçə qatıra yükləyərək səfərə çıxdığını görən bəsrəlilərdən bəziləri valiyə yaxınlaşaraq qatırların yüyənindən tutmuş və onları piyada səfərə çıxmağa təşviq edən Əbu Musaya (r.ə) öz təchizatını heyvanlara yükləyərək daşımasını irad tutmuşdular. Əbu Musa (r.ə) onların bu hərəkətindən qeyzlənmiş və onları acılamışdı. Buna görə də bəsrəlilər Mədinəyə heyət göndərərək "*Bəni-Əş'ər qəbiləsindən olan bu qocanı bizim başımızdan al və yerinə başqasını təyin et*" deyə isma-

rıc göndərmişdilər. Xəlifə işin əslini, səbəbini dəqiq öyrənəndən sonra onların istəklərinə müsbət cavab vermiş, özünün 25 yaşlı dayısı oğlu Abdullah ibn Amir ibn Kureyzi Bəsrə valiliyinə təyin etmişdi. Özünün vəzifədən azad edildiyini və yerinə Abdullah ibn Amirin təyin edildiyini eşidən Əbu Musa əl-Əş'əri (r.ə) məsciddə bəsrəlilərə belə xitab etmişdi: "*xərac toplayıb mal-dövlət artıran bir uşaq sizin üçün vali olaraq gəlir. Onun əmri altına iki ayrı ordu da verilmişdir*". Osman ibn Əffan (r.ə) Bəsrədəki hərbi qüvvələrlə yanaşı Osman ibn Əbi'l-As əs-Səqəfinin (r.ə) başçılıq etdiyi Bəhreyn və Omandakı İslam ordularının komandanlığını da yeni Bəsrə valisinə vermişdi.

Osman ibn Əffan (r.ə) hakimiyyətinin altıncı ilində bir sıra vilayətlərin canişinlərini və cəbhələrdəki ordu komandanlarını, əmirləri dəyişmişdi. İranın şimal-şərqi və Əfqanıstanın qərbini əhatə edən Xorasandakı orduların əmirliyinə Umeyr ibn Osman ibn Sə'd, İranın Sicistan vilayətindəki ordunun əmirliyinə əvvəlcə Abdullah ibn Umeyr əl-Leysini, daha sonra Abdullah ibn Amiri, Aşağı Türküstandakı Muqran vilayətinə Ubeydullah ibn Mə'məri, Kirmana əvvəlcə Əbdurrəhman ibn Ubeysi, daha sonra Asim ibn Əmri vali təyin etmişdi. Bir müddət sonra Ubeydullah ibn Mə'məri Fars və Əhvaz valiliyinə təyin edib, onun yerinə Muqrana Umeyr ibn Osmanı vali təyin etmişdi.

Hicri 29-cu ilin (avqust 649-iyul 650) ortalarında Fars vilayətinin zadəganları əhalini üsyana təşviq edərək İslam dövləti ilə bağladıqları əhdnamənin şərtlərini pozmuşdular. Onlar adamlarını silahlandıraraq kifayət qədər böyük hərbi dəstə təşkil edə bilmişdilər. Vali Ubeydullah ibn Mə'mər öz ordusu ilə Fars vilayətindəki İstəxr qalası yaxınlığında qiyamçılarla döyüşə girişmişdi. Bu döyüşdə Ubeydullah ibn Mə'mər çox sayda müsəlmanla birlikdə şəhid olmuşdu. Qiyamçıların bu qələbəsindən ruhlanan Darabgərd və Gur şəhərlərinin əhalisi də qiyam qaldırmışdı. Bəsrə valisi Abdullah ibn Amir ibn Kureyz dərhal ordusunu hərəkətə gətirmiş və bəsrəlilərə də könüllülərdən ibarət əlavə, köməkçi qüvvə təşkil etmələri üçün müraciət etmişdi. O, qabaqcadan İmran ibn Hüseynin əmrindəki süvariləri göndərərək topladığı ordusunu onun ardınca Fars vilayətinə yeritmişdi. Ordunun sağ cinahına Əbu Bərzə əl-Əsləmi (r.ə), sol cinahına isə Mə'qil ibn Yəsar əmirlik edirdi. Gənc komandan Abdullah ibn Amirin ordusu İstəxr qalası yaxınlığında qiyamçılarla döyüşə girib onları məğlub etmişdi. Bir qismi qılıncdan keçirilən qiyamçılar qaçıb dağılışmışdılar. İstəxr qalası yenidən fəth edilmişdi. Bəsrə valisi İstəxrdə yubanmadan öz qüvvələrini əvvəlcə Darabgərd, sonra isə Gur şəhərinə istiqamətləndirmiş və hər iki şəhərdəki qiyam yatırılmışdı. Ordu Gur qalasını mühasirədə saxlayarkən İstəxr yenidən qiyamçıların əlinə keçmişdi. Abdullah ibn Amir özü İstəxrə

qayıdaraq Gurun mühasirəsini Harim ibn Həyyan əl-Əbdiyə tapşırmışdı. Müsəlmanlar möhkəm divarlarla əhatə olunmuş Gurun fəthi vaxtı çox çətinlik çəkmişdilər. Lakin baş verən gözlənilməz hadisə şəhərin fəthini xeyli asanlaşdırmışdı. Belə ki, müsəlmanlar bir gün öz ordugahlarında sübh namazını qılandan sonra mücahidlərdən biri bir itin gəlib onun ərzaq torbasını alıb qaçdığını görmüşdü. O, ərzağını xilas etmək məqsədiylə iti qovub təqib etmiş və itin qala divarlarına yaxın bir yerdəki deşiyə girərək gözdən itdiyini görmüşdü. O, geri qayıdıb baş verəni əmirinə danışmışdı. Müsəlmanlar həmin deşiyin şəhərə gedən gizli yol ola biləcəyini düşünmüş və yanılmamışdılar. Sonrakı gecə oraya gedib həmin deşiyi qazıyaraq genişləndirmiş və bunun şəhərə gedən lağıma açılan yol olduğunu görmüşdülər. Beləcə gecə vaxtı həmin lağımdan şəhərə girən bir dəstə mücahid gözətçiləri öldürərək qala qapılarını İslam ordusunun üzünə açmışdılar. Beləcə Allah Gurun fəthini müsəlmanlar üçün asanlaşdırmışdı. Gur fəth edilərkən ordusu ilə İstəxrə gələn Abdullah ibn Amir (r.ə) qiyamçıları yenidən məğlub və darmadağın edərək şəhəri ələ keçirmişdi. Abdullah ibn Amir (r.ə) Fars vilayətindəki qiyamı tamamən yatırdıqdan sonra İstəxrə müsəlman mühacirləri köçürərək məskunlaşdırmış və buradakı qarnizona Şərik ibn Avər əl-Harisini əmir təyin etmişdi. Şərik ibn Avər İstəxrdə məscid inşa etdirərək əhalinin İslama dəvəti üçün çalışmışdı.

*İran və Əfqanıstandakı Hərbi Əməliyyatlar. Kabilin Fəthi*

Ömər ibn Xəttabın (r.ə) xilafəti dövründə baş vermiş döyüşlərlə Sasani imperiyasının hərbi qüvvələri arda-arda baş verən məğlubiyyətlər nəticəsində böyük ölçüdə məhv edilmişdi. Lakin İranın bəzi vilayətləri, xüsusiylə də dağlıq əraziləri fəth edilməmişdi. İranın tamamən İslam hakimiyyəti altına keçməsi Osman ibn Əffanın (r.ə) hakimiyyəti dövründə baş vermişdi. Hicri 30-cu (avqust 650-iyul 651) ildə Səid ibn əl-As (r.ə) əmri altındakı böyük bir ordu ilə İranın şimalında, Xəzər dənizinin cənub sahilindəki Təbəristan vilayətinə yürüş təşkil etmişdi. Bu hərbi səfərdə Həsən ibn Əli ibn Əbu Talib (r.ə), qardaşı Hüseyn ibn Əli (r.ə), Abdullah ibn Məs'ud (r.ə), Abdullah ibn Ömər (r.ə), Abdullah ibn Əmr ibn əl-As (r.ə), Abdullah ibn Zubeyr (r.ə), Huzeyfə ibn əl-Yəman (r.ə) kimi Allah Rəsulunun (s.ə.v) əshabından bir çox kəs iştirak etmişdi. Səid ibn əl-As (r.ə) Quməs şəhərinə yaxınlığında düşərgə quraraq ordusuna hərb nizamı vermişdi. Huzeyf ibn əl-Yəmanın (r.ə) əmrindəki mücahidlər Gürgan şəhərinə hücum edərək şiddətli döyüşdən sonra şəhəri fəth etmiş və gürganlılarla illik 200 min dirhəm cizyə müqabilində əhdnamə bağlamışdı. Səid ibn əl-As (r.ə) isə öz əsgərləri ilə Təbəristanın içərilərinə qədər irəliləyərək bu yerlərin ən möhkəm

qala-şəhərlərindən olan Tamisəni mühasirəyə almışdı. Ağır döyüşlərdən sonra Tamisə şəhəri fəth edilmişdi. Tamisənin ardınca Təbəristandakı bir sıra qalalar da ələ keçirilmişdi.

Bəsrə valisi Abdullah ibn Amir (r.ə) 651-ci ildə Sicistandakı əmirlərdən Mucaşi ibn Məs'uda (r.ə) məktub yazaraq Sasani sülaləsinin son hökmdarı III Yəzdigərdin gizlicə gələrək Sicistandakı qəsəbələrdən birində gizləndiyi barədə məlumat aldığını bildirmiş və Mucaşiyə (r.ə) şahın yerini müəyyən edib yaxalamağı əmr etmişdi. III Yəzdigərdin yerini müəyyən edəndən sonra Mücaşi ibn Məs'ud (r.ə) öz dəstəsi ilə şahı yaxalamaq üçün hərəkətə keçmiş, lakin şah bundan xəbərdar olaraq öz adamları ilə dərhal Xorasana qaçmışdı. Mucaşi ibn Məs'udun (r.ə) dəstəsi Əfqanıstanın qərbindəki yüksək dağlıq ərazilərdə şahı təqib edərkən gözlənilmədən şiddətli çovğuna və qar fırtınasına düşmüşdü. Belə hava şəraitinə vərdiş olmayan ərəblər irəliləyə bilməyərək orada qalmış və əksəriyyəti donaraq şəhid olmuşdular. Mucaşi ibn Məs'ud (r.ə) bir neçə əsgərlə sağ qalaraq geri qayıda bilmişdi. III Yəzdigər qaçıb qurtulmuş və özünü Mərv qalasına çatdırmışdısa da şəhər əhalisi qala qapılarını şahın üzünə açmayaraq onun oradan uzaqlaşmasını istəmiş, daha sonra isə şaha hücum etmişdilər. III Yəzdigərdin ətrafındakı az sayıdakı adamları da qaçıb dağılandan sonra o, bir dəyirmançının yanında sığınacaq tapmışdı. Dəyirmançı şahın bər-bəzəkli və dəbdəbəli paltarına tamah salaraq onu öldürmüş və cəsədini Murğab çayına atmışdı. Şahın yaxın adamları onu axtararkən dəyirmançıdan şübhələnərək onu sorğu-sual etmişdilər. Dəyirmançı törətdiyi əməli etiraf edəndə isə onu öldürmüş və şahın cəsədini atıldığı yerdən tapıb İstəxrə göndərmiş, buradakı bir qəbristanda dəfn etdirmişdilər. III Yəzdigərdin ailəsi daha əvvəl müsəlmanların əlinə əsir düşmüşdü. O, ölkəsinin şərqində qaçaq həyatı sürərkən kənizlərindən birindən Muhdəc adlı bir oğlu dünyaya gəlmişdi. Muhdəc anadangəlmə fiziki qüsurlu olduğu üçün Sasani əyanları onu şah elan edərək ətrafında birləşə bilməmişdilər. Lakin onu Fərqanə vilayətinə apararaq burada böyüyüb başa çatmasını təmin etmişdilər. Sasanilərin nəsli Muhdəcin övladları ilə davam etmiş, bunlardan bəziləri Əməvilərin hakimiyyəti dövründə Türküstanın fəthi vaxtı əsir alınmışdılar.

Xorasan vilayətinin bir qismi Ömər ibn Xəttabın (r.ə) hakimiyyəti dövründə fəth edilmiş, lakin xəlifənin şəhid edilməsindən sonra xorasanlılar müsəlmanlarla bağladıqları əhdnamənin şərtlərinə əməl etməkdən imtina etmişdilər. Bəsrə valisi Abdullah ibn Amir (r.ə) Fars vilayətindəki qiyamı yatırandan sonra ordudakı əmirlərdən Həbib ibn Əvs ət-Təmimi (r.ə) ona hərbi əməliyyatları Xorasan vilayətində davam etdirməyi təklif etmişdi. Abdullah ibn Amir (r.ə) bu fikri

bəyənsə də xəlifə tərəfindən belə bir göstəriş almadığı üçün geri Bəsrəyə qayıtmışdı. Əhnəf ibn Qeysin (r.ə) də bu barədəki məsləhətlərini dinləyən Abdullah ibn Amir (r.ə) bir müddət sonra böyük bir ordu ilə Bəsrədən yola çıxmışdı. O, Mücaşi ibn Məs'udu (r.ə) Kirmanın, Rabi' ibn Ziyad əl-Harisini (r.ə) isə Sicistanın bəzi yerlərində baş qaldırmış üsyanları yatırmaq üçün göndərmişdi. Daha sonra ordusu ilə Xorasana doğru irəliləyən Abdullah ibn Amir (r.ə) İranın Quhistan vilayətinə gələrək burada ona müqavimət göstərmək əzmində olan iranlıları məğlub etmiş və onlarla illik 600 min dirhəm cizyə müqabilində əhdnamə bağlamışdı. Abdullah ibn Amirin (r.ə) əmri altındakı ordular Nişapur, Rustaq-zam, Təbaseyn, Bahərz, Cüveyn, Beyhəq, Bust, Davun, Ərgiyan, İsfərayin, Nəsa, Əbivərd, Tus, Herat, Badğiz, Buşeync, Mərv, Mərvərrud, Savəngərd kimi şəhər, qəsəbə və bölgələr fəth edilmişdi. Bunların bəziləri sülh, bəziləri isə hərb yolu ilə fəth edilmişdi. Herat şəhərinin hakimi ilə 1 milyon, Mərv şəhəri hakimi ilə isə illik 2 milyon 2 yüz min dirhəm cizyə müqabilində əhdnamə bağlanmışdı. Bu bölgələrin fəthində Əhnəf ibn Qeys (r.ə), Abdullah ibn Hazim əs-Suləmi (r.ə), Qeys ibn Heysəm əs-Suləmi (r.ə) kimi əmirlər öz orduları ilə xüsusi seçilmişdilər. Hicri 31-ci (652) ilin sonlarında Əhnəf ibn Qeys (r.ə) Abdullah ibn Amirin (r.ə) əmri ilə öz ordusunu Əfqanıstanın şimal və mərkəzindəki dağlıq vilayətlərinə doğru yeritmişdi. O, Toxaristan, Taliqan və Faryabı fəth etməli idi. Bu üç vilayətin əhalisi öz hərbi qüvvələrini birləşdirərək Əhnəfin (r.ə) ordusu ilə şiddətli bir döyüşə girişmişdilər. Bu döyüş müsəlmanların qələbəsi ilə nəticələnmişdi. Faryab vilayətini Umeyr ibn Əhmərin (r.ə) əmrindəki mücahidlər fəth etmişdilər. Əhnəf ibn Qeys (r.ə) digər yandan da Əqra ibn Habis ət-Təmimini (r.ə) əmrindəki mücahidlərlə Gurgan vilayətində baş qaldırmış düşməni əzmək üçün göndərmişdi. Əqra və Umeyr, Əhnəf ibn Qeysin (r.ə) itaətindəki əmirlərdən, hərbi dəstə başçılarından idilər. Əhnəf ibn Qeys (r.ə) əsasən Bəni-Təmim qəbiləsindən olan mücahidlərə Gurgana doğru yola çıxmamışdan əvvəl belə xitab etmişdi: "*Ey Təmim oğulları! Bir-birinizi sevin, bir-birinizə qarşı şəfqətli olun, aranızda ədaləti yayın ki, cihadınız uğurla nəticələnsin. Mədələrinizə və şəhvani istəklərinizə qarşı da cihad edin ki, dininizə sıx bağlı qalasınız. Düşməninizə qarşı zalım olmayın ki, Allah sizi müvəffəq etsin*". Əqra ibn Habisin ordusu Gurgandakı düşmən qüvvələrini asanlıqla əzərək bu vilayəti ələ keçirmişdilər. Gurganın fəthindən sonra Əhnəf ibn Qeys (r.ə) əmri altındakı hərbi qüvvələrlə Əfqanıstanın Bəlx şəhərinə yürüş etmişdi. Şəhər qısa müqavimətdən sonra İslam ordusuna təslim olmuş, şəhər əhalisi ilə illik 400 min dirhəm müqabilində əhdnamə bağlanmışdı. Useyd ibn Mütəşəmmisi bir dəstə əsgərlə Bəlx qalasının mühafizəsinə təyin edən Əhnəf

ibn Qeys (r.ə) ordusunun əsas hissəsi ilə Xarəzmə tərəf yola çıxmışdı. O, Ceyhun çayını keçib Xarəzm torpaqlarına daxil olsa da burada ciddi bir uğur qazana bilməyərək geri, Mərvərruddakı əsas hərbi düşərgəyə qayıtmışdı. Bəlxin fəthindən bir müddət sonra Qeys ibn Heysəm (r.ə) Toxaristan vilayətindəki ən möhkəm qalalardan biri hesab olunan Səməngan qalasını fəth etmişdi.

Useyd ibn Mütəşəmmis (r.ə) Bəlxdə ikən bu şəhərin zadəganları əhdnamə ilə müəyyən olunmuş illik cizyə məbləğini gətirib Useydə (r.ə) təhvil vermişdilər. Useyd (r.ə) beytülmala məxsus məbləği sayaraq təhvil almışdı. Bəlxli zadəganlar gətirdikləri mal-qara sürüsünü də Useydə (r.ə) təhvil vermək istəyəndə Usyed (r.ə) onlara "*lakin əhdnamə şəhrtərində belə bir tələb yoxdur*" demişdi. Bəlx zadəganları ona "*bəli yoxdur, amma bu bizim adətimizdəndir, başımızdakı idarəçiyə hədiyyə veririk*". Useyd (r.ə) bu hədiyyəni qəbul etmək istəməsə də bəlxli zadəganlar təkid etmişdilər. Buna görə də Useyd (r.ə) onlara "*bunu almaq bizim haqqımızdırmı bilmirəm, amma bunu dəqiqləşdirənə qədər mənim yanımda qala bilər*" deyərək mövzunu Əhnəf ibn Qeysə (r.ə) məruzə etmiş və mal-qara sürüsünü ona gödərmişdi. Əhnəf ibn Qeys (r.ə) onu bu mal-qara sürüsünü qəbul etdiyi üçün qınamış və "*mənim bunlara ehtiyacım yoxdur*" deyə cavab vermişdi. Əhnəf ibn Qeys (r.ə) də öz növbəsində Bəsrə valisi Abdullah ibn Amiri (r.ə) məsələdən xəbərdar etmiş və sürünü ona göndərmişdi. Abdullah ibn Amir (r.ə) Əhnəf ibn Qeysə (r.ə) bu mal-qaranı özünə götürməyi təklif edəndə Əhnəf (r.ə) ona da "*mənim bunlara ehtiyacım yoxdur*" deyə cavab vermişdi. Bundan sonra Bəsrə valisi həmin sürünü hədiyyə olaraq qəbul edib öz sürüsünə qatmışdı.

İslam orduları ilk dəfə Sicistan torpağına Ömər ibn Xəttabın (r.ə) hakimiyyəti dövründə ayaq basmış və bu vilayətin ilk fəthi də bu vaxt baş vermişdi. Lakin Ömər ibn Xəttabın (r.ə) şəhid olmasından sonra Sicistan əhalisi əhdnamənin şərtlərini pozaraq cizyə ödəməkdən imtina etmişdilər. Yuxarıda Abdullah ibn Amirin (r.ə) Rabi' ibn Ziyad əl-Harisini (r.ə) Sicistanda baş qaldırmış üsyanları yatırmaq üçün göndərdiyini qeyd etmişdik. Hicri 31-ci il şaban ayının 6-sı (21 mart 652) atəşpərəstlər Novruz şənliyində ikən Rabi' ibn Ziyad (r.ə) Sicistanın ən möhkəm qala divarlarına malik şəhəri hesab olunan Zalikə hücum etmişdi. Bu qəfil hücum vaxtı Zalik şəhərinin dehqanı əsir düşmüşdü. O, cizyə müqabilində əhdnamə bağlayaraq canını qurtara bilmişdi. Zalikdən sonra Sicistanın Kəkaveyh, Zərənc, Naşiruz, Şirvaz şəhərləri də ard-arda fəth olunmuşdu. Ərəblərin vərdiş olmadıqları coğrafi relyefə malik olan Sicistanın yüksək dağlıq ərazilərinin fəthi bir qədər uzun çəkmişdi. Rabi' ibn Ziyad (r.ə) üç il Sicistan valisi oluş və bir çox qalaları, şəhər və qəsəbələri fəth etmişdi. Ondan sonra Sicistan valiliyinə Əbdurrəhman ibn Səmurə (r.ə) təyin edilmişdi. Əbdurrəhman

ibn Səmurə (r.ə) Rabi' ibn Ziyadın yarım qalmış işini davam etdirmiş, Keş, Davun və Zuz bölgələrini ələ keçirmişdi. Zuzda buradakı bütpərəstlərin ibadət etdikləri gözləri yaqut daşla bəzədilmiş bir büt var idi. Əbdurrəhman ibn Səmurə (r.ə) bütün gözlərindəki yaqut daşları söküb götürmüş və əhdnamə bağladığı Zuzun müşrik hakiminə "*bu qiymətli daşları saymasaq bu heykəlin heç kimə nə bir faydası, nə də bir zərəri toxuna bilər, ona görə də siz də buna ibadət etməyi buraxın artıq*" deyib bütün qollarını qılıncla kəsmişdi. Sicistanın fəthini tamamlayandan sonra Əbdürrəhman ibn Səmurə (r.ə) hicri 31-ci ilin sonlarında (652-ci ilin yayı) Zabulistan əyalətinə ordu yeridərək Kabil və Qəznə şəhərlərini fəth etmişdi. Əbdurrəhman ibn Səmurə ibn Həbib (r.ə) Osman ibn Əffanın (r.ə) hakimiyyətinin sonuna qədər Sicistan valisi olmuşdu. O, xəlifənin vəfatı xəbərini eşidəndə öz yerinə Umeyr ibn Əhməri (r.ə) vəkil qoyaraq Hicaza getmişdi. Bunu fürsət bilən Zərənc əhalisi əhdnaməni rədd edərək qiyam qaldırmış və müsəlmanlara hücum etmişdi. Umeyr ibn Əhmərin (r.ə) çevikliyi və zəkası sayəsində müsəlmanlar məğlub olmaqdan qurtulmuş və qiyamçılar ağır məğlubiyyətə uğradılaraq məhv edilmişdilər.

Beləcə Fars, Sicistan, Kirman və Xorasan vilayətləri Bəsrə valisi Abdullah ibn Amirin (r.ə) əmri altındakı ordular tərəfindən fəth edilərək xilafətə birləşdirilmişdi. Onun əmirləri, yəni əmri altındakı orduların komandanları Abdullah ibn Amirə (r.ə) "*bu qədər böyük məmləkətləri belə qısa müddətdə fəth etmək hələ heç kimə müyəssər olmamışdı*" deyərək onu təbrik etmişdilər. Abdullah ibn Amir (r.ə) onlara "*bütün bunların şükrünü buradan əliboş geri qayıtmaqla Allaha əda etmək istəyirəm*" demiş və yeni fəth olunmuş torpaqların ümum-valiliyinə Qeys ibn Heysəmi (r.ə) təyin edərək Nişaburdan həcc üçün niyyətlənərək Məkkəyə tərəf yola çıxmışdı.

Hicri 32-ci ilin sonlarında (653-cü ilin yayı) Kureyn adlı bir şəxs Herat, Quhistan, Təbaseyn və Badğis əyalətlərindən topladığı təqribən 40 minə yaxın silahlı ilə qiyam qaldıraraq əhdnamənin şərtlərini pozmuşdu. Kureyn qısa müddətdə bəzi yerləri zəbt edə bilmişdi. Qeys ibn Heysəm (r.ə) yaranmış gərgin vəziyyətlə bağlı əmirlərdən Abdullah ibn Həzmlə (r.ə) məsləhətləşmiş və onun məsləhəti ilə Bəsrəyə gedərək Abdullah ibn Amirə (r.ə) Xorasanda yaranmış vəziyyətlə bağlı məruzə edərək yardım istəmişdi. Onun izinsiz vəzifə yerini tərk edərək yardım ardınca gəlməsi Bəsrə valisi Abdullah ibn Amirin (r.ə) qəzəbinə səbəb olmuşdu. Bu vaxt Abdullah ibn Həzm (r.ə) təqribən dörd min döyüşçüsü ilə Kureynin qiyamçılarına qarşı vuruşmaq üçün hərəkətə keçmişdi. O, döyüşçülərinə çox sayıda məşəl hazırlamağı əmr etmişdi. Mücaihdlər dəyənəklərin və nizələrinin başına parça və pambıq topası bağlayaraq onları

yağa batırmışdılar. İbn Həzm (r.ə) öz ordusu ilə qiyamçıların düşərgəsinə yaxınlaşmış, lakin gündüz hücum etməyərək gecəni gözləmişdi. Gecə yarı olanda İbn Həzmin (r.ə) əmri ilə düşməni mühasirəyə almış mücahidlər məşəlləri yandırmışdılar. Məşəllərin işığı gecənin zülümətini yarmışdı. Kureynin qiyamçıları dörd bir tərəflərində çox sayıda məşəlin yandığını görüb təlaşa və vahiməyə qapılmışdılar. Belə bir vəziyyətdə onlara hücum edən mücahidlər asanlıqla onları məğlub etmiş və bir çoxunu qılıncdan keçirmişdilər. Qaçanlardan bir çoxu da əsir götürülmüşdü. Abdullah ibn Həzm (r.ə) bütün baş verənləri təfərrüatı ilə yazıb Bəsrə valisi Abdullah ibn Amirə (r.ə) bildirmişdi. Bəsrə valisi də İbn Həzmi (r.ə) Qeys ibn Heysəmin (r.ə) yerinə Xorasan ümum-valiliyinə təyin etmişdi. İbn Həzm (r.ə) Əli ibn Əbu Talibin (r.ə) hakimiyyətinin ilk illərinə qədər bu vəzifəni icra etmişdi.

*Müsəlmanlar Arasında Fitnənin Baş Qaldırması*

Ömər ibn Xəttabın (r.ə) dövründən etibarən xilfətin sərhədləri xeyli genişləmiş, bu genişləmə fəthlər sayəsində Osman ibn Əffanın (r.ə) dövründə də davam etmişdi. İslamın səsinin, Qur'anın hökmünün bu şəkildə yayılması digər millətlərin də İslamı qəbul etməsi kimi müsbət nəticələrlə yanaşı bəzi mənfi xüsusları da meydana gətirmişdi. Allah Rəsulunun (s.ə.v) Mədinədə İslami nizamı təsis etdiyi vaxtlarda bütpərəst ərəb qəbilələri ilə əlbir olaraq var gücləri ilə buna müqavimət göstərən yəhudi qəbilələri hələ Peyğəmbər (s.ə.v) həyatda ikən ərəb yarımadasındakı hərbi, siyasi və iqtisadi qüdrətlərini və üstünlüklərini itirmişdilər. Əbu Bəkr (r.ə), Ömər (r.ə) və Osmanın (r.ə) 12 illik hakimiyyəti dövrünün ilk yarısında İslam xilafəti heyrətamiz şəkildə, qısa müddətdə güclənərək dövrün ən böyük hərbi-siyasi və iqtisadi gücünə çevrilmişdi. Həmin dövrün iki ən böyük dövləti Bizans və Sasani imperiyaları İslamın qüdrəti qarşısında əzilərək öz əzəmətlərini itirmiş, Sasani dövlətinin varlığı tamamilə aradan qaldırılmışdı. Xilafət orduları qarşısında geriləyən Bizans isə şimali Afrika, Yaxın Şərq və şərqi Anadoludakı torpaqları ilə yanaşı siyasi və iqtisadi güc olaraq əvvəlki ehtişamını itirmişdi. Xilafət donanması Bizans imperiyasının Aralıq dənizində əsrlərlə davam etmiş hegemonluğuna da son qoymuşdu. İslam regiondakı bir çox millətin müştərək dininə çevrilməkdə idi. Şimali Afrika, yaxın və orta şərq, İran, şərqi Anadolu, cənubi Qafqaz, Xorasan, orta Asiyada yəhudi, iranlı, yunan, qıbti kimi millətlərə mənsub insanlar İslamı qəbul etməkdə idilər. Bu qeyri-ərəb millətlərə mənsub insanlar İslamı qəbul edərkən bəzi hallarda özlərinin əvvəlki dinlərinin təsirindən tamamilə qurtula bilmirdilər. Bununla da gələcək əsirlərdə müsəlmanlar arasında meydana çıxacaq olar bir sıra dini-

fəlsəfi cərəyanların, həmçinin bu mövzuya dair münaqişələrin təməli qoyulmuşdu. Fəth hərəkatının heyrətamiz uğurları ilə keçmiş ehtişam sahiblərinin hərbi-siyasi üsulla tövhid dəvətinin qarşısını almaq və tamamilə aradan qaldırmaq yolundakı gücləri ilə yanaşı buna olan ümidlərini də tükənmiş, aradan qaldırılmışdı. Lakin bu onların İslam əleyhindəki fəaliyyətlərinə bütünlüklə son qoymamışdı. Bunu əksər hallarda üzdə müsəlman olduqlarını söyləyib qəlblərində gizli İslam düşmənliyi bəsləyərək edirdilər.

Əbu Bəkr Əhməd əl-Beyhəqi "*Sünən*", Əhməd ibn Hənbəl "*Müsnəd*" və Əbu Muhəmməd Əbdulməlik ibn Hişam "*Sirə*" adlı əsərlərində qeyd etdikləri, Cabir ibn Abdullah (r.ə), Əbu Ubeydə ibn Cərrah (r.ə), Ayşə bint Əbu Bəkr (r.ə) və Ömər ibn Xəttabdan (r.ə) nəql olunan hədislərdə deyildiyinə görə Allah Rəsulu (s.ə.v) "*Ərəb yarımadasında iki qiblə qalmasın*", "*əgər ömrüm yetsə, əlbəttə yəhudi və xristianları ərəb yarımadasından çıxaracağam*", "*Hicaz yəhudilərini və Nəcran nəsranilərini ərəb yarımadasından çıxarın*" buyurmuşdu. Əbu Bəkr (r.ə) öz xəlifəliyi dövründə daha çox irtidad fəaliyyətlərinə qarşı mübarizə apardığı üçün Allah Rəsulunun (s.ə.v) bu vəsiyyətini yerinə yetirməyə fürsət tapmamışdı. Ömər ibn Xəttab (r.ə) da xəlifəliyinin ilk illərində ərəb yarımadasındakı kitab əhlilə mövcud olan əhdnamələrin hökmünə görə davranmışdı. Lakin fəth hərəkatının genişləməsindən sonra Allah Rəsulunun (s.ə.v) bu haqdakı vəsiyyətini həyata keçirməli olduğuna qərar vermişdi. Buna görə də o, Nəcran xristianları və Fədək yəhudilərinin liderləri ilə görüşərək onları məsələdən agah etmişdi. Onlarla bu haqda yeni bir əhdnamə tərtib edilmişdi. Yarımadakı kitab əhli Şam diyarı və İraqa köçürüləcəkdilər. Onlar daşınması mümkün olan əmlaklarını özləri ilə aparcaqdılar. Daşınmaz əmlakları isə dəyəri hesablanaraq beytülmaldan onlara ödəniləcək və satın alınacaqdı. Beləcə Fədək yəhudiləri və Nəcran xristianları Şam diyarına və İraqa köçürülmüşdülər. Xəlifə Teymə və Vadi əl-Quradakı yəhudi icmalarına toxunmamışdı. Çünki bu köçürmə sadəcə ərəb yarımadasındakı kitab əhlinə şamil edilməkdə idi. Bu yelər isə yarımadaya daxil hesab edilməmişdi.

İraqa köçürülən ərəbdilli yəhudi və xristianların böyük bir qismi Kufədə məskunlaşdırılmışdılar. Kufədə onların məskun olduqları səmt "*Nəcraniyyə*" adı ilə tanınmaqda idi. Bu köç hadisəsindən əvvəl də İraqda əhəmiyyətli sayıda yəhudi icması mövcud idi. Daha əvvəl qeyd etdiyimiz kimi Babil kralı II Nabu-Kodonosorun (e.ə.605-562) Qüdsü işğal edib xarabazara çevirdikdən sonra buradakı yəhudiləri İraq torpaqlarındakı Babilə sürgün etmişdi. İraqda min ildən artıq yaşayan bu yəhudi icması arasından bir çox məşhur ravinlər yetişmişdi ki, "*Babil Talmudu*" adlanan, Talmudun Babil versiyasını bunlar

qələmə almışdılar. Buradakı yəhudi icması İraqa hakim olmuş Makedoniyalı İsgəndər, Selevkilər, Parflar, Əhəməni və Sasani dövlətləri ilə daim yaxşı münasibətdə olmuş, bu sülalələrə mənsub hökmdarların əksəriyyəti tərəfindən himayə edilmişdilər. Ərəblərin İraqı fəth etməsindən sonra da Ömər ibn Xəttab (r.ə) Babil yəhudiləri ilə xoş rəftar etmiş, hətta onların lideri Bostanainin itaət və sədaqətini bəyan etməsindən sonra Sasani şahı II Xosrov Pərvizin (590-628) əsir alınmış qızlarından birini onunla evləndirmişdi. 641-ci ildə ərəb yarımadasından İraqa köçürülmüş yəhudilərin böyük bir hissəsi Əli ibn Əbu Talibin (r.ə) xəlifəliyi dövründə Kufədə məskunlaşmışdılar.

Kufə cənubi Qafqaz, İran və Xorasan cəbhələrində döyüşən əsgərlərin öz ailələri ilə birlikdə məskunlaşdıqları şəhər idi. Burada əsasən Yəməndən olan ərəb qəbilələri məskunlaşmışdılar. Daha əvvəl qeyd etdiyimiz kimi Osman ibn Əffan (r.ə) Kufə canişinliyinə Sə’d ibn Əbu Vəqqasdan (r.ə) sonra öz ögey qardaşı Vəlid ibn Uqbə ibn Əbi Muaytı təyin etmişdi. Vəlid ibn Uqbə bu vəzifəni beş il layiqincə icra etmiş, kufəlilərin rəğbətini qazanmışdı. Lakin bu vəziyyət səbəbi məlum olmayan bir hadisənin baş verməsinə qədər davam etmişdi. Heysəmə əl-Xuzai adlı bir kufəli ilə Müvərri əl-Əsədi, Zuheyr əl-Əzdi və Şubey əl-Əzdi adlı kufəli gənclər arasında naməlum səbəbdən baş vermiş davadalaş Heysəmə əl-Xuzainin qılıncla vurularaq öldürülməsi ilə nəticələnmişdi. Əbu Şureyh Xuveylid ibn Əmr əl-Xuzainin (r.ə) buna mane olmaq istəyərək müdaxilə etməsi nəticəsiz qalmışdı. Öldürülən şəxsin ailəsi və qəbilədaşları canişin Vəlid ibn Uqbəyə şikayət etmişdilər. Vəlid ibn Uqbə də bu üç gənci həbs etdirərək hadisəni təfərrüatı ilə yazdığı məktubla xəlifəyə bildirmişdi. Osman ibn Əffan (r.ə) qatillərin mühakimə edilib lazımi cəzaya məhkum edilməsini əmr etmişdi. Vəlid ibn Uqbə bu üç şəxsi mühakimə etdirmişdi. Şahidlərin ifadələri əsasında bu üç nəfər ölüm cəzasına məhkum edilmiş və Vəlid ibn Uqbə cəzanı tətbiq etdirmiş, qatillər edam edilmişdilər. Bu səbəbdən də bu üç nəfərin ailələri Vəlid ibn Uqbəyə düşmən kəsilmişdilər.

İraqdakı xristian ərəb qəbilələrindən Bəni-Təğlibə mənsub Əbu Zubeyd adlı bir şəxs qohumları ilə arasında olan miras məsələsi ilə bağlı Vəlid ibn Uqbəyə müraciət etmişdi. Canişin Əbu Zubeyd ət-Təğlibinin qəsb olunmuş əmlakını alıb özünə qaytarmışdı. Onun bu ədalətli davranışı Əbu Zubeydi heyran etmiş və o, Kufəyə gələrək burada yaşamağa başlamışdı. Canişinlə aralarındakı dostluq münasibəti bir müddət sonra Əbu Zubeydin İslamı qəbul etməsi ilə nəticələnmişdi. Lakin canişinin edam etdirdiyi üç gəncin qohumları Vəlid ibn Uqbə haqqında “*Vəlid səhərdən axşama qədər Əbu Zubeydlə birlikdə şərab içir*” şayiəsini yayaraq bu yalanın Mədinəyə qədər getib çıxmasına nail

olmuşdular. Bu vaxt Kufədə olan Abdullah ibn Məs'ud (r.ə) yayılan şayiə barədə Vəlid ibn Uqbəni qınamış və onların arasında bu səbəbdən mübahsə meydana gəlmişdi. Öldürülən üç gəncin yaxınları hər vəchlə Vəlid ibn Uqbəni gözdən salmağa çalışmışdılar. Onlar Vəlidin öz evində nə ilə məşğul olduğunu öyrənmək üçün evi gizlcə müşahidə edən adamlar yerləşdirmişdilər. Lakin bu şəxslərin ifşa olması Vəlid ibn Uqbənin adamları ilə edam edilmiş qatillərin qohumları arasında münaqişəyə səbəb olmuşdu. Bu hadisələr cərəyan edərkən kufəli Cundəb adlı bir şəxs sehirbazlıqla məşğul olan bir iraqlı məcusini vuraraq öldürmüşdü. Vəlid ibn Uqbə Cundəbi həbs etdirərək vəziyyəti məktubla Osman ibn Əffana (r.ə) bildirmişdi. Xəlifə canişinə Cundəbə dəyənək cəzası tətbiq edərək həbsdən azad edilməsini bildirmişdi. Lakin Cundəbin yaxınları təkidlə Vəliddən Cundəbi həbsdən azad etməsini tələb etmişdilər. Tələbləri qəbul edilmədiyi üçün Mədinəyə gedərək Vəlid ibn Uqbənin vəzifəsindən azad edilməsini xəlifədən tələb etmişdilər. Lakin xəlifə onların tələbini rədd etmişdi. Beləcə kufəlilər arasında Vəlid ibn Uqbəyə qarşı haqsız narazılıq və kin meydana gəlmişdi. Əbu Zeynəb və Əbu Müvərri adlı iki şəxsin başçılığındakı bir qrup kufəli Cundəbin məsələsi ilə bağlı canişinlə görüşərkən onun möhürünü oğurlamaqdan belə çəkinməmişdilər. Əbu Zeynəb və Əbu Müvərri Mədinəyə gedərək Osman ibn Əffanla (r.ə) görüşüb Vəlid ibn Uqbənin içki içdiyinə dair iddialarını təkrarlamışdılar. Xəlifənin "*sizlərdən onu içki içərkən görən varmı?*" sualına onlar "*xeyr*" cavabını vermişdilər. Xəlifənin "*elə isə onun içki içdiyini necə iddia edə bilirsiniz?*" sualına kufəlilər "*biz onun saqqalından şərab damladığını görmüşük*" deyib yalandan şahidlik etmişdilər. Onların bu iddialarında təkid və şahidlik etmələri xəlifənin hicri 29-cu (13 sentyabr 649-02 sentyabr 650) ildə Vəlid ibn Uqbəni Mədinəyə çağıraraq vəzifəsində azad etməsinə səbəb olmuşdu[78]. Xəlifə içki içmənin cəzası olaraq Vəlidə dəyənək cəzası da tətbiq etmişdi. Bununla Vəlidin məcusi sehirbazı öldürdüyü üçün dəyənək vurdurduğu Cundəbin əqrəbaları bu cəzanın eynisini Vəlidə tətbiq etdirməyə nail olmuşdular. Haqsız cəzaya məruz qalan Vəlid ibn Uqbə ilə kufəlilər arasında dərin münafirət meydana gəlmişdi. Xəlifə Səid ibn əl-As ibn Üməyyəni (r.ə) Kufə canişinliyinə təyin etmişdi. Uşaq yaşlarında yetim qalmış Səid ibn əl-As (r.ə) Ömər ibn Xəttabın (r.ə) himayəsində və tərbiyəsində böyümüşdü. O, gənc yaşlarında Şam diyarına gedərək Müaviyənin (r.ə) ordusunda Bizans cəbhəsində vuruşmuşdu. Səid ibn əl-As (r.ə) İranın Təbəristan vilayətinin fatehi

[78] Bu hadisədən sonra Vəlid ibn Uqbə heç bir vəzifə tutmamış, sonrakı illərdə baş vermiş siyasi hadisələrə də qarışmamışdı. Vəzifədən azad olunandan sonra Məkkədə, Kufədə və Rəqqədə yaşamış, hicri 61-ci (29 sentyabr 680-18 sentyabr 681) ildə Suriyanın Rəqqə şəhərində ölmüş və orada dəfn edilmişdir.

idi. Hicri 30-cu (avqust 650-iyul 651) ildə Səid ibn əl-As (r.ə) əmri altındakı böyük bir ordu ilə İranın şimalında, Xəzər dənizinin cənub sahilindəki Təbəristan vilayətinə yürüş tərtib etmişdi. Bu haqda daha əvvəl məlumat vermişdik. Səid ibn əl-As (r.ə) vəzifəsinin icrası üçün Kufəyə gəldikdən sonra məscidə gedərək kufəlilərə xitab etmiş və demişdi: "*Vallahi, mən arzu etmədiyim halda sizin idarəçiliyiniz üçün göndərilmişəm. Lakin arzu etməsəm də çiynimə yüklənən bu yükdən qaça da bilməzdim. Xəbəriniz olsun ki, yatmış fitnə oyanmış və gözünü açmışdır. Vallahi, mən bu fitnəni məhv edəcəyəm və kökündən söküb atacağam, yoxsa o məni məhv edəcək*".

Lakin sonrakı hadisələr göstərdi ki, bütün alicənablığı, təqvası və həlimliyinə rəğmən Səid ibn əl-As (r.ə) da ədalətli idarəçi olaraq kufəlilərə yaramamışdı. Səid ibn əl-As (r.ə) Kufəyə gələndən sonra burada İraqın fəthində iştirak etmiş, təqvada və İslama yardımda qabaqcıl olan insanların bir kənara çəkilmək məcburiyyətində qaldıqlarını, qaragüruhun isə meydan suladığının şahidi olmuşdu. O, Kufədəki bu vəziyyəti düzəltməyə çalışmışdı. Qadisiyyə qaziləri başda olmaqla İraqın fəthində iştirak etmiş müsəlmanlar onun yanında hörmət və ehtiram sahibinə çevrilməyə başlamışdılar. Buna baxmayaraq bir qrup kufəli tez-tez canişinin igamətgahına gələrək onunla müxtəif məsələləri müzakirə etməyə davam edirdilər. Belə söhbətlərdən birində başda Malik ibn Haris əl-Əştər ən-Nəxəi əl-Məzhəci olmaqla bir qrup kufəli ilə Qureyşin üstün keyfiyyətlərindən söhbət açan Əbdürrəhman ibn Hubeyş adlı bir gənc arasında mübahisə yaranmışdı. Qureyşdən olan mühacirin təriflənməsi əsasən yəmənli ərəb qəbilələrinə mənsub olan kufəlilərin xoşuna gəlməmişdi. Malik ibn Haris əl-Əştər də yəmənli Məzhəc qəbiləsinin Nəxə' oymağına mənsub idi. Mübahisə dava-dalaşa çevrilmiş, Malik əl-Əştər və yoldaşları onlarla mübahisəyə girişən gənci huşunu itirənə qədər döymüşdülər. Hətta oğlunu onların əlindən almağa çalışan yaşlı Hubeyşi də vurmaqdan çəkinməmişdilər. Hubeyş "*oğlumu sənin adamların döydü*" deyərək bu hadisədən ötürü Səid ibn əl-Ası (r.ə) təqsirləndirmişdi. Bu hadisədən Hubeyşin əqrəbaları Səidin (r.ə) yanına gələrək bu barədə onunla münaqişə etmişdilər. Səid ibn əl-As (r.ə) "*Onlar mənim adamlarım deyillər, bundan sonra sizlərdən heç kim mənim yanımda toplanmayacaq. Siz də artıq dilinizə yiyə durun və bu məsələni böyütməyin*" demişdi. Lakin bu hadisə Kufənin fitnə çıxarmaqda mahir olan insanlanları üçün fürsət olmuşdu. Onlar bu xoşagəlməz hadisəni müzakirə mövzusuna çevirərək unudulub getməsinə mane olmaqda idilər. Bu səbəbdən də Səid ibn əl-As (r.ə) məktub yazaraq vəziyyəti xəlifəyə bildirmişdi. Osman ibn Əffan (r.ə) canişinə bu şəxslərin dərhal Kufədən çıxarılaraq Şam diyarına, Müaviyə ibn Əbu Süf-

yanın (r.ə) yanına göndərilməsini əmr etmişdi. Müaviyəyə (r.ə) də məktub yazaraq Kufədən onun yanına göndərilən adamların hal və xüsusiyyətləri barədə onu xəbərdar etmiş, onlarla xoş rəftar edib islah etməsini tapşırmışdı. Müaviyə (r.ə) Kufədən sürgün edilən bu adamları Dəməşqdəki köhnə bir kilsədə məskunlaşdırmış, Kufədə ikən aldıqları illik maaşlarını burada onlara ödəmiş, əlavə olaraq yemək və geyimlə də təmin etmişdi. Bundan başqa bir neçə dəfə onlarla görüşüb söhbət etmiş, nəsihətlə islah etməyə çalışmışdı. Bu kufəlilərdən Sə'sa adlı bir şəxs Müaviyənin (r.ə) nəsihətlərini rişxəndlə qarşılayıb acı sözlərlə cavab verərək "*mən də sənə məsləhət görürəm ki, tutduğun vəzifədən istefa ver, qoy bu işi səndən daha xeyrli, atası da sənin atandan daha xeyrli olan biri görsün*" demişdi. Müaviyə (r.ə) Sə'sanın bu sözlərinə belə cavab vermişdi: "*Allaha and olsun ki, mənim İslamda öncəliyim vardır. Lakin məndən əvvəl bu dini qəbul edənlərin də məndən daha üstün bir öncəliyi vardır. Ömər ibn Xəttab (r.ə) məni bu vəzifəyə layiq bilərək təyin etmişdir. O, heç kimə iltimas etməzdi. Mən vəzifəmdən istefa etməmə səbəb olacaq hər hansı bir iş tutmamışam. Lakin bunula belə möminlərin əmiri göstəriş versə dərhal bu işi buraxaram. Şeytan həqiqətən sizi xoşunuza gələn xəyallara daldırır. Əgər işlər sizin arzu və təmənnilərinizə uyğun olaraq getsəydi gecə keçib səhər açılmazdı. Siz xeyrli danışın və yaxşılıqdan söz açın. Mən bu halınızla sizin başınıza müsibət gələcəyindən qorxuram. Bu nadanlığınız və asiliyiniz davam etsə Allah sizi həm dünya, həm də axirətdə məşəqqətlərlə üz-üzə qoyar*". Müaviyənin (r.ə) bu sözləri onlara pis təsir etmiş və onlar Müaviyənin (r.ə) üstünə hücum çəkərək yaxasından yapışıb saçını, saqqalını yolmağa cəhd etmişdilər. Onların əlindən qurtulan Müaviyə (r.ə) "*özünüzü yığışdırın, bura Kufə deyil. Vallahi, şamlılar sizin bu hərəkətinizi görsələr mən sizi onların əlindən xilas edə bilmərəm, hamınızı öldürərlər*" demişdi. Sürgündəki kufəlilər bununla da kifayətlənməyərək Şam diyarındakı zimmət əhlinin mal-mülkünə göz dikmişdilər. Müaviyə (r.ə) bu adamların islaholunmaz olduqlarını anladığı üçün onlara "*mən bu qənaətə gəldim ki, sizi bu hala salan ağlınızın azlığıdır. Sizlər elə bir xislətə sahibsiniz ki, insanlar sizdən nə bir fayda, nə də bir zərər hasil edə bilərlər, nəsihət edənin nəsihəti də sizə fayda etməz, artıq sərbəstsiniz, mən sizi burada məcbur saxlamıram, istədiyiniz yerə gedə bilərsiniz*" demişdi. Müaviyə (r.ə) onun yanına göndərilmiş bu kufəlilər haqqında Osman ibn Əffana (r.ə) məktub yazaraq bildirmişdi: "*Kufədən mənim yanıma dinləri və ağılları az olan bir qrup adam gəlmişdir. Belə görünür ki, içində yaşadıqları ədalət onlara narahatlıq verir. Onlar Allahdan heç nə diləmir, danışarkən heç bir dəlilə istinad etmirlər. İşləri-gücləri fətnə-fəsad çıxarmaqdır. Buraya gəlib zımmilərin malına-mülkünə göz*

*dikdilər. Allah onları sınayır, imtahan edir, beləcə onların bəd xislətləri meydana çıxır. Bunlar burada özləri kimiləri tapıb onlarla birləşsələr insanlar bunların əməllərindən əziyyət çəkəcəklər. Bunları Səiddən (r.ə) uzaq tut. Bunlardan pislikdən başqa bir şey gözləmək olmaz*".

Bu vaxt Şam diyarında da insanlar arasında narahatlıq və gərginlik meydana çıxmışdı. Osman ibn Əffanın (r.ə) xəlifəliyinin ikinci yarısında müsəlmanlar arasındakı rifah səviyyəsi xeyli yüksəlmişdi. Regiondakı ticarət yollarının xilafətin tərkibinə daxil edilməsi müsəlman tacirlər üçün ticari səfərləri asanlaşdırmış, ticarət dövriyyəsinin artması insanların qazancına qazanc qatmışdı. Əvvəllər bizanslılar və iranlıların nəzarətində olan iri ticarət bazarları müsəlmanların nəzarətinə keçmişdi. Üstəlk qənimət malları, cizyə, zəkat sayəsində müsəlman əhali qısa müddət ərzində böyük maddi zənginliyə qovuşmuşdu. Maddi zənginliyin gətirdyi rahatlıq daha yaxın keçmişdə Allah Rəsulu (s.ə.v) və ətrafındakı insanların çəkdikləri məşəqqətləri yaşamamış, İslamın o dövrünü görməmiş insanların xarakter və davranışlarına mənfi təsir göstərməyə başlamışdı. Bu və bənzər səbəblərdən ötürü Şam diyarında yaşayan Allah Rəsulunun (s.ə.v) səhabələrindən biri, özünün zöhd və təqvası ilə tanınan Əbu Zərr əl-Ğifari (r.ə) insanların həddən artıq maddi zənginliklərə sahib olmasını tənqid edərək onları daha çox infaq etməyə və əllərində olan ehtiyacdan artıq mal-dövləti digər insanlara paylamağa çağırmağa başlamışdı. O, insanların sıx toplaşdıqları yerlərdə Tövbə surəsinin 34-cü ayəsini (*Qızıl-gümüş yığıb onları Allah yolunda sərf etməyənləri üzücü bir əzabla müjdələ*) oxuyaraq zəngin insanları evlərində bir gecəlik azuqədən artıq heç bir şey saxlamayaraq haqq sahibi insanlara paylamağa səsləyirdi. Əslində bu ayə kitab əhlinin din xadimləri barədə idi. Bundan başqa zəkatı ödənmiş maddi zənginliklər bu ayənin hökmü ehtivasın daxil olmasa da Əbu Zərr əl-Ğifari (r.ə) öz ictihadına görə bu qənaətə gəlmişdi. Abdullah ibn Səba da bənzər çağırışlar edirdi və bu haqda öz fikirlərini Əbu Zərr əl-Ğifariyə (r.ə) də bildirmişdi. Anası həbəşi bir qadın olduğu üçün İbnü's-Sevda, yəni qara qadının oğlu ləqəbi ilə də tanınan Abdullah ibn Səba Yəmənin Səna şəhərindən olan yəhudi mənşəli bir şəxs idi. O, uzun müddət bir yerdə dayanmır, xilafətin ərazisini diyarbədiyar gəzirdi. Gah İraqda, gah Şam diyarında, gah da Misirdə olur, insanların arasında gəzib dolaşaraq onlarla söhbət edirdi. Abdullah ibn Səba daha əvvəl Bəsrəyə gələrək bir müddət orada yaşamış, ətrafına söhbətlərində iştirak edən bir qədər adam toplamışdı. Abdullah ibn Səba daha əvvəl müsəlmanların haqqında söz açmadıqları dini məsələri ortaya ataraq müzakirə edirdi. Bəsrə canişini Abdullah ibn Amir (r.ə) bundan xəbər tutduğu vaxt onu Bəsrədən qovmuşdu. Bəsrədən Kufəyə gələn Abdullah

ibn Səba bir müddət sonra buradan da qovulmuş və Şam diyarına getmişdi. Lakin orada da çox qalmayıb nəhayət Misirə gedərək orada yaşamağa başlamışdı. Buna baxmayaaq Bəsrə və Kufədəki dostları ilə daim məktublaşmaqda idi. O, Dəməşqdə olduğu vaxt Əbu Zərr əl-Ğifari (r.ə) ilə söhbət edərkən Müaviyədən (r.ə) şikayət edərək "*Müaviyə "mal-mülk Allahındır, hər şey Allaha məxsusdur" deyərək insanlardan soruşmadan onların malını Allaha aid edir*" demişdi. Əbu Zərr əl-Ğifari (r.ə) Müaviyə (r.ə) ilə görüşüb bunun səbəbini soruşanda Müaviyə (r.ə) ona "*Allah səni xeyirlə mükafatlandırsın ey Əbu Zərr. Biz Allahın qulları deyilikmi? Mülkün gerçək sahibi də Allah deyilmi?*" deyə cavab vermişdi. Əbu Zərr (r.ə) ona "*Olsun, sən yenə də bu cür sözlər söyləməkdən bəri ol*" demişdi. Müaviyə (r.ə) "*Yaxşı, mən də insanların sahib olduqlarını "müsəlmanların malları" deyə adlandıraram*" deyərək onun bu iradını qəbul etmişdi. Abdullah ibn Səba başqa bir səhabə, Əbu'd-Dərda (r.ə) ilə söhbət edərkən də Müaviyə (r.ə) haqqında eyni sözləri demişdi. Onun bu sözlərini xoşlamayan Əbu'd-Dərda (r.ə) "*Görürəm ki, sən hələ də yəhudisən*" deyə cavab vermişdi. Daha sonra bu haqda əshabdan Ubadə ibnu's-Samitlə (r.ə) danışan Əbu'd-Dərda (r.ə) onunla birlikdə Müaviyənin (r.ə) yanına gedərək "*Vallahi, Əbu Zərri (r.ə) təhrik edən İbn Səbədir*" demişdi. Bu qəbildən olan söz-söhbət o qədər yayılmışdı ki, Şam diyarında insanlar iki qismə ayrılaraq bir-birlərini xor görməyə başlamışdılar. Bu səbəbdən də Müaviyə (r.ə) Osman ibn Əffana (r.ə) məktub yazaraq xəlifəni vəziyyətdən agah etmişdi. Xəlifə Şam valisinə cavab məktubunda Əbu Zərri (r.ə) Mədinəyə göndərməyi tələb etmiş, Müaviyə (r.ə) də Əbu Zərri (r.ə) Mədinəyə göndərmişdi. Mədinəyə çatanda Əbu Zərr (r.ə) Mədinənin xeyli böyüdüyünü, evlərin Səl' dağının ətəklərinə qədər gəlib çatdığınının şahidi olmuşdu. Osman ibn Əffan (r.ə) Əbu Zərrlə (r.ə) görüşüb söhbət etmiş, məsələyə aydınlıq gətirməyə çalışmışdı. Əbu Zərri (r.ə) dinləyəndən sonra xəlifə ona belə demişdi: "*Ey Əba Zərr! Mən ancaq üstümə düşən vəzifəni icra edirəm. İnsanları qənaətcil olmağa, daha çox təsəddüq etmyə təşviq edə bilərəm. Lakin heç kimi daha çox zahid və təqvalı olmağa məcbur edə bilmərəm*". Buna baxmayaraq Əbu Zərr (r.ə) bu haqdakı fikirlərini xəlifənin yanında da təkrarlayaraq "*mallarından yetirincə təsəddüq və infaq etmədikləri müddətcə varlılardan razı qala bilmərik*" demişdi. Osman ibn Əffan (r.ə) ona Şam diyarına qayıtmayaraq Mədinədə qalmasını tapşırmışdı. Lakin Əbu Zərr (r.ə) xəlifəyə "*Mədinədə qalmaq istəmirəm, çünki Rəsulullah (s.ə.v) mənə "evlərin Səl' dağı ətəklərinə çatdığını görəndə artıq Mədinədə qalma*" *demişdi*" deyə söyləyib Mədinə yaxınlığındakı Rəbzə adlı yerə getmək istədiyini bildirmişdi. Əbu Zərrə (r.ə) iki xidmətçi və ehtiyaclarını təmin etmək üçün bir neçə dişi dəvə verən Osman ibn Əffan (r.ə) onun Rəbzədə yaşamasına

izn vermişdi. Rəbzəyə gələn Əbu Zərr (r.ə) burada bir məscid tikərək yaşamağa başlamışdı. Lakin çöl ərəbləri kimi bədəviləşməmək üçün vaxtaşırı Mədinəyə gedib gəlirdi. Xəlifə onun ailəsini də Şam diyarından gətirdib yanına yollamışdı. Əbu Zərr (r.ə) vəfat edənə qədər Rəbzədə yaşamışdı.

Yuxarıda Dəməşq valisi Müaviyənin (r.ə) Kufədən Şam diyarına məcburən göndərilmiş şəxsləri sərbəst buraxaraq onlara istədikləri yerə gedə biləcəklərini söylədiyini qeyd etmişdik. Müaviyənin (r.ə) tövsiyəsinə baxmayaraq Osman ibn Əffan (r.ə) onları yenidən Kufəyə göndərmişdi. Lakin onlar Kufəyə qayıdan kimi Səid ibn əl-Asla (r.ə) çəkişməyə və müxtəlif bəhanələrlə narazılıq etməyə başlamışdılar. Tezliklə Səid ibn əl-As (r.ə) xəlifəyə məktub yazıraq bu adamlardan artıq bezdiyini bildirmiş və bunların Kufədən uzaqlaşdırılmasını istəmişdi. Osman ibn Əffan (r.ə) Səid ibn əl-Asa (r.ə) bu şəxsləri yenidən Kufədən çıxarıb Şam diyarına, bu dəfə Xalid ibn Vəlidin (r.ə) oğlu Əbdürəhmanın (r.ə) canişin olduğu Hums şəhərinə göndərməyi əmr etmiş, Səid (r.ə) də bu əmri dərhal yerinə yetirmişdi. Səid ibn əl-Asın (r.ə) Kufədən Humsa göndərdiyi adamlar bunlar idi; Sə'sa ibn Suhan əl-Əbdi, onun qardaşı Yəzid ibn Suhan əl-Əbdi[79], Zeyd ibn Suhan əl-Əbdi, Malik ibn Haris əl-Əştər ən-Nəxəi, Sabit ibn Qeys ən-Nəxəi, Kumeyl ibn Ziyad ən-Nəxəi, Cundəb ibn Zuheyr əl-Ğamidi, Cundəb ibn Kə'b əl-Əzdi, Urvə ibn Cə'd əl-Xuzai, Əmr ibn əl-Əhməq əl-Xuzai, Əbu Əmr Abdullah ibn əl-Kəvva Yəşkuri[80] və digər bir neçə şəxs[81]. Hums valisi Əbdürrəhman ibn Xalid ibn Vəlid (r.ə) bu şəxsləri yanına çağıraraq ağır sözlərlə tənqid etmiş və onların şəhəri tərk etməsini qadağan edərək əl-Cəzirəyə getmələrinə mane olmuşdu. Əbdürrəhman (r.ə) onlara at və dəvə minməyi də qadağan edərək getdiyi hər yerə yanında piyada yeriməyə məcbur etmişdi. O, onlara hər dəfə tənə edərək "*sizin ərəb yoxsa qeyri-ərəb olduğunuz da hələ tam məlum deyil, mən sizi ədəbləndirmənin yolunu bilirəm*" deyirdi. Sürgündəki kufəlilərin lideri olan Sə'sa ibn Suhan ona "*Allah üçün artıq bizi rahat burax, biz etdiklərimizdən ötürü peşman olub tövbə etmişik*" deyənə qədər Əbdürrəhman ibn Xalid (r.ə) onlara qarşı sərt rəftar etməyə davam etmişdi. Hums canişini sürgündəki kufəlilərdən Malik ibn Haris əl-Əştəri Mədinəyə, Osman ibn Əffanın (r.ə) yanına göndərmişdi. Malik ibn Haris əl-Əştər xəlifəyə Kufəyə qayıtmaq istəmədiklərini, Əbdürrəhmanın (r.ə) yanında, Humsda qal-

---

[79] İbn Suhan qardaşları Bəni-Rəbiə qəbiləsinin Bəni-Əbdilqeys oymağına mənsub idilər. Cahiliyyə dövründə Bəni-Əbdiqeys qəbiləsi əsasən Bəhreyn həvalisində məskun idi.

[80] Bəni-Yəşkur oymağı Bəkr ibn Vail qəbiləsinə mənsub idi.

[81] Bu şəxslər Əli ibn Əbu Talibin (r.ə) xəlifəliyi dövründə zühur edəcək xəvaric firqəsinə liderlik edəcəkdilər. Lakin hələ ki, ayrı bir firqə olaraq formalaşmamışdılar.

maq istədiklərini bildirmişdi. Osman ibn Əffan (r.ə) ona istədikləri yerə gedib, istədikləri yerdə yaşaya biləcəklərini bildirərək sərbəst buraxmışdı.

Mədinə şəhərinin ərazisi əhalinin artması səbəbiylə böyümüşdü. Namaz vaxtı camaatın artması səbəbiylə məscidin genişləndirilməsi zərurəti meydana çıxmışdı. Hicri 29-cu (650) ildə Osman ibn Əffan (r.ə) Məscidu'n-Nəbəvini genişləndirmişdi. Genişləndirmə vaxtı ətrafdakı bəzi evlərin sahiblərinə evlərinin və ərazilərinin dəyəri ödənilərək sökülmüşdü. Yenidən inşa edilən Məscidu'n-Nəbəvinin uzunluğu 99 m., eni isə 92 m. olmuşdu. Əvvəl olduğu kimi məscidə 6 qapı qoyulmuşdu.

Hicri 32-ci ildə (652-653) Səid ibn əl-As (r.ə) xəlifənin əmri ilə Kufədəki hərbi birləşmələri yeni əməliyyatlar üçün səfərbər etmişdi. Bu əmrə görə Əş'as ibn Qeys (r.ə) əmrindəki ordu ilə Azərbaycana, Səid ibn Qeys (r.ə) İranın şimal-qərbinə, Nuseyr əl-İcli Həmədana, Səid ibn əl-Əqra İsfəhana, Hakim ibn Səlam əl-Xizami (r.ə) Anadolunun cənub-şərqinə, Cərir ibn Abdullah (r.ə) Anadolunun cənubuna, Salman ibn Rəbiə (r.ə) Azərbaycanın şimalı və Dağıstana, Uteybə ibn əl-Nəhhas isə Xorasana doğru yola çıxmışdı. Bu yürüşlər haqqında yuxarıda ətraflı məlumat verilməkdədir. Xilafətin dayağı olan mühüm şəxslərin əksəriyyətinin öz orduları ilə Kufədən uzaqda olmasını fürsət bilən Abdullah ibn Səba hicri 33-cü ilin (653) ortalarında Misirdən İraq və Şamdakı adamlarına məktublar yazaraq onları yeni çıxışlar üçün təşviq etməyə başlamışdı. İraqdan Şam diyarına sürgün edilənlər tezliklə Kufəyə qayıtmışdılar. Yəzid ibn Qeys Kufənin küçələrinə düşərək açıq və aşkar şəkildə Osman ibn Əffanın (r.ə) xəlifəlikdən əl çəkməli olduğunu car çəkməyə başlamışdı. Lakin Qə'qa ibn Əmrin (r.ə) onun yaxasından yapışması Yəzidin sözünü dəyişərək "*mən sadəcə Səidin istefasını tələb edirəm*" deməsi ilə nəticələnmişdi. Bu vaxt Səid ibn əl-As (r.ə) xəlifənin əmrilə onunla görüşmək Mədinəyə getmişdi. Valinin də Kufədə olmaması fitnəkarları daha da cürətləndirmişdi. Malik əl-Əştər cümə namazlarından birində Kufənin mərkəzi məscidinə gələrək camaata belə səslənmişdi: "*mən Mədinədən gəlirəm, orada Səidin möminlərin əmirinə kufəli qadınlara verilən illik maaşın yüz dirhəm azaldılmasını, İslam uğrunda vuruşmuş mücahidlərə ildə cəmi iki min dirhəm ödənməsini, bundan sonra qənimət mallarının sadəcə qüreyşlilərin arasında bölünməsini təklif etdiyini gördüm*". Belə görünür ki, bu yalan şaiyə əvvəlcədən hazırlanmış planın tərkib hissəsi idi. Çünki bundan dərhal sonra Yəzid ibn Qeys kufəlilərə "*Səidin bu əməllərinə son qoymaq istəyən ardımca gəlsin*" deyərək Kufə yaxınlığındakı əl-Cər'a adlı yerə yollanmışdı. Məsciddə sadəcə şəhərin aqil və müdrik insanları qalmış, digərləri bu şaiyəyə uyaraq Yəzidin ardınca getmişdilər. Səid ibn əl-As (r.ə)

Mədinəyə getməmişdən əvvəl Kufədə öz yerinə Əmr ibn Hureysi vəkil təyin etmişdi. Qə'qa ibn Əmr (r.ə) insanları şaiyəyə uymamağa, geri məscidə qayıtmağa səsləsə də buna nail ola bilməyən Əmr ibn Hureysə belə demişdi: "*Sən axıb getməkdə olan bir selin qarşısını almaq istəyirsən? Heyhat! Vallahi, bu qovğaya ancaq qılınc son qoya bilər ki, bunun da vaxtı yaxındır. Bu şəhərdə qılıncların cingiltisi eşidiləcək. Onlar bəyənmədikləri bu günlərini çox axtaracaqlar, lakin Allah bu dinc günləri onlara bir daha nəsib etməyəcək. Ey Əmr! İndi sənin işin ancaq səbr etmək olmalıdır*". Əmr ibn Hureys ona "*mən buna səbr edəcəyəm*" deyərək məscidi tərk edib evinə getmişdi. Asilərə qarşı güc tətbiq etməyi arzu edən sadəcə Qə'qa ibn Əmr (r.ə) deyildi. Huzeyfə ibn-ul-Yəmanla (r.ə) baş verənləri müzakirə edən Əbu Məs'ud Uqbə ibn Əmr əl-Ənsari (r.ə) belə demişdi: "*Vallahi, düşünürəm ki, bu özbaşnalıq və fitnə-fəsada ancaq bu şəhərin alt-üst olub xarabazara çevrilməsi ilə son qoyula bilər*". Huzeyfə (r.ə) onun bu sözlərinə cavabında "*Xeyr, bu şəhər alt-üst olmayacaq, hətta bu şəhərdə bir fincan qan belə tökülməyəcək. Mən indi sadəcə Allah Rəsulunun (s.ə.v) həyatda olmaını arzu edərdim*" demişdi.

Yəzid ibn Qeys və Malik əl-Əştər başlarına topladıqları güruhla Kufə ilə Qadisiyyə arasındakı əl-Cər'ada məskən tutmuşdular. Onlar Amir ibn Abdullah ət-Təmimi adlı bir şəxsi öz elçiləri olaraq xəlifənin yanına, Mədinəyə göndərmişdilər. Amir ət-Təmimi, Osman ibn Əffanla (r.ə) görüşərək demişdi: "*Bəzi müsəlmanlar toplanaraq sənin güddüyün siyasəti müzakirə etmiş, nəzərdən keçirmiş və sənin bir çox xətalara yol verdiyin, lazımsız işlər gördün qənaətinə gəlmişdirlər. Buna görə də sən Allahdan qorx və tövbə et*". Yazıb oxumağı belə bacarmayan bu adamın cürətkarlığı qarşısında təəccüb və təəssüfünü gizlətməyən xəlifə ətarfındakılara: "*Bu adama baxın. Görən də bunu alim zənn edəcək. Qarşımda oturub az qala məni təhqir edəcək. Vallahi, soruşsanız Rəbbinin harada olduğunu belə bilmir*" demişdi. Osman ibn Əffan (r.ə) mənsub olduğu Uməyyə ailəsindən bəzi şəxslərlə müşavirə edərək yaranmış vəziyyəti müzakirə etmişdi. Onlardan kimisi əl-Cər'a əhlinə qarşı silahlı qüvvə yeritməyi, kimisi onları maddi mənfəətlə təmin edib razı salmağı, kimisi də onlara qarşı səbrli olaraq heç bir tədbir görməməyi tövsiyə etmişdi. Mədinədən qayıdan Səid ibn əl-As (r.ə) danışmaq üçün əl-Cər'ada toplanan kufəlilərin yanına gedəndə onlar Səidi (r.ə) "*bizim səninlə danışacaq heç bir sözümüz yoxdur*" deyərək yaxına buraxmamışdılar. Asilərin başçılarından Malik ibn Haris əl-Əştər bununla da kifayətlənməyərək Səidin (r.ə) qulluqçusunu vuraraq öldürmüdü. Səid ibn əl-As (r.ə) artıq Kufədə qalmasının mümkün olmadığını anlayaraq Mədinəyə qayıtmış və baş verənlərdən xəlifəni agah et-

mişdi. O, Kufə valiliyindən imtina edərək öz yerinə Əbu Musa əl-Əş’ərinin (r.ə) təyin edilməsini tövsiyə etmişdi. Osman ibn Əffan (r.ə) onun tövsiyəsinə əməl edərək Əbu Musanı (r.ə) Kufə canişinliyinə təyin etmişdi. Xəlifə yeni canişinlə kufəlilərə yazdığı məktubu da göndərmişdi. Əbu Musa (r.ə) xəlifənin məktubunu əl-Cər’a əhlinə oxumuşdu. Məktubda deyilirdi: “*Mən sizin arzuladığınız şəxsi vali təyin edərək Səidi bu işdən azad etdim. Vallahi, mən sizi tutduğunuz bu yoldan qaytarmaq üçün səbrlə sizi sülhə və sükunətə dəvət edəcəyəm. Mənə içində Allaha üsyan olmayan hər tələbinizi çatdıra bilərsiniz. Həmçinin Allaha üsyana səbəb olmayacaq şəkildə dilədiyiniz şeyi rədd edə bilərsiniz. Mən Allahın yanında sizin heç bir dəliliniz və bəhanəniz qalmasın deyə arzu etdiyiniz xüsusları həyata keçirəcəyəm. Arzu etdiyiniz şeylərə qovuşana qədər Allahın bizə əmr etdiyi kimi səbr edəcəyəm*”. Xəlifə kufəlilərin beytülmaldan aldıqları illik maaşları da artırmışdı. Əbu Musa əl-Əş’əri (r.ə) Kufədə vəziyyətin sakitləşməsindən sonra hicri 34-cü illin sonlarında (655) xəlifənin əmri ilə Huzeyfə ibnu’l-Yəmanın (r.ə) komandanlıq etdiyi ordunu şimali Azərbaycan və cənubi Dağıstana hərbi səfərə göndərmişdi.

*Osman ibn Əffanın (r.ə) Evinin Mühasirəyə Alınması və Şəhadəti*

Osman ibn Əffan (r.ə) Qüreyş qəbiləsinin Uməyyə ailəsinə mənsub idi. O, İslamdan əvvəl Məkkənin varlı tacirlərindən biri və İslamı ilk qəbul edənlərdən idi. İslamdan əvvəl özü kimi varlı tacir olan Əbu Bəkrlə (r.ə) dostluq etmişdi. Məkkənin nüfuzlu və zəngin ailələrindən birinə mənsub olan Osman ibn Əffan (r.ə) Allaha və Rəsuluna (s.ə.v) ilk iman gətirənlərdən və imanını bütün dünya mənfəətlərindən üstün tutaraq, hər şeyi İslam uğrunda tərk edib hicrət etməkdən çəkinməyən bir insan idi. O, əşarətu’l-mübəşşəradan, Allah Rəsulunun (r.ə) cənnətlə müjdələdiyi on səhabədən biri idi. Allah Rəsulunun (s.ə.v) qızı Ruqəyyə (r.ə) ilə ailə qurmuş, onun vəfatından sonra Peyğəmbər (s.ə.v) onu digər qızı Umm Kulsumla (r.ə) evləndirmişdi. Yəni Osman ibn Əffan (r.ə) Əli ibn Əbu Talibin (r.ə) bacanağı idi. Allah Rəsulu (s.ə.v) Osmanı (r.ə) o qədər çox sevirdi ki, Umm Kulsumun (r.ə) vəfatından sonra Peyğəmbər (s.ə.v) ona “*əgər üçüncü bir qızım da olsa idi onu da səninlə evləndirərdim*” demişdi. Osman (r.ə) ürəyi yumuşaqlığı, həlimliyi ilə yanaşı ədəbi və həyası ilə tanınan bir insan idi. Buna görədir Allah Rəsulu (s.ə.v) onun haqqında “*mələklər belə Osmandan həya edib utanarlar*” demişdi. Allah Rəsulunun (s.ə.v) ona etimad və inamı sonsuz idi. Buna görədir ki, Hudeybiyyə beyəti günü müşriklər Osmanı (r.ə) Məkkədə girov götürüb saxladıqları vaxt hamı beyət edəndən sonra Allah Rəsulu (s.ə.v) sol əli ilə özünün sağ əlini tutub “*Os-*

*man bu yola Allah və Rəsulu üçün çıxmışdı, bu da Osmanın əlidir, onun üçün bey'ət edirəm*" demişdi.

Osman ibn Əffan (r.ə) həyatı boyunca bir neçə qadınla ailə qurmuş, bu qadınlardan Abdullah, Ömər, Xalid, Əban, Vəlid, Səid, Əbdulməlik, Utbə adlı oğulları, Məryəm, Umm Səid, Ayşə, Umm Əban, Umm Əmr adlı qızları dünyaya gəlmişdi. Bunlardan Abdullahın anası Peyğəmbərin (s.ə.v) qızı Ruqəyyə (r.ə) idi. Umm Kulsumlə (r.ə) nikahından isə övladı olmamışdı.

Osman ibn Əffan (r.ə) orta boylu, dolu bədənli, qırmızıya çalar ağ bənizli, sıx qara saç və saqqalı olan insan idi. Saçlarını bəzən çiyinlərinin bir qədər yuxarısına qədər uzadardı. Məkkədən Mədinəyə hicrət etdiyi vaxt təqribən 50 yaşında olan Osman ibn Əffan (r.ə) xəlifə seçildiyi vaxt 72 yaşı haqlamışdı. Xəlifəliyinin son illərində isə artıq yaşı 80-ni ötmüşdü. Yaşlı, həlim və yumuşaq qəlbli Osman ibn Əffan (r.ə) öz ailəsinə, qohum-əqrəbalarına düşkün bir insan idi. Bu səbəbdən də Uməyyə ailəsinə mənsub bəzi şəxslər onun xəlifəliyi dövründə yüksək vəzifəyə təyin olunmuşdular. Bu isə insanlar arasında yersiz dedi-qoduya səbəb olmuşdu. Fitnə-fəsad yayanlar bu vəziyyətdən sui-istifadə edərək xəlifə haqqında şaiyələr yaymağa başlamışdılar. Abdullah ibn Səba Şam diyarı, Bəsrə və Kufədəki adamları ilə daim əlaqə saxlayırdı. Onun təlqinilə belə bir fikir formalaşmışdı ki, yaşlı xəlifə öz qohum-əqrəbasının əlində oyuncağa çevrilmişdir və dövlətin işləri başqalarının nəzarətindədir. Yeganə çıxış yolu Osman ibn Əffanı (r.ə) iqtidardan uzaqlaşmağa məcbur etməkdir. O, insanlara hətta Osmandan (r.ə) sonra kimin xəlifə ola biləcəyi barədə fikir də aşılamaqda idi. Osman ibn Əffandan (r.ə) sonra ya Əli ibn Əbu Talib (r.ə), ya Zübeyr ibn Əvvam (r.ə), yaxud da Təlhə ibn Ubeydullah (r.ə) xəlifə ola bilərdilər. Onun bir tək deyil bir neçə şəxsin adını xəlifəliyə namizəd kimi hallandırması təsadüfi deyildi. Bunula o, müsəlmanların bölünərək əşarət-ul-mübəşşəradan həyatda olan şəxslərin ətrafında ayrı-ayrı qruplar halında birləşməsini hədəfləyirdi. İndiki mərhələdə isə mümkün qədər müsəlmanların nüvəsini təşkil edən Mədinə əhalisi arasında əyalətlərdə vəziyyətin gərgin olduğu, oradakı insanların xəlifənin təyin etdiyi məmurlardan narazı olduqları fikrini yaymaq lazım idi. Beləcə xilafətin mərkəzində də xəlifənin yanlış siyasət yeritdiyi barədə fikir formalaşmış olacaqdı. Bu da gələcəkdə onun istefaya məcbur edilməsi üçün əlverişli zəmin hazırlayacaqdı. Onun xilafətin müxtəlif yerlərindəki adamları fürsət düşdükcə Mədinəyə gələrək əyalətlərdə vəziyyətin xeyli gərgin olduğu, insanların əyalət məmurlarından narazı olduqları barədə şaiyə yaymaqda idilər. Bu şaiyələr Mədinədə narahatlıq yaratmağa başlamışdı. Hətta əshabdan bəzi şəxslər bu barədə Osman ibn Əffanla (r.ə) danışmış, insanların narahat və nara-

zı olduqlarını dilə gətirmişdilər. Osman ibn Əffan (r.ə) bu iradlara lazımi cavabı verərək bu cür şaiyələrə inanaraq həyəcana qapılmanın yersiz olduğunu bildirmişdi. Əslində məsələnin bu dərəcədə qəlizləşməsinə səbəb Osman ibn Əffanın (r.ə) güddüyü siyasət deyil, idarə etdiyi insanlara qarşı bəlkə də həddən artıq şəfqətli və yumuşaq davranması idi. O, özü də bunun fərqində idi və bunu onu xütbələrindən birində dediyi sözlərdən də anlamaq mümkündür. İcraatlarından ötürü qınanan xəlifə xütbələrindən birində belə demişdi: *"....vallahi, Xəttabın oğlu Öməri (r.ə) qınamadığınız xüsuslarda məni qınayıb durursunuz. Bunu ona qarşı edə bilməzdiniz. Çünki bəzinizi təpikləyərək, bəzinizi sillələyərək, bəzinizi də dili ilə yerinizə oturdardı. Siz də ona itaət edib bəyənsəniz də bəyənməsəniz də səsinizi çıxarmazdınız. Mən isə sizə qarşı son dərəcə yumuşaq davrandım, çiynimi sizin yükünüzün altına verdim, əlimi və dilimi sizdən uzaq tutdum, bununla da sizi özümə qarşı cürətkar etdim*".

Bütün bunlara rəğmən xəlifə bu xoşagəlməz söz-söhbətə birdəfəlik son qoymaq üçün tədbir görmənin zəruri olduğunu anlamışdı. Osman ibn Əffan (r.ə) əyalətlərin və böyük şəhərlərin valilərinə məktub yazaraq hicri 34-cü ilin həcc mövsümündə (iyun 655) Mədinəyə gəlməyi əmr etmişdi. O, həmçinin əyalətlərin müsəlman əhalisinə xəbər göndərərək həmin ilin həcc mövsümündə şikayətçiləri şəxsən qəbul edəcəyini, insanların öz narazılıqlarını şəkayət etdikləri məmurun üzünə qarşı xəlifənin yanında deyə biləcəklərini bildirmişdi. Hicri 34-cü ilin zilhiccə ayında (iyun-iyul 655) Müaviyə ibn Əbu Süfyan (r.ə), Abdullah ibn Sə'd ibn Əbi Sərh (r.ə), Abdullah ibn Amir (r.ə), Səid ibn əl-As (r.ə), Əbdurrəhman ibn Xalid ibn Vəlid (r.ə) digər bəzi əmir və canişinlər xəlifənin əmri ilə Mədinəyə gəlmişdilər. Lakin qəribədir ki, Mədinədə heç bir şikayətçi peyda olmamışdı. Mədinədə olarkən Müaviyə ibn Əbu Süfyan (r.ə) vəziyyətin gərgin olduğunu və getdikçə gərginləşməyə doğru meylli olduğunun fərqinə varmışdı. Buna görə də Müaviyə (r.ə) Osman ibn Əffanla (r.ə) bu barədə danışıb ona özü ilə Şam diyarına getməyi təklif etmişdi. Lakin Osman (r.ə) boynunun vurulacağını bilsə belə Peyğəmbərin (s.ə.v) şəhəri olan Mədinəni tərk etməyəcəyini bildirmişdi. Müaviyənin (r.ə) Şam diyarından öz inandığı adamladan ibarət mühafizə dəstəsi göndərmək təklifini də xəlifə "*Allah mənə yetər*" deyərək qəbul etməmişdi. Müaviyə (r.ə) Əli ibn Əbu Talib (r.ə), Təlhə (r.ə) və Zubeyrlə (r.ə) görüşüb söhbət edərək yaşlı Osman ibn Əffanın (r.ə) onlara əmanət olduğunu söyləyib Şam diyarına yola çıxmışdı. Barəsindəki xəbərlərin böhtan və yalandan ibarət olduğunu bilsə də Osman ibn Əffan (r.ə) kufəlilərin narazılığını nəzərə alaraq Səid ibn əl-Ası (r.ə) Kufə canişinliyindən azad etmiş və onun yerinə Əbu Musa əl-Əş'ərini (r.ə) təyin etmişdi. Bu haqda yuxarıda məlumat vermişdik.

Xəlifə hər kəsin şikayətini şəxsən dinləyəcəyini bildirsə də əyalətlərdən Mədinəyə heç bir şikayətçi gəlməmişdi. Buna baxmayaraq Osman ibn Əffan (r.ə) valiləri və narazıları Mədinəyə çağırmaqla da kifayətlənməyib əyalətlərə özünün inanıb etimad etdiyi adamarı təftiş üçün göndərmişdi. Xəlifənin tapşırığı ilə Muhəmməd ibn Məsləmə (r.ə) Kufəyə, Usamə ibn Zeyd (r.ə) Bəsrəyə, Abdullah ibn Ömər (r.ə) Şam diyarına, Əmmar ibn Yasir (r.ə) Misirə getmişdilər. Adı sadalananlardan başqa şəxslər də xəlifənin göstərişi ilə vəziyyəti yerində araşdırmaq üçün əhalisinin əksəriyyəti müsəlmanlardan ibarət olan böyük şəhərlərə yollanmışdılar. Qısa müddət sonra göndərilən müfəttişlər geri qayıdaraq xəlifəyə əyalətlərdə heç bir ciddi narazılığın və şikayətin olmadığını məruzə etmişdilər. Maraqlıdır ki, onlar getdikləri şəhər və əyalətlərin əhalisinin digər əyalətlərdəki narazılıqlar barədə xəbərlər eşidərək narahat olduqlarını bildirmişdilər. Sadəcə Əmmar ibn Yasir (r.ə) getdiyi Misirdən qayıtmamışdı. Onun aqibətindən narahat olan xəlifə Misir canişini Abdullah ibn Sə’d ibn Əbi Sərhə (r.ə) məktub yazaraq Əmmar ibn Yasir (r.ə) barədə soruşmuşdu. Canişin xəlifənin məktubuna cavabında Əmmarın (r.ə) Misirdəki bir dəstə adamla ünsiyyətdə olaraq səhv qənaət hasil etdiyini bildirmişdi. İbn Əbi Sərhin (r.ə) yazdığına görə Abdullah ibn Səba, Xalid ibn Mülcəm, Seydan ibn Humran əs-Səkuni əl-Muradi, Muhəmməd ibn Əbu Huzeyfə və Kinanə ibn Bişr kimi adamlar Əmmar ibn Yasiri (r.ə) öz təsirləri altına salmağa cəhd edərək onu Misirdəki müsəlmanların əksəriyyətinin mövcud vəziyyətdən şikayətçi olduqlarına inandırmağa çalışmışdılar. Əmmar ibn Yasir (r.ə) gec də olsa Misirdən qayıdaraq orada insanlar arasında bəzi xoşagəlməz söz-söhbətin yayıldığı barədə xəbər gətirmişdi.

Xəlifənin bu addımı Abdullah ibn Səba və adamlarını planları puç olacağı üçün narahat etmişdi. Bu təhqiqat əyalətlərdə hər hansı bir ciddi narazılığın olmadığı barədə qənaət yaratmaqla yanaşı, onların aldadıb yoldan çıxardıqları insanların da ətraflarından dağılışmaları ilə nəticələnə bilərdi. Buna görə də onlar dərhal hərəkətə keçmək qərarına gəldilər. Beləcə onlar umrə ziyarəti üçün Məkkəyə getmək bəhanəsilə razılaşdıqları vaxtda dəstə-dəstə Misir, Kufə və Bəsrədən hərəkətə keçərək Hicaza doğru yola çıxmışdılar. Hicri 35-ci ilin rəcəb ayında (yanvar 656) Muhəmməd ibn Əbu Bəkr, Əbdurrəhman ibn Udeys əl-Bələvi, Kinanə ibn Bişr əl-Leysi, Seydan ibn Humran əs-Səkuni əl-Muradi, Quteyrə əs-Səkuninin başçılığı altında Misirdən yola çıxan anarxistlərə ümumilikdə Ğafiqi ibn Hərb əl-Əkki iderlik etməkdə idi. Onların kufəli dostlarna Zeyd ibn Suhan əl-Əbdi, Malik ibn Haris əl-Əştər ən-Nəxəi, Ziyad ibn Nəzir əl-Harisi, Abdullah ibn əl-Ə’səm əl-Amiri rəhbərlik edirdilər. Bəsrəli anarxistlər isə Hurqus ibn Zuheyr əs-Sə’di, Həkim ibn Cəbələ əl-Əbdi, Zuheyr

ibn Əbbad, İbnü'l-Muhtəris və Bişr ibn Şureyh əl-Qeysinin başçılığı altında Hicaz yolunu tutmuşdular. Misir, Kufə və Bəsrədən umrə ziyarəti bəhanəsilə Mədiyəyə gəlmiş anarxistlərin ümumi sayı üç minə yaxın idi. Onlar təşkil etdikləri böyük izdihamla Mədinəyə daxil olmaq istəmədilər. Bu Mədinə əhalisi arasında narazılığa və işin onların əleyhinə dönməsinə səbəb ola bilərdi. Onlar isə bunu əsla arzu etmirdilər. Onların əsl məqsədi şəhərdə müxtəlif şaiyələr yaymaqla Mədinə əhalisini arasında özləri ilə həmfikir olanların sayını artırmaq, mədinəlilərdə xəlifənin istefasının zəruriliyi qənaətini oyatmaq, daha sonra bir neçə namizədin ətrafında insanları birləşdirərək qarşı-qarşıya qoymaq idi. Buna görə də onlar ayrı-ayrı dəstlər halında Mədinədən üç günlük məsafədə düşərgə salıb öz adamlarını şəhərə göndərmişdilər. Misirlilər Zil-Mərvə, kufəlilər əl-Ə'vas, bəsrəlilər isə Zu-Xuşub adlanan məntəqədə qərar tutmuşdular.

Bu insanların hər biri hansısa bir şəxsi səbəbdən ötürü xəlifənin əleyhinə çıxmaqda idilər. Bunlardan Muhəmməd ibn Əbu Huzeyfə, Əbu Bəkrin (r.ə) xəlifəliyi dövründə baş vermiş irtidad hadisələri vaxtı Yəmamədə şəhid olmuş Əbu Huzeyfə ibn Utbənin (r.ə) oğlu idi. Əbu Huzeyfə (r.ə) Yəmamə səfərindən əvvəl öz qohumu Osman ibn Əffandan (r.ə) bu səfərdə öldürüləcəyi təqdirdə ailəsi və övladlarını himayə etməsini xahiş etmiş, ələlxüsus oğlu Muhəmmədi ona tapşırmışdı. Osman (r.ə) Muhəmmədi hiymayə edərək onu böyütmüşdü. Osmanın (r.ə) xəlifəliyi dövründə gənc yaşlarında olan Muhəmmədin içki içdiyi barədəki söz-söhbət onun sərxoş yaxalanması ilə öz təsdiqini tapmış və xəlifə ona dəyənək cəzası tətbiq etmək məcburiyyətində qalmışdı. Dəyənək cəzasından sonra Muhəmməd həyat tərzini dəyişərək ibadətlərini artırmış, zöhd və təqvası ilə tanınmağa başlamışdı. O, xəlifədən özünün əyalətlərdən birinə əmir və ya vali olaraq təyin etməsini istəmiş, lakin xəlifənin "*bu işin öhdəsindən layiqincə gələcəyindən əmin olduğum vaxt bunu mütləq edəcəyəm*" deyə cavab verərək nəzakətlə onun bu istəyini rədd etmişdi. Arzusunu yerinə yetirmədiyi üçün Osman ibn Əffana (r.ə) qarşı ürəyi kinlə dolan Muhəmməd ibn Əbu Hazeyfə hərbi dəniz səfərlərində iştirak etmək istədiyini söyləyib Misirə getmək üçün izn istəmiş, xəlifənin izni ilə Misirə getmişdi. O, burada Bizans donanmasına qarşı aparlan hərbi dəniz səfərlərində iştirak etmiş, lakin eyni zamanda Misir valisi Abdullah ibn Sə'd ibn Əbi Sərhə (r.ə) acı sözlərlə tənə edib incitməkdən geri durmamışdı. O, Abdullah ibn Sə'də (r.ə) vaxtilə Məkkə müşriklərinin tərəfində Peyğəmbərə (s.ə.v) qarşı vuruşduğu üçün tənə edir və belə bir adamı vali təyin etdiyi üçün xəlifəni qınayıb ayıblayırdı. Abdullah ibn Səba Misirdə peyda olandan sonra Muhəmməd ibn Əbu Huzeyfənin qəlbinə yol tapmaqda gecikməmişdi. Vali xəlifəyə yazdığı məktublarda Muhəmməd

ibn Əbu Huzeyfənin əməllərindən şikayətlənir və baş verənlərdən agah edirdi. Lakin Osman ibn Əffan (r.ə) "*o, mənim qardaşımın oğludur, mənim oğlumdur*" deyərək validən bu gəncə qarşı lütfkar olamağı tələb edirdi. Şikayətlər kəsilmədiyi üçün Osman ibn Əffan (r.ə) Muhəmməd ibn Əbu Huzeyfəyə nəsihət dolu bir məktub, bahalı bir dəvə və 30 min dirhəm pul göndərmişdi. Misirli müsəlmanlar arasında zöhd, təqva və mücahidliyi ilə özünü tanıtmış Muhəmməd ibn Əbu Huzeyfə xəlifənin məktubu və ona göndərilən hədiyyələri insanlara nümayiş etdirərək "*xəlifə həqiqətləri söyləməyib susmağım üçün məni rüşvətlə ələ almağa çalışır*" demişdi. Onun bu hərəkətini bir təqva nümunəsi kimi qəbul edən insanlar ona daha çox rəğbət etməyə başlamışdılar. Misirli qiyamçılar öz liderlərinin başçılığı altında umrə bəhanəsi ilə Hicaza yola düşəndə Muhəmməd ibn Əbu Huzeyfə öz şəxsi vəsaiti hesabına onları təchiz etsədə də özü Misirdə qalmışdı. Osmanın (r.ə) öz evində mühasirə altına alındığı xəbərini alan Misir valisi Abdullah ibn Sə'd (r.ə) silahlı adamları ilə birlikdə Mədinəyə doğru yola çıxmış, lakin yarı yolda Osmanın (r.ə) öldürüldüyü xəbərini alıb Misirə qayıtmışdı. O, Misirə qayıdanda Muhəmməd ibn Əbu Huzeyfənin özbaşına olaraq Misir valiliyi vəzifəsini zəbt edib özünü Misirin yeni valisi elan etdiyini görmüş və geri qayıdıb Şam diyarına, Muaviyə ibn Əbu Sufyanın (r.ə) yanına getmişdi.

Mədinə yaxınlığında mövqe tutandan sonra bəsrəlilərdən Ziyad ibn Nəzir əl-Harisi və Abdullah ibn əl-Ə'səm həm Mədinədəki ümumi vəziyyəti öyrənmək, həm də gəlişlərinin məqsədini bəyan etmək üçün digərlərindən ayrılıb Mədinəyə getmişdilər. Onların şəhər ətrafında mövqe tutduqları xəbəri artıq Mədinədə yayılmışdı və şəhər əhalisi bundan narahat olaraq bəzi hazırlıqlar görmüşdülər. Mədinəyə gələn Ziyad və Abdullah burada bəzi tanınmış səhabələr və Peyğəmbərin (s.ə.v) xanımları ilə görüşüb gəlişlərinin məqsədini anlatmışdılar. Onlar öz vilayətlərindəki valilər barədə xəlifə ilə görüşüb danışmaq istəyirdilər. Ənsardan Ubey ibn Kə'b (r.ə) bu məsələnin artıq araşdırılıb təhqiq edildiyini bildirərək onlardan geri qayıtmalarını tələb etmişdi. Ziyad və Abdullahın öz yoldaşlarının yanına qayıdıb vəziyyəti izah etmələrindən sonra misirli, kufəli və bəsrəli qrupların hər biri ayrı-ayrılıqda öz adamlarını Əli ibn Əbu Talib (r.ə), Zubeyr ibn Əvvam (r.ə) və Təlhə ibn Ubeydullah (r.ə) ilə görüşüb danışmaq üçün Mədinəyə göndərmişdilər. Bu onların planının bir hissəsi idi. Bu şəxslərə xəlifənin artıq xeyli yaşlanıb ətrafındakıların təsiri altında olduğu üçün iş görə bilməz vəziyyətdə olduğunu söyləyəcək və əşarət-ül-mübəşşərədən olan bu üç şəxsdən hər hansı birinin möminlərin əmiri olmaq işini öz üzərinə götürməyə razı olacağı təqdirdə onu dəstəkləməyə hazır ol-

duqlarını bildirəcəkdilər. Misirli heyət Əli ibn Əbu Talibi (r.ə) Mədinə yaxınlığında zeytun emal edilən bir yerdə tapıb məramlarını açıqlamışdılar. Lakin onlar Əlidən (r.ə) gözləmədikləri bir reaksiya qarşısında əliboş geri qayıtmalı olmuşdular. Əli ibn Əbu Talib (r.ə) onlara "*bu ümmətin salehləri bilirlər ki, sizin başınıza toplanmış güruh Allahın Elçisinin (s.ə.v) dili ilə lənətlənmişdir*" deyə hayqıraraq yanından qovmuşdu. Əli (r.ə) oğlu Həsəni (r.ə) Osman ibn Əffanın (r.ə) yanına göndərək onu asilərin məramından agah etmişdi. Zubeyr (r.ə) və Təlhədən (r.ə) də bənzər cavab eşidən asilər planlarının bu qisminin də işə yaramadığını anlamışdılar. Vəziyyətdən xəbərdar olan xəlifə Məscidu'n-Nəbəvidə namazdan sonra minbərə çıxaraq insanlara xitab etmiş, qısa müddət əvvəl aparılmış araşdırma nəticəsində  Mədinə yaxınlığında qərar tutmuş insanların iddialarının heç bir əsası olmadığının məlum olduğunu, bunu hər kəsin bildiyini söyləyərək mədinəliləri yaranmış vəziyyətdən hali etmişdi. Daha sonra xəlifə, Əli ibn Əbu Talib (r.ə) və Muhəmməd ibn Məsləməni (r.ə) yanına çağırıb mədinəlilərdən ibarət bir heyət toplayaraq asilərin yanına getmələrini və onlarla danışıb geri, öz vilayətlərinə qayıtmalarını təmin etmələrini istəmişdi. Əli (r.ə) və İbn Məsləmə (r.ə) mühacir və ənsardan otuz nəfərlik bir heyətlə birlikdə asilərin yanına yollanmışdılar. Onlarla birlikdə asilərlə danışıq üçün gedənlərin arasında Səid ibn Zeyd (r.ə), Cübeyr ibn Mut'im (r.ə), Hakim ibn Hizam (r.ə), Səid ibn əl-As (r.ə), Əbdurrəhman ibn Əttab ibn Useyd (r.ə), Əbu Useyd əs-Səidi (r.ə), Zeyd ibn Sabit (r.ə), Həssan ibn Sabit (r.ə), Kə'b ibn Malik (r.ə) həmçinin xəlifənin katibi və əmisi oğlu Mərvan ibn Həkəm ibn Əbü'l-As da var idi. Heyətin adından Əli (r.ə) və Məsləmə (r.ə) asilərə liderlik edən misirlilərlə danışmış, onların istək və tələblərini dinləmişdilər. Onlar misirliləri öz ölkələrinə qaytmağa razı salmışdılar. Gəliş məqsədlərini və narazı qaldıqları xüsusları dilə gətirəndən sonra Əli (r.ə) ilə İbn Məsləmənin (r.ə) dediklərini diqqətlə dinləyən misirlilər geri qayıtmağa razı olmuşdular. "*Bizə bir tövsiyən və bizdən bir istəyin varmı?*" deyə soruşan Əbdurrəhman ibn Udeys əl-Bələviyə Muhəmməd ibn Məsləmə (r.ə) "*Bəli, var. Allahdan qorxmanı, başına topladığın bu insanları evlərinə qaytarmanı və onların şərrini möminlərin əmirindən uzaq tutmanı tövsiyə edirəm. Möminlərin əmiri də sizin narazı qaldığınız xüsuslara diqqət yetirərək bizim tövsiyələrimizə əməl edəcəyini söylədi*" deyə cavab vermişdi. Misirlilərin digər asilərlə birlikdə öz ölkələrinə qayıtmaq üçün yola çıxmasından sonra heyət Mədinəyə qayıdaraq xəlifəyə danışıqlar haqqında məlumat vermiş və onların öz ölkələrinin yolunu tutduqlarını bildirmişdilər.

Səhəri gün Osman ibn Əffan (r.ə) namazdan sonra məscidə toplaşmış insanlara xitab edib Misir, Kufə və Bəsrədən olan narazı kütlənin zənnə qapı-

laraq Mədinə civarına qədər gəldiklərini, zənnlərində yanıldıqları onlara izah edildiyi üçün də geri, öz ölkələrinə döndüklərini bildirmişdi. Daha sonra Osman (r.ə) minbərdə əllərini səmaya qaldırıb "*Ey Allahım! Mənim sənə ilk tövbə edənlərdən biri olduğumu bilirsən*" demişdi.

Misirli, kufəli və bəsrəlilərdən ibarət güruh öz vilayətlərinə geri qayıtmaq üçün yola çıxandan bir neçə gün sonra silahlı olaraq geri qayıdıb təkbir nərələri ilə Mədinəyə doluşmuş və Məscidu'n-Nəbəvinin ətrafında toplaşmağa başlamışdılar. Asilər "*əlini bizdən uzaq tutanlar bizdən zərər görməyəcək*" deyə car çəkmişdilər. Onlar hətta cəbhələrdəki orduların tərkibidə olan qəbilədaşlarına məktublar yazaraq "*əsl cihad buradadır, Mədinəyə gəlin*" deyə xəbər göndərmişdilər. Bu vəziyyət Mədinədə böyük həyəcan və təlatümə səbəb olmuşdu. Əli ibn Əbu Talib (r.ə) və Muhəmməd ibn Məsləmə (r.ə) yanlarındakı bir qrup mədinəli ilə onların qarşısına çıxıb niyə geri döndüklərini soruşanda onlar Buveyb adlı yerə çatanda Misirə doğru getməkdə olan bir qasidi yaxaladıqlarını, qasidin üstündən Misir valisi Abdullah ibn Sə'd ibn Əbi Sərhə xəlifə tərəfindən yazılmış bir məktub tapdıqlarını söyləmişdilər. Məktubda güya xəlifənin valiyə Mədinəyə gəlmiş asilər geri qayıdan kimi onlardan bəzilərinin həbs, bəzilərinin də edam edilməsini əmr etdiyi yazılmaqda idi. Onlar əllərindəki bu məktubla xəlifənin yanına soxularaq məktub haqqında soruşanda Osman ibn Əffan (r.ə) hər kəsin yanında Allaha and içərək belə bir məktub yazmadığını söyləmişdi. Onun and içdiyini görən Əli (r.ə) və İbn Məsləmə (r.ə) asilərə Osmanın (r.ə) əsla yalandan and içməyəcəyini söyləyərək onun bu məktubdan xəbərdar olmadığını söyləmişdilər.

Həmin bu məktub məsələsi keçmiş və müasir tarixçilər arasında ixtilaflı bir mövzu olmuşdur. Bəziləri məktubun əsla Osman (r.ə) tərəfindən deyil, onun katibi olan əmisi oğlu Mərvan ibn Həkəm tərəfindən yazıldığını düşünərkən, bəziləri isə ümumiyyətlə belə bir məktubun Mədinədən göndərilmədiyini, bu məktub məsələsinin geri qayıdıb məqsədlərinə nail olmaq üçün misirli asilərin özləri tərəfindən tərtib edildiyini bildirmişdirlər. İkinci ehtimal daha inandırıcı görünür. Çünki əgər həqiqətən də xəlifə asilərin mənsub olduqları əyalət valiləri tərəfindən cəzalandırılmasını istəsəydi sadəcə Misir valisinə deyil, həmçinin Kufə və Bəsrə valilərinə də eyni məzmunlu məktub yazardı. Halbuki sadəcə misirli qiyamçılar belə bir məktubdan bəhs etməkdə idilər və onlarla birlikdə kufəli və bəsrəli qiyamçılar da Mədinəyə qayıtmışdılar. Əli ibn Əbu Talib (r.ə) və İbn Məsləmə (r.ə) kufəli və bəsrəlilərə "*bəs siz niyə qayıtmısınız?*" deyə soruşanda onlar öz hüquqlarını tələb edən yoldaşlarını dəstəkləmək üçün gəldiklərini bildirmişdilər. Bundan başqa sonrakı kədərli hadisələrin baş

verməsi səbəbiylə Ayşə bint Əbu Bəkrin (r.ə) əllərini haqsız yerə Osman ibn Əffanın (r.ə) qanına batırdıqları üçün misirliləri qınayıb tənə edərkən bir misirli ona "*bizə məktub yazıb Osmanın (r.ə) əleyhinə təşviq edən sən deyildinmi?*" deyəndə Ayşə (r.ə) buna heyrətlənərək "*möminlərin iman edib kafirlərin inkar etdikləri Allaha and olsun ki, mən bu haqda heç kimə bir sətir belə yazmamışam*" deyə cavab vermişdi. Bundan başqa mənbələr Misir, Kufə və Bəsrədəki bəzi insanların arasında Əli (r.ə), Zubeyr (r.ə) və Təlhənin (r.ə) adından yazılmış saxta məktubların da oxunduğunu qeyd edirlər. Bütün bunlar onu sübut edir ki, Mədinədən Misir valisinə heç kim tərəfindən belə bir məzmunda məktub yazılmamışdır. Əli ibn Əbu Talib (r.ə) və İbn Məsləmənin (r.ə) aldadılaraq Mədinəyə gətirilmiş narazı kütləni dilə tutub geri göndərməsi qiyam tərtibçilərinin planlarını pozduğu üçün onlar fitnə atəşini yenidən alovlandırmaq məqsədiylə belə bir məktub oyunu tərtib etmişdilər.

Qiyamçılar silahlı olaraq Osman ibn Əffanın (r.ə) evi və məscidin ətrafında qərar tutsalar da ilk günlər xəlifənin evindən çıxaraq məsciddə insanlara namaz qıldırmasına və xütbə oxumasına mane olmamış, əksinə onlarla birlikdə, camaat halında namaz qılmışdılar. Lakin gərginlik getdikcə böyüyüyür, əsəblər tarıma çəkilir, münasibətlər gərginləşirdi. Osman ibn Əffan (r.ə) səhabələr və əsasən də onların gənc övladlarının qiyamçıları silah zoru ilə şəhərdən çıxarmaq təklifini rədd etmişdi. Çünki mədinədə əli silah tutan möminlərin sayı silahlı qiyamçıların sayından az idi. Qiyamçılar bunu bilirdilər və mədinəlilərin onları zorla şəhərdən çıxarmaq cəhdi qarşısında geri çəkilməyib silahla cavab verəcəkləri aşkardı. Bu isə daha böyük bir fitnənin ortaya çıxmasına, çox qan tökülməsinə səbəb ola bilərdi. Osman ibn Əffan (r.ə) namazlardan sonra minbərə çıxaraq insanlara xitab edir, nəsihət verirdi. O, bu yolla emosiyaların səngiyəcəyi və asilərin şəhəri tərk edəcəklərinə ümid edirdi. Lakin belə xütbələrdən birində asilərlə mədinəlilər arasında məsciddə dava-dalaşın qopması bu ümidi tükətmişdi. Kimin tərəfindən atıldığı bilinməyən daşın xəlifəyə dəyməsi nəticəsində yaşlı Osman ibn Əffan (r.ə) huşunu itirmişdi. Uməyyə ailəsindən bəzi şəxslər huşunu itirmiş xəlifəni evinə gətirmişdilər. Xəlifənin bu halda məscidi tərk etməsi asiləri bir qədər əndişələndirsə də onlar yenidən onun evinin ətrafında toplaşaraq gözləməyə başlamışdılar. Əli ibn Əbu Talib (r.ə) xəlifənin evinə gedib ondan hal-əhval tutmaq istəyərkən Məvan ibn Həkəm Əliyə (r.ə) "*bütün bunları bizim başımıza açan sənsən*" deyərək sərt reaksiya göstərmişdi. Xəlifənin "*ağzın yumulsun ey Mərvan, kəs səsini*" deməsinə baxmayaraq Əli ibn Əbu Talib (r.ə) qeyzli və incimiş olaraq oranı tərk edib evinə qapanmışdı. Xəlifə vəziyyətin geri dönüşü olmayacaq səviyyədə

gərginləşdiyini görərək asilərin zorla Mədinədən çıxarılmasından başqa çarə olmadığının fərqinə varmışdı. Lakin Mədinədə asiləri çəkindirəcək silahlı qüvvə yox idi. Xilafətin silahlı qüvvələri cəbhələrdə və ya cəbhələrə yaxın olan əyalətlərdə idi. Osman ibn Əffan (r.ə) Suriyadakı Müaviyə ibn Əbu Süfyan (r.ə) və İraqdakı Qə'qa ibn Əmrə (r.ə) məktub yazaraq vəziyyəti izah etmiş və silahlı qüvvə göndərmələrini tələb etmişdi. Onlar dərhal Həbib ibn Məsləmə əl-Fıhri (r.ə), Abdullah ibn Sə'd (r.ə), Müaviyə ibn Xudeyc əl-Kindi (r.ə), Uqbə ibn Əmr (r.ə) və Abdullah ibn Əbi Əvfanın başçılığı altındakı orduları Mədinəyə göndərmişdilər. Misirdən isə vali Abdullah ibn Sə'd ibn Əbi Sərh ordusu ilə yola çıxmışdı. Bu vaxt asilər xəlifənin evini mühasirəyə alaraq artıq onu evdən çıxmağa qoymurdular. Məsciddə camaata namazı xəlifənin göstərişi ilə Əbu Əyyub əl-Ənsari (r.ə) qıldırmaqda idi. Lakin bir müddət sonra asilər bu işi də öz əllərinə aldılar. Onların liderlərindən Ğafiqi ibn Hərb önə keçərək Məscidu'n-Nəbəvidə namaz qıldırmağa başlamışdı. Asilər Mədinəyə daxil olub qırx gün orada qalmış, bu məddət ərzində Osman ibn Əffanın (r.ə) evinin ətrafında toplaşmışdılar. Son on günü isə xəlifənin evindən çıxmasına mane olmaqla yanaşı evinə ərzaq və su gətirilməsinə də izn verməmişdilər. Peyğəmbərin (s.ə.v) xanımı Umm Həbibə (r.ə) və Əli ibn Əbu Talibin (r.ə) xəlifənin evinə su aparmaq cəhdləri də boşa çıxmışdı. Onlar xəlifəni ac və susuz buraxaraq istefaya məcbur edə biləcəklərini düşünürdülər. Bunu ona təklif etsələr də Osman ibn Əffan (r.ə) onlara "*Allahın geydirdiyi libası ancaq Allah çıxara bilər*" deyə cavab verərək istefa tələbini rədd etmişdi. O, evindən qiyamçılara "*mən öz pulumla Ruma quyusunu qazdırıb insanlar suyunu içsinlər deyə sədəqə edən Osmanam, indi siz məni susuz qoyursunuz?*" deyə səslənsə də qiyamçıların ölmüş insanlıq hisslərini oyada bilməmişdi. Bu vaxt hicri 35-ci ilin həcc mövsumu (iyun 656) idi və Mədinədən bir çox insan həcc ziyarəti üçün Məkkəyə getmişdi. Üsyançılar Suriya və Kufədən gələn orduların Vadi əl-Quraya çatıb Mədinəyə yaxınlaşmaqda olduqları xəbərini aldıqları vaxt əndişəyə qapıldılar. Ordular Mədinəyə gəlib çatacağı təqdirdə onların məqsədlərinə nail olmadan şəhəri tərk etməkdən başqa çıxış yolları qalmayacaqdı. Müqavimət göstərsələr öldürüləcəklərini bilirdilər. Buna görə də başladıqları işi sona çatdırmaq qərarına gəldilər. Lakin evə qapıdan soxulmağa cəsarət etmədilər. Çünki Osmanın (r.ə) evinin önündə gecə-gündüz Əlinin (r.ə) oğlu Həsən (r.ə), Təlhənin (r.ə) oğlu Muhəmməd (r.ə), Zubeyrin (r.ə) oğlu Abdullah (r.ə), Səid ibn əl-As (r.ə), Mərvan ibn Həkəm və digərləri keşik çəkməkdə idilər. Quteyrə, Ğafiqi və Seydan adlı üç qiyamçı xəlifənin qonşusu Ömər ibn Həzmin evinə girərək iki ev arasındakı keçiddən Osman ibn Əffanın (r.ə) evinə gizlincə soxulmuşdular. Onlar Qur'an oxumaq-

da olan xəlifənin üzərinə hücum edəndə xanımı Nailə (r.ə) onlara mane olmaq istəmişdi. Quteyrənin qılıncı Nailənin barmaqlarını qoparmışdı. Ğafiqi əlindəki küt dəmir alətlə xəlifənin başına zərbə endirmişdi. Osman ibn Əffan (r.ə) bu zərbə səbəbiylə yerə yıxılaraq şəhid olmuşdu. Onun başından axan qan yerdəki açıq vəziyyətdə duran Qur'anın "*onlara qarşı Allah sənə yetər*" (Bəqərə 137) ayəsinin üzərinə axmışdı. Onlar xəlifənin başını bədənindən ayırmaq istəsələr də Nailənin (r.ə) fəryadına gələn evdəki xidmətçi və qapıda keşik çəkənlər buna mane olmuşdular. Xidmətçi Seydanı vurub öldürsə də Qutyerənin qılınc zərbəsi ilə öz də öldürülmüşdü. Keşikçilərin evə girməsindən sonra bayırdakı qiyamçılardan bəziləri də evə soxulmuşdular. Osman ibn Əffanın (r.ə) evində qiyamçılarla keşikçilər arasında silahlı toqquşma baş vermiş, qiyamçılardan bəziləri öldürülmüşdü. Digərləri isə evdəki qiymətli əşyaları talayaraq qaçmışdılar. Mərvan ibn Həkəmi boynuna dəyən qılınc zərbəsi yaralamışdı. O, bu yaradan ölməmişdi, lakin boynu ömrü boyu əyri qalmışdı. Qiyamçılar xəlifənin öldürüldüyü xəbərini eşidən kimi dərhal beytülmala hücum edərək içəridəki bir miqdar nəğd pulu da yağmalayıb aparmışdılar. Osman ibn Əffan (r.ə) hicri 35-ci il zilhiccə ayının 18-i (17 iyun 656), 82 yaşında şəhid edilmişdi.

Qiyamçılar üç gün boyunca xəlifənin cənazəsinin dəfn edilməsinə izn verməmişdilər. Üç gün sonra ənsar və mühacirdən bir dəstə insan Osman ibn Əffanın (r.ə) nəşini evindən götürüb Bəqi qəbristanına gətirmişdilər. Lakin qiyamçılar xəlifənin Bəqidə dəfn edilməsinə izn verməmişdilər. Buna görə də Osman ibn Əffanın (r.ə) nəşi Bəqidə deyil Hiş Kəvkəb adlanan yerə gətirərək burada cənazə namazını qılıb dəfn etmişdilər. Bəqi ilə Hiş Kəvkəbi sadəcə bir divar ayırırdı. Cənazə namazını Cubeyr ibn Mut'im (r.ə) qıldırmışdı. Aldığı ilk zərbədən şəhid olduğu üçün Osman ibn Əffanı (r.ə) kəfənləməmiş, əynindəki paltarla dəfn etmişdilər. Müaviyə ibn Əbu Süfyan (r.ə) xəlifə olandan sonra Hiş Kəvkəblə Bəqi arasındakı bu divarı yıxdıraraq buranı da Bəqi qəbristanına qatmış və Osman ibn Əffanın (r.ə) məzarı digər məzarlarla əhatə olunmuşdu.

İstər klassik, istərsə də müasir tarixçilər arasında Osman ibn Əffanın (r.ə) qətli ilə nəticələnən hadisələrə zəmin hazırladığı düşünülən bəzi məsələlər müzakirə və ixtilaf mövzusu olmuşdur. Yəni xəlifənin qətli ilə nəticələnən hadisəyə onun bəzi icraatlarının yol açdığı söylənmiş və yazılmışdır. Bu tarixi məlumatları nəql edən bəzi mənbələr əsasən qiyam qaldırmış narazı kütlənin xəlifəyə qarşı irəli sürdükləri iddialara əsaslanmışdırlar. Bu tarixi hadisələri təhlil edən tədqiqatçılar da həmin mənbə materialları əsasında mövzunu işıqlandırmağa çalışmışdırlar. Lakin qeyd etmək lazımdır ki, Osman ibn Əffanın (r.ə) hakimiyyəti dövründə müsəlmanlar arasında meydana çıxmış ixtilaf və fitnə-fəsadın qızışmasında süni

amillərin çox mühüm rolu olmuşdur. Ən azından hadisələrin gedişatı onu deməyə əsas verir ki, Osman ibn Əffanın (r.ə) qətli ilə nəticələnən hadisələr heç də öz təbii axarı ilə inkişaf etmiş deyildir. Düşünürük ki, burada bu məsələrdən söz açıb aydınlıq gətirməyə çalışmaq yerinə düşəcəkdir.

Osman ibn Əffana (r.ə) qarşı müxaliflərin, qiyamçıların irəli sürdükləri iddialar və ona tutulan iradların başında xəlifənin öz yaxın qohumlarını yüksək vəzifələrə təyin etməsi gəlir. Gəlin Osman ibn Əffanın (r.ə) xəlifəliyi dövründə yüksək vəzifə tutmuş, daha doğrusu o, öldürülərkən vəzifədə olan şəxslər haqqında mənbələrin nəql etdiyi məlumatlarla tanış olaq. Məkkə valisi Abdullah ibn əl-Hədrəmi, Taif valisi Qasım ibn Rəbiə əs-Səqəfi, Yəmən valisi Yə’la ibn Munyə, Kufə valisi Əbu Musa əl-Əş’əri, Misir valisi Abdullah ibn Sə’d ibn Əbi Sərh, Bəsrə valisi Abdullah ibn Amir, Dəməşq valisi Müaviyə ibn Əbu Süfyan, Hums valisi Əbdurrəhman ibn Xalid ibn Vəlid, əl-Cəzirə valisi Həbib ibn Məsləmə əl-Fıhri, Azərbaycan və Ərməniyyə valisi Əş’əs ibn əl-Qeys əl-Kindi, Qarqisya valisi Cərir ibn Abdullah əl-Bəcəli, Hulvan valisi Uteybə ibn ən-Nəhhas, şərqi İran valisi Malik ibn Həbib, mərkəzi İran (Rey) valisi Səid ibn Qeys, İsfəhan valisi Saib ibn əl-Əqra, İordaniya əmiri Əbül-A’vər əs-Süləmi, Fələstin əmiri Əlqamə ibn Həkim əl-Kinani, Aralıq dənizindəki hərbi donanmanın əmiri Abdullah ibn Qeys əl-Fəzari, İraqdakı orduların baş komandanı Qə’qa ibn Əmir, baş amil (vergi işləri) Cabir əl-Muzni, baş qazı Zeyd ibn Sabit, Şam diyarı qazısı Əbu’d-Dərda, beytülmaldan məs’ul (xəzinədar) Uqbə ibn Amir. Yuxarıda adları sadalanan şəxslərdən sadəcə Misir valisi Abdullah ibn Sə’d ibn Əbi Sərh (r.ə), Bəsrə valisi Abdullah ibn Amir (r.ə), Dəməşq valisi Müaviyə ibn Əbu Süfyanın (r.ə) xəlifə ilə qohumluq əlaqəsi var idi. Müaviyəni (r.ə) həmin vəzifəyə Osman (r.ə) deyil, Ömər ibn Xəttab (r.ə) təyin etmişdi. Hətta ondan da əvvəl Peyğəmbər (s.ə.v) qayını Müaviyəyə[82] (r.ə) etimad edərək özünə katib təyin etmişdi. Müaviyənin (r.ə) komandan olaraq Bizans cəbhəsindəki yüksək xidmətləri barədə yuxarıda məlumat vermişdik. Kufədə valilik etmiş və xəlifənin əqrəbası olan Vəlid ibn Uqbə və Səid ibn əl-As isə kufəli müxaliflərin narazılıqları nəticəsində Osman ibn Əffan (r.ə) tərəfindən vəzifədən azad edilmiş, hətta həmin müxaliflər yalan şahidlik edərək xəlifənin Vəlid ibn Uqbəyə dəyənək cəzası vurdurmasına da nail olmuşdular. Digər ikisi yəni Misir valisi Abdullah ibn Sə’d ibn Əbi Sərh (r.ə) və Bəsrə valisi Abdullah ibn Amirə (r.ə) gəldikdə isə bu iki şəxsin hərbi və idari işlərdəki bacarıq və qabiliyyətinə dəlalət edən hadisələr haqqında bundan əvvəl məlumat vermiş-

[82] O, Peyğəmbərin (s.ə.v) xanımı Umm Həbibənin (r.ə) qardaşı idi.

dik. Abdullah ibn Amir ibn Kureyz Xorosan fatehi idi. Abdullah ibn Sə'din isə şimali Afrikanın fəthində mühüm xidmətləri olmuşdur. Yəni Osmanın (r.ə) vəzifəyə təyin etdiyi qohumları ləyaqətsiz insanlar deyildilər, əksinə İslam və ümmət qarşısında mühüm xidmətləri olmuş insanlar idilər.

Müxaliflərin Osman ibn Əffana (r.ə) tutduqları iradlardan biri də Mərvan ibn Həkəmi sürgündən qaytararaq öz katibliyinə təyin etməsi və Misirdən beytülmala daxil olan gəlirlərdən ona böyük pay ayırmasıdır. Bu məsələdə də xətaya və sui-zənnə yol verilməkdədir. Mərvan ibn Həkəm, Osman ibn Əffanın (r.ə) əmisi Həkəm ibn Əbü'l-Asın oğludur. Həkəm ibn Əbü'l-As tüləqadan, yəni Məkkənin fəthindən sonra İslamı qəbul edənlərdən biridir. Məkkənin fəthinə qədər isə müşrik idi və hicrətdən əvvəl Allah Rəsulu (s.ə.v) ilə müsəlmanlara əziyyət verən bir şəxs idi. Məkkənin fəthindən (630) sonra İslamı qəbul etmiş Həkəm ibn Əbü'l-As Allah Rəsulunun (s.ə.v) əmri ilə Məkkədən Taifə göndərilmişdi. 623-cü il təvvəllüdlü Mərvan bu vaxt 7 yaşlı bir uşaq idi. Taifə sürgün olunan Mərvan deyil, onun atası idi və Mərvan da digər ailə üzvləri ilə birlikdə Taifə gedərək orada yaşamışdı. Peyğəmbər (s.ə.v) heç kimi ömürlük sürgünə göndərməmişdi. Lakin bu hadisədən iki il sonra Allah Rəsulu (s.ə.v) vəfat etdiyi üçün Osman ibn Əffan (r.ə) əmisinin sürgündən qayıda bilməsi üçün xəlifə Əbu Bəkrə (r.ə) müraciət etmişdi. Nə Əbu Bəkr (r.ə), nə də Ömər ibn Xəttab (r.ə) Peyğəmbərin (s.ə.v) bu haqda heç bir söz deməməsi səbəbiylə Məkkədən Taifə göndərilmiş Həkəm ibn Əbü'l-Asın geri qaytarılması barədə əmr verməmişdilər. Həkəm ibn Əbü'l-As bu vaxt artıq ölmüşdü və Osman ibn Əffan (r.ə) xəlifə olduqdan sonra əmisinin ailəsinə Taifi tərk etməkdə sərbəst olduqları barədə xəbər yollamışdı. Bir müddət sonra isə Mərvanı Mədinəyə çağıraraq öz katibliyən təyin etmişdi. Bir daha qeyd edək ki, Məkkədən Taifə sürgün edilən Mərvan deyil, onun atası idi. Mərvanın bu vaxt uşaq olduğunu artıq bildirmişik və o, uşaqlıq illərindən dini vacibləri yerinə yetirən bir müsəlman kimi böyümüşdü. Bundan başqa sürgün qərarının hətta ona da şamil olduğunu fərz etsək belə bu həmin ailə üzvlərinin Məkkədə yaşamasına əngəl təşkil edə bilər, Mədinədə deyil. Misir valisi Abdullah ibn Sə'd ibn Əbi Sərh (r.ə) Misirdən Mədinəyə göndərilməli olan yarım milyon dirhəm məbləğindəki vergi gəlirlərinin nəğd qismini göndərmiş, daşınması çətin olan əmlak isə Misirdə qalmışdı. Mərvan ibn Həkəm xəlifənin izni ilə mal-qara sürüləri və məişət əşyalarından ibarət, daşınması müşkül olan həmin malları, dəyərini beytülmala hissə-hissə ödəməsi şərti ilə satın almışdı. O, bu dəyərin xeyli qismini hissə-hissə beytülmala ödəmiş, son 15 min dirhəmlik hissəni isə xəlifə ona bağışlamışdı. Lakin

bunun özünə irad tutulduğunu görən Osman ibn Əffan (r.ə) həmin 15 min dirhəmlik hissəni öz şəxsi vəsaitindən beytülmala ödəmişdi.

Xəlifənin əshabdan olan Abdullah ibn Məs'udu (r.ə) və Əbu Zərr əl-Ğifarini (r.ə) döydürməsi isə ona atılan iftira və böhtandan başqa bir şey deyildir. Hətta bəziləri Abdullah ibn Məs'udun (r.ə) Qur'an nüsxələrini çoxaldaraq əyalətlərə göndərməsi səbəbiylə tənqid etdiyi xəlifə tərəfindən qarnı yırtılıb bağırsaqları bayıra axana qədər döyüldüyünü iddia edirlər. Abdullah ibn Məs'udun (r.ə) güya xəlifə tərəfindən döydürüldüyü haqqında məlumat verən tək mənbə Əhməd əl-Yaqubinin "*Tarix*" adlı əsəridir. Əhməd əl-Yaqubinin (ölümü 905) Osman ibn Əffan (r.ə), eləcə də digər səhabələri pisləməkdən, tənə etməkdən çəkinməyən firqəyə mənsub olduğu bilinməkdədir. Bu səbəbdən də onun bu qəbildən olan məsələlər haqqında verdiyi məlumatlar səhihliyinin dəqiqləşdirilməsi baxımından mütləq digər mənbələrlə müqayisə edilməlidir. Həmçinin qeyd edək ki, Əhməd əl-Yaqubinin xəlifə Osmanın (r.ə) Qur'an nüsxələrinin çoxaldılması məsələsinə Abdullah ibn Məs'udun (r.ə) münasibəti haqda verdiyi məlumatlar ziddiyyətlidir. Müəllif əsərinin bir yerində Abdullah ibn Məs'udun (r.ə) xəlifənin bu addımını dəstəklədiyi, başqa bir yerində isə etiraz etdiyi haqda məlumat verməkdədir. İzzəddin ibn əl-Əsir də özünün "*əl-Kamil fi't-Tarix*"ində Abdullah ibn Məs'udun (r.ə) Qur'an nüsxələrinin çoxaldılması məsələsində xəlifəni dəstəklədiyini qeyd edir. Əbu Zərr əl-Ğifari (r.ə) isə öz istəyi ilə Mədinədən Rəbzəyə gedib orada məskunlaşmışdı və xəlifə tərəfindən heç bir cəzaya məruz qalmamışdı. Bu haqda yuxarıda məlumat vermişdik.

Osman ibn Əffana (r.ə) tutulan digər bir irad isə onun səfərdə namazları qısaldaraq deyil, tam şəkildə qılması və cümə namazı vaxtı ikinici əzanı oxutmasıdır. Bu fiqhi bir məsələdir. Fiqhi mövzularda ictihad edən bir alim isabət də edə bilər, yanıla da bilər. Ona bu mövzuda irad tutanlar Ömər ibn Xəttabın (r.ə) təravih namazlarını camaatla qıldırmasına səs çıxarmamışdılar. Deyəsən həqiqətən də məsələ Osman ibn Əffanın (r.ə) yuxarıda qeyd etdiyimiz xütbəsində dediyi kimidir. Onlar Ömərə (r.ə) səs çıxara bilməzdilər. Çünki Ömər (r.ə) Osman (r.ə) qədər mülayim və həlim bir insan deyildi. Narazı qalıb etiraz etməyi adət halına gətirənlərin bəhanəsini aradan qaldırmağı bacarırdı. Bundan başqa Osman (r.ə) həcc üçün daimi yaşayış yeri olan Mədinədən Məkkəyə getdiyi vaxt orada namazlarını qısaltmadan tam qılmışdı. Tutulan irad da buna idi. Bu irada Osman (r.ə) "*mənim Məkkədəki halım yəmənlilərinki kimi deyil, mən həm də məkkəliyəm, Məkkədə də evim var*" deyə cavab vermişdi. Cümə namazı vaxtı iki əzan oxunması isə o dövrdə Mədinənin artıq xeyli genişlənməsi və bir yerdə oxunan əzanın şəhərin hər tərəfindən eşidilməməsi səbəbilə idi.

Əli ibn Əbu Talib (r.ə) və Muhəmməd ibn Məsləmə (r.ə) xəlifə Osmanın (r.ə) istəyi ilə misirli qiyamçılarla görüşərkən onların dilə gətirdikləri istək və tələblərindən biri də fə'yin ədalətli şəkildə bölüşdürülməsi olmuşdu. Bu xeyli diqqəti cəlb edən bir xüsusdur. Ömər ibn Xəttabın (r.ə) xəlifəliyi dövründə fəth edilmiş ölkələrdə qənimət olaraq ələ keçirilmiş əkinə yararlı münbit ərazilər və digər daşınmaz əmlak fə'y olaraq qəbul edilmiş və mücahidlər arasında bölünməyərək əvvəlki sahiblərinin mülkiyətində saxlanmışdı. Bu kimi daşınmaz qənimətlərdən əldə olunan gəlirlər beytülmalın hesabına keçirilmiş və buradan haqq sahibi insanlara ödənməkdə idi. Ömər ibn Xəttabın (r.ə) "*Bu ona görədir ki, (həmin mal-dövlət) içərinizdəki zənginlər arasında əldən-ələ dolaşan bir sərvət olmasın (ondan yoxsullar da faydalansın)*" (Həşr surəsi 7) ayəsinə əsaslanaraq verdiyi bu qərar ayrı-ayrı insanların fəth olunmuş ölkələrdəki münbit torpaqlara sahib olaraq feodallaşmasının qarşısını almışdı. Bununla həm də cəbhələrdəki əsgərlərin cihad hərəkatından geri qalmamaları təmin olunmuşdu. İlk dövrlərdə fasiləsiz davam edən fəthlər sayəsində alınan qənimətlərlə kifayətlənənlər fəth hərəkatının səngiməsilə yenidən fə'yə yağlı bir tikə kimi baxmağa başlamışdılar. Ömər ibn Xəttabın (r.ə) iradəsi və qətiyyəti qarşısında bu qərara boyun əymək məcburiyyətində qalanlar Osman ibn Əffanın (r.ə) yumuşaq xasiyyəti və həlimliyindən istifadə edərək fə'y barədəki qərarın dəyişməsini arzulamaqda idilər. Lakin Osman ibn Əffan (r.ə) dirayətli bir dövlət başçısı kimi davranaraq narazı insanların səsinə qulaq verib dinləsə də haqsız tələblərinə boyun əyməmiş və onların bu istəyi rədd edilmişdi. Qiyamçıların Osman ibn Əffana (r.ə) qarşı olan kin və qəzəbini alovlandıran əsas səbəblərdən biri də bu idi. Burada Allah Rəsulunun (s.ə.v) nə qədər haqlı olduğunu qeyd etməmək mümkün deyil. Peyğəmbər (s.ə.v) buyurmuşdur ki:

**إن لكُل أمةٍ فتنَةً، وَإن فتنَةَ أمتى الْمَالُ**

"*Hər ümmətin bir fitnəsi (imtahanı) var, mənim ümmətimin fitnəsi isə (dünya) maldır*"[83]

Əbu Bəkr (r.ə) və Ömər ibn Xəttab (r.ə) riddə hadisələrində aktiv iştirak etmiş qəbilə və oymaqlara mənsub bədəviləri mümkün qədər cəbhələrdə vuruşan mücahidlərdən uzaq tutmağa çalışır, onları yeni fəth olunan ölkələrə göndərmirdilər. Lakin Osman ibn Əffan (r.ə) bu insanların yarımadada qalmalarındansa cəbhələrə gedib vuruşaraq daha faydalı ola biləcəklərini düşünmüş və onları Misir və İraqdakı hərbi düşərgələrə göndərmişdi. Belə görünür ki,

[83] İbn Macə, *Sünən*, Fitən 18; Tirmizi, *Sünən*, Zöhd, 2336

Osman ibn Əffan (r.ə) bu qərarında isabət etməmişdi. Çünki riddə hadisələrinin aktiv iştirakçılarının cəbhələrə getməsindən qısa müddət sonra yuxarıda sözü gedən etiraz və qiyam hadisələri başlamışdı.

Osman ibn Əffana (r.ə) tutulan iradlar, irəli sürülən tələblər və nəhayət asilərin Mədinəyə basqın edərək xəlifəni qətlə yetirməsi ilə nəticələnən hadisələrin axarı, gedişatı bu hadisələri "ikinici riddə hadisəsi" olaraq səciyyələndirməyə əsas verir. Əlbəttə ki, burada Abdullah ibn Səba və yaxın ətrafının fitnə atəşini alovlandırıcı hərəkətlərini unutmamaq lazımdır. Lakin həm də nəzərə almaq lazımdır ki, əlverişli zəmin, şərait olmasaydı Abdullah ibn Səbanın fitnəkarlığı Mədinə basqını və xəlifənin qətlinə qədər böyüyə bilməzdi. Elə isə bu əlverişli zəmin və şəraiti hazırlayan şərtləri araşdırıb ortaya çıxarmaqda yarar var. Əvvəla, unutmamaq lazımdır ki, Əbu Bəkrin (r.ə) bütün qətiyyəti və iradəsilə üstünə gedərək qarşısını aldığı riddə hadisələrinin üzərindən cəmi 23 il keçmişdi. Bəzi bədəvi ərəb qəbilələri Allah Rəsulunun (r.ə) vəfatından dərhal sonra dabanlarının üzərində dönərək arxalarını İslama çevirməkdən çəkinməmişdilər. Onlar İslamı bütünü ilə rədd etmirdilər. Çünki dini-fikri zəmində İslam qarşısında puç olub getmiş atalarının dininə, bütpərəstliyə qayıda bilməzdilər. İslamı bir din kimi qəbul edirdilər, lakin Allahın əmr etdiyi şəkildə deyil, öz arzuladıqları şəkildə. İslam bədəvi ərəb qəbilələri arasında yeni-yeni intişar tapmaqda idi. Əqidə baxımından tövhidi qəbil etsələrdə, əsrlərdən bəri mövcud olan cahiliyyənin bir çox adət və ənənələrini birdən-birə tərk etmələri xeyli çətin idi. İslam dini Məkkədə, Qüreyş qəbiləsi arasında zühur etmiş, Mədinədəki Əvs və Xəzrəc qəbilələri arasında özünə güclü dayaq tapmışdı. Məkkənin fəthindən sonra isə Qüreyş bütünlüklə İslamı qəbul etmişdi. Cahiliyyə dövrünün əsas ənənələrindən olan qəbilə təəssübkeşliyi səbəbilə bəzi bədəvi ərəb qəbilələri üçün İslamı qəbul etmək Qureyş qəbiləsinə itaət etməklə eyni mənanı ifadə edirdi. Onlar isə əsla Qüreyşi öz qəbilələrinin üzərində görmək istəmirdilər. Ümumiyyətlə qəbilə-tayfa münasibətləri şəraitində yaşamağa vərdiş etmiş bədəvilərin mərkəzləşdirilmiş dövlət hakimiyyətini qəbul etmələri onlar üçün xeyli çətin bir məsələ idi. Azad və sərbəst həyata vərdiş etmiş bədəvi qəbilələr mərkəzləşdirilmiş dövlət hakimiyyətini onların hürriyətini məhdudlaşdıran bir ünsür kimi görürdülər və onun tələblərinə boyun əymək bədəvilər üçün xeyli müşkül məsələ idi. Bədəvilərin riddə hadisələrinə böyük kütlələr halında dəstək verməsinin səbəbi bu idi. Həmin dövrdə Əbu Bəkr (r.ə) bunun qarşısını almış, nizam-intizamı təmin etmişdi. Ömər ibn Xəttabın (r.ə) qərarlı, tədbirli üsuli-idarəsi və qətiyyətli şəxsiyyəti irtidadın yenidən xortlamasının qarşısını almışdı. Lakin irtidad edənlərin övladları əsla atalarının acı aqibətini unutmamış-

dılar. Bundan ötürüdür ki, yaşlılığın verdiyi həlimliyə və yumuşaq xarakterə sahib olan Osman ibn Əffanın (r.ə) dövründə yatmış irtidad fitnəsi yenidən gözünü açmışdı. Onar Əbu Bəkrin (r.ə) dövründə edə bimlədiklərini Osmanın (r.ə) dövründə etdilər. Mədinəyə basqın gerçəkləşdirdilər. Lakin xəlifəni öz iradələrinə tabe etdirə bilmədikləri üçün onu qətlə yetirdilər. Amma bu asiləri başqa bir poblemlə üz-üzə qoydu: bundan sonra nə olacaqdı? Xəlifəlik işini, ümmətin idarəçiliyi vəzifəsini kim üzərinə götürəcəkdi? Bu hər kim olacaqdısa bunu həmin şəxsə onlar təklif etməli idilər. Yeni xəlifə bu vəzifəyə onların sayəsində yiyələnməliydi ki, sonrakı dövrdə onların iradəsinə daha asan tabe olsun. Lakin sonrakı hadisələr onların bu hesablarında da yanıldıqlarını göstərəcəkdir.

# V. FƏSİL

# ƏLİ İBN ƏBU TALİBİN (R.Ə) HAKİMİYYƏTİ DÖVRÜ (656-661)

Əli ibn Əbu Talib (r.ə) Allah Rəsulunun (s.ə.v) əmisi, Əbu Talib künyəsi ilə tanınan Əbdumənafın dörd oğlunun ən kiçiyidir. Talib, Uqeyl və Cə'fər (r.ə) Əlinin (r.ə) böyük qardaşları idilər. Əbu Talibin Umm Hani Faxitə (r.ə) və Cümanə (r.ə) adlı iki qızı da var idi. Əbu Talibin övladlarının anası Fatimə bint Əsəd (r.ə) idi. Fatimə bint Əsəd (r.ə) də Bəni-Haşim ailəsinə mənsub idi. O, İslamı qəbul edib hicrət etmiş qadınlardan biri idi. Əbu Talib kasıb, lakin şəfqətli və mülayim bir insan idi. Məkkənin quraqlıq və qıtlığa düçar olduğu illərdə Bəni-Haşim ailəsinə mənsub kişilər kasıb Əbu Talibin övladlarını öz himayələrinə götürmək qərarına gəlmişdilər. Dörd yaşlı Əlini (r.ə) Muhəmməd (s.ə.v) öz himayəsinə götürərək evinə gətirmiş və o, Allah Rəsulu (s.ə.v) ilə Xədicənin (r.ə) himayəsi və tərbiyəsi altında böyümüşdü. Bi'sətin başladığı miladi 610-cu ildə Əli (r.ə) yeddi yaşlı uşaq idi. İslamın bi'sətdən hicrətə qədərki məşəqqətli Məkkə dövrü Əlinin (r.ə) uşaqlıq, yeniyetməlik və gənclik illərinə təsadüf etmişdi. Hicrət vaxtı Əli ibn Əbu Talib (r.ə) artıq 22 yaşlı bir gənc idi. Hicrətin ikinci ilində (04 iyul 623-23 iyun 624) Allah Rəsulu (s.ə.v) onu öz qızı Fatimə (r.ə) ilə evləndirmişdi. Əlinin (r.ə) Fatimə (r.ə) həyatda olduğu müddətdə başqa evliliyi olmamışdır. Bu nikahdan Həsən (r.ə), Hüseyn (r.ə), azyaşlı ikən vəfat etmiş Muhəssin adlı oğulları, Zeynəb (r.ə) və Umm Kulsum (r.ə) adlı qızları dünyaya gəlmişdi. Peyğəmbərin (s.ə.v) qızı Fatimənin (r.ə) vəfatından[84] sonra Əli ibn Əbu Talibin (r.ə) digər xanımlarla evliliyi olmuşdur. Umm Bənin bint Hizam, Leyla bint Məs'ud, Əsma bint Umeys, Umm Həbibə bint Rəbiə, Umamə bint Əbü'l-As ibn Rəbiə[85], əl-Hənəfiyyə Xavlə bint Cə'fər, Umm Səid bint Urvə əs-Səqəfi, Məhyə bint Əmrə adlı xanımlardan onun Abbas, Cə'fər, Abdullah, Osman (böyük), Osman (kiçik), Ubeydullah, Əbu Bəkr (böyük), Əbu Bəkr (kiçik), Muhəmməd əl-Hənəfiyyə, Yəhya, Muhəmməd (böyük), Muhəmməd (kiçik),

[84] Allah Rəsulunun (s.ə.v) qızlarının ən kiçiyi olan Fatimə əz-Zəhra (r.ə) bi'sətin 5-ci ilində cəmadiyəlaxir ayının 20-si (təqribən 15 mart 616) Məkkədə dünyaya gəlmiş, hicrətin 11-ci ili cəmadiyəlaxir ayının 3-cü (24 avqust 632), atasından 77 gün sonra Mədinədə vəfat etmişdi.

[85] Bu xanım Peyğəmbərin (s.ə.v) qızlarından Zeynəbin (r.ə) qızı idi. Atası Əbü'l-As ibn Rəbiə əl-Kinani idi. Əbü'l-As ibn Rəbiə Peyğəmbərin (s.ə.v) xanımı Xədicənin (r.ə) bacısı oğlu idi.

Ömər (böyük), Ömər (kiçik) adlı oğulları, Umm Həsən, Ruqəyyə, Ramlə, Umm Hani, Zeynəb, Fatimə, Umamə, Xədicə, Umm Sələmə, Umm Kiram, Cumanə, Nəfisə, Umm Cə'fər adlı qızları dünyaya gəlmişdir. Əlinin (r.ə) oğullarından Əbu Bəkr (r.ə/böyük), Ubeydulah (r.ə), Cə'fər (r.ə), Abdullah (r.ə) və Osman (r.ə/böyük) qardaşları Hüseynlə (r.ə) birlikdə Kərbəla hadisəsində şəhid olmuşdular. Əli ibn Əbu Talibin (r.ə) nəsli oğulları Həsən (r.ə), Hüseyn (r.ə), Muhəmməd əl-Hənəfiyyə (r.ə), Abbas (r.ə) və Ömərdən (r.ə/böyük) davam etmişdir. Mənbələr ümumilikdə Əli ibn Əbu Talibin (r.ə) on dörd oğlu və on yeddi qızının olduğunu qeyd edirlər. Bunlardan bəziləri azyaşlı ikən vəfat etmişdilər.

Əli ibn Əbu Talib (r.ə) orta boylu, iri cüssəli, qarabuğdayı, gur qara saçları və saqqalı, iri qara gözləri olan, gülərüzlü bir insan idi. Saqqalını sinəsinə qədər uzadardı. Yaşlandığı vaxt saçları bir qədər seyrəlmiş, saçı və saqqalı yarı-yarıya ağarmışdı.

Əli ibn Əbu Talib (r.ə) gənc yaşlarından etibarən şücaəti və igidliyi ilə sadəcə Qüreyş qəbiləsində deyil, bütün ərəblər arasında məşhur olmuşdu. Peyğəmbərin (s.ə.v) yanında demək olar ki, bütün döyüşlərdə iştirak etmişdi. Xəndək döyüşündə ərəblərin məşhur cəngavərlərindən Əmr ibn Əbdud əl-Amirini, Xeybərin fəthində isə yəhudilərin adlı-sanlı pəhləvanlarından Mərhabı təkbətək döyüşdə öldürmüdü. Allah Rəsulu (s.ə.v) onu Yəmən canişinliyi və amilliyinə təyin etmişdi. Ömər ibn Xəttabın (r.ə) xilafəti dövründə məşvərət şurasının üzvü və xəlifənin qazısı idi.

Osman ibn Əffan (r.ə) qətlə yetiriləndən sonrakı günlərdə Mədinədə vəziyyət xeyli gərgin idi. Xəlifənin qiyamçılar tərəfindən qətlə yetirildiyi xəbəri qısa müddətdə bütün vilayətlərə və şəhərlərə yayılmışdı. Osman ibn Əffanın (r.ə) asiləri şəhərdən sıxışdırıb çıxarmaq üçün çağırdığı ordular Mədinədən bir neçə günlük məsafədə ikən bu xəbəri almış və əmirlər artıq şəhərə girmənin mənasız olduğunu düşünərək geri qayıtmışdılar. Çünki onlar xəlifəni qorumaq üçün göndərilmişdilər. Xəlifə isə artıq həyatda yox idi, başqa sözlə onların Mədinədə qoruyacaqları kimsə də yox idi. Osman ibn Əffanın (r.ə) öldürülməsindən sonrakı beş gün ərzində şəhəri asilərin liderlərindən Ğafiqi ibn Hərb əl-Əkki idarə etmişdi. Lakin asilər başa düşürdülər ki, bu iş bu şəkildə davam edə bilməz. Mədinəlilərin beyətini almış şəxsdən başqasına ümmətin itaət etməsi mümkün deyildi. Buna görə də bəsrəli və kufəlilərdən ibarət bir qrup Zübeyr (r.ə), Təlhə (r.ə), Sə'd ibn Əbi Vəqqas (r.ə) və Abdullah ibn Ömərin (r.ə) yanına gedərək onlara xəlifə olmağı təkif etmiş, lakin rədd cavab almışdılar. Misirlilərdən ibarət bir dəstə Əli ibn Əbu Talibin (r.ə) yanına gəlib ona xəlifə seçilməyi təklif edəndə Əli (r.ə) onların təklifini rədd

edərək “*bu sizin deyil, mədinəlilərin, ənsar və mühacirin işidir*” deyə cavab vermişdi. Asilər təkidlə mədinəlilərdən yeni xəlifəni seçməyi tələb etsələr də müsbət bir nəticə əldə etməmişdilər. Bunu görən asilər şəhər əhalisini “*ya bu adamlardan birini özünüzə xəlifə seçəcəksiniz, ya da onlarla birlikdə sizin də qanınızı tökəcəyik, bunun üçün elə də çox vaxtınız yoxdur*” deyib hədələyəndə ənsar və mühacirdən bir qrup Əli ibn Əbu Talibin (r.ə) yanına gələrək bu işi öz üstünə götürməyi xahiş etmişdilər. Əks təqdirdə Osman ibn Əffanın (r.ə) qatilləri Mədinədə qətliam törətməkdən çəkinməyəcəkdilər. Əli ibn Əbu Talibin (r.ə) “*mənim sizə əmir olmağımdansa əmirinizə vəzir olmağım daha xeyrlidir*” deyib imtina etməsi onları təkidli tələblərindən əl çəkdirə bilməmişdi. Nəhayət Əli ibn Əbu Talib (r.ə) ənsar və mühacir heyətinin təklifini qəbul etmişdi. Onun bu işi üzərinə götürməyə razılaşmasından sonra hicri 35-ci il zilhiccə ayının 24-ü (22 iyun 656) yeni xəlifəyə beyət edilməyə başlanmışdı. Asilər ilk olaraq şura üzvü olan Zübeyr (r.ə) və Təlhənin (r.ə) beyət etməsini istəmişdilər. Əli ibn Əbu Talibə (r.ə) ilk beyət edən Təlhə ibn Ubeydullah (r.ə) olmuşdu. Təlhənin (r.ə) sağ əli Uhud döyüşündə aldığı yara səbəbiylə iflic olmuşdu. O, iflic olmuş əli ilə yeni xəlifənin sağ əlini tutub beyət edəndə bəziləri “*vallahi, bu iş xeyrlə nəticələnməyəcək*” deyib bunun xeyrə əlamət olmadığını düşünmüşdülər. Başqa bir məlumata görə isə Əliyə (r.ə) ilk beyət edən asilərin liderlərindən Malik əl-Əştər olmuşdu. Ənsar və mühacirin əksəriyyəti yeni xəlifəyə beyət etsə də səhabədən bəzi şəxslər Əli ibn Əbu Talibə (r.ə) beyət etməkdən imtina etmişdilər. Əbu Abdullah Muhəmməd ibn Məsləmə əl-Ənsari (r.ə), Əbü’l-Vəlid Həssan ibn Sabit əl-Xəzrəci (r.ə), Kə’b ibn Malik əl-Ənsari (r.ə), Məsləmə ibn Muxəllid əl-Ənsari, Əbu Səid Sə’d ibn Malik əl-Xudri əl-Xəzrəci (r.ə), Ne’man ibn Bəşir əl-Ənsari (r.ə), Zeyd ibn Sabit əl-Ənsari (r.ə), Rafi ibn Xudeyc əl-Ənsari (r.ə), Fudalə ibn Ubeyd əl-Ənsari (r.ə), Kə’b ibn Ucrə əl-Bələvi əl-Ənsari (r.ə), Abdullah ibn Ömər ibn Xəttab (r.ə), Sə’d ibn Əbi Vəqqas əl-Mühaciri (r.ə), Suheyb ibn Sənan ər-Rumi əl-Mühaciri (r.ə), Sələmə ibn Əmr ibn əl-Əkva əs-Suləmi (r.ə), Usamə ibn Zeyd ibn Harisə (r.ə), Əbu Əmr Qudamə ibn Məz’un əl-Cumahi (r.ə), Muğirə ibn Şu’bə (r.ə), Abdullah ibn Səlam (r.ə) həmin gün yeni xəlifəyə beyət etməmişdilər. Əli ibn Əbu Talibə (r.ə) beyət etməyənlər Mədinəni tərk edərək bəziləri Şam diyarına, bəziləri isə Məkkəyə getmişdilər. O cümlədən Mədinədəki Bəni-Uməyyə ailəsi mənsubları da hamılıqla Mədinəni tərk edib getmişdilər. Ne’man ibn Bəşir əl-Ənsari (r.ə) Osman ibn Əffanın (r.ə) qanlı köynəyini və xanımı Nailənin kəsilmiş barmaqlarını özü ilə götürüb Suriyaya, Müaviyə ibn Əbu Süfyanın

(r.ə) yanına getmişdi. Müaviyə (r.ə) ilə Osman (r.ə) əmi nəvəsi[86] idilər. Osmanın (r.ə) bu acı aiqbətinə, başına gələn müsibətə son dərəcə üzülüb kədərlənən Müaviyə (r.ə) onun qanlı köynəyi və xanımının kəsilmiş barmaqlarını məsciddə insanlara göstərərək onları Mədinədə baş verənlədən agah etmişdi. İnsanlar Osmanın (r.ə) başına gələnlərdən ötürü kədərlənərək ağlaşmışdılar.

Osman ibn Əffan (r.ə) qətlə yetirildiyi vaxt Ayşə (r.ə) və Peyğəmbərin (s.ə.v) digər xanımları, eləcə də əshabdan bir çoxu həcc ziyarəti üçün Məkkədə idilər. Onlar Məkkədən yola çıxıb Mədinəyə gələrkən yolda Osman ibn Əffanın (r.ə) qətlə yetirildiyi xəbərini almışdılar. Bu xəbər onlara çatandan sonra Mədinəyə getməyib geri, Məkkəyə qayıtmışdılar.

Əli ibn Əbu Talib (r.ə) xəlifə seçilməsinin səhəri günü məsciddə insanlara namaz qıldırmış və namazdan sonra minbərdən camaata xitab etmişdi. Onun xütbəsindən sonra Təlhə (r.ə), Zubeyr (r.ə), əshabdan digər bəzi şəxslər "*biz sənə Allahın təyin etdiyi hüdudları və onun əmrlərini bərqərar etmən şərti ilə beyət etmişdik. Bu insanlar müsəlmanların qanını tökmüşdürlər və mühakimə olunub layiq olduqları cəzaya çatdırılmaları vacibdir. Onlar əllərini nahaq qana batırmışdırlar və bununla da öz qanlarını mübah etmişdirlər*" deyərək ətrafında toplaşdıqları xəlifəyə müraciət etmişdilər. Əli ibn Əbu Talib (r.ə) onlara belə cavab vermişdi: "*Qardaşlarım! Sizin bildiklərinizi mən də bilirəm. Lakin görürsünüz ki, bu güruh bütün gücü ilə bu şəhərə hakimdir. Bir çox bədəvi də gəlib bunlara qoşulmuşdur. Hətta bir çoxunuzun köləsi belə sizin deyil, onların sözünə qulaq asır. Belə bir halda sizin məndən etdiyiniz tələbi gerçəkləşdirməyim mümkündürmü?"*. Bir müddət sonra Təlhə (r.ə) və Zubeyr (r.ə) də ətraflarındakı böyük bir dəstə ilə Mədinədən çıxıb Məkkəyə gəlmişdilər.

*Valilər Məsələsi*

Əli ibn Əbu Talib (r.ə) əyalətlərə yeni valilərin təyin olunmasının zəruriliyini düşünmüşdü. O, ilk növbədə Misir, Kufə, Bəsrə və Dəməşq valilərini vəzifələrindən azad edərək yeniləri ilə əvvəz etmək istəmişdi. Çünki Osmanı (r.ə) qətlə yetirən asilər misirli, kufəli və bəsrəli idilər. Bu şəhərlərə hakim olacağı təqdirdə asilərin öhdəsindən daha asan gələcəyini düşünən Əli (r.ə) Şam valisi Müaviyəni (r.ə) də icraatlarını çoxdan bəri xoşlamadığı üçün vəzifəsindən azad etmək istəmişdi. Onun bu niyyətindən xəbərdar olan Muğirə ibn Şu'bə (r.ə) xəlifəyə "*sən valiləri dəyişmə, əvvəlcə onlara məktub yazaraq sənə itaət etmələrini istə və cavablarını gözlə. Əgər sənə beyət və itatə etsələr ondan son-*

[86] Uməyyə > Əbü'l-As > Əffan > Osman (r.ə); Uməyyə > Hərb > Əbu Süfyan > Müaviyə (r.ə).

*ra onlardan istədiyini dəyişdirərsən, istədiyini isə öz yerində qoyarsan*" deyə məsləhət vermişdi. Lakin xəlifənin onun öyüdünə əhəmiyyət vermədiyini görüb Təlhə (r.ə) və Zubeyrin (r.ə) ardınca o, da Məkkəyə yollanmışdı.

Əli ibn Əbu Talib (r.ə) Muğirənin (r.ə) məsləhətini qəbul etməsə də bu barədə əmisi oğlu Abdullah ibn Abbasla (r.ə) məsləhətləşməyə ehtiyac duymuşdu. İbn Abbas (r.ə) da ona eyni şeyi məsləhət görüb hakimiyyətini möhkəmləndirənə qədər ələlxüsus Müaviyəyə (r.ə) toxunmamasını bildirmiş, ona belə demişdi:

- *Müaviyənin (r.ə) yerinə başqasını təyin edəcəyin təqdirdə Osmanın (r.ə) qisasını almanı səndən tələb edəcəyindən qorxuram. Həm də Təlhə (r.ə) ilə Zubeyrin (r.ə) bu məsələdə sənin əleyhinə olmayacaqlarından əmin deyiləm.*

- *Mən belə fikirləşmirəm. Əksinə sən Şam diyarına get, səni oraya vali təyin edirəm.*

- *Səninlə qohum olduğum üçün Müaviyənin (r.ə) adamları məni öldürə və ya həbs edə bilərlər. Sən Müaviyəyə (r.ə) məktub yaz, onun vali olaraq yenidən təyin etdiyi bildir, onu ümidləndir, mən sənin məktubunu ona çatdıraram.*

- *Vallahi, bu mümkün olan şey deyil.*

- *Ey möminlərin əmiri! Hərb hiylədən ibarətdir. Allah Rəsulu (s.ə.v) da belə buyurmuşdur. Əgər sən mənim dediyimi etsən bir müddət sonra onlar sənə beyət etməkdən başqa yollarının qalmadığına əmin olacaqlar.*

Mədinə basqınında iştirak etmiş bəzi iraqlılar xəlifəyə özləri ilə birlikdə İraqa getməyi təkidlə təklif etməkdə idilər. Abdullah ibn Abbas (r.ə) bu haqda da Əli ibn Əbu Talibə (r.ə) məsləhət verərək əsla belə bir şey etməməsini tövsiyə etmişdi. Lakin Əli ibn Əbu Talib (r.ə) xilafətin paytaxtını Mədinədən Kufəyə köçürmək qərarına gəlmişdi.

Hicri 36-cı ilin (iyun 656-iyun 657) əvvəllərində Əli ibn Əbu Talib (r.ə) Yəmən, Bəsrə, Kufə, Misir və Şam diyarına yeni valilər təyin etmişdi. O, əmisi oğlu Ubeydullah ibn Abbası (r.ə) Yəmən, Səmurə ibn Cundəbi (r.ə) Bəsrə, Umarə ibn Şihabı Kufə, Qeys ibn Sə'd ibn Ubadəni Misir, Səhl ibn Huneyfi (r.ə) isə Suriya valiliyinə təyin etmişdi.

Səhl ibn Huneyf Şam diyarına yaxınlaşarkən Təbuk civarında Müaviyənin (r.ə) ordusuna mənsub süvarilərlə qarşılaşmışdı. Süvarilər ondan "*Sən kimsən?*" deyə soruşanda Səhl ibn Huneyf cavab vermişdi:

- *Mən valiyəm.*

- *Haranın valisi?*

- *Şam valisi.*

- *Əgər səni Osman (r.ə) təyin edibsə xoş gəlmisən. Yox, başqası təyin edibsə, geri qayıt.*

- *Siz baş verənləri eşitməmisinizmi?*
- *Eşitmişik.*

Şamlı əsgərlərin bu şəkildə reaksiyası ilə qarşılaşan Səhlin geri qayıtmaqdan başqa çarəsi qalmamışdı. O, Mədinəyə qayıdaraq baş verənlər haqqında Əli ibn Əbu Talibə (r.ə) məlumat vermişdi. Misirlilər və bəsrəlilərin bir qismi yeni valilərini qəbul etsələr də bir qismi Əli ibn Əbu Talibin (r.ə) Osmanın (r.ə) qatillərini cəzalandırmadığı müddətcə ona beyət etməyəcəklərini və göndərdiyi valilərə də itaət etməyəcəklərini bildirmidilər. Umarə ibn Şihab Kufəyə gəlib çatanda Osmanın (r.ə) qətlə yetirilməsi səbəbiylə qəzəbli olan Təlhə ibn Xuveylid (r.ə) onunla sərt mübahisəyə girişmiş, öldürməklə hədələyib onu Kufədən qovmuşdu. Umarə də geri, Mədinəyə qayıtmalı olmuşdu. Əli ibn Əbu Talib (r.ə) Kufə və Şam valilərinə öz elçiləri ilə məktub göndərmişdi. Kufənin əvvəlki valisi Əbu Musa əl-Əş’əri (r.ə) xəlifəyə yazdığı cavab məktubunu Mədinədən gələn Mə’bəd əl-Əsləmi adlı elçi vasitəsilə xəlifəyə göndərərək kufəlilərin böyük əksəriyyətinin ona beyət etdiklərini, sadəcə kiçik bir qrupun Təlhə ibn Xuveylidlə (r.ə) həmfikir olduğunu bildirmişdi. Ubeydullah ibn Abbas (r.ə) vali təyin olunduğu Yəmənə gələrək vəzifəsinin icrasına başlamışdı. Osman ibn Əffanın (r.ə) Yəmənə təyin etdiyi vali Yə’la ibn Munyə beytülmala aid 600 dəvə və təqribən 600 min dirhəm nəğd pulu özü ilə götürərək Məkkəyə gəlmişdi. Beləcə xilafət torpaqlarında faktiki bölünmə baş vermiş və mərkəzi hakimiyyət sarsılmışdı.

Əli ibn Əbu Talib (r.ə) xəlifə seçiləndən sonra Müaviyəyə (r.ə) ard-arda çox sayıda məktub yazmışdı. Əli ibn Əbu Talibin (r.ə) xəlifəliyinin ilk üç ayında yazdığı bu məktubların heç birinə Müaviyədən (r.ə) cavab gəlməmişdi. Əli ibn Əbu Talibin (r.ə) Şama elçi olaraq göndərdiyi Səbra əl-Cuhəni Müaviyəyə (r.ə) yeni xəlifənin beyət və itaət tələbilə bağlı sözlərini çatdıranda Müaviyə (r.ə) Səbranın sözlərini eşitmirmiş kimi dayanmadan Osmanın (r.ə) nahaq yerə tökülmüş qanından və bunun qisasından bəhs edən şeerlər oxumuşdu. Nəhayət Müaviyə (r.ə) Əliyə (r.ə) yazdığı cavab məktubunu adamlarından Qubeysa əl-Əbsi adlı biri ilə Mədinəyə yollamışdı. Müaviyə (r.ə) Qubeysaya Mədinəyə çatanda insanların sıx toplaşdıqları yerlərə gedib hər kəsin görə bilməsi üçün məktubu əlində havaya qaldırmasını tapşırmışdı. Qubeysa Əli ibn Əbu Talibin (r.ə) yanına daxil olanda ilk əvvəl ondan həyatının təhlükəsizliyi üçün təminat istəmişdi. Xəlifənin elçiyə zaval olmadığını söyləyib ona aman verməsindən sonra elçi məktubu xəlifəyə təqdim etmişdi. Məktub boş idi, orada heç nə yazılmamışdı. Müaviyə (r.ə) sadəcə məktubun mədinəlilər tərəfindən görülməsini istəmişdi. Bununla o, yeni xəlifəyə beyət və itaət etmək fikrində olmadığı is-

marıcını mədinəlilərə çatdırmışdı. Əli ibn Əbu Talib (r.ə) açdığı məktubda həç bir şey yazılmadığını görüb Müaviyənin (r.ə) elçisinə "*gəldiyin yerdən nə xəbər gətirmisən?*" deyə sual vermiş, elçi isə ona belə cavab vermişdi:

- *Mən qisasdan başqa heç bir tələbləri olmayan bir camaatın yanından gəlirəm. Onların hamısı Osmanın (r.ə) qatillərindən intiqam almanı tələb edirlər. Mən Osmanın (r.ə) qanlı köynəyinə baxıb göz yaşı tökən 70 min adamın yanından gəlirəm.*

- *Osmanın (r.ə) qətlinə görə məni təqsirkar bilirlər? Mən Osmanı (r.ə) bacardığım qədər qorumadımmı? Osmanın qanı Allahın iradəsi xaricində axmamışdır. Allahın murad etdiyi şey isə mütləq yerinə yetər. Allahım! Mən Osmanın (r.ə) qanı ilə heç bir əlaqəm olmadığını, bu işdən uzaq olduğumu sənə ərz edirəm.*

Müaviyənin (r.ə) elçisi gətirdiyi məktubu xəlifəyə verib onun yanından çıxdığı vaxt Əli ibn Əbu Talibin (r.ə) ordusundakı xəvariclərin hücumuna uğramış, lakin çətinliklə də olsa canını onların əlindən qurtarmışdı. Onlar "*köpəyin göndərdiyi bu köpək burada nə gəzir? dərhal öldürün onu*" deyərək Qubeysaya hücum çəkmişdilər. Lakin Qubeysanın yaxınları olan Mudar və Qeys qəbiləsindən bir neçə adam onu müdafiə edərək uzaqlaşıb getməsinə kömək etmişdilər.

Əli ibn Əbu Talib (r.ə) Müaviyənin (r.ə) elçisini dinlədikdən sonra bu işin silahsız həll olunmayacağına qərar verdi və hərbi hazırlıqlara başladı. Kufə canişini Əbu Musa əl-Əş'əriyə (r.ə) məktub yazaraq ona kufəliləri səfərbər etmək əmrini verdi. Yolda kufəlilərdən ibarət yardımçı qüvvələrlə birləşəndən sonra Şam diyarına yürüş edəcəkdi. Xəlifə mədinəliləri də Şam səfərində iştirak etmək üçün təşviq etsə də onların əksəriyyəti bu hərbi səfərdə iştirak etməmişdilər. Əli ibn Əbu Talib (r.ə) Abdullah ibn Ömər ibn Xəttabla (r.ə) danışaraq onun özü ilə birlikdə bu səfərdə iştirak etməsini istəmiş, Abdullah ibn Ömər (r.ə) isə mədinəlilərin iştirak etmədikləri bir səfərə çıxmaq istəmədiyini bildirmişdi. Daha sonra Abdullah ibn Ömər (r.ə) Mədinəni tərk edərək Məkkəyə getmişdi. Xəlifənin oğlu Həsən (r.ə) bu hərbi səfərin müsəlmanların bir-birinin qanını tökməsi ilə nəticələnib parçalanmanı daha da dərinləşdiəcəyini söyləyərək atasını bu fikirdən daşındırmağa çalışsa da buna müvəffəq ola bilməmişdi. Xəlifə əmisi oğlu Qəsəm ibn Abbası Mədinədə öz yerinə vəkil təyin edərək ordusu ilə yola çıxmağa hazırlaşarkən aldığı bir xəbər onu Suriyaya yürüş fikrindən daşınmağa məcbur etmişdi. Ayşə (r.ə), Təlhə (r.ə), Zubeyr (r.ə) və mühacirdən digər bəzi insanların liderlik etdiyi ordu Məkkədən Bəsrəyə gedərək şəhər ətrafında mövqe tutmuşdu.

*Cəməl Döyüşü*

Osman ibn Əffan (r.ə) qətlə yetirildiyi vaxt Ayşə (r.ə) və Peyğəmbərin (s.ə.v) digər xanımları, eləcə də əshabdan bir çox insan həcc ziyarəti üçün Məkkədə idilər. Onlar Məkkədən yola çıxıb Mədinəyə gələrkən yolda Osman ibn Əffanın (r.ə) qətlə yetirildiyi xəbərini almışdılar. Bu xəbər onlara çatandan sonra Mədinəyə getməyib geri, Məkkəyə qayıtmışdılar. Mədinədəki səhabə və tabiundan bir çoxu da Məkkəyə getmişdilər. Osmanın (r.ə) Bəsrə valisi Abdullah ibn Amir (r.ə) Məkkəyə gəlmişdi. Osmanın (r.ə) dövründə Yəmən valisi olmuş Yə'la ibn Munyə də beytülmala məxsus 600 dəvə və 600 min dirhəm nəğd pulu özü ilə götürərək Məkkəyə gəlmişdi. Onlar Məkkədə nə edəcəkləri barədə məsləhətləşərkən möminlərin anası Ayşəyə (r.ə) müraciət etmiş, o, da onlara qiyamçıların haram bir ayda, haram bölgə olan Mədinədə, Allah Rəsulunun (s.ə.v) qonşuluğunu heçə sayaraq möminlərin əmirinin qanının tökülməsinin, beytülmalın talan edilməsinin əsla bağışlana bilinməyəcəyini, qatillərin mühakimə edilərək layiq olduqları cəzaya çatdırılmasının vacib olduğunu bildirmişdi. Məkkədə toplaşmış camaatın bir qismi Şam diyarına gedərək orada Müaviyə (r.ə) ilə həmrəy olaraq çıxış etməyi, bir qismi camaat halında Mədinəyə gedib Əli ibn Əbu Talibdən (r.ə) qatilləri cəzalandırmasını tələb etməyi, digər bir qismi isə Bəsrəyə getməyi təklif etmişdi. Bəsrədə Osmanın (r.ə) qətlə yetirilməsi səbəbiylə qiyamçılardan qisas almaq əzmində olan böyük bir camaat var idi. Buna görə də Məkkədəki camaat Bəsrəyə getmək qərarı üzərində ittifaq etdilər. Allah Rəsulunun (s.ə.v) zövcələrindən Ayşə (r.ə) və Həfsa (r.ə) onlarla birlikdə Bəsrəyə getmək niyyətində idilər. Yə'la ibn Munyə Yəməndən gətirdiyi 600 dəvə və 600 min dirhəmi ordunun təchizatı üçün vermişdi. Abdullah ibn Amir (r.ə) də ordunun təchizatı üçün xeyli vəsait sərf etmişdi. Məkkəli və mədinəlilərdən ibarət 900-ü süvari, 3000 döyüşçü Məkkədən Bəsrəyə getmək üçün hazır vəziyyətə gətirilmişdi. Peyğəmbərin (s.ə.v) digər zövcələrinin Mədinədən başqa bir yerə getməyəcəklərini bildirmələrindən və Abdullah ibn Ömərin (r.ə) bacısı Həfsa bint Öməri (r.ə) Bəsrəyə getmək fikrindən daşındırmasından sonra Məkkədəki müsəlman camaatı başlarında Ayşə (r.ə), Təlhə (r.ə) və Zubeyr (r.ə) olaraq Bəsrəyə doğru yola çıxmışdı. Ayşə (r.ə) bütün səfər boyu dəvəsinin belinə qoyulmuş kəcavədə səyahət etmişdi. Orduya namazları Abdullah ibn Zubeyr (r.ə) qıldırmaqda idi. Abdullah ibn Abbasın (r.ə) anası bu vaxt Məkkədə idi. O, muzda bir qasid tutaraq baş verənlərdən Əli ibn Əbu Talibi (r.ə) agah etmişdi. Əli (r.ə) Ayşə (r.ə), Təlhə (r.ə) və Zubeyrin (r.ə) ətrafındakı adamlar haqqında "*onlar mənə əl qaldırmadıqca mən onlara əl qaldırmayacam*" deyib bu dəstə ilə üz-üzə gəlmək niyyətində olmadığını bildirmiş və onların Mədinəyə

deyil, İraqa getmələrinə sevinmişdi. Xəlifə İraqda öz tərəfdarlarının çox olması səbəbiylə Məkkədən çıxan ordunun iraqlıların etiraz və iradları qarşısında çözülüb dağılacağını düşünürdü. Lakin Abdullah ibn Abbas (r.ə) onunla eyni fikirdə deyildi. O, xəlifəni Məkkədən çıxmış ordunun İraqda daha da qüvvətlənə biləcəyi barədə xəbərdar etmişdi. Çünki bu orduda səhabədən olan insanlar var idi. Onların iraqlı müsəlmanları Osmanın (r.ə) nahaq tökülmüş qanının qisasını almağa çağıracaqları təqdirdə bir çox insanın bu haqlı dəvətə icabət edəcəkləri aşkar idi. Çünki əyalətlərdəki müsəlmanlar Mədinədə tam olaraq nə baş verdiyi haqda məlumat və fikir sahibi deyildilər. Əyalətlərdəki bir çox insan Osman ibn Əffanın (r.ə) bir dəstə qiyamçı fitnəkar tərəfindən qətlə yetirildiyini bilmirdi. İbn Abbasın (r.ə) bu sözlərindən sonra Əli (r.ə) də ordusu ilə Şam diyarından əvvəl İraqa getmək qərarına gəlmişdi. Ayşə (r.ə), Zubeyr (r.ə) və Təlhənin (r.ə) başçılıq etdikləri ordu bu vaxt artıq Bəsrəyə yaxınlaşmaqda idi. Ordu Bəsrə yaxınlığındakı əl-Həfir adlı yerdə düşərgə salandan sonra Bəsrənin əvvəlki valisi Abdullah ibn Amir (r.ə) möminlərin anası Ayşəyə (r.ə) özünün əvvəlcə Bəsrəyə gedib oradakı vəziyyətdən hali olmasında və Bəsrənin nüfuzlu şəxsləri ilə görüşüb danışmasında fayda olduğunu söyləmişdi. Ayşə (r.ə) onun bu təşəbbüsünə müsbət cavab vermiş, yazdığı bir neçə məktubu Abdullah ibn Amirə (r.ə) verərək onu Bəsrəyə göndərmişdi. Abdullah ibn Amir (r.ə) Bəsrəyə gəlib Əhnəf ibn Qeys (r.ə), Səbrə ibn Şeyman (r.ə) kimi şəhərin nüfuzlu şəxsləri ilə görüşərək Ayşənin (r.ə) məktublarını onlara çatdırmışdı. Əhnəf ibn Qeys (r.ə) nə möminlərin anası Ayşəyə (r.ə), nə də Rəsulullahın (r.ə) əmisi oğlu və xəlifəsi Əliyə (r.ə) qarşı heç bir hərəkət etməyəcəyini bildirərək hər iki tərəfin çağırışına mənfi cavab vermişdi. Bəsrədəki əmirlərdən Əbu Abdullah Osman ibn Huneyf ibn Vahib əl-Ənsari (r.ə) ordunun əl-Həfirdə qərar tutduğunu öyrənib məsələni araşdırmaq qərarına gəlmişdi. O, İmran ibn Husayn və Əbü'l-Əsvəd əd-Duəli adlı iki adamını əl-Həfirdəki düşərgəyə göndərmişdi. Bu iki şəxs əl-Həfirə gələrək Ayşə bint Əbu Bəkrlə (r.ə) görüşmüş və Osman ibn Huneyfin (r.ə) bu səfərin məqsədini öyrənmək istədiyini bildirmiş, nədən ötürü bu səfər barədə əvvəlcədən xəbər göndərmədiklərini soruşmuşdular. Möminlərin anası Ayşə (r.ə) onlara belə cavab vermişdi:

- *"Vallahi, bir ananın övladlarına bu haqda xəbər göndərməsinə lüzum yoxdur, çünki siz özünüz hərc-mərcliyin baş alıb getdiyini, azğınlaşmış bədəvilərin Rəsulallahın (s.ə.v) haram elan etdiyi bölgəyə hücum etdiyini, bu xoşagəlməz hadisələrin baş verdiyi görürsünüz. Bununla onlar Allah və Rəsulunun (s.ə.v) lənətinə müstəhəqq olmuşdurlar. Onlar əlarində heç bir məqbul səbəb və dəlil olmadan müsəlmanların imamının qanını tökmüş, quldur kimi beytülmalı ta-*

*lan etmişdirlər. Onlar bütün bunları haram olan bir ayda törətmişdirlər. Mən də bütün bunlardan müsəlmanları agah etək üçün yanımdakı bu admalarla buraya gəlmişəm. Məqsədimiz gəldiyimiz bu yerin adamlarının baş verənlərə münasibətini öyrənmək və azğınları ishat etməyə çağırmaqdır. Allah öz kitabında buyurur ki: "Onların gizli söhbətlərinin çoxunda xeyir yoxdur" (Nisa 114). Bax bu ayəni sizə xatırlatmaq üçün gəlmişəm. Bu ayə bizim yaxşılığı əmr edib, münkərdən çəkindirmək məqsədində olduğumuzun dəlilidir".*

İmranla Əbü'l-Əsvəd Zubeyr ibn Əvvamın (r.ə) yanına gedərək ondan gəlişinin məqsədini soruşanda Zubery (r.ə) "*Osmanın (r.ə) qanının yerdə qalmaması, qatillərinin cəzalandırılması üçün gəlmişəm*" deyə cavab vermişdi. Onların "*Bəs niyə Əliyə (r.ə) beyət etdin?*" sualına Zubeyr (r.ə) "*qılınc boynuma dirənmişkən başqa nə edə bilərdim? Bundan başqa mən Osmanın (r.ə) qatillərinin cəzalandırılacağı şərti ilə beyət etmişəm*" deyərək cavab vermişdi. Təlhə (r.ə) ilə görüşəndə ondan da eyni cavabı eşitmişdilər. İmranla Əbü'l-Əsvəd Bəsrəyə qayıdıb hər şeyi olduğu kimi Osman ibn Huneyfə (r.ə) çatdıranda o, çıxılmaz bir vəziyyətlə qarşı-qarşıya olduğunu anlayaraq bu iki şəxsdən nə edəcəyinə dair məsləhət etmələrini istəmişdi. Əbü'l-Əsvəd silahlanaraq əl-Həfirdəki orduya qarşı çıxmağı və onları geri qayıtmağa məcbur etməyi təklif etsə də İmran "*bu işlərə qarışmayaraq bir kənara çəkil, mən belə edəcəyəm*" deyə cavab vermişdi. Osman ibn Huneyf (r.ə) "*xeyr, mən möminlərin əmiri buraya gələnə qədər onların şəhərə girmələrinə mane olacağam*" deyib öz adamlarına səfərbər olmağı əmr etmişdi. Abdullah ibn Amir (r.ə) Osman ibn Huneyflə (r.ə) görüşərək bu işdən əl çəkməyi, Əli ibn Əbu Talibdən (r.ə) gələcək əmri gözləməyi tövsiyə etmişdi. Lakin Osman (r.ə) Bəsrə məscidinə toplanmış əhaliyə xitab edərək onları silahlanmağa və əl-Həfirə tərəf getməyə təşviq etmişdi. Onun bu çağırışı bəsrəlilər arasında çaxnaşma və ziddiyyətlərin meydana çıxmasına səbəb olmuşdu. Əsvəd ibn Səri' əs-Sə'di adlı bir şəxs məsciddəki camaata "*əl-Həfirdəkilər bizim Osman ibn Əffanın (r.ə) qatilləri olduğumuzu zənn etmirlər. Əksinə onlar Osmanın qatillərinin tapılıb cəzalandırılması üçün bizdən yardım istəmək üçün buraya gəliblər*" deyəndən sonra bəsrəlilərin böyük əksəriyyəti Osman ibn Huneyfin (r.ə) çağırışına əməl etməmişdilər. Hətta bir qrup bəsrəli silahlanaraq şəhəri tərk etmiş və əl-Həfirdəki orduya qatılmışdı. Ayşənin (r.ə) yanındakı döyüşçülər əl-Həfirdən çıxıb Bəsrəyə daha yaxın olan Mirbəd adlanan yerə gəlib mövqe tutmuşdular. Osman ibn Huneyf əl-Ənsari (r.ə) öz adamları ilə Bəsrədən çıxıb Mirbədə tərəf irəliləmiş və iki ordu üz-üzə dayanmışdı. İki tərəfin əsgərləri bir-birini batil tərəfdə olmaqla ittiham edib təhqiramiz sözlər söyləmişdilər. Osmanın (r.ə) əsgərləri qarşı tərəfə ox ataraq

döyüşə başlamaq istəsələr də Ayşə (r.ə) öz tərəfindəki əsgərlərə silaha əl atmayıb onalar cavab verməməyi tapşırmışdı. Təlhə (r.ə) və Zubeyr (r.ə) Osman ibn Huneyfin (r.ə) əsgərlərinə səslənərək məqsədlərinin heç kimə zərər vurmaq olmadığını, xəlifənin qatillərinin cəzalandırılmasından başqa bir məqsəd güdmədiklərini söyləmişdilər. Qarşı tərəfdən bir adam önə çıxaraq: "*Bunlar həmin o adamlardır ki, əvvəlcə Osmana (r.ə) vəfasızlıq edib batili əmr etdilər. İndi isə Əliyə (r.ə) beyət etdikləri halda insanları qatillərdən qisas almağa çağırır, fitnəni qızışdırıb, yaranı deşməyə çalışırlar*" deməsindən sonra gur səsi, xitabət və bəlağəti ilə tanınan möminlərin anası Ayşə (r.ə) kəcavəsinin içindən hər iki ordunun əsgərlərinə belə səslənmişdi:

- *Bir vaxtlar müsəlmanlardan bəziləri Osmanın (r.ə) valilərindən şikayətlənir, Mədinədə bizləri də ziyarət edərək bu valilərin icraatları barədə danışırdılar. Biz də baş verənləri araşdırıb dəyərləndirir, Osmanın (r.ə) bədxahlıqdan uzaq olduğunu, təmiz və vəfalı olduğunu söyləyir, bununla belə ona haqqı tövsiyə edirdik. Digər tərəfdən bu xəbərləri gətirən adamların yalançı, qəddar və insafsız olduqları üzə çıxmışdı. Onlar dilləri ilə bir şeyi söyləyir, qəlblərindəkini isə gizləyirdilər. Lakin vaxt keçdikcə onlar gücləndilər, çoxaldılar və nəhayət gəlib Osmanın (r.ə) haram olan qanını halal bilərək öz evində öldürdülər. Onlar bunu haram olan bir ayda, haram olan bir bəldədə və heç bir keçərli səbəbləri, dəlilləri olmadan etdilər. İndi sizin edəcəyiniz bir şey varsa o da qatillərin cəzalandırılması üçün Osmanın (r.ə) qanının qisasını tələb etmək, bu iş üçün Allahın kitabındakı hökmləri tətbiq etməkdir. O kitabda buyurulur ki: "Kitabdan özlərinə bir pay verilmiş kimsələri görmürsənmi? Onlar öz aralarında hökm vermək üçün Allahın kitabına (istinad etməyə) dəvət olunurlar. Sonra onların bir qismi bundan üz döndərir. Onlar həmişə dönüklük edəndirlər, haqdan üz çevirəndirlər"* (Ali-İmran 23).

Ayşənin (r.ə) bu xitabı Osman ibn Huneyfin (r.ə) əsgərlərinə təsir etmiş, onun ordusundakı əsgərlərin böyük bir hissəsi ayrılaraq Ayşənin (r.ə) yanındakı əsgərlərə qoşulmuşdular. Osman ibn Huneyfin (r.ə) əsgərlərindən bir gənc qarşı tərəfdəki orduya gələrək Ayşəyə (r.ə) belə səslənmişdi: "*Ey möminlərin anası! Öz evində oturman Osmanın (r.ə) qisasının tələb etməkdən sənin üçün daha xeyrlidir, çünki Allah öz kitabında siz Peyğəmbər (s.ə.v) zövcələrinə bunu əmr etməkdədir. Əgər səni buraya gəlməyə məcbur ediblərsə, biz geri qayıtman üçün sənə kömək edə bilərik. Siz, ey Təlhə (r.ə) və Zubeyr (r.ə), öz xanımlarınızı evinizdə qoyduğunuz halda möminlərin anasını buralara qədər gətirmişsiziniz*" deyərək onları qınamışdı. Həmin gün tərəflər arasında döyüş olmasa da gecə vaxtı Daru'r-Rizq adlanan yerdə kimin tərəfindən atıldığı bilinməyən oxların

əsgərləri yaralaması səbəbiylə iki tərəf arasında döyüş qızışmış və ertəsi gün günortaya qədər davam etmişdi. Osman ibn Huneyf (r.ə) çox sayıda itgi verərək geri çəkilməyə məcbur olmuş, döyüş davam edəcəyi təqdirdə hər iki tərəfdən də çox sayıda ölənin olacağını görərək döyüşü dayandırmağı tələb etmişdi. Qarşı tərəfdəki ordu onun bu istəyini qəbul edərək aralarında bir sülh bağlanmasını təklif etmişdilər. Bu sülh əhdnaməsinə görə Mədinəyə mötəbər bir adam göndərilərək Təlhə (r.ə) ilə Zubeyrin (r.ə) Əli ibn Əbu Talibə (r.ə) hansı şəraitdə və hansı şərtlərlə beyət etdikləri araşdırılıb öyrəniləcəkdi. Əgər onlara zorla beyət etdirilibsə Osman ibn Huneyf (r.ə) öz adamları ilə Bəsrəni tərk edəcək, əks təqdirdə Təlhə (r.ə) və Zubeyr (r.ə) Bəsrədən uzaqlaşıb gəldikləri yerə geri qayıdacaqdılar. Razılaşıldığı kimi Bəsrə qazısı olan Kə'b ibn Suvər əl-Əzdi (r.ə) Bəsrədən Mədinəyə gedərək bu məsələni yerində araşdıracaqdı. Kə'b ibn Suvər (r.ə) Mədinəyə gəlib cümə günü namazdan sonra camaata xitab edərək Təlhə (r.ə) və Zubeyrin (r.ə) Əli ibn Əbu Talibə (r.ə) beyət üçün məcbur edilib edilmədiyini soruşmuşdu. Məsciddəkilər susmuşdular. Sadəcə Usamə ibn Zeyd (r.ə) onların xəlifəyə məcburən beyət etdiklərini söyləmişdi. Usamənin (r.ə) bu sözündən sonra Təmmam ibn Abbas və Səhl ibn Huneyf Usamənin (r.ə) üstünə hücum çəkmişdilər. Suheyb ibn Sənan (r.ə), Əbu Əyyub əl-Ənsari (r.ə) və Muhəmməd ibn Məsləmə (r.ə) Usaməni (r.ə) zorla onların əlindən alaraq bunun doğru olduğunu və düz söz söylədiyi üçün bir adamı öldürə bilməyəcəklərini hayqırmışdılar. Buna baxmayaraq onlar Usaməni (r.ə) susmadığı üçün məzəmmət etmişdilər. Əli ibn Əbu Talib (r.ə) Osman ibn Huneyfə (r.ə) məktub yazaraq Təlhə (r.ə) ilə Zubeyri (r.ə) qiyamçıların deyil, mədinəlilərin məcbur etdiyini, lakin indi bunu söyləməkdə məqsədlərnin nə olduğunun anlaşılmadığını, əgər mövzu onun xəlifəliyinin qanuniliyi ilə əlaqəlidirsə bunun Təlhə (r.ə) və Zubeyrin (r.ə) beyəti olmadan da gerçəkləşmiş olduğunu, başqa bir niyyətləri varsa bunu izah etmələrini qeyd etmişdi. Kə'b ibn Suvər əl-Əzdi xəlifənin məktubunu Osman ibn Huneyfə (r.ə) çatdırmış, Osman (r.ə) məktubu oxuyub "*bu bizim maraqlandığımız bir mövzu deyildir*" deyə cavab vermişdi. Bu hadisədən bir müddət sonra Osman ibn Huneyf (r.ə) məcburən Bəsrəni tərk etməli olmuşdu. Hicri 36-cı il rəbiyələvvəl ayının 24-də (18 sentyabr 656) Ayşə (r.ə), Zubeyr (r.ə) və Təlhənin (r.ə) tərəfdarları tamamilə Bəsrəyə hakim olmuşdular. Onların əsgərləri Osman ibn Əffanın (r.ə) qətli ilə nəticələnmiş Mədinə basqınında iştirak etmiş və iştirak edənlərə yardım etmiş yetmiş nəfəri müəyyən edərək edam etmişdilər. Bəsrəli qiyamçıların liderlərindən Hurqus ibn Zuheyr əs-Sə'di qaçıb mənsub olduğu Bəni-Sə'd qəbiləsinə sığınmış və canını qurtara bilmişdi. Təlhə (r.ə) və Zubeyr (r.ə) Hurqusu təslim etmələri üzün

onlara təzyiq göstərsələr də Bəni-Sə'd Hurqus ibn Zuheyri təslim etməmiş, bu səbəbdən tərəflər arasında silahlı toqquşma meydana gəlmişdi.

Əli ibn Əbu Talib (r.ə) Şam səfəri üçün hazırladığı ordu ilə İraqa getmək qərarına gəlmiş və Mədinə əhalisinə bu səfərdə iştirak etmələri üçün çağırış etmişdi. Lakin mədinəlilərin əksəriyyəti Ayşə (r.ə), Təlhə (r.ə) və Zubeyrin (r.ə) əsgərləri ilə qarşı-qarşıya gələcəklərini bildikləri üçün bu səfərdə iştirak etmək istəməmişdilər. Bədr əshabından xəlifənin ordusuna sadəcə 6 səhabə qatılmışdı. Əli ibn Əbu Talib (r.ə) hazırladığı ordu ilə İraqa tərəf yola çıxmışdı. Rəbzəyə gəlib çatanda Abdullah ibn Səlam (r.ə) orduya yetişərək Əli ibn Əbu Talibin (r.ə) atının yüyənindən tutaraq "*ey möminlərin əmiri! Mədinəni tərk edib getmə, əgər sən bu şəhərdən getsən artıq bir daha heç vaxt müsəlmanların iqtidarı bu şəhərdə özün yer tapmaz*" desə də ordudakı bəziləri onu məzəmmət etmişdilər. Əli ibn Əbu Talib (r.ə) Abdullah ibn Səlama (r.ə) tənə edənlərə "*onu rahat buraxın, o, Allah Rəsulunun (r.ə) əshabındandır*" deyərək yoluna davam etmişdi. Oğlu Həsən (r.ə) də xəlifənin bu səfərdə orduya şəxsən özünün başçılıq etməsini istəmirdi. Bu haqda Əli ibn Əbu Talibə (r.ə) söyləyəndə xəlifə bu səfərə çıxmasının zəruriliyi haqqında oğluna danışmışdı. İraq yolunda ikən Əsəd və Təyy qəbilələrin nümayəndələri xəlifənin yanına gələrək ona rəğbətlərini bildirmiş və beyət etmişdilər. Onlardan bəziləri bu səfərdə iştirak etmək üçün orduya qoşulmuşdular. Əli ibn Əbu Talib (r.ə) Bəsrəyə yürüş edərkən kufəlilərin də onun ordusuna qoşulmalarını istəmiş və bu məqsədlə onlara məktub yazaraq Muhəmməd ibn Əbu Bəkr və Muhəmməd ibn Əbi Cə'fəri Kufəyə yollamışdı. Zi-Qar adlanan yerə çatanda Bəsrədən gələn Osman ibn Huneyf (r.ə) xəlifənin yanına gələrək uğradığı məşəqqətlər haqqında ona danışmışdı. Xəlifə Zi-Qarda ordunun yürüşünə fasilə verdi və Kufəyə göndərdiyi elçilərin gətirəcəkləri cavabı gözləməyə başladı. Zi-Qarda ikən Kufədən gələn Amir ibn Matar əş-Şeybani adlı bir şəxs xəlifənin yanına gedərək onunla danışmışdı. Xəlifənin Kufə valisi Əbu Musa əl-Əş'ərinin (r.ə) nə etmək niyyətində olduğunu soruşanda Amir "*vallahi, Əbu Musa (r.ə) sülhdən başqa heç bir şey istəmir. Hətta sən onunla vuruşsan belə Əbu Musa (r.ə) səninlə vuruşmağa təşəbbüs etməyəcəkdir*" deyə cavab vermişdi. Xəlifə isə cavabında: "*Allah and olsun ki, mən də sülhdən başqa heç nə istəmirəm, sülh və əmin-amanlığın bir an əvvəl bərqərar olmasını diləyirəm*" demişdi. Xəlifənin elçiləri Kufəyə gələrək Əlinin (r.ə) kufəlilərə yazdığı məktubu məsciddə camaata oxumuş, xəlifənin onları köməyə çağırdığını bildirmişdilər. Əbu Musa (r.ə) bu səfərdə iştirak edib etməmək barədə məsləhət üçün yanına gələn kufəlilərə "*bu səfərdə iştirak etməniz dünyanız üçün, evlərinizdə otumanız isə axirətiniz üçün daha xeyrlidi*" deyə cavab ver-

miş, bununla da müsəlmanların əldə silah üz-üzə dayanacaqları bu hadisədə iştirak etmək istəmədiyini bildirmişdi. Muhəmməd ibn Əbu Bəkr və Muhəmməd ibn Əbi Cə'fər Əbu Musanın (r.ə) bu sözlərindən xəbər tutanda onun yanına gəlmiş və valiyə sərt sözlər söyləyərək onu təhqir etmişdilər. Əbu Musa (r.ə) isə onlara "*Osmana (r.ə) etdiyimiz beyət, verdiyimiz söz mənim də, Əlinin (r.ə) də boyununda borc olaraq qalır, Osmanın (r.ə) qatilləri cəzalandırılmadıqları müddətcə biz heç kimlə vuruşa bilmərik*" deyə cavab vermişdi. Elçilərin Zi-Qara qayıdıb Əli ibn Əbu Talibə (r.ə) Kufədəki vəziyyət haqqında məlumat vermələrindən sonra xəlifə Malik əl-Əştər və Abdullah ibn Abbası (r.ə) Kufəyə göndərmişdi. Malik əl-Əştər  və Abdullah ibn Abbas (r.ə) Kufəyə gələrək Əbu Musa əl-Əş'əri (r.ə) ilə görüşmüş və ondan kufəliləri silahlanıb xəlifənin ordusuna qatılmaları üçün təşviq etməsini istəmişdilər. Kufə valisi Əbu Musa (r.ə) onların yanında məscidə toplaşmış kufəlilərə xitab edərək belə demişdi:

- *"Ey insanlar! Allah Rəsulunun (s.ə.v) əshabı Allahı və Elçisini onunla söhbət etməyənlərdən daha yaxşı tanıyırlar. Əmiriniz olaraq sizin mənim üzərimdə haqqınız var. Bu haqqı yerinə gətirmək üçün sizə nəsihət etmək mənim borcumdur. Həqiqət budur ki, Allahın bizim üstümüzdəki hökmü sarsılmamalıdır. Buna görə də Allahın hökmü məsələsini gözünüzdə kiçiltməyin. Allahın sizin üzərinizdəki haqqına təcavüz etməyə əsla cürət etməyin. Meydana gələn bu hadisələr son dərəcə pis və şiddətli bir fitnədir. Mən Peyğəmbərdən (s.ə.v) eşitmişəm ki, belə bir fitnə vaxtı yuxuda olan oyaqdan, oyaq olan oturandan, oturan ayaq üstə olandan, ayaq üstə olan atının belində olandan, atının belində olan isə atını çapandan daha xeyrlidir. Siz digər ərəblər kimi olmayın. Qılınclarınızı qınına, oxlarınızı sadağına qoyun, yayınızın ipini kəsin, zülmə məruz qalanları, məzlum olanları himayə edib qoruyun, ancaq bu yolla fitnənin kökü quruyar və aradan qalxar".*

Malik əl-Əştər və Abdullah ibn Abbas (r.ə) Əbu Musanı (r.ə) kufəliləri silahlandırıb səfərə yollamağa razı sala bilməyəcəklərini görüb geri, Zi-Qara qayıtmış və görüb eşitdiklərini xəlifəyə çatdırmışdılar. Əli ibn Əbu Talib (r.ə) bu dəfə Əmmar ibn Yasiri (r.ə) yanına çağıraraq onu təlimatlandırmış və "*indi get, fəsada uğratdıqlarını islah etməyə çalış*" deyərək onu öz oğlu Həsənlə (r.ə) birlikdə Kufəyə göndərmişdi. Əmmar ibn Yasir (r.ə) Ömər ibn Xəttabın (r.ə) dövründə Əbu Musa əl-Əş'əridən (r.ə) əvvəl Kufə valisi olmuşdu. Kufəlilərin çoxsaylı şikayətlərinə görə Ömər (r.ə) Əmmar ibn Yasiri (r.ə) Kufə valiliyindən azad etdərək yerinə Əbu Musanı (r.ə) təyin etmişdi. Həsən (r.ə) və Əmmar (r.ə) Kufəyə gəlib Əbu Musa (r.ə) ilə görüşəndə Əbu Musa (r.ə) Əmmara (r.ə) müraciət edərək "*yoxsa sən də Osmanı (r.ə) öldürən o fasiq və günahkarlar-*

*la birlikdə idin?*" deyə soruşmuş, Əmmar ibn Yasir (r.ə) də ona "*xeyr, mən əsla bu işin içində olmamışam, lakin orada baş verənlər məni elə də maraqlandırmayıb*" deyə cavab vermişdi. Əbu Musa (r.ə) ilə Əmmar (r.ə) arasındakı mübahisənin qızışmaması üçün müdaxilə edən Həsən ibn Əli (r.ə) "*nə üçün insanların bizə yardım etməsinə mane olursan?*" deyə sual vermişdi. Əbu Musa (r.ə) Peyğəmbərin (s.ə.v) nəvəsinə "*Atam, anam sənə fəda olsun ey qardaşımın oğlu! Mən Allah Rəsulunun (s.ə.v)* "*elə bir fitnə qopacaq ki, həmin vaxt oturan ayaq üstə olandan, ayaq üstə olan yeriyəndən, yeriyən atının belində olandan daha xeyirli olacaq" dediyini eşitmişəm. Allah bizi bir-birimizə qardaş etmişdir, qanlarımızı və mallarımızı bir-birimiz üçün haram qılmışdır*" deyə cavab vermişdi. Əmmarın (r.ə) Əbu Musaya (r.ə) "*sən bununla ancaq özünü tərifləyirsən*" deməsi Əbu Musanın (r.ə) adamları ilə Əmmar (r.ə) arasında mübahisənin qızışmasına səbəb olmuşdu. Bu vaxt məsciddə Ayşənin (r.ə) Bəsrədə olub kufəliləri özünə yardıma çağırdığını bildirən məktubu oxunmuşdu. Bu məktubun oxunması ilə vəziyyət biraz da gərginləşmişdi. Əbu Musa (r.ə) camaata müraciət edərək insanları başqalarına deyil, özünə itaət etməyə çağırmış və onları sakitləşdirmişdi. Qə'qa ibn Əmr (r.ə) də kufəlilərə xitab edərək Əbu Musa (r.ə) ilə həmfikir olduğunu, Məkkə və Mədinədəki müsəlmanlarla həmrəy olub fitnədən uzaq durmalarını söyləyərək onları sülhə və sükunətə dəvət etmişdi. Həsən ibn Əli (r.ə) kufəlilərə xitabən belə demişdi:

- *"Ey insanlar! Möminlərin əmirinin çağırışına cavab verin. Qalxın, qardaşlarınızın yanına gedin və onları araşdırıb özünüz görün. Vallahi, bu işdə yubanmayanların aqibəti xeyrli olacaqdır. Bizim çağırışımızı dinləyin. Sizin də, bizim də imtahan edildiyimiz bu hadisədə bizə yardımçı olun. Möminlərin əmiri Əli (r.ə) sizə səslənərək deyir ki, "mənim bu səfərə zalım və ya məzlum olaraq çıxdığıma insanlar özləri qərar versinlər. Vallahi, Təlhə (r.ə) ilə Zubeyr (r.ə) mənə beyət edən ilk insanlar idilər. Məgər mən müsəlmanların malınımı qəsb etmişəm, yoxsa Allahın hökmlərini dəyişdirmişəm ki, indi mənə qarşı çıxırlar?" Buna görə də qalxın, gedin və insanlara yaxşılığı əmr edib onları pislikdən çəkindirin".*

Həsən ibn Əlinin (r.ə) xitabından sonra kufəlilərdən 9 min nəfər onunla birlikdə Zi-Qara getmək üçün hazırlaşmışdı. Bu adamların əksəriyyəti Kinanə, Təmim, Əsəd, Qeys, Əş'ər, Rübab, Muzeynə qəbilələrinə mənsub idilər və onlara Maku ibn Yəsar ər-Reynani başçılıq edirdi. Malik əl-Əştər bundan qısa müddət sonra yenidən Kufəyə gəlib Əbu Musanı (r.ə) məsciddə xalqa xitab edib sükunətə çağırarkən görmüş və ona qəzəblənmişdi. O, həmin axşam Əbu Musaya (r.ə) artıq Kufə valisi olmadığını və şəhəri tərk etmək məcburiyyətində

olduğunu bildirmişdi. Əbu Musanın (r.ə) "*bu gecəlik qalmağım üçün mənə izn verin*" deməsinə baxmayaraq Malik əl-Əştər onu zorla Kufədən çıxarmışdı. Qə'qa ibn Əmr (r.ə) də Bəni-Əbdiqeys oymağına mənsub bir neçə yüz süvari ilə Bəsrədən Zi-Qara gələrək Əli ibn Əbu Talibin (r.ə) ordusuna qoşulmuşdu. Lakin Qə'qa (r.ə) xəlifəyə buraya gəlib onun ordusuna qoşulmaqda məqsədinin möminlərin anası Ayşə (r.ə) və onun yanındakı insanlarla vuruşmaq deyil, əksinə müsəlmanlar arasında döyüşün olmaması və bu işin sülhlə nəticələnməsi üçün çalışmaq istəməsi olduğunu söyləmişdi. Əli ibn Əbu Talib (r.ə) onunla həmfikir olduğunu, bu işdə onun məsləhət və fikirlərini dinləyəcəyini söyləmişdi. Əli ibn Əbu Talib (r.ə) Qə'qanı (r.ə) Ayşə (r.ə), Təlhə (r.ə) və Zubeyrlə (r.ə) danışıb həm nə etmək istədiklərini öyrənmək, həm də onları ətraflarına toplanmış silahlı insanları tərxis edərək Mədinəyə qayıtmalarını təmin etmək üçün Bəsrəyə göndərmişdi. Qə'qa ibn Əmr (r.ə) Bəsrəyə gəlib əvvəlcə möminlərin anası Ayşə (r.ə) ilə danışmış və ona demişdi:

- *Anacan, öz şəhərini tərk edib buraya gəlməyə səni nə məcbur etdi?*

- *Oğlum, mənim buraya gəlməkdə yeganə məqsədim müsəlmanların arasındakı fitnəni aradan qaldırıb sülhü bərqərar etməkdir.*

Daha sonra Qə'qa ibn Əmr (r.ə) möminlərin anasına Təlhə (r.ə) və Zubeyrlə (r.ə) onun yanında danışmaq istədiyini söyləmiş və Ayşə (r.ə) onları yanına çağırmışdı. Qə'qa (r.ə) onlara "*möminlərin anası mənə məqsədinin müsəlmanlar arasında sülhü bərqərar edib fitnəni aradan qaldırmaq olduğunu söylədi, siz bu mövzuda ona itaət edəcəksinizmi?*" deyə sual vermiş, onların müsbət cavab verməsindən sonra Qə'qa "*bunu necə etməyi düşünürsünüz?*" deyə soruşmuşdu. Zubeyr (r.ə) "*hər şeydən əvvəl Osmanın qatillərinin cəzalandırılması lazımdır. Onların sərbəst buraxılması Qur'anın hökmünün tərk edilməsi deməkdir*" deyə cavab vermişdi. Qə'qa (r.ə) bunun haqlı bir tələb olduğunu, lakin bu tutulan yol və üsulla bunun mümkün olmayacağını, əksinə bunun daha çox qan tökülməsilə nəticələnəcəyini söyləmişdi. Ayşə (r.ə) "*bəs sənin fikrin nədir? Nə təklif edirsən?*" deyə soruşanda Qə'qa ibn Əmr (r.ə) belə cavab vermişdi:

- *Bu xəstəliyin əlacı insanları sülhə və sükunətə dəvət etməkdir. Əgər biz indi insanları sakitləşdirsək insanların həyəcanı sönər və bu fəlakət sona çatar. Möminlərin əmirinə beyət edib onun ətrafında birləşmək lazımdır. İndiki vəziyyətdə barışıq rəhmətin və mərufun müjdəçisidir. Lakin barışığa yanaşmayıb bundan uzaqlaşmaq şərrin və münkərin dəvətçisi olacaq. Bu da nəticədə hakimiyyətin və mülkün zavalına gətirib çıxaracaq. Gəlin Allahdan sülh, sükunət və salamatlıq diləyək ki, Allah da onu bizə ehsan etsin. Sizlər İslamda xeyrə və mərufa ilk addım atan insanlarsınız. Bu dəfə də belə edin. Nə olar*

*bəla və müsibətlərə tərəf addım atmayın, yoxsa başımıza bundan daha betər müsibətlərin gələcəyindən qorxuram. Heç kim işlərin bu yerə qədər gəlib çatacağını güman etməzdi. Bu nə şəxsi ədavət, nə də qəbilə, soy çəkişməsi deyil, ümməti fəlakətə aparan bir bəladır"*

Bu sözlərdən sonra Ayşə (r.ə), Təlhə (r.ə) və Zubeyr (r.ə) ona "*haqlısan ey Qə'qa (r.ə). Sən indi qalx Əlinin (r.ə) yanına get. Bizə dediklərinin eynisini ona da de. Əgər Əli (r.ə) də sənin bu sözlərini bizim kimi qəbul edərsə, o zaman bu iş sülhlə bitəcəkdir*" demişdilər. Qə'qanın (r.ə) gətirdiyi xəbər Əli ibn Əbu Talibi (r.ə) son dərəcə sevindirmiş və o, bu təklifi məmnuniyyətlə qəbul etdiyi bildirmişdi. Xəlifə Allaha həmd və səna etdikdən sonra ətrafındakı insanlara xitab edərək cahiliyyə dövrünün bəd xüsusiyyətlərindən və adətlərindən, İslamın gəlişilə insanların qovuşduğu xoşbəxtlikdən, Allahın müsəlmanlara bəxş etdiyi nemətlərdən, Rəsulullahdan (s.ə.v) sonra xilafətin necə ucaldığından söz açmış, lakin daha sonra bütün bunlara görə möminlərə həsəd aparan bədxahların və dünya malına həris olanların meydana çıxaraq cahiliyyəyə geri dönmək üçün addım atmalarından danışmışdı. Daha sonra "*Şübhəsiz Allah dilədiyini yerinə gətirər və arzu etdiyini gerçəkləşdirər. Mən sabah buradan sülh və əmin-amanlıqla çıxıb gedəcəyəm, siz də mənim ardımca gəlin*" deyərək xütbəsini bitirmişdi. Əli ibn Əbu Talibin (r.ə) ordusundakı Hicaz əhli, eləcə də Bəsrə və Kufədən olan müsəlmanlar buna sevinmişdilər. Lakin bu orduda Osmanın (r.ə) qətli ilə nəticələnmiş Mədinə basqınında iştirak edən iki mindən artıq adam vardı. Qə'qanın (r.ə) vasitəçiliyi ilə nail olunan sülh onları son dərəcə məyus etmişdi. Həmin günün gecəsi Əlbə' ibn Heysəm, Abdullah ibn Səba, Salim ibn Sə'ləbə əl-Qeysi, Şureyh ibn Əvfa, Xalid ibn Mülcəm və Malik əl-Əştər başda olmaqla onların liderləri toplaşaraq öz aralarında məşvərət etmişdilər. Məşvərətdə iştirak edənlər iki tərəf arasında sülhün bərqərar olmasının onlar üçün fəlakət demək olduğu qənaətini hasil etmişdilər. Ayşə (r.ə), Təlhə (r.ə), Zubeyr (r.ə) və Əli ibn Əbu Talibin (r.ə) bu işi sülh yolu ilə həll edəcəkləri təqdirdə görəcəkləri ilk işin Osmanın (r.ə) qatillərdən qisas almaq olacağına əmin idilər. Malik əl-Əştər demişdi: - "*Təlhə (r.ə) ilə Zubeyrin (r.ə) bizim haqqımızda nə düşündüyünü bilirik. Lakin Əlinin (r.ə) bizim haqqımızda nə düşündüyünü bu günə qədər öyrənə bilməmişik. Onun bizə qarşı tutacağı mövqe digər insanlara da təsir edəcəkdir. Əgər bunlar sülh üzərində birləşsələr bizim qanımızı tökmək barədə mütləq həmfikir olacaqlar. Gəlin Osmanın (r.ə) öhdəsindən gəldiyimiz kimi Əlinin (r.ə) də öhdəsindən gələk. O zaman elə bir qarışıqlıq düşər ki, Osmanın (r.ə) qətlinin yaratdığı fəsad bunun yanında heç nə olar"*.

Abdullah ibn Səba: - "*Zənn edirsən Əlini (r.ə) öldürmək Osmanı (r.ə) öldürmək qədər asan olacaq? Mədinədə Osmanı (r.ə) müdafiə edə biləcək beş yüz nəfər belə yox idi. İndi Əlinin (r.ə) ətrafında 10 mindən çox silahlı insan var".*

Əlbə' ibn Heysəm: - "*Gəlin Əlini (r.ə) tərk edib gedək. Təlhə (r.ə) və Zubeyri (r.ə) sülhə məcbur edən Əlinin (r.ə) adamlarının çoxluğudur. Biz onu tərk etsək qüvvəsi zəifləyər. Təlhə (r.ə) ilə Zubeyr (r.ə) də cəsarətlənib onunla vuruşarlar. Beləcə hər bir-birlərini yeyib bitirərlər və iki tərəf zəifləyər*".

Abdullah ibn Səba: - "*Onlar bizim çıxıb getməyimizə ancaq sevinərlər. Biz onların arasında olduğumuz müddəcə orduda yekdillik olmayacaq. Lakin biz onları tərk edib gedən kimi bizim əleyhimizə yekdilliklə birləşəcəklər*".

Xalid ibn Mülcəm: - "*Əlinin (r.ə) öldürülməsi fikrini mən də bəyənmədim. Bizim etməli olduğumuz iş ancaq atlarımızı və silahlarımızı daim hazır vəziyyətdə saxlayıb ilk fürsətdə ədavəti və müharibə alvunu qızışdırmaq olmalıdır. Bu işin sülhlə bitməsinə əsla imkan verməməliyik*".

Abdullah ibn Səba: - "*Sənin bu fikrini mən də bəyəndim*".

Digərləri də Xalid ibn Mülcəmin fikri ilə razılaşaraq sonrakı hərəkət planlarını müzakirə etmişdilər. Səhəri gün günorta vaxtı Əli ibn Əbu Talib (r.ə) ordusuna hərəkət əmri evrərək Bəsrəyə doğru yola çıxmış və əz-Zaviyə adlanan yerə gəlib çatanda fasilə vermişdi. Ayşə (r.ə), Təlhə (r.ə) və Zubeyr (r.ə) də ətrafındakı adamlarla Fərda adlanan yerə tərəf irəliləmişdilər. Hicri 36-cı il cəmaziyələvvəl ayının ortalarında (656-cı il dekabrın əvvələri) iki ordu Bəsrədən bir qədər kənarda, Ubeydullah ibn Ziyadın evinin yaxınlığında rastlaşıb bir-birinə qonşu olaraq düşərgə salmışdılar. Ayşə (r.ə) yanındakı bir neçə qadınla Bəsrədəki Huddan məscidi adlanan məsciddə gecələmiş, Əzd qəbiləsinə mənsub döyüşçülər həmin gecə Huddan məscidi ətrafında keşik çəkmişdilər. Əli ibn Əbu Talibin (r.ə) ordusu 20 min, Təlhə (r.ə) ilə Zubeyrin (r.ə) ordusu isə 30 min əsgərdən ibarət idi. Ordulara başçılıq edənlər görüşüb sülh üçün lazım olan şərtləri müəyyənləşdirəcəkdilər. Əli ibn Əbu Talib (r.ə) Abdullah ibn Abbası (r.ə) gecələmək üçün qarşı tərəfə, onlar da Təlhənin (r.ə) oğlu Muhəmmədi Əlinin (r.ə) düşərgəsinə göndərmişdilər. Hər iki tərəfin nümayəndəsi Qə'qaya (r.ə) söylədikləri şərtlərə uyğun olaraq sülh əqdi bağlayacaqlarına dair əhdlərini təkrarlamışdılar. Abdullah ibn Səba və silahdaşları anlaşdıqları kimi həmin gecə ordular sübh namazı üçün oyanmamışdan əvvəl Təlhə (r.ə) və Zubeyrin (r.ə) ordusundakı bəsrəli əsgərlərə qəfil basqın edərək onlardan öldürə bildikləri qədərini öldürdülər. Bəsrəlilərin arasında çaxnaşma və təşviş başlamışdı. Əsgərlər zirehlərini geyib silahlanaraq basqınçıları təqib edib Əlinin (r.ə) ordugahının içərisinə qədər irəliləmişdilər. Abdullah ibn Səbanın adamları "*bəsrəlilər bizə hücum etdi*" deyə bağırmağa başlayanda isə

Əlinin (r.ə) əsgərləri silahlanaraq bəsrəlilərin hücumunu dəf etmək çalışmışdılar. Gecənin qaranlığında nə baş verdiyi, kimin kimə basqın etdiyi anlaşılmadığı üçün hər iki orduda təşviş və həyəcan başlamışdı. Əli ibn Əbu Talib (r.ə) öz ordusuna döyüşə hazır vəziyyətə gəlməyi, lakin onun əmri olmadan heç bir hərəkət etməməyi əmr edib səhərin açılmasını gözləmişdi. Səhər açılanda hər iki ordugahda xeyli sayıda insanın cəsədi aşkar edilmiş, beləcə döyüş qaçınılmaz olmuşdu. Çünki hər iki ordudakı əsgərlər xəyanətə uğradıqlarını düşünürdülər. Buna baxmayaraq orduların komandanları öz əsgərlərinə ümumi hücum əmri verməmiş, gözləmişdilər. Bu vaxt bir neçə nəfər Huddan məscidinə gedərək Ayşəyə (r.ə) "*insanlar qəflətən bir-birlərinə hücum etməyə başladılar, yubanmadan gəl və bunun qarşısın al*" demişdilər. Ayşə (r.ə) oxçulardan qorunmaq üçün dəmir lövhələrlə örtülüb zirehlənmiş kəcavəsinə minərək ordugaha gəlmişdi. Əli ibn Əbu Talib (r.ə) atını irəli sürərək bibisi oğlu Zubeyri (r.ə) səsləmişdi. Zubeyr (r.ə) də atını irəli sürərək dayısı oğlu Əliyə (r.ə) tərəf gəlmişdi. Zubeyrin (r.ə) anası Safiyyə bint Əbdulmuttəlib (r.ə) həm Peyğəmbərin (s.ə.v), həm də Əlinin (r.ə) bibisi idi. Əli (r.ə) ona yaxınlaşan Zubeyrə (r.ə) belə demişdi:

- *Ey Əbu Abdullah! Xatırlayırsanmı biz Bəni-Qənəm yurduna Peyğəmbərlə (r.ə) birlikdə getmişdik və Peyğəmbər (s.ə.v) sənə "ey Zubeyr, sən Əlinin sevmirsənmi?" deyəndə sən Allah Rəsuluna (s.ə.v) "Dayımın oğlunu və İslamda qardaşımı niyə sevməyim ki?" deyə cavab verdimişdin. O, da sənə "Amma sən Əliyə (r.ə) qarşı haqsız olaraq vuruşacaqsan" demişdi.*

Çoxdan olmuş bu söhbət Zubeyrin (r.ə) yadına düşəndə o, çox mütəəssir oluş və "*bunu indi xatırladım ey Əli! Vallahi, artıq əlimdə silah səninlə qarşı-qarşıya dayanmaram*" demişdi. Zubeyr (r.ə) geri qayıdıb ordugahı tərk etməyə hazırlaşanda ordakılar onu getməmək üçün dilə tutmağa çalışsalar da buna müvəffəq ola bilməmişdilər. Zubeyr (r.ə) bu işdən ötürü çox peşman olmuş və Allahdan məğfirət diləyib kəffarə olaraq köləsi Sərkisi azad etmişdi.

Abdullah ibn Səbanın sayıları iki min nəfərdən çox olan adamları Əli ibn Əbu Talibin (r.ə) hücum etməmək əmrinə baxmayaraq dayanmadan bəsrəlilərə hücum etməkdə və döyüşü qızışdırmaqda idilər. Müharibə alovu artıq geriyə dönüşü olmayacaq şəkildə qızışmış və hər iki tərədən xeyli sayıda adam ölmüşdü. Müsəlmanların bir-birinin qanını tökdüyünü görən Əli ibn Əbu Talib (r.ə) oğlu Həsənə (r.ə) "*gərək atan iyirmi il bundan əvvəl öləydi və bu günü görməyəydi*" deyərək duyduğu hüzn və kədəri dilə gətirmişdi. Döyüşün qızğın vaxtında kimin tərəfindən atıldığı bilinməyən zəhərli bir ox Təlhənin (r.ə) buduna sancılaraq damarını kəsmiş və o, şiddətli bir şəkildə qan itirməyə başlamışdı. Kölələrindən biri Təlhəni (r.ə) döyüş meydanından çıxaraq Bəsrədəki bir

evə gətirmişdi. Təlhə ibn Ubeydullah (r.ə) çox qan itirdiyi üçün orada vəfat etmişdi. Bəzi mənbələrdə Mərvan ibn Həkəmin yanlışlıqla Təlhəni (r.ə) oxla vurduğu qeyd olunur. İslamdan əvvəl Məkkənin zəngin ailələrindən birinin övladı olan Təlhə (r.ə) Əbu Bəkrin (r.ə) dəvəti ilə ailəsinin təzyiq və hədələrinə baxmayaraq İslamı qəbul etmişdi. O, Bədr döyüşü xaric Allah Rəsulunun (s.ə.v) bütün hərbi səfərlərində iştirak etmişdi. Uhud döyüşündə dirsəyindən aldığı ağır yara səbəbiylə bir qolu şikəst olmuşdu. Təlhə ibn Ubeydullah ət-Teymi (r.ə) Allah Rəsulunun (s.ə.v) cənnətlə müjdələdiyi on səhabədən biri idi.

Zubeyr ibn Əvvam (r.ə) ordunu tərk edib gedərkən Abdullah ibn Səbanın adamlarından Əmr ibn Cərmuz, Abdullah ibn  Xəbis və Nufey onu təqib edərək Vadi əs-Siba' adlanan yerə pusquya yatmış və Zubeyrə (r.ə) hücum edərək onu öldürmüşdülər. Zubeyr (r.ə) Allah Rəsulunun (s.ə.v) dəvətinə icabət edib İslamı qəbul edərkən 15 yaşlı gənc idi. O, iki dəfə hicrət edən və Peyğəmbərin (s.ə.v) cənnətlə müjdələdiyi on səhabədən biri idi. Əvvəlcə Həbəşistana, sonra isə Mədinəyə hicrət etmişdi. Zubeyr (r.ə) Peyğəmbərlə (s.ə.v) birlikdə bütün hərbi səfərlərdə iştirak etmiş, şücaəti və cəsarəti ilə ad çıxarmış bir səhabə idi. Ələlxüsus Xəndək döyüşündə göstərdiyi qəhrəmanlıqlarla Peyğəmbərin (s.ə.v) təqdirini qazanmışdı. Əbu Bəkr (r.ə) də gənc Zubeyri (r.ə) çox sevirdi və qızı Əsmanı (r.ə) onunla evləndirmişdi.

Döyüşün ən şiddətli saatlarında Ayşə (r.ə) Bəsrə qazısı Kə'b ibn Suvərə (r.ə) səslənərək Qur'anı başının üzərinə qaldıraraq onlara hücum edənlərə Allahın kitabının hökmünə əməl etməyə çağırmasını söyləmişdi. Kə'b ibn Suvər (r.ə) müshəfi başının üstündə tutaraq onlara hücum edən kufəliləri Allahın kitabına səsləyərkən Abdullah ibn Səbanın adamları Kə'b və yanındakı adamları oxa tutaraq öldürmüşdülər. Onlar bununla da kifayətlənməyib Ayşənin (r.ə) kəcavəsinə ox yağdırmışdılar. Belə ki, kəcavə üzərinə batmış oxlardan kirpiyə oxşar hala gəlmişdi. Ayşə (r.ə) kəcavəsinin içində əllərini səmaya qaldıraraq üzərinə ox yağdıranları Allaha şikayət etmiş, onlara qarğış etmişdi. Ayşənin (r.ə) əmrindəki əsgərlər möminlərin anasını canları bahasına qoruyur, kufəliləri kəcavənin olduğu dəvənin yaxınına buraxmırdılar. Abdullah ibn Səbanın əmrindəki kufəlilər Ayşənin (r.ə) kəcavəsinin yükləndiyi dəvəni nəzərdə tutaraq "*bu dəvə sağ olduğu müddətcə bu döyüş qələbə ilə bitməyəcək*" deyib kəcavəyə şiddətli şəkildə hücum etməyə başlamışdılar. Dəvənin ətrafındakı döyüşdə hər iki tərəfdən onlarla insan ölmüşdü. Bunların arasında Osman ibn Əffanın (r.ə) qətli ilə nəticələnmiş Mədinə basqınına başçılıq edənlərdən bir neçə nəfər də var idi. Möminlərin anasını onun canına qəsd etməkdə olan kufəlilərdən qoruyarkən Bəni-Dəbbə oymağına mənsub 70-dən çox döyüşçü

həlak olmuşdu. Təlhə ibn Ubeydullahın (r.ə) oğlu Muhəmməd də öldürülənə qədər kəcavəni qorumaq üçün vuruşmuşdu. Abdullah ibn Zubeyr (r.ə) kəcavəyə hücum etməkdə olan Malik əl-Əştərlə vuruşmuş, onlar bir-birlərini yaralamışdılar. Yaralı Abdullah (r.ə) onu döyüş meydanından çıxarmağa çalışan yoldaşlarına "*məni buraxın, Maliki öldürün, qaçıb qurtulmasın*" desə də onlar digər kufəlilərin arasına qarışıb qurtulan yaralı Maliki yaxalaya bilməmişdilər. Hicri 36-cı il cəmaziyələvvəl ayının 10-cu günü (2 noyabr 656) baş vermiş bu müharibədə ən şiddətli döyüşlər kəcavənin yükləndiyi dəvənin ətrafında cərəyan etdiyi üçün bu müharibə "cəməl", yəni dəvə döyüşü adı ilə tarixə düşmüşdü. Əli ibn Əbu Talib (r.ə) Muhəmməd ibn Əbu Bəkr və Əmmar ibn Yasirin (r.ə) yanına etimad etdiyi adamları verərək kəcavənin yükləndiyi dəvəni qanlı döyüş meydanından çəkib çıxarmağı tapşırmışdı. Onlar kəcavəni dəvənin belindən götürə bilmək üçün dəvənin dizlərini qılıncla kəsərək yerə çökdürmüşdülər. Dəvənin çökdüyünü görən bəsrəlilərin iradəsi qırılmış və onlar döyüş meydanını tərk etmişdilər. Əlinin (r.ə) göndərdiyi adamlar Ayşənin (r.ə) kəcavəsini cəsədlərin və yaralıların arasından kənara çəkmişdilər. Muhəmməd ibn Əbu Bəkr (r.ə) kəcavədəki bacısının[87] yaralı olub olmadığını soruşanda Ayşə (r.ə) sərt bir şəkildə bunun ona dəxili olmadığını söyləmişdi. Muhəmməd ibn Əbu Bəkr misirli qiyamçılarla birlikdə olub onlarla bərabər Əlinin (r.ə) ordusuna qatıldığı üçün Ayşə (r.ə) ona qarşı qəzəbli idi. Əmmarın (r.ə) "*necəsən anacan?*" sulana da Ayşə (r.ə) "*mən sənin anan deyiləm*" deyə cavab vermişdi. Buna baxmayaraq Əmmar (r.ə) ona "*bəli, sən mənim anamsan, istəsən də istəməsən də bu belədir*" demişdi. Daha sonra Əlinin (r.ə) ordusundakı mədinəlilər də gəlib Ayşəni (r.ə) ehtiramla salamlamış, onun bu döyüşdən heç bir xəsarət almadan çıxdığına görə sevinmişdilər. Əli ibn Əbu Talib (r.ə) döyüş səngidiyi vaxt əsgərlərinə "*yaralıları öldürməyin, qaçanları təqib etməyin, evlərə və həyətlərə girməyin*" deyə əmr vermişdi. Əli ibn Əbu Talib (r.ə) Cəməl döyüşündən sonra üç gün döyüşün getdiyi yerdə qalmışdı. Cəməl döyüşündə hər iki tərəfdən eyni sayıda olmaqla cəmi 10 min müsəlman öldürülmüşdü. Bunların arasında səhabə və tabiuna mənsub olan insanlar da var idi. Əli ibn Əbu Talib (r.ə) döyüş meydanında hər iki orduya aid əsgərlərin cənazələrini dəfn etdirmiş və Cəməl döyüşündə öldürülənlərin cənazə namazını özü qıldırmışdı. İlk əvvəl

[87] Ayşə (r.ə) və Muhəmməd ata bir, ana ayrı bacı-qardaş idilər. Əbu Bəkrin (r.ə) övladlarından Ayşə (r.ə) və Əbdurrəhmanın (r.ə) anası Umm Ruman bint Amir (r.ə) idi. Muhəmmədin anası isə Əsma bint Umeys (r.ə) idi. Əsma bint Umeys (r.ə) Cə'fər ibn Əbu Talibin (r.ə) dul qalmış xanımı idi və Əbu Bəkr (r.ə) bu qadınla evlənmişdi. Əbu Bəkrin (r.ə) vəfatından sonra isə Əli ibn Əbu Talib (r.ə) Əsma bint Umeyslə (r.ə) evlənmişdi.

qureyşli əsgərlərin cənazə namazınını qıldırmışdı. Daha sonra onunla vuruşaraq öldürülən əsgərlərə aid bütün əşya və silahları topladaraq Bəsrə məscidinə göndərmiş və insanların gəlib öz yaxınlarına aid əşya və silahları götürə biləcəyini elan etdirmişdi. Əli ibn Əbu Talibin (r.ə) ordusundakı Abdullah ibn Səbanın adamlarının bundan məmnun olmayaraq qənimətlərin öz aralarında bölünməli olduğu barədə yaydıqları söz-söhbət xəlifənin qulağına çatanda o, onları sərt bir dillə qınamış və "*sizin aranızda möminlərin anasının öz qənimət payına düşməsini istəyən varmı?*" deyə sual vermişdi. Xəlifənin məsələyə bu şəkildə münasibət bildirməsi fitnənin başını təşkil edənləri susmağa məcbur etmişdi. Əli ibn Əbu Talib (r.ə) Bəsrəyə gələndən sonra bu şəhərdəki beytülmaldan öz əsgərlərinin hər birinə 500 dirhəm paylamış və Şam səfərindən sonra da hər birinə bu qədər verəcəyini bildirmişdi. Həmin fitnəkarlar bu dəfə də xəlifəni "*müsəlmanlara aid mallardan öz şəxsi məqsədi üçün istifadə edir*" deyə suçlayaraq ordu arasında dedi-qodu yaymağa başlamışdılar.

Muhəmməd ibn Əbu Bəkr həmin gün möminlərin anası Ayşəni (r.ə) Abdullah ibn Xələf əl-Xuzainin evinə gətirmiş və onlar həmin gecə orada qalmışdılar. Bir neçə gün sonra Əli ibn Əbu Talib (r.ə) Ayşənin (r.ə) olduğu evə gələrək izn istəyib onunla görüşmüş, pərdə arxasından salamlaşıb hal-əhval tutmuşdu. Abdullah əl-Xuzainin Abdullah və Osman adlı iki oğlu Cəməl döyüşündə öldürülmüşdülər. Qardaşlardan biri Əlinin (r.ə), digəri isə Ayşənin (r.ə) tərəfində vuruşan ordunun əsgəri idi. Əli (r.ə) Abdullah ibn Xələf əl-Xuzainin evinə gələndə qardaşlardan Abdullahın dul qalmış arvadı Safiyyə xəlifəyə "*diləyirəm ki, sən mənim övladlarımı yetim qoyduğun kimi Allah da sənin övladlarını yetim qoysun*" demiş, lakin Əli ibn Əbu Talib (r.ə) ona heç bir cavab verməmişdi. Xəlifə evi tərk edəndə Safiyyə eynə sözlərlə ona bəddua etmiş, Əli (r.ə) yenə də susaraq ona heç bir cavab verməmişdi. Xəlifənin yanındakı adamlardan biri "*ey möminlərin əmiri! sən bu qadının dediklərini eşitdiyin halda niyə heç bir cavab vermirsən?"* demiş, Əli ibn Əbu Talib (r.ə) də həmin adama "*bizə hətta müşriklərin qadınlarına toxunmamaq əmr edilmişkən, müsəlman bir qadına nə deməyimi gözləyirsən?*" deyə cavab verərək evi tərk etmişdi.

Qə'qa ibn Əmr (r.ə) Abdullah əl-Xuzainin evinin yanına gələrək möminlərin anası Ayşəni (r.ə) çirkin sözlərlə təhqir edən iki kufəlini yaxalayıb xəlifənin yanına gətirmiş, Əli ibn Əbu Talib (r.ə) bu adamları qurşağa qədər soyundurub yüz dəyənək vurulmasını əmr etmişdi. Hicri 36-cı ilin rəcəb ayının əvvəlində (dekabr 656) Əli ibn Əbu Talib (r.ə) Ayşəni (r.ə) qardaşı Muhəmməd ibn Əbu Bəkr, qırxa yaxın bəsrəli qadın və Məkkədən gəlmiş adamlarla birlikdə Bəsrədən Məkkəyə yola salmışdı. Xəlifə onların karvanını Bəsrədən bir qədər aralanana

qədər müşayət etmşidi. Ayşə (r.ə) həmin ilin həcc mövsümünə qədər Məkkədə qalmış, həcc ziyarətindən sonra Mədinəyə qayıtmışdı. Ayşə (r.ə) Bəsrədən Məkkəyə yola düşməmişdən əvvəl onu yola salmaq üçün toplaşmış bəsrəlilərə müraciət edərək Əli ibn Əbu Taliblə (r.ə) aralarında baş vermiş ziddiyyətin hər bir ailədə gəlinlə qayın arasında ola biləcək qəbildən bir ziddiyyət olduğunu, bu ziddiyyətin insanların qanının tökülməsi ilə nəticələnməsindən çox mükəddər olduğunu, artıq aralarında hər hansı bir anlaşmazlığın qalmadığını söyləmişdi.

Əli ibn Əbu Talib (r.ə) hicri 36-cı ildə (28 iyul 656-18 iyul 657) bəzi əyalətlərə yeni valilər təyin etmişdi. Bəsrə valiliyinə əmisi oğlu Abdullah ibn Abbası (r.ə), Bəsrə beytülmalı rəisliyinə Ziyad ibn Əbihi, Misir valiliyinə əvvəlcə Qeys ibn Sə'd ibn Ubadəni (r.ə), qısa müddət sonra Malik əl-Əştəri, daha sonra da Muhəmməd ibn Əbu Bəkri təyin etmişdi. Özü isə hicri 36-cı il cəmaziyəlaxir ayının 13-cü (4 dekabr 656) Kufəyə gedərək bu şəhərdə qərar tutmuşdu. Bununla da xilafətin paytaxtı Mədinədən Kufəyə daşınmışdı.

*Sıffin Döyüşü*

Muhəmməd ibn Əbu Huzeyfə özü özünü Misir valisi elan etmişdi. Əli ibn Əbu Talib (r.ə) beyət və itaət tələb edərək onu bu vəzifədə təsdiq edə bilərdi. Çünki Əlinin (r.ə) ordusunda Muhəmməd ibn Əbu Huzeyfənin yoldaşlarından olub vaxtilə Osman ibn Əffana (r.ə) qarşı olan misirlilərdən çox sayıda adam var idi. Buna baxmayaraq Əli ibn Əbu Talib (r.ə) İbn Əbu Huzeyfənin bu özbaşnalığını məqbul hesab etməyib Misir valiliyinə Qeys ibn Sə'd ibn Ubadəni təyin etmişdi. Qeys ibn Sə'd onu müşayət edən yeddi nəfər yoldaşı ilə birlikdə Misirə gəlib məsciddə xəlifənin məktubunu misirli müsəlmanlara oxumuşdu. Əli ibn Əbu Talib (r.ə) bu məktubunda Osman ibn Əffanın (r.ə) qətli ilə nəticələnmiş hadisələr haqqında məlumat verir, misirliləri özünə beyətə çağıraraq Allahın kitabı və Peyğəmbərin (s.ə.v) sünnəsinə uyğun bir üsuli-idarə və'd edirdi. O, məktubunda Qeysi Misir valisi təyin etdiyini bildirməkdə idi. Misirli müsəlmanlar xəlifənin təyin etdiyi valiyə itaət edərək Əliyə (r.ə) beyət etmişdilər. Sadəcə Misirdəki Xərbəta adlı qəsəbənin müsəlman əhalisi yeni valiyə itaət etməyərək Osmanın (r.ə) qatilləri cəzalandırılmayana qədər Əli ibn Əbu Talibə (r.ə) beyət etməyəcəklərini bildirmişdilər. Onların sayı təqribən 10 min nəfərə yaxın idi.

Qiyamçılar Mədinəyə basqın edib Osmanı (r.ə) öz evində mühasirə altına aldıqları vaxt Əmr ibn əl-As Mədinəni tərk edərək Fələstinə getmişdi. Abdullah ibn Sə'd ibn Əbi Sərh (r.ə) Muhəmməd ibn Əbu Huzeyfənin Misir valiliyini zəbt etməsindən sonra Əmrin yanına, Fələstinə getmişdi. Əmr ibn əl-As

Müaviyə ibn Əbu Süfyanın (r.ə) tərəfində yer almışdı. Müaviyə ibn Əbu Süfyan (r.ə) Cəməl döyüşünün Əli ibn Əbu Talibin (r.ə) qələbəsi ilə nəticələndiyi xəbərini alandan sonra Şam diyarında öz mövqeyini möhkəmləndirməyə başlamış, Kipr, Fələstin, İornadiya, əl-Cəzirə vilayətlərini öz itaəti altına almışdı. O, Misirdə də öz mövqeyini möhkəmləndirmək istəyirdi. Abdullah ibn Sə'd ibn Əbi Sərhin (r.ə) Şam diyarına gəlib Əmr ibn əl-As və Müaviyə ibn Əbu Süfyana (r.ə) Muhəmməd ibn Əbu Huzeyfənin etdiklərini anlatmasından sonra Müaviyə (r.ə) Osmanın (r.ə) qətlindəki təqsirkarlarından biri olduğu qənaətini hasil etdiyi Muhəmməd ibn Əbu Huzeyfəni məğlub edərək Misiri ələ keçirmək istəmişdi. Əmr ibn əl-Asla məsləhətləşəndən sonra o, bu işin Misirə ordu yeritməklə hələ ki, mümkün olmayacağı qərarına gəlmişdi. Bu vaxt Qeys ibn Sə'd ibn Ubadə artıq Misir valiliyinə təyin olunmuşdu. Müaviyə (r.ə) Qeysə məktub yazaraq Osman ibn Əffanın (r.ə) qanının yerdə qalmaması üçün Qeysin ona yardım etməsinin vacib olduğunu bildirmiş və ondan öz tərəfində mövqe tutmasını istəmişdi. Bunun əvəzində Müaviyə (r.ə) Qeysə ərəb və əcəm İraqı valiliyini və'd etmişdi. Qeys Müaviyənin (r.ə) Misirə ordu yeridəcəyi təqdirdə bunun qarşısını ala biləcək gücdə olmadığını bilirdi. Əli ibn Əbu Talibdə (r.ə) Misirdən xeyli uzaqda olduğu üçün onun imdadına yetişməsi müşkül idi. Buna görə də Qeys Müaviyənin (r.ə) bu təklifinə müsbət cavab verməsə də ona etiraz da etməmiş, ona yazdığı məktubdakı iltifatlı sözlərlə Müaviyənin (r.ə) könlünü ələ almağa çalışmışdı. Müaviyə (r.ə) Qeysin onu yola verib sovuşdurmaq istədiyini anlayaraq növbəti məktubunda tələbini daha qəti sözlərlə ifadə etmişdi. O, Qeydən öz mövqeyini daha açıq şəkildə ortaya qoymasını, iki tərəfdən birini seçməsini tələb etmişdi. Qeys ya Əlinin (r.ə), ya da Müaviyənin (r.ə) tərəfində olduğunu açıq şəkildə ifadə etməli olduğunu görüb Müaviyəyə (r.ə) yazdığı məktubda Əliyə (r.ə) etdiyi beyətə sadiq qaldığını bildirmişdi. Müaviyə (r.ə) Qeysin bu cavabından sonra Misiri silah zoru ilə ələ keçirməkdənsə Qeysi Əlinin (r.ə) gözündən düşürəcək tədbirə əl atmışdı. O, Misirdən İraqa güya Qeysin artıq Müaviyə (r.ə) ilə əlbir olduğunu ifadə edən məktublar yazdırmışdı. Əli ibn Əbu Talib (r.ə) bu məktubların məzmunundan xəbərdar olandan sonra bu xəbərin doğru olub olmadığını aydınlaşdırmaq qərarına gəlmişdi. Əli ibn Əbu Talib (r.ə) Qeys ibn Sə'də məktub yazaraq ona beyətdən imtina edən Xərbəta qəsəbəsinə ordu yeritməyi əmr etmişdi. Lakin Qeys bunun təhlükəli bir iş olduğunu anlayırdı. Çünki Xərtibada 10 min silahlı insanın var idi. Onlara qarşı ordunun göndəilməsi bütün Misirdə vəziyyəti tərsinə döndərə bilərdi. Qeys ibn Sə'd bütün bunları xəlifəyə yazdığı məktubunda bildirsə də Əli ibn Əbu Talib (r.ə) onun mövqe dəyişdiyi haqqındakı şaiyələrin doğru olduğunu

düşünərək Qeysi vəzifəsindən azad etmiş və yerinə Muhəmməd ibn Əbu Bəkri təyin etmişdi. Qeysin onun yanına gəlib ətraflı məlumat verməsindən sonra xəlifə yanıldığını anlamışdı.

Əyalət valiləri və cəbhələrdəki ordu komandanlarından bir çoxu çaşqınlıq və tərəddüdlə baş verən hadisələri müşahidə edirdilər. Əhdnamələrə uyğun olaraq fəth olunmuş yerlərin cizyə və xaracının xilafət beytülmalına göndərilməsində müəyyən fasilə yaranmışdı. Əli ibn Əbu Talib (r.ə) belə bir vəziyyətdə həm öz iqtidarını möhkəmləndirməsinin çətin olacağı, həm də hazırlaşdığı Şam səfəri üçün zəruri maddi vəsaitin təmin edilməsinin müşkülə dönəcəyini anlayırdı. Buna görə də Kufədən bəzi əyalət valilərinə və cəbhələrdəki əmirlərə məktublar yazaraq onları özünə beyət və itaət etməyə çağırmışdı. Bunlardan biri də Azərbaycan valisi Əş'əs ibn Qeys əl-Kindi (r.ə) idi. Xəlifə Əş'as ibn Qeysə (r.ə) aşağıdakı məzmunda bir məktub yazmışdı:

*"Özbaşına hərəkət edəsən deyə səni mən təyin etməmişəm. Fəqət bu iş (valilik) sənin boynunda bir əmanətdir və sən sənin üzərində olanın (xəlifənin) əmri altındasan. İnsanlarla öz dilədiyin kimi rəftar etmə və heç bir təhlükəli işə də girişmə. Sənin əlində Allaha məxsus olan mallar var. Onu mənə təslim etmək sənin borcundur, çünki sən mənim məmurumsan. Mən sənə münkəri əmr etmədiyim müddətcə mənə itaət etməlisən və əlindəki (xəzinə) mallarını mənə təslim etməlisən".*

Əli ibn Əbu Talib (r.ə) Osmanın (r.ə) xəlifəliyi dövründən bəri Həmədan valisi olan Cərir ibn Abdullah əl-Bəcəliyə (r.ə) də məktub yazaraq Həmədandakı müsəlmanlardan onun üçün beyət aldıqdan sonra yanına, Kufəyə gəlməsini əmr etmişdi. Cərir ibn Abdullah (r.ə) Əlinin (r.ə) bu istəyinə soyuq yanaşıb müsəlmanların qanının töküldüyü bir məsələyə qarışmaq istəməsə də öz yaxın adamlarından Zahir ibn Qeys əl-Cu'finin məsləhəti ilə xəlifənin əmrini yerinə yetirmişdi. Xəlifə Azərbaycan və Ərməniyyə valisi Əş'əs ibn Qeys əl-Kindiyə (r.ə) də əmri altındakı əsgərlərin bir qismi ilə yanına gəlməsini əmr etmiş, Əş'əs (r.ə) xəlifənin əmrini yerinə yetirmişdi. Cərir ibn Abdullah (r.ə) ilə Müaviyə (r.ə) arasında köhnədən bəri dostluq var idi. Cərir (r.ə) bu dostluq səbəbiylə Müaviyənin (r.ə) yanına xəlifənin elçisi olaraq gedə biləcəyini bildirmiş, Malik əl-Əştərin buna etiraz etməsinə baxmayaraq xəlifə Müaviyəyə (r.ə) yazdığı məktubla Cəriri (r.ə) Şam diyarına göndərmişdi. Cərir ibn Abdullah (r.ə) xəlifənin məktubunu Müaviyəyə (r.ə) çatdırmışdı. Əli ibn Əbu Talib (r.ə) məktubda ənsar və mühacirin ona beyət etdiyini bildirir, Cəməl əshabının aqibətini qeyd edir və bənzər bir aqibətə uğramaması üçün Müaviyəni (r.ə) beyətə və itaətə dəvət edirdi. Müaviyə (r.ə) məktubu oxuyandan sonra Şam

diyarındakı əmirlərlə məşvərət etmiş və onları da məktubun məzmunu ilə tanış etmişdi. Şam diyarında əsasən ərəblərin Kində və Kəlb qəbilələri məskun idi. Müaviyə (r.ə) ilə bu qəbilələr arasında qohumluq əlaqəsi var idi. Kində qəbiləsinin rəisi Şurahbil ibn Simt, Əmr ibn əl-As və dəgərləri Müaviyəyə (r.ə) əmisinin nəvəsi Osmanın (r.ə) qanının yerdə qalmamasını arzu edirsə tutduğu mövqedən geri çəkilməməsini, əgər üzərinə silahlı qüvvə göndərilərsə buna silahlı qüvvə ilə cavab verməsini tövsiyə etmişdilər. Hətta Şurahbil ibn Simt Müaviyəyə (r.ə) "*əgər Osmanın qanının qisasını axıra qədər tələb edib bundan geri addım atmayacaqsansa biz səninlə birikdəyik, yox əgər yarı yolda bundan əl çəkəcəksənsə bu başdan söylə, biz gedib evimizdə oturaq*" deyərək bir növ onu Əlinin (r.ə) itaət və beyət tələbini rədd etmək məcburiyyətində qoymuşdu. O, qərarını Cərirə (r.ə) açıqlayanda Cərir (r.ə) bu işin xeyirlə nəticələnməyəcəyini söyləyib onu dilə tutmağa çalışsa da Müaviyə (r.ə) ona "*bəs necə olsun? Osmanın (r.ə) qanı hədər olub getsin? Əgər Əli (r.ə) ona beyət etməyimizi istəyirsə ya Osmanın qatillərini özü cəzalandırsın, ya da onları bizə təslim etsin*" deyərək qərarının qəti olduğunu bildirmişdi. Cərir ibn Abdullah (r.ə) geri qayıdıb Müaviyədən (r.ə) eşitdiklərini Əliyə (r.ə) bildirəndə Malik əl-Əştər Cəriri (r.ə) xainliklə suçlayaraq özünün Şam diyarına elçi olaraq getməli olduğunu demişdi. Cərir ibn Abdullah (r.ə) isə ona "*əgər sən Şama getsəydin, şübhəsiz ki, səni orada öldürərdilər, çünki Osmanın (r.ə) qatilləri arasında sənin də adını sadalamaqdadırlar*" deyərək cavab vermişdi. Cərir ibn Abdullah (r.ə) xoş niyyətinin bu cür sui-istemal edilməsindən incimiş və qəzəbli bir halda Həmədan valiliyindən də istefa edib Kufəni tərk etmişdi. Bir müddət əl-Cəzirə əyalətində qaldıqdan sonra Mədinəyə gedib heç bir şeyə qarışmadan orada yaşamağa başlamışdı.

Cəməl hadisəsindən lazımi dərsi çıxaran Müaviyə (r.ə) Əli ibn Əbu Talibin (r.ə) Şam diyarını itaət altına alana qədər mübarizə aparmaqdan geri durmayacağını anlayırdı. Buna görə də ehtimal olunan silahlı toqquşmaya hazırlaşmağa başlamışdı.

Mühacir və ənsar, yəni İslamda qabaqcıl olan insanların mühüm bir qismi Əli ibn Əbu Talibə (r.ə) beyət etmişdilər. Xəlifə bunu tutarlı bir arqumet kimi tez-tez Müaviyəyə (r.ə) xatırlatır və onun da İslam icmasına uyaraq beyət etməli olduğunu söyləyirdi. Buna görə də Müaviyə (r.ə) bu işə qarışmayıb heç kimin tərəfində olmayan səhabələrə məktub yazaraq iqtidarda gözü olmadığını, yeganə məqsədinin Osman ibn Əffanın (r.ə) qatillərinin cəzalandırılmasına nail olmaq olduğunu bildirmişdi. Ümumiyytlə Allah Rəsulunun (s.ə.v) əshabının əksəriyyəti Əli ibn Əbu Talibi (r.ə) xəlifə olaraq qəbul edib ona beyət etsələr də

sonrakı dövrdə meydana gələn və müsəlmanların bir-birinin qanını tökməsi ilə nəticələnən hadisələrdə bitərəf mövqe tutmuş, fitnə olaraq gördükləri üçün bu hadisələrdə aktiv rol oynamamışdılar. Onların bu cür mövqe tutmasının səbəbini Sə'd ibn Əbu Vəqqasın (r.ə) timsalında, ona verilən sualı cavablandırarkən dilə gətrdiyi sözlərdən anlamaq mümkündür. Sə'd ibn Əbu Vəqqasdan (r.ə) əvvəlki xəlifələr dövründə şura üzvü olduğu halda nə üçün heç bir şeyə qarışmadan bir kənara çəkildiyi soruşulanda o, belə cavab vermişdi: "*mənə iki gözü, dili və dodağı olan, "bu mömindir, bu kafirdir" deyə bilən bir qılınc verməsəniz heç kimlə vuruşmaram. Mən Allah yolunda vuruşmuşam və cihadın nə olduğunu bilirəm*" deyə cavab vermişdi. Ona "*yüz min qılınc sahibi var ki, xəlifəliyə səndən daha layiqli bir adam tanımırlar*" deyənlərə isə Sə'd ibn Əbu Vəqqas (r.ə) "*o yüz min qılıncdan daha qüvvətli qılınc möminin üstünə qaldırılanda onu kəsməyən, kafirin üstünə sıyrılanda isə onu kəsən qılıncdır*" deyə cavab vermişdi. Fitnə və qarışıqlığın baş verdiyi dövr haqqında Sə'd ibn Əbu Vəqqas (r.ə) həmçinin demişdi:

"*Bizim halımız açıq-aydın bir havada səfərdə olanların halı kimidir. Lakin bu səfərdə olanlar qəflətən şiddətli küləyə, fırtınaya məruz qalırlar, göz-gözü görmür və onlar gedəcəkləri istiqaməti itirirlər. Bu vaxt onlardan bəziləri deyir "yol sağ tərəfədir, biz sağ tərəfə getməliyik". Onlar sağ tərəfə gedirlər və yoldan çıxıb azırlar. Digər bir qrup isə "xeyr sol tərəfə getməliyik, yolumuz o tərəfdədir" deyib sola gedirlər və onlar da yolu itirib azıb qalırlar. Qalanları isə belə deyirlər "fırtına başlayana qədər biz doğru yolda gedirdik, fırtına kəsilənə qədər burada, olduğumuz yerdə dayanaq və fırtına sakitləşib hava aydınlananda yolumuza davam edərik". Sonra fırtına sakitləşir, külək dayanır və yol açıq-aydın görünür, nə sağa, nə sola getməyib olduqları yerdə dayananlar belə dedilər: "Biz axirətdə Allah Rəsuluna s.ə.v qovuşana qədər sadəcə Allah Rəsulunun s.ə.v bizim üçün qoyub getdiyinə (Qur'ana və sünnəyə) sarılmalıyıq, fitnə ilə əlaqəli heç bir şeyin içinə daxil olmamalıyıq*".

Sə'd ibn Əbu Vəqqas (r.ə) bu sözlərlə fitnə və qarışıqlıq zamanı kimin haqlı, kimin haqsız olduğunu ayırıd etmənin xeyli müşkül olduğunu, bu cür vəziyyətdə fitnə yatışana qədər səbr edib gözləmənin daha əfzəl olduğunu vurğulamaq istəmişdi.

Müaviyənin (r.ə) vali olduğu Şam diyarı Bizans imperiyası ilə həmsərhəd idi. Müaviyə (r.ə) iyirmi ildən artıq Şam diyarını idarə etmiş və Bizansa qarşı hərbi səfərlər tərtib etmişdi. Belə təhlükəli bir vəziyyətdə iki cəbhə arasında sıxışıb qalmaqa üçün Bizansla sülh müqaviləsinin bağlanmasının zəruri olduğu-

nu düşünmüşdü. Buna görə də o, Bizans imperatoru II Konstantinlə (641-668) ayda 4 min dinar xərac ödəmək şərti ilə sülh əqdi bağlamışdı.

Əli ibn Əbu Talib (r.ə) Şam diyarına hərbi səfər hazırlıqları üçün Kufə yaxınlığındakı Nəxlə adlı yerdə ordugah qurulması əmrini vermişdi. Yaxınları ona bu səfərə şəxsən başçılıq etməyib orduya bir başqasını komandan təyin etməsini tövsiyə etsələr də xəlifə bu səfərdə şəxsən iştirak etmək əzmində idi. Mühacir və ənsardan bir çoxu Əli ibn Əbu Talibə (r.ə) beyət etsələr də müsəlmanlar arasında cərəyan edəcək bu hərbi toqquşmada iştirak etmək istəməmişdilər. Bu hərbi səfərdə sadəcə otuza yaxın səhabə iştirak etmişdi ki, onlardan da sadəcə 2-3 nəfəri Bədr əshabından idilər. Hərbi hazırlıqları tamamladıqdan sonra Əli ibn Əbu Talib (r.ə) Ziyad ibn Nəzir və Şureyh ibn Huneyfin başçılığı altındakı 12 min nəfərlik avanqard qüvvəni Şam diyarına yollamışdı. Müaviyə (r.ə) xəlifənin öncü qüvvələrinin İraqdan yola düşdüyü xəbərini alan kimi dərhal Şam diyarındakı komandanlara qüvvələrini cəm etməyi əmr etmişdi. Cəməl hadisəsində Əli ibn Əbu Talibin (r.ə) ordusunun əlindən sağ qurtula bilənlər, həmçinin Cəməl döyüşündə öldürülənlərin yaxınlarından bir çoxu da İraqdan Şam diyarına gedərək Müaviyənin (r.ə) ordusuna qoşulmuşdular. Xəlifənin öncü qüvvələri Şam diyarına girib Ənət qəsəbəsi yaxınlığındakı körpüdən Fərat çayını keçmək istəyərkən qəsəbə əhalisi onlara mane olmuşdu. Buna görə də Ziyad və Şureyh əvvəlcədən planlanmış yoldan gedə bilməyib Xeyt adlı yerdəki körpüdən çayı keçmişdilər. Lakin bu dəfə də ordunun əsas hissəsi gəlmədən Müaviyənin (r.ə) Əbü'l-Avər Əmr ibn Süfyan əs-Süləmi və Haris ibn Cuhman əl-Cufinin əmrindəki öncü qüvvələri ilə qarşılaşa biləcəklərini təxmin edərək hərəkət istiqamətini dəyişmişdilər. Əli ibn Əbu Talib (r.ə) ordunun əsas hissəsi ilə Fərat çayının sağ sahili boyunca irəliləyib Mənbic qəsəbəsi civarına çatmış və buradakı körpüdən ordusunu qarşı tərəfə keçirmişdi. Mənbic indiki Suriya-Türkiyə sərhəddində, Hələb və Urfa şəhərləri arasında bir yerdir. Xəlifə daha sonra ordusu ilə cənuba doğru irəliləmişdi. Müaviyənin (r.ə) ordusu bu vaxt Rəqqə şəhərinin cənubundakı Sıffin adlı yerdə mövqe tutmuşdu. Əli ibn Əbu Talib (r.ə) öncü qüvvələrin ordunun əsas hissəsindən xeyli geri qaldığını görüb Ziyad və Şureyli əmirlikdən azad etmiş, onların yerinə Malik əl-Əştəri təyin etmişdi. Xəlifə Malikə hücum etməyərək Şam ordusunu beyətə çağırmağı tapşırmışdı. Şamlılar ilk hücuma keçəcəkləri təqdirdə müdafiə olunmağı tapşırmışdı. Beləcə hicri 36-ci ilin zilhiccə ayında (may-iyun 657) iki ordu üz-üzə dayanıb heç bir əməliyyata girişmədən gözləmə mövqeyi tutmuşdular. Əlinin (r.ə) ordusu 120 min, Müaviyənin (r.ə) ordusu isə 60 minə yaxın əsgərdən ibarət idi. Səhəri günü günorta vaxtı iraqlılardan Zibyan ibn Əmmarə ət-Təmimi adlı bir əsgərin

atdığı oxla şamlı əsgərlərdən Abdullah ibn Munzir ət-Tənuxini öldürməsi döyüşün başlamasına səbəb olmuşdu. Lakin bu aktiv bir döyüş olmamış tərəflər bir-birlərinə ox və nizə atmaqla kifayətlənmişdilər. Buna görə də döyüş itgisiz başa çatmışdı. Həmin günün axşamı həm Əli (r.ə), həm də Müaviyə (r.ə) ordularının əsas hissəsi ilə Sıffin çölünə gəlib əsgərlərinə hərb nizamı vermişdilər. Əbü'l-Avər əs-Süləmi Müaviyənin (r.ə) əmri ilə xəlifənin ordusu ilə Sıffindəki su hövzəsi arasında mövqe tutmuşdu. İraqlı əsgərlər, ordudakı minik və yük heyvanları qızmar yay günlərində susuzluqdan əziyyət çəkməkdə idilər. Əş'as ibn Qeys (r.ə) Müaviyəyə (r.ə) xəbər göndərərək əsgərlərini su hövzəsindən kənara çəkməsini istəmişdi. Əmr ibn əl-As insanları susuz qoymanın doğru olmadığını bildirib Əbü'l-Avər əs-Süləminin əsgərlərinə geri çəkilməyi əmr etməsini Müaviyəyə (r.ə) söyləsə də Vəlid ibn Uqbə "*Osmanı (r.ə) susuz qoyduqları kimi qoy özləri də susuzluqdan ölsünlər*" deyib bu istəyi yerinə yetirməməsini tövsiyə etmişdi. Buna baxmayaraq Malik əl-Əştər Əbü'l-Avər əs-Süləminin əsgərlərini sıxışdıraraq su hövzəsinin ətrafından çıxara bilmişdi. Daha sonra hər iki tərəf Fəratın suyundan istifadə etmədə bir-birlərinə mane olmamaq barədə razılığa gəlmişdilər. Hər iki ordu öz düşərgəsində mövqe tutub heç bir tərəf digərinə hücum etmirdi. Əli ibn Əbu Talib (r.ə) Bəşir ibn Əmr əl-Ənsari, Səid ibn Qeys əl-Həmdani və Şəbəs ibn Ri'bi əs-Səhmini Müaviyənin (r.ə) yanına göndərərək ona nəsihət edib beyət etməyə çağırmalarını tapşırmışdı. Bəşir əl-Ənsari Müaviyənin (r.ə) yanına gəlib demişdi:

- *Ey Müaviyə! Bir gün bu dünyanı tərk edib axirət yurduna köçəcəksən. Allah etdiklərinin hesabını səndən soruşacaq və bu dünyadakı əməlləinin əvəzini sənə verəcək. Allah üçün, bu ümmətin bir-birindən qopub dağılmasına, bir-birinin qanını tökməsinə səbəb olma.*

- *Bu tövsiyələri öz adamınıza niyə etmirsiniz?*

- *Bizim adamımız dediyin Əli (r.ə) insanlar arasında fəziləti, təqvası, İslama səndən daha əvvəl gəlməsi və Allahın Rəsuluna (s.ə.v) yaxınlığı səbəbiylə xəlifəliyə səndən daha layiqdir. O, səni beyətə dəvət edir. Belə etmən həm dünyan, həm də axirətin üçün daha xeyirlidir.*

- *Mənim xəlifəlik üçün cəhd etdiyimi sizə kim söylədi? Mən Osmanın (r.ə) qanının qisasını tələb etirəm. Siz onun haram olaraq axıdılmış qanının hədər olub getməsini istəyirsiniz? Əgər istədiyiniz budursa, xeyr, vallahi mən bunu etməyəcəm.*

Müaviyə (r.ə) "*Kim haqsız yerə öldürülmüşsə, artıq onun varisinə ixtiyar vermişik*" (İsra surəsi 33) ayəsini əldə dəlil tutaraq əmisinin nəvəsi olan Osman ibn Əffanın (r.ə) qatillərinin cəzalandırılmasını tələb etdiyini bildirmişdi.

Səid ibn Qeys Müaviyəyə (r.ə) müraciət etmək istəyəndə Şəbəs ibn Ri'bi onun sözünü kəsərək ağır ifadələrlə Müaviyəni (r.ə) təhqir etməyə başlamışdı. Bu bir anda vəziyyətin gərginləşməsinə səbəb oldu. Müaviyə (r.ə) özünün İslam və ümmət qarşısındakı xidmətlərini xatırladıb Şəbəsin isə heç kim olduğunu söylədi. Sonra isə ya Osmanın (r.ə) qanının qisasını alacağına, ya da bu uğurda öləcəyinə dair and içərək xəlifənin elçilərini yanından qovdu. Bununla da məsələnin sülh yolu ilə çözülməsinə olan ümidlər tükənmiş oldu. Həmin vaxtdan etibarən iki ordu arasında döyüşlər fasilələrlə bir aydan artıq müddətdə davam etmiş, lakin heç bir tərəf digərinə üstün gələ bilməmişdi. Hicri 37-ci ilin məhərrəm ayında (iyun-iyul 657) tərəflər atəşkəs elan edərək gözləmə mövqeyi tutmuşdular. Əli ibn Əbu Talib (r.ə) və Müaviyə (r.ə) bir-birlərinə öz elçi heyətlərini göndərsələr də heç bir nəticə əldə olunmamışdı. Əli (r.ə) Müaviyəyə (r.ə) əvvəlcə onun beyət etməsini, sonra Osmanın (r.ə) qatillərinin cəzalandırılması təklif edir, Müaviyə (r.ə) isə bunun əksini əstəyərək əvvəlcə xəlifənin əsgərləri arasında olan Mədinə basqınçılarının cəzalandırılmasını, daha sonra beyət məsələsinin müzakirə olunmasını tələb edirdi. Tərəflər arasında atəşkəsin pozulması hicri 37-ci il səfər ayının ilk günlərində (657-ci il iyulun ortaları) şiddətli döyüşlərin baş verməsinə səbəb olmuşdu. Lakin bu döyüşdə də heç bir tərəf qələbə və üstünlük əldə edə bilməmişdi. Ümumilikdə 110 gün davam edən Sıffin müharibəsində tərəflər arasında fasilələlə 80-dən çox döyüş baş vermişdi. Müaviyə (r.ə) xəlifənin ordusundakı kufəli süvarilərin komandanı Xalid ibn Mutəmərə gizli məktub yazaraq əsgərləri ilə öz tərəfində keçəcəyi təqdirdə onu İraq valisi təyin edəcəyini və'd etmişdi. Xalid Müaviyənin (r.ə) bu təklifini qəbul edərək öz süvari dəstəsi ilə Şam ordusu tərəfə keçmişdi. Bu səbəbdən xəlifənin ordusundakı iraqlı əsgərlərdən bəziləri özbaşına döyüş meydanını tərk etməyə başlamışdılar. Lakin Əli ibn Əbu Talibin (r.ə) əmri ilə Malik əl-Əştər bu iraqlı əsgərləri yaxalayıb bəzilərini cəzalandırmış, digərlərini yenidən döyüş mövqelərinə göndərmişdi. Müaviyə (r.ə) Sıffin müharibəsinin həddən artıq uzandığını anlayırdı. Onun imkanları məhdud idi və müharibə uzandıqca qüvvəsi tükənirdi. Bu cür davam edəcəyi təqdirdə Sıffində məğlub olacağını bildiyi üçün Əmr ibn əl-Asın təklifi ilə şiddətli döyüşlərdən birində öz əsgərlərinə Qur'an səhifələrini nizələrin ucuna taxaraq yüksəyə qaldırmalarını və Əlinin (r.ə) ordusundakı əsgərləri Qur'anın hökmünə çağırmağı əmr etmişdi. Aylardır davam edən döyüşlərdən yorğun düşmüş qarşı tərəfin əsgərləri də bu çağırışı məmnunluqla qarşılamışdılar. Əli ibn Əbu Talib (r.ə) bunun hərb hiyləsi ola biləcəyini söyləyərək döyüşə davam etmənin vacibliyini vurğulasa da şamlı əsgərlərdən bəzilərinin uca səslə "*kitabdan özlərinə bir*

*pay verilmiş kəsləri görmədinmi? Onlar, aralarında hökm versin deyə, Allahın Kitabına dəvət olunurlar, sonra da onlardan bir dəstə (haqdan) üz çevirir*" (Ali-İmran 23) ayəsini oxumaları iraqlı əsgərlərin bu cağırışa müsbət cavab verməsinə səbəb olmuşdu. Malik əl-Əştərin zəfərə yaxın olduqlarını söyləyib onları döyüşə təşviq etməsinin də bir faydası olmamışdı. Qur'anın hakimliyinə müraciət etmə cağırışını ən çox dəstəkləyənlər Mədinə basqınında iştirak etmiş kufəlilər idilər. Onların liderlərindən Mis'ər ibn Fədəki ət-Təmimi və Zeyd ibn Hısn ət-Təyyi Əli ibn Əbu Talibin (r.ə) yanına gələrək döyüşü dərhal dayandırmaq üçün əmr verməsini tələb etmişdilər. Əli ibn Əbu Talibin (r.ə) bu barədə tərəddüt etməsi onları qəzəbləndirmişdi. Onlar Əli ibn Əbu Talibə (r.ə) "*Osman (r.ə) Qur'anın hakimliyini qəbul etmədiyi üçün öldürüldü, sən də belə etsən başına eyni iş gələr*" deyərək xəlifəni hədələməkdən belə çəkinməmişdilər. Əli ibn Əbu Talib (r.ə) öz istəyinə zidd də olsa döyüşü dayandırmaq əmrini vermişdi. Malik əl-Əştər onlara şamlıların bu çağırışda səmimi olmadıqlarını, onlar Allahın hökmünə qarşı çıxdıqları üçün onlarla vuruşduqlarını söyləsə də bunun bir faydası olmamışdı. Bunu görən Malik əl-Əştər keçmiş silahdaşlarına tənə etmiş, onları qorxaqlıq, acizlik və alçaqlıqla suçlamışdı. Beləcə fasilələrlə 110 gün davam etmiş Sıffin müharibəsi əsasən başa çatmış, hər iki tərəf döyüş meydanını tərk edib öz mövqeyinə çəkilmişdi.

Sıffin müharibəsində 70 mindən çox müsəlman ölmüşdü. Bunun təqribən 45 minə yaxını şamlılardan, 25 mini isə xəlifənin ordusundan idi. Əli ibn Əbu Talib (r.ə) Sıffindəki döyüşlərin bir çoxunda şəxsən iştirak etmiş, bu döyüşlərdə 500-ə yaxın şamlı əsgəri öldürmüşdü. Müaviyənin (r.ə) ordusunda vuruşan Ubeydullah ibn Ömər ibn Xəttab (r.ə), Əlinin (r.ə) ordusunda vuruşan Əmmar ibn Yasir (r.ə) kimi şəxslər də Sıffində öldürülənlər arasında idilər. Əlaxüsus Əmmar ibn Yasirin (r.ə) Sıffində öldürülməsi mənadar idi. Əmr ibn əl-Asın oğlu Abdullah (r.ə) onun öldürülməsindən son dərəcə mütəəssir olmuş və Müaviyə (r.ə) də yanında ikən atasına Allah Rəsulunun (s.ə.v) bir vaxtlar Əmmara (r.ə) "*Heyf, ey Suməyyənin oğlu! Səni azğın bir güruh öldürəcək*" dediyini xatırlatmışdı. Əmr ibn əl-As oğlunun bu sözünə belə cavab vermişdi: "*Əmmarı (r.ə) biz yox, doxsan yaşlı bir qoca olduğu halda onu buraya qədər çəkib gətirənlər öldürmüşdür*". Əmr ibn əl-As Sıffin döyüşü üçün insanları təşviq edib orduya cəlb edən xəvaricdən Malik əl-Əştər və yoldaşlarını nəzərdə tutmaqda idi. Güman ki, Malik əl-Əştər yuxarıda bəhs edilən hədisdən xəbərdar idi və ahıl yaşdakı Əmmar ibn Yasirin (r.ə) Sıffində iştirak etməsini də bu səbəbdən arzu etmişdi. Əmmar ibn Yasir (r.ə) Sıffində şəhid olarkən 94 yaşını haqlamışdı.

Müaviyə (r.ə) bu atəşkəsdən istifadə edərək qüvvələrini təchiz etmək fürsətini əldə etmişdi. Əli ibn Əbu Talib (r.ə) də bu vaxt bəzi yarım qalmış işlərini tamamlayıb sahmana salmağa başlamışdı. O, Misir əyalətini tam olaraq öz itaəti altına almaq və buradakı qüvvələri öz tərəfinə cəlb etmək üçün bəzi tədbirlər görmüşdü. Abdullah ibn Sə'd ibn Əbi Sərh (r.ə) uzun müddət Misiri idarə etmişdi və onun burada xeyli sayıda tərəfdarı var idi. 25-26 yaşlarında bir gənc olan Muhəmməd ibn Əbu Bəkr misirlilərin ona qarşı layeqd və saymazyana münasibəti səbəbiylə Misiri Əli ibn Əbu Talibin (r.ə) iqtidarına tabe etdirə bilməmişdi. Bu səbəbdən də Əli ibn Əbu Talib (r.ə) Sıffin döyüşündən sonra əvvəlcə Mosul valiliyinə təyin etdiyi Malik əl-Əştəri Muhəmmədin yerinə Misir canişinliyinə təyin etmişdi. Malik əl-Əştər Misirə gedərkən qısa müddət Misirin əl-Qəlzum qəsəbəsində qalmışdı. Osman ibn Əffanın (r.ə) qətli ilə nəticələnmiş Mədinə basqınını tərtib edənlərdən biri olan Malik əl-Əştər içdiyi bal şərbətindən zəhərlənib əl-Qəlzumda ölmüşdü. Bəzi mənbələr Misirin vergi müfəttişlərindən Xansar adlı bir şəxsin Malik əl-Əştəri zəhərli bal şərbətinə qonaq etdiyini qeyd etsələr də bunun bir sui-qəsd olub olmadığı dəqiq bilinməməkdədir. Malik əl-Əştər hakimlər hadisəsində iştirak etmişdi. Onun ölümü bu hadisədən sonraya təsadüf edir.

Sıffində döyüşlərin dayandırılmasından sonra tərəflər öz aralarında sülh əqdinin bağlanmasının mexanizmini hazırlamaq məqsədiylə məsləhətləşmələr aparmağa başlamışdılar. Əş'as ibn Qeys (r.ə) Əli ibn Əbu Talibin (r.ə) izni ilə Müaviyənin (r.ə) yanına gedib bu mövzuda danışıq aparmışdı. Müaviyə (r.ə) Əş'əsə (r.ə) Qur'anı hakim qılaraq aradakı anlaşmazlığa son qoymağın ən münasib yol olduğunu söyləmişdi. Müaviyə (r.ə) tərəflərin hey'ət təşkil edərək etimad edib inandıqları bir şəxsi tam səlahiyyətlə təmin etdikdən sonra hər iki tərəfin nümayəndələrinin İraq və ya Şama aid olmayan bir ərazidə görüşmələrini təklif etmişdi. Bu heyətlərə başçılıq edən hakimlər öz aralarında Qur'anın hökmlərini əsas götürərək bir qərara gələcək, tərəflər bu qərarın hökmünü qəbul edəcəkdilər. Lakin əvvala bu niyyət anlaşmasının rəsmi olaraq sənədləşdirilməsi lazım idi ki, bunun üçün ilkin görüşmələr olmalı idi. Əli ibn Əbu Talib (r.ə) bacarıqlı sərkərdə və cəsur döyüşçü idi. Müaviyə (r.ə) problemi hərbi müstəvidən özü üçün daha əlverişli və manevr imkanları daha çox olan siyasi müstəviyə keçirmək arzusunda idi və buna nail olmuşdu. Əş'əs (r.ə) Müaviyənin (r.ə) fikrini xəlifəyə çatdıranda Əli ibn Əbu Talib (r.ə) buna bir etirazının olmadığını bildirmişdi. Əli ibn Əbu Talib (r.ə) özünün tam səlahəyyətli vəkili olaraq bu danışıqlara əmisi oğlu Abdullah ibn Abbası (r.ə) göndərmək niyyətində idi. Lakin Mis'ar ibn Fədəki və Zeyd ibn Hısnın liderliyindəki

kufəlilər buna etiraz etdilər. Xəlifənin Malik əl-Əştər və ya Əhnəf ibn Qeysi (r.ə) elçi heyətinə başçı təyin etmək istəyi də etirazla qarşılandı. Etiraz edənlər bu məsələlərə heç qarışmamış bir şəxsin səlahiyyətli vəkil təyin olunmasında israr edərək Əbu Musa əl-Əş'ərinin (r.ə) bu iş üçün daha münasib olduğunu söyləmiş və bunda israr etmişdilər. Əbu Musa (r.ə) xəlifənin əmri ilə Kufə valiliyindən azad edilib Malik əl-Əştər tərəfindən Kufədən qovulduqdan sonra İraqın Urz qəsəbəsində məskunlaşaraq çəkişmələrdən kənar durmuşdu. Əlinin (r.ə) yaxınlarından bəziləri Əbu Musanın (r.ə) yaşlı və sadədil bir adam olduğunu, diplomatik danışıqlarda asanlıqla aldadıla biləcəyini söyləyərək buna etiraz etsələr də Mis'ar və Zeydin ətrafındakı kufəlilər köhnə valiləri Əbu Musa əl-Əş'əridən başqasını hakim olaraq qəbul etməyəcəyini bildirmiş, əks təqdirdə özlərinə tabe olan əsgərlərlə ordunu tərk edəcəklərini söyləmişdilər. Əli ibn Əbu Talib (r.ə) onların təkidli tələblərini qəbul edərək Əbu Musa əl-Əş'ərini özünün səlahiyyətli vəkili olaraq təyin etmişdi. Müaviyə (r.ə) isə öz səlahiyyətli vəkili olaraq Əmr ibn əl-Ası təyin etmişdi. Əmr ibn əl-As (r.ə) niyyət əqdinin mətnini hazırlamaq üçün Əli ibn Əbu Talibin (r.ə) ordugahına gəlmişdi. Niyyət əqdi hər iki tərəfin əsgərlərinə elan ediləcəkdi. Lakin əqdin daha başlığı yazılarkən ciddi bir problemlə qarşılaşıldı. Əmr ibn əl-As "*bu əqd möminlərin əmiri Əli ibn Əbu Taliblə (r.ə) Müaviyə ibn Əbu Süfyan (r.ə) arasındadır*" başlığına etiraz edərək "*möminlərin əmiri*" ibarəsinin mətndə qeyd edilməməsini istəmişdi. O, mətndə xəlifənin də öz adı və atasının adının qeyd edilməsinin daha münasib olacağını bildirmişdi. Əhnəf ibn Qeys (r.ə) bunun mümkün olmadığını, Əlinin (r.ə) həqiqətən möminlərin əmiri olduğunu söyləsə də Əmr bu tələbində təkid etmişdi. Bu anlaşmazlıq danışıqları bitmə nöqtəsinə gətirmiş və həmin günün sonuna qədər danışıqlara fasilə verilmişdi. Danışıqların davam etməsini istəyən Əş'əs ibn Qeysin (r.ə) "*indiki mərhələdə bunun elə bir əhəmiyyəti yoxdur*" deməsinə Əli ibn Əbu Talib (r.ə) "*Allahu Əkbər! Hudeybiyyə günündə mən Allah Rəsulunun (s.ə.v) katibi idim. Məkkə müşrikləri müqavilədəki "Rəsulullah" sözünün silinməsini tələb etmişdilər. Allah Rəsulu (s.ə.v) bu kəlməni silməmi məndən istəmişdisə də mən bunu silməmişdim, o, kəlmənin yerini göstərməyimi söyləyib "Rəsulullah" kəlməsini öz əli ilə silmişdi. Sonra da mənə "sən də buna bənzər bir vəziyyət qarşılaşacaqsan" demişdi. İndi bu bir sünnəmi oldu?*" deyə cavab vermişdi. Əmr ibn əl-As xəlifənin bu sözünə "*Sübhanallah! Mömin olduğumuz halda sən bizi müşriklərəmi bənzədirsən*" deyə etiraz etmişdi. Nəhayət bu problem Əmrin istəyi üzrə həllini tapmışdı. Tərəflər arasında mətnini aşağıda qeyd etdiyimiz niyyət əqdi bağlanmışdı.

*"Bu qərar Əli ibn Əbu Talib (r.ə) ilə Müaviyə ibn Əbu Süfyan (r.ə) arasındakı xüsuslarla bağlıdır. Əli (r.ə) yanındakılarla birlikdə Kufəlilərin, Müaviyə (r.ə) yanındakılarla birlikdə Şamlıların təmsilçisidir. Biz Allahın kitabındakı hökmlərə tabe olduq və bunun xaricində heç bir şeyin aramızda qərar verməyəcəyi barədə razılaşdıq. Bizim aramızda başdan sona qədər Allahın kitabı ilə hökm ediləcək, bu işdə Allah Rəsulunun (s.ə.v) sünnəsinə müraciət ediləcək və biz Allahın kitabındakı hökmləri bərqərar edəcəyik, bunu xaricindəki hökmləri yox sayacağıq. İki hakim Allahın kitabından hansı hökmü çaxaracaqlarsa biz həmin hökmə tabe olacağıq. Bu hakimlər Əbu Musa Abdullah ibn Qeys əl-Əş'əri əl-Yəməni və Əbu Abdullah Əmr ibn əl-As ibn Vail əs-Seymi əl-Kinani olacaqlar. Bu iki hakim həm Əlidən (r.ə), həm də Müaviyədən (r.ə) özlərinin, ailə fərdlərinin təhlükəsizliyinə dair təminat alacaqlar və verəcəkləri hökmə etiraz edəcək kəslərə qarşı bütün ümmət hakimlərə yardım edəcəkdir. Əbu Musa əl-Əş'əri və Əmr ibn əl-As ümmətin bir daha öz aralarında silahlı toqquşmaya getməməsi üçün Allahın kitabı ilə ən mükəmməl şəkildə hökm edəcəklərinə dair söz verəcəklər. Bu iki hakimin razılığı ilə qarşıdakı ramazan ayına qədər (9 fevral-10 mart 658) hər cür silahlı fəaliyyətə son qoyacaqlar. Onlar arzu edəcəkləri təqdirdə bu müddəti uzada bilərlər. Onların verəcəkləri hökm Kufə əhli ilə Şam əhli arasında ədalətli bir hökm olacaqdır".*

Bu niyyət əqdini Əli ibn Əbu Talibin (r.ə) tərəfindən Əş'əs ibn Qeys (r.ə), Səid ibn Qeys əl-Həmdani, Vərqa' ibn Süməyyə əl-Bəcəli, Abdullah ibn Muxlil əl-İcli, Hucr ibn Ədiyy əl-Kindi (r.ə), Abdullah ibn Tufeyl əl-Amiri (r.ə), Uqbə ibn Ziyad əl-Hədrəmi, Yəzid ibn Hucəyyə ət-Təmimi, Malik ibn Kə'b əl-Həmdani, Müaviyənin (r.ə) tərəfindən isə Əbü'l-Avər əs-Suləmi, Həbib ibn Məsləmə əl-Fıhri (r.ə), Ziml ibn Əmr əl-Uzri, Xumran ibn Malik əl-Həmdani, Əbdurrəhman ibn Xalid ibn Vəlid əl-Məxzumi (r.ə), Səbyi' ibn Yəzid əl-Hədrəmi əl-Ənsari, Utbə ibn Əbu Sufyan və Yəzid ibn Hürr əl-Əbsi adları qeyd olunaraq şahid qismində təsdiq etmişdilər.

Niyyət əqdinin təsdiq olunmasından sonra tərəflər əqd mətninin hər iki ordu arasında oxunmasına qərar vermişdilər. Əş'əs ibn Qeys (r.ə) Əli ibn Əbu Talibin (r.ə) ordugahında gəzərək bir neçə dəfə əqdi oxuyub əsgərlərə elan etmişdi. Lakin bu niyyət əqdi xəlifənin ordusda birmənalı qarşılanmamışdı. Təmim qəbiləsinin liderlərindən Urvə ibn Udəyyə Sıffin döyüşünün insanların deyil, Qur'anın hakimliyinə müraciət edilməsi üçün dayandırıldığını söyləyərək Əş'asa (r.ə) etiraz etmişdi. Urvə ibn Udəyy əsgərlər arasında "*Hökm ancaq Allahındır*"[88]

[88] Yusif surəsi 40.

ayəsini oxuyaraq "*Hakimlik, hökm vermək ancaq Allaha məxsus bir haqdır, siz bu başdan iki adamın hökmünü qəbul etməklə onları Allaha şərik qoşdunuz*" demiş, hətta Əş'as ibn Qeysin (r.ə) üstünə getməkdən belə çəkinməmişdi. Urvənin bu sözləri qısa müddətdə Əli ibn Əbu Talibin (r.ə) ordusunda ağızdan-ağıza gəzərək yayılmağa başlamışdı. Buna etiraz edənlər Əli ibn Əbu Talibdən (r.ə) Sıffində döyüşü dayandırmağı tələb edən şəxslər idilər. Lakin indi yanıldıqlarını anlayaraq peşman olmuşdular. Onlar əslində Qur'anın hakimliyinə müraciət etmək deyərkən bu işin necə olacağı, mexanizmi ilə bağlı hər hansı bir fikir sahibi deyildilər. Təhkim məsələsinə, yəni hər iki tərəfdən hakimlərin təyin edilməsinə də bu səbəbdən qarşı çıxırdılar. Gələcəkdə xaricilər, ərəbcə cəm formasında xəvaric adlandırılacaq bu qrup belə demək mümkünsə nə istədiyini özü də bilməyən bir güruh idi. Lakin Mədinə basqıında iştirak etmiş bu adamların sayı artıq əvvəlki kimi 2-3 min deyildi. Onlar Əli ibn Əbu Talibin (r.ə) ordusunda apardıqları təbliğatla özlərinə xeyli tərəfdar toplaya bilmişdilər. Mə'dən əl-Ənzi, Cə'd əl-Ənzi, Mə'qil ibn Qeys ər-Riyahi, Mis'ar ibn Fədəki, Şəbəs ibn Ri'bi kimi bəzi insanlar Urvə ibn Udəyylə həmfikir olaraq öz adamlarına onun irəli sürdüyü fikirləri aşılamağa başlamışdılar. Onlar xəlifədən dərhal bu əqdi ləğv etəmyi tələb etmiş, əks təqdirdə onun ordusunu tərk edib gedəcəklərini bildirmişdilər. Bəzi insanlar isə Əli ibn Əbu Talibə (r.ə) Malik əl-Əştərin hakimlərin verəcəkləri hökmü qəbul etməyəcəyindən əndişə duyduqlarını bildirməkdə idilər. Əli ibn Əbu Talib (r.ə) belə qarışıq bir vəziyyət qarşısında öz adamlarına xitab etmək zərurətini hiss etmişdi. Xəlifə onlara belə demişdi:

- "*Vallahi, mən sizin razı olmadığınız heç bir şeyə razı olmadım. Razı olduğunuz şeylərdə də mən sizinlə həmfikir oldum. Hər hansı bir mövzuda "bəli" deyib qərar qəbul etdikdən sonra fikir dəyişdirmək, caymaq, geri addım atmaq heç doğru deyil. Sadəcə içində Allaha üsyan və Allahın kitabındakı hökmlərə xələl gətirən şeylər xaric, əgər bu olarsa qərardan caymaq, verilən sözdən dönmək olar. Siz Allahın əmrinə boyun əyməyənlərə qarşı vuruşun, Malik əl-Əştər Allanın əmrinə qarşı çıxmış bir kəs deyildir. Mənə itaətsizlik də etmir. Mən bu adamdan qorxub çəkinmirəm də. Kaş sizin aranızda onun kimi bir-iki nəfər daha olaydı. Mənim sizə olan güvənim, etimadım bir qədər sarsılmışdır. Allahdan sizin doğru qərar vermənizi diləyirəm, beləcə mənim sizə olan etimadımı doğrultmuş olarsınız. Bundan əvvəl mən sizi bəzi məsələrdən çəkindirməyə çalışdım, lakin siz məni dinləmədiniz. Vallahi, siz elə işlər tutdunuz ki, nəticədə qüvvətimiz sarsıldı, əlimizdəki nemətlər getdi, sonra hətta qorxuya da qapıldınız, zillət üstünüzə çökdü. Döyüşdə üstün olmuşdunuz, düşmənin qəlbinə qorxu salmışdınız, düşmən ona vurduğunuz zərbələrin iztirabını hiss etməyə*

*başlamışdı. Onlar döyüşü dayandırmaq üçün Qur'an səhifələrini nizələrinin ucunda havaya qaldıraraq hiyləyə əl atdılar. Siz də onlara arzu etdikləri fürsəti verdiniz. Öz bildiyinzdən geri addım atmadınız və bu işdə dirəndiniz. Bilin ki, bu yanlış addımınızdan sonra bir daha doğru yolu tapa bilməyəcək və sağlam bir qapıdan içəri daxil ola bilməyəcəksiniz".*

*Xəvaricin Meydana Çıxması və Üsyan Hərəkətləri*

Əli ibn Əbu Talib (r.ə) ordusuna Sıffindən hərəkət edib Kufəyə yola düşmək əmrini verəndə hakimlər məsələsinə etiraz edənlər ordudan ayrılmışdılar. Onlar hakimlər məsələsi üçün bağlanmış əqdi qəbul edən əsgərlərə "*siz Allahın əmrinə müxalitfət edən Allahın düşmənləriziniz*" deyərək ayrı bir qrup olaraq İraqa tərəf üz tutmuşdular. Onların sayı 12 mini keçməkdəydi. Bu qruplaşmanın nüvəsini Mədinə basqınında iştirak etmiş kufəlilər və misirlilərin bir qismi təşkil edirdilər. Digər qismi isə hələ də Əli ibn Əbu Talibin (r.ə) yanında olub onun tərəfdarı idilər. Ordudan ayrılan bu 12 min nəfərlik qrup İraqın Hərura qəsəbəsi yaxınlığında qərar tutub barada yaşadıqları üçün həruri adlanmışdılar. Lakin İslam tarixində bu qrup daha çox xaricilər, xəvaric adı ilə məşhur olmuşdur.

Bu qrup, yəni xaricilər əsilndə Cəməl döyüşündən sonra meydana çıxmışdılar. Lakin həmin vaxt tərəfdarları az idi və zəif idilər. Cəməl döyüşündən sonra Həsəkə ibn Əttab və İmran ibn Fudeyl əl-Bərcəmi adlı iki şəxs Cəməl döyüşündə xəlifənin ordusunda vuruşmuş bəzi dəbəviləri yoldan çıxararaq öz ətraflarında toplamışdılar. Onlar özbaşın ordudan ayrılıb İranın Sicistan əyalətinə getmiş və buradakı Zalik şəhərinə silahlı basqın tərtib etmişdilər. Zalikin məcusi əhalisi cizyə ödəməkdən imtina edərək xilafətlə bağladıqları əqdini pozmuşdular. Əli ibn Əbu Talib (r.ə) daxili məsələlərlə məşğul olduğu üçün bu işə müdaxilə etməyə fürsət tapmamışdı. Bu cür hadisələrdə xəlifənin izni olmadan hər hansı bir müdaxilə etmək olmazdı. Buna baxmayaraq sözü gedən dəstə özbaşına Zalikə hücum edərək qiyamçıları məğlub etmiş, mallarını qarət edərək şəhəri ələ keçirmişidlər. Zalikdən aldıqları qənimətlərlə Zərənc şəhərinə gəlmiş, Zərəncin məcusi hakimi qorxduğu üçün onlarla sülh əqdi bağlamışdı. Halbuki onların bu cür bir əqd bağlamaq səlahiyyəti yox idi. Əli ibn Əbu Talib (r.ə) bundan xəbər tutduğu vaxt Əbdurrəhman ibn Cəvr ət-Təyyinin əmrinə verdiyi ordunu onlara qarşı göndərmişdi. Həsəkə ibn Əttab xəlifənin göndərdiyi əmirə itaət edib tutduğu işdən çəkinmək yerinə hücum edib Əbdurrəhman ibn Cəvri ömdürmüşdü. Əli ibn Əbu Talib (r.ə) Abdullah ibn Abbasa (r.ə) məktub yazaraq Sicistandakı xəvaricə qarşı ordu göndərməsini əmr etmişdi. Abdullah ibn Abbas (r.ə) Ri'bi ibn Qas əl-Ənbari və Hısn ibn əl-Hürr əl-Ənbarinin

əmrinə dörd min nəfərlik ordu verərək Sicistana göndərmişdi. Bu ordu Sicistandakı xariciləri məğlub edərək əksəriyyətini qılıncdan keçirmiş və Sicistanda xilafətin hakimiyyətini yenidən bərqərar etmişdi.

Əbu Bəkrin (r.ə) xilafəti dövründə irtidad hərəkətlərilə baş qaldırmış bədəvi ərəb qəbilələrinin mühüm bir qismi Osman ibn Əffanın (r.ə) hakimiyyəti illərində Kufə və ətraf bölgələrdə məskunlaşmışdılar. Bunlar əsasən Mudar qəbiləsinə mənsub bədəvi çöl ərəbləri idilər. Bu bədəvi qəbilələr yarımadadakı səhralardan İraqın münbit ərazilərinə köçürülüb şəhərlərdə məskunlaşmış olsalar da öz bədəvi adət-ənənələrinə uzun illər boyu sadiq qalmışdılar. Bədəvilər xarakterləri etibarı ilə sərt və qatı məzaclı insanlar idilər. Qəbiləsoy təəssübkeşliyinə olan bağlılıqları nəsillər dəyişsə də aradan qalxmamış, mərkəzi dövlət təhəkkümünə itaət etmək alışqanlığını qazana bilməmişdilər. Öz qəbilə rəislərinə itaətləri, dövlətin təyin etdiyi valiyə olan itaətlərini hər zaman üstələməkdə idi. Əli ibn Əbu Talibin (r.ə) dövründə baş qaldırmış xəvaricin mühüm bir qismi məhz Mudar qəbilə ittifaqına mənsub bədəvi oymaqları arasından çıxmışdı. Riddə hadisələrinin üzərindən elə də uzun müddət keçməmişdi və hələ də zehnlərdə öz yerini qorumaqda idi.

Sıffin döyüşündən sonra xəlifənin ordusundan ayrılıb Hərurada toplanmış xəvariclər Şəbəs ibn Ri’bi ət-Təmimini özlərinə hərbi işlərdə əmir, Abdullah ibn əl-Kəvva əl-Yəşkurini isə namazları qıldırmaq üçün imam seçmişdilər. Onlar xəlifənin yanında qalmış köhnə silahdaşlarına “*sizlər və Şam əhalisi küfrdə bir-birləri ilə yarışan iki ata bənzəyirsiniz. Mə’rufu əmr edib münkəri qadağan etmək üçün idari işlər artıq şura ilə olacaqdır və beyət də ancaq Allahadır*” deyə xəbər göndərmişdilər. Həruradakı xəvaric həm Müaviyə (r.ə) və onun tərəfdarlarını, həm də Əli (r.ə) və onun tərəfdarlarını təkfir edir, küfrə düşməkdə ittiham edirdilər. İki tərəf arasındakı vəziyyət xeyli gərginləşmiş olsa da Əli ibn Əbu Talib (r.ə) xəvaric hücum etmədikcə onlara qarşı güc tətbiq etməmiş və onları yola gətirməyə çalışmışdı. Bu məqsədlə əvvəlcə Qeys ibn Sə’di, sonra Əbu Əyyub əl-Ənsarini (r.ə), daha sonra isə Abdullah ibn Abbası (r.ə) onlarla danışığa göndərmişdi. Abdullah ibn Abbasın (r.ə) xəvariclə apardığı danışığı mənbələr nəql edirlər. Abdullah ibn Abbas özü bu hadisəni belə təsvir etmişdi: “*Mən onların yanına günorta vaxtı getmişdim. Əynimdə Yəmən parçasından tikilmiş gözəl bir paltar vardı. Onlar günortanın istisində istirahət edirdilər. Çox ibadət edir, namaz qılırdılar. Üzlərində yuxusuzluq əlaməti görünürdü. Əlləri ibadət etməkdən dəvənin dizi kimi qabar atmışdı. Məni görən kimi onlardan biri: “Bu əynindəki paltar nədir belə?” dedi. Mən ona: “Yoxsa bununla mənə irad tutursunuz? Mən Allah Rəsulunun (s.ə.v) əynində bundan daha gözəlini*

*görmüşəm və bu ayə nazil olmuşdu: "Allahın öz qulları üçün yaratdığı zinət və təmiz ruziləri haram qılan kimdir?*" (Əraf surəsi, 32). Sonra isə onların arasında aşağıdakı mükalimə olmuşdur.

**Xəvaric:** *Buraya niyə gəlmisən?*

**İbn Abbas** (r.ə): *Buraya sizə Allah Rəsulunun (s.ə.v) əshabı haqqında danışmağa gəlmişəm. O insanlar haqqında ki, vəhy nazil olarkən onların üzərinə nazil olurdu. Halbuki mən onlardan heç birini sizin aranızda görmürəm. Mənə deyin görüm, Allah Rəsulunun (s.ə.v) əmisi oğlu və kürəkəni olan, ona ilk iman edənlərdən biri olan və səhabənin tərəfini tutduğu adama siz nə vermisiz ala bilmirsiz?*

**Xəvaric**: *Biz ona üç məsələdə müxalifik.*

**İbn Abbas** (r.ə): *Hansı məsələlərdir onlar?*

**Xəvaric**: *Əvvəla, Allahın dinində insanları hakim qıldı. Halbuki Allah buyurur: "Hökm ancaq Allahındır"* (Yusif surəsi, 40). *Allahın bu kəlamından sonra insanların hökmdə nə işi ola bilər?*

**İbn Abbas** (r.ə): *Sonra?*

**Xəvaric**: *Əli (r.ə) insanlarla vuruşdu. Amma nə əsir aldı, nə də qənimət. Əgər vuruşduqları kafir idilərsə, malları Əli (r.ə) üçün halal olmalıydı. Yox əgər mömin idilərsə, möminin qanını tökmək haramdır.*

**İbn Abbas** (r.ə): *Sonra?*

**Xəvaric**: *"Əmir əl-möminin" titulundan əl çəkdi. Əgər möminlərin əmiri deyilsə, deməli kafirlərin əmiridir.*

**İbn Abbas** (r.ə): *Ona başqa bir mövzuda etirazınız varmı?*

**Xəvaric**: *Bunlar bizim üçün kifayət edir.*

**İbn Abbas** (r.ə): *Əgər sizə Allahın kitabından və Rəsulunun (s.ə.v) sünnəsindən dəlil gətirsəm, bu tutduğunuz yoldan əl çəkərsiz?*

**Xəvaric**: *Bəli.*

**İbn Abbas** (r.ə): *Allahın dinində insanların hökm verə bilib-bilməməsinə gəldikdə, Qur'anın "Ey insanlar ehramlı ikən ov öldürməyin" deyə başlayıb "aranızdan ədalətli olan iki nəfər hökm versin" deyə bitən ayəsini (Maidə, 95) və "Əgər ər ilə arvadın arasının dəyməsindən ehtiyat edirsəniz kişinin ailəsindən bir, qadının ailəsindən də bir hakim göndərin" (Nisa, 35) ayələrini oxuyun. İndi mən sizdən Allaha and verərək soruşuram deyin insanların bir-birinin qanını tökməsinin qabağını almaq daha əfzəldir, yoxsa qiyməti dirhəmin dörddə biri qədər olan dovşanı öldürməyin və hansısa qadının boşanmasının qarşısını almaqmı daha xeyirlidir? Üstəlik Allah istəsəydi özü hökm verərdi bu haqda, insanların öhdəsinə qoymazdı.*

**Xəvaric**: *Qan tökülməsinin qarşısını almaq daha fəzilətlidir.*

**İbn Abbas** (r.ə): *Sonra, deyirsiniz ki, Əli (r.ə) vuruşdu, amma nə qənimət aldı, nə də əsir götürdü. Deyin, siz də möminlərin anası Ayşəni (r.ə) söyürsünüz? Ya da başqa qadınlarda halal bildiyinizi onda da halal bilirsiniz? Əgər belə fikirləşirsinizsə, deməli kafir olmusunuz. Yox əgər onun möminlərin anası olmadığını iddia edirsinizsə, bu yenə kafir olmusunuz deməkdir. Çünki Allah buyurur: "Peyğəmbər möminlərə öz nəfslərindən daha əvladır, zövcələri də onların analarıdır" (Əhzab, 6). Görürsünüzmü, siz iki zəlalət arasında çaşıb qalmısınız. İndi hansını seçirsiniz seçin. Artıq bu fikrinizdən də əl çəkdiniz deyilmi?*

**Xəvaric**: *Vallahi, bəli.*

**İbn Abbas** (r.ə): *Üçüncü məsələyə gəldikdə, Hudeybiyyə gününü xatırlayın. Suheyl ibn Əmr Peyğəmbərlə (s.ə.v) anlaşıb sülh müqaviləsi bağlamağa gəlmişdi. Müqavilənin mətnini Əli (r.ə) yazırdı. Onlar müqavilədə Peyğəmbərin (s.ə.v) öz adını "Allah Rəsulu Muhəmməd" olaraq yazdırmasına etiraz etdilər və dedilər ki, əgər biz sənin Allahın Elçisi olduğuna inansaydıq səninlə vuruşmazdıq, indi də sülh müqaviləsi bağlamağa ehtiyac qalmazdı. Bundan sonra Peyğəmbər (r.ə) dedi ki, "vallahi siz inansanız da inanmasanız da həqiqət budur ki, mən doğrudan da Allahın Rəsuluyam". Sonra da Əliyə (r.ə) əmr etdi ki, müqavilədə öz adını Muhəmməd ibn Abdullah kimi qeyd etsin. Peyğəmbərin (s.ə.v) müşriklərin bu tələbi ilə razılaşması onu Allahın Rəsulu olmaqdan çıxarmadı. Bu fikrinizdən də əl çəkdinizmi?*

**Xəvaric**: "*Ey İbn Abbas! Müsəlmanların qanını tökməyi Allah haram buyurmuşkən bunu mümkün, lakin təcavüzkara qarşı vuruşmağı qeyri-mümkün sayan, üstəlik vaxtilə Allahın düşmənlərinə kömək etmiş bir adamın hakimliyini Əli (r.ə) necə qəbul edə bilir? Fərz edək ki, hakimlərin rəyinə müraciət etmək doğru bir işdir. Lakin möminlərin qanını tökməyi halal bilən birini hakim olaraq qəbul etmək nə dərəcədə doğru bir işdir? Bu müsəlmanların qətl edilməsinə göz yummaq, Allah və Elçisinin (s.ə.v) düşmənlərinə yaxın olmaqdır ki, bununla Əli (r.ə) haqq yoldan çıxmışdır. Onun öz tərəfindən təyin etdiyi hakim, Əbu Musa qəti qərara gələ bilməyən, təcavüzkara qarşı vuruşmaqdan insanları çəkindirən bir kəs deyilmi? Əli (r.ə) belə bir adamın hakimliyini necə qəbul edə bilir? Əmr ibn əl-As müsəlmanların qanını tökməyi məşru hesab edən bir adam deyilmi? Bu cür adamların hakimliyini qəbul etmək ehramlı ikən ov heyvanını öldürməyi halal bilən bir adamın həmin ov heyvanının qiymətini təyin etməsi ilə razılaşmaq kimi bir şeydir. Bəli, Allah "əgər ər ilə arvadın arasının dəyməsindən ehtiyat edirsəniz kişinin ailəsindən bir, qadının ailəsindən də bir hakim göndərin" (Nisa, 35) buyurur. Fərz edək ki, yəhudi*

*və ya xristian bir qadınla evlənmiş bir müsəlman kişinin ailəsində anlaşmazlıq meydana gəlib. Belə halda həmin kitab əhli qadının yəhudi və ya xristian əqrəbasını şahid olaraq qəbul etmək İslama görə doğru bir qərar olarmı? Elə isə müsəlmanların haram olan qanının tökülməsini halal bilən Əmr ibn əl-Asın hakimliyini necə qəbul edirsiniz? Belə bir əhdnamənin qanunauyğun olduğu barədə Peyğəmbərin (s.ə.v) müşriklərlə Hudeybiyyədə bağladığı əhdnaməni dəlil gətirirsən. Sən əvvəllər qiblənin Qüds olduğunu, sonra Kə'bəyə çevrildiyini bilirsən. Əvvəllər içki içmək haram deyildi, lakin sonradan Qur'anın hökmü ilə haram buyuruldu. Bəraə (Tövbə) surəsinin hökmü ilə müşriklərlə bağlanmış bütün əhdnamələrin, o cümlədən Hudeybiyyə əhdnaməsinin hökmü aradan qaldırılmadımı? İndi necə olsun? Əgər Hudeybiyyə əhdnaməsi sizin üçün hələ də keçərli bir dəlildirsə onda qoy müşriklərlə bağlanmış bütün əhdnamələrin hökmü bərqərar edilsin və Tövbə surəsinin hökmünü də ləğv edin. Həmçinin sənin adamın qoy qibləni yenidən Qüdsə çevirsin".*

Xaricilər təhkim, yəni hakimlər məsələsində Abdullah ibn Abbasın (r.ə) irəli sürdüyü arqumentlərin tutarsız olduğunu iddia edərək qəbul etmirdilər. Abdullah ibn Abbas (r.ə) onlara Hüdeybiyyə sülh müqaviləsi mətnində Məkkə müşriklərinin tələbi ilə Peyğəmbərin (r.ə) "Allah Rəsulu" sözünü "Abdullahın oğlu Muhəmməd" olaraq dəyişdirilməsinə razılıq verdiyini söyləmişdi. Xaricilər Muhəmmədin (s.ə.v) Allah tərəfindən rəsul olaraq seçildiyini, insanların bir qisminin bunu qəbul etməməsinin bu sifəti onun üzərindən qaldırmayacağını söyləyir, xəlifənin isə möminlər tərəfindən seçildiyi üçün "möminlərin əmiri" adlandığını, onun özünün müqavilə mətnində bu titulun qeyd edilməməsi tələbini qəbul etməsilə bu sifətdən məhrum olduğunu bildirirdilər. Bu səbəbdəndir ki, xaricilər Osman ibn Əffanı (r.ə) qətlə yetirərkən də heç tərəddüd etməmiş, sonradan da tutduqları bu işdən ötürü peşmanlıq ərz edən heç bir söz söyləməmişdilər. Onlar xəlifə Qur'anın höklərinə bağlı qaldığı müddətcə ona itaət etməklə mükəlləf olduqlarını, möminlərin əmirinin Qur'anın hökmlərindən ayrıldığı vaxt onu devirmək haqqına sahib olduğunu düşünürdülər. Xəvaric daha sonra Əli ibn Əbu Talibi (r.ə) də bu düşüncə ilə qətlə yetirəcəkdi. Xaricilər üçün bir insanın ənsar və mühacirdən olub İslam və ümmət qarşısındakı keçmiş xidmətlərinin heç bir dəyəri yox idi. Onlar Osmanın (r.ə) öz icraatları səbəbilə, Əlinin (r.ə) isə hakimlər məsələsini qəbul etdiyi üçün şirkə düşdüyünü söyləyir, bununla da onların keçmişdəki saleh əməllərinin puç olduğunu iddia edirdilər. Buna dəlil olaraq isə "*Sənə və səndən əvvəlkilərə (keçmiş peyğəmbərlərə) belə vəhy olunmuşdur: "Əgər (Allaha) şərik qoşsan, bütün əməlin puça çıxacaq və mütləq ziyan çəkənlərdən olacaqsan!"* (Zumər 65)

ayəsini irəli sürürdülər. Bu düşüncə əlbəttə ki, çürük və məsnədsiz idi. Çünki nə Osmanın (r.ə), nə də Əlini (r.ə) icraatları Qur'anın hökmlərinə xilaf deyildi. Qur'anın hökmlərini ən yaxşı bilənlər Allah Rəsulunun (r.ə) səhabələri, mühacir və ənsar idi ki, xaricilər arasında onlardan bir nəfər belə yox idi. Bundan başqa xaricilər Tövbə surəsi 1-2-ci ayələrinin hökmü ilə müşriklərlə bağlanmış Hudeybiyyə və bənzəri sazişlərin hüquqi keçərliliyinin aradan qaldırıldığını, hakimlər hadisəsinin bu tip sazişlərlə müqayisə edilməsinin mümkünsüzlüyünü söyləyərək belə bir hüquqi zəminə oturdula bilinməyəcəyini bildirirdilər. Abdullah ibn Abbasın (r.ə) təhkim məsələsində ərlə arvad arasındakı anlaşmazlığın çözülməsi üçün hər ikisinin ailəsindən ədalətli hakim təyin edilməsinə dair ayəyə istinad etməsini də xəvaric dəlil olaraq qəbul etməmişdi. Belə ki, ayədə iki ədalətli hakimin müsəlman olması şərt qoşulurdu. Halbuki xaricilər Əmr ibn əl-Ası, eləcə də onun təmsil etdiyi tərəfi müsəlmanların əmirinə beyət və itaət etmədikləri üçün bütünlüklə təkfir edirdi, kafir adlandırırdılar. Bu səbəbdən də onlar "*əgər müsəlman kişi kitab əhli qadınla evlidərsə kitab əhli qadının ailəsini təmsil edəni ədalətli hakim olaraq qəbul etmək olarmı?*" deyirdilər. Bu əlbəttə xaricilərin iddiası idi. Aralarındakı dərin ziddiyyətə rəğmən Əli ibn Əbu Talibin (r.ə) özü Müaviyə (r.ə) və tərəfdarlarını, eləcə də Müaviyə (r.ə) də Əli ibn Əbu Talibi (r.ə) təkfir etməmişdilər. Müaviyənin (r.ə) Əmr ibn əl-Ası özünün tam səlahiyyətli nümayindəsi olaraq göndərməsinə də xəlifə bu səbəbdən etiraz etməmişdi. Çünki Əli ibn Əbu Talib (r.ə), eləcə də yanındakı əshab və tabiundan olan şəxslər belə bir hadisənin müsəlmanlar arasında baş verə biləcəyini və bənzər bir vəziyyətdə necə davranılacağını Qur'ana[89] istinadən bilirdilər. Xaricilər isə sadəcə zənnə qapılır və mübtəla olduqları təkfir xəstəliyi onların Allahın kitabını düzgün dərk etmələrinə mane olurdu. Xaricilər tərəflər arasındakı ziddiyyətin çözümünə dair artıq Qur'anda hökm olduğunu, zərurətin bu hökmü tətbiq etmək olduğunu söyləyir, Allahın hökmü olan bir mövzuda insanların hakimliyinə ehtiyac olmadığını bildirirdilər. Xaricilərə görə Müaviyə (r.ə) və ətrafındakılar İslam dinindən çıxmış insanlar idilər. Onlarla ya tövbə edənə, ya da tamamən məhv edilənə qədər vuruşmaq lazım idi.

Abdullah ibn Abbas (r.ə) xəvariclə bu şəkildə mübahisə edərkən Əli ibn Əbu Talib (r.ə) onların yanına gəlmiş və Abdullah ibn Abbasa (r.ə) "*sənə mən gələnə qədər onlarla mübahisəyə girişmə deməmişdim?*" deyəndən sonra xəvaricdən "*sizin lideriniz kimdir?*" deyə soruşmuşdu. Onlar "*əl-Kəvvanın oğludur*" deyəndən sonra xəlifə onun çadırına gedib içəri girmiş və iki rəkat

---

[89] Bax: Hücurat surəsi 9.

namaz qılandan sonra İbn əl-Kəvva və yanındakılara belə müraciət etmişdi: "*Artıq elə bir nöqtəyə gəlib çatdıq ki, burada nəcat tapan, axirətdə də nəcat tapacaqdır. Burada danışarkən haqqa isabət etdirməyən, axirət günü də kor və azğın olacaqdır. İndi söyləyin, bizə qarşı xüruc etmənizin səbəbi nədir?*".

**Abdullah ibn əl-Kəvva**: "*Səbəbi Sıffin döyüşündə hakimlərin qərarına razı olmağı qəbul etmənizdir*"

**Əli ibn Əbu Talib** (r.ə): *Allahı şahidimiz olsun, deyin görək aranızda hakimlər məsələsinə məndən daha çox qarşı olan var idimi? Siz ki, bunu bilirsiniz. Onlar "Qur'anın hökmünə müraciət edək" dedikləri, siz də bunu qəbul etdiyiniz vaxt mən sizə "mən bu adamları uşaqlıq və gənclik dövrlərindən bəri tanıyıram, bunlarla yoldaşlıq etmişəm, bu bir hiylədir" demədimmi? Siz də məni bunu qəbul edənə qədər dilə tutub məcbur etmədinizmi? Sonra mən hakimlərin kim olacağı barədə qəti qərar qəbul etməmişdim. Biz Qur'anın haqlı bildiyini haqlı, haqsız bildiyini də haqsız qəbul edilməsi şərti ilə hakimlərin təyin olunmasına razılıq verdik. Əgər belə olacaqsa buna heç kimin bir etirazı olmayacaq dedik. Amma Qur'anın hökmünə əməl etməyəcəklərsə onlarla aramızda hər hansı bir əhdnin hökmü qalmayacaq*.

**İbn əl-Kəvva**: *Sən bizə insanların hakimliyini qəbul edib etmədiyini söylə.*

**Əli ibn Əbu Talib** (r.ə): *Biz insanların deyil, Qur'anın hakimliyini qəbul etdik. Qur'an isə səhifələrə yazılmış bir kitabdır. Dili yoxdur, danışa bilməz. İnsanlar onu oxuyub danışırlar və ondan hökm çıxarırlar.*

**İbn əl-Kəvva**: *Bəs niyə müəyyən bir möhlət üçün razılıq verdin?*

**Əli ibn Əbu Talib** (r.ə): *Bilməyənlər eşidib agah olsunlar və bu iş üçün hazırlaşsınlar deyə. Həm də bu möhlət vaxtı bəlkə Allah bu insanları islah edər deyə ümid etdik.*

**İbn əl-Kəvva**: *Bunu doğru söylədin, haqqın var. Lakin biz hakimlər məsələsinə razılıq verməklə günaha batdıq və bundan ötürü tövbə etdik. Sən də Allaha tövbə et, Allahdan əvf dilə, biz də sənin yanına qayıdaq.*

**Əli ibn Əbu Talib** (r.ə): *Mən hər bir günahdan ötürü Allaha tövbə edirəm və ondan bağışlanma diləyirəm.*

Bu söhbətdən sonra xəvaricdən 6 min nəfəri hicri 37-ci ilin şaban ayıda (yanvar-fevral 658) Həruranı tərk edərək Kufəyə qayıtmışdılar. Bunların arasında onların liderlərindən Şəbəs ibn Ri'bi, Mirdas ibn Udəyyə, Abdullah ibn əl-Kəvva da var idi. Geri qalan 6 min nəfəri isə Qur'andakı bəzi ayələri öz bildikləri kimi təvil edərək xəlifyə qarşı xürucda israr etmiş və İraqın Nəhrivan adlanan məntəqəsnə gedərək orada qərar tutmuşdular. Xəvaric öz aralarında zəki və xitabət qabiliyyəti yüksək olan bir şəxs kimi tanınmış, çox ibadət etməkdən dizləri döyənək olub çatlamış Abdullah ibn Vəhb ər-Rasibini özlərinə

əmir seçmişdilər. Hurqus ibn Zuheyr, Zeyd ibn Hısn, Həmzə ibn Sənan, Şureyh ibn Əvfa onun ən inanılmış adamlarından idilər. Nəhrivanda dinclik və əmin-amanlıqla oturduqları müddətcə Əli ibn Əbu Talib (r.ə) onlara toxunmamışdı. Kufəyə qayıdıb gələn xaricilər şəhərdə Əli ibn Əbu Taliblə (r.ə) danışıb razılaşdıqlarını, xəlifənin təhkim, yəni hakimlər məsələsi ilə bağlı aldığı qərardan döndüyünü, bu səbəbdən də Kufəyə geri qayıtdıqları sözünü yaymışdılar. Əli ibn Əbu Talib (r.ə) onun adından belə bir yalanın uydurulub danışıldığından xəbər tutanda Kufə məscidində insanlara müraciət edərək bunun şaiyədən başqa bir şey olmadığını, hakimlər məsələsi ilə bağlı gəldiyi qərardan dönmədiyini bildirmişdi. Xəlifənin bunu açıq bir ifadə ilə insanlara bəyan etməsindən sonra xaricilər yenidən Kufəni tərk etməyə başlamışdılar. Xəlifə Abdullah ibn Abbası (r.ə) yenidən onlara nəsihət etmək üçün göndərmiş, Abdullah ibn Abbas (r.ə) xaricilərdən 2 min nəfəri yenidən Kufəyə qaytarmağa nail olmuşdu.

Xaricilər təhkim üçün niyyət əqdinin bağlandığı gündən hakimlərin Əzruhda görüşəcəyi günə qədər keçən altı ay müddətində Əli ibn Əbu Taliblə (r.ə) hakimlər hadisəsilə bağlı qərarından vaz keçməsi üçün münaqişə etmişdilər. Xaricilərin liderlərindən Zura' ibn Bürc ət-Təyyi və Hurqus ibn Zuheyr əs-Sə'di xəlifə ilə görüşərək onu bu qərarından döndərmək üçün dilə tutmuşdular. Lakin Əli ibn Əbu Talib (r.ə) onlara "*Əhd etdiyiniz zaman Allaha verdiyiniz əhdi yerinə yetirin. Allahı özünüzə şahid tutub möhkəm and içdikdən sonra onu pozmayın. Həqiqətən, Allah nə etdiyinizi bilir!*" (Nəhl 91) ayəsini oxuyaraq əhdi pozmasının mümkün olmadığı üçün verdiyi sözdən dönə bilməyəcəyini bildirmişdi. Xəlifəni dilə tuta bilmədiklərini görən bu iki xəvaric ifadələrini sərtləşdirmiş, hətta onu ölümlə hədələməkdən belə çəkinməmişdilər. Bununla belə onlar hakimlərin görüşməsi üçün vədələşilmiş günə qədər Əlinin (r.ə) bu işdən dönəcəyinə dair ümidlərini itirməmişdilər. Onlardan bəziləri Əlinin (r.ə) də könlünün bu işə razı olmadığını, lakin ətrafındakı müharibə əleyhdarı bəzi əmirlərin təzyiqilə bunu açıq ifadə edə bilmədiyini düşünürdülər. Lakin vədələşilmiş gün gəlib çatdığı və hakim heyətinin Kufədən yola çıxdığını görəndə xaricilərlə Əli ibn Əbu Talib (r.ə) arasındakı əlaqələr bütünylə qopmuşdu. Xaricilər Kufə əhalisi bu işə etiraz etmədiyi üçün artıq Kufənin darü'l-küfr olduğunu, əhalisi imandan sonra küfrə dönən bu diyarı tərk edib hicrətin vacib olduğunu söyləməyə başlamışdılar. Buna görə də kiçik qruplarla Kufədən ayrılmağa başlamışdılar.

*Hakimlər Hadisəsi və Nəhrivan Döyüşü*

Hicri 37-ci ilin ramazan ayının (9 fevral-10 mart 658) ilk günlərində Əli ibn Əbu Talib (r.ə) Sıffin əhdnaməsinin şərtlərinə uyğun olaraq Şureyh ibn

Haninin əmrindəki 400 süvarini Kufədən yola çıxarmışdı. Bu dəstədə Əbu Musa əl-Əş'əri (r.ə) və Abdullah ibn Abbas (r.ə) da var idi. Əbu Musa (r.ə) xəlifənin tam səlahiyyətli vəkili idi. Abdullah ibn Abbas (r.ə) isə ona müşavir olaraq təyin edilmişdi. Muaviyə (r.ə) də əhdnamənin şərtinə uyğun olaraq 400 nəfərlik dəstəni Əmr ibn əl-Asın liderliyində yola salmışdı. Mədinədən də bəzi səhabə və tabiun işinə nə ilə nəticələnəcəyini görmək üçün Əzruha gəlmişdi. Hər iki tərəf əvvəlcədən müəyyənləşdirildiyi kimi Dumətu'l-Cəndəldəki Əzruh adlı yerdə görüşmüşdülər. Əzruh Dəməşqlə Kufə arasında, hər iki tərəfə eyni məsafədə olan bir yer idi[90]. Əbu Musa (r.ə) ilə Əmr ibn əl-As iki səlahiyyətli hakim olaraq məsələni müzakirə etmişdilər. Əmr ibn əl-As Əbu Musadan (r.ə) Osma ibn Əffanın (r.ə) məzlum olaraq öldürüldüyü barədə fikrini soruşmuşdu. Əbu Musanın (r.ə) Osmanın (r.ə) məzlum olaraq öldürüldüyü qənaətində olduğunu öyrənəndən sonra Əmr Əbu Musaya (r.ə) Müaviyə (r.ə) və qohumlarının Osmanın (r.ə) qanının qisasını tələb etməkdə haqlı olub olmadıqları barədə fikrini soruşmuşdu. Əbu Musanın (r.ə) onların buna haqqı olduğunu söyləməsindən sona Əmr bu işi ədalətli surətdə yalnız Müaviyənin (r.ə) həll edə biləcəyini söyləmişdi. Daha sonra Əmr ibn əl-As Əbu Musaya (r.ə) Əli ibn Əbu Talibin (r.ə) xəlifəliyinə son qoyulub bu işin Müaviyəyə (r.ə) həvalə edilməsini təklif etmişdi. Lakin Əbu Musa əl-Əş'əri (r.ə) buna qəti surətdə qarşı çıxmışdı. Onlar uzun müzakirələrdən sonra hər şeydən əvvəl bu məsələ üzərində ortaq qərara gəlmişdilər ki, Əli ibn Əbu Talib (r.ə) və Müaviyə (r.ə) tərəflərə başçılıq etdikləri müddətcə müsəlmanlar arasında sarsılmaz sülhün bağlanması artıq mümkün deyildir. Əmr ibn əl-As bu təqdirdə öz oğlu Abdullahın (r.ə) namizədliyini irəli sürmüşdü. O, Abdullah ibn Əmr ibn əl-Asın bütün müsəlmanlar tərəfindən məqbul bir şəxs olaraq görüldüyünü, həm elmi, həm də təqvası ilə bu işə layiq olduğunu bildirmişdi. Lakin Əbu Musa (r.ə) bu təklifi də rədd etmişdi. Əbu Musanın (r.ə) xəlifəlik işini Ömər ibn Xəttabın (r.ə) oğlu Abdullaha (r.ə) həvalə edilməsi təklifini də Əmr ibn əl-As qəbul etməmişdi. Hər iki hakim uzun müzakirələrdən sonra belə qərara gəlmişdilər ki, onlara verilmiş tam səlahiyyətdən istifadə edərək Əli ibn Əbu Talibi (r.ə) xəlifəlik vəzifəsindən, Müaviyə ibn Əbu Süfyanı (r.ə) isə Şam valiliyi və şamlıların əmirliyi vəzifəsindən azad etsinlər. Müsəlmanlar bu iki şəxsin hər ikisinin namizədliyi müzakirə olunmadan şura təşkil edərək özlərinin layiq bildikləri bir şəxsi xəlifə seçsinlər. Bu fikir üzərində həm Əbu Musa (r.ə), həm də Əmr ibn əl-As ittifaq etmişdilər. Onlar öz aralarında razılığa gəldikdən sonra Kufə

---

[90] Əzruh-bu gün İordaniya ərazisində olan bir kənddir.

və Şamdan olan dəstələrin qarşısına çıxaraq uca səslə verdikləri qərarı elan etmək barədə razılığa gəlmişdilər. Əmr ibn əl-As Əbu Musa əl-Əş'əriyə (r.ə) "*sən məndən həm yaşda böyüksən, həm də Allah Rəsulunun (r.ə) səhabələrdən birisən, buna görə də mən ilk söz haqqını sənə verirəm*" deyərək Əbu Musanı (r.ə) irəli vermişdi. Onlar qərarı elan etmək üçün çadırdan çıxıb insanlara xitab etməyə hazırlaşarkən Abdullah ibn Abbas (r.ə) Əbu Musaya (r.ə) "*qoy əvvəlcə Əmr danışsın, sən ondan sonra danış*" desə də Əmr ibn əl-As Əbu Musanın (r.ə) yaşına hörmət etdiyi üçün ondan əvvəl danışmaq istəmədiyini bildirmişdi. Əbu Musa əl-Əş'əri (r.ə) Əzruhdakı 800 nəfərlik camaata xitab edərək belə demişdi:

- *"Ey insanlar! Biz ümmətin xilafət məsələsini nəzərdən keçirdik. Ümmətin işlərinin sülhlə nəticələnməsi, başına gələn bu fəlakətin sovuşub getməsi üçün müəyyən bir qərara gəldik və həmfikir olduq. Qərarımız belədir ki, Əli (r.ə) ilə Müaviyənin (r.ə) hər ikisini vəzifədən uzaqlaşdıraq və xəlifəlik məsələsini yenidən ümmətin təşkil edəcəyi şuraya həvalə edək. Mən burada Əlini (r.ə) və Müaviyəni (r.ə) tutduqları bütün vəzifələrdən azad edirəm. Siz bu işi öz üzərinizə götürün və münasib bildiyiniz birini özünüzə xəlifə seçin".*

Əbu Musadan (r.ə) sonra Əmr ibn əl-As ayağa qalxaraq oradakı insanlara belə xitab etmişdi:

- *"Əbu Musanın (r.ə) dediklərini eşitdiniz. O, səlahiyyətli vəkili olduğu şəxsi vəzifəsindən azad etdi. Mən də səlahiyyətli vəkili olduğum Müaviyəni (r.ə) tutduğu vəzifədə saxlayıram. Çünki o, məzlum olaraq qətlə yetirilmiş Osman ibn Əffanın (r.ə) dostu və vəlisidir. Osmanın (r.ə) yerinə keçməyə layiqdir və haqq sahibidir".*

Əmr ibn əl-Asın bu sözləri Əbu Musa əl-Əş'ərini (r.ə) dərindən sarsıtmışdı. O, Əmr ibn əl-Asa ağır sözlər söyləmiş və Əmr də misli ilə ona cavab vermişdi. Şureyh ibn Hani Əmr ibn əl-Asın üstünə hücum çəkərək əlindəki qırmacla onu qırmaclamış, Əmrin oğlu Abdullah (r.ə) da Şureyhi qırmaclamışdı. Lakin oradakı insanlar araya girərək davanın böyüməsinin qarşısını almışdılar. Sə'd ibn Əbu Vəqqas (r.ə) "*Bu nə işdir başımıza gətirdin ey Əbu Musa? Səni bu tələyə salan nə oldu?*" deyəndə Əbu Musa (r.ə) "*Mən nə edə bilərdim? Görmədinizmi adam necə sözündən döndü?*" deyə cavab vermişdi. Bunu eşidən Abdullah ibn Abbas "*Sənin bir təqsirin yoxdur ey Əbu Musa (r.ə)! Təqsir bu işi sənə tapşırandadır*" demişdi. Əbu Musa (r.ə) ona da "*Bu adam mənə dediklərindən fərqli şeyləri sizə söylədi. Mən nə edə bilərdim axı?*" deyə cavab vermişdi. Bütün bunları müşahidə edən Abdullah ibn Ömər (r.ə) "*Gör bu ümmətin başına nələr gəldi. Bu işə ən son qoşulacaq olan bir adamı qabağa çıxartdılar və iş tapşıdı-*

*lar*". Muhəmməd ibn Əbu Bəkr də Əbu Musanı (r.ə) məzəmmət edərək "*Sənin uzun illər əvvəl ölüb getmən bu gün burda bu işi görməndən daha xeyrli olardı ey Əbu Musa*" demişdi. Bu məzəmmətlərdən sıxılan yaşlı Əbu Musa əl-Əş'əri (r.ə) üzünü Əmr ibn əl-Asa tutaraq "*Allah səni müvəffəq etməsin*" deyə bəddua etmişdi. Heyətlər geri qayıdıb təmsil etdikləri şəxslərə Əzruhda baş verənlər haqqında məlumat vermişdilər. Əbu Musa əl-Əş'əri (r.ə) Məkkəyə getmişdi. Əli ibn Əbu Talib (r.ə) Əzruhda baş verənlərdən agah olduqdan sonra buna çox üzülmüş, kədərlənmişdi. Əli ibn Əbu Talib (r.ə) əvvəlcədən sadəcə Qur'anın hökmünə zidd olmaması şərtiylə hakimlərin qərarı ilə razılaşacağını bildirmişdi. Xəlifə Kufədə insanlara xitab edərək Qur'anın hökmünə zidd olduğu üçün Əzruhda hakimlərin çıxardıqları qərarı rədd etdiyini bildirmişdi. Lakin Kufədə vəziyyət dəyişmişdi. Bəzi insanlar ki, bunların böyük əksəriyyətini Kufədə qalan xəvaric təşkil edirdi, Əzruhda hakimlərin verdikləri qərardan sonra Əli ibn Əbu Talibi (r.ə) tərk edərək ona yardım etməmək qərarına gəlmişdilər. Əli ibn Əbu Talib (r.ə) Kufə məscidinin minbərindən camaata xitab edərkən bir qrup xəvaric onun sözünü kəsib "*Hökm ancaq Allahındır*" (Yusif surəsi 40) ayəsini şüar edərək nümayişkaranə şəkildə məscidi tərk etmişdilər. Əli ibn Əbu Talib (r.ə) onların bu hərəkətinə cavab olaraq xütbəsinə bu sözlərlə davam etmişdi:

- *"Allahu Əkbər! Bu haqq bir kəlmədir, lakin bu haqq kəlmə ilə batili tələb edirlər. Əgər siz bizimlə olan birliyinizə davam etsəniz üstümüzdə bu üç haqqınız var; əvvəla Allahı zikr etmək üçün gəldiyiniz müddətcə məscidlərimizə girməyi sizə qadağan etmərik, ikincisi, bizimlə birlikdə olduğunuz müddətcə sizə beytülmaldan pay ayrılacaqdır və üçüncüsü siz bizimlə vuruşmadığınız müddətcə biz də sizə qarşı silaha əl atmayacağıq. Sizin haqqınızda Allahın əmri həyata keçəcəkdir"*

Xəvariclər öz liderlərindən Şureyh ibn Əvfa əl-Əbsinin Kufədəki evində toplaşaraq bundan sonrakı hərəkət planlarını müzakirə etmişdilər. Onlar Kufədən çıxıb başçıları Abdullah ibn Vəhbin məsləhətilə Nəhrivana getmək qərarına gəlmişdilər. Buradan ətraf bölgələrdəki həmfikirlərinə məktub yazaraq öz yanlarına gəlmələrini istəyəcək və qüvvələrini səfərbər edəcəkdilər. Nəhrivan indiki Bağdad şəhərindən şərqdə, Dəclə çayı üzərində bir məntəqə idi. Kufə xariciləri yola çıxarkən yazdıqları məktubla Bəsrədəki silahdaşlarını öz planlarından agah etmiş və onlardan müsbət cavab almışdılar. Onların hərəkətlərindən xəbər tutan xəlifə Nəhrivan yaxınlığındakı Mədain valisi Sə'd ibn Məs'uda məktub yazaraq tədbirli olmağı tapşırmışdı. Xaricilər Mədainə hücum edib şəhəri zəbt edə bilərdi. Vali xəlifənin məktubunu alandan sonra müdafiə olunmaq üçün deyil, hücum etmək üçün əmri altındakı şəhər qarnizonunu hazır vəziyyətə gətirmişdi.

Sə'd ibn Məs'ud 500 süvari ilə xəvaricə qarşı hərəkətə keçmişdi. Xaricilər qüvvələrini səfərbər edib birləşdirə bilmədikləri üçün Sə'd ibn Məs'udun dəstəsi ilə qarşılaşmaq istəmirdilər. Buna görə də yollarını dəyişərək indiki Bağdad şəhəri ərazisinə tərəf getmişdilər. Sə'd ibn Məs'ud əl-Kərx adlanan məntəqədə xaricilərə hücum etmiş, təqribən bir saat davam edən döyüşdən sonra xaricilər döyüş meydanından qaçmışdılar. Yaxın adamlarının tövsiyəsi ilə vali Sə'd onları təqib etməyərək Mədainə qayıtmışdı. Xaricilər isə gecənin qaranlığından faydalanaraq Dəclə çayını keçib liderləri Abdullah ibn Vəhb ər-Rasibi və əsas qüvvlərinin olduğu Nəhrivana çatmışdılar. Bəsrə xariciləri də Nəhrivana getmək üçün şəhəri tərk etmişdilər. Mis'ar ibn Fədəki ət-Təmiminin liderliyində 500 xaricinin yola çıxdığını öyrənən Bəsrə valisi Abdullah ibn Abbas (r.ə) Əbü'l-Əsvəd əd-Düəlinin əmrindəki silahlı dəstəni onların üstünə göndərmişdi. Lakin Mis'ar ət-Təmimi döyüşdən yayınaraq Nəhrivandakı yoldaşlarına yetişə bilmişdi. Əli ibn Əbu Talib (r.ə) Nəhrivanda toplanmış xaricilər dinclik və sükunətlə orada oturduqları müddətcə onlara qarşı hər hansı bir tədbir görməmiş, əksinə nəsihət edərək onların yenidən orduya qatılmalarına ümid etmişdi. Əli ibn Əbu Talib (r.ə) kufəli tərəfdarlarına xitab edərək belə demişdi:

*Zaman bütün müsibətləri və böyük hadisələrilə üstümüzə gəlməkdədir. Allahdan başqa ilah olmadığına, Muhəmmədin (s.ə.v) Allahın Elçisi olduğuna şahidlik edirəm. Üsyan sonunda peşmanlıq olan bir əməldir və bu əməli işləyən peşmanlıqdan canını qurtara bilməz. Bu iki hakim məsələsi ortaya atıldığı vaxt mən insanları bundan çəkindirməyə çalışdım. Lakin siz mənə yox, öz arzu və istəklərinizə qulaq verdiniz. Lakin indi görürsünüz ki, hər şey bütün çılpaqlığı ilə ortaya çıxmışdır. Siz öz qərarınızın yanlış olduğunu, mən də bu yanlışın nəticələrini görürəm. O iki adamı hakim olaraq siz seçdiniz. Lakin onlar Qur'anın hökmünə əməl etməmişdirlər. Allahın əmrlərini qulaq ardına vurmuş və Qur'anın ləğv etdiyini onlar dirçəltmişdirlər. Bunu edərkən də hidayət yolunda deyil, öz arzu və həvəslərinin göstərdiyi yolda getmişdilər. Onların verdiyi hökm Allahın kitabındakı heç bir dəlilə əsaslanmır. Buna dəlil təşkil edə biləcək, sünnə deyə biləcəyimiz hər hansı bənzər bir hadisə də daha əvvəl baş verməmişdir. Üstəlik bu qərarı yekdilliklə də verməmiş, bu mövzuda ixtilafa düşmüşdürlər. Bu səbəndən də iki hakimin verdiyi hökmün heç bir keçərli tərəfi yoxdur və batil bir qərardır. Bütün bunlardan ötürü, indi siz hərbi səfər üçün hazırlıqlara başlayın və əmr etdiyim gün üçün hazır olun.*

Əli ibn Əbu Talib (r.ə) kufəlilərə hərbi səfər üçün hazırlaşma əmri verməklə yanaşı Nəhrivandakı xaricilərə məzmununu aşağıda qeyd etdiyimiz məktubla müraciət etmişdi:

*“Rəhman və Rəhim olan Allahın adı ilə. Allahın qulu və möminlərin əmiri Əlidən (r.ə) Abdullah ibn Vəhb, Zeyd ibn Hısn və onlarla birlikdə olanlara... Hakim olaraq təyin etdiyiniz iki adam Allahın kitabının xilafına olaraq hökm vermişdirlər. Bu hökmü verərkən Allahın hidayətinə deyil, öz arzu və həvəslərinə uymuşdurlar. Allah Rəsulunun (s.ə.v) sünnəsinə əməl etməmiş, Qur’anın hökmünü icra etməmişdirlər. Buna görə də möminlər onların verdikləri hökmü qəbul etməmişdirlər. Bu məktubu aldığınız vaxt bizim yanımıza gəlin, daha əvvəl tutduğumuz yola qayıdaq və bizə müxalif olanların üstünə birlikdə gedək”.*

Nəhrivandakı xaricilər xəlifənin bu müraciətinə məzmununu aşağıda qeyd etdiyimiz məktubla cavab vermişdilər:

*“...Sən hakimlərin qərarına qəzəblisən, lakin bu qəzəbin Allahın rizasını qazanmaq üçün deyil, öz nəfsin üçündür. Əgər sən özünün küfrə düşdüyünü və bundan ötürü tövbə edib İslama geri döndüyünü qəbul etsən, biz də sənin etdiyin təklifi nəzərdən keçirərik. Yox əgər tövbə etməyi qəbul etmirsənsə biz birbaşa sənin özünə müharibə elan edəcəyik. Allah xainlər güruhunu sevməz”.*

Əli ibn Əbu Talib (r.ə) xəvaricin bu cür mövqe nümayiş etdirməsindən sonra Kufə yaxınlığındakı Nuxeylə adlı yerdə ordugah qurdurmuşdu. O, səfərbərlik işini davam etdirib əyalət valilərinə məktublar yazmış və onlara əmrləri altındakı orduları Nuxeyləyə göndərməyi əmr etmişdi. Əli ibn Əbu Talibə (r.ə) beyət və itaət etmiş bütün vali və əmirlər bu tapşırığı yerinə yetirmişdilər. Yalnız Mədain valisi Sə’d ibn Məs’ud xəlifəyə yazdığı məktubda mədainli müsəlmanların xəlifənin bu müraciətinə münasibətini ifadə etmişdi. Mədaindəki müsəlmanlar Nəhrivanda toplanmış xəvaricdən ehtiyatlanmaqda idilər. Onlar öz evlərini və ailələrini təhlükə ilə üz-üzə qoyaraq Mədaini tərk edib Şam səfərində iştirak etmək istəməmişdilər. Onlar xəlifədən əvvəla Nəhrivandakı xəvaric təhlükəsinin aradan qaldırılması, sonra Şama yürüş edilməsini istəməkdə idilər. Xəlifə onlara yazdığı məktubda Şam diyarındakı təhlükənin xəvariclərin ərz etdikləri təhlükədən daha böyük olduğunu söyləyib bunu sonraya saxladığını bildirsə də baş verən hadisələr Sə’d ibn Məs’ud və onunla həmfikir olan mədainli müsəlmanları haqlı çıxarmışdı. Xaricilər Nəhrivan ətrafındakı məntəqələrdə yaşayan müsəlmanlara müraciət edərək Əli ibn Əbu Talib (r.ə) və onu dəstəkləyənlərin küfrə düşdüklərini təbliğ edirdilər. Onların bu təbliğatını qəbul etməyib əleyhlərinə çıxanları da kafir olmaqla ittiham edib öldürür, malını talan edib qənimət olaraq götürürdülər. Xəvaricin törətdiyi misli görülməmiş bir amansızlıq Əli ibn Əbu Talibi (r.ə) onlara qarşı hərəkətə gətirmişdi. Xaricilərdən bir dəstə süvari tabiundan olan Abdullah ibn Həbbab ibn Ərətə (r.ə) hamilə xanımı ilə birlikdə yol gedərkən rast gəlmiş

və onu sorğu sula etmişdilər. Abdullahın atası Həbbab ibn Ərət (r.ə) Allaha və Rəsuluna (s.ə.v) ilk iman edib İslamı qəbul etmiş mühacirlərdən biri idi. Həbbabın (r.ə) Məkkədə öz imanı uğrunda məruz qaldığı məşəqqətlərdən əvvəlki bölümlərdə bəhs etmişdik. Xaricilər onun oğlu Abdullaha (r.ə) rast gələndə kim olduğunu soruşmuş, o, da "*mən Həbbabın oğlu Abdullaham*" deyə cavab vermişdi. Xaricilər onun kim olduğunu anlayandan sonra demişdilər:

- *Çox yaxşı, elə isə sənin bu baş verənlər barədə mütləq bizə deyə biləcəyin sözün vardır. Çünki atan Allah Rəsulu (s.ə.v) ilə həmsöhbət olmuş, ondan eşitmişdir.*
- *Bəli, mən atamdan Allah Rəsulunun (s.ə.v) belə dediyini eşitmişəm "Vaxt gələcək elə bir fitnə qopacaq ki, insanların bədəninin öldüyü kimi sinələrində qəlbləri ölüb gedəcəkdir. O zaman mömin olaraq axşamlayan adam kafir olaraq səhərə çıxacaq, kafir olaraq səhərə çıxan adam mömin olaraq axşamlayacaqdır".*

Abdullah ibn Həbbab (r.ə) bu sözlərlə əslində xaricilərə nəsihət etmək istəmişdi. Çünki bu hal onların içinə düşdükləri vəziyyətə daha çox bənzəyirdi. Lakin xaricilər bunu öz üstlərinə götürməyərək hədisdə işarə edilən halın Osman (r.ə) və Əlinin (r.ə) halına bənzətməklə təvil etmişdilər. Onlar Abdullahın (r.ə) bu sözündən sonra "*elə biz də bu haqda soruşmaq istəyirdik, de görək Əbu Bəkr (r.ə) və Ömər (r.ə) haqqında nə düşünürsən?*" deyə sual vermişdilər. Abdullah ibn Həbbabın (r.ə) Əbu Bəkrlə (r.ə) Öməri (r.ə) xeyirlə yad etməsindən sonra onlar "*bəs Osmanın (r.ə) xilafətinin əvvəlindəki və sonrasındakı halı, Əlinin (r.ə) isə hakimlər hadisəsinə qədərki halı və sonrası haqqında nə deyə bilərsən?*" deyə sual vermişdilər. Abdullahın (r.ə) Osmanla (r.ə) Əlinin (r.ə) Allah Rəsulu (s.ə.v) yanındakı hörmətləri, İslama etdikləri xidmətləri dilə gətirib hər ikisinin müttəqi və mömin əmirlər olduğunu söyləməsindən sonra xaricilər ona "*sən insanları əməllərinə görə deyil, ad-sanlarına görə dəyərləndirdiyin üçün küfrə düşdün, bu səbəbdən də öldürülməyə layiqsən*" deyərək onun əllərini arxadan bağlayaraq boğazını kəsib öldürmüşdülər. Xaricilər Abdullah ibn Həbbabın (r.ə) hamilə xanımının yalvarmasına məhəl qoymadan onu da eyni şəkildə öldürmüşdülər. Nəhrivan xariciləri alınları və dizləri səcdə etməkdən qaralıb döyənək olacaq qədər ibadətə düşkün, sahibindən izinsiz ağacın altına düşmüş xurmanı yedikləri üçün sahibinə dəyərini ödəycək qədər güya ixlaslı idilər. Lakin Qur'an ayələrini öz arzularına görə təvil və təfsir edərək müsəlmanları təkfir edib qanını tökəcək qədər də cahil və zalım insanlar idilər. Əsas şüarları "*hökm ancaq Allahındır*" ayəsi olduğu halda Qur'an ayələrini əlaqəsiz şəkildə yozmaq xaricilərin ən bariz təzahürlərindən idi. Bu kimi hallar-

da öz aralarında ziddəyətə düşəcək qədər tutarsız idilər. Onlar Əli ibn Əbu Talib (r.ə) və Müaviyənin (r.ə) tərəfində olmayaraq onların hər ikisinə qarşı çıxarkən "*Əgər möminlərdən iki dəstə bir-biri ilə vuruşsa, onları dərhal barışdırın. Əgər onlardan biri təcavüzkarlıq etsə, təcavüzkarlıq edənlə Allahın əmrinə (itaətinə) qayıdana qədər vuruşun*" (Hücurat surəsi 9) ayəsini əsas tuturdular. Özlərini ayədə haqqında bəhs olunan bu üçüncü, islahedici tərəf olaraq görürdülər. Lakin ayədə bir-biri ilə vuruşan iki dəstənin də mömin olduğu qeyd olunur. Halbuki Nəhrivan xariciləri istər Əli (r.ə) və ordusundakıları, istərsə də Müaviyə (r.ə) və ordusundakıları təkfir edir, kafirliklə ittiham edirdilər. Baxmayaraq ki, nə Əli ibn Əbu Talib (r.ə) istər Cəməl döyüşündə, istərsə də Sıffində vuruşduğu insanları təkfir etməməkdə, mömin olaraq görməkdə idi. Eləcə də Müaviyə ibn Əbu Süfyan (r.ə) və tərəfdarları bütün ziddiyyətlər və qanlı döyüşlərə baxmayaraq Əli ibn Əbu Talib (r.ə) və ətrafındakı insanları təkfir etməmişdilər.

Əli ibn Əbu Talib (r.ə) Nəhrivan xaricilərinin müsəlmanları bu şəkildə qətl və qarət etməsi hadisələrinin gettikcə artdığı bir vaxta yeni bir Şam səfəri tərtib etmənin xeyli təhlükəli olacağının fərqinə varmışdı. Bu vaxt Kufə yaxınlığındakı Nuxeylə ordugahında 68 min tam təchizatlı ordu toplanmışdı. Xəlifənin ordusunun İraqı tərk edib Şam torpaqlarında olduğu bir vaxtda xəvaricin Kufə və digər iri şəhərlərə basqın edib eyni əməlləri törətməyəcəyinə dair heç kim zəmanət verə bilməzdi. Buna görə də Əli ibn Əbu Talib (r.ə) əvvlcə xəvaric təhlükəsini aradan qaldırmaq qərarına gəldi. Xəlifə orduya Nəhrivana doğru yürüş əmri verdi. Nəhrivanda toplanmış xaricilər üzərlərinə ordunun gəldiyindən xəbər tutduqları vaxt qüvvələrini səfərbər edib döyüş nizamı almışdılar. Əli ibn Əbu Talib (r.ə) xaricilərin ordusu ilə qarşılaşdığı vaxt onlara "*bizim qardaşlarımızı öldümüş qatilləri bizə göndərin, layiq olduqları cəzanı alsınlar, belə etsəniz bizim sizinlə işimiz olmaz, biz Şam diyarına gedərik, sizi isə ümid edirəm ki, Allah islah edər və tutduğunuz bu bəd yoldan dönərsiniz*" deyə xəbər göndərmişdi. Xaricilər xəlifənin bu çağırışına "*hamımız birlikdə onların qatiliyik, öldürülənləri hamımız birlikdə öldürdük, xəbəriniz olsun ki, sizi də eyni aqibət gözləyir*" deyə cavab vermişdilər. Onlar Müaviyəyə (r.ə) də Osmanın (r.ə) qatillərinin təslim edilməsini tələb edərkən belə cavab vermişdilər: "*hamımız Osmanın qatilləriyik*". Əli ibn Əbu Talib (r.ə) Qeys ibn Sə'd ibn Ubadə və Əbu Əyyub əl-Ənsarini (r.ə) onlara nəsihət etmək üçün göndərmişdi. Səhabənin ağsaqqallarından olan yaşlı Əbu Əyyub əl-Ənsarinin (r.ə) onlara etdiyi nəsihətin heç bir faydası olmamışdı. Xaricilər Əlinin (r.ə) təhkim hadisəsilə küfrə düşdüyünü və tövbə etməyəcəyi müddətcə onunla vuruşmaq əzmində olduqlarını bildirmişdilər. Əbu Əyyubun (r.ə) təhkim məsələsinə onların özlərinin təşəbbüs

etdiklərini söyləməsinə isə onlar yanıldıqlarını anlayıb bundan ötürü tövbə etdiklərini bildirərək cavab vermişdilər. Əli ibn Əbu Talib (r.ə) döyüş bayraqlarından birini Əbu Əyyub əl-Ənsariyə (r.ə) verərək xəvaricə belə elan etmişdi: "*sizlərdən kim bizimlə döyüşmək niyyətində deyilsə Əbu Əyyubun (r.ə) bayrağının ətrafına toplansın, onlara toxunulmayacaq, buradan çıxıb Kufəyə və ya Mədainə gedənlərə də toxunulmayacaq*". Əksəriyyətinin inadkarlığına baxmayaraq nəsihətlər xaricilərin bir qisminə təsir etmişdi. Fərvə ibn Novfəl əl-Əşcai xaricilərin liderlərinə "*vallahi, mən Əli (r.ə) ilə nəyin uğrunda vuruşmaq istədiyimizi anlayana qədər onunla vuruşmayacağam*" deyərək 500 nəfər süvari ilə Nəhrivanı tərk edərək Bənd ən-Nəci adlı yerə getmişdi. İki yüz nəfərlik bir qrup da xaricilərdən ayrılıb Kufə yolunu tutmuşdu. Daha sonra 4 min nəfər xarici də döyüşmək istəməyərək Nəhrivanı tərk etmişdi. Aralarında ixtilafın meydana çıxıb qüvvələrinin bölünməyə başlaması xaricilərin liderlərini qəzəbləndirmiş və onlar xəlifənin ordusuna hücum etmişdilər. Əli ibn Əbu Talib (r.ə) də ordusuna hücum əmri vermişdi. Hicri 38-ci il səfər ayının 9-da (15 iyul 658) Nəhrivanda meydana gələn və bir saat davam edən bu döyüşdə xaricilərin demək olar ki, hamısı məhv edilmişdi. Xaricilər bu döyüşdə min nəfər itgi vermişdilər. Liderlərindən Abdullah ibn Vəhb, Hurqus ibn Zuheyr və Şureyh ibn Əvfa da Nəhrivanda öldürülmüşdülər. Əli ibn Əbu Talibin (r.ə) ordusu isə cəmi 7 nəfər itgi vermişdi. Xəlifə öz əsgərlərinə xaricilərdən qalmış əşyaları qənimət olaraq götürməyi qadağan etmişdi. Öldürülən xaricilərin yaxınlarının bu əşya və silahları götürmələrinə izn verilmişdi.

Əli ibn Əbu Talib (r.ə) Nəhrivandan birbaş Şam diyarına yürüş etmək fikrində idi. Lakin ordusundakı kufəli əmirlər və əsgərlər Şam səfəri üçün hazırladıqları bütün hərbi ləvazımatı Nəhrivan döyüşündə sərf etdiklərini söyləmişdilər. Onlar Şam səfəri üçün yenidən hazırlaşmağın zəruri olduğunu bildirəndən sonra Əli ibn Əbu Talib (r.ə) orduya Nuxeylədəki ordugaha qayıtmaq əmrini vermişdi. Nəhrivanda Abdullah ibn Vəhb ər-Rasibidən ayrılaraq Əbu Əyyub əl-Ənsariyə (r.ə) verilmiş döyüş bayrağının ətrafına toplanmış və Nəhrivan döyüşündə iştirak etməmiş təqribən 2 min xəvaric də Nuxeyləyə gəlmişdi. Əli ibn Əbu Talib (r.ə) onlara ayrı bir qrup halında qalmayıb yeni Şam səfərində iştirak etmək üçün öz ordusuna qatılmağı əmr etmişdi. Lakin onlar bundan imtina etmişdilər. Buna görə də xəlifə öz əsgərlərinə Nuxeylə ordugahındakı 2 min nəfərlik silahlı xəvariclə vuruşmaq əmri vermiş və onların tamamına yaxını bu döyüşdə məhv edilmişdi. Beləcə Nəhrivan və Nuxeylə döyüşlərində öldürülmüş xaricilərin sayı 3000-ə çatmışdı.

Əli ibn Əbu Talib (r.ə) kufəli əsgərlərə öz evlərinə getməyib ordugahda hazırlıqları tamamlamaq əmrini versə də onlar dəstələr halında Nuxeyləni tərk edib Kufəyə gəlmiş və ordugaha geri qayıtmamışdılar. Belə ki, ordugahda əmirlər, Mədinədən və digər şəhərlədən gəlmiş əsgərlərdən başqa heç kim qalmamışdı. Lakin bu qüvvə Şam səfəri üçün çox az idi. Əli ibn Əbu Talibin (r.ə) ordusunun əksəriyyəti kufəli əsgərlərdən ibarət idi. Xəlifə özü şəxsən Kufəyə gedib şəhər əhalisini Şam səfəri üçün səfərbər olmağa təşviq etməyə başlamışdı. Xütbələrində dəfələrlə bu barədə kufəlilərə müraciət etsə də onlar üzərlərinə miskinlik çökmüş halda yerlərindən tərpənmək istəməmişdilər. Belə görünür ki, Nəhrivan və Nuxeylədə xaricilərin böyük bir qisminin öldürülməsi kufəlilərin əhval-ruhiyyəsinə mənfi təsir göstərmişdir. Çünki öldürülən bu xaricilərin böyük əksəriyyəti kufəli idilər. Kufəlilər hər nə qədər Əlinin (r.ə) tərəfdarı olsalar da bu iki döyüşdə öldürülənlər onların həmşəhərliləri və əqrəbaları idilər. Buna görə də Əli ibn Əbu Talibin (r.ə) ikinci dəfə Şam diyarına hərbi yürüş təşkil etmək istəyi kufəlilərin passivliyi ucbatından baş tutmamışdı.

Nəhrivan və Nuxeylə döyüşlərində verdikləri ağır itgilərə baxmayaraq xaricilər Əli ibn Əbu Talibin (r.ə) xəlifəliyinin sonrakı illərində, əvvəlkilər qədər iri çaplı olmasa da, bir neçə qiyam qaldırmışdılar. Lakin bu qiyamlar mütəşəkkil xarakter daşımamış, daha çox ayrı-ayrı liderlərin ətrafında toplanmış bir neçə yüz silahlının fərdi fəaliyyətindən ibarət olmuşdu. Buna baxmayaraq xəvaric qiyamları Əli ibn Əbu Talibi (r.ə) xeyli məşğul etmiş və əsas hədəfindən yayındırmışdı.

Hicri 38-ci ilin rəbiəlaxir ayında (sentyabr 658) Əşras ibn Əvf əş-Şeybani iki yüz nəfər silahlı xəvaricə liderlik edərək İraqın Dəskərə qəsəbəsində qiyam qaldırmış və Ənbar şəhərinə basqın etmişdi. Xəlifənin Əbrəş ibn Həssanın başçılığı altında göndərdiyi ordu Ənbarda qiyamçılarla döyüşərək onları məğlub etmiş və əksəriyyətini qılıncdan keçirmişdi. Bundan bir qədər sonra Hilal ibn Ulləfə ət-Teymi və Mücahid ibn Ulləfə ət-Teymi adlı iki qardaş 100-150 nəfərlik xarici ilə İranın Masəbzan əyalətində qiyam qaldırmışdılar. Xəlifənin Mə'qil ibn Qeys ər-Rihayinin başçılığı altında göndərdiyi ordu hicri 38-ci ilin cəmaziyələvvəl ayında (oktyabr 658) Masəbzan xariciləri ilə vuruşaraq onları məğlub etmişdilər. Bundan bir qədər sonra Əş'as ibn Bişr əl-Bəcəli adlı xarici yanındakı 180 nəfərlə Hilal ibn Ulləfə və yoldaşlarının öldürüldüyü yerə gələrək onların cəsədlərini dəfn edəndən sonra onların qiyamını davam etdirmişdi. Lakin Əli ibn Əbu Talibin (r.ə) Hucr ibn Ədiyynin başçılğı altında göndərdiyi ordu Əş'əs ibn Bişrin xariciləri ilə vuruşaraq onların əksəriyyətini qılıncdan keçirmişdi. Hicri 38-ci ilin rəcəb ayında (dekabr 658) xaricilərdən Səid ibn Qifl

ət-Teymi iki yüz nəfərlik dəstəsi ilə Mədaindən bir qədər aralıdakı Dərzəncan qəsəbəsinə silahlı basqın tərtib etmişdi. Sə'd ibn Məs'udun əmrindəki xəlifəyə tabe əsgərlər xaricilərin Dərzəncan basqınının qarşısını aldıqdan sonra onları mühasirəyə alaraq hamısını məhv etmişdilər.

Kufəlilərdən Hureys ibn Raşid ən-Naci mənsub olduğu Bəni-Naciyyə qəbiləsindən ətrafına topladığı 300 nəfərlə birlikdə Əli ibn Əbu Talibə (r.ə) itaət etməkdən boyun qaçırmışdı. Hureys ibn Raşid xəlifənin yanına gələrək demişdi:

- *Ey Əli! Bil ki, mən artıq sənin heç bir əmrinə itaət etməyəcəyəm, arxanda namaz da qılmayacağam, sabah isə bu şəhəri tərk edib gedəcəyəm.*

- *Anan səni itirsin ey Hureys! Beyət əhdini pozmaqla Rəbbinə asi olursan, bunun isə ancaq sənə zərəri olar. Səni belə etməyə vadar edən nədir?*

- *Çünki sən Allahın hökmü var ikən insanların hakimliyinə müraciət etdin. İş ciddiləşəndə isə öz haqqını qorumaqda acizlik etdin. Zalım insanlara meyl etdin. Bundan ötürü biz səni qınayırıq, sənə müxalifik və səndən bunun qisasını alacağıq.*

Hureys ibn Raşid ən-Naci xəlifəyə asiliyini bu şəkildə açıq-aşkar bəyan edəndən sonra yoldaşları ilə birlikdə Kufəni tərk edib Bəsrəyə yollanmışdı. Oradan isə qərbi İranın dağlıq ərazisinə, Ram-Hörmüzd bölgəsinə getmişdi. Onlar yol boyu insanları özünə qoşulmağa səsləsələr də müsəlman əhalidən onlara qoşulan olmamışdı. Lakin əhdnamə ilə cizyə ödəməyi öhdəsinə götürmüş zımmilərin bir qismi məmnuniyyətlə xaricilərə qoşulmuşdular. Bunlar əsasən şərqi Mesopotamyadakı kürdlər və cənub-qərbi İranın dağlıları idilər. Hureys ibn Raşidin adamları Niffər qalasına hücum edərək buradakı İslamı yeni qəbul etmiş iranıları öldürmüş, mallarını talan etmişdilər. Əli ibn Əbu Talib (r.ə) Hureys ibn Raşidin ətrafındakı xaricilərin müsəlmanları qətl etdiklərini öyrəndikdən dərhal sonra əmir Mə'qil ibn Qeysin əmrinə ordu verib onun ardınca göndərmişdi. Mə'qil ibn Qeys Hureys ibn Raşidi Ram-Hörmüzd dağlarına qədər təqib etmişdi. Hicri 38-ci ilin (iyun 658-may 659) ortalarında Ram-Hörmüzddə bir saatdan çox davam edən döyüş Hureys ibn Raşidin dəstəsinin ağır məğlubiyyəti ilə nəticələnmişdi. Onlardan çoxu öldürülmüş, bir qismi isə əsir götürülmüşdü.

Xəvaric qiyamlarının ən mühümlərindən biri də Əbu Məryəm əs-Sə'di qiyamıdır. Əbu Məryəm əs-Sə'di Nəhrivan döyüşündən sağ qurtula bilmiş xəvaricdən biri idi. O, bir neçə yoldaşı ilə İranın Şəhrəzur əyalətinə qaçaraq bir müddət dağlıq ərazidə gizlənmişdi. Burada ətrafına topladığı 400 nəfərlik qrupla qiyam qaldıraraq Kufəyə basqın etmək istəmişdi. Onun 400 nəfərlik

dəstəsindəki xaricilərin cəmi 6-sı ərəb mənşəli idi. Digərləri isə məvalidən, İslamı qəbul etmiş iranlılar idilər. Hicri 38-ci ilin ramazan ayında (fevral 659) dəstəsi ilə Kufəyə tərəf irəliləyən Əbu Məryəm əs-Sə'di Əli ibn Əbu Talibin (r.ə) xəbərdarlığına rəğmən niyyətindən daşınmamışdı. Nəhayət Kufə yaxınlığında xəlifənin Şureyh ibn Haninin başçılığında göndərdiyi 600 əsgər Əbu Məryəm əs-Sə'dinin dəstəsi ilə döyüşə girərək onları məğlub etmişdi. Bu döyüşdə Əbu Məryəmin özü də daxil olmaqla xaricilərin əksəriyyəti öldürülmüş, sadəcə 50 nəfər təslim olaraq əsir götürülmüşdü.

*Əmr ibn əl-Asın Misir Valiliyinə Təyin Olunması*

Əli ibn Əbu Talib (r.ə) xəlifə seçiləndən sonra bəzi əyalətlərin valilərini dəyişmiş, yeniləri ilə əvəz etmişdi. Misirə Qeys ibn Sə'd ibn Ubadəni vali təyin etmişdi. Lakin Misirdəki Xərbəta adlı qəsəbənin sayı təqribən 10 min nəfərə yaxın olan müsəlman əhalisi yeni valiyə itaət etməyərək Osmanın (r.ə) qatilləri cəzalandırılmayana qədər Əli ibn Əbu Talibə (r.ə) beyət etməyəcəklərini bildirmişdilər. Bununla belə onlar Cəməl və Sıffin döyüşlərində iştirak etməmiş, heç kimin tərəfini tutmamışdılar. Bu 10 min nəfərə Allah Rəsulunun (s.ə.v) əshabından olan Məsləmə ibn Müxəllid əl-Ənsari (r.ə) və Müaviyə ibn Xudeyc əl-Kindi (r.ə) liderlik edirdilər. Bu iki şəxs Ömər ibn Xəttab (r.ə) və Osman ibn Əffanın (r.ə) dövründə Bizans cəbhəsində aparılan döyüşlərdə, Şam diyarı, Misir və Məğribin fəthində mühüm rol oynamış insanlar idilər.

Qeys ibn Sə'din daha əvvlə qeyd etdiyimiz səbəblərdən ötürü vəzifəsindən azad edilməsindən sonra Əli ibn Əbu Talib (r.ə) 25-26 yaşlarında bir gənc olan Muhəmməd ibn Əbu Bəkri Misir valiliyinə təyin etmişdi. Misirlilərin yeni valiyə qarşı layeqd və saymazyana münasibəti səbəbiylə Muhəmməd ibn Əbu Bəkr Misiri bütünlüklə Əli ibn Əbu Talibin (r.ə) iqtidarına tabe etdirə bilməmişdi. Bu səbəbdən də Əli ibn Əbu Talib (r.ə) Sıffin döyüşündən sonra Malik əl-Əştəri Muhəmmədin yerinə Misir canişinliyinə təyin etmişdi. Lakin Osman ibn Əffanın (r.ə) qətli ilə nəticələnmiş Mədinə basqınını tərtib edənlərdən biri olan Malik əl-Əştərin içdiyi bal şərbətindən zəhərlənərək əl-Qəlzumda ölməsindən sonra xəlifə Muhəmməd ibn Əbu Bəkrin Misir valisi olaraq qalmasını münasib bilmiş və bunu məktubla Muhəmməd ibn Əbu Bəkrə bildirmişdi. Lakin Sıffin döyüşü və hakimlər məsələsindəki uğursuzluq, xəvaricə qarşı apardığı mübarizədə hərbi qüvvəsinin əhəmiyyətli ölçüdə tükənməsi Əli ibn Əbu Talibin (r.ə) Misirdəki mövqeyini bütünlüklə zəiflətmişdi. Əzruhdakı hakimlər hadisəsindən sonra Müaviyə (r.ə) öz mövqeyini daha da möhkəmləndirmək üçün misirli müsəlmanların yardımını əldə etmək və Misiri öz itaəti altına almaq

istəmişdi. Bu məqsədlə o, Əmr ibn əl-As, Şurahbil ibn Səmt, Əbdurrəhman ibn Xalid ibn Vəlid, Busr ibn Əbi Ərtat, Əbü'l-Avər əs-Suləmi, Həmzə ibn Sənan əl-Həmdani və digər əmirləri toplayaraq məşvərət etmiş və Misir barədəki düşüncələrini onlara açıqlamışdı. Onlar Misirin ələ keçirilməsinin faydalı olacağını bildirərək bu fikri bəyənmişdilər. Müaviyə (r.ə) bu işin Əmr ibn əl-Asa həvalə olunmasını arzuladığını, bu işin öhdəsindən gələcəyi təqdirdə onun Misir valisi olacağını bildirmişdi. Əmr ibn əl-As bu təklifi məmnunluqla qəbul etmişdi. Çünki o, Misir fatehi idi. Misirə ilk ayaq basmış xilafət ordusuna o, başçılıq etmişdi. Bir müddət Misir valisi olmuşdu. Orada özünün etibar edəcəyi adamların varlığını bilirdi. Müaviyə ibn Əbu Süfyan (r.ə) daha sonra Məsləmə ibn Müxəllid (r.ə) və Müaviyə ibn Xudeycə (r.ə) məktub yazaraq onları öz planlarından agah etmişdi. Məsləmə və İbn Xudeyc yazdıqları cavab məktubunda bundan məmnun olacaqlarını bildirib Əmr ibn əl-As Misirə gələndə ona yardım edəcəklərini vəd etmişdilər. Müaviyə onların müsbət cavabını alandan sonra Əmr ibn əl-Ası hicri 38-ci ilin səfər ayında (iyul 658) 6 minlik ordu ilə Misirə göndərmişdi. O, Əmr ibn əl-Asa bu işi tələsgənliyə yol vermədən, mümkün qədər qan axıtmadan həll etməsini, sadəcə ona hücum ediləcəyi təqdirdə döyüşə girməsini tövsiyə etmişdi. Əmr ibn əl-As ordusu ilə Misirə daxil olandan sonra Xərbəta camaatı, eləcə də Misirin digər yerlərindən bir çox silahlı qrup gəlib onun ordusuna qatılmışdı. Əmr ibn əl-As Muhəmməd ibn Əbu Bəkrə Müaviyənin (r.ə) özü ilə gətirdiyi aşağıdakı məzmunlu məktubunu göndərmişdi.

*"Azğınlığın və haqsızlığın sonu böyük bir bəladır. Haqsız yerə qan tökən kəs dünyada qisasdan, axirətdə isə əzabdan yaxa qurtara bilməz. Biz sənin Osmana qarşı ən şiddətli şəkildə müxaliflik edənlərdən biri olduğunu bilirik. Siz bir zamanlar Osmana etdiklərinizi etdiniz. Sən zənn edirdin ki, mən sənin etdiklərindən xəbərsizəm. Nəhayət gəlib mənim əyalətimə qonşu bir əyalətin valisi oldun. Halbuki valilik etdiyin ölkədə mənim tərəfdarlarım səninkilərdən çoxdur. İndi mən sənə qarşı elə bir ordu göndərmişəm ki, döyüşçüləri səninlə vuruşmağı Allaha yaxınlaşmaq üçün bir vəsilə hesab edirlər. Harada olmağından aslı olmayaraq Allahın intiqamı gəlib səni tapacaqdır. Vəssəlam".*

Əmr ibn əl-As həmçinin özü də Muhəmməd ibn Əbu Bəkrə məktub yazmışdı. Əmr ibn əl-As Muhəmməd ibn Əbu Bəkrə onun ölümünün öz əlindən olmasını əsla arzu etmədiyini, Şam diyarından gələn əsgərlərin əlinə keçəcəyi təqdirdə mütləq öldürüləcəyini, misirlilərin ona yardım etməyəcəyini bildirib Misiri tərk edib getməsini tövsiyə etmişdi. Muhəmməd ibn Əbu Bəkr "*əgər Misir sənə lazımdırsa dərhal vəsait və əsgər göndər*" xəbəri ilə birlikdə

Müaviyə (r.ə) və Əmr ibn əl-Asın ona yazdıqları məktubları Əli ibn Əbu Talibə (r.ə) göndərmişdi. Əli ibn Əbu Talib (r.ə) ona cavab məkubunda səbat göstərməyi tövsiyə etmiş və yardım göndərəcəyini bildirmişdi. Muhəmməd ibn Əbu Bəkr xəlifənin yardım vədini alandan sonra həm Müaviyə (r.ə), həm də Əmr ibn əl-Asa ağır ifadələr işlətdiyi cavab məktubları yazmışdı. Əmr ibn əl-As onun asanlıqla təslim olmayacağını anlayıb ordusunu hərəkətə gətirmişdi. Muhəmməd ibn Əbu Bəkr əmirlərindən Kinanə ibn Bişrlə birlikdə 2 min nəfərlik ordu ilə Əmrin qüvvələrinə qarşı çıxmışdı. Bu döyüş Muhəmməd ibn Əbu Bəkrin ordusunun üstünlüyü ilə başlasa da Müaviyə ibn Xudeyc (r.ə) onun ordusunu mühasirəyə salaraq məhv etmişdi. Kinanə ibn Bişr öldürülmüş, Muhəmməd ibn Əbu Bəkr yaralı halda yaxınlıqdakı kəndlərdən birinə sığınmışdı. Müaviyə ibn Xudeyc onun sığındığı evi taparaq Muhəmmədi yaralı və susuz halda əsir götürmüşdü. Muhəmməd ibn Əbu Bəkr onlardan su istəyəndə Müaviyə ibn Xudeycdən "*sən Mədinədə Osmanı öz evində susuz qoyanladan birisən, əgər mən sənə su versəm Allah ömrümün sonuna qədər məni suya həsrət qoysun*" cavabını eşitmişdi. Müaviyə ibn Xudeycin bu sözündən sonra Muhəmməd ibn Əbu Bəkr Müaviyə ibn Əbu Süfyan, Müaviyə ibn Xudeyc, Əmr ibn əl-As və orada olanların hamısını təhqir etməyə başlamışdı. Bundan qəzəblənən Müaviyə ibn Xudeyc Muhəmməd ibn Əbu Bəkri vurub öldürmüşdü. Bəlkə elə onun da istəyi bu idi ki, daha çox iztirab çəkməməsi üçün onu tez öldürsünlər. Əmr ibn əl-Asın ordusunda olan Əbdürrəhman ibn Əbu Bəkr qardaşını labüd ölümdən xilas etmək istəsə də buna nail ola bilməmişdi. Muhəmməd ibn Əbu Bəkrin ailəsi və övladları Mədinəyə göndərilmiş, orada bibiləri Ayşə bint Əbu Bəkrin (r.ə) himayəsində yaşamışdılar. Əbu Bəkrin (r.ə) oğlu Muhəmmədin yaxın adamlarından olan Muhəmməd ibn Əbu Huzeyfə Əmr ibn əl-Asın adamları tərəfindən Əriş qəsrində sıxışdırılaraq yaxalanmışdı. Mədinə basqınında iştirak etmiş misirli qiyamçıların liderlərindən biri olan İbn Əbu Huzeyfə Müaviyə ibn Əbu Süfyanın dayısı oğlu idi. Buna görə də Əmr ibn əl-As ona toxunmayaraq cəzasının Müaviyənin (r.ə) özü tərəfindən verilməsini istəmişdi. O, İbn Əbu Huzeyfəni Şam diyarına göndərmiş, Müaviyə ibn Əbu Süfyan (r.ə) da dayısı oğlunu Fələstindəki bir qalanın zindanında həbsə saldırmışdı. Lakin Muhəmməd ibn Əbu Huzeyfə zindandan qaçıb qurtula bilmişdi. Öz adamları ilə onu təqib edən Abdullah ibn Əmr ibn Zəlam, İbn Əbu Huzeyfəni gizləndiyi bir mağarada yaxalamışdı. Abdullah ibn Zəlam yenidən Müaviyənin (r.ə) yanına göndəriləcəyi təqdirdə Müaviəynin (r.ə) onu yenə əvf edəcəyi əndişəsiylə Muhəmməd ibn Əbu Huzeyfəni qətlə yetirmişdi.

Əli ibn Əbu Talib (r.ə) kufəli tərəfdarlarının miskinliyi və dönüklüyü ucbatından Muhəmməd ibn Əbu Bəkrə vəd etdiyi yardımı vaxında göndərə bilməmişdi. Xəlifə Misirdən gələn həyəcanlı xəbərlərdən sonra Kufə əhalisinə xitab edərək öz yaxın adamları ilə şəhədən bir qədər aralıda əl-Cəra' adlı yerə gedib ordugah quracağını, onların da döyüş ləvazımatlarını hazırlayaraq oraya gəlməsini əmr etmişdi. Səhəri gün günortaya qədər əl-Cəra'da gözləyən xəlifə Kufədən bir nəfərin belə ordugaha gəlmədiyini görüb yenidən şəhərə qayıtmış və insanlara xitab etmişdi. Bəlağət və fəsahət sahibi olan Əli ibn Əbu Talib (r.ə) bütün natiqlik bacarığı ilə kufəlilərə xitab etmiş, onlara bu səfərin zəruri olduğunu izah edərək təşviq etmişdi. Buna baxmayaraq kufəlilər yerlərindən tərpənməmişdilər. Xəlifədən sonra əshabdan Kə'b ibn Malik əl-Ənsari (r.ə) də kufəlilərə xitab etmiş, onları möminlərin əmirinə itaətsizlik etməklə böyük günaha batdıqlarını söyləmişdi. Buna baxmayaraq kufəlilər lazımi köməyi göstərməmişdilər. Əli ibn Əbu Talib (r.ə) Kə'b ibn Malikin (r.ə) əmrinə verdiyi məhdud sayıda əsgərdən ibarət ordunu Misirə, Muhəmməd ibn Əbu Bəkrə kömək üçün göndərmişdi. Fəqət ordu yola rəvan olandan beş gün sonra Əmr ibn əl-Asın Misiri ələ keçirdiyi və İbn Əbu Bəkrin qətlə yetirildiyi xəbərini aldığı vaxt dərhal Kə'b ibn Malikin (r.ə) ardınca çapar göndərib geri qayıtmasını əmr etmişdi. Xəlifə baş verənlərdən xəbərsiz olaraq Misirə gedən yaşlı səhabə Kə'b əl-Ənsarinin (r.ə) orada pusquya düşürülə biləcəyindən əndişə etmişdi. Əmr ibn əl-As Misiri ələ keçirdikdən sonra Müaviyə ibn Əbu Süfyan (r.ə) onu Misir valiyinə təyin etmişdi.

*Müaviyəyə (r.ə) Tabe Əsgərlərin İraqın Bəzi Şəhərlərini Zəbt Etməsi*

Misirin öz hakimiyyəti altına keçməsindən sonra Müaviyə ibn Əbu Süfyan (r.ə) diqqətini müsəlman əhalinin daha sıx yaşadığı İraqa yönəltmişdi. Hicaz əhalisi, ələlxüsus Mədinə əhli ki, bunların arasında xeyli sayda mühacir və ənsar var idi, Əli ibn Əbu Talibə (r.ə) beyət etsələr də baş verən daxili çəkişmələr və silahlı toqquşmaları müsəlmanlar arasındakı fitnə hesab etdikləri üçün heç kimin tərəfində olmamış və bu kimi döyüşlərdə iştirak etməmişdilər. Beləcə Müaviyə (r.ə) Misiri ələ keçirməklə mövqeyini möhkəmləndirmiş və şərtləri özü üçün daha əlverişli hala gətirmişdi. Şam diyarı, Misir, Hicaz və İraq müsəlman əhalinin əksəriyyəti təşkil etdiyi vilayətlər idi. Hicaz əhalisinin bitərəfliyini nəzərə alsaq Müaviyənin (r.ə) Şam və Misiri hakimiyyəti altına almasından sonra Əli ibn Əbu Talibin (r.ə) əlində sadəcə İraq qalmışdı. Kufəlilərin passivliyi və qərarsızlığı xəlifənin İraqdakı hakimiyyətini də sual altında qoyurdu.

Hakimlər hadisəsindən sonra müsəlmanların zehnində xəlifəlik mövzusunda bəzi tərəddüdlər meydana gəlmişdi. Əli ibn Əbu Talibin (r.ə) tam səlahiyyət verib özünə vəkil təyin etdiyi Əbu Musa əl-Əş’ari (r.ə) təhkim hadisəsi vaxtı Əlini (r.ə) xəlifəlik vəzifəsindən azad etmişdi. Əli ibn Əbu Talib (r.ə) bunun bir hiylə nəticəsində meydana gəldiyini söyləyib vəkilinin qərarını rədd etsə də bəzi insanların nəzərində Əli ibn Əbu Talibin (r.ə) xəlifəliyi məşruluğunu, qanuniliyini itirmişdi.  Şam əhalisinin əksəriyyəti təhkim hadisəsindən sonra Müaviyəni (r.ə) xəlifəlik üçün ən münasib namizəd görərək ona beyət etmişdilər. Müaviyə ibn Əbu Süfyan (r.ə) bu vəziyyətdən məharətlə istifadə etmiş, insanların ona beyət etməsi üçün bəzi fəaliyyətlərə girişmişdi. Müaviyə (r.ə) İraqdakı ərəb qəbilələri arasındakı tərəfdarları və adamları vasitəsilə daim İraqdakı vəziyyət barədə məlumat alırdı. O, ilk əvvəl Bəsrə şəhəri və ətrafında yaşayan qəbilələri öz tərəfinə çəkməyi düşünmüşdü. Çünki bəsrəlilərin əksəriyyəti Cəməl döyüşündə Ayşə (r.ə), Təlhə (r.ə) və Zubeyrin (r.ə) tərəfində olduqları üçün bu döyüşdə xeyli zərər görmüşdülər. Cəməl döyüşündən sağ qurtulanların böyük bir qismi Şam diyarına gedərək Müaviyənin (r.ə) ordusuna qatılmışdılar. Müaviyə (r.ə) bəsrəlilərin Osman ibn Əffanın (r.ə) haqsız yerə, fitnəkarlıqla qətlə yetirildiyi və qatillərinin cəzalandırılmasının vacib olduğu qənaətində olduqları barədə məlumatlı idi. Buna görə də o, öz yaxın adamlarından Abdullah ibn Əmr əl-Hədrəmini təlimatlandıraraq Bəsrəyə göndərmişdi. Gənc oğlu ilə birlikdə Bəsrəyə gedən Abdullah əl-Hədrəmi Müaviyənin (r.ə) tövsiyəsinə əməl edərək əsasən Təmim, Mudar və Əzd qəbiləsinə mənsub oymaqları gəzərək bu qəbilələrin nüfuzlu şəxsləri ilə görüşüb söhbət etmişdi. Abdullah əl-Hədrəmi Bəsrəyə gəldiyi vaxt şəhərin valisi Abdullah ibn Abbas (r.ə) Bəsrədə yox idi. O, Ziyad ibn Əbihi öz yerinə vəkil təyin edərək xəlifə ilə görşmək üçün Kufəyə getmişdi. Abdullah ibn Əmr əl-Hədrəmi Bəsrədə Təmim qəbiləsinin məhəlləsinə gedərək bu qəbilənin Osman ibn Əffanın (r.ə) məzlum olaraq qətlə yetirildiyi qənaətində olan liderləri və nüfuzlu adamları ilə bu barədə söhbət etmişdi. Bəsrə qarnizonunun əmiri Dəhhak ibn Qeys əl-Hilali bundan xəbər tutan kimi Abdullah əl-Hədrəminin oturduğu məclisə getmiş və “*bundan əvvəl Təlhə və Zübeyr də bu şəhərə gələrək eyni sözləri söyləmiş, nəticədə bizlər iki qismə bölünüb bir-birimizə qılınc çəkmişdik*” deyərək buna dərhal son qoymasını tələb etmişdi. Lakin Təmim qəbiləsinin nüfuzlu şəxslərindən Abdullah ibn Həzm əs-Süləmi Dəhhakın sözünü kəsərək ona mane olmuş, sonra isə Abdullah ibn Əmr əl-Hədrəmiyə belə demişdi “*biz səninlə həmfikirik və sənin sözlərini təsdiqləyirik, sən bizə Müaviyənin məktubunu oxu*”. Abdullah əl-Hədrəmi öz oğluna Müaviyənin (r.ə) məktubunu oxutmuşdu. Müaviyə

bəsrəlilərə xitabən yazdığı məktubda Osmanın (r.ə) zülmə məruz qalaraq öldürüldüyünü, intiqamının alınmasının zəruri olduğunu, onun necə həlim bir insan olduğunu, bəsrəlilərə qarşı necə lütfkar olduğunu, Osmanın (r.ə) öz canı və malını Allah yolunda sərf etməkdən çəkinməyərək Allah Rəsuluna (s.ə.v) yardım etdiyini qeyd etmişdi. Müaviyənin (r.ə) bəsrəlilərə müraciəti birmənalı qarşılanmamış, bu mövzuda fikirlər haçalanmışdı. Kimi Müaviyənin (r.ə) haqlı olduğunu söyləyib ona yardım etməyin vacibliyini söyləyir, kimi də artıq Əli ibn Əbu Talibə (r.ə) beyət etdiklərini, beyət əhdini pozmanın yolverilməz olduğunu deyirdi. Abdullah ibn Əmr əl-Hədrəmi Bəni-Əzd qəbiləsinin liderlərindən Səbra ibn Şeymana müraciət edərək onu himayə və öz evində qonaq etməsini istəmiş, Səbra ibn Şeyman da onun bu istəyini yerinə yetirmişdi. Bu vaxt Ziyad ibn Əbih də bəsrəliləri Əli ibn Əbu Talibin (r.ə) ətrafında sıx birləşməyə səsləməkdə, Bəsrə beytülmalını qorumağa çağırmaqda idi. Ziyad ibn Əbih Bəsrədə vəziyyətin gedərək gərginləşdiyini görüb məktubla Əli ibn Əbu Talibi (r.ə) şəhərdə baş verənlərdən agah etmişdi. Xəlifə, Ə'yan ibn Dəbiə ət-Təmimini əmrinə verdiyi kiçik hərbi dəstə ilə Bəsrəyə göndərmiş və Ziyad ibn Əbihi məktubla gördüyü bu tədbirdən xəbərdar etmişdi. Ə'yan ət-Təmimi Bəsrəyə gələrək Ziyad ibn Əbihlə görüşmüş və xəlifəyə tərəfdar olan insanları öz ətrafında birləşməyə səsləmişdi. Daha sonra o, Əzd qəbiləsindən Abdullah ibn Əmr əl-Hədrəminin təbliğatına uymuş insanları yanına çağıraraq xəlifəyə olan bey'ətlərini yeniləmələrini tələb etmişdi. Ə'yan ibn Dəbiənin bu istəyi əzdlilərlə təmimlilər arasındakı ziddiyyəti qızışdırmış və meydana gələn silahlı toqquşmada Ə'yan ibn Dəbiə öldürülmüşdü. Ziyad ibn Əbih xəlifəyə məktub yazaraq meydana gələn hadisələri və Ə'yan ibn Dəbiənin başına gələni bildirmişdi. Bəsrədə vəziyyətin bu şəkildə gərginləşdiyini görən Əli ibn Əbu Talib (r.ə) Təmim qəbiləsindən olan tərəfdarlarından Cariyə ibn Qudamə əs-Sə'di ət-Təmimini Bəsrəyə göndərmişdi. Cariyə ibn Qudamə yanındakı 50 nəfər süvari ilə Bəsrəyə gəlib Ziyadla görüşmüşdü. Ziyad Bəsrədəki vəziyyət barədə Cariyə ibn Qudaməyə ətraflı məlumat verəndən sonra Cariyə ibn Qudamə Əzd qəbiləsi liderləri ilə görüşərək onlara öyüd-nəsihət vermiş, xəlifəyə etdikləri bey'əti pozmanın böyük bir günah olduğunu bildirmişdi. Cariyə ibn Qudamə əs-Sə'di Əli ibn Əbu Talibin (r.ə) əzdlilərə xitabən yazdığı məktubu da onlara oxumuşdu. Xəlifə məktubunda bu vaxta qədər baş verənlərdən ötürü əzdliləri qınamaqda, onları tutduqları yoldan çəkindirməkdə, əks təqdirdə özünün şəxsən Bəsrəyə gələcəyi və ikinci bir Cəməl hadisəsinin baş verəcəyi ilə hədələməkdə idi. Əzdlilərin böyük bir qismi Cariyə ibn Qudamənin nəsihətlərinə qulaq verib ona itaət etmişdilər. Daha sonra öz qəbiləsi olan Təmim oymaqlarını gəzən

Cariyə ibn Qudamə onlara da eyni şəkildə nəsihət etmiş, sülh və sükunət içində Bəsrədə yaşamalarını istəmişdi. Təmim və Əzd qəbiləsindən xeyli silahlı insan Cariyənin ətrafında toplanmış və 50 süvari ilə Bəsrəyə gəlmiş Cariyənin gücü artmışdı. O, ətrafındakı adamlarla Abdullah ibn Əmr əl-Hədrəminin üstünə getmişdi. Abdullah əl-Hədrəmi ona tabe olmuş insanlarla birlikdə Cariyə ibn Qudamənin dəstəsi ilə vuruşsa da məğlub olaraq Bəsrə yaxınlığındakı bir qəsrə sığınmış və müdafiə olunmağa başlamışdı. Cariyə ibn Qudamə mühasirəyə aldığı qəsrin oda verilməsini əmr etmiş, Abdullah ibn Əmr əl-Hədrəmi yanındakı 70 döyüşçü ilə həmin qəsrdə yanaraq can vermişdi. Bu xəbər qısa müddət ərzində əyalətlərdəki müsəlmanlar arasında yayılmış və Cariyə ibn Qudamənin insanları yandıraraq öldürməsi böyük narazılığa səbəb olmuşdu. İranın Fars vilayətindəki müsəlmanlar buna etiraz olaraq xəlifənin Kirman şəhərindəki valisi Səhl ibn Huneyfə qarşı çıxaraq ona itaət etməkdən boyun qaçırmış və onu qovmuşdular. Əli ibn Əbu Talib (r.ə) Səhl ibn Huneyfin qovulmasından sonra Abdullah ibn Abbasın (r.ə) tövsiyəsi ilə tədbirliliyi və ədalətliliyi ilə seçilən Ziyad ibn Əbihi Fars və Kirman valiliyinə təyin etmişdi. 4000 nəfər süvari ilə Kirmana gələn Ziyad ibn Əbih burada yenidən nizam-intizamı bərqərar etmişdi. Fars və Kirmandakı ərəb və qeyri-ərəb müsəlmanlar Ziyad ibn Əbihin idarəçiliyindən məmnun qalaraq ona itaət etmişdilər.

Ziyad ibn Əbihin Fars və Kirman valiliyinə təyin olunmasından sonra Əli ibn Əbu Talib (r.ə) Haris ibn Murrə əl-Əbdini bir neçə minlik ordu ilə Hindistana hərbi səfərə yollamışdı. Haris ibn Murrə indiki Pakistanın şərqi, Hindistanın şimal-qərbindəki ərazilərə yürüş edərək zəfər qazanmış, çox sayıda qənimət və əsir əldə edərək ordusu ilə fəth olunmuş ərazidə qalmışdı.

Hicri 39-cu ildə (27 may 659-15 may 660) Müaviyə (r.ə) Ne'man ibn Bəşiri (r.ə) ixtiyarına verdiyi 2000 əsgərlə İraqın Əynu't-Təmr şəhərinə göndərmişdi. Əynu't-Təmrdə Əli ibn Əbu Talibin (r.ə) min nəfərlik ordusu var idi və bunlara Malik ibn Kə'b əl-Ərhəbi komandanlıq edirdi. Şamlıların üzərlərinə gəldiyi xəbərini eşidəndə Əynu't-Təmrdəki kufəli əsgərlər şəhəri tərk edərək Kufəyə getmişdilər. Malik ibn Kə'b bu qaçışın qarşısını almağa çalışsa da müvəffəq ola bilməmiş, yanında sadəcə 100 döyüşçü qalmışdı. O, məktub yazaraq Əli ibn Əbu Talibi (r.ə) vəziyyətdən xəbərdar etmişdi. Əli ibn Əbu Talib (r.ə) kufəli döyüşçüləri Əynu't-Təmrin müdafiəsi üçün təşviq etsə də onlar bu çağırışa qulaq verməmişdilər. Əli ibn Əbu Talib (r.ə) bu hərəkətlərindən ötürü onları ağır sözlərlə qınasa da bunun bir faydası olmamışdı. Malik ibn Kə'b ətrafındakı 100 döyüşçü ilə Əynu't-Təmri müdafiə etmiş və burada şamlılarla iraqlılar arasında şiddətli döyüş baş vermişdi. Mixnəf ibn Suleym əl-Ğamidi Malikin yardım

istəyinə cavab olaraq oğlu Əbdurrəhmanı az sayıdakı süvari ilə Əynu't-Təmrə göndərmişdi. Şamlılar uzaqdan Əbdurrəhmanın süvarilərinin qopardığı tozdumanı görərək böyük bir ordunun Əynu't-Təmrə yardıma gəldiyini düşünüb geri çəkilmişdilər. Malik ibn Kə'b onları bir qədər təqib etdikdən sonra geri qayıtmışdı.

Əynu't-Təmr hadisəsindən bir müddət sonra Müaviyə (r.ə) Süfyan ibn Əvf əl-Ğamidini (r.ə) əmrindəki 6000-lik ordu ilə İraqa göndərmişdi. Süfyan ibn Əvf (r.ə) İraq torpaqlarına daxil olaraq əvvəlcə bugünkü Hadisa və Ramadi şəhərləri arasında yerləşən Hit şəhərinə yürüş etmiş və heç bir müqavimətə rast gəlmədən Hiti ələ keçirmişdi. Daha sonra o, öz ordusu ilə cənuba, Ənbar şəhərinə tərəf istiqamət götürmüşdü. Ənbar şəhərini Əşrəs ibn Həssan əl-Bələvinin əmri altındakı 500 nəfərlik qarnizon qorumaqda idi. Lakin Süfyan ibn Əvfin ordusunun yaxınlaşdığını eşidəndə onlardan sadəcə 100 nəfəri Ənbarın müdafiəsi üçün şəhərdə qalmış, digərləri qaçmışdılar. Əşrəs ibn Həssan əl-Bələvi yanındakı döyüşçülərlə Süfyan ibn Həssanın ordusuna qarşı döyüşə girmiş və öldürülmüşdü. Onun ölümündən sonra döyüşçüləri müqaviməti dayandırmışdılar. Süfyan ibn Əvf əl-Ğamidi Ənbarı ələ keçirmişdi. Hit və Ənbarın şamlılar tərəfindən ələ keçirildiyi xəbərini alan Əli ibn Əbu Talib (r.ə) Kufədən çıxaraq Nuxeylədə düşərgə qurmuş və şəxsən başçılıq edəcəyi hərbi səfər üçün hazırlıqlara başlamışdı. Kufəlilər xəlifəyə "*izn ver bu işi biz görək*" desələr də Əli ibn Əbu Talib (r.ə) onlara "*siz öz işinizi görməkdə aciz adamlarsınız, mənim işimi necə görəcəksiniz?*" deyərək səfər hazırlıqlarını davam etdirmişdi. Əli ibn Əbu Talib (r.ə) Sə'd ibn Qeysi öncü qüvvələrin başında yola çıxardıqdan sonra özü də ordusu ilə Ənbar və Hitə tərəf getmişdi. Xəlifənin ordusu oraya çatanda şamlılar artıq Ənbar və Hiti tərk edərək getmişdilər. Əli ibn Əbu Talib (r.ə) bu iki şəhəri döyüşsüz geri alandan sonra ordusu ilə Kufəyə geri qayıtmışdı.

Hicri 39-cu ilin (27 may 659-15 may 660) qışında Abdullah ibn Məs'ədə əl-Fəzari 1700 şamlı əsgərdən ibarət ordusu ilə İraqdakı Teymə şəhərini ələ keçirmişdi. Əli ibn Əbu Talib (r.ə) ona qarşı 2000 əsgərlə Müsəyyib ibn Nəcibə əl-Fəzarini göndərmişdi. Müsəyyib Abdullah ibn Məs'ədə ilə vuruşaraq onu məğlub etmiş və Abdullah yanındakı az sayıda əsgərlə Teymə yaxınlığındakı istehkama sığınmışdı. Müseyyib istehkamda müdafiə olunanları mühasirəyə almış və istehkamın ətrafına odun yığdıraraq oda vermişdi. Abdullah və əsgərləri yanaraq öləcəklərini anlayanda Müseyyibdən aman istəmişdilər. İstehkamdakıların çoxu Müseyyibin də mənsub olduğu Bəni-Fəzarə qəbiləsindən idilər. Müseyyib onların aman istəklərinə cavab olaraq odu söndürtmüş və onların çıxıb getmələrinə izn vermişdi. Ordusundakı bəzi əmirlər "*sən möminlərin*

*əmirinə xəyanət edirsən*" deyərək buna mane olmaq istəsələr də Müseyyib ibn Nəcibə onları dinləməmişdi. Bu hadisədən qısa müddət sonra Müaviyənin (r.ə) əmirlərindən Dəhhak ibn Qeysin 3000 nəfərlik ordusu ilə xəlifən əmirlərindən Hucr ibn Ədiyyin 4000 nəfərlik ordusu indiki İordaniya ərazisindəki Tədmur adlanan yerdə qarşılaşmışdılar. Burada baş verən döyüşdə hər iki tərəfdən bir neçə nəfər öldürülmüş, gecənin qaranlığında hər iki ordu döyüş meydanını tərk edərək geri çəkilmişdi.

Hicri 39-cu ilin həcc mövsümündə (aprel 660) əyalətlərdəki müsəlmanlar həcc ziyarəti üçün Məkkədə toplaşmışdılar. İraqlı zəvvarlara Abdullah ibn Abbasın (r.ə) qardaşı Qusəm ibn Abbas (r.ə)[91], şamlı zəvvarlara isə Müaviyənin (r.ə) təyin etdiyi Yəzid ibn Şəcərə ər-Rəhavi (r.ə) başçılıq etməkdə idi. Həcc əmirliyi və insanlara namazları qıldırma mövzusunda tərəflər arasında anlaşmazlıq meydana gəlmişdi. Lakin Əbu Səid əl-Xudrinin (r.ə) vasitəçiliyi ilə hər iki tərəf məkkəli Şeybə ibn Osman ibn Əbi Təlhə əl-Əbdərinin bütün zəvvarlara həcc əmirliyi etməsi və namazları qıldırması barədə razılığa gəlmiş və anlaşmazlıq aradan qaldırılmışdı.

Hicri 40-cı ilin (15 may 660-05 may 661) payızında Müaviyə ibn Əbu Süyfan (r.ə) Busr ibn Əbi Ərtatı ixtiyarına verdiyi 3000 əsgərlə Hicaza göndərmişdi. Busrun öz ordusu ilə Mədiyəyə yaxınlaşdığı xəbərini eşidən xəlifənin buradakı valisi Əbu Əyyub əl-Ənsari (r.ə) şəhəri tərk edərək Kufəyə, Əli ibn Əbu Talibin (r.ə) yanına getmişdi. Busr ibn Əbi Ərtat heç bir müqavimətlə rastlaşmadan Mədinəyə daxil olmuşdu. Busr məscidə gələrək buradakı camaata xitab etmiş və onları Osman ibn Əffanın (r.ə) öldürülməsinə mane ola bilmədikləri üçün ağır sözlərlə qınamışdı. Daha sonra ordusu ilə Məkkəyə gedən Busr ibn Əbi Ərtat xəlifənin Məkkə valisi Əbu Musa əl-Əş'arinin (r.ə) öldürüləcəyindən ehtiyat etdiyini eşidəndə "*mən Allah Rəsulunun (r.ə) dostlarını öldürmərəm*" deyərək ona toxunmamışdı. Məkkədən sonra Yəmənə üz tutan Busr ibn Əbi Ərtat buranı da asanlıqla ələ keçirə bilmişdi. Əli ibn Əbu Talib (r.ə) Cariyə ibn Qudamə və Vəhb ibn Məs'udun əmrinə verdiyi 4000 nəfərlik ordunu Busr ibn Əbi Ərtata qarşı Hicaza göndərmişdi. Cariyə ibn Qudamə ilk əvvəl Osman ibn Əffanın (r.ə) qatilləri cəzalanana qədər Əli ibn Əbu Talibə (r.ə) beyət etməyəcəklərinə dair əhd etmiş camaatın olduğunu eşitdiyi Nəcrana gəlmişdi. Cariyə ibn Qudamə nəcranlı bu camaatı qılıncdan keçirərək Yəmənə üz tutmuşdu. Busr ibn Əbi Ərtat Cariyə ibn Qudamənin gəldiyini eşidən kimi Yəməni

[91] Mənbələrdə bu haqda iki fərqi məlumat mövcuddur. Bəzilərində Əli ibn Əbu Talibin (r.ə) bu həcc əmirliyi üçün Qusəm ibn Abbası (r.ə), bəziləri isə Abdullah ibn Abbasın (r.ə) digər qardaşı Ubeydullah ibn Abbası (r.ə) təyin etdiyi qeyd olunmaqdadır.

tərk edərək Məkkəyə getmiş və Cariyə onu təqib etmişdi. Lakin Busr Məkkədə çox qalmayaraq əsgərləri ilə Şam diyarına geri qayıtmışdı. Cariyə ibn Qudamə ordusu ilə Məkkə daxil olaraq məkkəlilərin Əli ibn Əbu Talibə (r.ə) etdikləri beyəti yeniləmələrini tələb etmiş[92] və buna nail olmuşdu. Məkkədən sonra ordusu ilə Mədinəyə yollanan Cariyə ibn Qudamə buranı da ələ keçirməyə müvəffəq olmuşdu.

Bütün bu hadisələr hicri 40-cı ilin (15 may 660-05 may 661) qışında Müaviyə ibn Əbu Süfyanla (r.ə) Əli ibn Əbu Talibin (r.ə) sülh barədə qarşılıqlı razılaşması ilə nəticələnmişdi. Müaviyə (r.ə) və Əli ibn Əbu Talib (r.ə) uzun məktublaşmadan sonra İraq və Hicazın Əli ibn Əbu Talibin (r.ə) Şam və Misirin isə Müaviyənin (r.ə) hakimiyyətində qalması barədə anlaşma əldə etmişdilər. Tərəflər həmçinin əllərində olan girovları da azad etmək barədə razılıq əldə etmişdilər.

Bu hadisədən bir müddət sonra Bəsrə valisi olan Abdullah ibn Abbasla (r.ə) xəlifənin Bəsrə qazılığına təyin etdiyi Əbü'l-Əsvəd əd-Duəli adı ilə tanınan Zalım ibn Əmr əl-Kinani arasında anlaşmazlıq meydana gəlmişdi. Məsələdən xəlifənin də xəbərdar olmasından sonra Abdullah ibn Abbas (r.ə) əmisi oğlu Əli ibn Əbu Talibdən (r.ə) inciyərək vəzifəsindən istefa etmiş və Bəsrəni tərk etmişdi. Əbü'l-Əsvəd əd-Duəli xəlifəyə məktub yazaraq güya Abdullah ibn Abbasın (r.ə) haqsız qazanc əldə etmək üçün beytülmal gəlirlərindən sui-istifadə etdiyini bildirmişdi. Əli ibn Əbu Talib (r.ə) bu xəbəri özünə kimin çatdırdığını bildirmədən Abdullah ibn Abbasdan (r.ə) əl-Cəzirə vilayətindən aldığı malları hansı vəsait hesabına əldə etdiyini soruşmuşdu. Abdullah ibn Abbas (r.ə) bu haqdakı məsnədsiz xəbərləri xəlifəyə Əbü'l-Əsvəd əd-Duəlinin çatdırdığını anlayaraq Bəsrə qazısına "*sən dəvəsini otlağa çıxarıb otara bilməyən çobandan daha qabiliyyətsizsən*" deyərək onu tutduğu işdən ötürü qınamış, daha sonra Əli ibn Əbu Talibə (r.ə) məktub yazaraq Mədinəyə getmək istədiyini, öz istədiyi adamı Bəsrə valiliyinə təyin etməsini bildirmişdi. Abdullah ibn Abbas (r.ə) bu hadisədən sonra vəzifəsindən istefa edib Bəsrəni tərk edərək Mədinəyə getmişdi.

*Əli ibn Əbu Talibin (r.ə) Şəhadəti*

Nəhrivan döyüşündən sonra Əli ibn Əbu Talibin (r.ə) mövqeyi siyasi və hərbi baxımdan zəifləmişdi. Xəlifəni öz təsirləri altına salıb onu istədikləri

[92] Bəzi mənbələrdə verilən məlumatlara görə Cariyə ibn Qudamə Məkkəyə daxil olanda artıq Əli ibn Əbu Talib (r.ə) şəhid olmuş və bu xəbər Məkkəyə də çatmışdı. Məkkəlilər Cariyəyə xəlifə həyatda olmadığı üçün ona necə beyət edə biləcəklərini söyləyəndə Cariyə onlara "*elə isə hamı kimə beyət edibsə siz də ona beyət edin*" deyərək məkkəlilərdən Həsən ibn Əli ibn Əbu Talibə (r.ə) beyət etməyi tələb etmişdi.

kimi istiqamətləndirə bilməyəcəklərini anlayan xaricilər xəlifənin ordusunu tərk etməklə kifayətlənməmiş, ordudakı insanların əhval-ruhiyəsinə və xəlifəyə olan sədaqətlərinə təsir edici təbliğatla məşğul olmağa başlamışdılar. Bu Əli ibn Əbu Talibə (r.ə) və ümumiyyətlə xilafətə qarşı açıq-aşkar təxribat idi. Bu təxribat sadəcə Əliyə (r.ə) qarşı deyildi. Xaricilər həm Əli ibn Əbu Talibi (r.ə), həm də Müaviyə ibn Əbu Süfyanı (r.ə), eləcə də onların ətrafındakı əmirləri zəlalətin liderləri adlandıraraq insanları onları tərk etməyə, ətrafından dağılışıb onları dəstəkləməməyə çağırırdılar. Buna müvəffəq ola bilməyəndə isə Əli ibn Əbu Talibi (r.ə) xəlifə olaraq qəbul edib ona qarşı çıxmayan hər kəsi təkfir etməyə başlamışdılar. İlk başlarda təbliğat xarakterli bu təxribat hərəkətləri vaxt keçdikcə silahlı fəaliyyətə dönməyə başlamışdı. Xaricilər onların təbliğatına, çağırışına qulaq verməyən insanları sadəcə təkfir etməklə kifayətlənmir, kafir olduqlarını iddia etdikləri müsəlmanların canına və malına da təcavüz edir, qətl və qarətlə məşğul olurdular. Onların bu fəaliyyətləri xəlifənin əmrilə Nəhrivan və Nuxeylədə əksəriyyətinin qılıncdan keçirilmələrinə qədər davam etmişdi. Bu iki döyüşdə Əli ibn Əbu Talib (r.ə) xaricilərin əksəriyyətini, ələlxüsus onların liderlərini məhv etməyə müvəffəq olmuşdu. Bu hadisə əmin-amanlığın bərqərar edilməsinə müsbət təsir etmişdisə də bir müddət sonra özünün mənfi təsirlərini də göstərməyə başlamışdı. Belə ki, xaricilərin əksəriyyəti Kufə, Bəsrə və bu iki şəhərin ətraf bölgələrində məskun ərəb qəbilələrinə mənsub idilər. Xəlifənin ordusunun əsasını da bu bölglələrdən olan əsgərlər təşkil edirdilər. Başqa sözlə xaricilərin əksəriyyətilə onların əqrəbalığı var idi. Onların kütləvi şəkildə məhv edilməsi istər kufəlilər, istərsə də digər bölgələrdəki müsəlmanların əhval-ruhiyyəsinə mənfi təsir etmişdi. Kufəlilərin mühüm bir qisminin zehnində xəlifəyə itaət edib etməmə barədə tərəddüd meydana gəlmişdi. Baxmayaraq ki, hadisələrin bu məcraya yönəlməsi Əli ibn Əbu Talibin (r.ə) deyil, kufəlilərin qüsurları səbəbiylə baş vermişdi. Sadalanan səbəblərdən ötürü sonrakı hadisələrdə Əli ibn Əbu Talib (r.ə) möhkəm və əmrə itaət edən ordu toplamaqda böyük çətinliklərlə qarşı-qarşıya qalmışdı.

Xaricilər öz liderlərinin məhv edilməsini həzm edə bilmir, bunun səbəbkarı olaraq Əli ibn Əbu Talibi (r.ə) görürdülər. Ümumiyyətlə isə onların fikrinə görə işlərin bu məcraya yönəlməsinin, müsəlmanların böyük fəlakətlərlə qarşı-qarşıya qalmasının səbəbkarı Əli ibn Əbu Taliblə (r.ə) yanaşı həm də Müaviyə ibn Əbu Süfyan (r.ə) və onu dəstəkləyənlər idilər. Buna görə də xəvaric bu insanlara dərin kin bəsləyir və intiqam arzusu ilə yaşayırdılar.

Xaricilərdən Əbdurrəhman ibn Əmr ibn Mülcəm əl-Himyəri əl-Kindi[93], Bərq ibn Abdullah ət-Təmimi və Əmr ibn Bəkr ət-Təmimi bir gün bir görüşərək söhbətləşmişdilər. Nəhrivanda öldürülmüş dostlarını yad edərək "*onlar bu dünyadan gedəndən sonra yaşamağa dəyərmi? Onlar qınayanların qınağından qorxmadılar. Biz də canımızı fəda edərək bu zəlalət liderlərinin öhdəsindən gəlsək həm insanları onlardan xilas edərik, həm də qardaşlarımızın qisasını alarıq*" demiş, bu iş üçün öz aralarında razılaşmışdılar. İbn Mülcəm Əli ibn Əbu Talibi (r.ə), Bərq ibn Abdullah Müaviyə ibn Əbu Süfyanı (r.ə), Əmr ibn Bəkr isə Əmr ibn əl-Ası qətlə yetirməyi öz öhdəsinə götürmüşdü. Bu üç xarici qətlləri eyni gündə, hicri 40-cı il ramazan ayının 17-sində (24 yanvar 661) törətməyi planlamış və bir-birlərinə söz verərək ayrılmışdılar. Hər üçü bu iş üçün xüsusi olaraq bir qılınc əldə edib həmin günə qədər zəhərli məhlulun içində saxlamışdılar.

İbn Mülcəm Kufəyə gələrək bir müddət şəhərdə qalmış və şəhəri gəzib müxtəlif insanlarla ünsiyyətdə olaraq Kufədəki ümumi ab-havanı öyrənməyə çalışmışdı. Güman ki, planladığı qətli tək başına törədə bilməyəcəyini düşünərək özü ilə əlbir olacaq adam axtarmışdı. İbn Mülcəm əl-Muradi bir gün Teym-Rəbab qəbiləsindən olan insanların məclisində oturarkən onların Nəhrivanda öldürülənlər arasında olan öz qəbilələrinə mənsub şəxsləri xeyirlə yad edib onlar üçün təəssüfləndiyini eşidir. O, burada həm də bu qəbiləyə mənsub Quttam adlı gözəl bir qadını görüb ona vurulur. Quttamın atası və qardaşı da Nəhrivanda öldürülmüşdü. İbn Mülcəm Quttama evlənmə təklif edəndə qadın bunu üçün bəzi şərtlərinin olduğunu bildirmiş və mehr olaraq İbn Mülcəmdən üç min dirhəm, bir kölə, bir kəniz və Əli ibn Əbu Talibin (r.ə) öldürülməsini istəmişdi. İbn Mülcəm Əlini (r.ə) öldürəndən sonra ona qovuşmasının müşkül olduğunu söyləyəndə qadın ona bu işi gizlicə edib sağ qalmanın bir yolunu düşünməsini tövsiyə etmiş, əgər ələ keçib öldürülsə də axirət nemətinə qovuşacağını söyləmişdi. İbn Mülcəm Quttamın bu sözündən sonra ona Kufəyə gəlməkdə əsl məqsədinin Əlini (r.ə) öldürmək olduğunu bildirmişdi. Qadın bunu eşidəndə bu iş üçün İbn Mülcəmə kömək edəcəyini söyləmiş, öz qohumlarından olan Vərdan adlı bir şəxsi məsələdən agah edərək İbn Mülcəmə kömək etməsini istəmişdi. Vərdan bu iş üçün İbn Mülcəmə kömək edəcəyinə dair söz vermişdi. İbn Mülcəm həmçinin Kufədə rast gəldiyi xəvaricdən Şəbib ibn Bəcərə əl-Əşcai adlı bir şəxslə də rastlaşmış, onu məqsədindən agah edərək kömək etməsini istəmişdi. Lakin Şəbib əl-Əşcai bunu xeyli müşkül bir iş olduğunu, əgər bacarsalar belə

[93] Kində qəbiləsinin Bəni-Murad oymağına mənsub bu şəxs daha çox İbn Mülcəm əl-Muradi olaraq tanınmaqdadır.

sağ qala bilməyəcəklərini söyləyib boyun qaçırmışdı. İbn Mülcəm Nəhrivanda öldürülən dostları və əqrəbalarını Şəbib əl-Əşcaiyə xatırlatmış, bunu bir sübh namazı vaxtı, alaqaranlıqda edəcəklərini və heç kimin onları tanımadan aradan çıxa biləcəklərini söyləyərək onu dilə tuta bilmişdi.

Əli ibn Əbu Talib (r.ə) sui-qəsdə uğradığı gecədən əvvəlki gün cümə xütbəsində kufəlilərə xitab edərək belə demişdi:

*"Eşitdiyimə görə Busr ibn Əbi Ərtat əsgərlərilə Yəməni ələ keçirmişdir. Allaha and olsun ki, Busr və ətrafındakıların sizə qalib gələcəyini düşünürəm. Sizə qalib gəlmələrinin səbəbi budur ki, siz imamınıza itaət etmədiniz, onlar isə öz imamlarına itaət etdilər. Siz xəyanət etdiniz, onlar isə etibarlı çıxdılar. Siz öz diyarınızda fitnə-fəsad törətdiniz, onlar isə öz diyarlarını islah etdilər. Onu göndərdim xəyanət etdi, bunu göndərdim xəyanət etdi, topladığı zəkat malını Müaviyəyə göndərdi. Mən sizə etimad edib bir nizə versəm, siz mütləq həmin nizənin qınını da ələ keçirməyə çalışacaqsınız. Allahım, mən bunlardan bezdim, bunlar da məndən bezdilər. Allahım mən bunlardan ikrah etdim, bunlar da məndən ikrah etdilər. Allahım məni bunlardan xilas et, bunları da məndən xilas et"*[94].

Əli ibn Əbu Talib (r.ə) bu xütbəni oxuduğu cümədən sonrakı cüməyə qədər yaşamamış, bir fasiqin vurduğu zərbə nəticəsində şəhid olaraq bu dünyadan köçmüşdü. Həmin cümə gününün gecəsi sui-qəsdçilər hazırlaşmışdılar. Sübh namazının vaxtına az qalmış onlar Əli ibn Əbu Talibin (r.ə) evinin önündə pusqu qurmuş və onun məscidə getmək üçün evdən çıxmasını gözləmişdilər. Xəlifə silahsız olaraq evindən çıxıb uca səslə insanları sübh namazı üçün məscidə səsləyərkən Şəbib onun üzərinə atılaraq qılıncı ilə zərbə endirmişdi. Lakin zərbəsi isabət etməyərək qapıya dəymişdi. Onun ardınca İbn Mülcəm "*ey Əli (r.ə) hökm Allahındır, sənin və ətrafındakıların deyil*" deyərək əvvəlcədən hazırladığı zəhərli qılıncla xəlifənin başına zərbə vurmuşdu. İbn Mülcəmin zərbəsindən sonra qatillər qaçıb gizlənməyə çalışmışdılar. Vərdan öz evinə gedərək həyəcanla gözləməyə başlamışdı. İbn Mülcəm qaça bilmədən ələ keçmişdi. Şəbib Kufədən çıxıb qaçmağa müvəffəq olsa da bir qrup insan onu yaxalamaq üçün təqib etmiş, lakin yolda hədraməvtli bir tanışının köməyi ilə izini azdıra bilmişdi. Vərdan evində həyəcanla gözləyərkən yanına gələn bir əqrəbası onun halından şübhələnərək niyə belə həyəcanlı olduğunu soruşmuş, Vərdan da baş verənləri ona danışmışdı. Həmin adam ona heç bir şey demədən evinə getmiş, qılıncını götürüb geri qayıtmış və ölənə qədər qılıncla Vərdana vurmuşdu.

[94] İmadəddin İsmayıl ibn Kəsir "əl-Bidayə və'n-Nihayə" adlı əsərində bu xütbənin mətnini Ə'məşə (hicri 61-148/miladi 681-765) istinadən qeyd edərək, Ə'məşin bunu Zuheyr ibn Ərqamdan eşidərək nəql etdiyini bildirməkdədir.

Başından axan qan Əli ibn Əbu Talibin (r.ə) saçını və saqqalını qırmızıya boyamışdı. O, bacısı Umm Haninin (r.ə) oğlu Cə'də ibn Hubeyrə əl-Məxzumiyə (r.ə) məscidə gedərək camaata sübh namazını qıldırmasını tapşırmışdı. Əli ibn Əbu Talib (r.ə) onu vuran adamın gətirilməsini istəmişdi. İbn Mülcəm xəvaric yoldaşları ilə birlikdə bir vaxtlar xəlifənin ordusunda xidmət etdiyi üçün xəlifə onu tanımış və demişidi:

- *Ey Allahın düşməni! Mən sənə yaxşılıqlar etməmişdimmi?*

- *Elədir.*

- *Bəs sən niyə bu cinayətə əl atdın?*

- *Mən qılıncımı qırx gün itilədim və Allahdan onun insanların ən şərlisini öldürməsini dilədim.*

- *İnsanların ən şərlisi səndən başqası deyildir və sən elə bu qılıncla da öləcəksən.*

Sonra Əli ibn Əbu Talib (r.ə) yanındakı insanlara belə dedi:

- *Canın əvəzində can. Əgər mən bu yaradan ölsəm onu da məni öldürdüyü kimi vurub öldürün. Əgər ölməyib sağ qalsam mən özüm onun haqqında hökm verəcəyəm. Ey Əbdulmüttəlibin övladları! Qəti olaraq bu işdən ötürü digər insanların qanını axıtmayın. Mənim qatilimdən başqasını əsla qisas üçün öldürməyin. Məni dinlə ey Həsən (r.ə). Mənə vurduğu bu zərbə səbəbiylə ölsəm, qatilimə də eyni şəkildə zərbə vur, lakin ona işgəncə etmə. Çünki mən Allah Rəsulunun (s.ə.v) belə dediyini eşitdim: "Əsla muslə (bədən üzvlərinin kəsilməsi) etməyin, hətta öldürdüyünüz bir qotur köpək belə olsa".*

Cundəb ibn Abdullah (r.ə) Əli ibn Əbu Talibdən (r.ə) "*Allah səni xilas etsin, inşaallah sənə heç bir şey olmaz, lakin əgər sənə nəsə olsa oğlun Həsənə (r.ə) beyət edəkmi?*" deyə soruşanda xəlifə ona belə cavab vermişdi: "*Mənu bunu sizə nə əmr edirəm, nə də bunu sizə qadağan edirəm, siz öz işinizi özünüz yaxşı bilərsiniz".*

Atası üçün ağlayan xəlifənin qızı Umm Kulsum (r.ə) İbn Mulcəmi görəndə ona "*Allahın düşməni, Allah atamı xilas etsin, sənin də cəzanı versin*" demişdi. Bunu eşidən soyuqqanlı qatil İbn Mülcəm "*Sən kimin üçün ağlayırsan? Bu qılıncı min dirhəmə satın aldım, min dirhəm verib zəhərlətdim. Əgər onunla bu şəhərdə yaşayan hər kəsi vursalar biri də sağ qalmaz*" deyə cavab vermişdi.

Əli bin Əbu Talib (r.ə) oğulları Həsən (r.ə), Hüseyn (r.ə) və Muhəmməd əl-Hənəfiyyəni (r.ə) ayrıca yanına çağıraraq onlara vəsiyyətini etmiş, bir gün sonra hicri 40-cı il ramazan ayının 18-i (25 yanvar 661) 63 yaşında vəfat etmişdi. Vəfat edərkən son sözləri "*lə iləhə illallah*" sözünü ruhunu təslim edənə qədər təkrarlaması olmuşdu. Əli ibn Əbu Talibin (r.ə) şəhid olmasından sonra Həsən

ibn Əli (r.ə) atasının vurulduğu qılıncla İbn Mülcəmin başına zərbə endirmiş və onu öldürmüşdü. Kufəli bir neçə adam İbn Mülcəmin cəsədini həsirə bükərək od vurub yandırmışdılar.

Əli ibn Əbu Talibin (r.ə) cənazəsini öz oğulları və qardaşı Cə’fər ibn Əbu Talibin (r.ə) oğlu Abdullah (r.ə) yuyub kəfənləmiş və cənazə namazını oğlu Həsən (r.ə) qıldırmışdı. Əli ibn Əbu Talibin (r.ə) cənazəsi Kufədəki İmarə bağçasındakı məscidin yanında dəfn edilmişdi. O, 4 il doqquz ay xəlifəlik etmişdi.

Əli ibn Əbu Talibə (r.ə) sui-qəsd edildiyi gün Bərq ibn Abdullah ət-Təmimi Dəməşqdə sübh namazı üçün evindən çıxıb məscidə getməkdə olan Müaviyə ibn Əbu Süfyana (r.ə) pusqu quraraq hücum etmişdi. Müaviyənin (r.ə) yanında mühafizəçiləri olduğu üçün Bərqin sui-qəsd cəhdi uğursuz olmuşdu. Onun qılıncla vurduğu zərbə Müaviyənin (r.ə) ombasında dərin, lakin ölümcül olmayan yara açmışdı. Müaviyənin (r.ə) təbibi qanaxmanı dayandırsa da iltihablanmanın qarşısını almaq üçün aparılan müalicə onun səhhətinə pis təsir etmiş və bu yara səbəbiylə Müaviyənin (r.ə) bu hadisədən sonra övladı olmamışdı. Lakin bu hadisəyə qədər onun Yəzid və Abdullah adlı iki oğlu dünyaya gəlmişdi. Buraq ibn Abdullah yaxalanmış və Müaviyə (r.ə) onu sorğu-sual edərkən Bərq "*sənə sevindirici bir xəbərim var, bu gün bir dostum Əlini (r.ə) öldürmüşdür*". Lakin Müaviyə (r.ə) buna sevinməyərək Bərqə "*inşaallah ki, buna müvəffəq olmamışdır*" deyəndə Bərq "*xeyr, mütləq öldürmüşdür, çünki Əlinin (r.ə) yanında onu qoruyan mühafizəçiləri yoxdur*" deyə cavab vermişdi. Bərqin sonrakı aqibəti barədə mənbələrdə iki cür məlumat mövcuddur. Bir məlumata görə onun edam olunduğu qeyd edilməkdədir. Digər məlumata görə isə məqsədinə nail olub öldürə bilmədiyi üçün Müaviyənin (r.ə) ona silahlı basqın törədənlərə verilən cəzanı verdirdiyi, bir əlini və bir ayağını kəsdirərək sərbəst buraxdığı bildirilməkdədir. Bərq ibn Abdullah Bəsrəyə getmiş və orada yaşamağa başlamışdı. O, bir əli və bir ayağı olduğu halda Bəsrədə yaşamış və burada evlənərək övladları olmuşdu. Müaviyənin (r.ə) hakimiyyəti dövründə Bəsrə valiliyinə təyin olunan Ziyad ibn Əbih Bərq ibn Abdullaha "*möminlərin əmirini övladsız qoy, amma özün övladlarınla birlikdə yaşa, eləmi?*" deyərək Bərqin boynunu vurdurmuş, cəsidini isə asdırmışdı.

Əmr ibn əl-Ası öldürmək üçün Misirə gələn Əmr ibn Bəkr ət-Təmimi də həmin gün Misir valisi Əmr ibn əl-Asa sui-qəsd etmək üçün sübh namazı vaxtı valinin namaz qıldırdığı məscidə getmişdi. Əmr ibn əl-As şiddətli qarın ağrısından əziyyət çəkdiyi üçün həmin gün məscidə getməmiş və camaata namaz qıldırmağı şəhər qarnizonunun əmiri Xaricə ibn Əbi Həbibə əl-Amiryə tapşırmışdı. Əmr ibn Bəkr Əmr ibn əl-Ası şəxsən tanımadığı üçün məsciddə cama-

ata namaz qıldıran Xaricəyə hücum edərək zəhərli qılıncı ilə bir neçə zərbə vurmuş və Xaricəni öldürmüşdü. Onu yaxalayaraq Əmr ibn əl-Asın yanına gətirmişdilər. Əmr ibn əl-As nə baş verdiyini anlamaq üçün Əmr ibn Bəkri sorğu-sual edəndə o, sorğu-sual edənin kim olduğunu soruşmuşdu. Ona qarşısındakının Əmr ibn əl-As olduğunu söyləyəndə Əmr ibn Bəkr ət-Təmimi bəs öldürdüyü adamın kim olduğunu soruşmuş və ona bunun Xaricə ibn Əbi Həbibə olduğunu demişdilər. Buna qəzəblənən Əmr ibn Bəkr üzünü Əmr ibn əl-Asa tutaraq "*ey fasiq, vallahi mən səni öldürdüymü zənn edirdim*" deyəndə Əmr ibn əl-As ona "*sən məni öldürmək istədin, amma uca Allah Xaricənin ölməsini istədi*" deyərək özü Əmr ibn Bəkr ət-Təmimini qılıncı ilə vuraraq öldürmüşdü.

Kufəlilər demək olar ki, yekdilliklə Həsən ibn Əlinin (r.ə) xəlifəliyi mövzusunda həmfikir olmuşdular. Əli ibn Əbu Talibin (r.ə) şəhid olmasından iki gün sonra Qeys ibn Sə'd ibn Ubadə əl-Ənsari (r.ə) Kufə məscidində insanlara xitab edərək Həsən ibn Əlinin (r.ə) fəzilətləri və üstün xüsusiyyətlərini sadalamış və ona beyət etməyə çağırmışdı. Həsən ibn Əliyə (r.ə) ilk beyət edən şəxs Qeys ibn Sə'd (r.ə) özü olmuşdu. O, xütbəsini bitirdikdən sonra Həsənə (r.ə) "*sənə Allahın kitabı, Rəsulunun (s.ə.v) sünnəsi və dində fəsad çıxaranlara qarşı vuruşmaq üzrə beyət edirəm*" demişdi. Onun bu sözünə Həsən ibn Əli (r.ə) belə cavab vermişdi: "*Allahın kitabı və Rəsulunun (s.ə.v) sünnəsi hər cür şərti ehtiva etməkdədir. Əlavə bir şərtə ehtiyac yoxdur*". Daha sonra Həsən ibn Əli (r.ə) ona beyət etmək istəyən kufəlilərə müraciət edərək "*siz təslimiyyətlə mənə itaət edəcəksiniz. Mənim vuruşduğumla vuruşacaq, mənim sülh bağladığımla sülh bağlayacaqsınız*" demişdi. Həsən ibn Əlinin (r.ə) bu xitabından sonra Kufənin kişi əhalisindən 70 min nəfər ona beyət etmişdi.

Əli ibn Əbu Talibin (r.ə) vəfat xəbərindən sonra Müaviyə ibn Əbu Süfyan (r.ə) da öz idarəsi altında olan əyalətlərdəki müsəlmanların beyətini almağa başlamışdı. Əslində hakimlər hadisəsindən sonra ətrafındakı insanların əksəriyyəti onu xəlifə olaraq görür və "*möminlərin əmiri*" titulu ilə müraciət edirdilər.

تلك امة قد خلت لها ما كسبت ولكم ما كسبتم ولا تسالون عما كانوا يعملون

"Onlar bir camaat idilər ki, keçib getdilər.
Onların etdikləri əməllər özlərinə, sizin etdiyiniz
əməllər isə sizə aiddir. Onların əməlləri barəsində
sizdən sorğu-sual olunmaz". (Bəqərə surəsi 134)

**Birinci Cildin Sonu**

# İSTİFADƏ OLUNMUŞ MƏNBƏLƏR


- ATÇEKEN, İsmail Hakkı, "Hz. Osman Dönemi İç Olaylarında Mervan b. Hakem'in Rolü", SÜİFD, S. 9, Konya 1999, ss. 315-348.
- AYAR, Kenan, "Hz. Ebû Bekir Dönemi Olaylarında Kur'an'ın Referans Olarak Kullanılması", OMÜİFD, S. 24-25, Samsun 2007, ss. 153-177.
- AYAR, Kenan, "Mâlik b. el-Haris el-Eşter'in İlk Dönem Siyasi Hadiseler deki Rolü", DAAD, C. 5, S. 4, Samsun 2005, ss. 37-93.
- BAKIXANOV, Abbasqulu ağa, *Gülüstani-İrəm*, Bakı 1951.
- BƏL'ƏMİ, Əbu Əli Muhəmməd, *Tarixi-Qozidə*, Məşhəd 1373.
- BƏLAZURİ, Əbül-Abbas Əhməd, *Ənsabu'l-Əşraf*, C. II-XIII, (nəşr. S. Zəkkar-Zirikli. R), Beyrut 1996.
- BƏLAZURİ, Əbül-Abbas Əhməd, *Fütuhü'l-Büldan*, (nəşr. A. ət-Təbba), Beyrut 1987.
- BUXARİ, Muhəmməd ibn İsmayıl, *Səhih*, C. I-XI, (tərc. K. Miras), İstanbul 1976.
- BÜNYADOV, Ziya, *Azərbaycan VII-IX Əsrlərdə*, Bakı 1989.
- ÇAĞATAY, Neşet, *İslam Dönemine Dek Arap Tarihi*, Ankara 1989.
- DEMİREL, H. Reşit, "Hz.Âişe ve Siyâset (Hadis-Haber ve Tarihî Bilgiler Işığında)", YYÜİFD, S. 3, Van 2000, ss.123-148.
- DİNƏVƏRİ, Əbu Hənifə Əhməd, *Kitabu'l-Əxbari't-Tival*, Bağdad (tarixsiz).
- EFENDİOĞLU, Mehmet, *Arap Olmayan Sahâbîler*, İstanbul 2011.
- ƏLİ, Cavad, *Müfəssəl fi Tarixü'l-Ərəb Qəblə'l-İslam*, C. I-II, Bağdad 1993.
- HƏMİDULLAH, Muhəmməd, *Allah'ın Elçisi Hz.Muhammed*, (tərc. Ü. Z. Babacan), İstanbul 2001.
- HƏMİDULLAH, Muhəmməd, *İslâm Müesseselerine Giriş*, İstanbul 1992.
- HƏMİDULLAH, Muhəmməd, *Vəsaiqü's-Siyasiyyə*, Beyrut 1985.
- HƏSƏN, Həsən İbrahim, *İslam Tarihi*, C. I-III, İstanbul 1987.
- HİTTİ, Philip, *Siyasi ve Medeni İslam Tarihi*, (tərc. S. Tuğ), İstanbul 1980.
- HİZMETLİ, Sabri, "Tarihî Rivayetlere Göre Hz. Osman'ın Öldürülmesi", AÜİFD, C. 27, S. 1, Ankara 1986, ss. 149-176.

- İBN ƏBDULHƏKƏM, Əbul-Qasım Əbdurrəhman, *Fəthu Misr və'l-Məğrib*, (nəşr. Ə. Amir), Qahirə (tarixsiz).
- İBN ƏSAKİR, Əbül-Qasım Əli, *Tarixu-Mədinəti-Diməşq*, (nəşr. M. Əmrəvi), C. III-IX, Beyrut 1995-2000.
- İBN HAZM, *Cevamiü's-Sira*, (tərc. M.S.Arı), İstanbul 2004.
- İBN HƏBİB, Əbu Cə'fər Muhəmməd əl-Bağdadi, *Kitabu'l-Muhəbbər*, Beyrut 2013.
- İBN HİŞAM, Əbu Muhəmməd Əbdulməlik, *Sirətü'n-Nəbəviyyə*, (tərc. İ. Hasan-Çağatay N.), Ankara 1992.
- İBN İSHAQ, Əbu Abdullah Muhəmməd, *Sirətu'n-Nəbəviyyə*, Beyrut 2012.
- İBN KƏSİR, İmadəddin İsmayıl, *Bidayə və'n-Nihayə*, (tərc. M. Keskin), C. I-V, İstanbul 1994.
- İBN MACƏ, Əbu Abdullah Muhəmməd, *Sünən*, (tərc. H. Hatipoğlu), C. I-IX, İstanbul 1983.
- İBN MİSKƏVEYH, Əbu Əli Muhəmməd, *Təcaribü'l-Üməm*, (tərc. H. Amedroz), C. I-IV, London 1921.
- İBN MÜNƏBBİH, Vəhb, *Kitabu't-Tican fi Müluki-Himyər*, Səna 1979.
- İBN QUTEYBƏ, Əbu Muhəmməd Abdullah, *Kitabu'l-İmamə və's-Siyasə*, C. I-II, (nəşr. T. Zeyni), Qahirə 1967.
- İBN SƏ'D, Muhəmməd əl-Bağdadi, *Kitabu't-Təbəqatu'l-Kübra*, C. I-VIII, Beyrut 1957-1960.
- İBN TAĞRIBİRDİ, Cəmaləddin Yusif, *Nücumu'z-Zahirə fi Müluki-Misr və'l-Qahirə*, C. I, Qahirə 1930.
- İBN UQBƏ, Musa, *Məğazi*, Əkadir (Mərakeş) 1994.
- İBN XƏLDUN, Vəliyəddin Əbdürrəhman, *Kitabü'l-İbər və Divanü'l-Mübtəda və'l-Xəbər*, C. I, Beyrut 1979.
- İBNü'l-CƏVZİ, Əbü'l-Fərəc Əbdürrəhman, *Müntəzəm fi Tarixi'l-Müluk və'l-Üməm*, (nəşr. M. Ə. Əta), C. I-IV, Beyrut 1992.
- İBNü'l-Ə'SƏM, Əhməd əl-Kufi, *Fəthlər Kitabı*, (tərc. Z. Bünyadov), Bakı 1995.
- İBNü'l-Ə'SƏM, Əhməd əl-Kufi, *Kitabu'l-Fütuh*, (nəşr. Ə. Şiri), Beyrut 1991.

- İBNü'l-ƏSİR, İzzəddin Əli, *Kamil fi't-Tarix*, (tərc. A. Ağırakça-Özaydın A), C. I-III, İstanbul 1987.
- KALLEK, Cengiz, *Asrı-Saadette Yönetim Piyasa İlişkisi*, İstanbul 1997.
- KAPAR, M. Ali, "Hz. Ali'nin Öldürülmesi ile ilgili Rivayetlerin Değerlendirilmesi", SÜSBED, S. 3, Konya 1994, ss. 341-345.
- KAPAR, M. Ali, "Hz. Hasan'ın Halifeliği ve Hasan-Muaviye Andlaşması", İD, S. 7, Konya 1997, ss. 67-80.
- KƏLBİ, Hişam ibn Muhəmməd, *Kitabu'l-Əsnam*, (nəşr. Ə.Z.Başa), Qahirə 1995.
- KÖKSAL, Mustafa Asım, *İslam Tarihi*, C. I-IV, İstanbul 2005.
- MƏQDİSİ, Mütəhhər ibn Tahir, *Kitabu'l-Bədi' və't-Tarix*, Qahirə (tarixsiz).
- MƏQRİZİ, Təqiyəddin Əhməd, *Kitabu's-Süluk fi Mərifəti-Düvəl və'l-Müluk*, C. I-III, Beyrut 1997.
- MƏS'UDİ, Əbü'l-Həsən Əli, *Mürucü'z-Zəhəb və Mə'adini'l-Cəvhər*, (nəşr. M.M. Əbdülhəmid), C. I-II, , Beyrut 1973.
- MƏS'UDİ, Əbü'l-Həsən Əli, *Tənbih və'l-İşraf*, Beyrut 1981.
- MÜSLİM, Əbü'l-Hüseyn ibnü'l-Həccac, *Səhih*, (tərc. A. Davutoğlu), C. I-IX, İstanbul 1968.
- SƏM'ANİ, Əbu Səid Əbdülkərim, *Kitabü'l-Ənsab*, (nəşr. A. əl-Barudi), C. I-IV, Beyrut 1988.
- SÜYUTİ, Cəlaləddin Əbdurrəhman, *Tarixu'l-Xüləfa*, Beyrut 2003.
- ŞAKİR, Mahmud, *İslam Tarihi*, (tərc. F. Aydın), C. I-IV, İstanbul 1993.
- ŞƏHRİSTANİ, Muhəmməd ibn Əbdülkərim, *Miləl və'n-Nihal*, (tərc. M. Öz), İstanbul 2008.
- ŞEŞEN, Ramazan, *Müslümanlarda Tarih-Coğrafya Yazıcılığı*, İstanbul 1998.
- ŞİBLİ, Numani, *Bütün yönleriyle Hz.Ömer ve devlet idaresi*, Ankara 1986.
- TƏBƏRİ, Əbu Cəfər Muhəmməd ibn Cərir, *Camiü'l-Bəyan fi Təfsiri'l-Qur'an*, C. I-VIII, İstanbul 1996.
- TƏBƏRİ, Əbu Cəfər Muhəmməd ibn Cərir, *Tarixi-Təbəri*, C. II-VI, Tehran 1383.
- TEMMAVİ, Süleyman Muhammed, *Hz. Ömer ve Modern Sistemler*, (tərc. M.V.Taylan), İstanbul 2004.

- VAQİDİ, Əbu Abdullah Muhəmməd, *Fütuhu'l-Cəzirə*, (nəşr. G. Evald), Göttingen 1827.
- VAQİDİ, Əbu Abdullah Muhəmməd, *Fütuhü'ş-Şam*, (nəşr. Ə. Əbdürrəhman), C. I-II, Beyrut 1997.
- VAQİDİ, Əbu Abdullah Muhəmməd, *Kitabu'-Riddə*, (nəşr. Y. əl-Cəburi), Beyrut 1990.
- VƏLİXANLI, Nailə, *Ərəb Xilafəti və Azərbaycan*, Bakı 1993.
- YAQUBİ, Əhməd ibn İshaq, *Tarixi-Yaqubi*, C. I-II, Tehran 1372.
- YUSRİ, Əbdulqəni Abdullah, *Mu'cəmu'l-Muvərrixinu'l-Muslimin*, Beyrut 1991.
- YÜKSEL, Ahmet Turan, *İslamın İlk Döneminde Ticari Hayat*, İstanbul 1999.
- ZƏHƏBİ, Şəmsəddin Muhəmməd, *İbər fi Xəbər mən Ğəbər*, C. I-IV, Küveyt 1966.
- ZƏHƏBİ, Şəmsəddin Muhəmməd, *Siyəru Ə'lamu'n-Nübəla*, C. II-IX, Qahirə 1956.
- ZEYDAN, Corci, *Tarixu't-Təməddunі'l-İslami*, C. I, Beyrut (tarixsiz).


**Kitab haqqındakı rəy və təkliflərinizi aşağıdakı elektron ünvana göndərə bilərsiniz**

**islamtarixi1@box.az**


FƏTHLƏR
İslam Ordularının Yürüşləri
Mühüm Döyüşlər
İSLAMIN İNTİŞARI
Muhammad (s.a.v)-in Dövrü
Əbu Bakrin (r.a) Dövrü (632-634)
Ömar ibn Xattabın (r.a) Dövrü (634-644)
Osman (r.a/644-656) və Əlinin(r.a) (656-661) Dövrləri
Əməvilərin Hakimiyyəti Dövrü (661-750)
BULGARS
HUNGARIANS
TURKIC PEOPLES
Aral Sea
Talas 751
FERGHANA
TRANSOXIANA
Samarkand 710
Bukhara 710
Balkh 664
Merv
Nishapur 651
Kabul 664
Herat
GEORGIA
Tiflis
Derbend
ARRAN
SHIRVAN
Caspian Sea
AZERBAIJAN
Tabriz
Ardabil
MESOPOTAMIA
Mosul 641
Rayy
GURGAN
KHURASAN
Jalula
Nehavend 642
Kerbela
Ctesiphon
Kufa
Qadisiya 636
Susa
Isfahan
SASANIAN PERSIA
PUNJAB
Multan 711
Basra
Istahar 648
FARS
KERMAN
SEISTAN
HINDU STATES
SIND
BAHRAIN
Persian Gulf
MAKRAN
Arabian Sea
HEJAZ
Medina
Suhar
OMAN
Muscat
YAMAMA
Mecca
Red Sea
Arabian Peninsula
Najran
HADHRAMAUT
YEMEN
Aden
KINGDOM OF AXUM
INDIAN OCEAN
300 km
300 miles

